*Kitab Diasporla İş üzrə Dövlət Komitəsinin dəstəyi ilə nəşr olunub*

Tərtibçi:
**Mətanət Bağıyeva**

Redaktorlar:
**Elman Qədirov, Yaşar Quluzadə**

Korrektorlar:
**Zeynəb Əmrəliyeva, Gülzaman Qurbanova, İrisma Mirzalıyeva**

**Xaricdə yaşayan azərbaycanlılar. Qısa bioqrafik məlumat kitabçası.**
Bakı, «Papirus NP», 2016, 500 səh.

Kitabda Azərbaycan diasporunun peşəkar fəaliyyətin müxtəlif sahələrində tanınmış və uğur qazanmış iki yüzdən çox məşhur nümayəndəsi haqqında bioqrafik məlumatlar toplanıb.

Kitab geniş oxucu auditoriyası üçün nəzərdə tutulub.

**ISBN 978-9952-8299-1-4**

# Ön söz

Azərbaycan Respublikası dövlət müstəqilliyini bərpa edəndən və xüsusilə ümummilli lider Heydər Əliyev hakimiyyətə qayıtdıqdan sonra diasporun formalaşmasına, onun azərbaycançılıq ideyası ətrafında sıx birləşməsinə dair tədbirlər kompleksinin işlənib hazırlanması və reallaşdırılması dövlət siyasətinin prioritet istiqamətlərindən birinə çevrildi. Heydər Əliyev hələ 1991-ci ildə Naxçıvan Muxtar Respublikasının Ali Məclisinin sədri olarkən, bu istiqamətdə ilk addım atdı – Dünya Azərbaycanlılarının Həmrəyliyi Gününün hər il bayram edilməsi haqqında qərar qəbul edilməsi təşəbbüsünü irəli sürdü. Azərbaycan xalqının birliyi ideyasının bəyan edildiyi bu sənəd Azərbaycan diasporunun birləşməsinin təməlini qoydu, bunun üçün güclü təkan oldu.

Prezident Administrasiyasında xüsusi strukturun – Azərbaycan diasporu ilə iş üzrə sektorun təsis edilməsi xaricdə yaşayan həmvətənlərimizin sıx birləşməsi işində, onların hüquqlarının və qanuni maraqların müdafiəsi üçün prinsipial əhəmiyyətli amil oldu. 2001-ci ildə keçirilmiş və milli birliyin möhkəmlənməsinin strateji proqramını müəyyən etmiş Dünya Azərbaycanlılarının I Qurultayından az sonra - 2002-ci ildə isə Xarici Ölkələrdə Yaşayan Azərbaycanlılarla İş üzrə Dövlət Komitəsi (hazırda Diasporla İş üzrə Dövlət Komitəsi) yaradıldı.

"Xaricdə yaşayan azərbaycanlılarla əlaqədar dövlət siyasəti haqqında" Qanun və Dünya Azərbaycanlılarının Xartiyası qəbul edildi, Dünya Azərbaycanlılarının Əlaqələndirmə Şurasının tərkibi seçildi, çoxsaylı başqa tədbirlər keçirildi. Bu kompleks operativ işin istiqamətləndiyi nəticə – xaricdə yaşayan azərbaycanlıların qarşılıqlı əlaqələrini möhkəmləndirmək, onların hüquqlarını, azadlıqlarını və maraqlarını təmin etmək, Azərbaycanın pozitiv imicini formalaşdırmaq, tarixi həqiqəti və reallıqları dünya ictimaiyyətinə çatdırmaq, Azərbaycan ilə başqa dövlətlər arasında mədəni-iqtisadi əlaqələrə töhfə verməkdir.

Diqqətəlayiqdir ki, müasir mərhələdə xaricdə yaşayan azərbaycanlıların birləşməsi yeni fazaya daxil olub: icmalar formalaşıb və ardıcıl fəaliyyət göstərirlər, onların sayı artıb, tarixi Vətənlə əlaqələr möhkəmlənib. Bir sözlə, Azərbaycan diasporu dünyada ən gənc diasporlardan biri olmasına baxmayaraq, qısa müddətdə böyük in-

kişaf yolu keçib, əvvəlkindən daha güclü, daha mütəşəkkil struktura çevrilərək, kifayət qədər pozitiv nəticələrə nail ola bilib.

Bütün bunlar, çox cəhətdən, Azərbaycan Prezidenti İlham Əliyevin siyasəti sayəsində mümkün olub. Prezident İlham Əliyev əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulmuş ənənələri uğurla davam etdirərək, azərbaycanlıların birliyi və həmrəyliyi, həmvətənlərimizin dəstəklənməsi və müdafiəsi məsələlərinə böyük əhəmiyyət verir. Prezident hələ Dünya azərbaycanlılarının III qurultayındakı çıxışında xüsusi vurğulayıb: "... diaspor təşkilatlarımız fəaliyyət göstərdikləri ölkələrdə bütün Azərbaycan icmasını birləşdirməlidir. İdeal variant ondan ibarət ola bilər ki, hər bir azərbaycanlı diaspor təşkilatlarına üzv olsun, onların tədbirlərində iştirak etsin, öz dəstəyini versin, özköməyini göstərsin və eyni zamanda, diaspor təşkilatları tərəfindən də lazım olanda kömək görsün. Bunu etmək üçün bu təşkilatlar daha da güclü olmalıdır". İlham Əliyev həmçinin qeyd edib ki, "…birlik olmasa, biz güclü ola bilmərik".

Ölkəmizin liderinin sözləri bu gün həmişəkindən daha aktualdır. Hazırda dünyanın bütün guşələrində çoxmilyonlu Azərbaycan diasporu yaşayır, onun ictimai təşkilatları, milli-mədəni birlikləri fəaliyyət göstərir. Xaricdəki azərbaycanlılar yaşadıqları ölkələrin ictimai-siyasi, sosial-iqtisadi və elmi-mədəni həyatına fəal cəlb ediliblər. Əslən Azərbaycandan olan insanların yaşadığı və işlədiyi dövlətlərdə diasporumuzun nüfuzu, rolu və təsiri ilbəil artır.

Hər hansı səbəblərdən müxtəlif vaxtlarda öz tarixi Vətəninin hüdudlarından kənarda yaşamalı olan həmyerlilərimiz öz etnik eyniliyini və milli bənzərsizliyini, tarixi köklərinə, mənəvi və mədəni ənənələrə, Azərbaycanın taleyinə bağlılıq hissini praktik olaraq qoruyub saxlayıblar.

Sevindirici haldır ki, Azərbaycan diasporunun böyük intellektual, mədəni və maliyyə-iqtisadi potensiala malik olan nümayəndələri həm yaşadıqları ölkələrdə elmin və mədəniyyətin, iqtisadiyyatın və səhiyyənin inkişafına, həm də ümumbəşər sivilizasiyasına imkanları daxilində töhfə verirlər.

Müxtəlif dövlətlərin fəal və yaradıcı vətəndaşları olan bu insanlar Azərbaycanı ləyaqətlə təmsil edirlər, həm özlərinin ikinci vətəninin çiçəklənməsi, həm də dünyada ölkəmizin müsbət imicinin formalaşması, xalqlar arasında dialoqun möhkəmlənməsi naminə əllərindən gələni edirlər.

Əlinizdə tutduğunuz bu kitab geniş oxucu auditoriyasına peşəkar fəaliyyətdə

böyük nailiyyətlər qazanmış azərbaycanlılarla tanış olmağa imkan verəcək. Bu insanların bəziləri görkəmli elmi işlərin, kəşflərin və ixtiraların müəllifidir, başqaları mədəniyyətin, incəsənətin və təhsilin inkişafı sahəsində məhsuldar işləyir, digərləri müəssisə və təşkilatlara səmərəli rəhbərlik edir, daha bir çoxları siyasi sahədə bacarıqlarını fəal şəkildə və müvəffəqiyyətlə sınayır. Kimsə dövlət təltiflərinə layiq görülüb və onlara fəxri adlar verilib, bəzilərinin şərəfinə küçələr adlandırılıb və abidələr ucaldılıb… Qeyri-səlis çoxluqlar nəzəriyyəsinin və qeyri-səlis məntiqin banisi Lütfi-Zadə, "müasir dövrün 100 dahisi" siyahısında on ikinci dahi, helium-neon lazerini yaradan Əli Cavan, insanın və heyvanların sümüklərində xüsusi gərginliklər yaranması hadisəsini kəşf etmiş Elyaz Babayev, 1966-1991-ci illərdə pilotlu kosmik gəmilərin uçuş sınaqları üzrə Dövlət Komissiyasının sədri olmuş Kərim Kərimov, Sibirdə ilk neft yataqlarını kəşf edən Fərman Salmanov, dünyaca məşhur genetik Ənvər Quliyev və bir çox başqa həmvətənimiz belə görkəmli şəxsiyyətlərdəndir, biz haqlı olaraq onlarla fəxr edirik.

Heydər Əliyev 1996-cı ilin iyulunda Bonna səfəri zamanı Almaniyadakı Azərbaycan Cəmiyyətləri Federasiyasının nümayəndələri qarşısında çıxışında məhz belə şəxsiyyətlər haqqında danışaraq deyirdi: "… azərbaycanlı sadə bir vətəndaş kimi yox, elə olsun ki, onun şəxsində Azərbaycan səslənsin, ölkəmizin bayrağı qalxsın".

Sözsüz ki, bu kitaba xalqımızın ən yaxşı bütün nümayəndələri haqqında məlumatlar daxil edilməyib – bir nəşrdə onların hamısı barədə yazmaq sadəcə mümkün deyil. Amma hətta onların bu natamam siyahısı da xalqımızın nümayəndələrinin nə qədər istedadlı və necə böyük potensiala malik olması , həm hazırda yaşadıqları ölkə üçün, həm də öz tarixi vətəni naminə çox işlər görməsi, qürurla AZƏRBAYCANLI adı daşımaqla Azərbaycanı məşhurlaşdıra bilməsi haqda təsəvvür yaradır.

Yaxın gələcəkdə biz adları tanınmağa layiq olan azərbaycanlılara həsr edilmiş neçə-neçə kitablar görəcəyik. Belə soydaşlarımız isə minlərlədir…

**Mətanət Bağıyeva**



## Abbasov
## İftixar Balakişi oğlu

*Texnika elmləri doktoru, professor.*
*Cənub Federal UniversitetininTaqanroq Texnologiya İnstitutunun mühəndis qrafikası və kompyuter dizaynı kafedrasının müdiri*

Abbasov İftixar Balakişi oğlu 1966-cı il oktyabrın 29-da Azərbaycan Respublikasının Lənkəran rayonunun Daşdalıqcar kəndində anadan olub.

1988-ci ildə İ.Abbasov Taqanroq Radiotexnika İnstitutunu "elektrohidroakustika və ultrasəs texnikası" ixtisası üzrə bitirib. 1989-1993-cü illərdə Taqanroq Radiotexnika İnstitutunun elektrohidroakustika və ultrasəs texnikası kafedrasında baş laborant, mühəndis, laboratoriya müdiri vəzifələrində işləyib. 1993-1996-cı illərdə Taqanroq Dövlət Radiotexnika Universitetinin (TDRU) aspirantı, Soros Fondunun və Universitetin Elmi Şurasının təqaüdçüsü olub. 1996-cı ildə aspiranturanı bitirdikdən sonra TDRU-nun mühəndis qrafikası kafedrasının assistenti vəzifəsinə qəbul edilib. 1997-ci ildə fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib.

1998-2013-cü illərdə İ.Abbasov mühəndis qrafikası və kompyuter dizaynı kafedrasının dosenti vəzifəsində işləyib, 2000-ci ildə dosent elmi adı alıb. 2012-ci ildə texnika elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. 2013-cü ildə mühəndis qrafikası və kompyuter dizaynı kafedrasının müdiri vəzifəsinə seçilib.

İ.Abbasovun elmi maraqlarının əhatə dairəsi: hidrodinamikada və akustikada qeyri-xətti dalğavarı hadisələrin riyazi modelləşdirilməsi, sənaye dizaynında kompyuter modelləşdirməsi.

İ.Abbasov 5 monoqrafiyanın, 180 elmi və tədris-metodiki işin, EHM üçün proqramların dövlət qeydiyyatı haqqında 3 şəhadətnamənin müəllifidir. Onun elmi araşdırmalarının əsas nəticələri akademik, referativ və xarici jurnallarda – "Dokladı RAN", "Akustiçeskiy jurnal", "İzvestiya RAN: Mexanika jidkosti i qaza", "Fizika atmosferı i okeana", "Jurnal texniçeskoy fiziki", "Vıçislitelnaya mexanika sploşnıx sred", "Journal of Sound and Vibration (UK)", "Waves in Random and Complex Media (UK)", "Applied Mathematics (USA)", "International Journal of Pure and Applied Mathematics (EU)" nəşrlərində məqalələr şəklində dərc edilib.

İ.Abbasov mühəndis və kompyuter qrafikası, üçölçülü kompyuter modelləşdirməsi, qavrama psixologiyası üzrə mühazirə kursları oxuyur. Kompyuter texnologiyalarının dizaynda tətbiqi üzrə 12 dərs vəsaitinin müəllifidir. Bu vəsaitlərdən 8-i RF Təhsil Nazirliyinin, RF Təhsil Nazirliyinin mühəndis qrafikası üzrə Elmi-Metodik Şurasının, dizayn və monumental-dekorativ incəsənət sahəsində Tədris-Metodika Şöbəsinin qrifləri ilə "DMK Press" nəşriyyatında (Moskva) nəşr edilib. İ.Abbasov tələbə-dizaynerlərin elmi işlərinə rəhbərlik edir, hər il müxtəlif səviyyəli elmi konfranslarda və sərgilərdə iştirak edir.

"MİFİ" Milli Nüvə Tədqiqatları Universitetində (Moskva, 2009), S.Q.Stroqanov adına Moskva Dövlət Bədii-Sənaye Akademiyasında (Moskva, 2010) ixtisasartırma kursları keçib.

İ.Abbasov Rusiya Dizaynerlər İttifaqının, Rusiya Akustika Cəmiyyətinin, Hindistan Riyaziyyat Cəmiyyətinin (IMS) üzvüdür. Onun bioqrafik məlumatları "Uçyonıye Rossii" (Rossiyskaya akademiya yestestvoznaniya) kitabına, "Marquis Who's Who in the World" (ABŞ), "Who's Who v Rossii" (İsveçrə) beynəlxalq bioqrafik məlumat kitabçalarına daxil edilib.



## Abbasov
## Rahib Yusif oğlu

*Tibb xidməti polkovniki, ali dərəcəli terapevt.*
*Professor,"Poema zdorovya" ailə klinikasının kliniki rəhbəri*

Abbasov Rahib Yusif oğlu 1939-cu il fevralın 23-də Yerevanda anadan olub.

1962-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) müalicə-diaqnostika fakültəsini fərqlənmə diplomu ilə bitirib. 1967-ci ildən Sankt-Peterburqda yaşayır.

R.Abbasov tələbəlik illərində institutun yuxarı kurslarında oxumaqla bərabər, Bakıdakı kliniki xəstəxanalardan birinin terapevtik şöbəsində kiçik tibb işçisi kimi çalışıb. R.Abbasov institutu bitirdikdən sonra Sovet Ordusu sıralarında hərbi xidmətə çağırılır və o vaxtdan, həyatının təxminən otuz ilini bu işə həsr edir. 1962-ci ildən hərbi hissələrdə tibb məntəqəsi lazaretinin rəisi və raket qoşunları tədris mərkəzinin tibbi xidmət rəisi olub.

1967-ci ildə R.Abbasov Leninqradda S.M.Kirov adına Hərbi Tibb Akademiyasının kliniki ordinaturasına daxil olub. Ordinaturanı bitirəndən sonra 1969-1990-cı illərdə Hərbi Tibb Akademiyasının hərbi-səhra terapiyası kafedrasında baş ordinator, baş elmi işçi, müəllim, baş müəllim vəzifələrində çalışıb.

Hərbi xidmətin bu dövründə müxtəlif kimyəvi və fiziki amillərin insana təsiri zamanı mədəaltı vəzinin xarici sekretor fəaliyyətinin funksional vəziyyətini öyrənib. R.Abbasov dünyada ilk dəfə sübut edib ki, mədəaltı vəzinin xarici sekretor fəaliyyətinin vəziyyəti ekstremal təsirlərdən sonra uzun müddət orqanizmin ümumi reaksiyasının indikatorudur.

Aparılmış tədqiqatların son nəticələri məşqlərin və uçuşların optimal rejimlərinə, pilotlarda və kosmonavtlarda müxtəlif nasazlıqların profilaktikasına və onların rasional qidalanmasına dair tövsiyələr işlənib hazırlanması zamanı istifadə edilib.

R.Abbasov ftorlu və ftor-üzvi birləşmələrin, ionlaşdırıcı şüaların, impuls maqnit sahələrinin, mexaniki və istilik hadisələrinin insan orqanizminə təsirini öyrənib. Həmin tədqiqatların nəticələri SSRİ Müdafiə Nazirliyi və SSRİ Səhiyyə Nazirliyi tərəfindən təsdiq olunmuş rəhbər sənədlərdə ("Kombinə edilmiş radiasiyadan zərər çəkmiş şəxslərin tibbi təxliyyəsi mərhələlərində diaqnostikası, tibbi çeşidlənməsi və

müalicəsinə dair Təlimat" (1980), "Klinika, diaqnostika, müalicə və profilaktika üzrə Metodik Tövsiyələr" (1981) və s.) tətbiq edilib.

1990-cı ildə ordudan tərxis ediləndən sonra R.Abbasov Elmi-Tədqiqat Sənaye və Dəniz Təbabəti İnstitutunun peşə patologiyası və ümumi terapiya klinikasına rəhbərlik edib. 1994-cü ildə o, eyni zamanda, institut direktorunun kliniki iş üzrə müavini, 1999-cu ildə isə "Medbioekstrem" Federal İdarəsinin Peşə Patologiyası Mərkəzinin baş həkimi vəzifəsinə təyin olunur.

1990-1994-cü illərdə R.Abbasov həm də Radiasiya və kimyəvi qəzalar zamanı təcili tibbi yardım üzrə Şimal-Qərb Regional Mərkəzinə rəhbərlik edib. Alim qısa müddətdə ittifaq və respublika əhəmiyyətli 11 subyektin daxil olduğu Mərkəzin ştat-təşkilat strukturunu hazırlayıb və bu subyektlərin fəaliyyətini məharətlə tənzimləyib. Bu dövrdə R.Abbasov atom buzqıran donanması dənizçilərinin çoxillik dispanser müşahidəsi təcrübəsini ümumiləşdirib və xroniki patologiyanın formalaşmasında məskunlaşma amillərinin rolunu aşkar edib. Çernobıl Atom Elektrik Stansiyasında (ÇAES) qəzaları ləğv edən insanlarda xromosom aberrasiyaları və bu insanların immunitet vəziyyəti arasında qarşılıqlı əlaqə və digər problemləri tədqiq edilib.

R.Abbasov qastroenterelogiya, endokrinologiya, hematologiya, revmatologiya və terapiyanın başqa sahələrinə həsr edilmiş 117 elmi işin müəllifidir.

R.Abbasov "Semeynaya medisina" ("Ailə təbabəti") klinikası yanında Rusiyada ilk dəfə anlaqsız və çətinliklə anlayan xəstələr üçün tibbi mərkəz təşkil edib və on il həmin Mərkəzə rəhbərlik edib.

Hazırda R.Abbasov "Poema zdorovya" ailə klinikasının kliniki rəhbəri və Elmi-Tədqiqat Sənaye və Dəniz Təbabəti İnstitutunun peşə patologiyası mərkəzinin tibbi-ekspert komissiyasının sədridir.

2002-ci ildə R.Abbasova "Rusiya Federasiyasının Əməkdar Həkimi" fəxri adı verilib.



## Abdullayev Fəxrəddin Gülməmməd oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*Mersin Universitetinin riyaziyyat departamentinin müdiri*

Abdullayev Fəxrəddin Gülməmməd oğlu 1957-ci il mayın 15-də Azərbaycan Respublikasının Şamaxı rayonunun Sündü kəndində anadan olub.

1980-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) mexanika-riyaziyyat fakültəsini bitirib və təyinatla Azərbaycan EA Riyaziyyat və Mexanika İnstitutuna göndərilib. 1980-ci ilin noyabr ayından Ukrayna EA Tətbiqi Riyaziyyat və Mexanika İnstitutunun (TRMİ, Donetsk) funksiyalar nəzəriyyəsi şöbəsində təcrübə keçib (elmi rəhbər - fizika-riyaziyyat elmləri doktoru, professor V.İ.Belıy). 1984-cü ilin yanvarında Ukrayna EA TRMİ-nin "riyazi analiz" ixtisası üzrə aspiranturasına daxil olub. 1986-cı ilin iyununda Ukrayna EA TRMİ-də "Kvazikonform sərhədli oblastlarda sahəcə ortoqonal polinomlar" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1986-1994-cü illərdə Azərbaycan EA Riyaziyyat və Mexanika İnstitutunun riyazi analiz şöbəsində kiçik elmi işçi, elmi işçi, böyük elmi işçi vəzifələrində işləyib. 1994-cü ilin mart ayından Türkiyə universitetlərində (Trabzon, Mersin) çalışmağa başlayıb. 2003-cü ildə Azərbaycan EA Riyaziyyat və Mexanika İnstitutunda "Sahəcə ortoqonal polinomlar və Biberbax polinomları" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

F.Abdullayevin tədqiqatlarının əsas istiqamətləri: Biberbax polinomlarının, onların bəzi ümumiləşmələrinin və Furye sıralarının sahəcə ortoqonal polinomlar üzrə aproksimasiya xassələrinin öyrənilməsi; sahəcə ortoqonal polinomların və ixtiyarı cəbri polinomların kompleks müstəvinin müxtəlif oblastlarında davranışı.

F.Abdullayevin rəhbərliyi ilə 10 namizədlik və 8 doktorluq dissertasiyası müdafiə edilib. Onun 150-dən çox elmi işi dünyanın bir sıra ölkələrinin elmi jurnallarında dərc olunub.

F.Abdullayev Mersin Universiteti ilə Kanada, Fransa, Ukrayna, Almaniya, Polşa və başqa ölkələrin ali məktəbləri arasında elmi əlaqələr yaradıb. O, Türkiyə, Ukrayna, Bolqarıstan, Polşa, İsrail, Kipr və başqa ölkələrin elmi təşkilatları və univer-

sitetləri ilə birgə keçirilən çoxsaylı beynəlxalq riyazi konfransların təşəbbüskarı və təşkilatçısıdır.

Ukrayna EA Riyaziyyat İnstitutu ilə elmi əlaqələrə verdiyi töhfəyə və elm sahəsində qazandığı yüksək nailiyyətlərə görə F.Abdullayev 2002-ci ildə Ukrayna EA-nın M.V.Ostroqradski adına qızıl medalı ilə təltif edilib. 2007-ci ildə o, yaxınlaşma və interpolyasiya nəzəriyyəsində müasir metodlar sahəsində silsilə işlərinə görə Ukrayna EA-nın N.M.Krılov adına mükafatına layiq görülüb. 2009-cu ildə II Ukrayna Beynəlxalq Riyaziyyat Konqresində Ukrayna EA-nın N.N.Boqolyubov adına qızıl medalı ilə təltif edilib.

F.Abdullayev özünü həm də rəhbər işçi kimi yaxşı tanıdıb. 2006-2010-cu illərdə Mersin Universiteti nəzdində Mersin Texniki Məktəbinin direktoru, 2008-2011-ci illərdə Mersin Universitetinin təbiətşünaslıq və ədəbiyyat fakültəsinin dekanı olub, hazırda Riyaziyyat Departamentinin müdiridir. 2010-cu ildə F.Abdullayev Mersin Universitetinin rektoru vəzifəsinə irəli çəkilib.



## Abdullayev
## Rizvan Yaqub oğlu

*Tibb elmləri doktoru, professor.*
*Xarkov Diplomdansonrakı Təhsil Tibb Akademiyasının ultrasəs diaqnostikası kafedrasının müdiri*

Abdullayev Rizvan Yaqub oğlu 1959-cu il martın 30-da Azərbaycan Respublikasının Mərəzə (indiki Qobustan) rayonunun Sundu kəndində anadan olub.

1975-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutuna (indiki Azərbaycan Tibb Universiteti) daxil olub. 1981-ci ildə ali məktəbi bitirəndən sonra təyinatla Belqoroda göndərilir. Orada 1985-ci ilin avqustuna qədər sahə həkimi işləyib, sonra Ukrayna Həkimləri Təkmilləşdirmə İnstitutunun (indiki Xarkov Diplomdansonrakı Təhsil Tibb Akademiyası) kliniki ordinaturasına daxil olub.

1985-1986-cı illərdə R.Abdullayev Moskvada, dünyada ilk həkim-kosmonavt, professor O.Y.Atkovun rəhbərliyi ilə ultrasəs diaqnostikası metodunu öyrənib. Xarkova qayıdandan dərhal sonra həmin metodu infarkt şöbəsinin işində tətbiq edib və miokardın kəskin infarktı sahəsində onun tətbiqinin əsasını qoyub.

1988-ci ildə "Xırda ocaqlı miokard infarktı, qeyri-stabil stenokardiya və aralıq tac sindromu zamanı exokardioqrafiya" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 1987-2000-ci illərdə 25 №-li Xarkov şəhər klinik xəstəxanasında həkim işləyib.

1993-cü ildə R.Abdullayevin rəhbərliyi ilə MDB-də ilk dəfə ultrasəs diaqnostikası üzrə (ürək xəstəlikləri üzrə) atlas nəşr edilib. Professor O.Atkovun, Y.Sobolun və "Essen" klinikası (Almaniya) əməkdaşlarının iştirakı ilə yaradılmış bu atlasda 300-dən çox exoqram təqdim olunub, müxtəlif xəstəliklərin diaqnostik və diferensial-diaqnostik əlamətləri təsvir edilib. Atlasda verilən məlumatlar birölçülü və ikiölçülü Doppler exokardioqrafiyasından istifadə edilməklə 4 mindən çox xəstənin müayinəsinin nəticələrinə əsaslanırdı. 1998-ci ildə, yenə R.Abdullayevin rəhbərliyi altında Kaliforniya Universitetinin professorlarının (N.Şiller, E.Foster, R.Redberq) iştirakı ilə "Müasir exokardioqrafiya" kitabı nəşr edilib.

1989-cu ildə R.Abdullayev ultrasəs metodunun kliniki təcrübədə tətbiq sahəsini genişləndirib (o vaxta qədər bu metod yalnız kardiologiyada tətbiq olunurdu). Transvaginal və transrektal müayinə, süd vəzisinin, göz almacıqlarının, onurğa sütununun,

mədənin ultrasəs müayinəsi, damarların tədqiqatı, mamalıq elmində doppleroqrafiya metodlarını Xarkovda ilk dəfə R.Abdullayev tətbiq edib.

2000-ci ildə R.Abdullayev şüa diaqnostikası kafedrasının dosenti vəzifəsinə qəbul edilib. 2003-cü ildə "Ürəyin işemik xəstəliyinin müxtəlif formaları zamanı ürək çatışmazlığının inkişafı və kəskinləşməsi mexanizmlərinin exokardioqrafik diaqnostikasının bəzi aspektləri" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

2008-ci ilin yanvarında Xarkov Diplomdansonrakı Təhsil Tibb Akademiyasında professor R.Abdullayev tərəfindən Ukraynada ilk və yeganə ultrasəs diaqnostikası kafedrası yaradılıb.

Onun rəhbərliyi ilə 13 namizədlik və 2 doktorluq dissertasiyası hazırlanıb.



## Abdullayev
## Rizvan Yusif oğlu

*Tibb elmləri doktoru, professor.*
*Rusiya Tibb Elmləri Akademiyası Mərkəzi Elmi-Tədqiqat Vərəm İnstitutunun biokimya laboratoriyasının müdiri*

Abdullayev Rizvan Yusif oğlu 1961-ci il aprelin 30-da Azərbaycan Respublikasının Ağstafa rayonunda anadan olub.

1978-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) sanitariya-gigiyena fakültəsinə daxil olub. 1984-cü ildə institutu bitirib və təyinatla Dəvəçi (indiki Şabran) şəhərinin Mərkəzi rayon xəstəxanasının kliniki diaqnostika laboratoriyasına göndərilib, orada əvvəlcə həkim-laborant, sonra isə laboratoriya müdiri vəzifəsində çalışıb. 1988-ci ildə müsabiqə yolu ilə Azərbaycan Səhiyyə Nazirliyinin Elmi-Tədqiqat Ftiziopulmonologiya İnstitutunun kiçik elmi işçisi vəzifəsinə keçib. 1990-cı ildə Rusiya Tibb Elmləri Akademiyasının Mərkəzi Elmi-Tədqiqat Vərəm İnstitutunun (RTEA METVİ) aspiranturasına daxil olub.

Sonrakı dövrdə R.Abdullayevin əmək fəaliyyəti və formalaşması RTEA METVİ ilə bağlıdır. 1993-cü ildə o, "Ağciyər vərəminə tutulmuş xəstələrdə kimyəvi terapiya prosesində energetik mübadilə göstəricilərinin və eritrositlərin oksigen ötürmə funksiyasının klinik əhəmiyyəti" mövzusunda namizədlik dissertasiyasını vaxtından əvvəl müdafiə edib. Kliniki-eksperimental xarakterə malik olan bu tədqiqat ftiziatriyanın aktual probleminə – ağciyər vərəminə tutulmuş xəstələrin müalicəsinin effektivliliyinin artırılmasına həsr edilib. Dissertasiya işində müəyyən olunub ki, ağciyər vəreminin inkişafı bioenergetika, antioksidant müdafiə sistemlərində və eritrositlərin oksigen ötürmə funksiyasında pozuntularla müşayiət olunur. Belə dəyişikliklərin bir qismi kompensasiyaedici, digərləri patoloji xarakter daşıyır. Bu pozuntuların korreksiyası üçün müəllif tərəfindən işlənib hazırlanmış üsullar ağciyər vərəminə tutulmuş xəstələrin vərəmə qarşı preparatlara dözümünü və müalicənin effektivliliyini artırmağa imkan yaradıb.

1993-cü ildə R.Abdullayev müsabiqə yolu ilə RTEA METVİ-nin patoloji anatomiya, elektron mikroskopiya və biokimya şöbəsinin elmi işçisi vəzifəsinə təyin edilib, sonra isə böyük elmi işçi vəzifəsinə keçirilib. 1999-cu ildən aparıcı elmi işçidir.

1999-cu ildə R.Abdullayev "Dövr edən faqositlərin və ağciyər faqositlərinin metabolik statusu müxtəlif olan xəstələrdə ağciyər vəreminin gedişatı" mövzusunda dok-

torluq dissertasiyası müdafiə edib. Fundamental xarakter daşıyan bu işə tələbat çox idi, çünki müasir tibb elminin strategiyası müxtəlif patoloji proseslərin mahiyyətini aşkar edən və optimal terapevtik yanaşmalar üçün yollar nəzərdə tutan fundamental tədqiqatların prioritetli inkişafına əsaslanır.

Böyük həcmdə kliniki və eksperimental materiala əsaslanan bu tədqiqat işinin unikallığı ondan ibarətdir ki, müəllif ilk dəfə olaraq, vərəmə yoluxmuş insanın və müxtəlif növ eksperimental heyvanların (hind donuzları və siçovullar) orqanizmində dövr edən faqositlərin və ağciyər faqositlərinin bakterisid funksiyasını öyrənib, onları müqayisə edib. Aparılmış tədqiqatın praktiki əhəmiyyəti ondan ibarət idi ki, xəstənin orqanizminin qeyri-spesifik reaktivliyini qiymətləndirmək və vərəm prosesinin gedişatını proqnozlaşdırmaq üçün müəllif tərəfindən formalaşdırılmış prinsipcə yeni laboratoriya testləri kompleksi müalicənin optimal planının qurulması üçün zəruri əsasdır.

2010-cu ildə R.Abdullayev institutun biokimya laboratoriyasının müdiri vəzifəsinə təyin edilib. Ona "kliniki laboratoriya diaqnostikası" ixtisası üzrə ali ixtisas kateqoriyası verilib.

R.Abdullayevin rəhbərliyi ilə aparılan əsas elmi araşdırmalar vərəmin müasir patogenezinin biokimyəvi mexanizmlərinin (ağciyər vərəmi halında humoral tənzimləmənin müxtəlif aspektləri, biokimyəvi müdafiə reaksiyaları, metabolik pozuntular və s.) öyrənilməsinə həsr edilib. Alınmış məlumatlar fundamental elmə əhəmiyyətli töhfə olmaqla bərabər, praktiki ftiziatriyanı həm diaqnostika məsələlərində, həm də ağciyər vərəminə tutulmuş xəstələrin kompleks müalicəsinə məqsədyönlü patogenez yanaşmaların əsaslandırılması baxımından zənginləşdirib.

R.Abdullayevin araşdırmalarının nəticələri nəşr edilmiş 123 elmi işdə əks olunub. Onun rəhbərliyi altında 4 namizədlik dissertasiyası müdafiə edilib.

R.Abdullayev mütəmadi olaraq Rusiya Federasiyasının və MDB ölkələrinin ftiziatrlarının qurultaylarında, tənəffüs orqanlarının xəstəliklərinə həsr olunan milli konqreslərdə, Avropa Respirator Cəmiyyətinin konqreslərində (Münxen, Stokholm, Barselona) elmi məruzələrlə çıxış edir. 2010-cu ildə R.Abdullayev "Açıq dünya" proqramı çərçivəsində RF nümayəndə heyətinin tərkibində Texas ştatında Amerika Vərəmə qarşı Mübarizə Mərkəzində (Heart Land National TB Center) olub, orada məruzə ilə çıxış edib.

Onun iştirakı ilə "Vərəmlə mübarizə müəssisələrində biokimyəvi tədqiqat metodlarının tətbiqi" və "Kəskin inkişaf edən ağciyər vərəminə tutulmuş xəstələrin biokimyəvi tədqiqatı" adlı metodik tövsiyələr tərtib olunub.

R.Abdullayev böyük pedaqoji iş aparır, ftiziatrların və pulmonoloqların ixtisaslaşması və təkmilləşdirilməsi üçün silsilə mühazirələr oxuyur.



## Abdullayev
## Sərdar Süleyman oğlu

*İqtisad elmləri doktoru, professor.*
*"Tverqrajdanstroy" tikinti şirkəti Qapalı Səhmdar Cəmiyyətinin baş direktoru*

Abdullayev Sərdar Süleyman oğlu 1951-ci il yanvarın 21-də Azərbaycan Respublikasının Kəlbəcər rayonunun Yanşaq kəndində anadan olub.

1973-cü ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunu (indiki Azərbaycan Texniki Universiteti) "Hidromeliorasiya işlərinin mexanikləşdirilməsi" ixtisası üzrə bitirəndən sonra təyinatla Kalinin vilayətinin Belıy şəhərinə göndərilib, orada Kalinin vilayəti "Kalininmeliorasiya" İstehsalat Birliyinin 2 №-li Səyyar Mexanikləşdirilmiş Dəstəsində (PMK-2) mühəndis-mexanik, daha sonra baş mexanik vəzifələrində işləyib. 1977-1980-ci illərdə Sov.İKP Belski rayon komitəsinin təlimatçısı, 1980-1982-ci illərdə isə Kalinin vilayəti "Kalininmeliorasiya" İstehsalat Birliyinin 2 №-li Səyyar Mexanikləşdirilmiş Dəstəsinin (PMK-2) rəisi olub.

1982-ci ildə S.Abdullayev Kalinin (indiki Tver) vilayətindəki "Kalininselstroy" İstehsalat Birliyində işə dəvət edilib, 1982-1986-cı illərdə orada 1316 №-li İxtisaslaşdırılmış Səyyar Mexanikləşdirilmiş Dəstənin (SPMK-1316) rəisi, sonra isə "Kalininselstroymexanizasiya" trestinin müdiri olub.

1986-cı ildən S.Abdullayev "Kalininqrajdanstroy" vilayət İstehsalat Birliyi rəisinin müavini, sonra rəisin birinci müavini vəzifəsində işləyib. Özünü yüksək ixtisaslı mütəxəssis və texniki cəhətdən savadlı rəhbər kimi tanıtmış S.Abdullayev 1991-ci ilin may ayından bu birliyin rəisi təyin edilib, 1993-cü ilin iyul ayından bu günə qədər "Tverqrajdanstroy" Tikinti Şirkəti Qapalı Səhmdar Cəmiyyətinə rəhbərlik edir.

"Tverqrajdanstroy" şirkətinə S.Abdullayevin rəhbərlik etdiyi illər ərzində onun bilavasitə iştirakı ilə Tverdə və Tver vilayətində milyonlarla kvadratmetr mənzil sahəsi, sənaye və sosial əhəmiyyətli iri obyektlər istifadəyə verilib. Şirkətdə Rusiyanın və xarici ölkələrin - Almaniya, Kanada, Böyük Britaniya, Finlandiya və Türkiyənin inşaat firmaları ilə işgüzar əməkdaşlığa, onların köməyi ilə yeni texnologiyaların və inşaat materiallarının istehsalatda tətbiqinə xüsusi diqqət yetirilir.

2000-ci ildə S.Abdullayev "İqtisadi informasiya əsasında istehsalatın idarə edilməsi" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

Tikinti sahəsində xidmətlərinə görə 1994-cü ildə S.Abdullayevə "Rusiya Federasiyasının Əməkdar İnşaatçısı" fəxri adı verilib, 1998-ci ildə o, "Dostluq" ordeni ilə təltif edilib və ona "Rusiyanın Fəxri İnşaatçısı" adı verilib.

1998-ci ildə Rusiya İnşaatçılar İttifaqının təqdimatına əsasən, "Alfa Biznes Klub" tərəfindən S.Abdullayevə Londonda nüfuzlu beynəlxalq mükafat - "Yeni şəraitdə biznesin uğurlu tətbiqinə görə" Gümüş mükafat və Qızıl nişan təqdim edilib.

2001-ci ildə Amerika-Rusiya Sənaye-Ticarət Palatasının (ARCCI) Direktorlar Şurası S.Abdullayevə "Stabil yüksək istehsal göstəricilərinə şəxsi töhfəyə görə" nominasiyasında "Golden Galaxy" medalı verilməsi haqqında qərar qəbul edib.

S.Abdullayevin Tver diyarında çoxillik səmərəli işi layiqincə qiymətləndirilib: 2001-ci ildə Tver vilayətinin Qanunverici Məclisi onu Fəxri Fərmanla təltif etməyi qərara alıb. S.Abdullayev həm də xüsusi təltiflərə – 2001-ci ildə "Tver vilayətinin inkişafında xidmətlərinə görə" Tver vilayəti qubernatorunun döş nişanına və 2004-cü ildə "Tver vilayətinin inkişafına böyük töhfəyə, yüksək peşəkarlıq göstəricilərinə görə" Tver vilayəti qubernatorunun Fəxri Fərmanına layiq görülüb.

S.Abdullayevin çoxillik səmərəli işi və tikinti sahəsinin inkişafına böyük şəxsi töhfəsi RF Dövlət Tikinti və Mənzil-Kommunal Kompleksi Komitəsinin və RF Dövlət İnşaat, Arxitektura və Mənzil Siyasəti Komitəsinin fəxri fərmanları ilə qeyd edilib.

Rusiya İnşaatçılar İttifaqı tərəfindən RF Regional İnkişaf Nazirliyi və Tikinti və inşaat materialları sənayesi işçilərinin Həmkarlar İttifaqı ilə birgə hər il keçirilən "Ən yaxşı tikinti təşkilatı" Ümumrusiya müsabiqəsinin yekunlarına görə S.Abdullayevə dəfələrlə "Rusiya inşaat kompleksi təşkilatının ən yaxşı rəhbəri" xüsusi sertifikatı təqdim edilib.

S.Abdullayev tanınmış istehsalat rəhbəri olmaqla bərabər, həm də görkəmli alim, iqtisad elmləri doktoru, Tver Dövlət Texniki Universitetinin (TDTU) Fəxri Professoru, Verxnevoljsk Mühəndislik Akademiyasının həqiqi üzvü, strateji uçot və iqtisadi informasiya əsasında inşaat kompleksinin idarə edilməsi sahəsində bir sıra məqalələrin müəllifidir.

S.Abdullayevin adı Rusiyada və xaricdə tərtib olunan "Luçşiye lyudi Rossii", "Who is who v Rossii" kimi nüfuzlu ensiklopedik nəşrlərə daxil edilib.

Fəal həyat mövqeyi ilə fərqlənən S.Abdullayev Sov.İKP Belski Rayon Komitəsinin üzvü, rayon sovetinin deputatı, Tver vilayət Xalq Deputatları Sovetinin deputatı seçilib.

2006-cı ildə S.Abdullayev Azərbaycanın "Tərəqqi" medalı ilə təltif olunub.



## Abışev
## Azad Ziyad oğlu

*Kimya elmləri doktoru, professor.*
*Sankt-Peterburq Dövlət Kimya-Əczaçılıq Akademiyasının əczaçılıq kimyası kafedrasının elmi işçisi*

Abışev Azad Ziyad oğlu 1935-ci il mayın 15-də Azərbaycan Respublikasının Puşkin (indiki Biləsuvar) rayonunun Qriboyedovka qəsəbəsində anadan olub.

A.Abışev 1956-cı ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) əczaçılıq fakültəsinə daxil olub, 1962-ci ildə həmin ali məktəbi fərqlənmə diplomu ilə bitirib. Bir müddət Sintetik Kauçuk Zavodunda və Azərbaycan EA Botanika İnstitutunda işləyəndən sonra, 1963-cü ildə Leninqrada gedib, orada SSRİ Elmlər Akademiyasının V.L.Komarov adına Botanika İnstitutunun bitki kimyası laboratoriyası nəzdində yaradılmış aspiranturaya daxil olur. Aspiranturada oxumaqla bərabər Leninqrad Dövlət Universitetinin (LDU) kimya fakültəsinə də daxil olur və 1965-ci ildə bu fakültəni bitirir.

A.Abışev 1967-ci ildə LDU-nun kimya fakültəsinin elmi şurasında kimya elmləri namizədi, 1978-ci ildə (LDU) və 1984-cü ildə (Üzvi-Kimya İnstitutu, Moskva) isə iki ixtisas: "bioloji üzvi-kimya" və "təbii və fizioloji aktiv maddələr kimyası və üzvi-kimya (incə üzvi sintez)" ixtisasları üzrə kimya elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. 1979-cu ildə ona böyük elmi işçi, 1991-ci ildə isə professor elmi adı verilib.

A.Abışev 1987-2000-ci illərdə Leninqrad Sanitariya-Gigiyena Tibb İnstitutunun (1994-cü ildən İ.İ.Meçnikov adına Sankt-Peterburq Dövlət Tibb Akademiyası) biokimya professoru olub, 2007-ci ildən Sankt-Peterburq Dövlət Kimya-Əczaçılıq Akademiyasının əczaçılıq kimyası kafedrasının professorudur.

1992-ci ildə o, Avropa Kimyəvi Terapiya Cəmiyyətinin üzvü, 1994-cü ildə isə dərman vasitələrinin kimyası və texnologiyası və heterosiklik birləşmələrin biokimyası sahəsində Nyu-York Elmlər Akademiyasının həqiqi üzvü seçilib.

A.Abışevin elmi-tədqiqat işləri immun modulyasiyaedici və antivirus təsirli yeni ürək-damar dərman preparatları yaradılmasına yönəlib. O, ilk dəfə olaraq Rusiya Federasiyasında və başqa ölkələrdə patentlənmiş kalsium ionlarının sintetik anti-

genləri (immun modulyatorları və onların konyuksiya edilmiş antigenləri) və antaqonistləri sahəsində yeni elmi istiqamət yaradıb.

Obtusifol, dekursinol, diumankal və onların analoqları kimi birləşmələr ilk dəfə A.Abışevin rəhbərliyi altında təbii heterosiklik birləşmələrin və onların sintetik analoqlarının kimyəvi-farmakoloji tədqiqatları prosesində aşkar edilib. Bu birləşmələr kalsium ionlarının yeni antaqonistlərinin xüsusiyyətlərinə malikdir.

A.Abışevin elmi-tədqiqat işlərinin nəticələri onun çoxsaylı əsərlərində işıqlandırılıb. O, öz şagirdlərinin iştirakı ilə yazılmış 260-dan çox elmi məqalənin və məruzə tezislərinin, o cümlədən 7 monoqrafiyanın müəllifidir, SSRİ dövründə 17 müəlliflik şəhadətnaməsi, Rusiyanın 10 patentini, İtaliyanın 3 patentini alıb.

A.Abışevin fundamental tədqiqatlarının əsas nəticələri aşağıdakı əsərlərdə ümumiləşdirilib: "Kalsium ionlarının ürəyin işemik xəstəliyinin müalicəsi üçün yüksək təsirli diumankal antaqonisti" (Sankt-Peterburq, 1997), "Ankardin (diumankal) – kalsium ionlarının yeni nəslinin antaqonistidir" (Sankt-Peterburq, 2002, həmmüəllif), "Kalsium ionlarının yeni nəslinin antaqonistləri" (Bakı, 2003, həmmüəllif), "Təbii kumarinlərin kimyası və farmakologiyası" (Bakı, 2003, həmmüəllif) və s.

A.Abışevin hərtərəfli elmi-pedaqoji fəaliyyəti yüksək qiymətləndirilib. O, "1941-1945-ci illərin Böyük Vətən müharibəsində sovet xalqının Qələbəsinin əlli illiyi" medalı (1995), "Sankt-Peterburqun 300 illiyi" xatirə medalı (2003), Rusiya Müstəqil Həmkarlar İttifaqları Federasiyasının "Rusiya həmkarlar ittifaqlarının 100 illiyi" medalı (2005) ilə təltif edilib.

RF Prezidentinin fərmanı ilə professor A.Abışevə "Rusiya Federasiyasının Əməkdar Elm Xadimi" fəxri adı verilib (2007).



## Ağakişiyev İsmayıl Əlövsət oğlu

*Tarix elmləri namizədi. M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin dosenti. Rusiya Dövlət Humanitar Universiteti yanında Qafqazşünaslıq Mərkəzinin rəhbəri*

Ağakişiyev İsmayıl Əlövsət oğlu 1961-ci il oktyabrın 29-da Bakıda anadan olub.

1988-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin tarix fakültəsini fərqlənmə diplomu ilə bitirib. 1988-1991-ci illərdə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin humanitar fakültələri nəzdində Vətən tarixi kafedrasında əyani aspiranturada oxuyub. 1991-ci ildə "Hümmət" sosial-demokrat partiyasının yaradılması və fəaliyyəti (1904-1911-ci illər)" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

2005-ci ildən İ.Ağakişiyev postsovet məkanının öyrənilməsi üzrə informasiya-analitik mərkəzin əməkdaşıdır. "Rusiya–Azərbaycan" adlı xüsusi layihənin rəhbəridir. 2006-cı ildən M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin tarix fakültəsinin yaxın xarici ölkələrin tarixi kafedrasında dərs deyir.

İ.Ağakişiyev "Bakı neft sənayesinin tarixi və İkinci neft bumu (XIX əsrin ikinci yarısı – XXI əsrin başlanğıcı)" monoqrafiyasının (2011) müəllifidir. Onun qələminin məhsulları arasında, həmçinin, 50-dən çox elmi iş, o cümlədən "1904-1911-ci illərdə Zaqafqaziyada "Hümmət" ("Birlik") sosial-demokrat partiyasının yaradılması və fəaliyyəti" (1993), "Azərbaycan demokratları və İranda 1905-1911-ci illər inqilabı" (1996), "İkinci Dövlət Duması və azərbaycanlı deputatların fəaliyyəti" (1998), "Birinci Rus İnqilabı illərində azərbaycanlılarla ermənilər arasında çar gizli polisi tərəfindən təşkil edilmiş birinci milli münaqişə və bu münaqişədən çıxış yolları" (1999), "Dünya dinlərinin tarixi" (2005) əsərləri (hamısı rus dilində) var. O, "Azərbaycan tarixi. Ən qədim dövrlərdən 1991-ci ilə qədər" (1991), "Xəzər regionu ölkələrinin neft sənayesinin tarixi (1993-2005-ci illər)" (2011), "Qafqazda geosiyasi proseslər" (2012) tədris kurslarının müəllifidir.

İ.Ağakişiyev "Kavkazskiy Vestnik" layihəsinin təşkilatçılardan biri və baş direktorudur. 2014-cü ildən fəaliyyət göstərən bu analitik informasiya agentliyi Azərbaycanda baş verən proseslər haqqında obyektiv və mötəbər məlumatın çatdırılması üzrə fəal iş aparır.

İ.Ağakişiyev 2014-cü ildən həm də "Şimal-Cənub" politoloji mərkəzin icraçı direktorunun müavini, bu mərkəzin media-layihələrinin rəhbəridir.

İ.Ağakişiyev M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin tarix fakültəsinin dosentidir. O, həm Rusiyada, həm də digər ölkələrdə təşkil edilən çoxsaylı elmi konfransların və "dəyirmi masa"ların daimi iştirakçısıdır. Tələbələr üçün azərbaycanşünaslıq kursu aparmaqla, Azərbaycan üzrə mütəxəssislər hazırlayır.

İ.Ağakişiyevin elmi maraqlarının əhatə dairəsi: Azərbaycan tarixi, dinşünaslıq, Azərbaycanın ictimai hərəkatları, Azərbaycanın müasir siyasi tarixi, Xəzər problemi.



## Ağalarov
## Araz İsgəndər oğlu

*İqtisad elmləri namizədi.*
*"Crocus Group"un prezidenti və sahibi*

Ağalarov Araz İsgəndər oğlu 1955-ci il noyabrın 8-də Bakıda anadan olub.

1977-ci ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunu (indiki Azərbaycan Texniki Universiteti) "elektron hesablama maşınları mühəndisliyi" ixtisası üzrə bitirib.

1983-1987-ci ildə Ümumittifaq Həmkarlar İttifaqları Mərkəzi Şurasının (ÜİHİMŞ) N.M.Şvernik adına Ali Həmkarlar İttifaqı Hərəkatı Məktəbinin (indiki Əmək və Sosial Münasibətlər Akademiyası) müdavimi, 1988-1990-cı illərdə ÜİHİMŞ Elmi Mərkəzinin kiçik elmi işçisi olub.

1998-ci ildə A.Ağalarov "Rabitə müəssisəsi nümunəsində əməkhaqqı fondunun formalaşması və istifadəsi" mövzusunda dissertasiya müdafiə edərək iqtisad elmləri namizədi alimlik dərəcəsi alıb. Beynəlxalq İnformasiyalaşdırma Akademiyasının akademikidir.

1990-cı ildə Rusiyada ilk kompyuter sərgisi keçirib. 1989-cu ildə A.Ağalarov "Krokus İnternəşnl" Amerika-sovet müəssisəsinin (sonralar "Crocus Group" şirkətlər qrupu) əsasını qoyub. Onun təşəbbüsü ilə "Crocus Group" Moskva metrosunun "Myakinino" stansiyasının tikintisinin investoru (2009) və Russkiy adasında (Primorsk diyarı) Uzaq Şərq Federal Universitetinin tikintisinin baş podratçısı olub. A.Ağalarov 1992-ci ildən "Krokus" Qapalı Səhmdar Cəmiyyətinə və "Krokus Siti"nin Krasnoqorsk filialına rəhbərlik edib, həmçinin "Kroteks" şirkətinin Direktorlar Şurasının sədri olub.

1998-ci ildə A.Ağalarov "Sənin evin" adlı Ticarət Mərkəzi açıb. Bu Mərkəzin tərkibinə qastronom, mebel kompleksi, ev üçün mallar satılan hipermarket və oranjereya daxil idi. Onun 2002-ci ildə açdığı "Krokus Siti Moll" həmin ilin ən yaxşı riteyl-layihəsi olub. 2007-ci ildə A.Ağalarov "Krokus Ekspo"nun üç növbəsini, 2009-cu ildə "Vegas" Ticarət-Əyləncə Mərkəzinin tikintisini başa çatdırıb.

A.Ağalarov – "Krokus-bank" Kommersiya Bankının idarə heyətinin sədri, "Kroteks" Qapalı Səhmdar Cəmiyyətinin Direktorlar Şurasının sədri, Moskva beynəlxalq

biznes-assosiasiyasının vitse-prezidenti, "Opora Rossii" ("Rusiyanın dayağı") Ümumrusiya kiçik və orta sahibkarlıq ictimai təşkilatının vitse-prezidenti, "Biznes i vıstavki" jurnalının baş redaktoru, "İslahatlar dövründə Rusiyaya mənim baxışım", "Rusiya: bazara gedən yolda düşüncələr" və "Daha bir cəhd?.. Rusiya iqtisadiyyatı haqqında 1996-1999-cu illərdə dərc edilmiş məqalələr" kitablarının müəllifidir.

A.Ağalarov "M.Maqomayevin mədəni-musiqi irsi Fondu"nu təsis edib. Bundan başqa, "Crocus Group" Moskva vilayətinin ərazisində keçirilən müxtəlif sosial layihələrin reallaşdırılmasına yardım göstərir.

A.Ağalarov Azərbaycanın "Tərəqqi" medalı (2006), Rusiyanın "Şərəf" ordeni (2013), II dərəcəli Müqəddəs knyaz Daniil Moskovski ordeni (2005) və "İtaliya Respublikası qarşısında xidmətlərə görə" ordeni (OMRI) (2009) ilə təltif olunub, "The MICAM Awards" və "Donald Trump Diamond Excellence Award" mükafatlarına layiq görülüb.

A.Ağalarov 2010-cu ildə "Kommersant" qəzetinin tərtib etdiyi ali rəhbərlər reytinqində "Ticarət" nominasiyasında birinci yeri, Rusiyanın kommersiya təyinatlı daşınmaz əmlak sahiblərinin reytinqində "Forbes" jurnalının versiyasına görə (2010) birinci yeri tutub, həmçinin 2011-ci ildə "Commercial Real Estate Awards" mükafatının "İlin developeri" nominasiyasının qalibidir.



## Ağayev
## Ədnan Tofiq oğlu

*KAMS hüquq firmasının Moskva ofisinin direktoru. Moskva Dövlət Beynəlxalq Münasibətlər Universitetinin professoru*

Ağayev Ədnan Tofiq oğlu 1956-cı il oktyabrın 25-də Bakıda anadan olub.

1979-cu ildə Moskva Dövlət Beynəlxalq Münasibətlər İnstitutunu (MDBMİ) bitirib. 1985-ci ildə SSRİ Xarici İşlər Nazirliyinin Diplomatik Akademiyasında tarix üzrə namizədlik dissertasiyası müdafiə edib.

Ə.Ağayev diplomatik karyerasına 1979-cu ildə SSRİ Xarici İşlər Nazirliyində attaşe ranqında başlayıb. 1980-ci ildə BMT-nin Cenevrədəki qərargahında siyasi məsələlər üzrə böyük əməkdaş vəzifəsinə təyin olunub, sonra işini İsveçrədə, BMT-nin Tərksilah Problemləri üzrə Tədqiqatlar İnstitutunda davam etdirib. 1986-cı ildə Ə.Ağayev Moskvaya, SSRİ Xarici İşlər Nazirliyinə qayıdıb. 1986-1989-cu illərdə Beynəlxalq Təşkilatlar Departamentində tərksilah problemləri şöbəsinin rəisi, 1990-1991-ci illərdə çoxtərəfli tərksilah və beynəlxalq təhlükəsizlik departamentinin direktoru olub.

1991-ci ildə Ə.Ağayev RF xarici işlər nazirinin xüsusi müşaviri vəzifəsini tutur və eyni zamanda Rusiya Xarici Siyasət Fondunun sədri olmaqla, Xarici siyasətin planlaşdırılması Departamentinə başçılıq edir, 1993-cü ildə isə bu vəzifələrə daha biri əlavə edilir – Ə.Ağayev BMT-nin Baş katibi yanında Tərksilah Şurasının üzvü olur.

1994-1999-cu illərdə Ə.Ağayev Rusiya Federasiyasının Kolumbiya Respublikasında Fövqəladə və Səlahiyyətli səfiri olub.

1999-2013-cü illərdə Ə.Ağayev "Yeqorov, Puqinski, Afanasyev i Partnyorı" hüquq firmasının (sonradan – vəkil bürosu) Moskva bölməsinin tərəfdaşı olub. Burada o, beynəlxalq konsaltinq idarəsinə başçılıq edir, Rusiyanın ən iri korporasiyalarının xarici layihələrini idarə edir, həmçinin Rusiyada və MDB ölkələrində işləyən xarici firmalara məsləhətlər verirdi.

2013-cü ildən Ə.Ağayev "KAMS" hüquq firmasının Moskva ofisinin direktorudur. Beynəlxalq layihələrin müşayiəti və firmanın müştərilərinin maraqlarına lobbiçilik fəaliyyəti ilə məşğul olur.

Ə.Ağayev Moskva Dövlət Beynəlxalq Münasibətlər Universitetinin (MDBMİ) professorudur, Parisdəki Panteon-Assas ("Paris 2") Universitetində mühazirələr oxuyur. O həmçinin, Corctaun Universitetində (Vaşinqton, ABŞ), Cenevrə Beynəlxalq Münasibətlər İnstitutunda, Fransa Beynəlxalq Münasibətlər İnstitutunda, Ekol Militer Hərbi Akademiyasında (Paris), Mayami Universitetində (ABŞ) mühazirələrlə çıxış edib.

Beynəlxalq təhlükəsizlik və tərksilah məsələləri üzrə bir sıra işləri nəşr olunub. 2000-ci ildən Rusiya-Amerika işgüzar əməkdaşlıq şurasının vitse-prezidentidir.

Ə.Ağayev Rusiya-Amerika biznes-dialoqunun təşəbbüskarlarından biridir. Bununla əlaqədar, Rusiya işgüzar dairələri üçün Rusiya-Amerika iqtisadi münasibətlərinin siyasi iqliminin yaxşılaşmasına dair tövsiyələr hazırlanmasında fəal iştirak edir.



## Axundov
## Emil Əhməd oğlu

*Texnika elmləri namizədi.*
*"Daşımalarda yeni texnologiyalar"*
*Elm-İstehsalat Şirkətinin texniki direktoru*

Axundov Emil Əhməd oğlu 1950-ci il aprelin 28-də Bakıda anadan olub.

1967-ci ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunun (indiki Azərbaycan Texniki Universiteti) mexanika fakültəsinə daxil olub və 1972-ci ildə oranı bitirib. SSRİ Elektrotexnika Sənayesi Nazirliyinin Ümumittifaq Elmi-Tədqiqat Elektromaşınqayırma Texnologiyaları İnstitutunun Bakı şöbəsinə (ÜETETİElektromaş BŞ) təyinat alıb.

1974-cü ildə E.Axundov Kiyevdə Ukrayna Elmlər Akademiyası İfrat Bərk Materiallar İnstitutunun aspiranturasının əyani şöbəsinə müsabiqə yolu ilə qəbul edilib. Sintetik almazlardan hazırlanmış metalkəsən alətlərin və SSRİ-də ilk dəfə onun tərəfindən sintezləşdirilmiş kub bor nitridin yeni növlərinin işlənib hazırlanması ilə məşğul olub, əldə etdiyi nəticələrə görə SSRİ müəlliflik şəhadətnaməsi alıb. İfrat bərk materiallardan hazırlanan alətlərin ölkənin xalq təsərrüfatında tətbiqi proseslərini araşdırıb. 1978-ci ildə Kiyevdə namizədlik dissertasiyasını uğurla müdafiə edib.

E.Axundov 1978-1982-ci illərdə Bakıda ÜETETİElektromaş BŞ-də və Elektrotexnika Sənayesi Nazirliyinin digər müəssisələrində laboratoriya müdiri vəzifəsində işləyib. Bu dövrdə fəal elmi iş aparıb, Ümumittifaq konfranslarında məruzələrlə iştirak edib, ixtiraçılıq fəaliyyəti üzrə seminarlar keçirib, 25-dən çox elmi məqalə dərc etdirib.

1982-ci ildə E.Axundov Moskvada "Vladimir İliç Zavodu" Moskva Elektromexanika Birliyinin Xüsusi Konstruktor Bürosunun (MPO ZVİ) baş layihə konstruktoru vəzifəsinə təyin olunub, 1991-ci ilədək burada çalışıb. Birlikdə işlədiyi dövrdə MPO ZVİ-nin Elmi-texniki mərkəzinin baş texnoloqu, baş konstruktorun müavini, rəis müavini vəzifələrində işləyib.

E.Axundovun rəhbərliyi ilə MPO ZVİ-nin yenidən qurulması layihəsi hazırlanıb ki, buna əsasən ekoloji normalara uyğun olmayan zərərli istehsal, çuquntökmə, elektrik qaynaq və qalvanik sexləri Moskvadan kənara çıxarılıb. Yeni kütləvi tələbat məmulatları - Fransanın "Tomson" şirkətinin məişət elektrik pilətələri və xüsusi istehsal

olan paltaryuyan maşınlar mənimsənilib. Bu məmulatların buraxılışı Fransa, İtaliya, Almaniya və Yuqoslaviya şirkətlərinin ekologiyanın tələblərinə tam uyğun olan avtomatik xətləri üzrə qurulub. Moskvanın yeni binaları indiyədək ZVİ məişət elektrik qızdırıcıları ilə komplektləşdirilir.

"Yenidənqurma"nın sənayeyə ayaq açması ilə istehsalın iqtisadi istiqamətləri kəskin dəyişilib. Ali məktəbdə tədris edilən hərtərəfli biliklər yada düşüb. 1991-1994-cü illərdə E.Axundov İ.Lixaçyev adına Moskva Avtomobil Zavodunun bazasında təşkil olunmuş "ZiL & Ştal" Rusiya-Almaniya birgə müəssisəsinin istehsal üzrə direktoru işləyib. Burada Minsk Soyuducular Zavodu və MDB-nin digər müəssisələri üçün anbar avtomatlaşdırılmış kompleksləri hazırlanırdı. Daha sonra Avstraliyanın "Goldvar International pty Ltd." şirkətinin nümayəndəliyində fəaliyyət göstərib.

E.Axundov 1995-ci ildən indiyədək "Daşınmalarda yeni texnologiyalar" Elm-istehsalat şirkətinin texniki direktoru işləyir.

1998-ci ildə E.Axundov unikal işə - 14 ton yükgötürmə qabiliyyətinə zəmanət verilən, çoxdəfəli tətbiq olunan yumşaq ağır yük daşıyan konteynerin işlənilməsinə görə Rusiya Federasiyasının patentini alıb. Konteynerin konstruksiyasına görə sonralar Rusiyanın daha iki patentini əldə edib. Bu konteynerin dünyada analoqu yoxdur. O, Almaniya və Ukraynada patentləşdirilib, digər ölkələrdə isə patentlər baxılma mərhələsindədir.

Ağır yük daşıyan yumşaq konteynerlər şirkətdə təkbaşına istehsal olunur. Bu konteynerlər vasitəsilə beynəlxalq marşrutlar üzrə dəniz və çay gəmilərində, dəmir yolu və avtomobil nəqliyyatı ilə "Russkiy alyuminiy", "Norilskiy nikel" və başqa dağ-metallurgiya şirkətləri üçün 1 milyon tondan çox tökülmə yük daşınıb.

Ağır yük daşıyan yumşaq konteynerlər "Lloyd's Register" tərəfindən sertifikatlaşdırılıb və yüklərin geniş diapazonda - həm ərzaq məhsullarının, həm də təhlükəli yüklərin daşınmasına icazə verilib. Konteynerlərin istifadəsinin temperatur diapazonu +60 dərəcədən –50 dərəcəyədək dəyişir.

E.Axundov beynəlxalq təşkilatlarda yumşaq ağır yük daşıyan konteynerin irəliləməsi üzrə böyük məqsədyönlü iş aparır. Bu konteynerin beynəlxalq multimodal nəqliyyat sxemlərində kommersiya dövriyyəsinə daxil edilməsi ətraf mühitin çirklənməsinin aradan qaldırılmasına imkan verəcək, böyük həcmdə tökülmə yüklərin daşınmasını ucuzlaşdıracaq, insan ekologiyasının tələblərinə uyğun olaraq nəqliyyatçıların işini sabitləşdirəcək.

Belə ki, Rostexrequlirovaniyanın 246 "Konteyner" Texniki Komitəsinin üzvü olan E.Axundov ISO beynəlxalq standartlarının tələblərinə uyğun konteynerlərin yeni Dövlət standartlarının hazırlanmasına təşəbbüs göstərir və bu işdə iştirak edir.

O, təhlükəli yüklər və konteynerlər üzrə Beynəlxalq Assosiasiyanın üzvüdür. Bu qurumun illik konfranslarında quru, hava və su vasitəsilə nəqliyyatın bütün növlərində təhlükəli yüklərin daşınmasının beynəlxalq qaydalarının harmonizasiyası üzrə təkliflər verilir və müzakirə olunur.

E.Axundov ağır yük daşıyan konteynerin istismar xarakteristikalarının tədqiqatlarını aparır, konteynerlərin modifikasiyasının resurslarını müəyyənləşdirir, onların istehsalında yeni müasir materialların seçimini həyata keçirir, araşdırmaların nəticələrinin beynəlxalq mətbuatda, o cümlədən "Dangerous goods & containers" jurnalında dərc olunmasında iştirak edir.

E.Axundov Rusiya nümayəndə heyətinin tərkibinə daxil edilib və 2009-cu ildə Cenevrədə BMT-nin Avropa İqtisadi Komissiyasının ekspertlərinin təhlükəli yüklərin daşınması üzrə Alt Komitəsinin 35-ci sessiyasında məruzə ilə çıxış edib.



## Axundov
## Fuad Namiq oğlu
*"Akkuyu" AES-in baş direktoru*

Axundov Fuad Namiq oğlu 1966-cı il mayın 12-də Bakıda anadan olub.

1991-ci ildə M.Əzizbəyov adına Azərbaycan Neft və Kimya İnstitutunu (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) mühəndis-iqtisadçı ixtisası üzrə fərqlənmə diplomu ilə bitirib, 1993-cü ildə isə Texas Universitetinin nəzdindəki biznes məktəbini korporativ və beynəlxalq maliyyə ixtisası üzrə (Ostin, Texas ştatı, ABŞ) başa vurub. Beynəlxalq Valyuta Fondu (BVF) yanında Birləşmiş Vyana İnstitutunun və Yaponiya Beynəlxalq Maliyyə Mərkəzinin diplomlarının da sahibidir.

F.Axundov karyerasını 1986-cı ildə SSRİ Müdafiə Nazirliyində başlayıb, orada müxtəlif vəzifələrdə, o cümlədən Xüsusi Tikinti Baş İdarəsi yanında Normativ-Tədqiqat Stansiyasının rəisi işləyib.

1991-ci ildən F.Axundov İqtisadiyyat və Planlaşdırma üzrə Dövlət Komitəsində və Azərbaycan Prezidenti Administrasiyasında müxtəlif vəzifələrdə çalışıb. 1993-cü ildən bank sistemində fəaliyyət göstərib. Azərbaycan Milli Bankı idarə heyəti sədrinin müavini olub, BVF və Dünya Bankı ilə danışıqlar üzrə qrupa rəhbərlik edib. Azərbaycanın valyuta tənzimlənməsi sahəsində qanunvericiliyinin yaradıcılarından biri olub. 1995-ci ildən 2001-ci ilədək Azərbaycan Beynəlxalq Bankı idarə heyətinin sədri vəzifəsində çalışıb.

2001-2003-cü illərdə "NİKoyl" İnvestisiya Bank Qrupunun baş icraçı direktoru, birinci vitse-prezidenti, 2003-2006-cı illərdə "Bank Uralsib" ASC-nin prezidenti, idarə heyətinin sədri olub.

2006-cı ildə F.Axundov "Birləşmiş kapital" İnvestisiya Qrupunu yaradıb və ona rəhbərlik edib, "Silkroutefinancial" Fondunun Müşahidə Şurasının (London) üzvü vəzifəsində çalışıb. 2012-ci ildən isə "Uralsib Esset Menecment" İcraçı Şirkətinin Direktorlar Şurasının sədri və "ZNAK" ASC-nin baş direktoru olub. 2012-ci ildə "URALSİB" Maliyyə Korporasiyası Direktorlar Şurasının üzvü seçilib.

F.Axundov 2014-cü il aprelin 1-dən "Akkuyu" AES-in baş direktorudur. Şirkət Türkiyənin Mersin vilayətində "Akkuyu" atom elektrik stansiyasının tikinti layi-

həsini həyata keçirir. "Akkuyu" AES-in tikinti layihəsi hər biri 1,2 GBt gücə malik VVER-1200 Rusiya dizaynlı dörd enerji bloku olan stansiyanın tikintisini nəzərdə tutur. Əsas kimi "Rosatom" atom enerjisi üzrə dövlət korporasiyasının "AES-2006" Rusiya layihəsi götürülüb.

"Akkuyu Nuklear" Səhmdar Cəmiyyəti BOO (build-own-operate, "tik-sahib ol-idarə et") sxemi üzrə dünyada ilk layihəni həyata keçirir. Layihənin dəyəri 20 milyard ABŞ dollarıdır.



## Axundov
## İlham Sənan oğlu

*Professor, Uoterlu Universitetinin riyaziyyat fakültəsinin mühasibat uçotu, biznes və riyaziyyat üzrə proqram direktoru*

Axundov İlham Sənan oğlu 1959-cu il iyunun 1-də Azərbaycan Respublikasının Lənkəran rayonunda anadan olub.

1981-ci ildə Leninqrad Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsini, sonra isə həmin universitetin aspiranturasını bitirib. 1987-ci ildə professor V.Nevzorovun rəhbərliyi altında "Qaydalı təsadüfi kəmiyyətlər və onların məbləğləri üçün son teoremlər" mövzusunda namizədlik dissertasiyasını uğurla müdafiə edib.

1988-ci ildən 1997-ci ilədək İ.Axundov Azərbaycan Dövlət İqtisad Universitetində müəllim, baş müəllim, dosent, 1997-1999-cu illərdə isə Odlar Yurdu Universitetində (Bakı) xarici əlaqələr üzrə prorektor işləyib.

İ.Axundov 1999-cu ildə ABŞ Dövlət Departamenti tərəfindən dünya alimləri arasında keçirilən çox nüfuzlu Fulbrayt müsabiqəsinin qalibi olub. O, 1999-2000-ci illərdə Texas Universitetində (Texas A&M University) tədqiqat aparmaq imkanı qazanıb. Bu tədqiqat işlərinin nəticələri elmi jurnallarda dərc edildikdən sonra İ.Axundov xarici universitetlərdən bir neçə dəvət alıb. O, 2000-2001-ci illərdə Fatih Universitetində (Türkiyə), 2001-ci ildən isə Kanadanın Makmaster (Hamilton) Universitetində çalışıb.

2007-ci ildə professor İ.Axundov karyerasını Uoterlu Universitetinin (Kanada) riyaziyyat fakültəsində davam etdirib. 2009-2013-cü illərdə bu universitetin riyaziyyat fakültəsinin Dubaydakı filialının direktoru vəzifəsində çalışıb. Hazırda o, Uoterlu Universitetinin riyaziyyat fakültəsinin riyaziyyat, biznes və mühasibat uçotu üzrə proqram direktorudur.

İ.Axundov fəal alimdir. O, universitetin bir çox komitələrinin - universitet dekanlarının məşvərət komitəsinin, statistika və aktuar elm proqramları üzrə komitənin, bakalavrların işi üzrə komitənin işində iştirak edir.

İ.Axundov, həmçinin dörd istiqamət üzrə (siyasi, iqtisadi, sosial və təhsil) fəaliyyət göstərən "Kanada-Azərbaycan" Əməkdaşlıq Assosiasiyasının prezidentidir.

2012-ci ildə İ.Axundov Kanada Azərbaycan Araşdırmaları İnstitutunu yaradıb ki, bu qurumun məqsədi Azərbaycanın elmi institutları ilə əməkdaşlığın qurulması, Azərbaycan üzrə araşdırmaların aparılması, materialların nəşri, uğurların təbliği, ölkəmizin tarixi, coğrafiyası, ədəbiyyatı, iqtisadiyyatı, diasporu və mədəni irsi üzrə məlumatlandırılma, elmi ictimaiyyət, hökumət nümayəndələri və KİV-lər üçün konfrans, seminar və mühazirələrin təşkil edilməsidir. 2012-ci ildə onun köməyi ilə Toronto Universitetinin Avropa, Rusiya və Avrasiya Tədqiqatları Mərkəzi (CERES) bu universitetin tələbələri üçün Azərbaycan tədqiqatları üzrə kredit kursu keçirib.

Professor İ.Axundov ehtimal nəzəriyyəsi və riyazi statistika sahəsində ekspertdir. O, ehtimal nəzəriyyəsinin asimptotik metodlarına, sıra statistikası nəzəriyyəsinə ekstremal əhəmiyyətli əlavələrlə çox böyük töhfə verib.

İ.Axundov üç dərslik və 30-dan çox elmi məqalənin müəllifidir.



## Allahverdi Novruz Muxtar oğlu

*Kompyuter mühəndisliyi üzrə fəlsəfə doktoru, professor. Səlcuq Universiteti texnologiya fakültəsinin kompyuter mühəndisliyi kafedrasının müdiri*

Allahverdi Novruz Muxtar oğlu 1948-ci il mayın 9-da Azərbaycan Respublikasının Ağdam rayonunun Qaradağlı kəndində anadan olub.

1966-cı ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutuna (indiki Azərbaycan Texniki Universiteti) "hesablama texnikası" ixtisasına qəbul edilib. Təhsilini başa vurduqdan sonra 1972-ci ildə institutun hesablama texnikası kafedrasında baş laborant, assistent işləyib. 1976-1978-ci illərdə Moskva Energetika İnstitutunda məqsədli aspiranturada əyani təhsil alıb.

"Hesablama texnikası" ixtisası üzrə doktorluq dissertasiyasının müdafiəsindən sonra N.Allahverdi 1979-cu ildə doğma institutun hesablama texnikası kafedrasında assistent, baş müəllim, sonra isə dosent vəzifələrində işləyib.

O, 1992-ci ildə Səlcuq Universitetindən rəsmi dəvət alıb, ailəsi ilə birgə daimi yaşamaq üçün Konya (Türkiyə) şəhərinə köçüb. 2000-ci ildə ona professor elmi adı verilib. 2006-cı ildən Səlcuq Universiteti Senatında fakültə təmsilçisidir.

N.Allahverdi Səlcuq Universitetinin texnologiya fakültəsində kompyuter təhsili üzrə müəllim-mütəxəssislər hazırlayan kompyuter təhsili kafedrasını, sonra isə kompyuter mühəndisliyi kafedrasını yaradıb və onlara rəhbərlik edib.

N.Allahverdi kompyuter elmləri üzrə magistr və fəlsəfə doktoru dərəcələrini almaq üçün 30-dan çox magistr və 6 doktorluq dissertasiyası işinin elmi rəhbəri olub. Səlcuq Universitetində işlədiyi illərdə regionlararası və beynəlxalq miqyaslı bir çox elmi və texniki layihələrdə iştirak edib və onlara rəhbərlik edib. O, prosessorların və çoxprosessorlu paralel hesablama sistemlərinin layihələndirilməsi, distant təhsil problemləri, habelə süni intellekt problemləri ilə məşğul olub. Son illər onu tibdə və avtomatlaşdırmada qeyri-səlis məntiqin, süni neytron şəbəkələrinin və digər süni intellekt metodlarının tətbiqi problemləri maraqlandırıb.

N.Allahverdi müxtəlif beynəlxalq elmi jurnallarda və elmi konfrans toplularında dərc edilmiş 200-dək məqalənin, habelə 3-ü Türkiyədə nəşr olunmuş 9 kitabın müəllifi və həmmüəllifidir.

2004-2009-cu illərdə "Selcuk Journal of Applied Mathematics" jurnalının baş redaktoru işləyib. Hazırda bir neçə beynəlxalq elmi jurnalın redaksiya heyətinin üzvüdür. O, Səlcuq Universitetində beynəlxalq elmi konfransların təşkilatçısıdır, beynəlxalq elmi simpozium və konfransların proqram komitəsinə daxildir.



## Allahverdiyev
## Adil Məhəmmədəli oğlu

*Tibb elmləri doktoru, professor.*
*"Yıldız" Texniki Universitetinin Biomühəndislik bölməsinin professoru*

Allahverdiyev Adil Məhəmmədəli oğlu 1951-ci il martın 1-də Azərbaycan Respublikası Naxçıvan MR-in Culfa rayonunda müəllim ailəsində anadan olub.

1968-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutuna (indiki Azərbaycan Tibb Universiteti) qəbul edilib. 1974-cü ildə institutu əla qiymətlərlə başa vurması və aktiv ictimai fəaliyyətinə görə S.M.Kirov adına Azərbaycan Elmi-Tədqiqat Tibbi Parazitologiya və Tropik Təbabət İnstitutuna həkim-baş laborant vəzifəsinə təyin edilib.

1975-1977-ci illərdə A.Allahverdiyev elə həmin institutda klinik ordinaturanı davam etdirib. Ordinaturanı bitirdikdən sonra hemoqlabin-enzimopatiya laboratoriyasında kiçik elmi işçi işləyib.

1978-1981-ci illərdə A.Allahverdiyev elmi-tədqiqat fəaliyyətini Moskvada, Tibb Elmləri Akademiyası nəzdində Y.İ.Marsinovski adına Tibbi Parazitologiya və Tropik Təbabət İnstitutunun məqsədli aspiranturasında davam etdirib, 1981-ci ildə aspiranturanı bitirib, tibb elmləri namizədi elmi dərəcəsini alıb.

Həmin illərdə də onun tərəfindən ilk dəfə tətbiq edilmiş "qlükoza-6-fosfatdehidrogenaz (G-6PD) ferment çatışmazlığından əziyyət çəkən, dərman preparatlarına həssaslığı olan insanlarda "in vitro" hemolizinin müəyyən edilməsi" metodu elmdə ciddi problemlərin həll olunmasına kömək edib. Tədqiqatlarda natrium formiatın antioksidant xüsusiyyəti də aşkara çıxarılıb. Bu, primaxinin yaratdığı G-6PD ferment çatışmazlığı olan adamlarda eritrositlərin hemolizinin qarşısını alır.

1981-1983-cü illərdə A.Allahverdiyev S.M.Kirov adına Azərbaycan Elmi-Tədqiqat Tibbi Parazitologiya və Tropik Təbabət İnstitutunda böyük elmi işçi vəzifəsində çalışıb, Azərbaycanda malyariyanın qarşısının alınması üçün öz yeni metodunu tətbiq edib. 1983-1989-cu illərdə yenidən Moskvaya qayıdan A.Allahverdiyev elmi tədqiqatını həmin institutda davam etdirib və 1989-cu ildə doktorluq dissertasiyası müdafiə edib, tibb elmləri doktoru elmi dərəcəsini alıb.

Bu illərdə SSRİ-də ilk dəfə aparılan elmi işlərin böyük hissəsini dərman preparatlarının və vaksinin hazırlanmasında mühüm rol oynayan eritrositar silsilənin "P.falci-

parum in vitro"dan faziləsiz kulturasının alınması təşkil edirdi. Akademik B.A.Astafyev bu elmi tədqiqatların nəticələrini yekunlaşdıraraq kitabında yazır: "SSRİ-də bu sahənin inkişafı doktor A.Allahverdiyevin adı ilə bağlıdır. O, ilk dəfə "P.falciparum" uzun xalis kulturasını əldə edərək ölkəmizdə bu sahənin inkişafına böyük töhfə verib. Əldə edilən nəticələr SSRİ və bəzi sosialist ölkələrində malyariya sahəsində, xüsusən vaksinin yaradılmasında fundamental tədqiqatların öyrənilməsi üçün əsas oldu".

A.Allahverdiyevin tədqiqatında ilk dəfə olaraq malyariya parazitlərinin eritrositar mərhələsinin daxilində "rest state" dinclik vəziyyəti aşkar edilib. Bunun epidemiologiya və kimyəvi terapiyada mühüm əhəmiyyəti var.

1990-cı ildə A.Allahverdiyev Azərbaycan Mikrobiologiya, Epidemiologiya və Peşə Xəstəlikləri İnstitutunda (indiki V.Axundov adına Milli Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu) "Hüceyrə kulturaları və krioprezervasiyalar" laboratoriyasının müdiri kimi öz işini davam etdirib. 1992-ci ildə beynəlxalq konqresdəki (İran, Tehran) çıxışından sonra A.Allahverdiyev Türkiyənin ən məşhur universitetlərindən biri olan Çukurova Universitetinin (Adana) tibb fakültəsinə dəvət edilib. Dəvətin əsas məqsədi Türkiyədə "P.falciparum" fasiləsiz kulturalarının və onun əsasında malyariya sahəsində yeni elmi nailiyyətlərin tətbiqi olub.

Sonralar 1992-2006-cı illərdə A.Allahverdiyev tibbi biologiya kafedrasında işləyib, 1995-2000-ci illərdə tibb fakültəsinin mikrobiologiya və immunologiya kafedrasında, 2000-2006-cı illərdə Tropik Xəstəliklərin Tədqiqi İnstitutunda və Tətbiq Mərkəzində işləyib. Burada A.Allahverdiyev müxtəlif hüceyrə kulturaları və kriobank laboratoriyasını yaradıb və ona rəhbərlik edib.

Çukurova Universiteti dövründə A.Allahverdiyev dünyada ilk dəfə leyşmaniozun dəri formasının və insan üçün təhlükəli olan visseral formasının diaqnostikasında yeni mikrokultura metodunu işləyib. Dünyanın müxtəlif konqreslərində (Avropa Dermatoloqları və Veneroloqları Konfransı, İspaniya, 2004, İtaliya, 2004; Türkiyə Mikrobioloqlarının Konfransı, İzmir, Quşadası, 2004; Beynəlxalq Transmissiv Xəstəliklər Simpoziumu, İstanbul, 2005; Leyşmanioz üzrə III Dünya Konqresi, İtaliya, 2005) təqdim edilən kəşf bu sahədə işləyən alimlərin diqqətini cəlb edib. Hazırda mikrokultura metodu dünyanın müxtəlif ölkələrində (ABŞ, Çin, İspaniya, İsveç, Yunanıstan, İndoneziya, Azərbaycan və s.) uğurla tətbiq edilir. Bu metodla bağlı tədqiqatlar yeni sahələrdə yayılmaqda və genişlənməkdə davam edir. Bu metoddan donor qanında və asimptomatik formalı leyşmanioz xəstələrdə leyşmaniozun diaqnostikasında, habelə gövdə hüceyrələrinin kultivasiyasında istifadə olunur. Bundan

başqa, A.Allahverdiyev "in vitro" və "in vivo" müxtəlif kultura modellərindən istifadə edərək yeni dərman preparatları və vaksin sahəsində mühüm nəticələr də əldə edib. Onun tədqiqatında ilk dəfə "in vitro və in vivo" (Çukurova Universitetində əldə edilmiş) modeli sistemində natrium formiatın antihemolitik təsiri, bitki mənşəli maddələrin antivirus, antileyşmanioz və antikanserogen təsiri göstərilib (Allahverdiyev və başqaları, 2000, 2002, 2004).

2006-cı ildə A.Allahverdiyev Türkiyənin qədim və məşhur universitetlərindən biri olan "Yıldız" (İstanbul) Texniki Universitetinin Biomühəndislik bölməsinə dəvət alıb və orada həmkarı və həyat yoldaşı, tibb elmləri namizədi Məlahət Bağırova ilə birgə "Hüceyrə kulturaları və toxuma mühəndisliyi" laboratoriyasını yaradıb. İstanbulda A.Allahverdiyevin rəhbərliyi altında dünyada ilk dəfə leyşmanioz əleyhinə polimerlərə əsaslanan yeni vaksin hazırlanıb.

A.Allahverdiyev hazırda böyük elmi-tədqiqat qrupuna rəhbərlik edir. Elmdə uğurlarının bazası onun öz sahəsində sadəcə mütəxəssis kimi formalaşmasında deyil, həm də xüsusi yolla getməsində, çalışdığı sahələri elmin sürətlə inkişaf edən və ən müasir sahələrlə birləşdirməsindədir. O, tədqiqatlarında regenerativ təbabətə, bionanotexnologiyaya, biomühəndisliyə və kriobiologiyaya böyük yer ayıraraq multidisiplinar tədqiqatlar aparır.

Hazırda A.Allahverdiyevin elmi-tədqiqat işlərinin böyük hissəsi aşağıdakı mövzuları əhatə edir: gövdə hüceyrələri (stem cells), gövdə hüceyrələri və infeksiyalar (mikroorqanizmlər), regenerativ təbabətdə gövdə hüceyrələrinin tətbiqi, hüceyrələrin kriobiologiyası, infeksiya xəstəlikləri və şişlərə qarşı nanodaşıyıcılar sistemi üzrə yeni nəsil vaksin və dərman preparatlarının hazırlanması, infeksiya xəstəliklərində diaqnostik metodların və diaqnostik kitlərin hazırlanması. Son vaxtlar A.Allahverdiyevin rəhbərliyi altında sifət iflicinin, qaraciyər, oynaq-qığırdaq xəstəliklərinin, süd vəzi xərçənginin müalicəsində müxtəlif gövdə hüceyrələrindən sinir, hepatosit, xondrosit, adiposit hüceyrələri əldə edilir. Hüceyrə mühəndisliyi əsasında bu hüceyrələr müxtəlif canlıların üzərində sınaqdan keçirilir. Eyni zamanda, leyşmaniozun aşkar edilməsi üçün hibridoma texnologiyası əsasında diaqnostik baza hazırlanır və həmin xəstəliyə qarşı nanodaşıyıcı sistemə əsaslanan yeni nəsil vaksinin elmi layihələri həyata keçirilir.

A.Allahverdiyevin bütün tədqiqatlarının maliyyə əsasını böyük müsabiqə əsasında qəbul edilmiş beynəlxalq səviyyəli elmi layihələr təşkil edir. Bu layihələr Türkiyənin Elm, Sənaye və Texnologiyalar Nazirliyi, Türkiyə Elmi-Texnoloji Tədqiqatlar Şurası (TÜBİTAK) tərəfindən dəstəklənir.

A.Allahverdiyev müxtəlif beynəlxalq jurnallarda dərc edilən 180-dən çox elmi məqalənin, bir neçə ixtiranın, səmərələşdirici təkliflərin; Amerika və Avropada nəşr edilən kitabların, 9 kitabın bölmələrinin müəllifidir. Onun rəhbərliyi altında 9 fəlsəfə doktoru işi (Ph.D), 10-dan çox magistr dissertasiya işi yerinə yetirilib.

Beynəlxalq indeksli jurnallarda dərc etdirdiyi çoxsaylı məqalələrinə görə A.Allahverdiyev professorlar arasında "Yıldız" Texniki Universiteti rektoratının mükafatına (2013), habelə müxtəlif illərdə rektorat və dekanlıq tərəfindən bir çox mükafat və təşəkkürnamələrə layiq görülüb.

İnsanın burun boşluğu şöbəsindən alınmış gövdə hüceyrələrinə həsr edilən və onların dünyada ilk dəfə zədələnmiş fassiya sinirinin bərpasında tətbiqinə görə A.Allahverdiyevə Otolarinqologiya və Kəllə-Sümük Cəmiyyətinin mükafatı verilib (2013). O, "Elm aləmində fəal iştirakına görə" Boğaziçi Universiteti Elmi Klubunun mükafatı laureatıdır (2012). Vaksin hazırlamasına görə A.Allahverdiyev XVI Türkiyə Milli Parazitologiya Konqresinin birinci mükafatına layiq görülüb. "Gövdə hüceyrələri və infeksiya" işinə görə Avrasiya Beynəlxalq İnfeksiya Xəstəlikləri Konqresində (EACID, 2009) ona ikinci mükafat verilib.

Leyşmaniozun diaqnostikasında yeni mikrokultura metodunu işləyib hazırlamasına görə 2006-cı ildə Beynəlxalq Rotari Cəmiyyətinin (Adana bölməsi) İdarəetmə Şurasının qərarı ilə A.Allahverdiyev "Professional xidmətə görə" mükafatına layiq görülüb. Ona digər mükafatlar da verilib. Bunların sırasında "Ən yaxşı patentçi" (1977) müsabiqəsində birinci yer, səmərəliləşdirici təklifinə görə Marsinovski adına Tibbi Parazitologiya və Tropik Təbabət İnstitutunun (1977), elmi tədqiqatlara görə Azərbaycan Elmi-Tədqiqat Tibbi Parazitologiya və Tropik Təbabət İnstitutunun mükafatlarını (Bakı, 1977) qeyd etmək olar.

1998-ci ildə Türkiyə Elmi-Texnoloji Tədqiqatlar Şurası (TÜBİTAK) tərəfindən A.Allahverdiyevə "Uluslararası Bilimsel Yayın Desteği" mükafatı verilib.

Bu gün A.Allahverdiyev öz fəaliyyətini TÜBİTAK-da, müxtəlif nazirliklərdə, o cümlədən Türkiyə Sənaye və Ticarət Nazirliyində elmi layihələrin müzakirəsində ekspert, habelə Türkiyə Parazitologiya və Tropik Xəstəliklər Şurasının üzvü kimi davam etdirir.

Dünya Səhiyyə Təşkilatının (DST) malyariyaya qarşı mübarizə proqramında (Kopenhagen, 2000) iştirakı ilə yanaşı, A.Allahverdiyev dünyanın məşhur tədqiqat mərkəzləri və universitetləri ilə birgə tədqiqatlar aparır. Bu sıraya Stony Brook Universiteti (ABŞ), Universitet de Barcelona (İspaniya), U.S. Army MRMC, The

University of Health Sciences Chicago Medical School (ABŞ) daxildir. O, bu universitetlərə tez-tez gedir.

A.Allahverdiyev müxtəlif ölkələrin (Amerika, Türkiyə, Rusiya və s.) elmi cəmiyyətlərinin, o cümlədən Türkiyə Parazitoloqlar Cəmiyyətinin fəxri üzvüdür. Eyni zamanda, o, müxtəlif elmi jurnalların idarə heyətinin və şurasının, SCI-ya daxil olan, Amerika və Avropada nəşr edilən yüksək impakt-faktorlu 6 jurnal redaksiyasının üzvüdür, 11 jurnalda ekspert kimi xidmət göstərir.

A.Allahverdiyev müxtəlif vaxtlarda müsabiqə yolu ilə seçilən, TÜBİAK, Sənaye və Ticarət Nazirliyinin, Çukurova Universitetinin, "Yıldız" Texniki Universitetinin elmi-tədqiqat qrupları tərəfindən dəstəklənən təxminən 20 elmi layihəyə rəhbərlik edib.

Hazırda A.Allahverdiyev bu fəaliyyətini aktiv surətdə davam etdirir.



## Allahverdiyev Surxay Rəhim oğlu

*Biologiya elmləri doktoru, professor. M.A.Şoloxov adına Moskva Dövlət Humanitar Universitetinin biologiya və ekologiya kafedrasının professoru*

Allahverdiyev Surxay Rəhim oğlu 1941-ci il mayın 21-də İrəvanda anadan olub.

1958-ci ildə Bakı şəhərində 26 saylı orta məktəbi bitirib. 1959-cu ildə K.A.Timiryazev adına Moskva Kənd Təsərrüfatı Akademiyasının meyvə-tərəvəzçilik fakültəsinə daxil olub və 1964-cü ildə ali təhsilini bitirib.

1964-1965-ci illərdə Xabarovskda sovet ordusu sıralarında xidmət edib.

Bir il sonra SSRİ Elmlər Akademiyasının A.N.Bax adına Biokimya İnstitutunun aspirantı olub və 1972-ci ildə “bitkilərin biokimyası” ixtisası üzrə namizədlik dissertasiyasını müdafiə edib.

1969-cu ildə S.Allahverdiyev Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunun bitkilərin fiziologiyası şöbəsində kiçik elmi işçi kimi əmək fəaliyyətinə başlayıb. 1977-1988-ci illərdə S.Allahverdiyev Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunun bitkilərin fiziologiyası şöbəsinin baş elmi işçisi vəzifəsində çalışıb. 1988-ci ildə S.Allahverdiyev Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunun bitkilərin davamlılığı laboratoriyasının rəhbəri vəzifəsini icra edib, 1989-cu ildə isə Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunun bitkilərin fiziologiyası şöbəsinin və bitkilərin davamlılığı laboratoriyasının müdiri təyin olunub.

1992-ci ildə S.Allahverdiyev Sankt-Peterburqdakı N.İ.Vavilov adına Ümumittifaq Bitkiçilik İnstitutunda “bitkilərin fiziologiyası” ixtisası üzrə doktorluq dissertasiyası müdafiə edib. 1993-1994-cü illərdə Yakın Doğu Texniki Universitetində (Ankara, Türkiyə) dəvətli, 1995-2008-ci illərdə Zonquldak Karaelmas Universitetində (Bartın, Türkiyə) müqavilə əsasında professor vəzifəsində çalışıb.

1998-ci ildə S.Allahverdiyev BMT yanında Beynəlxalq İnformatizasiya Akademiyasının, 2003-cü ildə isə Rusiya Qeyri-ənənəvi və Nadir Bitkilər İctimai Akademiyasının akademiki seçilib.

2007-2012-ci illərdə S.Allahverdiyev Moskva Dövlət Vilayət Universitetinin kənd təsərrüfatının əsasları ilə botanika kafedrasının professor vəzifəsini tutub. 2011-

ci ilin sentyabrından bu günə qədər M.A.Şoloxov adına Moskva Dövlət Humanitar Universitetinin biologiya və ekologiya kafedrasının professorudur.

S.Allahverdiyev "Bitkilərin stresslərə davamlılığının fizioloji və biokimyəvi aspektləri və onların becərilməsində ekoloji cəhətdən təmiz texnologiyalar" elmi məktəbinin yaradıcısıdır.

2008-ci ildə Səudiyyə Kralı adına Universitet (Ər-Riyad, Səudiyyə Ərəbistanı) S.Allahverdiyevin Kral Feysəl mükafatına namizədliyini irəli sürüb. 2011-ci ildə Rusiya Təbiətşünaslıq Akademiyası ona "Elmi məktəbin banisi" fəxri adı verib. Rusiya Təbiətşünaslıq Akademiyasının 2012-ci il 23 may tarixli qərarı ilə S.Allahverdiyev akademik fəxri adına layiq görülüb. Elə həmin il o, ixtiralara verdiyi töhfələrə görə Alfred Nobel medalı ilə təltif edilib.

S.Allahverdiyev Azərbaycan Bitki Fizioloqları Cəmiyyətinin (1969), Rusiya Bitki Fizioloqları Cəmiyyətinin (1993), Türkiyə Biokimyaçılar Cəmiyyətinin (1997), Avropa Bitki Fizioloqları Cəmiyyətinin (1998) üzvüdür. O, "Teoretiçeskiye i prikladnıye problemı aqropromışlennoqo kompleksa", "Vestnik Moskovskoqo qosudarstvennoqo ovlastnoqo universiteta" və s. jurnallarının şura üzvüdür.

S.Allahverdiyev Rusiya, Ukrayna, Belarus, Qazaxıstan, Azərbaycan, Özbəkistan, Latviya, İran, Yunanıstan, Türkiyə, Pakistan, İsveç, Çexiya, ABŞ, Səudiyyə Ərəbistanı, İtaliya, Fransa və Bolqarıstanda keçirilən beynəlxalq konqres, simpozium və konfranslarda iştirak edib. O, Rusiya, Avropa və Türkiyə jurnallarında 187 elmi əsər dərc edib.

Alimin rəhbərliyi altında 8 namizədlik (onlardan 3-ü SSRİ-də, 5-i Türkiyədə) və 2 doktorluq (Ph.D) (Türkiyə) dissertasiyası müdafiə olunub.

S.Allahverdiyev tərəfindən bir sıra elmi-tədqiqat işləri yerinə yetirilib: hormonal aktivliyə malik bioloji aktiv polimer-polistimulinlərin testinə dair Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunun və D.İ.Mendeleyev adına Moskva Kimya-Texnologiya İnstitutunun təsərrüfat müqavilələli işləri (1984-1988); ətraf mühitin quraqlıq və duzluluğu şəraitində bitki davamlılığı mexanizmlərini müəyyən etməyə dair Bolqarıstan EA-nın Popov adına Bitki Fiziologiyası İnstitutu ilə birgə layihə (1989-1991); Türkiyə Elmlər Akademiyası və Zonquldak Karaelmas Universitetinin xətti ilə 10 layihə (1995-2006); şabalıd xərçənginin tədqiqinə dair Moskva Dövlət Vilayət Universiteti ilə birgə layihə (2005-2008); Türkiyə Hökuməti xətti ilə Türkmənistanda həyata keçirilən ağac növlərinin fotosintezinin müəyyən edilməsi üçün lazer texnologiyasının tətbiqinə və Türkiyənin şimal-qərb zonasındakı meşələrində karbon dioksid balansının müəyyən edilməsinə dair Türkiyə Elmlər Akademiyasının Tədqiqat Mərkəzi ilə birgə layihə (2010-2013); Saransk Dövlət Universitetinin bio-

logiya fakültəsi ilə "Bitki xammalının kompleks istifadəsinə və ekoloji cəhətdən təhlükəsiz materialların əldə edilməsi üçün onun tullantılarının emalına dair problem oriyentasiyalı tədqiqatların keçirilməsi" layihəsi (2011-2013).

S.Allahverdiyevin öz kəşflərinə patentləri və müəlliflik şəhadətnaməsi vardır: "Vodorastvorimıye ammoniynıye soli akrilovıx kislot i alkil efirı aril-aroksialkan-karbonovıx kislot v roli requlyatorov rosta i razvitiya rasteniy" (Moskva, 1992), "Water soluble polymeric systems of phytohormones with slow release: synthesis and application" Avropa patenti (1993); "Cryphonectria parasitica, şabalıd xərçəngi doğuran göbələyi müəyyən etmənin ekspress metodu"nun kəşfi patenti (Ankara, 2010); "Sposob identikfikatsii fitopatoqennoqo qriba Cryphonectria parasitica i di-aqnostika krifonektroza (endotievoqo raka) kastana metodom PTSP" kəşf patenti (Moskva, 2011).



## Allahverdiyev
## Süleyman İfxan oğlu

*Biologiya elmləri doktoru. Rusiya Elmlər Akademiyasının (REA) Bitkilərin Fiziologiyası İnstitutunun idarəolunan fotosintez laboratoriyasının müdiri. REA-nın Biologiyanın Fundamental Problemləri İnstitutunun baş elmi işçisi*

Allahverdiyev Süleyman İfxan oğlu 1950-ci il avqustun 1-də Ermənistan Respublikasının Krasnoselsk rayonunun Çaykənd kəndində anadan olub.

1973-cü ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indi Bakı Dövlət Universiteti) fizika fakültəsini bitirib. 1973-1977-ci illərdə Çaykənd orta məktəbində fizika müəllimi vəzifəsində işləyib. 1977-ci ildə SSRİ Elmlər Akademiyasının Fotosintez İnstitutunun (indiki REA-nın Biologiyanın Fundamental Problemləri İnstitutu) aspiranturasına daxil olub. 1984-cü ildə SSRİ EA-nın Biofizika İnstitutunda (Puşşino) biofizika üzrə namizədlik dissertasiyası müdafiə edib və fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsi alıb.

Namizədlik dissertasiyasının müdafiəsindən sonra S.Allahverdiyev SSRİ EA-nın Fotosintez İnstitutunda işləməyə başlayıb. 2002-ci ildə o, REA-nın Bitkilərin Fiziologiyası İnstitutunda "bitkilərin fiziologiyası və biokimyası" ixtisası üzrə biologiya elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya işini uğurla müdafiə edib.

S.Allahverdiyev fotosintez, fiziologiya, biofizika, biokimya və molekulyar biologiya sahələrində elm aləmində tanınmış mütəxəssisdir. Onun tədqiq etdiyi 2 fotosisteminin (FS-2) elektron-nəqliyyat zəncirində fəaliyyətin əsasını təşkil edən ilkin mexanizmlərin, fotosintez zamanı elektronların təklif olunan energetik və kinetik yerdəyişmə sxemi bütün dünyada fotosintez üzrə dərsliklərə daxil edilib. Sonradan S.Allahverdiyevin əldə etdiyi məlumatların məcmusu əsasında FS-2 bitki və sianobakteriyaların fəaliyyəti, eləcə də inaktivasiya mexanizmləri və stressli şəraitlərdə onun sonrakı reparasiyası haqqında yeni təsəvvürlər sistemi yaradılıb, bitkilərin fotosintez aparatının əlverişsiz ətraf mühit şəraitinə uyğunlaşdırmanın molekulyar mexanizmləri tədqiq edilib.

S.Allahverdiyev tərəfindən duz stressinə qarşı FS-2-nin dayanıqlılığında qatqısız canlı hüceyrələrin rolu müəyyən edilib, FS-2-nin ətraf mühitin stressli amillərinə müqavimətini yetərincə gücləndirən gen mühəndisliyi yolları aşkarlanıb.

Hazırda S.Allahverdiyev nanobiotexnologiyanın yeni istiqamətlərindən biri olan təbii zülal strukturu əsasında süni fotosintez sistemlərinin yaradılmasını fəal inkişaf etdirir. Bu, gələcəkdə alternativ enerji mənbəyi kimi molekulyar hidrogenin əldə edilməsinə imkan verəcək.

Öz elmi araşdırmalarının nəticələrini S.Allahverdiyev müntəzəm olaraq "Proceedings of National Academy of Science USA", "The EMBO Journal", "J Photochem. Photobiol", "Photosynthesis Research", "FEBS Letters" və s. Proceedings" kimi nüfuzlu jurnallarda dərc edir. Bundan başqa, S.Allahverdiyev bu və digər jurnallarda bir sıra icmal məqalələrin, habelə Rusiyada və xaricdə nəşr edilən elmi əsərlərdə bir neçə fəslin müəllifidir.

Bütün bunlar S.Allahverdiyevin elmi nailiyyətlərinin beynəlxalq miqyasda tanınmasına sübutdur. Alim dəfələrlə bir sıra beynəlxalq jurnalların xüsusi buraxılışlarına redaktor kimi dəvət olunub.

S.Allahverdiyev bitkilərin fiziologiyası və biokimyası, fotosintez və nanotexnologiyalara dair elmi əsərlər nəşr edən aparıcı beynəlxalq jurnalların, o cümlədən "Biochimica et Biophysica Acta (BBA-Bioenergetics)", "International Journal of Hydrogen Energy", "Journal of Photochemistry and Photobiology B: Biology", "European Journal of Chemistry", "The Open Structural Biology Journal", "Journal of Biomedical Science and Engineering", "Frontiers in Plant Physiology" və "Advances in Bioscience and Biotechnolog"un redaksiya heyətinin üzvüdür. O, həm də doktorluq dissertasiyalarının müdafiəsi üzrə iki ixtisaslaşmış şuranın üzvüdür. Onun rəhbərliyi altında 2 elmlər doktoru və 6 elmlər namizədi hazırlanıb.

S.Allahverdiyev 300-dən çox məqalənin və 6 ixtiranın müəllifidir. ISI indeksinin və Hirş indeksinin məlumatına görə, S.Allahverdiyevdən sitatgətirmə və elmi əsərlərinə istinad sayı müvafiq olaraq təxminən 3500 və 31-dir. O, 1000-dən çox sitat indeksi ilə (cəmi 1795 nəfər) "Milli alimlərin lider siyahısı"na (Rusiya) daxildir. S.İ.Allahverdiyev belə yüksək sitat reytinqi (3500-dən çox) olan yeganə azərbaycanlıdır.

S.Allahverdiyev 15-dən çox ölkədə (Avstraliya, Fransa, Hollandiya, Almaniya, Sinqapur, İsveç, Çexiya, Macarıstan, Türkiyə, Hindistan və s.) dəvətli professor kimi çalışıb. O, Rusiya və digər ölkələrdə keçirilən 80-dən çox konfransda çıxış edib, dünyanın 40-dan çox ölkəsində, o cümlədən Avstraliya, Macarıstan, Yaponiya, Almaniya, İspaniya, Kanada, Hollandiya, Sinqapur, Fransa, İsveç, Türkiyə və s. dövlətlərdə dəvətlə mühazirələr oxuyub.

S.Allahverdiyev Yaponiya, Kanada, Hindistan, Macarıstan, Almaniya, Sinqapur, ABŞ, İsveç və s. dövlətlərin elmi-tədqiqat təşkilatlarının beynəlxalq layihələrində rəhbər və iştirakçıdır. O, böyük uğurla keçən "Postgenom dövrdə fotosintez: biofizikadan molekulyar biologiyaya qədər" (Kanada, 2004), "Fotosistemlərin struktur və funksiyası" (Puşşino, 2006), "Davamlı inkişaf üçün fotosintez tədqiqatları" (Bakı, 2011) beynəlxalq simpozium və konfransların təşkilatçısı olub.

S.Allahverdiyev Rusiyanın ən tanınmış və ən istedadlı alimlərindən biridir, onun ən yüksək səviyyədə yerinə yetirdiyi elmi işləri isə dünya səviyyəsində Rusiya elminin nüfuzunu formalaşdırır.



## Allaverdiyev
## Ələddin Məmməd Hüseyn oğlu

*Fizika-riyaziyyat elmləri namizədi, professor.*
*Moskva Dövlət Elektron Texnika İnstitutunun tədris işi üzrə prorektor müavini,*
*Təhsil Prosesinin Keyfiyyəti Xidmətinin rəhbəri*

Allaverdiyev Ələddin Məmməd Hüseyn oğlu 1947-ci il mayın 29-da Ermənistan Respublikasının Basarkeçər rayonunun Kəsəmən kəndində anadan olub.

1965-ci ildə Bakı şəhər 190 nömrəli orta məktəbini medalla bitirib. Həmin ildə də S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) mexanika-riyaziyyat fakültəsinə qəbul edilib. Üçüncü kursdan sonra təhsilini M.V.Lomonosov adına MDU-nun mexanika-riyaziyyat fakültəsində davam etdirib. Ali məktəbi bitirəndən sonra dalğa və qaz dinamikası kafedrasının aspiranturasında saxlanılıb. MDU-nun qapalı elmi şurasında "Əlaqəli rəqslərdə pyezoelektrik konstruksiyaların elektrofiziki parametrlərinin tədqiqi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1974-cü ildə Ə.Allaverdiyev təyinatla SSRİ Elektron Sənayesi Nazirliyinin Ümumittifaq Elmi-Tədqiqat "FONON" İnstitutuna işə qəbil edilib. 1974-1994-cü illərdə bu institutda kiçik elmi işçi, baş elmi işçi və riyazi modelləşdirmə şöbəsinin müdiri vəzifələrində çalışıb.

1994-1995-ci illərdə Ə.Allaverdiyev "Green Star İnternational" Rusiya-Amerika birgə firmasında baş direktorun elm və istehsalat üzrə müavini olub.

1995-1996-cı illərdə Ə.Allaverdiyev Moskvada Zelenoqrad şəhər kiçik və orta biznes Assosiasiyasının direktoru vəzifəsini tutub. 1996-cı ilin sentyabr ayından Moskva Dövlət İşgüzar İdarəçilik Akademiyasında ali və tətbiqi riyaziyyat kafedrasının professoru və müdiri vəzifələrində işləyib. 1997-1999-cu illərdə eyni vaxtda iqtisadiyyat və menecment fakültəsinin dekanı olub. 2000-ci ildən birinci prorektor, tədris-metodika işi üzrə prorektor vəzifələrində çalışıb.

2010-cu ilin dekabrından Moskva Dövlət Elektron İnstitutunda (indi "Moskva Elektron Texnika İnstitutu" Milli Tədqiqat Universiteti) tədris işləri üzrə prorektor müavini, Təhsil Prosesinin Keyfiyyəti Xidmətinin rəhbəri işləyir. 2015-ci ildən "Moskva Elektron Texnika İnstitutu" Milli Tədqiqat Universitetinin təhsil metodikasının və texnologiyaların hazırlanması şöbəsinin rəisidir.

Ə.Allaverdiyev 150-dən çox məqalənin və 8 ixtiranın müəllifidir. Onun məqalə və ixtiralarında əksini tapan tədqiqatlarının elmi nəticələri və yeni texniki həlləri elm və texnikanın ayrı-ayrı sahələrində uğurla istifadə olunub: dünya okeanının və kosmik fəzanın tədqiqində (sualtı qayıqlarda və kosmik gəmilərdə, tədqiqat gəmilərində və süni peyklərdə), dəniz seysmokəşfiyyatında; elektronika (xüsusilə akusto və mikroelektronikada), müdafiə və tibb sənayesi (o cümlədən Ə.Allaverdiyevin həmmüəllifləri ilə birgə hazırladığı pyezokeramik ötürücü süni ürəyin yaradılmasında uğurla istifadə edilib) müəssisələrində tətbiq olunub.

70-80-ci illərdə pyezotexnika sahəsində alim və konstruktorların qarşısına verilmiş ayrı-ayrı elektrofiziki parametrlərlə və minimal kütləyə malik (söhbət bir neçə qramdan gedirdi – xüsusi mövzu) pyezoötürücü hazırlamaq vəzifəsi qoyulmuşdu. Mütəxəssislər uzun müddət bu problemi həll edə bilmirdilər. Ə.Allaverdiyev riyaziyyatda məşhur metoddan - Pontryaqin maksimumu prinsipindən istifadə edərək ilk dəfə nəzəri cəhətdən bu qəbildən olan məsələnin həllini tapıb. O, həmçinin öz tələbələri ilə birgə iki və üçölçülü elektro-elastik dinamika məsələlərinin həllində ümumiləşmiş variasiya prinsipi əsasında sərhəd və sonlu elementlər metodlarını uğurla tətbiq edən ilk alimlərdən biridir. Alimlər arasında pyezokeramik disk membranlarda “kənar effekti”nin mövcudluğunu nəzəri cəhətdən ilk dəfə o, sübut edib.

Ə.Allaverdiyev 30-dan çox beynəlxalq, ümumittifaq, Rusiya elmi konfrans, qurultay və simpoziumda pyezoelektrik mühitlərdə dalğaların yayılmasının, pyezokeramik konstruksiyaların əlaqəli rəqslər zamanı elektrofiziki parametrlərinin tədqiqinə həsr edilmiş 60-dan çox elmi məruzə, o cümlədən 10-dək plenar məruzə ilə çıxış edib.

Alimin rəhbərliyi altında 7 aspirant uğurla namizədlik dissertasiyası müdafiə edib. Ə.Allaverdiyev 24 dərslik və dərs vəsaitinin (“İqtisadi ixtisaslar üçün riyazi analiz”, “Ehtimal nəzəriyyəsi və riyazi statistika”, “Diferensial tənlik” və s.), ali peşəkar təhsil texnologiyalarının ayrı-ayrı problemlərinə həsr edilən çoxsaylı elmi məqalələrin müəllifidir.

Ə.Allaverdiyev bir neçə il RF Ali Təhsil Müəssisələrinin Tədris İşi üzrə Prorektorlar Şurasının üzvü, Moskva Şəhər Təhsil Departamenti Əlaqələndirmə Şurasının üzvü olub. 2001-ci ildə RF Ali Attestasiya Komissiyası tərəfindən Ə.Allaverdiyevə professor elmi adı verilib.

Ə.Allaverdiyevə elmi, istehsalat və pedaqoji fəaliyyətinə görə hökumət və sahə mükafatları verilib. O, “Ali peşəkar təhsilin fəxri işçisi” nişanı, “Moskvanın 800 illiyinə xatirə” medalı, Ümumrusiya Sərgi Mərkəzinin qızıl medalı, "M.V.Lomonosov adına MDU-nun 250 illiyi" xatirə medalı ilə təltif edilib.

Ə.Allaverdiyev tibb texnikasının inkişafına şəxsi töhfəsinə görə Ümumittifaq Elmi Tibbi-Texnika Cəmiyyətinin Mərkəzi İdarəsinin Rəyasət Heyətinin baxış müsabiqəsinin diplom mükafatı ilə təltif olunub. Alim Moskva hökumətinin təsis etdiyi (2001-2004) təhsildə elm və texnologiyalar sahəsində "Moskva qrantı" müsabiqəsinin dörd dəfə laureatı olub, müxtəlif təşkilatların pul mükafatlarına, çoxsaylı fəxri diplom və fəxri fərmanlara layiq görülüb.



## Arifcanov
## Rüstəm Mustafa oğlu

*"Al-RTV" ilk ictimai müsəlman kanalının baş redaktoru*

Arifcanov Rüstəm Mustafa oğlu 1958-ci il fevralın 22-də Özbəkistan Respublikasında anadan olub.

1980-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) tarix fakültəsini bitirib. 1985-ci ildən R.Arifcanov "Komsomolskaya Pravda" qəzetinin Qərbi Sibir üzrə xüsusi müxbiri, 1988-ci ildən "Sobesednik" həftəlik qəzetinin şöbə redaktoru, redaksiya heyətinin üzvü olub. 1990-cı ildən "Meqapolis" jurnalında şöbə redaktoru, daha sonra "Meqapolis-Metro" qəzetinin baş redaktoru vəzifələrində çalışıb.

1993-cü ildə R.Arifcanov "İzvestiya" qəzetinin şərhçisi olub. 1989-cu ildə "Surqutskaya alternativa" siyasi birliyinin fəaliyyətində iştirak edib. 1996-1997-ci illərdə o, "Kommersant. İzdatelskiy dom" QSC-nin "Stolitsa" publisistik jurnalının şef-redaktoru, redaksiya heyətinin üzvü vəzifələrini daşıyıb.

1998-ci il fevralın 18-dən sentyabr ayına qədər R.Arifcanov "İzvestiya" qəzetinin baş redaktorunun müavini işləyib.

1998-ci ildə "Soverşenno sekretno" Nəşriyyat Evinə məxsus olan həftəlik "Soverşenno sekretno. Versiya" qəzetinin şef-redaktoru təyin edilib. 1999-cu ilin oktyabrında "Soverşenno sekretno", "Versiya" qəzetlərini və "Litsa" jurnalını nəşr edən "Soverşenno sekretno informatsionno-izdatelskaya qruppa" QSC-nin baş redaktoru vəzifəsinə təyin edilib.

2002-ci ildə TVS telekanalında MDB ölkələrinin problemlərini işıqlandıran "Materik" proqramının aparıcısı olub. 2003-cü ildən "Agentura"da R.Arifcanovun köşə yazıları dərc edilir. 2004-cü ilin yazında, o, "Nasional" informasiya-nəşriyyat holdinqini yaradıb və "Nasional" jurnalının baş redaktoru olub.

2006-2007-ci illərdə R.Arifcanov "NTK Zvezda" ASC baş direktorunun birinci müavini və baş prodüser vəzifələrində çalışıb.

2012-ci ildən bu günədək "Al-RTV" ilk ictimai müsəlman kanalının baş redaktorudur.

R.Arifcanov Avrasiya Televiziya və Radio Akademiyasının vitse-prezidenti, Jurnalistlərin "Mediakratiya" Milli Assosiasiyasının Müşahidə Şurasının sədri, Şimali Qafqaz Federal Dairəsi İctimai Şurasının üzvüdür.

Rusiya və Azərbaycanda nəşr edilən 10 publisistik kitabın müəllifidir.



## Aslanov
## Ramiz Mütəllim oğlu

*Fizika-riyaziyyat elmləri namizədi, pedaqoji elmlər doktoru, professor. Moskva Dövlət Pedaqoji Universitetinin riyazi analiz kafedrasının professoru*

Aslanov Ramiz Mütəllim oğlu 1947-ci il martın 26-da Azərbaycan Respublikasının Daşkəsən rayonunun Muşavaq kəndində anadan olub.

H.Zərdabi adına Kirovabad Dövlət Pedaqoji İnstitutunu (indiki Gəncə Dövlət Universiteti) "riyaziyyat müəllimi" ixtisası üzrə bitirib.

1968-ci ildən 2000-ci ilədək Gəncə Dövlət Universitetində laborant, baş laborant, müəllim, aspirant, riyazi analiz kafedrasının müdiri, prorektor, doktorant (doktoranturanı 1995-1997-ci illərdə Moskva Dövlət Pedaqoji Universitetində (MDPU) bitirib) olub.

1997-ci ildə R.Aslanov MDPU-da doktorluq dissertasiyası müdafiə edib. 2000-ci ildən bu günədək MDPU-nun riyazi analiz kafedrasının professorudur.

R.Aslanov diferensial tənliklər, kompleks analiz, riyaziyyat tarixi və ali məktəblərdə riyaziyyatın tədrisi metodikası sahəsində mütəxəssisdir. Hazırda onun elmi tədqiqatlarının əsas istiqaməti diferensial tənliklərin və əlaqəli fənlərin öyrənilməsi prosesində gələcək riyaziyyat müəllimlərinin riyazi hazırlığının təkmilləşdirilməsidir. R.Aslanov tərəfindən pedaqoji ali məktəblərdə diferensial tənliklərin tədrisi metodikası sistemi işlənib hazırlanıb. Tədris praktikasında alimin yaratdığı diferensial tənliklərin metodiki təminat komponentləri (müxtəlif ali məktəblərdə istifadə edilən dərsliklər və dərs vəsaitləri, elektron dəstək, iş proqramları və nəzarət-ölçü materialları) mühüm əhəmiyyət kəsb edir.

R.Aslanov 160-dan çox elmi və elmi-metodiki işin, aparıcı jurnallarda riyaziyyatın tarixi və riyaziyyatın didaktikası haqqında məqalələrin, 6 monoqrafiyanın, ali məktəb tələbələri üçün 5 dərslik və 25 dərs vəsaitinin, o cümlədən tədris-metodiki birliyin qrifi ilə üçcildlik "Riyaziyyat" dərsliyinin, Rusiya Federasiyasının Təhsil və Elm Nazirliyinin qrifi ilə "Diferensial tənliklər və xüsusi törəməli tənliklər" dərsliyinin (2011) müəllifi və həmmüəllifidir. Bundan başqa, R.Aslanov Vyetnamda bu ölkənin dövlət dilində nəşr edilən "Misal və məsələlərdə diferensial tənlik" dərsliyinin həmmüəllifidir.

R.Aslanov doktorluq dissertasiyalarının müdafiəsi üzrə iki ixtisaslaşmış şuranın (Moskva Şəhər Pedaqoji Universitetində və Moskva Dövlət Pedaqoji Universitetində) üzvüdür, Moskva Dövlət Pedaqoji Universitetinin Dissertasiya Şurasında elmi katib vəzifəsini tutur. Dəfələrlə dissertasiya müdafiələrində ekspert və opponent kimi çıxış edib.

O, dəfələrlə Rusiya Federasiyasının müxtəlif universitetlərinə Dövlət Attestasiya Komissiyasının sədri kimi dəvət olunub (Moskva Şəhər Pedaqoji Universiteti, Şimal Federal Universiteti (Arxangelsk), İ.N.Ulyanov adına Ulyanovsk Dövlət Pedaqoji Universiteti.

2002-2012-ci illərdə R.Aslanov MDPU-nun riyazi analiz kafedrası müdirinin elmi iş üzrə müavini olub. Onun birbaşa rəhbərliyi ilə (məsul katib qismində) müxtəlif yubileylərə həsr olunan səkkiz elmi və elmi-metodiki məqalələr toplusu nəşr olunub. 2005-2012-ci illərdə R.Aslanov Moskva Dövlət Pedaqoji Universitetinin riyaziyyat fakültəsi dekanının tədris-metodiki işlər üzrə müavini olub. 2002-ci ildən bu günədək R.Aslanov Moskva Dövlət Pedaqoji Universitetinin pedaqoji kadrların hazırlanması sahəsində elmi-metodiki təhsil birliyinin riyaziyyat və informatika komissiyasının elmi katibidir.

R.Aslanov müxtəlif səviyyəli elmi və elmi-metodiki konfransların daimi iştirakçısıdır: Yaroslavlda "Kolmoqorov oxuları", Ümumrusiya universitetlərin və pedaqoji ali məktəblərin riyaziyyat müəllimlərinin seminarı və s.

R.Aslanov inzibati, elmi və elmi-metodiki fəaliyyəti tədris işləri ilə uğurla birləşdirir. O, riyazi analiz kafedrasının aparıcı mühazirəçisidir, müxtəlif riyazi fənlər üzrə (diferensial tənliklər, riyazi fizika tənlikləri, törəmə diferensial tənliklər, riyazi analiz, kompleks dəyişən funksiyalar nəzəriyyəsi) müəllif kursları keçir. R.Aslanov magistrantlar üçün seçmə fənlər üzrə mühazirələr oxuyur: sərhəd məsələləri, inteqral tənliklər, əməliyyat hesabı və onun əlavələri və s. Bununla yanaşı, riyaziyyat tarixi üzrə konfranslar, "Riyaziyyatçı qadınlar" adlı elmi-praktiki tələbə konfransları keçirir.

R.Aslanov 4 elmlər namizədi hazırlayıb.

Elmi və pedaqoji fəaliyyətində nailiyyətlərə görə R.Aslanov dəfələrlə müxtəlif mükafatlarla təltif olunub, təşəkkürnamələr alıb. 1998-ci ildə o, "Xüsusi törəmələrlə diferensial tənliklər" dərs vəsaitinə görə MDPU-nun ən yaxşı elmi-metodik iş müsabiqəsinin 2-ci dərəcəli laureatı adını alıb. 2007-ci ildə "Riyaziyyatçı qadınlar" monoqrafiyasına görə ona riyaziyyat və informatika sahəsində ən yaxşı elmi iş üçün MDPU-nun P.S.Novikov adına müsabiqəsinin I dərəcəli laureatı adı verilib. 2013-cü ildə R.Aslanov "Riyaziyyatçı qadınlar" 3 cildlik tarixi-riyazi oçerklərinə görə fizika-riyaziyyat elmləri sahəsində ən yaxşı elmi iş üçün müsabiqənin (III yer) laureatı olub.



## Aşurbəyli
## İqor Rauf oğlu

*Texnika elmləri doktoru.*
*"КБ-1" ASC-nin elmi rəhbəri, Direktorlar Şurasının sədri*

Aşurbəyli İqor Rauf oğlu 1963-cü il sentyabrın 9-da Bakıda anadan olub.

1980-ci ildə bir sıra fənlərin ingilis dilində tədris olunduğu 27 nömrəli xüsusi orta məktəbi qızıl medalla bitirib. 1985-ci ildə Azərbaycan Neft və Kimya İnstitutunun (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) istehsal proseslərinin avtomatlaşdırılması fakültəsinin avtomatlaşdırılmış idarəetmə sistemləri kafedrasında mühəndis-sistemotexnik ixtisası üzrə ali təhsil alıb.

1988-ci ildə əyani aspiranturada təhsil dövründə Bakıda xüsusi proqram təminatının hazırlanması, kompyuter biliyinin artırılması, kompyuter texnikasının satışı və konsaltinqi ilə məşğul olan "Sosium" Kooperativ Koordinasiya-İstehsalat Birliyini yaradıb və ona rəhbərlik edib.

1990-cı ildə İ.Aşurbəyli Moskvaya köçüb, SSRİ "Sentrsoyuz" İstehlak Kooperasiyası Müəssisələri İttifaqının nəzdində informasiya məlumat bazalarının işlənməsi, istehsalı və satışı ilə məşğul olan "Sosium" Ümumittifaq Elm-İstehsalat Birliyini yaradıb və ona rəhbərlik edib. 1991-ci ildə "Almaz" Elm-İstehsalat Birliyi (EİB) və bir sıra digər tanınmış dövlət və özəl qurumlarla birgə informasiya və telekommunikasiya məhsullarının geniş nomenklaturasının işlənməsi, istehsalı və satışı ilə məşğul olan "Beynəlxalq informasiya və telekommunikasiya bürosu" ASC-nin həmtəsisçisi və rəhbəri olub.

1992-ci ildə İ.Aşurbəyli "Texnoloji proseslərin desentralizasiya olunmuş avtomatik tənzimləmə sisteminin qurulması məsələləri" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 1994-cü ildə "Almaz" EİB-də daimi işə keçib, burada baş direktorun müavini, maliyyə direktoru, baş direktorun birinci müavini, Direktorlar Şurasının sədri vəzifələrində çalışıb.

2000-ci ildə baş konstruktor, Rusiya Elmlər Akademiyasının həqiqi üzvü, iki dəfə Sosialist Əməyi Qəhrəmanı B.Bunkinin yazılı tövsiyəsi əsasında, Rusiyanın müvafiq nazirlik və idarələrinin nümayəndələrindən ibarət Direktorlar Şurasının qərarı ilə İ.Aşurbəyli yekdilliklə akademik A.Raspletin adına "Almaz" EİB" ASC-nin (indiki

“Almaz-Antey” QSKB” ASC) baş direktoru təyin edilib və 2011-ci ilədək bu vəzifədə çalışıb. 2002-2003-cü illərdə onun bilavasitə iştirakı ilə yaradılmış “Almaz-Antey” PBO Konsern” ASC-nin baş direktorunun müavini işləyib. 2002-2011-ci illərdə “Almaz-Antey” PBO Konsern” ASC-nin İdarə Heyətinin üzvü olub. 2011-ci ildən bu günədək “KB-1” ASC-nin elmi rəhbəridir.

Onun elmi rəhbərliyi ilə “Favorit” zenit raket sisteminin ən yeni modifikasiyası yaradılıb, hazırlanması başa çatdırılıb, dövlət sınaqları aparılıb və müasir və perspektiv hava hücumu vasitələrinin - maneə yaradan təyyarələrin, radiolokasiya patrulu və tuşlaması təyyarələrinin, kəşfiyyatçı təyyarələrin, o cümlədən kəşfiyyat-zərbə komplekslərinin tərkibindəki aviasiya raket daşıyıcıları olan strateji təyyarələrin, taktiki, operativ-taktiki ballistik raketlərin, orta mənzilli ballistik raketlərin, habelə intensiv radiomüqavimət şəraitində digər hava hücumu vasitələrinin məhv edilməsi üçün nəzərdə tutulan “Triumf” zenit raket sistemi Rusiya Federasiyasının Silahlı Qüvvələrində istifadəyə verilib.

İ.Aşurbəyli 2004-cü ildə onun təşəbbüsü ilə yaradılmış “Hava-kosmik müdafiə problemləri üzrə müəssisədənkənar ekspert şurası” (ВЭС ВКО) qeyri-kommersiya tərəfdaşlığı Rəyasət Heyətinin sədridir. O, Rusiyanın Hava-Kosmik Müdafiə Vahid Sisteminin (ЕС ВКО) yaradılması Konsepsiyasını hazırlayıb.

2013-cü ildə İ.Aşurbəyli “Aerospace International Research Center, Gmbh”-ni (Vyana, Avstriya) təsis edib. Həmin vaxtdan “Room Space Journal” jurnalının baş redaktorudur. 2015-ci ildə ВЭС ВКО BMT-nin İqtisadi və Sosial Şurasının (ЭКОСОС) struktur eksperti statusunu alıb.

İ.Aşurbəyli texnika elmləri doktoru, A.Proxorov adına Mühəndis Elmləri Akademiyasının və Hərbi Elmlər Akademiyasının həqiqi üzvüdür. 100-dən çox elmi əsərin, o cümlədən bir ensiklopediya və iki monoqrafiyanın müəllifidir.

İ.Aşurbəyli Rus pravoslav kilsəsinin 2-ci və 3-cü dərəcəli “Moskva knyazı müqəddəs Daniil” (2000, 2002, 2008), “Şərəf” (2007) ordenləri, “Georgi Jukov” (1995), “1941-1945-ci illər Böyük Vətən müharibəsində Qələbənin 50 illiyi” (1995), “Rusiya Donanmasının 300 illiyi” (1996), “Moskvanın 850 illiyi” (1997) xatirə medalları ilə təltif olunub. Akademik V.Utkin adına qızıl medalın (2005), “SSRİ EA-nın akademiki A.A.Raspletin” gümüş medalının (2008) sahibidir. İki dəfə “İlin meneceri” Moskva müsabiqəsinin (2000, 2009), “Müəssisə Sahibi - Alim il” nominasiyasında “Rusiya Milli Olimpi” mükafatının (2003), “Rusiya iqtisadiyyatının lideri” milli mükafatının (2004), akademik A.Proxorov adına mükafatın (2008), “İlin adamı” milli mükafatının (2009) və s. laureatıdır.



## Atakişiyev
## Natiq Məmməd oğlu

*Fizika-riyaziyyat elmləri doktoru.*
*Meksika Milli Muxtar Universitetinin*
*Riyaziyyat İnstitutunun aparıcı elmi işçisi*

Atakişiyev Natiq Məmməd oğlu 1939-cu il fevralın 15-də Bakıda anadan olub.

1961-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika fakültəsini bitirdikdən sonra Azərbaycan Respublikası Elmlər Akademiyasının Fizika İnstitutuna kiçik elmi işçi vəzifəsinə qəbul edilib və 1994-cü ilə qədər orada işləyib. 1964-cü ildə N.Atakişiyev Azərbaycan Elmlər Akademiyası yanında aspiranturaya daxil olub və üç illiyə Moskva vilayətinin Dubna şəhərinin Birləşmiş Nüvə Fizikası İnstitutunun nəzəri fizika laboratoriyasına ezam olunub.

1971-ci ildə Yüksək Enerji Fizikası İnstitutunun Elmi Şurasında (Serpuxov) namizədlik dissertasiyası müdafiə edib. 1973-1974-cü illərdə N.Atakişiyev Amerika Birləşmiş Ştatlarında, Kolumbiya Universitetinin fizika kafedrasında təcrübə keçib.

1987-ci ildə Kiyevdə, Nəzəri Fizika İnstitutunun (indi görkəmli nəzəriyyəçi fizik və riyaziyyatçı Boqolyubovun adını daşıyır) Elmi Şurasında N.Atakişiyev fizika-riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. 1994-cü ilin yayından o, Meksika Milli Muxtar Universitetinin Kuernavaka şəhərindəki Riyaziyyat İnstitutunda çalışır.

N.Atakişiyev xüsusi funksiyalar və diferensial tənliklər nəzəriyyəsi sahəsində mütəxəssisdir. Nəzəriyyəçi fizik olan alim öz elmi fəaliyyətinin 30 ilində tədricən riyaziyyata doğru “yuvarlanaraq”, riyazi fizikanın funksiyaları və onların qrup-nəzəri interpretasiyası ilə daha çox maraqlanıb. Məhz bu istiqamətdə o, klassik xüsusi funksiyaların ümumiləşdirmələrini təbii yolla yaratmaq üçün fərq tənliklərinin mühümlüyünü dərindən dərk edib.

1985-ci ildə N.Atakişiyev və S.K.Suslov “Journal of Physical A: Mathematical and General” jurnalında dərc etdirdikləri məqalədə müəlliflər mahiyyətcə ortoqonal polinomların yeni ailəsini – Hahnın fasiləsiz polinomlarını (continuous Hahn polynomials) təqdim və ətraflı tədqiq ediblər. Bu nəticənin vacibliyi və heyrətamiz müasirliyini bu fakt təsdiq edir: XX əsrin 70-ci illərinin sonu - 80-ci illərinin əvvəllərində

aydın oldu ki, o vaxtadək yaxşı məlum olan və tədqiq edilən ortoqonal polinomlar ailəsinin sayı artıb və onları bir qədər "qaydaya salmaq" çox zəruridir. Bu problemi həll etmək üçün ABŞ-dan olan riyaziyyatçı Riçard Aski (hələ həyatda olan, özünü xüsusi funksiyaların öyrənilməsinə həsr edən alimlərdən ən məşhuru) ortoqonal polinomları sxemə uyğun təsnifatlandırmağı təklif edir. Bu sxemə görə ortoqonal polinomlar müxtəlif səviyyələri tutmalıdır. Səviyyələr isə bu ailələrə xas parametrlərlə müəyyən edilir (əlbəttə, bu zaman səviyyələrin hər birində onları müəyyən edən eyni sayda parametrlər ailəsi yerləşir).

N.Atakişiyev və S.K.Suslovun "Journal of Physical A: Mathematical and General" jurnalındakı məqaləsi Aski sxeminin ilk variantı nəşr ediləndən sonra dərc olunub. Buna görə də R.Aski dərhal həmin məqaləyə diqqət yetirib və 1985-ci ildə Britaniyada nəşr olunan həmin jurnala qısa bir məqalə göndərərək bu nəticənin əhəmiyyətini vurğulayıb. R.Aski xüsusi diqqəti ona yönəldib ki, sxemin ilkin variantında davamlı Hahn polinomları qeydə alınmamışdı, çünki hələ riyaziyyatçılara məlum deyildi və indi bu polinomların yeni ailəsi təbii şəkildə R.Aski sxemində yer alacaq və orada müvafiq boşluğu tutacaq. Fasiləsiz Hahn polinomlarının tanınması ilə bitən bütün hekayət holland riyaziyyatçı Tom Kornvinderin "Hypergeometric Orthogonal Polynomials and Their q-Analoques", R.Koekoek, P.A.Lesky and R.F.Swarttouw (Springer-Verlag, 2010) monoqrafiyasının girişində ətraflı qeyd olunub.

N.Atakişiyevin tədqiqatlarının bir başqa istiqaməti olduqca gözlənilməz transformasiya xassələri geniş məlum olan Furyenin klassik inteqral çevrilmələrinə münasibətdə xüsusi funksiyaların müxtəlif q-ümumiləşdirmələridir. Bu istiqamətdə ilk addımı o, "Teoretiçeskaya i matematiçeskaya fizika" jurnalında (Moskva, 1994-cü il) edib. Hazırda fizika-riyaziyyat elmləri doktoru olan Ş.Nağıyevlə (hazırda fizika-riyaziyyat elmləri doktoru) həmmüəlliflikdə yazılan məqalədə XIX əsrin sonunda ingilis riyaziyyatçı Rogersin kəşf etdiyi q-Ermit polinomlar ailəsi ətraflı tədqiq edilib. Məlum olub ki, q-Ermit polinomların bəlli ümumiləşdirilməsi olan polinomlar ailəsi Furyenin inteqral çevrilməsinə nəzərən sadə transformasiya xüsusiyyətinə malikdir.

1994-cü ildə q-Ermit polinomları nümunəsində Furye inteqral çevrilmələrinə münasibətdə xüsusi funksiyaları müxtəlif ümumiləşdirmələrin transformasiya xüsusiyyətlərinə bu yanaşma çox məhsuldar olub. Bu elmi işdən sonra sübut edilib ki, Furye inteqral çevrilmələrinə münasibətdə analoji sadə davranış R.Aski sxemindəki bütün çoxparametrli klassik ortoqonal polinomların q-ümumiləşdirmələrə xasdır.

1994-cü ildən sonra N.Atakişiyev Azərbaycan, Meksika, Braziliya, İspaniya, Türkiyə və ABŞ-dan olan həmkarları ilə birlikdə bu yanaşma ideyalarına əsaslanan və onları inkişaf etdirən 30-dan çox elmi məqalə dərc etdirib.

O, elmi jurnallarda 114 məqalənin, beynəlxalq konfransların nəşrlərində 54 məruzənin müəllifi və həmmüəllifidir. Bu əsərlərə 700 istinad var.

2011-ci il aprelin 19-da N.Atakişiyev "Hindawi Publishing Corporation" nəşr etdiyi "Abstract Analysis and Application" beynəlxalq riyazi jurnalın redaksiya heyətinin və 1996-cı ilin oktyabrından Meksika Elmlər Akademiyasının üzvüdür.

N.Atakişiyev Meksikada rəsmən 2008-ci il dekabrın 11-də qeydə alınan Latın Amerikası Azərbaycanlıları Assosiasiyasının prezidentidir. Öz təşəbbüsü ilə o, Meksikada və digər Latın Amerikası ölkələrində yaşayan azərbaycanlı ailələr haqqında məlumat toplayıb, yad mühitə uyğunlaşmaqda onlara yardım edib. N.Atakişiyev Meksika şəhərlərində Azərbaycan mədəniyyəti və milli mətbəxi günlərini təşkil edib və bu tədbirlərdə meksikalıları onların tanımadığı ölkə ilə tanış edib. Alimin səyləri nəticəsində meksikalılarla azərbaycanlılar arasında dostluq telləri güclənib.

2011-ci ildə N.Atakişiyev "Azərbaycan Respublikasının əməkdar elm xadimi" fəxri adına layiq görülüb.



## Babayev
## Elyaz Piri oğlu

*Texnika elmləri doktoru, professor.*
*"Arobella Medical, LLC" şirkətinin prezidenti və təsisçilərindən biri*

Babayev Elyaz Piri oğlu 1947-ci il yanvarın 26-da Ermənistan Respublikasının Qafan şəhərində anadan olub.

1964-cü ildə 1 nömrəli orta məktəbi qızıl medalla bitirib, Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutuna (indiki Azərbaycan Texniki Universiteti) daxil olub. 1969-cu ildə avadanlıqların istehsalı və texnologiyası fakültəsini bitirdikdən sonra onu ali məktəbdə işləmək üçün saxlayıblar. Həmin ali məktəbdə assistent, baş müəllim, dosent, daha sonra professor olub.

1972-ci ildə E.Babayev N.Bauman adına Moskva Ali Texniki Məktəbinin aspiranturasına daxil olub. 1975-ci ildə "İnsanın kəllə sümüklərinin ultrasəs qaynağı və kəsilməsi üçün texnologiyaların və alətlərin hazırlanması" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1976-cı ildə E.Babayev akademik G.Nikolayev, texnika elmləri doktoru, professor V.Loşşilov ilə birlikdə insan və heyvanların sümüklərində məxsusi gərginliyin yaranması hadisəsini kəşf edib. Bunun mahiyyəti ondan ibarət idi ki, ilk dəfə insan və heyvanların sümük toxumalarında skelet şöbəsindən və orqanizmin yaşından asılı olan, makrohəcmlərdə tarazlaşdırılan xüsusi gərginlik sahələrin olması müəyyənləşdirilib. Bu kəşf 181 №-si ilə qeydə alınıb və SSRİ Nazirlər Soveti yanında kəşf və ixtiralar üzrə SSRİ Dövlət Komitəsində xüsusi diploma layiq görülüb.

1991-ci ildə E.Babayev Riqada "Təbabətdə canlı bioloji toxumaların ultrasəs emalı üçün sistem və texnologiyaların hazırlanması" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

1994-cü ildə E.Babayev Amerikada işləməyə dəvət olunub. O, ailəsi ilə birlikdə Minnesota ştatının Minneapolis şəhərinə köçüb, xüsusi istedadlı əcnəbi alim statusu alıb.

E.Babayev tibb avadanlığı buraxan "Arobella Medical, LLC" şirkətinin prezidenti və təsisçilərindən biridir.

E.Babayev 50-dən çox Amerika, 100-dən artıq təsdiqlənmiş beynəlxalq patentin və 25-dən çox yeni texnologiyanın müəllifidir. Dünya praktikasında müalicəsi çətin

olan, sağalmaz, yoluxucu və adi yara və yanıqların müalicəsi üçün xəstəxanalarda əsasən 5 müxtəlif cihazdan istifadə edilir. E.Babayev bu müxtəlif cihazlardan ikisinin müəllifi-ixtiraçısı patentini alıb. Üçüncüsü isəartıq Amerikada (FDA) təsdiqlənib və xəstəxanalara çıxmasını gözləyir.

E.Babayev qazların ion səviyyəsində istənilən maye ilə qarışdırılması üçün cihaz üzərində işini başa çatdırıb. Güllənin, yad cisimlərin zərərçəkmişlərin (əsgər, polis, yanğınsöndürən və s.) bədənindən çıxarılması, qanaxmanın dayandırılması, ağrısızlaşdırma, sterilizasiya üzrə eksperimental cihazlar hazırdır. Xərçəngin müalicəsi və cərrahiyyə sahəsində çox maraqlı nəticələr əldə edib. Bundan başqa, E.Babayev ikiaxınlı səs cərrahiyyəsi üzrə prinsipcə yeni cihaz hazırlayıb.



## Bağırov
## Aqşin Böyükağa oğlu

*Tibb elmləri doktoru, professor.*
*1 nömrəli Moskva ortopediya və travmatologiya klinikasının rəhbəri*

Bağırov Aqşin Böyükağa oğlu 1953-cü il iyunun 6-da Bakı şəhərində doğulub.

1970-ci ildə Nəriman Nərimanov adına Azərbaycan Tibb İnstitutuna (indiki Azərbaycan Tibb Universiteti) qəbul olunub. 1976-1977-ci illərdə Zabaykalye dəmir yolunun Beloqorsk bölmə xəstəxanasında internatura keçib.

1978-1980-ci illərdə Sumqayıt şəhərində təcili tibbi yardım xəstəxanasında travmatoloq-həkim vəzifəsində çalışıb. 1980-ci ildə Azərbaycan Səhiyyə Nazirliyinin kollegiyasının qərarına əsasən Azərbaycan Elmi-Tədqiqat Travmatologiya və Ortopediya İnstitutuna təyinat alıb.

A.Bağırov 1982-ci ildə Moskva Mərkəzi Travmatologiya və Ortopediya İnstitutuna (MTOİ) göndərilib. 1985-ci ildə namizədlik dissertasiyasını müdafiə etdikdən sonra Bakıya, Elmi-Tədqiqat Travmatologiya və Ortopediya İnstitutuna qayıdıb.

1988-ci ildə Səhiyyə Nazirliyinin qərarına əsasən A.Bağırov MTOİ-yə doktoranturaya göndərilib. Orada apardığı elmi işlərin nəticəsinə görə "Aşağı ətrafların uzun sümüklərinin daxili və oynaqətrafı sınıqları, deformasiyaya uğrayan artrozun profilaktikası" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib.

A.Bağırov 1993-cü ildə Bakıya qayıdıb, 5 il ərzində şöbə rəhbərindən elmi işlər üzrə direktor müavini vəzifəsinə qədər yol keçdiyi Travmatologiya və Ortopediya İnstitutunda işləyib. O, 1994-cü ildə travmatologiya üzrə mütəxəssislər arasında seminar məşğələlər aparmaq üçün Londona dəvət olunub. 1998-ci ildə İsveçrədə ixtisasartırma kursu keçib.

1998-ci ildə Moskva şəhərinə qayıdan A.Bağırov Rusiya Federasiyası Prezidentinin İşlər İdarəsinin 1 nömrəli klinik xəstəxanasının travmatologiya-ortopediya bölməsinin müdiri vəzifəsinə təyin edilib. Lyublinoda 1 nömrəli Moskva Ortopediya və Travmatologiya Klinikasının tikilməsi barədə qərar qəbul olunanadək burada çalışıb. MTOİ klinik bazasının rəhbəri, Moskva Aviasiya İnstitutunun materiallar texnologiyaları kafedrasının professoru olub.

A.Bağırov 2010-cu ildən 1 nömrəli Moskva Ortopediya və Travmatologiya Klinikasının rəhbəridir. Klinika ayaq əyriliyinin düzəldilməsi, baldır və budun uzadılması yolu ilə boyun artırılması, pəncə deformasiyasının müalicəsi, uşaqların sümük inkişafında qüsurların aradan qaldırılması, ətraf sümüklərin ağır və mürəkkəb sınıqlarının və digər ortopedik xəstəliklərin müalicəsi ilə məşğuldur.

A.Bağırov 7 ixtiranın, 5 yeniliyin və 2 patentin müəllifidir, 36-dan çox elmi işi dərc olunub. Onun rəhbərliyi ilə 2 namizədlik dissertasiyası müdafiə edilib.

Beynəlxalq Aqrar Təhsil Akademiyasının həqiqi üzvü, bir çox beynəlxalq konfransın iştirakçısı olan Aqşin Böyükağa oğlu Bağırov Belçikadakı sərgidə tibb sahəsində uğurlarına görə "Avro-2002" qızıl medalı ilə təltif edilib.



## Bağırov
## Məmməd Adil oğlu

*Tibb elmləri doktoru.*
*Rusiya Tibb Elmləri Akademiyası*
*Mərkəzi Elmi-Tədqiqat Vərəm İnstitutunun*
*cərrahiyyə şöbəsinin rəhbəri*

Bağırov Məmməd Adil oğlu 1960-cı il dekabrın 12-də Ermənistan Respublikasının Masis rayonunda anadan olub.

1984-cü ildə Nəriman Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) bitirib. 1985-1987-ci illərdə 53 nömrəli Moskva şəhər xəstəxanasında cərrah işləyib. 1987-ci ildə Mərkəzi Elmi-Tədqiqat Vərəm İnstitutunda çalışıb.

1993-cü ildə namizədlik, 2003-cü ildə isə "Ağciyərin yayılmış və mürəkkəb fibroz-kavernoz vərəmi xəstələrinin kompleks cərrahi müalicəsi" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib.

M.Bağırov 1998-ci ildən Mərkəzi Elmi-Tədqiqat Vərəm İnstitutunun 2-ci cərrahiyyə bölməsinə rəhbərlik edib, 2011-ci ildə həmin institutun cərrahiyyə şöbəsinin müdiri təyin olunub.

O, Mərkəzi Elmi-Tədqiqat Vərəm İnstitutunun və Rusiya Federasiyasının aparıcı ftiziocərrahıdır. Eyni zamanda vərəm, həmçinin ağciyər və plevranın digər patologiyaları: bronxların transsternal tıxanması, pulmonektomiya, plevropulmonektomiya, əməliyyat olunmuş ağciyərin götürülməsindən əvvəl lobektomiya, bilobektomiya, kombinə edilmiş anatomik rezeksiyalar, seqmental anatomik rezeksiyalar, əməliyyat edilmiş ağciyərin təkrar rezeksiyaları, bronxial gövdə rerezeksiyaları, kollaps-cərrahiyyə əməliyyatları (silikon möhürlə ekstraplevral pnevmoliz, torakoplastiklər), plevra patologiyasında müxtəlif əməliyyatlar, sinədaxili limfa düyünlərinin patologiyalarında əməliyyatlar zamanı bütün növ operativ müdaxilələri yerinə yetirir.

O, ağciyər vərəmi, lazerin tətbiqi ilə operativ müdaxilə üzrə müxtəlif metodların müəllifidir. 100-dən çox elmi iş, 4 metodiki tövsiyə hazırlayıb, ağciyərdə texniki əməliyyatların işlənməsi və modifikasiyasına həsr olunan 5 patentin müəllifidir.

M.Bağırov uzun illər ərzində Rusiya Diplomdansonrakı Təhsil Tibb Akademiyasının torakal cərrahiyyə kafedrasında və Mərkəzi Elmi-Tədqiqat Vərəm İnstitutunun tədris mərkəzində həkimlərin diplomdansonrakı təhsili çərçivəsində mühazirələr oxuyur.

2011-ci ildə Rusiyada tibbin inkişafına verdiyi böyük töhfəyə görə RF Prezidentinin yazılı təşəkkürnaməsinə layiq görülüb.



## Bağırov
## Məmməd Mansur oğlu

*Tibb elmləri doktoru, professor.*
*Ukrayna Diplomdansonrakı Təhsil Milli Tibb Akademiyasının torakal cərrahiyyə və pulmonologiya kafedrasının professoru*

Bağırov Məhəmməd Mansur oğlu 1942-ci il noyabrın 3-də Azərbaycan Respublikasının Gədəbəy rayonunun Qaraməmmədli kəndində anadan olub.

1958-ci ildə Gədəbəy rayonunun Böyük Qaramurad kəndində orta məktəbi, 1964-cü ildə Nəriman Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) bitirib.

1964-1968-ci illərdə M.Bağırov Kirovabad (indiki Gəncə) şəhərində cərrah işləyib. 1968-1972-ci illərdə Kiyev Həkimləri Təkmilləşdirmə İnstitutunun aspirantı olub.

1972-ci ildə "Transplantatın ilkin hazırlığından sonra yoğun bağırsaqdan süni qida borusunun yaradılması" mövzusunda namizəd dissertasiyasını müdafiə edib. 1972-1975-ci illərdə 6 nömrəli Kiyev şəhər klinik xəstəxanasının torakal cərrahiyyə bölməsinin müdiri və ordinatoru işləyib. 1975-1977-ci illərdə şəhərin Torakal Cərrahiyyə Mərkəzinin ordinatoru olub.

M.Bağırov 1977-1986-cı illərdə Kiyev Həkimləri Təkmilləşdirmə İnstitutunun pulmonologiya kafedrasının assistenti, 1986-1990-cı illərdə dosenti olub, 1990-cı ildən isə həmin kafedranın professoru vəzifəsində çalışır. 1988-ci ildə "Traxeya xəstəliklərinin cərrahi müalicəsi" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib.

1977-ci ildən SSRİ respublikaları və Ukrayna vilayətləri üçün torakal cərrahların, pulmonoloqların və bronxoloqların hazırlanması ilə aktiv məşğul olur. M.Bağırov tərəfindən həkimlərin hazırlanması sikli üçün dərs proqramları hazırlanıb və təkmilləşdirilib. O, kafedra əməkdaşları ilə birgə pulmonologiya və torakal cərrahiyyə üzrə metodik vəsaitlər və monoqrafiyalar dərc edib, şəxsən pulmonoloq-həkim və torakal cərrahların kompyuter təlim proqramını hazırlayıb.

M.Bağırov 1968-ci ildən qida borusunun rekonstruktiv-bərpa cərrahiyyəsi ilə aktiv məşğul olur. Ezofaqoplastikanın ağırlaşması və ölümlə nəticələnməsinin yüksək faizi səbəbindən gələcək transplantatın boru axarının ilkin məşqi yolu ilə əməliyyat nəticələrinin yaxşılaşdırılması metodlarını eksperimental yolla tədqiq edib. Yeni yanaşmaların tətbiqi sayəsində alim əməliyyat sonrası ölüm hallarını 5 faizdən sıfra endirməyə nail olub.

Torakal cərrahiyyənin digər bölmələri ilə paralel olaraq, M.Bağırov 1971-ci ildən rekonstruktiv traxeobronxial cərrahiyyə ilə də məşğul olmağa başlayıb. Xüsusən qarşıya udlaq və traxeyanın əlaqəli postintubasion və posttraxeostomik stenozları zamanı bərpa əməliyyatlarında nəticələri yaxşılaşdırmaq məqsədi qoyulub. Belə ki, əvvəllər tətbiq olunan əməliyyatlar (mexaniki genəlmə, T-vari borunun daxil edilməsi ilə larinqotraxeotomiya, çoxmərhələli plastika, auto və homoplastik materialların tətbiqi) lazımi nəticə vermirdi. M.Bağırov professor O.M.Avilovla müştərək cərrahi praktikada zədələrin traxeoudlaq lokallaşdırılması zamanı ani rekonstruktiv əməliyyatların yeni prinsipial metodlarını hazırlayıb. Bunlara traxeoudlaq plastikasının yeni fiqurlu növləri, sirkulyar-loskut traxeoudlaq plastikası, traxeyanın geniş rezeksiyasından sonra dermatoplastika aiddir. Qeyd olunan bütün cərrahiyyə növləri müəllif şəhadətnaməsi və patentlərlə qorunur. Yeni metodlar sayəsində klinika tibb praktikasında prioritetə malikdir. M.Bağırov, həmçinin traxeyada əməliyyatların yeni variantlarını, onun bronxlarda, döş divarında, qida borusunda bifurkasiyasını işləyib. Asfiksiya təhlükəli traxeya stenozları zamanı yeni tibbi yanaşma hazırlanıb.

Professor M.Bağırov rekonstruktiv torakal cərrahiyyə sahəsində dünyanın aparıcı mütəxəssislərindən biridir. Onun nailiyyətləri Rusiya və xarici mətbuatda dərc olunan 300-dən çox elmi işdə öz əksini tapıb. O, tənəffüs və həzm orqanları xəstəliklərinin müalicəsi və diaqnostikasının yeni metodlarına dair 6 monoqrafiya dərc etdirib, 22 müəllif şəhadətnaməsi və patent alıb.

M.Bağırov Ukrayna SSR Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin diplomu, Avropa kardiotorakal cərrahlar assosiasiyasının birinci dərəcəli diplomu, Ukrayna Səhiyyə Nazirliyinin (Ukrayna MOZ) fəxri fərmanları ilə təltif olunub. 1997-ci ildə pulmonoloji yardım barədə elmi işinə görə ona elm və texnika sahəsində Ukrayna Dövlət mükafatı, 2008-ci ildə isə Ukraynanın görkəmli elm və texnika xadimi fəxri adı verilib.

M.Bağırov Avropa kardiotorakal cərrahlar assosiasiyasının, Avropa torakal cərrahlar assosiasiyasının, Amerika torakal cərrahlar assosiasiyasının, Avropa respirator cəmiyyətinin üzvüdür.

1998 və 1999-cu illərdə M.Bağırov Amerika və İngiltərə bioqrafik cəmiyyətinin dünyanın 100 ən yaxşı həkimləri sırasında qeyd edilib. 2011-ci ildə Amerika Bioqrafik İnstitutunun qızıl medalı ilə təltif olunub.

M.Bağırovun rəhbərliyi ilə 7 namizədlik və 2 doktorluq dissertasiyası müdafiə edilib. O, öz elmi fəaliyyətinin nəticələri ilə bağlı hər il cərrahların Avropa və Dünya konqreslərində məruzə edir.



## Bağırov
## Toğrul Adil oğlu

*Siyasi elmlər doktoru, professor.*
*Moskva beynəlxalq neft klubunun icraçı vitse-prezidenti*

Bağırov Toğrul Adil oğlu 1954-cü il mayın 6-da Bakıda anadan olub.

1976-cı ildə SSRİ Xarici İşlər Nazirliyinin Moskva Dövlət Beynəlxalq Münasibətlər İnstitutunun beynəlxalq münasibətlər fakültəsini bitirib. 1976-1990-cı illərdə SSRİ Xarici İşlər Nazirliyində, SSRİ-nin ABŞ-dakı səfirliyində, SSRİ-nin BMT Avropa bölməsi (Cenevrə) nəzdindəki nümayəndəliyində işləyib. 1991-1992-ci illərdə Rusiya xarici siyasət fondunda Rusiya özəl biznesinə dəstək intellektual mərkəzinin proqramları üzrə vitse-prezident vəzifəsində çalışıb.

1993-1996-cı illərdə energetika sahəsində "Resursların istismarı" beynəlxalq konsaltinq kompaniyasının prezidenti olub. 1994-cü ildən Rusiya Federasiyasının yanacaq və energetika nazirinin xüsusi müşaviri, bir sıra nəhəng neft-qaz kompaniyalarının ("Qazprom", "LUKoyl", "Transneft", "Zarubejneft", "Tatneft") məsləhətçisi, ixtisaslaşmış beynəlxalq qeyri-hökumət təşkilatları olan Rusiya-Amerika, 1996-cı ildən Moskva beynəlxalq neft-qaz klubunun icraçı vitse-prezidentidir. 1996-cı ildən Rusiya Federasiyası hökumətinin nəzdində neft-qaz sahəsində beynəlxalq layihələr üzrə ictimai konsultativ mərkəzin rəhbəri, Rusiya Federasiyası hökuməti sədrinin ştatdankənar məsləhətçisidir.

T.Bağırov 1997-ci ildə Rusiya Təbiət Elmləri Akademiyasının müxbir üzvü seçilib. O, "Moskva neft klubu" fondunun icraçı vitse-prezidenti, Davos və Zaltsburq Ümumdünya İqtisadi Forumunun, Rusiya-OPEC dialoqunun iştirakçısı, 1998-ci ildən Amerika-Rusiya İşgüzar Şurasının (ARİŞ) daimi üzvüdür. 2000-ci ildə T.Bağırov ARİŞ-in Rusiya analoqu olan Rusiya-Amerika işgüzar əməkdaşlıq şurasının Qəyyumluq Şurası sədrinin müavini seçilib. O, "İncəsənət aləmi" beynəlxalq humanitar təşkilatının, Sankt-Peterburqun Mariinsk opera və balet teatrının müşahidə şuralarının üzvü, Rusiya Beynəlxalq Nobellər irsi fondunun təsisçisidir.

2004-cü ildə "1990-cı illərdə Rusiya-Amerika münasibətləri kontekstində Rusiyanın neft-qaz sektorunda islahatların beynəlxalq əhəmiyyəti" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

O, "Mejdunarodnaya jizn", "Amerika", "Neft Rossii" jurnallarının daimi müəllifidir. "Böyük səkkizlik" ölkələrinin energetika nazirlərinin birinci görüşü barədə külliyyatın 1988-ci il nəşri üzrə proqram komitəsinin koordinatorudur. Rusiya Dövlət Duması və ABŞ Konqresi arasında dialoqa dəstək ictimai qrupunun üzvü, energetika üzrə Duma-Konqres böyük qrupunun yaradılmasının təşəbbüskarıdır.

T.Bağırovun dərc olunmuş işləri arasında "Rusiya və OPEC ölkələri - əməkdaşlığın perspektivləri", "Rusiyanın xarici siyasətində neft və qaz", "1990-cı illərdə Rusiyanın neft-qaz sektorunda iqtisadi dəyişikliklərin beynəlxalq əhəmiyyəti" mövzusunda monoqrafiya və s. yer alır.



## Bağırov
## Vüqar Əliniyaz oğlu

*Biologiya elmləri doktoru.*
*Ümumrusiya Elmi-Tədqiqat Heyvandarlıq İnstitutunun heyvanların reproduktiv kriobiologiya laboratoriyasının müdiri*

Bağırov Vüqar Əliniyaz oğlu 1968-ci il iyunun 21-də Azərbaycan Respublikasının Neftçala rayonunun Aşağı Surra kəndində anadan olub.

1987-1989-cu illərdə Sovet Ordusunda hərbi xidmət keçib. Əfqanıstanda keçirilən hərbi əməliyyatlarda iştirak edib. 1992-ci ildə Azərbaycan Kənd Təsərrüfatı Akademiyasını bitirib. Bir il sonra Ümumrusiya Heyvandarlıq ETİ-nin (Moskva) aspiranturasına qəbul olunub. 1996-cı ildə "Heyvan toxumundakı xarici nuklein turşularının mayalanmaya və emiriogenezə təsiri" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib. 1997-1999-cu illərdə biotexniki laboratoriyanın elmi və baş elmi işçisi vəzifələrində çalışıb, 1999-2002-ci illərdə isə Ümumrusiya Donuzçuluq ETİ-nin elmi katibi işləyib.

2002-2005-ci illərdə V.Bağırov Ümumrusiya Heyvandarlıq ETİ-nin doktorantı olub. "Heyvanların genetik resurslarının qorunmasının biotexnoloji aspektləri" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. 2005-ci ildən Rusiya Kənd Təsərrüfatı Akademiyasının zootexnika bölməsinin elmi katibi, eyni zamanda Ümumrusiya Heyvandarlıq ETİ-nin heyvanların reproduktiv kriobiologiyası laboratoriyasının müdiridir. 2010-cu ildən Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyasının müxbir üzvüdür.

V.Bağırov biotexnologiya, fiziologiya və heyvanların reproduktiv kriobiologiyası sahəsində görkəmli alimdir. Onun rəhbərliyi və bilavasitə iştirakı ilə heyvanların bioloji müxtəlifliyinin qorunması üzrə aktiv iş aparılır. O, bu sahədə bir sıra vacib məsələlər üzərində işləyib və bunun sayəsində ilk dəfə olaraq nadir və nəsli kəsilməkdə olan heyvanların genetik resurslarını qorumağa imkan verən, epididimal və testikulyar heyvan toxumlarının yeni kriokonservasiyası texnologiyası yaradılıb. V.Bağırov tərəfindən hazırlanan borudaxili mayalanma metodu yüksək dəyərə malik genotipləri çoxaltmağa imkan verib. O, kənd təsərrüfatı heyvanlarının, həmçinin zubr, yak, müşk öküzü, arxar, qar qoyunu, sayqak və dağ keçisinin genetik materialının (toxum, embrion və DNT) dünyada analoqu olmayan kriobankını yaradıb.

V.Bağırov "Döyüş xidmətlərinə görə", "SSRİ Silahlı Qüvvələrinin 70 illiyi", "Əfqan xalqı adından – beynəlmiləl döyüşçüyə" medalları, SSRİ Ali Soveti Rəyasət Heyətinin "Beynəlmiləl döyüşçü" fəxri fərmanı və döş nişanı, həmçinin Ümumrusiya Sərgi Mərkəzinin 3 qızıl medalı ilə təltif olunub.

V.Bağırov 100-dən çox elmi işin, o cümlədən 7 monoqrafiyanın müəllifidir. İxtiralarına dair 2 patenti var.



## Bağırova
## Məlahət İbrahim qızı

*Tibb elmləri namizədi."Yıldız" Texniki Universitetinin biomühəndis bölməsinin baş müəllimi*

Bağırova Məlahət İbrahim qızı 1952-ci il yanvarın 13-də Azərbaycan Respublikasının Naxçıvan şəhərində anadan olub.

1969-cu ildə Nəriman Nərimanov adına Azərbaycan Tibb İnstitutuna (indiki Azərbaycan Tibb Universiteti) qəbul olunub. Ali məktəbi bitirdikdən sonra 1975-ci ildə daxili xəstəliklər üzrə internatura keçərək Naxçıvan şəhər poliklinikasında terapevt işləyib.

1980-1982-ci illərdə M.Bağırova SSRİ Tibb Elmləri Akademiyası nəzdindəki Tibbi Parazitologiya və Tropik Tibb İnstitutunda (Moskva) klinik ordinaturada təhsil alıb və oranı bitirdikdən sonra həmin institutda çalışmağa başlayıb.

1989-cu ildə Bakıya qayıdıb və Elmi-Tədqiqat Mamalıq və Ginekologiya İnstitutunda işləyib. 1993-cü ildə ailə vəziyyəti ilə əlaqədar olaraq Türkiyəyə köçüb və 1993-2002-ci illərdə "BİR-LAB" diaqnostika mərkəzində mikrobioloq vəzifəsində çalışıb.

2002-2003-cü illərdə Hatay şəhərində Mustafa Kamal Atatürk Universitetinin parazitologiya kafedrasında baş müəllim vəzifəsini tutub. 2003-cü ildən Çuxurova Universitetində baş müəllim işləyib və eyni zamanda tropik xəstəliklərə yoluxmuş xəstələrin diaqnostikası və müalicəsi ilə məşğul olub.

2007-ci ildə o, tibb elmləri namizədi alimlik dərəcəsi almaq üçün "Leyşmaniozun diaqnostikasında yeni mikrokultural metod" mövzusunda namizədlik dissertasiyasını uğurla müdafiə edib.

M.Bağırova daxili və tropik xəstəliklər sahəsində mütəxəssisdir. O, həmçinin gövdə hüceyrələrinin, kriobioloji hüceyrələrin tədqiqi, infeksion xəstəliklərə qarşı yeni nəsil vaksinin və infeksion xəstəliklərdə yeni diaqnostik metodların hazırlanması ilə də məşğul olur.

2006-cı ildə M.Bağırova "Yıldız" Texniki Universitetinin (İstanbul) biomühəndis bölməsinə dəvət alıb və burada professor Adil Allahverdiyevlə birgə "Hüceyrə və toxumaların mədəniyyəti mühəndisliyi" laboratoriyasının əsasını qoyub. O, leyşma-

nioza qarşı polimerlər əsasında yeni vaksinin yaradılması layihəsinin hazırlanmasında iştirak edib. Həmçinin "Helicobacter pylori" diaqnostikasının hazırlanması üzrə layihənin rəhbəri olub və onu uğurla sona çatdırıb. Layihənin nəticələri dünyanın tanınmış tibb jurnallarında dərc edilib.

M.Bağırova dünyanın bir çox ölkəsində, müxtəlif beynəlxalq jurnallarda, o cümlədən 8 kitabın bir neçə bölməsində dərc olunan 80-dən çox elmi məqalənin həmmüəllifidir. Onun rəhbərliyi altında fəlsəfə doktoru elmi dərəcəsi (Ph.D) almaq üçün 3 dissertasiya, 4 magistr dissertasiya işi yerinə yetirilib. M.Bağırova bəzilərində rəhbər kimi təmsil olunduğu təxminən 20 elmi layihədə iştirak edib. Layihələr müsabiqə əsasında keçirilib və Türkiyənin Elmi-Texniki Təşkilatı, Sənaye və Ticarət Nazirliyi, Çuxurova Universiteti, "Yıldız" Texniki Universitetinin elmi-tədqiqat qrupları tərəfindən dəstəklənib. Hazırda M.Bağırova bu sahədə fəaliyyətini davam etdirir.

Beynəlxalq indeksli jurnallarda dərc olunan çoxsaylı məqalələrinə görə M.Bağırova "Yıldız" Texniki Universitetinin rektorat mükafatı ilə təltif edilib (2013). Həmkarları ilə birgə tez-tez getdiyi Universitet Stony Brook (ABŞ), Chicago Medikal Scool (ABŞ) kimi məşhur tədqiqat mərkəzləri və universitetlərlə müştərək tədqiqatlar aparır. O, həmçinin ictimai və diaspor fəaliyyəti ilə də məşğuldur. "İstanbul-Türkiyə-Azərbaycan" Cəmiyyətinin qadın bölməsinin üzvüdür.

M.Bağırova Bakı Beynəlxalq Humanitar Forumunun (2013) iştirakçısıdır.



## Bayramov
## Baxış Xəlil oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*A.F.İoffe adına Fizika-Texnika İnstitutunun*
*baş elmi əməkdaşı*

Bayramov Baxış Xəlil oğlu 1944-cü il iyunun 1-də Gürcüstan Respublikasının Marneuli rayonunda anadan olub.

B.Bayramov 7-ci sinfi bitirdikdən sonra Tbilisi Maşınqayırma Texnikumuna qəbul olunub. Təhsildə fərqləndiyinə görə 1961-ci ildə hələ texnikumu bitirməmiş "metalların kəsilmə ilə emalı" ixtisası üzrə texnik-texnoloq ixtisası alaraq Tbilisi aviasiya zavoduna texnik-konstruktor qismində işləməyə göndərilib.

1969-cu ildə Leninqrad Politexnik İnstitutunun radioelektronika fakültəsini bitirən B.Bayramov A.F.İoffe adına Fizika-Texnika İnstitutunun (FTİ) aspiranturasına qəbul edilib. Onun elmi rəhbəri akademik B.P.Zaxarçenya olub.

Lazer şüalanmasının qeyri-xətti yayılmasının tədqiqi və seriyalı spektrometrlərin təkmilləşdirilməsi üzrə ilk işləri ilə o, digər görkəmli alim, FTİ-nin direktoru, akademik V.M.Tuçkeviçin diqqətini cəlb edib. 1972-ci ildə yarımkeçiricilərin fizikası üzrə Beynəlxalq konfransa (Ştutqart, AFR) təqdim etdiyi tezislərə görə B.Bayramov proqram komitəsindən məruzə ilə çıxış etmək təklifini alır. Belə təklif sovet aliminə ilk dəfə edilirdi. Hərçənd bir çox səbəbdən konfransa getmək B.Bayramova qismət olmasa da, məruzə konfransın materiallarına daxil edilir, bu barədə məlumat isə yenidən V.M.Tuçkeviçin diqqətini çəkir. 1972-ci ildə B.Bayramovun namizədlik dissertasiyasının müdafiəyə növbədənkənar təqdim edilməsindən sonra Tuçkeviç onun həmin dövrlər üçün çətin olan daimi işə götürülməsi məsələsində hər cür kömək göstərir. Belə ki, bu cür sənədləşdirmə yüksək partiya instansiyalarından keçirdi və beləliklə, B.Bayramov kiçik elmi işçi qismində FTİ-də işə düzəlir. Bu məşhur institutda onun hazırda baş elmi işçi qismində indiyədək davam edən elmi-tədqiqat fəaliyyəti belə başlayır.

B.Bayramovun ilk elmi uğurları çox da güclü olmayan (100 mVt-a qədər) fasiləsiz arqon və helium-neon şüalanmasının yayılması zamanı yarımkeçirici materiallarda aşkara çıxan yeni fenomenlərin müəyyən olunması ilə bağlıdır. Konusvarı şüalanma, iki fotonlu optik udulma, qeyri-xətti qütbləşmə effekti – optik aktivlik,

Faradeyin qeyri-xətti effekti və bu kimi qeyri-xətti effektlər ilk dəfə B.Bayramov tərəfindən tədqiq edilib, tapılıb və təsnifləşdirilib. Bu işlər nəticəsində nəhəng impulslu şüalanmanın yayılması zamanı meydana çıxan istilik qeyri-xətliliyindən fərqli olaraq, optiki qeyri-xətliliyin fotostimullaşdırılmış elektron xüsusiyyəti aşkara çıxarılıb. Bu işlər yeni qeyri-ənənəvi istiqamətin – həyəcanlanmanın kiçik sıxlıqlı qeyri-xətli optikanın başlanğıcı olub.

B.Bayramov tərəfindən işığın elektron səpələnməsinin tədqiqi zamanı prinsipial yeni nəticələr əldə edilib. O, adi çətinliklə əl çatan aşağı tezlikli sahələrdə işığın kvazi-elastik aşkarlanması metodunu təklif və inkişaf etdirib. Bu metod xeyli maraq kəsb edən, xüsusən aşağı konsentrasiyalı elektrik daşıyıcıları olan yarımkeçirici materiallarda, eyni zamanda, ənənəvi rezonans metodları və elektrik ölçülərini nəzərəçarpacaq dərəcədə üstələyən həssaslıqla spektrləri müəyyən etməyə imkan verir. Göstərilib ki, bu cür yayılmanın meydana çıxması rentgen şüalanmasının yayılması zamanı yaxşı məlum olan Kompton effektinin optik analoqu - enən dalğanın təsiri altında fərdi elektronların (və ya dəliklərin) hərəkəti ilə əsaslanır. Bu qeyri-adi tapıntı İ.P.İpatova ilə birgə yerinə yetirilən nəzəri tədqiqatların aparılmasına rəvac verib.

Helium arsenidində yüngül və ağır dəliklər misalında ikikomponentli plazmanın modeli B.Bayramov tərəfindən təklif olunub və reallaşdırılıb. Bu da yeni tip akustik plazma tərəddüdlərinin eksperimental aşkarlanmasına gətirib çıxarıb. Bu eksperimental işlər sərt cisimlər fizikasında çoxhissəcikli qarşılıqlı əlaqələr barədə müasir təsəvvürlərin inkişafında mühüm rol oynayıb. Onlar “Nort-Holland” beynəlxalq nəşrinin sifarişi ilə “Physics Reports” jurnalının xüsusi buraxılışının (1993) icmal materialında ümumiləşdirilib.

B.Bayramov, həmçinin neytral donor mərkəzlərində lokallaşdırılmış – dielektrik modlarında məkani lokallaşdırılmış uzununa optik fonon spektrlərinin incə strukturunu aşkar edib. Bu zaman həm sinqlet modları, həm də onların çoxluğu müşahidə olunub. Zəif əlaqəli elektron-fonon vəziyyətlərin nəzəriyyəsi çərçivəsində belə modların mövcudluğu tanınmış nəzəriyyəçilər - professor Ş.M.Koqan və Rusiya Elmlər Akademiyasının akademikləri R.A.Suris tərəfindən ikimərhələli və E.İ.Raşba tərəfindən çoxmərhələli mərkəzlər üçün qabaqcadan irəli sürülmüşdü. Alınan məlumat elektron-fonon və elektron-elektron qarşılıqlı əlaqəsinin fundamental xüsusiyyətləri haqda mövcud təsəvvürləri nəzərəçarpacaq dərəcədə genişləndirir və cari metodikanın yüksək analitik imkanlarını nümayiş etdirir.

B.Bayramov tərəfindən ilk aşkar olunan Mandelştam-Brillyuen işığının rezonans səpələnməsi indiyədək aparılan geniş eksperimental tədqiqatların nəticələrinin iza-

hına yeni yanaşmanın əsasını qoyub. Hazırda bu nəticələr işığın kombinasiyalı rezonans yayılmasının izahı üçün istifadə olunur.

Onun yeni prinsipial istiqamət - geniş imkanlı spektroskopiya üzrə hazırladığı, həyata keçirdiyi işləri və tədqiqatları xeyli maraq doğurur. İnfraqırmızı sahəyə yaxın işığın qeyri-elastik yayılma spektrlərinin B.Bayramov tərəfindən həm təklif edilən, həm də yaradılan qeydiyyat üsulu yeni yüksək həssaslı diaqnostik metodların hazırlanması problemində əsas rol oynayır.

B.Bayramovun son illər apardığı yeni tədqiqatlarının nəticələri prinsipial əhəmiyyət daşıyır. Geometrik ölçüləri və əvvəlcədən verilən xüsusiyyətləri ilə nəzarət olunan kolloid yarımkeçirici kvant nöqtələrinin əldə edilməsi imkanlarının həyata keçirilməsi, həmçinin lüminessensiyanın yüksək effektivliyi və yüksək fotostabilliyi onları hazırda tibb sahəsində istifadə olunan ənənəvi fluoressent orqanik molekullarına alternativ qismində xüsusilə cəlbedici edir. Onlar strukturları fərdi molekullar səviyyəsində görüntüləmək imkanı verir. Bu işlər dərman preparatlarının hədəf-hüceyrələrə çatdırılması üçün effektiv vasitələrin yaradılması, yüksək həssaslığa malik yeni nəsil selektiv biosensorların hazırlanması, həmçinin müxtəlif problemli xəstəliklərin ilkin diaqnostikası üçün perspektiv nanomaterialların eksperimental tədqiqatı praktikasında yeni istiqamətin əsasını qoyur.

İşığın qeyri-elastik səpələnməsi prosesinin bir sıra prinsipial yeni öyrənilmə metodlarının yaradılması üzrə B.Bayramovun işləri nəinki dünyada daha aktual istiqamətlərin elmi səviyyəsini müəyyən edən və nanotexnologiyalar sahəsində sonrakı tərəqqiyə, yeni fiziki təzahürləri müəyyənləşdirməyə və riyazi təsvir etməyə, strukturun mükəmməlliyi müəyyənliyini dağıtmayan kontaktsız metodikalar hazırlamağa imkan verən yarımkeçirici və bio-tibbi materialların əsas və texnoloji vacib parametrlərinin fundamental tədqiqatını aparmağa imkan verir, həmçinin uzunluğun atom şkalasında lokal diaqnostikanın yeni əsas istiqamətinin yolunu açır.

B.Bayramov 250-dən çox elmi işin, 2 kollektiv monoqrafiyanın  müəllifi və həmmüəllifidir. O, bir monoqrafiya tərcümə edib, ixtiralarına görə 14 patent və müəllif şəhadətnaməsi, həmçinin Rusiya fundamental tədqiqatlar fondunun, INTAS Avropa cəmiyyətinin beynəlxalq proqramının; ABŞ Milli elm fondunun, aerokosmik tədqiqatlar və layihələr üzrə Avropa bölməsinin (EOARD, London), ABŞ (Moskva və Beynəlxalq elmi-texniki mərkəzi və CRDF ilə müştərək), “Deusche Forschungsgemeinschaft” (AFR) və EPSRS (Böyük Britaniya) proqramları və başqa təşkilatların qrantlarını alıb. Onun rəhbərliyi altında 5 namizədlik və 2 doktorluq dissertasiyası müdafiə olunub.

B.Bayramov beynəlxalq əməkdaşlıqda aktiv iştirak edib, Bilkent Universiteti, Ankara, Türkiyə (1992-1995); Kembric Universiteti, Kembric, İngiltərə (1993-1994), Dağ Akademiyası, Frayberq, AFR (1992-1995), Şimali Karolina Universiteti, Raley, ABŞ (1998), Millətlər Birliyi Universiteti, Riçmond, Virciniya, ABŞ (1999) və Sankt-Peterburqun Böyük Pyotr Politexnik Universiteti (2002-ci ildən indiyədək) və başqa təhsil müəssisələrinin fizika fakültələrinin tələbə və aspirantlarına mühazirələr oxumaq üçün dəvət alıb.

B.Bayramov Rusiya Elmlər Akademiyasının fəxri fərmanları ilə təltif olunub. Ən yaxşı elmi işlərinə görə Fizika-Texniki İnstitutunun mükafatlarına layiq görülüb. O, Sankt-Peterburq Alimləri İttifaqının, Beynəlxalq Tədqiqatçı Materialşünaslar İttifaqının (MRS), Avropa Fizika Cəmiyyətinin üzvü, Optik Texnologiyalar üzrə Beynəlxalq İttifaqın (SPIE) və bir sıra digər elmi təşkilatların fəxri üzvü, müxtəlif beynəlxalq konfransların proqram komitələrinin üzvü, Rusiya Təbiət Elmləri Akademiyasının həqiqi üzvüdür.



## Bayramov
## Ələkbər Əzizağa oğlu

*Tibb elmləri doktoru, professor. Kliniki endikrinologiya elmi-tədqiqat laboratoriyasının müdiri. V.A.Almazov adına ürək, qan və endikrinologiya Federal Mərkəzinin Endikrinologiya İnstitutu direktorunun elmi iş üzrə müavini*

Bayramov Ələkbər Əzizağa oğlu 1959-cu il aprelin 10-da Azərbaycan Respublikası Cəlilabad rayonunun Ocaqlı kəndində anadan olub.

1986-cı ildə Leninqrad Sanitar-Gigiyena Tibb İnstitutunu (LSGTİ) (sonradan İ.İ.Meçnikov adına Sankt-Peterburq Dövlət Tibb Akademiyası, hazırda İ.İ.Meçnikov adına Şimal-Qərb Dövlət Tibb Universiteti) fərqlənmə ilə bitirib. 1987-2009-cu illərdə Rusiya Tibb Elmləri Akademiyasının akademiki F.Q.Uqlovun akademik İ.P.Pavlov adına Leninqrad Tibb İnstitutunun subordinatorlar üçün hospital cərrahiyyə kafedrası nəzdindəki akademik qrupunda kardiologiya üzrə elmi işçi vəzifəsində çalışıb.

1987-ci ildə Ə.Bayramov klinik kardiologiya üzrə ixtisaslaşma keçib. 1991-ci ildə "ürək-damar cərrahiyyəsi" və "farmakologiya" ixtisasları üzrə tibb elmləri namizədi alimlik dərəcəsi almaq üçün "Cərrahi müalicə etapında gecikmiş mərhələdə olan birləşmiş mitral ürək qüsurlu xəstələrdə miokardın metabolik pozulmasının qiymətləndirilməsi və onların farmakokorreksiyası" mövzusunda dissertasiya müdafiə edib.

2000-2005-ci illərdə Rusiya Tibb Elmləri Akademiyasının Elmi-Tədqiqat Eksperimental Tibb İnstitutunun S.V.Aniçkov adına neyrofarmakologiya şöbəsində çalışarkən "Cinsi funksiyanın mərkəzi holinerjik tənzimlənməsi mexanizmləri" mövzusunda doktorluq dissertasiyası üzrə elmi işini yerinə yetirib. Dissertasiyanı 2009-cu ildə S.M.Kirov adına Hərbi-Tibb Akademiyasının Dissertasiya Şurasında "urologiya" və "farmakologiya" ixtisasları üzrə müdafiə edib.

Ə.Bayramov 2009-cu ildən bu günədək V.A.Almazov adına ürək, qan və endikrinologiya Federal Mərkəzinin əməkdaşı, kliniki endikrinologiya elmi-tədqiqat laboratoriyasının müdiri, Endikrinologiya İnstitutu direktorunun elmi iş üzrə müavinidir. Novqorod Dövlət Universitetinin Tibb Təhsili İnstitutunun "Andrologiya, urologiya" kursu üzrə hospital cərrahiyyə kafedrasının professorudur.

Ə.Bayramov 4 monoqrafiyanın, o cümlədən "Sexual Dysfunctions – Special Issues" (2011, EU, Croatia), "Kişinin cinsi funksiyasının holinerjik tənzimlənmə mexanizmləri" (2013, SPb), ürək qüsurunun cərrahi müalicəsi mərhələsində miokardın

işemik və reperfuzion zədələnməsinə, həmçinin ontogenez mərhələsində reproduktiv, cinsi funksiyanın neyroendokrin tənzimlənməsinə həsr olunan 90 elmi məqalənin müəllifidir.

O, S.M.Kirov adına Hərbi-Tibb Akademiyası nəzdində Dissertasiya Şurasının, "Rossiyskiy biomedisinskiy jurnal - Medline.ru" jurnalının redaksiya heyətinin üzvüdür.

Ə.Bayramovun elmi marağı orqanizmin visseral funksiyalarının neyroendokrin tənzimlənməsinin öyrənilməsi, androgen və reproduktiv funksiyaların neyroendokrinologiya və ontogenez sahəsindəki tədqiqatı ilə bağlıdır. O, Rusiya Psixoneyroendokrinoloqlar Cəmiyyətinin, Avropa Neyroendokrinoloqlar Cəmiyyətinin üzvüdür. Androloq-endokrinoloq həkimdir.



## Bayramov
## Vaqif Deyruş oğlu

*Sosiologiya elmləri doktoru, professor.*
*Moskva Dövlət Humanitar-İqtisad Universitetinin rektoru*

Bayramov Vaqif Deyruş oğlu 1957-ci il yanvarın 28-də Tbilisi şəhərində anadan olub.

1986-cı ildə Moskva Metallurgiya İnstitutunu "metallurgiya sobalarının istilik texnikası və avtomatlaşdırılması" ixtisası üzrə, 2002-ci ildə A.S.Puşkin adına Leninqrad Dövlət Vilayət Universitetini "hüquqşünaslıq" ixtisası üzrə bitirib. N.E.Bauman adına Moskva Dövlət Texniki Universitetinin dissertasiya şurası 2003-cü ilin may ayında V.Bayramova siyasi elmlər namizədi elmi dərəcəsi verib.

O, 2004-cü ildən Moskva Dövlət Humanitar-İqtisad İnstitutunda (2014-cü ildən Moskva Dövlət Humanitar-İqtisad Universiteti) əvvəlcə dekan, sonra institutun birinci prorektoru vəzifəsində çalışıb. 2006-cı ildən həmin institutun rektorudur.

2009-cu ilin aprel ayında sosiologiya elmləri doktoru elmi dərəcəsini, 2010-cu ildə isə professor elmi adını alıb. Onun 30 ildən çox ümumi əmək stajı var.

V.Bayramov institutun maddi-texniki bazasını genişləndirmiş təcrübəli rəhbərdir. Onun rektor işlədiyi dövr ərzində institutun bütün binalarında, qurğularında və ərazisində miqyaslı təmir-bərpa və abadlıq işləri aparılıb.

Elmi fəaliyyətində uğurlarına, yüksək ixtisaslı mütəxəssis hazırlığı işlərinə verdiyi böyük töhfəsinə, institutun maddi-texniki bazasının gücləndirilməsinə görə Təhsil üzrə Federal Agentlik ona iki dəfə təşəkkür elan edib.

V.Bayramovun şəxsi töhfəsi sayəsində institutda yeni hazırlıq istiqamətləri açılıb. Son bir neçə ildə onların sayı 9-dan 17-yə, ixtisasların genişləndirilmiş qruplarının (hazırlıq istiqaməti) sayı 3-dən 8-ə, həmçinin təhsil proqramlarının sayı 9-dan 39-a qədər artıb.

V.Bayramov təhsil sisteminə cəlb olunan kadr resurslarının ixtisas artırması üzrə daimi işlər aparır. Kafedralarda əsas professor-müəllim heyətinin tərkibi professor və dosent elmi rütbələrinə malik elmlər namizədi və doktorlarından təşkil olunub. Təhsil səviyyəsinin yüksəldilməsi və nəzərdə tutulan məsələlərin həlli üçün ali təhsil müəssisəsinin informasiya strukturu, idarə sistemi təkmilləşdirilir, yeni müasir informasiya texnologiyaları tətbiq olunur.

V.Bayramov RF Federal Məclisi Federasiya Şurasının Sədri yanında əlillərin işi üzrə Şuranın üzvüdür, ali və ali təhsildən sonrakı peşəkar təhsilə çıxış məsələsində daim əlillərin maraqlarını müdafiə edir. Onun təşəbbüsü ilə Moskva Dövlət Humanitar-İqtisad İnstitutunda hər il yaradıcı qabiliyyətlərin "Hüdudsuz imkanlar həyatı" Beynəlxalq festivalı keçirilir. Burada Rusiyanın bütün regionlarından, yaxın və uzaq xaricdən sağlamlıq imkanları məhdud olan gənc insanlar iştirak edir. Moskva Dövlət Humanitar-İqtisad İnstitutu 2010-cu ildə Moskva Hökumətinin "Hər kəs üçün şəhər" müsabiqəsində "Təhsilin təşkili" nominasiyasının qalibi olub.

2011-ci ildə "Rusiya Federasiyasında ali peşə təhsilinin və elmin inkişafı perspektivləri və problemləri" adlı V Ümumrusiya Konfransında müstəqil ictimai müsabiqə şurasının qərarına əsasən institut "Ən yaxşı sosial təmayüllü ali təhsil müəssisəsi" nominasiyasında "Rusiyanın ən yaxşı 100 ali təhsil müəssisəsi" qızıl medalına layiq görülüb. Müsabiqənin nəticələrinə görə V.Bayramova "İlin rektoru-2011" qızıl medalı təqdim olunub.

V.Bayramov orta peşə təhsili fəxri işçisi, gənclər siyasəti sahəsində fəxri işçi, RF Federal Məclisi Federasiya Şurasının Sədri yanında əlillərin işi üzrə Şuranın üzvü, Rusiya Federasiyası prezidenti yanında əlillərin işi üzrə Şuranın əlillərin təhsili və sosial-mədəni fəaliyyəti məsələləri üzrə komissiyanın işçi qrupunun üzvü, Rusiya Təbiət Elmləri Akademiyasının müxbir üzvü, Humanitar Elmlər Akademiyasının üzvüdür. 2009-cu ildə Rusiya Elmlər Akademiyasının Sosiologiya İnstitutu və Sosial-Siyasi Tədqiqatlar İnstitutu tərəfindən sosioloji elmlərin inkişafı sahəsində nailiyyətlərinə görə Pitirim Sorokin adına Gümüş medalla təltif olunub. 2010-cu ildə Beynəlxalq İnformasiya, İnformasiya Prosesləri və Texnologiyaları Elmləri Akademiyasının akademiki seçilib. 2013-cü ildə V.Bayramov əldə etdiyi əmək nailiyyətlərinə və çoxillik vicdanlı işinə görə II dərəcəli "Vətənə xidmətlərinə görə" ordeni ilə təltif olunub.



## Bəşirov
## Ağamirzə Ənvər oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor. Şərqi Aralıq Dənizi Universitetinin riyaziyyat kafedrasının professoru*

Bəşirov Ağamirzə Ənvər oğlu 1954-cü il mayın 9-da Azərbaycan Respublikasının Salyan rayonunda anadan olub.

1976-cı ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) mexanika-riyaziyyat fakültəsini bitirib və sonra Azərbaycan Elmlər Akademiyasının Kibernetika İnstitutunun aspiranturasına qəbul olunub. 1980-1992-ci illərdə Azərbaycan Elmlər Akademiyasının Kibernetika İnstitutunda kiçik, böyük və aparıcı elmi işçi işləyib.

1981-ci ildə Ukrayna Elmlər Akademiyasının Riyaziyyat İnstitutunda "Ehtimallar nəzəriyyəsi və riyazi statistika" ixtisası üzrə namizədlik dissertasiyasını, 1991-ci ildə Kiyev Dövlət Universitetində eyni zamanda iki ixtisas - "Riyazi kibernetika" və "Ehtimallar nəzəriyyəsi və riyazi statistika" ixtisasları üzrə fizika-riyaziyyat elmləri doktoru elmi dərəcəsi almaq üçün dissertasiyasını uğurla müdafiə edib.

A.Bəşirov 1992-ci ildən dəvət əsasında Şimali Kipr Türk Cümhuriyyətinin Famaqusta şəhərindəki Şərqi Aralıq Dənizi Universitetində (Eastern Mediterranean University) riyaziyyat kafedrasında işləyir: 1992-1993-cü illərdə dosent olub, 1994-cü ildən indiyədək isə professordur. 2006-2012-ci illərdə kafedraya rəhbərlik edib.

Optimal idarəetmənin riyazi nəzəriyyələri və təsadüfi proseslərin filtrlənməsi, həmçinin idarəedicilik nəzəriyyəsi A.Bəşirovun əsas işlərinə aiddir. O, ağ küylərin paylanmış gecikmələri əsasında geniş zolaqlı küylər nəzəriyyəsini işləyib hazırlayıb və bu nəzəriyyəni geniş zolaqlı küylər zamanı idarəetmə və filtrləmənin riyazi metodlarının hazırlanmasında tətbiq edib. Kalman filtri, qeyri-xətti filtrləmə, qismən müşahidələr zamanı xətti-kvadrat idarəetmənin bölünmə prinsipi və Pontryaqinin maksimumluq prinsipi kimi sistemlər nəzəriyyəsinin təməl nəticələri geniş zolaqlı küylər və daha ümumi xassəli küylər üçün sübut olunub.

İdarəedicilik nəzəriyyəsində A.Bəşirov tərəfindən tam və deterministik sistemlər üçün approksimativ idarəediciliyin prinsipcə yeni zəruri və yetərli şərtləri göstərilib,

bu anlayışlar üçün stoxastik sistemlərin təbii davamı verilib və onlar üçün vacib və yetərli şərtlər tapılıb, həmçinin qismən idarəedicilik konsepsiyası hazırlanıb.

Tətbiqi riyaziyyata aid olan bu nəticələrdən əlavə o, riyazi analiz sahəsində təmiz riyaziyyatda bir sıra nəticələr əldə edib. Bu nəticələr əsasən multiplikativ nöqteyi-nəzərindən diferensial və inteqral hesablama bəhsinə aid edilir. A.Bəşirov tərəfindən, əsasən kompleks multiplikativ hesablamanın əsası qoyulub.

A.Bəşirov "SIAM Journal on Control and Optimization", "International Journal of Control", "IEEE Transactions on Automatic Control", "AIAA Journal of Astronautics and Aeronautics", "Journal of Mathematical Analysis and Applications", "Applied Mathematics Letters", "Journal of the Franklin Institute", "Trudı Matematiçeskoqo instituta im. Steklova", "Differensialnıe upravleniya" və başqa nüfuzlu jurnallarda dərc olunan 60-dan çox elmi işin müəllifi və həmmüəllifidir.

Onun 2003-cü ildə "Birkhäuser" nəşriyyatı tərəfindən dərc edilən "Partially Obsevable Linear Systems under Dependent Noises" monoqrafiyası natamam müşahidələr zamanı idarəetmə və filtrasiya üsullarına həsr olunub. 2014-cü ildə "Elsevier" nəşriyyatı onun "Fundamentals of Mathematical Analysis; Single Variable" dərs vəsaitini çap edib.

A.Bəşirov Nyu-York Elmlər Akademiyasının, Amerika Riyaziyyat Cəmiyyətinin, Amerika Aeronavtika və Astronavtika İnstitutunun, Planetar Cəmiyyətin üzvüdür. Onun rəhbərliyi altında 6 namizədlik dissertasiyası müdafiə olunub.

1997-ci ildə A.Bəşirov Beynəlxalq Bioqrafiya Mərkəzinin (Kembric, İngiltərə) diplomuna və medalına layiq görülüb. Onun adı "Who is Who" ("Kim kimdir") ensiklopediyasına daxil edilib.



## Bəşirov
## Rza Ənvər oğlu

*Professor, Şərqi Aralıq Dənizi Universitetinin incəsənət və elm fakültəsinin dekanı*

Bəşirov Rza Ənvər oğlu 1960-cı il mayın 16-da Bakı şəhərində anadan olub.

1982-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) tətbiqi riyaziyyat fakültəsini fərqlənmə diplomu ilə bitirib. 1982-1984-cü illərdə Azərbaycan Elmlər Akademiyasının Kibernetika İnstitutunda işləyib. 1984-1986-cı illərdə Moskvada SSRİ EA-nın hesablama riyaziyyatı şöbəsində təcrübə keçib. 1990-cı ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetində "Yenilənən çoxkaskadlı kommutasiya şəbəkələrinin tikintisi" mövzusunda namizədlik dissertasiyasını uğurla müdafiə edib. Sonra Azərbaycan Elmlər Akademiyasının Kibernetika İnstitutunda işə başlayıb.

1990-cı ildən baş elmi işçi, 1991-ci ildən isə Kibernetika İnstitutunda laboratoriya müdiri olub. 1990-1993-cü illərdə Bakı Dövlət Universitetinin riyazi kibernetika kafedrasında dərs deyib. 1993-cü ildən Şimali Kipr Türk Cümhuriyyətində yerləşən Şərqi Aralıq Dənizi Universitetində işləyir.

1997-ci ildə R.Bəşirov riyaziyyat kafedrasının müdiri, 2000-ci ildə Elmi-Tədqiqatlar İnstitutunun direktoru olub. 2011-ci ildə onun təşəbbüsü ilə "İnformasiya Sistemləri" magistr proqramının əsası qoyulub. 2010-cu ildə R.Bəşirova professor elmi dərəcəsi verilib. 2010-cu ildən incəsənət və elm fakültəsinin dekanıdır. 2011-ci ildən öz təşəbbüsü ilə qurulan biologiya elmləri kafedrasına rəhbərlik edir.

Rza Bəşirov informasiya və superkompyuterlərin paralel emalı sahəsində Azərbaycanda ilk mütəxəssislərdən biridir. Yenidən köklənən çoxkaskadlı kommutasiya şəbəkələri, Petri şəbəkələrinin tətbiqi və nəzəriyyəsi, bioinformatika və hesablama molekulyar biologiyası onun elmi tədqiqatlarının əsas istiqamətləridir.

90-cı illərin sonlarında R.Bəşirov kombinator metodlar tətbiq edərək 70-ci illərdə V.Beneş tərəfindən formalaşdırılmış 30 ilə yaxın həllini tapmamış paylanan kommutasiya şəbəkəsinin yenilənməsini sübuta yetirib. Həmin nəticə kompyuter elminin təməllərini qoyanlardan biri - Stanford universitetinin professoru Don Knut da daxil olmaqla, bu sahənin mütəxəssislərinin diqqətini cəlb edib. R.Bəşirov, həmçinin kom-

mutasiya şəbəkələrinin köklü tutumu, optik kommutasiya şəbəkələrində asılı itki və çarpaz maneə yolunun azaldılması məsələlərinin həllində rəngli Petri şəbəkələrinin orijinal tətbiqini hazırlayıb.

R.Bəşirov tərəfindən hibrid Petri şəbəkələrinin köməyi ilə bioloji yolun imitasiyası və modelləşdirilməsi əsasında hüceyrə bölünməsinin nizamlanması analizi üzrə bir sıra tədqiqatlar yerinə yetirilib. Modelin aparılan keyfiyyətli və kəmiyyətli analizi hüceyrə siklinin G1/S nəzarət nöqtəsinin qanunauyğunluğunu öyrənməyə imkan verir. Hazırlanmış modellərin tətbiqi ilə yerinə yetirilən bu fənlərarası tədqiqatlar orqanizmin qocalmasına və xərçəng şişlərinin inkişafına təsir edən faktorları müəyyən etməyə imkan yaradır.

R.Bəşirov fəal alimdir. Çoxsaylı elmi məqalənin müəllifi və həmmüəllifidir, ABŞ, İtaliya, İspaniya, Almaniya, Finlandiya, Rusiya, Ukrayna və Türkiyədə təşkil olunan ənənəvi beynəlxalq konfranslarda elmi məruzələrlə çıxış edir. Həmkarları ilə birgə konfranslar təşkil edib. Fransa, Almaniya, Qətər, Türkiyə və Şimali Kipr Türk Cümhuriyyətində keçirilən beynəlxalq konfransların təşkilat komitəsinin üzvüdür. Bir çox nüfuzlu xarici elmi jurnalların resenzentidir.

Rza Bəşirov Şərqi Aralıq Dənizi Universitetinin doktorantura və magistraturalarında elmi kadrlar hazırlayır. Onun rəhbərliyi altında 3 doktorluq və 10 magistr dissertasiyası hazırlanıb və uğurla müdafiə edilib.



## Cavadov
## Əbülfət Kalvalı oğlu

*Biologiya elmləri doktoru, professor.*
*Tədris Elmi-İstehsalat Kompleksi - Dövlət Universitetinin Mtsensk filialının kimya, ekologiya və yer quruluşu kafedrasının müdiri və professoru*

Cavadov Əbülfət Kalvalı oğlu 1956-cı il iyunun 12-də Azərbaycan Respublikasının Xanlar rayonunun (indiki Göygöl rayonu) Ziyadlı kəndində anadan olub.

1979-cu ildə S.Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunu (indiki Azərbaycan Dövlət Aqrar Universiteti) bitirib və Şəki quşçuluq sovxozuna işləməyə göndərilib. Lakin quşçuluq sovxozunda baş baytar ştatının ləğvi ilə əlaqədar olaraq Ə.Cavadov işə götürülməyib və Azərbaycan Respublikası Quşçuluq Sənayesi idarəsi rəhbərliyinin icazəsi ilə RSFSR-in qeyri-qaratorpaq zonasına ixtisası üzrə işləməyə gedib və Kaluqa vilayətinin Jukov rayonunun "Zarya" kolxozunda baş veterinar işləyib. İşdə yüksək göstəricilərə görə kolxozun və Jukov rayonunun rəhbərliyi Ə.Cavadovun Ümumrusiya Elmi-Tədqiqat Kənd Təsərrüfatı Heyvanlarının Fiziologiyası, Biokimyası və Qidalanması İnstitutunda gələcək işinə və təhsilinə mane olmayıb.

Ə.Cavadov 1982-ci ildən baş veterinar, 1984-cü ildən Ümumrusiya Elmi-Tədqiqat Kənd Təsərrüfatı Heyvanlarının Fiziologiyası, Biokimyası və Qidalanması İnstitutunda birləşdirici mübadilə laboratoriyasında baş veterinar işləyib. Ə.Cavadov "Rasionda yemin fiziki forması ilə əlaqədar buzovların orqanizmində fosfolipidlərin mübadiləsi" mövzusunda namizədlik dissertasiyasını yazıb və 1986-cı ildə müdafiə edib. Ə.Cavadov 1987-ci ildə Sumı Kənd Təsərrüfatı İnstitutuna (Ukrayna) işə dəvət edilib. 2000-ci ilədək Sumı Dövlət Aqrar Universitetinin daxili qeyri-yoluxucu xəstəliklər və farmakologiya kafedrasının dosenti vəzifəsində işləyib və doktorluq dissertasiyasının müdafiəsinə hazırlaşıb.

2000-2009-cu illərdə Orlov Dövlət Aqrar Universitetinin terapiya, cərrahiyyə və mamalıq kafedrasının professoru və müdiri vəzifələrində işləyib. Ə.Cavadov 2001-ci ildə Ümumrusiya Elmi-Tədqiqat Kənd Təsərrüfatı Heyvanlarının Fiziologiyası, Biokimyası və Qidalanması İnstitutunda "fiziologiya" ixtisası üzrə biologiya elmləri doktoru elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə edib.

Ə.Cavadov insan və heyvan orqanizmində maddələr mübadiləsi sahəsində mütəxəssisdir. Onun elmi tədqiqatları dana, buzov, düyə və inəklərin orqanizmində

ümumi lipidlər mübadiləsinin, onların siniflərinin və fosfolidlərin yarımsiniflərinin, habelə yemlərin müxtəlif xırdalanma indeksli rasionda saxlanması və yetişdirilməsi, dənli konsentratların ot qranulası ilə qismən və tam əvəz edilməsində onların məhsuldarlığı, habelə buzovların orqanizmində dənəvərləşdirilmiş monorasionlar fonunda natrium asetatın ümumi fosfolipidlərin və onların yarımsiniflərinin mübadiləsinə təsirinin öyrənilməsinə həsr edilib.

Müxtəlif yaşlarda qaramal üzərində eksperimental cərrahi üsulların tətbiqi təcrübəsində Ə.Cavadov ilk dəfə dünya elmində mədə-bağırsaq kanalında, qaraciyərdə ümumi fosfolipidlərin və onların yarımsiniflərinin istehlakı və mübadiləsinin kəmiyyət aspektlərinin, habelə bu fraksiyanın öd və bağırsaq limfası tərkibində daşınmasının öyrənilməsi üzrə mürəkkəb eksperimental iş aparıb.

Buzovların mədə-bağırsaq traktatının müxtəlif şöbələrində fosfolipidlərin və onların yarımsiniflərinin mübadilə kəmiyyəti Ə.Cavadovun (həmmüəllif) qursağı mədəönündən ayıran kanyulanı hazırlaması və onun implantasiya üsulu nəticəsində öyrənilib. İxtirasına görə 1986-cı ildə müəlliflik şəhadətnaməsi alıb. Kanyulanın tətbiqinə görə alimə “SSRİ ixtiraçısı” dərəcəsi verilib.

İlk dəfə Ə.Cavadov tərəfindən müəyyən edilib ki, monorasiona natrium asetatın qranul formasında daxil edilməsi qaraciyərdə fosfatidilxolin və sfinqomielinin sintezinin genişlənməsi hesabına fosfolipidlərin sintezinin güclənməsinə kömək edir. Bu kəşf birbaşa sübut tələb edən elmi kəşf kimi qeydiyyatdan keçib.

Ə.Cavadov tərəfindən fosfolipidlərin yarımsiniflərinin müəyyən edilməsi üsulunun densitometriyanın istifadəsilə mikronazikqatlı xromatoqrafiya metoduna dəyişilməsi (1989) alimə bioloji materialda fosfolipidlərin yarımsiniflərinin standart məhlullarını və kalibrovkasını tətbiq etmədən onların kəmiyyətini müəyyənləşdirməyə imkan verib.

Mədəönündə infuzor kütlənin miqdarının müəyyən edilməsi üçün işlədiyi üsul, - buna görə 1987-ci ildə müəlliflik şəhadətnaməsi alıb, - ona mədəönündən qursağa daxil olan infuzor kütlənin miqdarını dəqiq müəyyən etməyə və bununla da buzovların mədəönündə mikroorqanizmlərlə sintez edilən fosfolipidlərin və onların yarımsiniflərinin dəqiq miqdarını öyrənməyə imkan yaradıb.

Ə.Cavadov 150-dən çox elmi və elmi-metodik işin, o cümlədən 3 dərsliyin, 1 monoqrafiyanın, 3 dərs vəsaitinin, 90-dan çox elmi məqalənin, 30-dan çox metodik tövsiyənin müəllifidir. Onun tərəfindən 6 biokimyəvi tədqiqat üsulu, 5 qurğu və heyvanların 2 klinik tədqiqat metodu hazırlanıb və dəyişdirilib və bunlar RF və Ukraynanın 10 müəlliflik şəhadətnaməsi və patenti ilə qorunub. Baytarlıq və aqrar

mütəxəssisləri Ə.Cavadovun hazırladığı maqnit zondundan Ukrayna və RF-nin təhsil müəssisələrində tədris prosesində uğurla istifadə edirlər.

Ə.Cavadov dəfələrlə RF Kənd Təsərrüfatı Nazirliyinin təhsil və elm departamenti tərəfindən Bryansk Dövlət Kənd Təsərrüfatı Akademiyasının Baş Attestasiya Komissiyasına "baytarlıq" ixtisası üzrə sədr təyin edilib.

O, işlədiyi dövrdə hər il 2-3 namizədlik dissertasiyasına opponentlik edib, iki ixtisas üzrə namizədlik və doktorluq dissertasiyalarının müdafiəsi şurasının sədri və üzvü olub. Ə.Cavadovun rəhbərliyi altında 5 elmlər namizədi hazırlanıb.



## Cavan Əli

*Helium-neon (qaz) lazerinin yaradıcısı.*
*"Müasir dövrün 100 dahisi" siyahısında on ikinci dahi.*
*Massaçusets ştatında Texnologiya İnstitutunun professoru*

Əli Cavan 1926-cı il dekabrın 26-da Tehranda azərbaycanlı ailədə anadan olub.

Fizikanın əlifbasını Tehran Universitetində öyrənib. 1947-1948-ci illərdə orada oxuyub, ABŞ-a köçüb və təhsilini Nyu-Yorkda davam etdirib. 1954-cü ildə Kolumbiya Universitetinin fəlsəfə doktoru dərəcəsini alıb. 1958-1961-ci illərdə Nyu-Cersidə "Bell Telephone Labarotories" firmasında işləyib. Bu firma artıq çoxlu ixtiraları ilə şöhrət qazanmışdı, tranzistoru məhz burada 1940-cı ildə icad ediblər.

Ə.Cavan 60-cı illərin əvvəllərində Massaçusets Texnologiya İnstitutunda (o, buraya 1960-cı ildə gəlmişdi) optik spektral diapazonda tezliyin ölçülməsinin radiotexniki metodlarının genişləndirilməsinə yönələn tədqiqat layihəsinə başlayıb. O, anten, qəbuledici, infraqırmızı lazer şüalanmasının qarışdırıcı cihazları kimi istifadə olunan "metal-dielektrik-metal" nöqtə kontaktlarının nazik telləri ilə təcrübə aparıb. Sonra bu cür elementlər Boulderdə Milli Standartlar Bürosundan (MSB, indiki Milli Standartlar İnstitutu) D.Holl və K.Evenson tərəfindən metan üzrə sabitləşən dalğa uzunluğu 3,39 mkm olan helium-neon qaz lazerinin dalğa uzunluğunun və şüalanma tezliyinin ölçülməsi yolu ilə işığın sürətini müəyyən etmək üçün istifadə edilən harmonikanın generasiyası əsasında ilk tezlikli zəncirin yaradılmasında istifadə edilib.

Harmonikanın generasiyasına əsaslanan lazer tezlikli zəncirlər özlüyündə vahid optik tezliyin ölçülməsi üçün mürəkkəb sistem idi, buna görə də çox az belə tezlik zənciri bir neçə yaxşı təchiz olunmuş milli metrologiya laboratoriyasında yaradılmışdı.

Ə.Cavan 1964-cü ildə Massaçusets Texnologiya İnstitutunda işləməkdə davam edərək professor adını alıb. Onu tez-tez "Şərqin Eynşteyni" və lazerin "atası" adlandırırlar. Məkanda yerləşdirilmiş iki lazer topasının işığı bölən lövhənin, iki kamertondan gələn səs dalğalarının analoji interferensiyasının köməyi ilə vurnuxmasını fotodetektorda ilk dəfə Ə.Cavan müşahidə edib. Bu, əla nəticə idi, çünki sübut etdi ki, lazer şüalanması özünü klassik radiodalğa kimi apara bilər. Koherent lazer şüalanması müəyyən faza və amplituda malik ola bilər, beləliklə bu cür işıq dalğasının çıxıntılarını saymaq olar.

Ə.Cavan 1960-cı ildə qaz lazerini təklif edib və onu U.Bennet və C.Erriotla birlikdə düzəldib. 1963-cü ildə Ç.Taunsla birgə helium-neon lazerindən istifadə edərək Maykelson-Morli təcrübəsini təkrarlayıb, U.Bennet və U.Lemblə güclənmə xəttinin mərkəzində lazerin çıxış gücünün rezonans azalması hadisəsini aşkar edib ("Lemb quyusu").

Ə.Cavan 1966-cı ildə mod kəsişməsi effekti nəzəriyyəsini yaradıb və onu 1969-cu ildə müşahidə edib.

Qaz lazeri ilk fasiləsiz yüngül lazer olub və bu xüsusiyyət ondan telekommunikasiya sənayesində lif optikası texnologiyasında istifadə olunmasına imkan yaradıb. Ə.Cavanın ixtirası telekommunikasiya sahəsində yeni texnologiyaların inkişafında yeni mərhələ təşkil edib, qoloqrafiyanı praktikləşdirib, habelə ondan UPC kod kontrollerində istifadə edilir.

Ə.Cavan, həmçinin işıq sürətinin mütləq dəqiq ölçmə proseslərinin öyrənilməsi və yüksək ayırdetmə qabiliyyətinə malik lazer spektroskopiyası sahəsində tədqiqatların müəllifidir. O, işıq rəqslərinin mütləq tezliyini ölçmə metodunu və qeyri-xətti flyuoressensiya metodlarını işləyib (1970).

Ə.Cavanın tədqiqatı kvant elektronikasına və onun lazer spektroskopiyasında tətbiqinə aiddir. O, qeyri-xətti spektroskopiyanın əsasını qoyub və spektral xətlərin itələyici daralmasını kəşf edib. Onun ixtirası və kəşfi tibb və informasiya-kompyuter texnologiyalarında geniş tətbiq olunur.

Ə.Cavan yaşının bu vaxtında da fasiləsiz işləyir: işıq rəqslərinin mütləq tezliyinin ölçülməsi və qeyri-xətti flyuoressensiyanın ölçülməsi metodunu işləyib hazırlayır. O, nanotexnologiyaları xüsusi diqqətlə öyrənir və mikroçipləri radiotezliklərin köməyi ilə işıq dalğasına çevirməyə çalışır ki, bu, məhsuldarlığı dəfələrlə artıra bilər.

Ə.Cavan ABŞ Milli Elmlər Akademiyasının, Amerika Elm və İncəsənət Akademiyasının üzvü, Triest Elmin İnkişafı Fondunun fəxri üzvüdür.

Ona lazerə görə 1964-cü ildə Stüart Ballantayn, iki ildən sonra Fanni və Con Herts Fondunun, 1975-ci ildə Amerika Optika Cəmiyyətinin, habelə Frederik İves medalı verilib. Nəhayət, 1993-cü ildə dünya elminə töhfəsinə görə Albert Eynşteyn adına mükafata layiq görülüb. 1998-ci ildə Uills Lemb mükafatını alıb.



## Cəfərli
## Tahir Barat oğlu

*Tibb elmləri namizədi."Doktor Vizus" Tibbi Oftalmoloji Mərkəzin baş həkimi*

Cəfərli Tahir Barat oğlu 1970-ci il martın 24-də Bakıda anadan olub.

1986-cı ildə 223 nömrəli orta məktəbi bitirib, N.İ.Piroqov adına 2-ci Moskva Dövlət Tibb İnstitutunun müalicə fakültəsinə qəbul olunub.

Göz xəstəlikləri kafedrası yanında elmi dərnəkdə fəal iştirak edib, tələbə elmi konfranslarında daim çıxış edib, Lenin ordenli 2-ci Moskva Dövlət Tibb İnstitutunun həvəsləndirici diplom və fərmanları ilə təltif olunub.

T.Cəfərli 1993-cü ildə Rusiya Dövlət Tibb Universitetinin (Moskva) müalicə fakültəsini əla qiymətlərlə bitirib. 1993-1995-ci illərdə Rusiya Dövlət Tibb Universitetinin göz xəstəlikləri kafedrasında klinik ordinaturada "göz xəstəlikləri" ixtisası üzrə təhsil alıb. 1995-ci ildə həmin kafedrada da "göz xəstəlikləri" ixtisası üzrə aspiranturada oxuyub.

T.Cəfərli 1993-1995-ci illərdə paralel olaraq Rusiya Dövlət Tibb Universitetinin normal anatomiya kafedrasının tədris laboratoriyasının müdiri işləyib. 1995-ci ildə "Buynuz qişası regenerasiyasının yeni stimulyatoru - 2 faizli betamesil mazı gözün ön şöbəsi xəstəliklərinin müalicəsində" mövzusunda dissertasiya müdafiə edib. Elə həmin il ona tibb elmləri namizədi elmi dərəcəsi verilib.

1995-ci ildən bu günədək N.İ.Piroqov adına Rusiya Milli Tədqiqat Tibb Universitetinin göz xəstəlikləri kafedrasının böyük elmi işçisidir, 1997-ci ildən isə "Oko-Eksimer" ("Doktor Vizus") Görmə Korreksiyası Tibbi Oftalmoloji Mərkəzin baş həkimidir. "Doktor Vizus" Oftalmoloji Mərkəzi Moskva Oftalmoloji Klinik Xəstəxanasının bazasında yerləşir. "Doktor Vizus" Mərkəzi Rusiya Diplomdansonrakı Təhsil Tibb Akademiyası tərəfindən himayə olunur.

T.Cəfərli tərəfindən görmə orqanının müxtəlif patologiyalarında 30 mindən çox unikal lazer əməliyyatı aparılıb. Qlaukoma və yüksək ambliopiyanın müəllif müalicə metodu hazırlanıb, RF-nin 6 patenti, şəhər səhiyyəsi üçün sosial proqramların və texnologiyaların hazırlanmasında iştirakına görə Moskva Hökumətinin 2 qrantı əldə edilib.

Onun rəhbərliyi ilə “Doktor Vizus” Tibb Mərkəzi Moskvanın aparıcı oftalmoloji müəssisələrindən birinə çevrilib.

O, I dərəcəli Hippokrat ordeni, “Sankt-Peterburqun 300 illiyi şərəfinə” yubiley medalı, “Admiral N.Q.Kuznetsovun 100 illiyi” yubiley medalı, RF Prezidenti və Moskva Hökumətinin fəxri fərmanları, RF FTB və Müdafiə Nazirliyinin, Rusiya Dövlət Tibb Universitetinin və Rusiya Tibb-Texnika Elmləri Akademiyasının fərmanları ilə təltif edilib.

T.Cəfərli Rusiya Dövlət Tibb Universiteti və Rusiya Diplomdansonrakı Tibb Akademiyasının göz xəstəlikləri kafedralarında tələbələr və kursantlarla aktiv pedaqoji iş aparır.



## Cəfərov
## Məmməd Xanhüseyn oğlu

*K.İ.Skryabin adına Moskva Dövlət Veterinar Təbabət və Biotexnologiya Akademiyasının parazitologiya və heyvanların invazion xəstəlikləri kafedrasının professoru*

Cəfərov Məmməd Xanhüseyn oğlu 1957-ci il oktyabrın 24-də Azərbaycan Respublikasının Neftçala rayonunun Qaçaqkənd kəndində anadan olub.

1982-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) kimya fakültəsini "kimya" ixtisası üzrə əla qiymətlərlə bitirib. Elə həmin ildə Azərbaycan Elmlər Akademiyasının (indiki Azərbaycan Milli Elmlər Akademiyası) Fiziki Kimya və Kataliz İnstitutunun məqsədli aspiranturasına qəbul olunub və aspirantura təhsilinin bütün dövrü üçün SSRİ Elmlər Akademiyasının Fizioloji Aktiv Maddələr İnstitutunun təbii maddələrin tədqiqinin struktur və nəzəri yolları laboratoriyasına göndərilib.

M.Cəfərov 1982-1985-ci illərdə SSRİ Elmlər Akademiyası M.M.Şemyakin adına Bioüzvi Kimya İnstitutunun steroidlər kimyası laboratoriyasında təcrübə keçib.

1988-ci ildə kimya elmləri namizədi elmi dərəcəsini almaq üçün M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin kimya fakültəsində "C/D bağlanmasının "ikimərkəzli dövretmə" vasitəsilə steroidlərin izomerləşməsinin rentgenostruktur tədqiqi" mövzusunda dissertasiya müdafiə edib.

1986-1991-ci illərdə elmi işçi vəzifəsində çalışıb. 90-cı illərdə müxtəlif təşkilatlarda konsultant, kommersiya bölməsinin rəhbəri işləyib, LBO monokristallarının istehsalı və kardiotonik steroidlərin tam sintezi üzrə laboratoriya yaradıb.

M.Cəfərov 2005-ci ildən K.İ.Skryabin adına Moskva Dövlət Veterinar Təbabət və Biotexnologiya Akademiyasının üzvi və bioloji kimya kafedrasında dosent işləyib, 2014-cü ildən isə həmin akademiyanın parazitologiya və heyvanların invazion xəstəlikləri kafedrasının professorudur. Eyni vaxtda HTC-nin üzvü olub, "Elmi-mühəndislik problemləri mərkəzi" RİT-də biotexnologiyalar və əczaçılıq şöbəsinin rəisi, Rusiya Elmlər Akademiyası N.D.Zelinski adına Üzvi Kimya İnstitutunun aparıcı elmi işçisidir.

Hazırda geniş təsir spektri olan yeni veterinar və dərman vasitələrinin hazırlanması üzərində işləyir.

M.Cəfərov 65-dən çox elmi və tədris-metodik işlərin, o cümlədən "Steroidlər. Quruluşu, alınması, xüsusiyyətləri və bioloji əhəmiyyəti, təbabətdə və baytarlıqda tətbiqi" (S.Y.Zaytsevin və V.İ.Maksimovun həmmüəllifliyi ilə, 2010) dərs vəsaitinin müəllifidir. Bu kitab yazılarkən müəllif steroidlərin kimya və biologiyasını yığcam və anlaşıqlı dildə verməyə çalışıb, təbiətin steroid birləşmələrinin tibbdə, baytarlıqda, habelə kənd təsərrüfatında əhəmiyyətini göstərməyə çalışıb. Bundan başqa, M.Cəfərov ixtiralarına görə 4 patentin sahibidir.



## Cəfərov Nizami Nəcəf oğlu

*Geologiya-mineralogiya elmləri doktoru. "Asbest geoloji kəşfiyyat müəssisəsi" MMO-nun baş direktoru*

Cəfərov Nizami Nəcəf oğlu 1957-ci il iyunun 2-də Azərbaycan Respublikasının İsmayıllı rayonunun Təzəkənd kəndində anadan olub.

1979-cu ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetini (indiki Bakı Dövlət Universiteti) "geoloji çəkiliş, faydalı qazıntı yataqlarının axtarışı və kəşfiyyatı" ixtisası üzrə əla qiymətlərlə bitirib. Elə həmin ildə Kustanay vilayətinin Jitikara şəhərində SSRİ Sənaye Tikinti Materialları Nazirliyinin "Sentrgeolnerud" ekspedisiyasının geoloji kəşfiyyat partiyasında əmək fəaliyyətinə başlayıb, geoloq, baş geoloq, 1982-1996-cı illərdə isə partiyanın rəisi işləyib.

1988-1989-cu illərdə Yəmən Ərəb Respublikasına sement xammalı yatağının kəşfiyyatı üzrə müqavilənin texniki direktoru göndərilib.

1996-cı ildən indiyədək N.Cəfərov "Asbest geoloji kəşfiyyat müəssisəsi" MMO-nun baş direktorudur.

O, sənayedəki işini elmi fəaliyyəti ilə birləşdirib. 1981-ci ildə Sverdlovsk Dağ-Mədən İnstitutunun aspiranturasına qəbul olunub və 1985-ci ildə "Jitikar yatağında xrizotil-asbest yığınının geoloji yerləşmə şəraiti və onların kəşfiyyat metodikası" mövzusunda dissertasiya müdafiə edib. 1999-cu ildə isə Almatı şəhərində Beynəlxalq Akademik Assosiasiyanın nümayəndəliyində "Qazaxıstanın xrizotil-asbesti" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib.

N.Cəfərov 2001-ci ildə Beynəlxalq Mühəndislik Akademiyasının (Moskva) akademiki, 2003-cü ildə isə Qazaxıstan Respublikası Milli Mühəndislik Akademiyasının həqiqi üzvü (akademik) seçilib.

N.Cəfərovun bütün elmi və istehsal fəaliyyəti faydalı qazıntı yataqlarının öyrənilməsinin müxtəlif problemləri üzrə işlərin yerinə yetirilməsinə, yeraltı sərvətlərdən kompleks və səmərəli istifadə olunmasına yönəlib.

Müasir mobilizm nəzəriyyəsi əsasında alim tərəfindən xrizotil-asbest yataqlarının yaranmasının və qorunmasının geoloji-genetik modeli hazırlanıb, Qazaxıstanın mineragenik rayonlaşdırılması xəritəsi tərtib olunub və ölkədə xrizotil-asbestin mineral-xammal potensialı müəyyən edilib.

Asbest yataqlarının formalaşmasının N.Cəfərov tərəfindən hazırlanmış elmi modeli Qazaxıstanın faydalı qazıntı yataqlarının genezisi Atlasına daxil edilib və 2004-cü ildə İtaliyada Dünya Geoloji Konqresində təqdim olunub.

N.Cəfərovun rəhbərliyi altında Qazaxıstan və Rusiya ərazisində Cənubi Uralın çoxsaylı yataqlarının, o cümlədən qızıl, kobalt-nikel, nadir torpaq elementləri, kaolinlər, tikinti materialları, eləcə də Cənubi Uralda (Jitikar və Kiyembayev) iri xrizotil-asbest yataqlarının öyrənilməsi üzrə geoloji kəşfiyyat işləri yerinə yetirilir. Onun bilavasitə iştirakı və rəhbərliyi ilə Jitikarda - Qazaxıstanda yeganə nefrit yatağı kəşfiyyatının xüsusi metodikası hazırlanıb və qiymətləndirilməsi aparılıb.

N.Cəfərov "Xrizotil-asbest filizlərinin zənginləşdirilməsi tullantılarının emalı üsulları" tədqiqatının müəllifidir. Bu layihənin tətbiqi nəticəsində asbest filizlərinin zənginləşdirilməsi tullantılarından qızıl, maqnetit, kobalt-nikel və xromit konsentratları, odadavamlı qum və s. istehsal etmək olar.

N.Cəfərov 50-dən çox böyük elmi işin, 2 monoqrafiyanın və müxtəlif faydalı qazıntı ehtiyatlarına dair SSRİ, RF və Qazaxıstan Respublikası dövlət komissiyalarının təsdiqlədiyi çoxsaylı geoloji layihələrin və hesabatların müəllifidir.

2000-ci ildə onun "Qazaxıstanın xrizotil-asbesti" monoqrafiyası nəşr edilib. Bu əsərdə ilk dəfə Qazaxıstanın bütün xrizotil-asbest yataqları üzrə materiallar ümumiləşdirilib, onların geoloji-sənaye tipləri seçilib. Müəllifin ən böyük töhfəsi bu yataqların öyrənilməsinin metodik aspektlərini tədqiq etməsi olub.

N.Cəfərovun əkiz qardaşı, məşhur geoloq, geologiya-mineralogiya elmləri doktoru Füzuli ilə birgə yazdığı və 2002-ci ildə çap edilmiş "Jitikar filiz rayonunun (Kustanay Zauralyesi) faydalı qazıntıları" monoqrafiyası Jitikar filiz rayonunun təxminən bir əsrlik geoloji tədqiqinin nəticələrinə yekun vurur, bütün məlum yataqlar və filiz aşkaretmə mədənləri, qeyri-filiz faydalı qazıntıları və yeraltı sular üzrə geoloji materialları ümumiləşdirir.

N.Cəfərov 2003-cü ildən buraxılan və bu cür miqyaslı yeganə nəşr olan respublika elmi-texniki "Qorno-geoloqiçeskiy jurnal"ın nəşrinin təşəbbüskarı və baş redaktorudur, jurnalın redaksiyası paytaxtda və ya vilayət mərkəzində deyil, bilavasitə regional şəhərdə yerləşir.

N.Cəfərov 2009-cu ildə Jitikar rayon maslixatının 3 nömrəli Baykonur seçki dairəsindən deputat olub.

2005-ci ildə N.Cəfərova "Qazaxıstan Respublikası yeraltı sərvətlərinin fəxri kəşfiyyatçısı" adı verilib. O, bir neçə çağırış rayon və şəhər maslixatlarının deputatıdır. "Qazaxıstan Respublikasının müstəqilliyinin 10 illiyi" və "Qazaxıstan Respublikası müstəqilliyinin 20 illiyi" medalları, Kustanay vilayəti akiminin fərmanı ilə təltif olunub.



## Cəfərova
## Tahirə Ənvər qızı
*Fin ədəbiyyatı tərcüməçisi, yazıçı*

Cəfərova Tahirə Ənvər qızı 1940-cı il aprelin 19-da Bakıda anadan olub.

1957-ci ildə 124 nömrəli məktəbi qızıl medalla bitirib. Eyni dərəcədə həm riyazi, həm də ədəbi bacarığa malik olaraq və o zaman "fiziklər və liriklər haqqında" aparılan debatları nəzərə alaraq sənət seçimində fizikaya üstünlük verib - S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika fakültəsinə qəbul olunub, 1962-ci ildə oranı "nəzəri fizika" ixtisası üzrə qırmızı diplomla bitirib.

T.Cəfərova 1962-1964-cü illərdə Azərbaycan Elmlər Akademiyasının (indiki Azərbaycan Milli Elmlər Akademiyası) Fizika İnstitutunda kiçik elmi işçi işləyib. Sonra 1965-1968-ci illərdə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin məqsədli aspiranturasında yarımkeçiricilər kafedrasında professor V.L.Bonç-Bruyeviçin rəhbərliyi altında təhsil alıb, aspiranturanı qurtarandan Azərbaycan Elmlər Akademiyasının Fizika İnstitutunda (EAFİ) işləyib. Həmin vaxt onun taleyində köklü dəyişiklik baş verib, o, sənətini dəyişmək qərarına gəlib, çünki ədəbiyyat və xarici dillər onu uşaq vaxtından cəlb edirdi.

T.Cəfərova 1970-ci ildə Azərbaycan Xarici Dillər İnstitutunun (indiki Azərbaycan Dillər Universiteti) ingilis dili fakültəsinin qiyabi bölməsinə, 1972-ci ildə isə Moskvada M.Qorki adına Ədəbiyyat İnstitutuna qəbul olunub. Bu iki ali məktəbdə sessiyalar müxtəlif vaxtda keçirildiyi üçün o, iki təhsil müəssisəsini asanlıqla qurtarıb. 1970-1972-ci illərdə Morneftdə neft hasilatı platformasında ingilis dili tərcüməçisi işləyib.

T.Cəfərova 1973-cü ildə Moskvada SSRİ İnturisti yanında ali ingilis dili kursunu bitirib. Lakin şəxsi həyatındakı dəyişikliklə əlaqədar olaraq tezliklə peşə seçimində yenə də dönüş yaranıb. T.Cəfərova Ədəbiyyat İnstitutunda oxuyaraq özünün əsas nəsr seminarından başqa, V.Boqaçevin rəhbərliyi altında fin dilindən ədəbi tərcümə seminarına da gedib. Fin dilini öyrənərək 1981-1985-ci illərdə SSRİ Yazıçılar İttifaqının Xarici Komissiyasında tərcüməçi işləyib.

T.Cəfərovanın ilk hekayə və povestləri Bakıda "Literaturnıy Azerbaydjan" və "Azərbaycan" jurnallarında dərc edilib. 1976-cı ildə "Gənclik" nəşriyyatında T.Cəfərovanın ilk nəsr kitabı - Azərbaycan dilinə tərcümə edilmiş "Nigar" kitabı nəşr edilib.

1978-ci ildə “Yazıçı” nəşriyyatında rus dilində “Sarı cinslər” hekayələr və povestlər toplusu çapdan çıxıb.

T.Cəfərova 1984-cü ildən “Literaturnaya Rossiya” həftəlik məcmuəsində (“Zarubejnıy rasskaz” bölməsində), “Literaturnaya qazeta”da, “Literaturnıy Azerbaydjan”, “Gənclik” (“Molodost”) jurnallarında fin dilindən tərcümələrini dərc etdirib.

1985-ci ildə “Biblioteka inostrannoy literaturı” (Moskva) seriyasında T.Cəfərovanın tərcüməsində fin klassiki Veyo Merinin “Bir dollarlıq nahar” adlı ilk hekayə və povestlər toplusu çıxıb. Fin dilindən çoxsaylı tərcümələr “Biblioteka finskoy literaturı” seriyasında “Xudojestvennaya literatura” və “Raduqa” nəşriyyatlarında çap edilib.

1994-2000-ci illərdə T.Cəfərova Tampere Universitetində (Finlandiya) əvvəlcə slavyanşünaslıq fakültəsində, sonra fin ədəbiyyatı və incəsənəti fakültəsində tanınmış ədəbiyyatşünas Yurye Varpionun kafedrasında işləyib. Bu işin yekunlarından biri Sankt-Peterburqda nəşr edilmiş müasir fin tənqidi, poeziyası və nəsri antologiyası - “Etot bezumnıy razumnıy mir” kitabı olub. Nəşrə kafedranın ədəbiyyatşünaslarının, habelə müasir fin şairləri və nasirlərinin şeirləri və hekayələri daxil edilib.

T.Cəfərova fin ədəbiyyatının məşhur tərcüməçisidir. Onun tərəfindən 15 kitab rus dilinə tərcümə edilib. Onların sırasında “Fin yumoru antologiyası”, “Müasir fin lirikası” poetik antologiyası, “Nişanlanma və digər fin pyesləri” dramaturgiya toplusu, “Finlandiya mədəniyyəti və ədəbiyyatı tarixinə giriş” kitabları var.

Xarici dillər institutlarında fin dilini öyrənən tələbələr onun antologiyaları üzrə diplom işi yazırlar. T.Cəfərovanın “Sever”, “Mir Severa”, “Peterburqskiye çteniya”, “Moskovskiy vestnik”, “NLO”, “Literaturnıy Azerbaydjan” jurnallarında da çoxsaylı tərcümələri var. Onun tərcümələrinə resenziyalar “Knijnoye obozreniye”, “Literaturnaya Rossiya”, “Literaturnaya qazeta”, “Nezavisimaya qazeta”, “Strastnıy bulvar, 13” həftəlik məcmuələrində, “Literaturnıy Azerbaydjan” jurnalında, “Bakinskiy raboçiy” və “Kaspiy” qəzetlərində dərc edilib.

2000-ci ildə T.Cəfərova yubileyi ilə əlaqədar olaraq Azərbaycan Yazıçılar Birliyinin Fəxri tərcüməçisi adını alıb. O, tərcümə sahəsində Tampere şəhər mükafatı laureatıdır (1995), bir neçə qrant, o cümlədən Fin Ədəbiyyatı İnformasiya Mərkəzinin (FƏİM) illik qrantını, fin qadın yazıçısı Layla Xietamiesin “Mnoqolikiy Mannerqeym” pyesinin tərcüməsinə görə “British Centre for Literary Translation” tərcümə mərkəzinin (2002), fin qadın yazıçısı Leyena Lextolaynenin “Mednoye serdtse” əsərinin tərcüməsinə görə Fransada Beynəlmiləl Ədəbi Tərcümə Mərkəzinin (CITL) qrantını qazanıb.

T.Cəfərova, həmçinin Tampere, Şanxay, Nyu-York və İstanbulda tərcüməçilərin beynəlxalq konqreslər və simpoziumlarının üzvüdür.



## Dəhnəvi
## Eldar Musa oğlu

*Kimya elmləri doktoru.*
*Kazan Dövlət Texnologiya Universitetinin ümumi kimya texnologiyaları kafedrasının professoru.*
*NİOST "Sibur holdinq" ASC-nin riyazi modelləşdirmə və layihələrin texnoloji ekspertizası şöbəsinin rəisi*

Dəhnəvi Eldar Musa oğlu 1966-cı il mayın 17-də Azərbaycan Respublikasının Şəki rayonunun Kiçik Dəhnə kəndində anadan olub.

1988-ci ildə Kazan Kimya-Texnologiya İnstitutunu "lakların, boyaların, lak və boya materiallarının texnologiyası" ixtisası üzrə əla qiymətlərlə bitirib və həmin institutun aspiranturasına qəbul edilib. Aspirant olarkən ictimai fəaliyyətlə aktiv məşğul olub.

E.Dəhnəvi 1988-ci ilin noyabrında həmfikirləri ilə postsovet məkanında ilk azərbaycanlı həmyerlilər cəmiyyətlərindən birini yaradıb və ona sədrlik edib.

1993-cü ildə texnika elmləri namizədi elmi dərəcəsini almaq üçün "Əridicilərin köməyi ilə hidroperoksid kumolun turşu-katalitik parçalanması prosesinin idarə olunması" mövzusunda namizədlik dissertasiyası yazıb. 2008-2010-cu illərdə Tatarıstan Respublikası Hökumətinin qrantı ilə Əmək və Sosial Münasibətlər Akademiyasında (Moskva) "korporativ menecment" ixtisası üzrə MBA proqramı (Master of Business Administration - Biznes Administrasiyası Magistri) çərçivəsində iqtisadi təhsil alıb. 2011-ci ildə "Fenol və asetonun birgə istehsalının optimallaşdırılması, əlavə məhsulların neft hasilatı reagentində kompleks emalı" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

E.Dəhnəvi 2001-ci ildə "EDXİM elmi istehsal mərkəzi" MMC-ni yaradıb, neftkimya sahəsində araşdırma aparan bu müəssisənin rəhbəri olub. Sonra neft quyularının və yeraltı anbarların hidroizolyasiyasında istifadə edilən "Smola PM-14" texnologiyasını hazırlayıb. Bu qətran Tatarıstanın neft və tikinti şirkətlərinin obyektlərində natura sınaqlarından uğurla keçib.

2003-cü ildə E.Dəhnəvi "Speskauçuk" ETİ-nin (Kazan) direktor müavini təyin edilib, institutda tiokol, poliefir və polieuretanların hazırlanmasına rəhbərlik edib, habelə onların əsasında məhsullar istehsal edib.

2005-2011-ci illərdə Kazan Texnologiya Universitetinin ümumi kimya texnologiyası kafedrasında pedaqoji fəaliyyətlə məşğul olub. Doktorluq dissertasiyasının

müdafiəsindən sonra kafedranın professoru seçilib. Universitetin magistr tələbələri üçün xüsusi kursları, o cümlədən "Qeyri-formal kinetika", "Texnoloji proseslər nəzəriyyəsinin əsasları", "Elmi tədqiqatlarda və texnoloji proseslərdə kompyuter texnikasının tətbiqi", habelə baza istehsalının tədris kompyuter modelinin, bir sıra sənaye proseslərinin elektron trenajorlarını hazırlayıb.

E.Dəhnəvinin pedaqoji fəaliyyəti elmi istehsalatla birləşib – Texnologiya Universitetinin "Panximtex" elmi-istehsalat mərkəzində aparıcı elmi işçi işləyərək kafedranın regionun sənaye müəssisələri ilə əlaqəsinə cavabdehlik daşıyıb, fenol və asetonun, propilen oksid və stirolun, baza monomerlərinin istehsalı üzrə müqavilələrin məsul icraçısı olub.

E.Dəhnəvinin işləri Rusiyanın nəhəng şirkətləri "Nijnekamskneftexim" ASC-ni, "Kazanorqsintez" ASC-ni maraqlandırıb. O, regionun müəssisələrinə, o cümlədən aztonnajlı kimya ilə məşğul olan müəssisələrə konsultasiya verib və beləliklə, istehsal sahəsində, xüsusilə neft-kimyada böyük təcrübə toplayıb. 2011-ci ildə nəhəng neft-kimya şirkəti "Sibur holdinq" ASC-yə dəvət alıb.

2012-ci ilin əvvəlindən holdinqin tədqiqat mərkəzində - Rusiyada kimya texnologiyaları üzrə ən böyük elmi mərkəzdə işləyib, holdinqin tematik istiqamətləri üzrə elmi araşdırmalarına rəhbərlik edib.

E.Dəhnəvinin elmi və praktik maraq sahəsi neft-kimyanın mühüm aspektlərini, o cümlədən oksigen tərkibli məhsulların texnologiyasını, neft və qaz emalını, kimyəvi-texnoloji proseslərin riyazi və kompyuter modelləşdirilməsini, sənaye istehsalının texniki müayinəsini, tədqiqat mərkəzlərində elmi işlərin təşkilini, elmi araşdırma və texnologiyaların qiymətinin müəyyən edilməsini, tədqiqat mərkəzlərinin böyük bizneslə qarşılıqlı əlaqəsini, yeni sənaye proseslərinin təşkilində risklərin azaldılmasını əhatə edir.



## Dəmirli
## Mehman Əlişah oğlu

*Hüquq elmləri doktoru, professor.*
*"Odessa Hüquq Akademiyası" Milli Universitetinin Avropa İttifaqı hüququ və müqayisəli hüquqşünaslıq kafedrasının professoru*

Dəmirli Mehman Əlişah oğlu 1964-cü il yanvarın 23-də Azərbaycan Respublikası Şamaxı rayonunun Ərəbqədim kəndində anadan olub.

1990-cı ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) hüquq fakültəsini, 1994-cü ildə isə həmin universitetin aspiranturasını (qiyabi) bitirib. 1992-1993-cü illərdə Azərbaycan Respublikası Prezidenti Aparatında dövlət-hüquq şöbəsində işləyib. 1994-2003-cü illərdə Bakı Dövlət Universitetinin dövlət və hüquq nəzəriyyəsi və tarixi kafedrası və Bakının digər ali məktəblərində dərs deyib.

M.Dəmirli 1998-ci ildə Odessa Dövlət Hüquq Akademiyasında (indiki "Odessa Hüquq Akademiyası" Milli Universiteti) "Azərbaycan Demokratik Respublikasının (1918-1920) dövlət quruluşu" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib. 2005-ci ildə isə Yaroslav Mudrı adına Ukrayna Milli Hüquq Akademiyasında (Xarkov) "dövlət və hüquq tarixi və nəzəriyyəsi" ixtisası üzrə "Tarixi-hüquqi idrakın predmet sahəsi: ənənə və yenilənmə (epistemoloji analiz)" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. 2007-ci ildə ona professor adı verilib.

M.Dəmirli 2004-cü ildən indiyədək "Odessa Hüquq Akademiyası" Milli Universitetinin Avropa İttifaqı hüququ və müqayisəli hüquqşünaslıq kafedrasında işləyir. Kafedranın üç baza fənnindən mühazirə oxuyur: "Müqayisəli hüquqşünaslıq", "Avropa İttifaqı hüququ", "Avropa Şurası hüququ".

O, aktiv elmi və elmi-metodik iş aparır. M.Dəmirlinin elmi işlərinin dairəsinə – hüquqi dərketmənin epistemoloji və metodoloji problemləri, hüquq elminin elmşünaslıq problemləri, Azərbaycanın hüquq tarixi, müqayisəli hüquq və Avropa hüququ məsələləri daxildir.

Azərbaycan, türk, rus, Ukrayna və ingilis dillərində 150-dən çox elmi və tədris-metodiki işlərin müəllifidir. Alimin əsas elmi xidmətlərinə Azərbaycanın hüquq tarixi üzrə ilk ümumiləşdirilmiş işlər, məsələn, "Azərbaycanın hüquq tarixi. Dərs vəsaiti" (Bakı, 1999, Azərbaycan dilində), "Azərbaycanın hüquq tarixi: cinayət hü-

ququ (qədim zamanlardan 1920-ci ilədək)" (Bakı, 1999, Azərbaycan dilində, həmmüəllif) daxildir.

M.Dəmirli tərəfindən Azərbaycanın hüquq tarixində ən mühüm dövrlərdən birinin – Azərbaycan Demokratik Respublikası dövrünün (1918-1920) kompleks və sistemli tədqiqi həyata keçirilib. Bu mövzuda bir neçə əsər, o cümlədən "ADR-in ali dövlət orqanları: təşkiletmənin və fəaliyyətin hüquqi əsasları" (Bakı, 1996), "Azərbaycanda dövlət hakimiyyətinin təşkili. 1918-1920-ci illər. Tarixi-hüquqi tədqiqat" (Odessa, 1998), "Ukrayna və Azərbaycanda parlament hüququ: irəliləyişlər və qüsurlar (1917-1920-ci illər)" (Odessa, həmmüəllif), "Azərbaycan Demokratik Respublikası (1918-1920)" (Ankara, 2002, toplu, türk dilində) əsərləri yazılıb.

O, tarixi-hüquqi idrakın yenilənməsi konsepsiyasını hazırlayıb, hüququn fəlsəfi-tarixi dərk edilməsi – tarix fəlsəfəsi baxımından hüquqi dərketmədə yeni istiqamətin imkanlarını, zəruriliyini və aktuallığını əsaslandırıb. Bu mövzuda "Tarixi-fəlsəfi hüquq – hüququn öyrənilməsində boşluqlar" (Bakı, 2000), "Qərbi Avropada tarixi-hüquqi idrakın təkamülü: mənbələr və ənənələr" (SPb., 2001), "Hüquq və tarix: epistemoloji problemlər (tarixi-hüquqi dərketmənin predmet və strukturu probleminin kompleks tədqiqi təcrübəsi)" (SPb., 2002), "Müasir istorioqrafiyada tarixi-hüquqi dərketmənin epistemoloji vəziyyət baxımından predmet sahəsi" (Odessa, 2002) adlı əsərləri nəşr edilib.

M.Dəmirli müqayisəli hüquqşünaslığın nəzəri və metodoloji problemlərinin araşdırılması mövzusunda elmi əsərlər, o cümlədən "Ukraynada müqayisəli hüquq elmi: nəzəri-metodoloji ənənələr (XIX–XX əsrin əvvəlləri). Elmi-tədris nəşri" (Odessa, 2007), "Comparative Law Hermeneutics: Cognitive Possibilities // Foundation of Comparative Law: Methods and Typologies" ("Hüququn müqayisəli hermenevtikası: dərketmə imkanları // müqayisəli hüquqşünaslığın əsasları: metodologiya və tipologiya" (2011), "Müqayisəli hüquqşünaslıq. 1-ci hissə. Status, predmet və sistem" (Odessa, 2013), "Hüquqi fəaliyyətin texnologiyalarının müasirləşdirilməsinin müqayisəli tədqiqinin metodoloji əsasları // Müasir dövrün hüquqi sistemlərində hüquqi fəaliyyət texnologiyalarının metodoloji əsasları: aktual problemlər" (monoqrafiya, həmmüəllif, redaktə və ön söz M.Dəmirli və başqaları, 2013) əsərlərin müəllifidir.

M.Dəmirli Rusiya Tarixi-Hüquqi Assosiasiyasının, Ukrayna Tarixi-Hüquqi Assosiasiyasının, Ukrayna Müqayisəli Hüquqşünaslıq Assosiasiyasının, habelə Beynəlxalq Hüquq Elmləri Akademiyasının Milli (Ukrayna) Komitəsinin üzvüdür. Elmi kadrların hazırlanması prosesinin fəal iştirakçısı, namizədlik və doktorluq disserta-

siyalarının müdafiəsi üzrə iki ixtisaslaşmış elmi şuranın üzvüdür. Onun rəhbərliyi altında "dövlət hüquq nəzəriyyəsi və tarixi", "siyasi və hüquqi nəzəriyyələr tarixi" və "hüquq fəlsəfəsi" ixtisasları üzrə 7 elmlər namizədi hazırlanıb. "Fəlsəfi hüquq və ümumi hüquq nəzəriyyəsi", "Müqayisəli hüquqşünaslıq", "Dövlət və hüququn aktual problemləri", "Siyasətin aktual problemləri" dövri nəşrlərinin redaksiya kollegiyasının üzvüdür.

Elmi-pedaqoji fəaliyyətində qazandığı uğurlara görə 2007-ci ildə "Ukrayna təhsil əlaçısı" nişanı ilə təltif edilib.



## Dosiyev
## Anar Adıgözəl oğlu

*Fizika-riyaziyyat elmləri doktoru.*
*Yaxın Şərq Texniki Universitetinin riyaziyyat kafedrasının professoru*

Dosiyev Anar Adıgözəl oğlu 1972-ci il oktyabrın 10-da Bakıda anadan olub.

1990-cı ildə Novosibirsk Dövlət Universitetinin fizika-riyaziyyat fakültəsinə qəbul olunub. 1993-cü ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinə (indiki Bakı Dövlət Universiteti) keçirilib və 1995-ci ildə oranı bitirib.

1995-1998-ci illərdə Azərbaycan Elmlər Akademiyasının (indiki Azərbaycan Milli Elmlər Akademiyası) Riyaziyyat və Mexanika İnstitutunun aspiranturasında təhsil alıb. "Li cəbrinin Banaxov təsvirində Teylor spektri" mövzusunda namizədlik dissertasiyasını müdafiə etdikdən sonra 1998-ci ildə Azərbaycan Elmlər Akademiyasının Riyaziyyat və Mexanika İnstitutunun funksional analiz şöbəsində elmi işə başlayıb. 1998-2001-ci illərdə institutda kiçik elmi işçi, 2002-2004-cü illərdə böyük elmi işçi vəzifələrində işləyib.

A.Dosiyev 2004-2006-cı illərdə Atılım Universitetinin (Ankara) dosenti, 2006-2008-ci illərdə isə həmin universitetdə professor olub. 2008-ci ildən Yaxın Şərq Texnika Universitetində işləyir.

2012-ci ildə M.V.Lomonosov adına MDU-da "Li Cəbrinin təsvirlərinin qeyri-kommutativ holomorf funksional hesabı" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib.

O, kvant funksional analizi və qeyri-kommutativ həndəsə sahəsində mütəxəssisdir. Onun elmi tədqiqatlarının əsas istiqamətləri qeyri-kommutativ analiz və cəbr, funksional analizin kvant modeli və qeyri-kommutativ cəbri həndəsəni əhatə edir.

A.Dosiyev tərəfindən qeyri-kommutativ operatorlar ailəsi üçün funksional hesablama metodu, informasiyanın kvant nəzəriyyəsi sahəsində tədqiqatlar aparmağa imkan verən müxtəlif kvant məkanlarının təsviri işlənib hazırlanıb.



## Eyvazova
## Kəmalə Əhliman qızı

*Tibb elmləri namizədi. S.N.Fyodorov adına "Gözün mikrocərrahiyyəsi" SETK rekonstruktiv okuloplastik cərrahiyyə bölməsinin müdiri*

Eyvazova Kəmalə Əhliman qızı 1975-ci ildə Azərbaycan Respublikasının Şamaxı rayonunda anadan olub.

1992-ci ildə Şamaxının 2 nömrəli orta məktəbini gümüş medalla bitirib. Elə həmin il N.Nərimanov adına Azərbaycan Tibb Universitetinə (indiki Azərbaycan Tibb Universiteti) qəbul olub və 1998-ci ildə oranı bitirib.

1998-2001-ci illərdə Moskvada S.N.Fyodorov adına "Gözün mikrocərrahiyyəsi" Sahələrarası Elmi-Texniki Kompleksdə (SETK) klinik ordinaturada təhsil alıb. Görmə orqanları xəstəliklərinin müayinə və diaqnostikasının əsas üsullarına yiyələnib.

2001-ci ilin noyabrından K.Eyvazova S.N.Fyodorov adına "Gözün mikrocərrahiyyəsi" SETK-nın refraksion cərrahiyyə şöbəsinin aspiranturasına qəbul olunub. Təhsil zamanı özünü elmi-klinik işlərdə müstəqil surətdə görə bilən məqsədyönlü, diqqətli, düşüncəli həkim kimi göstərib. Müasir oftalmologiyanın nailiyyətləri ilə mütəmadi maraqlanıb, Rusiya və xarici elmi ədəbiyyatları öyrənərək bilik səviyyəsini daim artırıb. A.İ.İvaşinanın rəhbərliyi altında "Presbiopik yaşda yüksək dərəcəli hipermetropiyanın intraokulyar korreksiyası" mövzusu üzərində çalışıb.

O, aspiranturada təhsil aldığı müddətdə müxtəlif oftalmoloji patologiyaların terapevtik və cərrahi müalicəsi metodlarına yiyələnib. Hazırda müstəqil şəkildə operativ müdaxilənin geniş spektrlərini - kataraktın fakoemulsifikasiyası, antiqlaukomatoz, skleroplastik və vazorekonstruktiv əməliyyatlar, müxtəlif növ refraksion əməliyyatlar, çəpgözlük zamanı əməliyyatlar həyata keçirir.

K.Eyvazova 2005-ci ildə tibb elmləri namizədi elmi dərəcəsi almaq üçün "Presbiopik yaşda yüksək dərəcəli hipermetropiyanın intraokulyar korreksiyası" mövzusunda dissertasiya müdafiə edib. Onun elmi işi 2006-cı ildə "Fyodorov oxuları" Ümumrusiya elmi-praktiki konfransı çərçivəsində keçirilən gənc alimlərin konfransında 2-ci yeri tutub.

2006-cı ildən S.N.Fyodorov adına "Gözün mikrocərrahiyyəsi" SETK klinikasının 9-cu oftalmoloji bölməsində həkim-oftalmoloq işləyib. 2007-ci ildən indiyədək

S.N.Fyodorov adına "Gözün mikrocərrahiyyəsi" SETK-nın rekonstruktiv okuloplastik cərrahiyyə bölməsinə rəhbərlik edir.

K.Eyvazova dəfələrlə elmi-praktiki konfranslarda iştirak edib, 14 elmi məqalənin müəllifidir. Dissertant olduğu zaman RF-nin 3 patentini, – onlardan 2-si apardığı iş çərçivəsində, 1-i RF patenti vermək üçün müsbət qərara görə, - alıb. Həmin iş S.N.Fyodorov adına "Gözün mikrocərrahiyyəsi" SETK-nın 2002-ci, 2003-cü və 2004-cü illərdə keçirilmiş elmi-praktiki konfranslarında, gözün refraksion və plastik cərrahiyyəsi üzrə III Rusiya simpoziumunda (Moskva, 2002), "Lazer refraksion və intraokulyar cərrahiyyə" elmi-praktiki konfransında (Sankt-Peterburq, 2002), oftalmocərrahiyyə üzrə III Avro-Asiya konfransında (Yekaterinburq, 2003), Rusiya oftalmoloqlarının VIII qurultayında (Moskva, 2005) müzakirə edilib.

A.Dosiyev 40-dan çox beynəlxalq səviyyəli və digər ölkələrin mütəxəssislərinə tanış olan elmi işin müəllifidir. Müxtəlif illərdə o, Rumıniya, Sloveniya, Polşa, Danimarka və Türkiyədə mühazirələr deyib. M.V.Lomonosov adına MDU-nun professorları ilə sıx əlaqə saxlayır. MDU-nun funksional analiz və funksiyanın nəzəriyyəsi kafedrasının seminarlarında dəfələrlə çıxış edib.

İdmanla fəal məşğul olur və hazırda universitet tələbələrinin sambo və cüdo güləşi üzrə məşqçisidir.



## Əbiyev
## Rahib Hidayət oğlu

*Texnika elmləri doktoru, professor.*
*Yakın Doğu Universitetinin kompyuter mühəndisliyi kafedrasının müdiri*

Əbiyev Rahib Hidayət oğlu 1966-cı il yanvarın 8-də Azərbaycan Respublikasının Cəlilabad rayonunun Həsənli kəndində anadan olub.

1982-ci ildə orta məktəbi bitirdikdən sonra M.Əzizbəyov adına Azərbaycan Neft və Kimya İnstitutuna (AzNKİ, indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti (ADNSU)) daxil olub. 1984-1986-cı illərdə həqiqi hərbi xidmətdə olub. 1989-cu ildə ali məktəbi "Sənaye istehsal proseslərinin avtomatlaşdırılması" ixtisası üzrə fərqlənmə diplomu ilə bitirib.

1990-1993-cü illərdə R.Əbiyev AzNKİ-nin avtomatlaşdırılmış idarəetmə sistemləri kafedrasında aspiranturada oxuyub, aspiranturanı bitirəndən sonra AzNKİ-nin "İstehsalatı intellektual idarəetmə sistemləri" elmi-tədqiqat laboratoriyasında işə başlayıb. 1997-ci ildə R.Əbiyev namizədlik dissertasiyası müdafiə edib. Onun elmi işi məlumatların işlənməsinin yeni metodlarının yaradılması və texnoloji proseslərdə mövcud olan dinamik obyektlərin eyniləşdirilməsi və onlara nəzarət üçün qurğular yaradılmasında bu metodlardan istifadə əsasında hazırlanmışdı. Nəzarət qurğularının yaradılmasında süni intellekt elementlərindən, o cümlədən qeyri-səlis məntiq və neyron şəbəkələri nəzəriyyəsindən istifadə edilmişdi. Dissertasiya müdafiə edəndən sonra R.Əbiyev AzNKİ-nın avtomatlaşdırılmış idarə sistemlərinin kafedrasının assistenti kimi işləməyə başlayır.

1999-cu ildə R.Əbiyev Şimali Kipr Türk Respublikasının (ŞKTR) Yakın Doğu Universitetinə (YDU), kompyuter mühəndisliyi kafedrasına işə dəvət edilir. O, müəllimlik fəaliyyəti ilə yanaşı, elmi tədqiqat işi ilə də fəal məşğul olur, Yakın Doğu Universitetinin və TÜBİTAK-ın (Türkiye Bilimsel ve Teknolojik Araştırma Kurumu – Türkiyə Elmi və Texnoloji Tədqiqat Şurası) bir sıra elmi layihələrinin rəhbəri və iştirakçısı kimi çıxış edir.

2001-ci ildə R.Əbiyev YDU-da Tətbiqi Süni İntellekt Elmi Tədqiqat Mərkəzi yaradır və o vaxtdan həmin Mərkəzin direktorudur. R.Əbiyevin elmi fəaliyyətinin nəticələrinə görə 2002-ci ildə ona dosent elmi adı, 2009-cu ildə isə professor elmi adı verilib. 2009-cu ildən R.Əbiyev YDU-nun kompyuter mühəndisliyi kafedrasının müdiridir.

R.Əbiyevin 7 kitabı və 200-dən çox məqaləsi dərc olunub. Onun 50-dən çox məqaləsi SCI (Science Citation List) "WEB of Knowledge" məlumat bazasına daxil edilib.

R.Əbiyevin elmi-tədqiqat işləri, əsasən, süni intellekt elementlərindən istifadə edilməklə məlumatların işlənməsinin yeni metod və modellərinin yaradılmasına aiddir. O cümlədən: dinamik obyektlərin eyniləşdirilməsi və onlara nəzarət sistemləri üçün qeyri-səlis məntiq, genetik alqoritm və neyron şəbəkəsi əsasında adaptiv hibrid idarəetmə sistemlərinin işlənib hazırlanması. Bu halda R.Əbiyev qradiyent və genetik alqoritmlərdən istifadə edilməklə kontrollerlər hazırlanması üçün öyrədici alqoritmlər (qeyri-səlis məntiqdən və genetik alqoritmdən istifadə edilməklə portfolionun yeni optimallaşdırma modeli) yaradıb. Bu modeldə gözlənilən mənfəətin qeyri-səlis olması və investor tərəfindən üstünlük verilən mümkün riskin qeyri-səlis olması nəzərə alınaraq, risk ilə mənfəət arasında seçim üçün kompromisli şans imkanı müəyyən edilir. Hazırlanmış model testləşdirilib və İstanbul fond birjasında qiymətli kağızların optimal portfelinin seçimi üçün istifadə edilib.

R.Əbiyevin elmi işlərinin bir hissəsi gözün qüzehli qişası və barmağın izi əsasında biometrik sistemlərin yaradılmasına aiddir. İnsanların tanınması üçün biometrik eyniləşdirmə sistemlərinin modelləri insan gözünün qüzehli qişalarının sürətli seqmentasiyası və neyron şəbəkələrindən istifadə edilməklə gözün qüzehli qişasının təsnifatı alqoritmlərinə əsaslanır. Fraktal həndəsə əsasında müxtəlif mətn təsvirlərinin tanınması metodlarının işlənib hazırlanması da R.Əbiyevin tədqiqatlarının bu istiqamətinə yaxındır.

R.Əbiyev qeyri-xətti dinamik obyektlərin eyniləşdirilməsi və onlara nəzarət üçün, həmçinin zaman sıraların proqnozlaşdırılması üçün qeyri-səlis məntiq, neyron şəbəkəsi və veyvlet texnologiyası əsasında yeni idarəetmə sistemləri yaradıb. Onun modellərində qeyri-səlis məntiq, neyron və veyvlet texnologiya yanaşmaları inteqrasiya olunub. Bundan başqa, R.Əbiyev ikinci tip qeyri-səlis sistemlərdən və neyron şəbəkəsindən istifadə edərək, qeyri-xətti obyektlər üçün nəzarət qurğuları hazırlayıb və onları müxtəlif qeyri-xətti gərginlikli sabit cərəyan mühərriklərinə nəzarət üçün tətbiq edib. O, yuxarıda göstərilən metodlardan istifadə edərək müştərilərin krediti ödəmə qabiliyyətinin qiymətləndirilməsi, elektrik cərəyanı istehlakının, valyutaların məzənnə dəyişikliklərinin, fond birjasında tərəddüdlərin proqnozlaşdırılması üçün hibrid intellektual sistemlər işləyib hazırlayıb.

2009-cu ildə R.Əbiyev "Robotika" adlı elmi-tədqiqat qrupu təşkil edib və bu qrupda öz tələbələri ilə birlikdə müxtəlif intellektual robotlar və helikopterlər yaradıb.

R.Əbiyevin rəhbərliyi altında 4 doktorluq və 40-dan çox magistr dissertasiyası müdafiə edilib.

R.Əbiyev fəal alimdir. O, kompyuter mühəndisliyi və elektron-elektrik mühəndisliyi kafedralarında doktorluq dissertasiyalarının müdafiəsi üzrə elmi şuraların üzvü, kompyuter mühəndisliyi kafedrasında bakalavriat və magistratura üzrə münsiflər heyətinin sədridir. Bundan başqa, R.Əbiyev mühəndislik və süni intellekt üzrə çoxsaylı beynəlxalq konfransların proqram və təşkilat komitələrinin üzvü olub.

R.Əbiyevin elmi fəaliyyətdə qazandığı uğurlara görə Yakın Doğu Universiteti ona bir sıra mükafatlar təqdim edib.



## Əfəndiyev
## Aydın Məmməd oğlu

*Texnika elmləri doktoru, professor.*
*N.İ.Vavilov adına Saratov Dövlət Aqrar Universitetinin ASK müəssisələrinin enerji təminatı kafedrasının professor*

Əfəndiyev Aydın Məmməd oğlu 1938-ci il noyabrın 25-də Azərbaycan Respublikasının Qax rayonunun İlisu kəndində anadan olub.

1960-cı ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunu (indiki Azərbaycan Texniki Universiteti) "avtomobil nəqliyyatının istismarı" ixtisası üzrə bitirib. 1960-1964-cü illərdə təyinatla Qazaxıstan SSR-in Cənubi Qazaxıstan regional idarəsindəki nəhəng avtonəqliyyat müəssisəsində işləyib və böyük mexanik vəzifəsindən baş mühəndis vəzifəsinədək yüksəlib. A.Əfəndiyev 1965-ci ildə Daşkənd Politexnik İnstitutunda mühəndis-tədqiqatçı, 1966-1970-ci illərdə V.İ.Lenin adına Xarkov Politexnik İnstitutunun daxili yanma mühərrikləri kafedrasının aspirantı, böyük elmi işçisi olub. 1970-ci ildə Özbəkistan KP MK-nın dəstəyi ilə bu respublikanın Təhsil Nazirliyi tərəfindən Xarkovdan geri çağırılaraq Buxaraya, əvvəlcə DaşPİ-nin filialının, sonradan yeni texniki ali məktəbin açılması üçün göndərilib.

O, 1970-1977-ci illərdə dosent, mexanika kafedrasının müdiri, DaşPİ filialı direktorunun tədris və elmi işlər üzrə müavini, 1975-1985-ci illərdə 1977-ci ildə fəaliyyətə başlayan Buxara Texnoloji İnstitutunun kənd təsərrüfatı maşınları kafedrasının müdiri və gecə-qiyabi təhsil üzrə prorektoru vəzifələrində işləyib. A.Əfəndiyev bu institutun açılmasının əsas təşkilatçılarından biri olub.

"Özbəkqazsənaye" trestinin nəqliyyat müəssisələri, "Buxaraqazsənayetikinti", "Buxarairtikinti" və digər trestlərlə real istehsalat məsələlərinin həllinə dair aparılan fasiləsiz elmi əməkdaşlıq 1985-1988-ci illərdə A.Əfəndiyevə texnika elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya işini tamamlamağa imkan verib. 1991-ci ildə o, Sankt-Peterburq Dövlət Aqrar Universitetində iki ixtisas - "İstilik mühərrikləri" və "Kənd təsərrüfatı texnikasının istismarı, təmiri və bərpası" üzrə doktorluq dissertasiyasını müdafiə edib. 1992-ci ilin yanvarında ona professor elmi adı verilib.

1988-1996-cı illərdə A.Əfəndiyev Buxara Texnoloji İnstitutunun istilik texnikası və istilik energetika qurğuları kafedrasının müdiri və institutun elmi işlər üzrə prorektoru işləyib. 1996-2002-ci illərdə nəqliyyat vasitələrinin istismarı kafedrasının müdiri olub.

1988-ci ildən indiyədək professor A.Əfəndiyevin elmi fəaliyyəti qeyri-ənənəvi və bərpa olunan energetika texnologiyaları və vasitələrinin hazırlanması, həmçinin kənd təsərrüfatı və istehsalat müəssisələrinin üzvi tullantılarından alternativ qaz və maye yanacağının əldə edilməsi ilə bağlıdır. O, 200-dən çox elmi əsər, o cümlədən 4 monoqrafiya və 8 dərs vəsaiti dərc etdirib, 4 müəlliflik şəhadətnaməsi, 3 patent alıb. A.Əfəndiyev tərəfindən 2 doktor və 5 elmlər namizədi hazırlanıb. 2005-ci ildə üzvi tullantılardan bioqaz emalı zamanı alınan ekoloji təmiz biogübrələrin keyfiyyətinin texniki şərtləri işlənib.

Özbəkistan ali məktəblərində kiril əlifbasından latın qrafikasına keçid və rus dilində (qeyri-dövlət) məşğələlərə rəsmi qadağa qoyulması səbəbindən A.Əfəndiyev 2002-ci ildə Özbəkistanı tərk etmək məcburiyyətində qalır. N.İ.Vavilov adına Saratov Dövlət Aqrar Universiteti rektorunun dəvəti ilə KTMEİ–də yeni ixtisas - "müəssisələrin enerji təminatı" üzrə laboratoriya bazasının, təhsil prosesinin və kadr hazırlığının təşkili üçün Saratova köçür.

A.Əfəndiyev 2002-ci ildən idarəçilikdən imtina edərək N.İ.Vavilov adına SDAU ASK-nın müəssisələrin enerji təminatı kafedrasının professoru və 2005-ci ildə özü tərəfindən yaradılan "Biotexnoloji proseslərin qeyri-ənənəvi və bərpa olunan mənbələri və avtomatlaşdırılması" kafedralararası elmi-tədqiqat laboratoriyasının müdiri vəzifəsini tutur.

1985-ci ildə A.Əfəndiyevə "SSRİ ali təhsil əlaçısı" fəxri adı verilib. 2014-cü ildə o, Saratov DAU-nun "Ən yaxşı monoqrafiya" müsabiqəsinin qalibi olub. Onun "Bioqaz. Texnologiyalar və avadanlıqlar" işi 2-ci yerə layiq görülüb.



## Əfəndiyev
## Azər Həmid oğlu

*Fəlsəfə elmləri doktoru, professor.*
*MTU AİM-in ordinar professoru.MTU AİM-in menecment fakültəsinin şirkətin sosial təşkili araşdırmalar Mərkəzinin direktoru*

Əfəndiyev Azər Həmid oğlu 1947-ci il mayın 16-da Bakıda anadan olub.

1969-cu ildə V.İ.Lenin adına Moskva Dövlət Pedaqoji İnstitutunun tarix fakültəsini bitirib. SSRİ EA-nın Fəlsəfə İnstitutunda namizədlik dissertasiyasını, 1992-ci ildə isə "Şəxsiyyətin formalaşması: sosiologiya nəzəriyyəsinin əsas prinsipləri" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib.

1999-cu ildən A.Əfəndiyev Milli Tədqiqat Universitetinin "Ali İqtisad Məktəbi"nin (MTU AİM) menecment fakültəsində çalışır. 2003-2009-cu illərdə həmin fakültənin dekanı olub. Menecment fakültəsi məhz onun rəhbərliyi ilə yüksək inkişaf mərhələsinə çıxaraq RF-də menecment sektorunda ali təhsil sahəsində liderlərdən biri olub, bir sıra aparıcı xarici ali məktəb və elmi mərkəzlərlə əlaqələrini gücləndirərək beynəlxalq səviyyədə tanınıb. Menecment fakültəsinin məzunları əmək bazarında yüksək qiymətə malikdir.

2004-2010-cu illərdə A.Əfəndiyev insan resurslarının idarə olunması kafedrasının müdiri vəzifəsini icra edib. Onun rəhbərliyi altında MTU AİM-də "İnsan resurslarının idarə olunması" magistr proqramı və müvafiq elmi istiqamət yaradılıb. 2010-cu ildə A.Əfəndiyev MTU AİM-in menecment fakültəsində şirkətin sosial təşkili Mərkəzinə rəhbərlik edib.

A.Əfəndiyev təhsil və metodiki fəaliyyətini hər zaman sistematik nəzəri və empirik tədqiqat işləri ilə birləşdirib. Bununla yanaşı, irəli sürülən nəzəri konsepsiyaların zənginləşdirilməsi və sübutu üçün aktiv istifadə olunan empirik məlumatların nəzəri işləri və analizi arasındakı qırılmaz bağlılıq elmi fəaliyyətinin mühüm prinsipidir. Son illər o, bir sıra elmi-tədqiqat layihələrinə (o cümlədən aspirantların elmi işlərinə) rəhbərlik edib, kütləvi sosioloji tədqiqatlar aparıb. Bunun nəticəsi olaraq bir neçə kitab, o cümlədən ümumi sosiologiya üzrə dərs vəsaiti çap olunub, bir sıra monoqrafiyalar dərc edilib. A.Əfəndiyev ümumilikdə 80-dən çox məqalənin müəllifidir.

Ümumi sosiologiyanın nəzəri, metodoloji və empirik problemləri, təhsil sosiologiyası və idarəetmə sosiologiyası A.Əfəndiyevin elmi tədqiqat işlərinin əsas möv-

zularına daxildir. Ümumi sosiologiya üzrə onun redaktorluğu ilə hazırlanan dərs vəsaiti RF Təhsil Nazirliyi tərəfindən tövsiyə olunub. Biznesin sosiologiyası və şirkətin sosial təşkili problemləri son 10 ildə A.Əfəndiyevin elmi işlərinin əsas mövzularından biridir.

A.Əfəndiyev aparıcı xarici elmi mərkəzlərlə beynəlxalq elmi-tədqiqat əməkdaşlığını aktiv surətdə inkişaf etdirir. Hazırda Şirkətin Sosial Təşkili Araşdırmalar Mərkəzi bir sıra Avropa ölkələrində fəaliyyət göstərən həmkarları ilə sıx əlaqələr yaradıb. Xarici nəşrlərdə bir sıra məqalələr (dərc olunan və ya resenziyaya təqdim edilən), həmçinin beynəlxalq elmi konfranslar çərçivəsində sosial münasibətlər və biznesin sosial təşkili problemlərinə həsr olunan və xarici məruzəçilərin iştirakı ilə hər il keçirilən xüsusi seksiyaların təşkili bu əməkdaşlığın nəticəsidir.



## Əfəndiyev
## Məsud Arif oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*"Helmholtz" Elmi-Tədqiqat Mərkəzinin dinamik sistemlər şöbəsinin müdiri*

Əfəndiyev Məsud Arif oğlu 1953-cü il oktyabrın 21-də Azərbaycan Respublikasının Zaqatala rayonunda qulluqçu ailəsində anadan olub.

1970-ci ildə Zaqataladakı Ş.Qurbanov adına 3 nömrəli məktəbi qızıl medalla bitirərək bu məktəbin ilk medalçısı olub. Elə həmin il S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinə (indiki Bakı Dövlət Universiteti) qəbul olunub.1975-ci ildə M.V.Lomonosov adına MDU-nun mexanika-riyaziyyat fakültəsində diferensial idarəetmələr kafedrasında diplom işi yazıb. 1975-1978-ci illərdə M.V.Lomonosov adına MDU-nun aspiranturasında oxuyub. 1980-ci ildə namizədlik dissertasiyasını müdafiə edib. 1979-1990-cı illərdə Azərbaycan EA-nın Riyaziyyat və Mexanika İnstitutunda işləyib.

M.Əfəndiyev 1990-cı ildə elm sahəsində nailiyyətlərinə görə Aleksandr fon Humboldt adına nüfuzlu mükafat almış ilk azərbaycanlı alimdir. Beynəlxalq jürinin təsdiqi ilə layiq görüldüyü bu mükafat ona alman hökuməti tərəfindən təqdim olunub. Bu, AFR-də ən nüfuzlu mükafat sayılır. Həmin mükafatı almış 49 alimin son nəticədə "Nobel" mükafatına layiq görülməsi buna sübutdur.

1991-ci ilin əvvəlindən M.Əfəndiyev Azərbaycan vətəndaşlığını saxlamaqla Almaniyada yaşayır və işləyir. 1998-ci ildə fizika-riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün Azad Berlin Universitetində (Freie Universität Berlin – Habilitation) dissertasiyasını müdafiə edib. Sonra isə Azad Berlin Universiteti, Ştutqart Universiteti və Münxen Texniki Universitetində işləyib və mühazirələr oxuyub. 2007-ci ildən Münxenin "Helmholtz" Elmi-Tədqiqat Mərkəzinin (Institute of Biomathematics and Biometry) dinamik sistemlər şöbəsinin müdiridir.

M.Əfəndiyevin elmi maraq spektri çox genişdir. O, qeyri-xətti analiz və riyazi fizikanın qeyri-xətti tənliklərin kifayət qədər geniş sinfinin qlobal həlli üçün yeni topoloji invariant düzülüşü üzrə mütəxəssisdir. M.Əfəndiyev tərəfindən əldə olunan topoloji invariantlar lokal və qlobal bifurkasiya terminlərində qeyri-xətti sistemlərin kifayət qədər geniş sinfinin keyfiyyətli dəyişməsini analiz etməyə şərait yaradır.

Bundan başqa həmin topoloji invariantlar ona bağlı sahələr üçün Riman-Hilbert qeyri-xətti məsələnin tamamlanmış nəzəriyyəsini qurmağa imkan verib.

Onun tərəfindən biologiya, tibb, ekologiya, mexanika və fizikada məsələlərin riyazi modelləşdirilməsi zamanı yaranan, təkamül tənliklərinə uyğun olan dinamik sistemlərin attraktorlarının yeni sinifləri yaradılıb və ilk dəfə sistematik öyrənilib.

Son zamanlar M.Əfəndiyevin elmi tədqiqatlarının əsas istiqamətləri biologiya, ekologiya və tibb sahələri, müvafiq riyazi modellərin qurulması ilə sıx bağlıdır.

Əlavələrdə meydana çıxan müstəqil və qeyri-müstəqil riyazi modellərin etibarlılığını təyin etməyə imkan verən vacib və kafi şərtlər ilk dəfə M.Əfəndiyev tərəfindən əldə edilib. Bu meyarların xüsusiyyətləri onların biologiya, ekologiya və tibb sahələrində problemlərin riyazi modellənməsi zamanı ortaya çıxan həm deterministik, həm də stoxastik tiplər kimi sonsuz ölçülü dinamik sistemlər üçün asanlıqla yoxlanıla və tam tətbiq oluna bilməsindədir.

M.Əfəndiyevin bu tədqiqatları mikrobioloqlar, həkimlər, mühəndislər, fiziklər, riyaziyyatçılar və başqaları ilə müştərək aparılıb.

Bavariya Elmlər Akademiyasının prezidenti, professor K.N.Hoffmannın (1749-cu ildən fəaliyyət göstərən bu akademiyanın üzvləri arasında Aleksandr və Vilhelm Humboldt, Maks Plank, Albert Eynşteyn, Verner Heyzenberq və Almaniyanın başqa bu kimi “Nobel” mükafatı laureatları yer alıb) azərbaycanlı alim haqda dedikləri: “Əfəndiyev... həm nəzəri, həm də tətbiqi riyaziyyatda fundamental nəticələr əldə edən nadir ekspertlərdən biridir. Və biz onun yanımızda, Almaniyada olmasından şadıq. O, şübhəsiz ki, Bavariya Elmlər Akademiyasının üzvü olmağa layiqdir və biz onu Akademiyamızın üzvləri arasında görməkdən məmnun olardıq. Lakin Akademiyanın nizamnaməsinə görə Akademiyanın həqiqi üzvü yalnız Almaniya vətəndaşları ola bilər...”.

M.Əfəndiyevin Yaponiya, Almaniya, ABŞ və İsveçrədə çap olunan və onun elmi maraqlarının geniş spektrini əks etdirən 5 monoqrafiyası buna sübutdur. Ümumilikdə isə o, dünyanın tanınmış jurnallarında dərc edilən 160-dan çox elmi işin müəllifidir. Bütün bu dövr ərzində M.Əfəndiyev dəvət olunan professor qismində Yaponiya, Avropa, Kanada və ABŞ-ın bütün aparıcı universitetlərində mühazirələr oxuyub.

Hazırda o, 10 nüfuzlu beynəlxalq jurnalın redaksiya heyətinin üzvü və “International Journal of Biomathematics and Biostatistics” jurnalının redaktorudur.

Onun rəhbərliyi və bilavasitə iştirakı ilə Almaniya, Yaponiya, Fransa, Kanada və Danimarkadan olan tədqiqatçılar 7 namizədlik dissertasiyası müdafiə edib.

M.Əfəndiyev Almaniya, Yaponiya, Fransa, Kanada və Danimarka universitetlə-

rində (Ph.D) namizədlik və (Habilitatoin) doktorluq elmi dərəcələrinin verilməsi üzrə elmi şuranın üzvüdür.

Görkəmli uğurlarına görə M.Əfəndiyev "Japan Society for the Promotoin of Science" (Yaponiya, 2005) və "Otto Monsted" (Danimarka, 2008) mükafatlarına layiq görülüb. Bu mükafatların laureatı olarkən o, Okayamada (Yaponiya) yaponiyalı riyaziyyatçıların illik qurultayında əsas məruzəçi kimi çıxış edib, 2008-ci ildə isə əsas məruzə ilə Danimarka riyaziyyatçılarının illik qurultayının açılışına dəvət olunub.

M.Əfəndiyev bir çox beynəlxalq konfrans və konqreslərin təşkilat komitələrinin üzvüdür və çox vaxt onların işində məruzəçi qismində iştirak edir.

Hazırda "Nonlinear Evolution Equations, Related Questions and Applications" müştərək Almaniya-Yaponiya konfransının sədridir (Almaniya tərəfdən).

2014-cü ildə Münxendə M.Əfəndiyevin 60 illiyinə həsr olunan "Biologiya, fizika və mexanikada qeyri-xətti təzahür" beynəlxalq konfransı keçirilib.



## Əfəndiyev
## Nazim Tofiq oğlu

*"Metalloinvest" İK ASC-nin baş direktorunun birinci müavini - kommersiya direktoru*

Əfəndiyev Nazim Tofiq oğlu 1963-cü il dekabrın 16-da Bakıda anadan olub.

1985-ci ildə Xarici Dillər Hərbi İnstitutunu, 1995-ci ildə Kinqston Universitetində (Böyük Britaniya) MBİ-nin (Master of Business Administration, tərcümədə – "Magistr Biznes-İnzibatçılıq") xüsusi Beynəlxalq Menecment proqramı üzrə Xalq Təsərrüfatı Akademiyasını bitirib. 1985-1992-ci illərdə Silahlı Qüvvələrin sıralarında xidmət edib.

1996-cı ildən N.Əfəndiyev "Sibirskiy alyuminiy" kompaniyasında Sayan alüminium zavodunun kommersiya direktorunun müavini, Samara metallurgiya zavodunun Ticarət Evinin direktoru vəzifələrində çalışıb, "Russkiy alyuminiy" kompaniyasının prokat divizionuna başçılıq edib. 2001-ci ildən "NOSTA" ASC və "Uralskaya Stal" kompaniyasında satış üzrə direktor işləyib. 2004-cü ilin mayında "Uralskaya Stal" kompaniyasının baş direktoru təyin edilib. 2006-2007-ci illərdə "Metalloinvest" İK ASC-nin icraçı direktoru olub.

2007-ci ildə "Uralmaşzavod" ASC-nin baş direktoru, 2007-2009-cu illərdə "Uralmaş" Maşınqayırma Korporasiyası" QSC-nin baş direktoru vəzifələrində çalışıb.

2008-2011-ci illərdə Sverdlovsk vilayəti Qanunverici Məclisinin Nümayəndələr palatasının deputatı olub. 2011-ci ildən Orenburq vilayəti V çağırış Qanunverici Məclisin deputatıdır.

2010-2012-ci illərdə "Uralskaya Stal" ASC-nin idarəetmə direktoru işləyib. 2011-ci ilin sentyabrından "Metalloinvest" İK ASC-nin baş direktorunun müavini olub. 2011-2012-ci illərdə "Metalloinvest" İK ASC-nin baş direktorunun dövlət hakimiyyəti orqanları ilə qarşılıqlı əlaqə üzrə müavini vəzifəsini tutub.

N.Əfəndiyev 2012-ci ildən "Metalloinvest" İK ASC-nin baş direktorunun birinci müavini - kommersiya direktoru vəzifəsində çalışır. 2014-cü ildən "Metalloinvest" İK ASC-nin direktorlar şurasının üzvüdür.

2014-cü ildə o, "Rusiya Federasiyasının fəxri metallurqu" adını alıb. Metallurgiya sahəsinin inkişafına verdiyi böyük töhfəyə görə N.Əfəndiyevə RF Sənaye-Ticarət Nazirliyinin idarə mükafatı təqdim olunub.



## Əfəndiyev
## Yalçın Rafiq oğlu

*Professor. Hesablama və tətbiqi riyaziyyat sahəsində fəlsəfə doktoru Texas Aqrar-Texniki Universitetinin hesablama elmləri kafedrasının müdiri*

Əfəndiyev Yalçın Rafiq oğlu 1971-ci il yanvarın 25-də Bakıda anadan olub.

Bakının 82 nömrəli orta məktəbində oxuduğu zaman riyaziyyat üzrə Respublika olimpiadasında iki dəfə uğurla çıxış edərək 1987-ci ildə I dərəcəli diplom, 1988-ci ildə isə riyaziyyat üzrə məktəblilərin Ümumittifaq olimpiadasında II dərəcəli diplomunu alıb.

1993-cü ildə M.V.Lomonosov adına MDU-nun mexanika-riyaziyyat fakültəsini fərqlənmə diplomu ilə bitirib. ABŞ-da təhsilini davam etdirərək 1999-cu ildə Kaliforniya Texnologiya İnstitutunda hesablama və tətbiqi riyaziyyat sahəsində fəlsəfə doktoru alimlik dərəcəsini alıb. Minnesota Universiteti nəzdində Tətbiqi Riyaziyyat İnstitutunda (ABŞ, Minnesota ştatı) ikiillik postdoktorluq təcrübəsindən sonra Y.Əfəndiyev 2001-ci ildə Texas Aqrar-Texniki Universitetində (Texas A&M University) professor assistenti olub. 2008-ci ildə ona professor adı verilib. Elə həmin il Texas A&M. Universiteti nəzdində Elmi-Hesablama İnstitutunun direktoru vəzifələrini icra edib, 4 ildən sonra isə həmin institutun direktoru olub. O, 2012-ci ildə Texas A&M Universitetində hesablama elmi kafedrasının müdiri vəzifəsinə təyin olunub.

Y.Əfəndiyev bir sıra mükafatın sahibidir: Fraunqofer-Bessel mükafatı (Aleksandr Humboldt Fondu tərəfindən təsis edilib), ən görkəmli dissertasiya işinə görə Kaliforniya Texnoloji Universiteti tərəfindən təqdim olunan "W.P Carey" mükafatı.

O, müxtəlif nüfuzlu elmi-tədqiqat jurnallarının redaksiya heyətlərinin üzvü, həmçinin "SIAM Multiscale Modeling and Simulation", "Geomathematics", "DCDS-B", "Numerical Mathematics", "International Journal for Uncertainty Quantification" jurnallarında redaktor köməkçisi, "Vıçislitelnaya i prikladnaya matematika" jurnalının baş redaktorudur. Bundan başqa, alim bir neçə peşəkar təşkilatın - SIAM, AMS, InterPore, SPE-nin üzvüdür.

Y.Əfəndiyev tanınmış elmi-tədqiqat jurnallarında 100-dən çox nəşrin müəllifi, həmçinin ABŞ, Yaxın Şərq və Avropada çoxsaylı konfrans və seminarların təşkilat-

çısıdır. Konfranslarda, o cümlədən "SIAM Geosciences"də çoxsaylı dəvətli və plenar məruzələrlə, həmçinin "East Asia SIAM"da əsas məruzəçi kimi və bir çox digər çıxışlar edib.

Y.Əfəndiyev İnterPor (InterPore – beynəlxalq ədədi məsaməli mühit təşkilatı) illik yığıncağının baş təşkilatçısı və dalğalı tənliklərin çoxmiqyaslı həlli metodlarına həsr olunmuş konfransın, Obervolfax seminarının və başqa tədbirlərin həmtəşkilatçısıdır.

Y.Əfəndiyev çoxsaylı qrantların, o cümlədən ABŞ Milli Elm Fondu, energetika şöbəsi və Amerika ordusu qrantlarının sahibidir. Onun elmi tədqiqatları bir neçə federal və sənaye təşkilatları tərəfindən maliyyələşdirilir. Bundan başqa, Y.Əfəndiyev lay rezervuarının modelləşdirilməsi sahəsində onun tədqiqatlarını dəstəkləyən bir neçə neft kompaniyalarından da qrantlar alıb. 2012-ci ildə müsabiqədə qalib gələn Y.Əfəndiyev Kral Abdullah adına Elmi-Texniki Universitetdə (KAUST, Səudiyyə Ərəbistanı) Ədədi Məsaməli Mühitlər Elmi-Tədqiqat Mərkəzi təşkil edib. Bu mərkəz məsaməli mühitlərin müxtəlif modelləşməsi sahələrində çalışan alimləri birləşdirir, habelə buraya bir neçə postdoktor və aspirant daxildir.

Y.Əfəndiyev çoxmiqyaslı modelləşdirmə metodları sahəsində aparıcı tədqiqatçıdır. Müxtəlif sahələrdə bir çox proses müxtəlif miqyaslarda üzə çıxır, lakin mövcud olan modelləşdirmə metodları bu mürəkkəb prosesləri adekvat təkrarlamağa qadir deyil. Buna görə də eyni məsələnin bir neçə miqyasda əldə olunan həlləri ilə fəaliyyət göstərə bilən modelləşdirmə metodlarını daxil etmək vacib idi. Y.Əfəndiyev kompleks məsələlərin geniş sinfi, o cümlədən qeyri-həmcins məsaməli mühitlərdə prosesləri nəzərdən keçirən məsələlər üçün çoxmiqyaslı modelləşdirmə metodları üzərində işləyib. O, müxtəlif miqyaslarla həlləri nəzərə alan məsaməli mühitlərdə axınların yeni modelləşdirmə texnikasını hazırlayıb. Y.Əfəndiyevin işlərinə çoxlu istinadlar edilir və müxtəlif tətbiqi məsələlərin modelləşdirilməsi üçün onun tədqiqatının nəticələrindən istifadə olunur.

Y.Əfəndiyev ABŞ və Almaniyada 12 aspirant hazırlayıb.



## Əfəndiyeva
## Mətanət Tələt qızı

*Tibb elmləri doktoru, professor.*
*RBTKEM-in baş həkiminin elmi-tədqiqat və klinik-sınaq işləri üzrə müavini*

Əfəndiyeva Mətanət Tələt qızı 1960-cı ildə Bakıda anadan olub.

1983-cü ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) "müalicə işi" ixtisası üzrə bitirib. Əmək fəaliyyətinə Bakı Şəhər Təcili və Təxirəsalınmaz Tibbi Yardım Stansiyasında təcili yardım həkimi kimi başlayıb. 1987-ci ildə Moskvada Ümumittifaq Elmi-Tibbi Reabilitasiya və Fiziki Terapiya Mərkəzi nəzdində aspiranturaya qəbul olub. Vaxtından qabaq tibb elmləri namizədi alimlik dərəcəsi almaq üçün hələ aspiranturanı bitirməzdən əvvəl "Xəstələrin qida borusunda cərrahi müdaxilədən sonra bərpaedici müalicəsi" mövzusunda dissertasiya müdafiə edib. 1990-2000-ci illərdə Azərbaycan Səhiyyə Nazirliyinin Qastroenterologiya ETİ-də elmi işçi vəzifəsində çalışıb.

M.Əfəndiyeva 2000-2003-cü illərdə Rusiya Bərpaedici Tibb və Kurortologiya Elmi Mərkəzində (RBTKEM - keçmiş Mərkəzi Kurortologiya və Fizioterapiya ETİ) doktorantura təhsili alıb. 2003-cü ildə məqsədli doktoranturanı bitirdikdən sonra tibb elmləri doktoru elmi dərəcəsi almaq üçün "Aşağı qida borusu sfinkterinin müxtəlif patologiya formalarında onun neyrohumoral tənzimlənməsinin qeyri-farmakoloji korreksiyası" mövzusunda dissertasiya müdafiə edib.

M.Əfəndiyeva 2004-cü ildən RBTKEM-də baş həkimin elmi-tədqiqat və klinik-sınaq işləri üzrə müavini vəzifəsində işləyir.

Onun elmi tədqiqatlarının nəticələrinə dair 160-dan çox elmi iş, o cümlədən metodiki tövsiyələr, həkimlər üçün vəsaitlər dərc olunub. RF Dövlət İxtiralar Reyestrində M.Əfəndiyeva ixtiralarına 7 patenti qeydiyyatdan keçirib.

Onun rəhbərliyi altında və elmi məsləhəti ilə tibb elmləri doktoru alimlik dərəcəsi almaq üçün 1 dissertasiya və tibb elmləri namizədi alimlik dərəcəsi almaq üçün 4 dissertasiya müdafiə edilib.

M.Əfəndiyevanın elmi tədqiqatları qastroenterologiya, kurortologiya və fizioterapiya üçün böyük praktiki əhəmiyyət kəsb edir. Onun elmi tədqiqatlarının nəticələri Moskvanın və Rusiyanın digər şəhərlərinin müalicə-profilaktika müəssisələrində tətbiq olunub.

2011-ci ildə M.Əfəndiyevaya RF Təhsil və Elm Nazirliyi nəzdindəki Ali Attestasiya Komissiyası tərəfindən professor elmi adı verilib.



## Əhədov
## Eldar Əlixas oğlu

*Rusiya yazıçısı.*
*Rusiya Yazıçıları İttifaqı və "XXI əsrin yazıçıları" İttifaqının üzvü*

Əhədov Eldar Əlixas oğlu 1960-cı il iyulun 19-da Bakıda anadan olub.

1983-cü ildə Leninqrad dağ-mədən institutunu bitirib. 1986-cı ildən Krasnoyarskda yaşayır.

E.Əhədov yaradıcılıq fəaliyyəti ilə yanaşı ixtisası üzrə də işləyir. Qütbarxası sahələrdən tutmuş monqol çöllərinə qədər, Yamaldan Tıvayadək tayqanın və tundranın bütün əlçatmaz yerlərində olub.

E.Əhədov – Sibir Yazıçılarının IV Qurultayının (2002) nümayəndəsi olub. Sibir Yazıçıları Assosiasiyasının Krasnoyarsk Diyar Yazıçılar Təşkilatının (1998), Rusiya Ədəbiyyat Fondunun üzvü, Rusiya Yazıçılar İttifaqının Krasnoyarsk regional bölməsinin (2003-2008) üzvüdür. Rusiya Markşeyderlər İttifaqının üzvüdür.

10 il ərzində (2000-2010) Krasnoyarsk Diyar Xalq Yaradıcılığı Dövlət Mərkəzi Ədəbiyyat Birliyinin və korlar və zəif görənlər üçün "Bılina" ədəbiyyat studiyasına rəhbərlik edib.

E.Əhədov 2010-cu ildə "Mirı Eldara" saytını və "Ozareniye" beynəlxalq rusdilli poetik müsabiqəsini yaradıb.

Yazıçının əsərləri "Molodaya qvardiya" (Moskva), "Murzilka" (Moskva), "Kukumber", "Sibirskiye oqni" (Novosibirsk), "Neizvestnaya Sibir" (Novosibirsk), "Den i noç" (Krasnoyarsk), "Obskaya raduqa" (Salexard), "Yamalskiy meridian" (Salexard), "Sibiryaçok" (İrkutsk), "Deti Ra" (Moskva) jurnallarında və digər nəşrlərdə dərc edilib.

E.Əhədov poeziya və nəsrin müxtəlif janrlarında yazılmış 30-dan çox kitabın, o cümlədən "Moya azbuka", "Veşşiy son", "Skrijali vetra", "Kamennaya azbuka", "Posmotri mne v qlaza", "Molitva o tebe", "Derjavnıy panteon", "Slavyanskiy panteon", "Nemetskiy panteon", "Kniqa lyubvi", "Puteşestviye oçarovannıx starikov", "Kuyumba", "Vasilkovoye nebo", "Dobrıye skazki", "Severnıye rasskazı i povesti", "Na Kraynem Severe" və digər kitabların müəllifidir. 2012-ci ildə E.Əhədovun beşcildlik seçilmiş əsərləri işıq üzü görüb. Yazıçının iki kitabı ABŞ-da, bir çox əsərləri isə Bolqarıstan, İsrail, Almaniya, Ukrayna, Qazaxıstan, Belarus və Azərbaycanda nəşr edilib.

E.Əhədov - milli-regional komponent üzrə “Krasnoyarsk diyarına səyahət” adlı unikal məktəb vəsaitinin həmmüəllifidir.

Onun yaradıcılığına D.Krupskaya, A.Karpenko, V.Antikina, Y.Liquzova, N.Lixtenfeld (Almaniya, Berlin), O.Ruçinski (Ukrayna), İ.Jurakovskaya (Ukrayna) və Y.Tuçiyev kimi ədəbiyyatşünas və tənqidçilərin məqalələri həsr olunub.

“Neizvestnaya Sibir” jurnalı (№4, 2010) E.Əhədovu Rusiyanın ən istedadlı yazıçılarından biri adlandırıb. Onun “Sənə dua edirəm” əsəri dünyanın 1313 dilinə, o cümlədən ərəb, yunan, ingilis, ispan, Çin dillərinə tərcümə olunub.

2010-cu il noyabrın sonunda Rusiya Milli Şöhrət Mərkəzi müqəddəs Apostol Andrey Pervozvannıy adına Fondun dəstəyi ilə E.Əhədovu “Svyatost materinstva” Ümumrusiya Ədəbiyyat Müsabiqəsinin qalibi elan edib. E.Əhədovun “Derjavnıy panteon” poeması Milli Şöhrət Mərkəzinin 2011-ci ilin noyabrında nəşr etdiyi “İstoriya Rossii v semeynıx predaniyax” kitabına daxil edilib.

E.Əhədov – V.M.Şukşin adına “Svetlıye duşi” (2006) Ümumrusiya Ədəbiyyat Müsabiqəsinin, “Serebryanoe pero Rusi” (2007) Milli Ədəbiyyat Mükafatının, “Zolotoye pero Rusi” (2007) Milli Ədəbiyyat Mükafatının, uşaqlar üçün əsərlərə görə “Zolotoy listopad” (Şərqi Sibir, 2008) ədəbiyyat mükafatının, Rusiya Müftilər Şurasının dəstəyi ilə keçirilən “Prorok Muxammed – milost dlya mirov” Ümumrusiya Poeziya Müsabiqəsinin, incəsənətdə mənəviyyat sahəsində “Na blaqo mira” (2012) milli mükafatının və s. laureatıdır. E.Əhədov ümumilikdə 22-dən çox müsabiqə, mükafat, festival, o cümlədən Valeri Qruşin adına Müəllif Mahnısı Ümumrusiya Festivalının (2011, 2 nominasiyada) laureatı və qalibidir.

E.Əhədovun yaradıcılığı Krasnoyarsk Diyar Administrasiyasının Mədəniyyət İdarəsinin (2001), Teleradioyayım, Mətbuat və informasiya İdarəsinin (2004), Krasnoyarsk başçısının (2006), Krasnoyarsk diyarının mədəniyyət nazirinin (2001) təşəkkürnamələri ilə qeyd edilib. 2002-ci ildə E.Əhədova yaradıcılıq fəaliyyətinə görə Azərbaycanın Rusiyadakı fövqəladə və səlahiyyətli səfiri R.Rizayev şəxsən təşəkkürünü bildirib.

2016-cı ilin aprelində E.Əhədov “Rospan İnterneşnl” SC-nin baş mütəxəssis-markşeyderi kimi markşeyder işinin inkişafına, Rusiya təkinin sərvətlərinin səmərəli istifadəsi və qorunmasına şəxsi töhfəsinə görə Rusiya Markşeyderlər İttifaqının gümüş döş nişanı ilə təltif edilib.

Sibirin Sayan bölgəsində Tyoplaya çayının iki qoluna E.Əhədovun adı verilib.



## Əhmədov
## Emil Tofiq oğlu

*Fizika-riyaziyyat elmləri doktoru.*
*"Kurçatov İnstitutu" Elmi-Tədqiqat Mərkəzinin Nəzəri və Eksperimental Fizika İnstitutunun aparıcı elmi işçisi*

Əhmədov Emil Tofiq oğlu 1972-ci il iyunun 19-da Almatıda anadan olub.

Bakıdakı 157 nömrəli orta məktəbdə oxuyub. 1995-ci ildə Moskva Fizika-Texnika İnstitutunu (MFTİ), 1998-ci ildə isə MFTİ-nin aspiranturasını fərqlənmə diplomu ilə bitirib və A.İ.Alixanov adına Nəzəri və Eksperimental Fizika İnstitutunda (NEFİ) namizədlik dissertasiyasını müdafiə edib. 1998-2009-cu illərdə NEFİ-də baş elmi işçi işləyib.

2005-ci ildə E.Əhmədov Albert Eynşteyn İnstitutuna (Potsdam, Almaniya) professor kimi işə dəvət olunub. 2008-ci ildən Moskva Fizika-Texnika İnstitutunun (MFTİ) nəzəri fizika kafedrasının (Dolqoprudnı, Moskva vilayəti) dosentidir.

E.Əhmədov 2009-cu ildə Birləşmiş Nüvə Tədqiqatları İnstitutunda (BNTİ) "Branın kvantlaşdırılması və ya sahə nəzəriyyəsinin geometrizasiyasına dair" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. Həmin ildən NSFİ–də aparıcı elmi işçi vəzifəsində işləyir.

2012-ci ildən E.Əhmədov MFTİ-nin nəzəri fizika kafedrasının dosenti, "Ali İqtisadiyyat Məktəbi" Milli Tədqiqat Universitetinin riyaziyyat fakültəsinin dosentidir. 2013-cü ildə İtaliyanın Piza şəhərindəki Ali Normal Məktəbə (Scuola Normale Superiore di Pisa) professor kimi dəvət olunub.

Birləşmiş Nüvə Tədqiqatları İnstitutu (Moskva vilayətinin Dubna şəhəri), Maks Plank Fiziki Cazibə İnstitutu (Albert Eynşteynin İnstitutu), Kawai, RIKEN Nəzəri Fizika Laboratoriyası ilə əməkdaşlıq edib.

Bundan əlavə, böyük auditoriya toplayan "Arxe" (Moskva) mədəni-maarif mərkəzində populyar mühazirələr oxuyur. Onun mühazirələrinin çoxsaylı yazılarına Rusiya Vençura şirkəti ilə birgə həyata keçirilən, müasir fundamental elm və alimlər haqqında layihə olan "PostNauka" internet-jurnalında da baxmaq olar.

E.Əhmədov kvant sahə nəzəriyyəsi, kvant qravitasiyası və superstrun, məkanın modulları, kombinatorika nəzəriyyəsi sahəsində mütəxəssisdir. O, riyaziyyat və nəzəri fizika üzrə 40-dan çox əsərin, o cümlədən bir monoqrafiyanın və dərs vəsaitlə-

rinin müəllifi və həmmüəllifidir. Onun əsərləri resenziyalı xarici jurnallarda da nəşr olunub. 2015-ci ildə "Qara dəliklərin doğulması və ölümü haqqında" kitabı çapdan çıxıb.

Səmərəli elmi fəaliyyətinə görə Atom Enerjisi üzrə Federal Agentliyin rəhbəri tərəfindən fəxri fərmanla təltif edilib (2006). "Sülalə" ("Dinastiya") fondunun təqaüdçüsü (2014-2016) olub, "Sülalə" ("Dinastiya") fondunun "Gənc elmlər doktoruna" təqaüdünü alıb (mart 2014).



## Əhmədov
## Etibar Əhmədağa oğlu

*Rusiya Federasiyasının əməkdar artisti.*
*Novosibirsk Musiqili Komediya Teatrının quruluşçu dirijoru*

Əhmədov Etibar Əhmədağa oğlu 1959-cu il iyunun 6-da Bakıda anadan olub.

1974-cü ildə Bakıda Asəf Zeynallı adına musiqi məktəbinin xor dirijorluğu şöbəsinə pedaqoq Q.Gimpileviçin sinfinə qəbul edilib və 1978-ci ildə oranı bitirib. Azərbaycan Dövlət Opera və Balet Teatrının baş xormeysteri N.Məlikovun rəhbərlik etdiyi dövlət imtahan komissiyasının tövsiyəsi ilə Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyasının (indiki Ü.Hacıbəyli adına Bakı Musiqi Akademiyası) xor dirijorluğu fakültəsinə - kafedranın dosenti L.Atakişiyevanın sinfinə daxil olub.

Təhsil illərində E.Əhmədov kamera xorunda xor artisti kimi çalışıb, Sovet İttifaqının şəhərlərində (Sevastopol, Simferopol, Tbilisi, İrəvan, Kişinyov) qastrol səfərlərində olub. 1983-cü ilin fevralında konservatoriyanı bitirən E.Əhmədov Ş.Qurbanov adına Bakı Musiqili Komediya Teatrına dirijor vəzifəsinə dəvət edilib. Onun Bakı Musiqili Komediya Teatrında dirijorluq etdiyi ilk tamaşa İ.Kalmanın "Hollandiyalı qadın" operettası olub.

1990-cı ildə E.Əhmədova Novosibirsk Musiqili Komediya Teatrında baş dirijor vəzifəsi təklif olunub. Novosibirskdə onun yaradıcılıq bioqrafiyasının yeni mərhələsi başlanıb.

1994-1996-cı illərdə E.Əhmədov M.Qlinka adına Novosibirsk Dövlət Konservatoriyasında SSRİ xalq artisti, professor A.Katsın sinfində təcrübə keçib. 2000-ci ildə M.Qlinka adına Novosibirsk Dövlət Konservatoriyasının aspiranturasını bitirib.

Novosibirsk Dövlət Akademik Opera və Balet Teatrında E.Əhmədov "Sehrli fleyta" (V.A.Motsart), "Yevgeni Onegin" (P.İ.Çaykovski), "Traviata" (C.Verdi) kimi tamaşalara dirijorluq edib. 2002-2008-ci illərdə Başqırdıstan Opera Teatrının dirijoru olub, Yekaterinburq Opera Teatrının Barnaul və Tomsk simfonik orkestrləri ilə əməkdaşlıq edib, orada ikinci dirijor kimi C.Verdinin "Traviata" əsərini (quruluşçu rejissor A.Stepanyuk) tamaşaya qoyub. E.Əhmədov 2007-ci ildə bu teatrla Portuqaliyaya qastrol səfərinə çıxıb.

E.Əhmədov 50-dən çox tamaşanın quruluşçu dirijoru olub. Buraya İ.Ştrausun "Yarasa" (Novosibirsk teatrında onun səhnəyə qoyduğu ilk tamaşa), "Vals kralı",

İ.Kalmanın “Skripkaçılar kralı”, “Cənab İks”, “Silva”, “Hollandiyalı qadın”, “Bayadera”, F.Leqarın “Qraf Lüksemburq”, “Şən dul qadın” operettaları, K.Porterin “Kankan”, F.Lounun “Mənim gözəl xanımım”, A.Jurbinin “Arabaçı və kral” müziklləri, O.Feltsmanın “Çarleya xala”, L.Solinin “Xanımlar və qusar” musiqili komediyaları, V.Domoratskinin “Aylı gün” müzikli, bəstəkar C.Rossininin “Sevilya bərbəri” operasının motivləri əsasında “Fiqaro burada!” musiqili komediyası, V.Pleşakın “Peterburqlu inkoqnito”, M.Samoylovun “Don Juan. İlk məhəbbət” müziklləri, V.Baskinin “İsveç kibriti”, G,Kançelinin “Xanuma”, A.Kolkerin “Gürzə” musiqili komediyaları, “Məhəbbət şeypurları”, “Mavi işıq” konsert proqramları və s. daxildir.

2005-ci ildə E.Əhmədova incəsənət sahəsindəki xidmətlərinə görə Rusiya Federasiyasının əməkdar artisti fəxri adı verilib. 2001-ci ildə F.Leqarın “Qraf Lüksemburq” tamaşası ilə, 2008-ci ildə İ.Kalmanın “Silva” operettasına, 2009-cu ildə isə A.Kolkerin “Gürzə” müziklinə görə “Ən yaxşı musiqili teatr dirijoru” nominasiyasında “Qızıl maska” Rusiya milli teatr mükafatına namizəd olub. Sonuncu tamaşa ona layiqli mükafatı qazandırıb.

Hazırda E.Əhmədov Novosibirsk Musiqili Komediya Teatrında quruluşçu dirijor işləyir.



## Əhmədov
## Əsgər Cahangir oğlu

*Texnika elmləri doktoru, professor.*
*Volqoqrad Dövlət Aqrar Universitetinin yer quruluşu və kadastrlar kafedrası müdirinin müavini*

Əhmədov Əsgər Cahangir oğlu 1963-cü il fevralın 5-də Gürcüstan Respublikasının Dmanisi rayonunun Yaqublu kəndində çoxuşaqlı ailədə anadan olub.

1990-cı ildə Volqoqrad Dövlət Kənd Təsərrüfatı İnstitutunu bitirib. Diplom müdafiəsindən sonra Volqoqrad Dövlət Kənd Təsərrüfatı İnstitutunun kənd təsərrüfatı hidrotexniki meliorasiya və geodeziya kafedrasında laboratoriya müdiri kimi əmək fəaliyyətinə başlayıb, eyni zamanda, aspiranturada qiyabi təhsil alıb.

1996-cı ildə Ə.Əhmədov Moskvada namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə edərək texnika elmləri namizədi olub, 2006-cı ildə isə texnika elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. Namizədlik və doktorluq dissertasiyaları ayrı-ayrı kənd təsərrüfatı bitkilərinin müxtəlif üsullarla suvarılması ilə məşğul olan sahə təsərrüfatları barədə silsilə işləri əsasında hazırlanıb.

2012-ci ildə professor elmi adı alan Ə.Əhmədov meliorasiya, rekultivasiya və torpaqların mühafizəsi sahəsində tanınmış alimdir. Elmi tədqiqatlarının ümdə istiqamətlərini riyazi planlaşdırma tətbiq etməklə torpaqdaxili və damcı üsulu ilə suvarma sistemlərinin mühüm parametrlərinin əsaslandırılması təşkil edir.

Professor Ə.Əhmədovun bilavasitə iştirakı ilə Aşağı Volqaboyunun müxtəlif torpaq-iqlim şəraitində torpaqdaxili və damcılı suvarmanın inkişafı və nəzəriyyəsinin bir sıra mühüm istiqamətlərində nailiyyətlər əldə olunub. İlk növbədə, bu, hazırda müxtəlif kənd təsərrüfatı bitkilərinin becərilməsində istifadə olunan torpaqdaxili və damcı üsulu ilə suvarmaya, həmçinin çiləmə üsulu ilə suvarmanın fərqli rejiminə aiddir.

Araşdırmalar zamanı Ə.Əhmədov tərəfindən meliorasiya və suvarma sistemlərinin istismarı sahəsində orijinal nəticələr əldə edilib, torpağın köksalma qatında su rejiminin proqnozlaşdırılmasının torpaqdaxili və damcı ilə suvarma sistemləri xarakteristikasının əsas parametrləri ilə əsaslandırılmış riyazi modeli yaradılıb. İlk dəfə Volqa-Don çayarası yer şəraitində torpaqdaxili suvarmanın birtərəfli lokal quruluşu tədqiq olunub, Aşağı Volqaboyu şəraitində suvarma üsullarının kənd təsərrüfatı bitkilərinin məhsuldarlığına, artımına və inkişafına təsiri, eləcə də kənd təsərrüfatı bit-

kilərinin müxtəlif suvarılma üsullarının səmərəliliyinin enerji-iqtisadi qiymətləndirilməsi öyrənilib.

Ə.Əhmədov müxtəlif beynəlxalq konfrans, konqres və simpoziumlarda, sərgilərdə fəal iştirak edib. O, 300-dək elmi əsərin, o cümlədən 6 monoqrafiyanın və 8 dərs vəsaitinin müəllifi və həmmüəllifidir. "Şəhər mühitinin mühafizəsi və monitorinqi", "Şəhər ərazilərinin idarə edilməsi", "Təbiətin sahmana salınması investisiya layihələrində qiymətqoyma və smeta-maliyyə hesablamalar" dərs vəsaitləri ali aqrar təhsil müəssisələrinin yer quruluşu və kadastrlar istiqaməti və iqtisadi ixtisaslar üzrə təhsil alan tələbələri üçün dərslik kimi Rusiya Kənd Təsərrüfatı Nazirliyi tərəfindən buraxılıb. Son illər professor Ə.Əhmədov və onun tələbələri tərəfindən hazırlanmış 60 tədris-metodik və elmi-tədqiqat materialları Rusiyanın və xarici ölkələrin mərkəzi nəşriyyatlarında çap edilib.

Fəal alim olan Ə.Əhmədov torpaqların mühafizəsi, rekultivasiyası və meliorasiyası istiqamətində doktorluq dissertasiyalarının müdafiəsi üzrə ixtisaslaşdırılmış şuranın üzvüdür. O, aspirantura çərçivəsində yüksək ixtisaslı kadr hazırlığı sahəsində böyük iş aparır. Aparılan araşdırmalar prosesində əldə edilən elmi nailiyyətlərin bir çox nəticələri tədris prosesində istifadə olunur.

1990-cı ildən indiyədək Volqoqrad Dövlət Aqrar Universitetində çalışan Ə.Əhmədov orada müxtəlif illərdə müxtəlif vəzifələrdə işləyib: Volqoqrad Kənd Təsərrüfatı İnstitutunun kənd təsərrüfatı və geodeziya kafedrasının laboratoriya müdiri; Volqoqrad Dövlət Kənd Təsərrüfatı Akademiyasının təbiət quruluşu texnologiyaları kafedrasında assistent, dosent, professor; geodeziya və daşınmaz əmlak kadastrları kafedrasının professoru; yer quruluşu və torpaq kadastrı kafedrasının müdiri.

Ə.Əhmədov hazırda ekologiya-meliorasiya fakültəsinin metodik şurasının sədri, fakültə elmi şurasının üzvüdür.

Professor Ə.Əhmədov Moskvada "Qızıl payız" Rusiya aqrosənaye sərgisinin qızıl medalına (2008) və iki bürünc medalına (2010, 2014) layiq görülüb. "Volqoqrad Dövlət Kənd Təsərrüfatı Akademiyası qarşısında xidmətlərinə görə" 3-cü və 4-cü dərəcəli döş nişanları ilə təltif edilib.



## Əhmədov
## Şahin Yarməmməd oğlu

*Professor. Yaxın Şərq Universitetinin bədən tərbiyəsi və idman fakültəsinin dekanı*

Əhmədov Şahin Yarməmməd oğlu 1958-ci il yanvarın 1-də Bakıda anadan olub.

1981-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) müalicə işi ixtisası üzrə bitirib. 1981-1982-ci illərdə Bakıdakı Respublika Elmi-Tədqiqat Kardiologiya İnstitutunda həkim-intern işləyib. 1982-ci ildə təyinatla sahə həkimi kimi 1 nömrəli Sumqayıt şəhər xəstəxanasına göndərilib. 1985-1988-ci illərdə Ş.Əhmədov Respublika Neyrocərrahiyyə Mərkəzində müalicə həkimi, Azərbaycan Dövlət Həkimləri Təkmilləşdirmə İnstitutunda ixtisasartırma kursu keçdikdən sonra isə anestezioloq-reanimatoloq kimi çalışıb. 1988-1991-ci illərdə Rusiya Tibb Elmləri Akademiyasının Ümumittifaq Cərrahiyyə Elmi Mərkəzində (Moskva) reanimasiya və intensiv terapiya şöbəsinin əyani aspiranturasında təhsil alıb. İntensiv terapiya şöbəsində ağır xəstələrə hemodializ verilməsi zamanı ürək-damar sisteminin parametrlərinin dəyişikliklərinin öyrənilməsinə həsr olunan namizədlik dissertasiyası SSRİ Səhiyyə Nazirliyinin baş reanimatoloqu, professor R.Lebedevanın rəhbərliyi ilə yerinə yetirilib və müvəffəqiyyətlə müdafiə olunub.

1990-cı ildə Moskvada aspiranturada oxuyarkən Ş.Əhmədov "Medicine" Sovet-Amerika birgə müəssisəsinin Moskva Refleks Terapiyası İnstitutunun həkim-reflek-soterapevtlərinin iştirakı ilə təşkil etdiyi Çin akupunktura (iynəbatırma ilə müalicə) kursunu bitirib.

Aspiranturanı bitirib Bakıya qayıdan Ş.Əhmədov 1991-1993-cü illərdə Azərbaycan Həkimləri Təkmilləşdirmə İnstitutunun reanimasiya kafedrasının assistenti olub. 1993-cü ilin iyulunda Şimali Kipr Türk Respublikasında (ŞKTC) anestezioloq kimi işə dəvət olunub və 1993-1997-ci illərdə Nikosiyada doktor Burhan Nalbantoğlu adına dövlət xəstəxanasında anestezioloq-reanimatoloq işləyib. 1997-ci ilin oktyabrından indiyədək Nikosiyada Yaxın Şərq Universitetinin (Near East University) bədən tərbiyəsi və idman fakültəsinin dekanı vəzifəsində çalışır.

1998-2001-ci illərdə Ş.Əhmədov ABŞ-da tibbi təcrübəyə yiyələnmək istəyən, xaricdən olan həkimlər üçün ABŞ-ın Tibb Təhsili üzrə Komissiyası tərəfindən təşkil

olunmuş tibb üzrə imtahanlar seriyasını uğurla verib. 2002-ci ildə dosent elmi adı alıb. 2013-cü ilin dekabrında ona professor elmi adı verilib. 2003-cü ildən indiyədək universitetdəki fəaliyyətindən sonrakı asudə vaxtlarında Ş.Əhmədov tibbi praktika ilə - Nikosiyadakı özəl klinikada iynəbatırma müalicəsi ilə məşğul olur.

Fakültə dekanı kimi rəhbərlik fəaliyyəti ilə yanaşı, Ş.Əhmədov anatomiya, kineziologiya, sağlamlıq və idman təbabəti problemlərini, bədən tərbiyəsi və idmanda elmi araşdırma üsullarını, eləcə də ilk tibbi yardım prinsiplərini türk və ingilis dillərində tədris edir.

Ş.Əhmədov ŞKTC-nin müxtəlif idman federasiyaları tərəfindən təşkil olunan, bədən tərbiyəsi və idman sahəsində mütəxəssislərin ixtisasartırma kurslarında aparıcı mühazirəçilərdən biridir.

Ş.Əhmədovun elmi fəaliyyəti həm Qərb, həm də ənənəvi Çin təbabəti məsələlərini əhatə edir. Müasir təbabət sahəsindəki tədqiqatlarının əsas istiqaməti əhalinin sağlamlığının profilaktikası problemləri və ŞKTC-nin əhalisinin funksional vəziyyətinin və antropometriyasının normativ parametrlərinin öyrənilməsi ilə bağlıdır. Ş.Əhmədovun bilavasitə iştirakı ilə 2005-ci ildə Yaxın Şərq Universiteti və ŞKTC Mədəniyyət və İdman Nazirliyinin birgə fəaliyyəti nəticəsində AVROFİT proqram çərçivəsində ŞKTC-nin 9-11 yaşda, demək olar ki, bütün ibtidai sinif şagirdlərinin fiziki vəziyyətinin əsas 12 parametrinin birbaşa ölçülməsi və öyrənilməsi üzrə genişmiqyaslı tədbir keçirilib, bunun nəticəsində həmin yaşda uşaqların fiziki vəziyyəti profilinin ümumi mənzərəsi əldə olunub.

2005-2009-cu illərdə Yaxın Şərq Universiteti Sağlamlıq Mərkəzinin direktoru əvəzi vəzifəsində işləyərkən Ş.Əhmədov həmkarları ilə birlikdə Mərkəzin xidmətlərindən istifadə edən ŞKTC əhalisi üçün fiziki hərəkətlər və idman proqramı təlimatının yeni sistemini hazırlayıb və tətbiq edib. Buna uyğun olaraq Sağlamlıq Mərkəzinin hər yeni üzvü ilkin tibbi müayinənin nəticələri və bu məqsədlə xüsusi təchiz olunmuş fitnes laboratoriyasında alınan, fiziki vəziyyətinin göstəriciləri (çeviklik, güc, dözümlülük, balans və s.) əsasında fiziki hərəkətlərin fərdi göstərişini əldə edir.

Ş.Əhmədovun sağlam əhalinin fiziki vəziyyətinin qiymətləndirilməsi prosesinin təkmilləşdirilməsi üzərindəki işi  yeni avadanlığın yaradılmasına gətirib çıxarıb. Universitetdəki həmkarı, elektron mühəndisliyi sahəsində mütəxəssis, professor Doğan İbrahim ilə birlikdə Ş.Əhmədov ixtira üçün Böyük Britaniyanın Patent Bürosu tərəfindən iki patent alıb (2007, 2008). Birinci ixtira ürək indeksinin (ürək tərəfindən bədən səthinin 1 vahid sahəsinə 1 vahid vaxtda atılan, qan dövranına daxil olan qanın miqdarı) qansız müəyyənləşdirilməsini həyata keçirməyə imkan verir.

İkinci ixtira idmançının fiziki gücünün maddi baxımdan ən qənaətcil ölçülməsini həyata keçirir.

Ş.Əhmədovun ənənəvi Çin təbabəti sahəsindəki işi həm bir çox xroniki xəstəliklərin müalicəsində iynəbatırma refleks terapiyasının praktik tətbiqi, həm də inteqrativ tibb çərçivəsində elmi-tədqiqat işlərinin aparılması ilə bağlıdır. Ş.Əhmədov tərəfindən müasir və ənənəvi Çin təbabətinin inteqrasiya imkanları aşkarlanıb və öyrənilib. Xüsusilə, sonralar Amerika İynəbatıranlar Assosiasiyasının "Medical Acupuncture" jurnalında dərc olunmuş müşahidələr ağrı sindromlarının müalicəsində akupunkturanın müsbət təsirinin monitorinqi üçün barmaq oksimetrindən istifadənin səmərəliliyini nümayiş etdirib. Ş.Əhmədov "ConditionningJounal of Strength and Research" jurnalında idmançıların fiziki güc və dözümlülüyünün artırılması məqsədi ilə akupunkturadan istifadənin müasir vəziyyətinin təhlilinə həsr olunan digər işində göstərdi ki, akupunktura idman hazırlığını artırmaq iqtidarındadır; gözlənilən müsbət təsir dərəcəsi bir çox hallarda ənənəvi Çin təbabəti çərçivəsində, akupunkturanın tətbiqi ilə, fərdi müəyyənləşdiriləcək. "Çin inteqrativ tibb jurnalında" dərc edilən, ənənəvi Çin təbabətinin bütün mövcud konsepsiyalarından ən məşhuru olan, müasir antropometriyadakı İn-Yan-ın Ş.Əhmədov tərəfindən tətbiqi Şərq təbabətinin qədim təcrübəsi ilə Qərb tibb elminin potensialının çoxtərəfli inteqrasiya imkanlarının daha bir nümunəsi idi.

Alim tez-tez ŞKTC-nin müxtəlif televiziya və radio kanallarının qonağı olur. Ənənəvi Çin təbabətinin tətbiqi məsələlərinə həsr olunan proqramlarda pəhriz və bitki müalicəsinin iynəbatırma refleks terapiyası sahəsində ekspert, habelə "taytszıtsyuan" Çin sağlamlaşdırma gimnastikasının təlimatçısı kimi çıxış edir.

Ş.Əhmədov namizədlik dissertasiyalarının müdafiəsi üzrə elmi şuranın üzvü, idman təbabəti və akupunktura üzrə beynəlxalq konfranslarda məruzəçi və fəxri spikerdir, müxtəlif elmi jurnallarda, o cümlədən "Science CitationIndex" jurnallarında dərc olunmuş 45-dən çox elmi işin müəllifi və həmmüəllifidir.



## Əkbərov
## Surxay Cabbar oğlu

*Texnika elmləri doktoru, professor.*
*"Yıldız" Texniki Universitetinin mexanika-maşınqayırma fakültəsinin professoru*

Əkbərov Surxay Cabbar oğlu 1954-cü il fevralın 8-də Ermənistan Respublikasının Masis rayonunun Zəhmət kəndində anadan olub.

1976-cı ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) mexanika-riyaziyyat fakültəsini "mexanika" ixtisası üzrə bitirib. Ali məktəbi bitirəndən sonra təyinatla Azərbaycan SSR Elmlər Akademiyasının (indiki Azərbaycan Milli Elmlər Akademiyası) Riyaziyyat və Mexanika İnstitutuna göndərilib, baş laborant vəzifəsində işləyib.

S.Əkbərov 1978-ci ildə Azərbaycan SSR EA-nın Riyaziyyat və Mexanika İnstitutunun əyani aspiranturasına daxil olub və Ukrayna SSR EA-nın S.P.Timoşenko adına Mexanika İnstitutuna (Kiyev) ezam edilib. 1981-ci ildə elə həmin institutda "Əyilgən matrisada iki lifin dayanıqlılığının bu dayanıqlılıq itirilən zaman onların qarşılıqlı təsiri nəzərə alınmaqla tədqiqi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

S.Əkbərov 1983-1985-ci illərdə S.P.Timoşenko adına Mexanika İnstitutunda elmi təcrübə keçib. 1988-ci ildə "Əyilmiş strukturlu kompozit materiallarda gərgin vəziyyət. "Hissə-hissə bircins cisim modeli" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

1990-1993-cü illərdə Azərbaycan EA-nın Riyaziyyat və Mexanika İnstitutunun dağılma mexanikası şöbəsinin müdiri olub. 1992-ci ildə "deformasiya olunan bərk cisim mexanikası" ixtisası üzrə professor olub. 1993-cü ilin sonundan indiyə qədər "Yıldız" Texniki Universitetində (İstanbul, Türkiyə) professor vəzifəsində çalışır.

S.Əkbərov 2001-ci ildə AMEA-nın "mexanika" ixtisası üzrə müxbir üzvü seçilib.

S.Əkbərov Azərbaycanda 3 fizika-riyaziyyat elmləri doktoru və 10 fizika-riyaziyyat elmləri namizədi, Türkiyədə isə 16 fəlsəfə elmləri doktoru (Ph.D) yetişdirib.

S.Əkbərovun əsas elmi nailiyyətləri: Elastiklik və özlü-elastiklik nəzəriyyəsinin dəqiq üçölçülü tənliklərinin cəlb olunması ilə hissə-hissə bircins cisim modeli çərçivəsində əyilmiş strukturlu, lay şəklində və lifli kompozit materiallar mexanikası işlənib hazırlanıb; ilkin natamamlıq kriterisi cəlb olunmaqla üçölçülü xəttiləşdirilmiş

dayanıqlılıq nəzəriyyəsi işlənib hazırlanıb və bu nəzəriyyə elastik və özlü-elastik kompozitlərin və onlardan hazırlanmış konstruksiyaların elementlərinin strukturunda əvvəllər həll edilməmiş çoxsaylı məsələlərin həllinə tətbiq edilib; ilkin gərginliyi olan iki materialdan ibarət elastik və özlü-elastik sistemlərin dinamikası işlənib hazırlanıb.

S.Əkbərov bir sıra beynəlxalq elmi-texniki jurnalların ("International Applied Mechanics", "Mechanics of Composite Materials", "Pure and Applied Mathematics" və s.) redaksiya şuralarının üzvüdür. O, həmçinin "Elsevier", "Spinger" və digər dünya şöhrətli nəşriyyatlarda dərc olunan "International Journal Solids and Structures", "Journal Sound and Vibration", "International Journal Mechanical Science", "European Journal of Mechanics A/ Solids", "Applied Mathematical Modelling", "Composites: Part B, Engineering", "International Journal of Engineering Sciences", "CMES: Computer Modelling in Engineering Sciences", "CMC: Computers, Materials & Continue", "International Applied Mechanics", "Mechanics of Composite Materials" və s. kimi jurnallarda dərc edilən çoxsaylı məqalələrin rəyçisi və müəllifidir.

S.Əkbərov 300-dən çox məqalənin müəllifidir. Bu məqalələrin 160-dan çoxu annotasiyası "Science Citation Index"də verilən və yüksək impakt-faktorlara malik olan jurnallarda dərc olunub. S.Əkbərov həm də aşağıdakı monoqrafiyaların müəllifi və həmmüəllifidir: S.C.Əkbərov, A.N.Quz, Y.A.Mövsümov, S.M.Mustafayev "Əyilmiş strukturlu materialların mexanikası" (Naukova Dumka, 1995), S.D.Akbarov, A.N.Guz' "Mechanics of Curved Composites" (Kluwer Academic Publishers, 2000), S.D.Akbarov "Stability Loss and Buckling Delamination: Three-Dimensional Approach for Elastic and Viscoelastic Composites" (Springer-Verlag Berlin Heidelberg, 2013).



## Ələkbərov
## Vahid Yusif oğlu

*İqtisad elmləri doktoru.*
*"LUKoyl" ASC-nin prezidenti*

Ələkbərov Vahid Yusif oğlu 1950-ci il sentyabrın 1-də Bakıda anadan olub.

1974-cü ildə Məşədi Əzizbəyov adına Azərbaycan Neft və Kimya İnstitutunun (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) axşam şöbəsini "neft-qaz yataqlarının işlənməsi texnologiyası və kompleks mexanikləşdirilməsi üzrə dağ-mədən mühəndisi" ixtisası üzrə bitirib.

V.Ələkbərov sonralar "Xəzərdənizneft" İstehsalat Birliyinin A.P.Serebrovski adına Neft-Qaz Çıxarma İdarəsində 1972-1974-cü illərdə qazmaçı, 1974-1977-ci illərdə neft-qaz hasilatı üzrə operator, 1977-1978-ci illərdə növbə rəisi, 1978-ci ildə usta, 1978-1979-cu illərdə böyük mühəndis – neft mədəni rəisinin müavini işləyib.

V.Ələkbərov 1979-cu ilin oktyabrından 1985-ci ilə qədər Sibirdə, "Surqutneftqaz" İstehsalat Birliyində (İB) çalışıb. 1979-1980-ci illərdə "Surqutneftqaz" İB-nin "Fyodorovskneft" Neft-Qaz Çıxarma İdarəsinin (NQÇİ) 2 nömrəli neft mədəninin baş mühəndisi, rəisi (Surqut, Tümen) işləyib.

1980-1981-ci illərdə V.Ələkbərov "Surqutneftqaz" İB-nin "Xolmoqorneft" NQÇİ-nin Mərkəzi mühəndis-texnologiya xidmətinin rəisi (Tümen vilayətinin Purovsk rayonunun Noyabrsk qəsəbəsi) olub. 1981-1983-cü illərdə "Surqutneftqaz" İB-nin "Lyantorneft" NQÇİ-nin baş mühəndisi, rəis müavini vəzifələrində (Tümen vilayətinin Surqut rayonunun Lyantor qəsəbəsi) çalışıb. 1983-1985-ci illərdə "Surqutneftqaz" İB-nin "Povxneft" NQÇİ-nin rəisi (Tümen vilayətinin Surqut rayonunun Koqalım qəsəbəsi) işləyib. 1985-1987-ci illərdə "Başneft" İB-nin Qərbi Sibir üzrə baş direktorunun birinci müavini (Tümen vilayətinin Surqut rayonunun Koqalım qəsəbəsi), 1984-1990-cı illərdə "Koqalımneftqaz" İB-nin baş direktoru olub.

V.Ələkbərov 1990-1991-ci illərdə SSRİ neft-qaz sənayesi nazirinin müavini vəzifəsində çalışıb. 1991-ci ildə SSRİ neft-qaz sənayesi nazirinin birinci müavini təyin edilib. 1991-ci ildən Beynəlxalq Neft Konsorsiumunun (BNK) vitse-prezidentidir, Rusiya Neft İxracatçıları İttifaqı sədrinin müavinidir.

V.Ələkbərov 1991-ci ilin sonunda "Langepas-Uray-Koqalım-neft" Neft Konserninin (sonralar "LUKoyl" ASC) yaradılması təşəbbüsü ilə çıxış edib. Konsern 1991-ci il noyabrın 25-də Yanacaq və Energetika Nazirliyinin struktur bölməsi kimi qeydə alınıb.

V.Ələkbərov 1992-1993-cü illərdə "Langepas-Uray-Koqalım-neft" Neft Konserninə başçılıq edib. 1993-cü il aprelin 5-də "Langepas-Uray-Koqalım-neft" dövlət konserninin adı dəyişdirilərək "LUKoyl" neft şirkəti" Səhmdar Cəmiyyəti adlandırılıb. V.Ələkbərov şirkətin prezidenti olub. V.Ələkbərov 1993-2000-ci illərdə "LUKoyl" ASC-nin Direktorlar Şurasının sədri olub. 1995-1998-ci illərdə Müşahidə Şurasının sədri, Himayəçilik Şurasının üzvü, "İmperial" Bankının Himayəçilik Şurasının sədri olub. 1995-2000-ci illərində "Petrokommerts" Bankının Direktorlar Şurasının sədri olub. 1996-2002-ci illərdə "Volqa-Kama Neft Şirkəti" Qapalı Səhmdar Cəmiyyətinin Direktorlar Şurasının tərkibinə daxil olub.

V.Ələkbərov 2001-2004-cü illərdə "LUKoyl" Neft Şirkətinin Elmi-Texniki Mərkəzi Assosiasiyasının idarə heyətinə başçılıq edib. 2001-2006-cı illərdə "RİTEK" ASC-nin Direktorlar Şurasının sədri olub. 2000-ci ildən "LUKoyl İnternəşnl QmbX"nin Müşahidə Şurasının sədridir. 2005-ci ildən Yanacaq-Energetika Kompleksi və Mineral-Xammal Bazasının Təkrar İstehsalı Məsələləri üzrə Hökumət Komissiyasının üzvüdür.

V.Ələkbərov 2000-ci ildə Rusiya Sənayeçilər və Sahibkarlar İttifaqının (RSSİ) idarə heyətinin tərkibinə daxil olub. Sonralar o, iki dəfə - 2003 və 2006-cı illərdə idarə heyətinə yenidən seçilib. V.Ələkbərov 2006-cı ilin iyununda RSSİ-də yaradılan Yanacaq-Energetika Kompleksi sahələrinin energetika təhlükəsizliyi, enerji səmərəliliyi və inkişafı məsələləri üzrə Komitəyə başçılıq edib.

V.Ələkbərov iqtisad elmləri doktoru, Rusiya Təbiət Elmləri Akademiyasının həqiqi üzvü, bir sıra kitabların və elmi məqalələrin, o cümlədən "Rusiyanın şaquli inteqrasiya olunmuş neft şirkətləri: formalaşma və reallaşma metodologiyası" (1996) və "Rusiya nefti: top-menecerin baxışı" (2001) monoqrafiyalarının müəllifidir.

V.Ələkbərov iki dəfə Rusiya Federasiyası Hökumətinin mükafatının laureatı olub, 11 orden və medalla, o cümlədən "Şərəf nişanı" (1986), "Dostluq" ordenləri, Azərbaycan Respublikasının iki ordeni – "Şöhrət" (Azərbaycan və RF arasında iqtisadi əlaqələrin inkişafında xidmətlərinə görə, 2000) və "Şərəf" ordenləri (2010), IV dərəcəli "Vətən qarşısında xidmətlərinə görə" (2005), I dərəcəli "Madar atlısı" ordenləri (Bolqarıstan, 2006), "Qərbi Sibirdə yerin təkinin mənimsənilməsi və neft-qaz kompleksinin inkişafına görə" medalı (1978) və s. ilə təltif olunub.



## Ələkbərzadə
## Aftandil Vaqif oğlu

*Tibb elmləri doktoru. İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin tibbi-profilaktika fakültəsinin cərrahiyyə kafedrasının professoru*

Ələkbərzadə Aftandil Vaqif oğlu 1970-ci il sentyabrın 2-də Azərbaycan Respublikasının Bərdə şəhərində anadan olub.

1993-cü ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) müalicə-profilaktika fakültəsini "müalicə işi" ixtisası üzrə fərqlənmə diplomu ilə bitirib. 1993-1995-ci illərdə M.A.Topçubaşov adına Elmi-Tədqiqat Klinik və Eksperimental Cərrahiyyə İnstitutunda "cərrahiyyə" ixtisası üzrə kliniki ordinatura keçib.

A.Ələkbərzadə 1996-1999-cu illərdə M.A.Topçubaşov adına Respublika Elmi-Cərrahiyyə Mərkəzində "cərrahiyyə" ixtisası üzrə aspiranturada təhsil alıb. 1999-cu ildə namizədlik dissertasiyası müdafiə edib. 1999-2000-ci illərdə "Azərbaycan tibb jurnalı"nın redaktoru işləyib. 2001-ci ildə İ.M.Seçenov adına Moskva Tibb Akademiyasının (2010-cu ildən İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universiteti) tibbi-profilaktika fakültəsinin cərrahiyyə kafedrasında assistent vəzifəsinə seçilib. 2003-cü ildən həmin kafedranın elmi katibidir.

2004-cü ildə A.Ələkbərzadə "Qanaxma ilə ağırlaşmış xora xəstəliyindən əziyyət çəkənlərin müalicəsinin nəticələrinin yaxşılaşdırılması yolları" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. O, xora üçün "Trombokol" kollagen preparatının endoskopik applikasiyası vasitəsilə qanaxmanın residivi profilaktikasının etibarlı, təhlükəsiz və əlçatan üsulunu işləyib hazırlayıb; Helicobacter pylorinin eradikasiyasında denol, klaritromitsin və furozolidonla üç tərəfdən aparılan terapiya ilə müqayisədə "Pilobakt" kompleks preparatının üstünlüyü sübuta yetirilib.

A.Ələkbərzadə kompleks tədqiqatlar – "Trombokol" kollagen preparatının xoraya endoskopik applikasiyası ilə qanaxma residivinin profilaktikalarını; işlənib hazırlanmış taktikaya müvafiq "Pilobakt" preparatı ilə aparılan eradikasiya terapiyası; qanaxma residivinin proqnozunun çox etibarlı riyazi modelini; onikibarmaq bağırsaq güdülünün emalı üsulunu tətbiq edib. Bu tədqiqatlar qanaxma ilə ağırlaşmış xora xəstəliyindən əziyyət çəkənlər arasında ölüm faizini azaltmağa imkan verir.

A.Ələkbərzadə 2005-ci ildə İ.M.Seçenov adına Moskva Tibb Akademiyasının (indiki İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universiteti) tibbi-profilaktika fakültəsinin cərrahiyyə kafedrasının dosenti vəzifəsinə seçilib.

A.Ələkbərzadə 2007-ci ildə İ.M.Seçenov adına MTA-nın "qastroenterologiya" ixtisası üzrə tematik təkmilləşdirmə sikli üzrə ixtisasartırma kursunun müdavimi olub. 2009-cu ildə İ.M.Seçenov adına Moskva Tibb Akademiyasının Ali Peşə Təhsili Dövlət Təhsil Müəssisəsinin "hepatopankreatobiliar cərrahiyyə"nin tematik təkmilləşdirmə sikli üzrə ixtisasartırma kursu, 2010-cu ildə isə Rusiya Diplomdansonrakı Təhsil Tibb Akademiyasında "mammalogiya" ixtisası üzrə ixtisasartırma kursu keçib.

A.Ələkbərzadə 2012-ci ildə Nyu-York Elmlər Akademiyasının (New York Academy of Sciences, patron membership) həqiqi üzvü seçilib.

Hazırda V.Ələkbərzadə İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin tibbi-profilaktika fakültəsinin cərrahiyyə kafedrasının professorudur.

A.Ələkbərzadə cərrahiyyə qastroenterologiyası, endoskopiya, koloproktologiya və flebologiya sahəsində 120-dən çox elmi əsərin, habelə RF-nin 2 ixtira patentinin və 3 səmərələşdirici təklifin müəllifi və həmmüəllifidir. O, "Kəskin qanaxma ilə müşayiət olunan xora xəstəliyinin fəsadlarının proqnozlaşdırılması" kitabının (2003), "Çənbər bağırsaq xərçəngi" adlı tədris vəsaitinin müəllifidir.



## Ələsgərov
## Fuad Tağı oğlu

*Texnika elmləri doktoru, professor.*
*Rusiya "Ali İqtisadiyyat Məktəbi" Milli Tədqiqat Universitetinin ali riyaziyyat kafedrasının müdiri*

Ələsgərov Fuad Tağı oğlu 1951-ci il yanvarın 23-də Bakıda anadan olub.

1974-cü ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin (MDU) mexanika-riyaziyyat fakültəsini bitirib. 1975-ci ildən Rusiya Elmlər Akademiyasının (REA) A.Trapeznikov adına İdarəetmə Problemləri İnstitutunda (İPİ) təcrübəçi, aspirant, kiçik elmi işçi, böyük elmi işçi, sektor müdiri, həllərin seçimi və analizi laboratoriyasının müdiri işləyib.

F.Ələsgərov 1981-ci ildə REA İPİ-də "sosial və iqtisadi sistemlərdə idarəetmə" ixtisası üzrə "İnterval seçim" mövzusunda namizədlik dissertasiyası, 1993-cü ildə "Lokal aqreqatlaşdırma modelləri" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

F.Ələsgərov Avropa ölkələrinin və ABŞ-ın bir çox universitetlərində, məsələn, Kaliforniya Texnologiya Universitetində (1992, 1994-1995, Pasadena, ABŞ), Bosfor Universitetində (1995-2001, İstanbul, Türkiyə), "Paris I" Universitetində (2002, Fransa), Turku Universitetində (2004, Finlandiya), Beynəlxalq İqtisadi Tədqiqatlar Mərkəzində (2006, 2007, Turin, İtaliya) dəvətli professor işləyib.

F.Ələsgərov 2003-cü ildən "Ali İqtisadiyyat Məktəbi" Milli Tədqiqat Universitetinin iqtisadiyyat fakültəsində ali riyaziyyat kafedrasının müdiridir.

F.Ələsgərov həllərin qəbul edilməsi, iqtisadiyyat və psixologiya kimi fənlərin təməli olan müasir seçim nəzəriyyəsinin banilərindən biridir. O, ilk dəfə N.Viner tərəfindən nəzərdən keçirilən interval seçimi modellərini, K.Errou və E.Maskin tərəfindən tədqiq edilən klassik işləri ümumiləşdirən kollektiv seçim modellərini tədqiq edərək ümumiləşdirib.

F.Ələsgərov riyaziyyatda, iqtisadiyyatda və psixologiyada geniş istifadə olunan binar münasibətlərin məlum siniflərini ümumiləşdirən zəif ikitərtibli, sadə və ən sadə yarımtərtibli binar münasibətlərin yeni siniflərini müzakirəyə çıxarıb.

F.Ələsgərov 30-dan çox universitetdə, o cümlədən Harvard, MIT, Stanford, Merilend universitetlərində, Rays və La Sapienza universitetlərində, Avropa Universitetinin İnstitutunda, London İqtisadiyyat Məktəbində və s. məruzələrlə çıxış edib.

F.Ələsgərov informatika, seçim nəzəriyyəsi, aqreqatlaşdırma nəzəriyyəsi, mikroiqtisadiyyat, makroiqtisadiyyat, bank işi, siyasi proseslər nəzəriyyəsi üzrə 150-dən çox

məqalənin və 9 kitabın - "Variantların seçimi (nəzəriyyənin əsasları)" (M.Ayzerman ilə birlikdə), "Seçkilər. Səsvermə. Partiyalar" (P.Ordeşukla birlikdə), "Seçim nəzəriyyəsi" (M.Ayzerman ilə birlikdə ingilis dilində), "Errounun aqreqatlaşdırma modelləri" (ingilis dilində), "Seçkilərdən koalisiyaya doğru: siyasi qərarlar necə qəbul olunur" (X.Ersel, Y.Sabunçu ilə birlikdə türk dilində), "Faydalılığın maksimallaşdırılması, seçim və üstünlük" (B.Monjarde ilə birlikdə ingilis dilində), "Binar münasibətlər, qraflar və kollektiv qərarlar" (E.Xabin, D.Şvarts ilə birlikdə), "Rusiya parlamentində təsir və struktur sabitliyi" (1905-1917 və 1993-2005) (N.Blaqoveşşenski, G.Satarov, A.Sokolova, V.Yakuba ilə birlikdə), "Bazel II riyazi modellərinin analizi" (İ.Andriyevski, H.Penikas, V.Solodkov ilə birlikdə), "Linear Algebra for Economists Springer-Verlag" (X.Ersel, D.Piontkovski ilə birlikdə) kitablarının müəllifidir.

F.Ələsgərov böyük redaktorluq işi aparır. O, "Həllərin analizi və dəstəklənməsi" monoqrafiyalar seriyasının redaksiya şurasının sədri, "İctimai seçim nəzəriyyəsi və praktikası" preprintlər seriyasının redaktorudur. Bir sıra məşhur kitabların – A.Senin "Etika və iqtisadiyyat haqqında" (1996), S.Brams və A.Teylorun "Ədalətlə bölürük, yaxud hər kəsə uduş zəmanəti" (2002), K.Errounun "Kollektiv seçim və fərdi dəyərlər" (2004) kitablarının rus dilinə tərcümələrinin elmi redaktoru olub.

F.Ələsgərov "Avtomatika i telemexanika", "Ekonomiçeskiy jurnal VŞE", "Problemı upravleniya", "Politiya", "Mathematical Social Sciences", "Political Studies (TBF)", "Modelirovaniye v cosialno-politiçeskoy sfere", "Biznes-informatika" və s. kimi bir neçə beynəlxalq və Rusiya jurnallarının redaksiya heyətinin üzvüdür.

Onun rəhbərliyi ilə tətbiqi xarakterli bir sıra mühüm layihələr həyata keçirilib: Moskva regionunun inkişafının riyazi modelləşdirilməsi (1985-1986), Yaroslavl vilayətində ekoloji vəziyyətin qiymətləndirilməsi (1988), "Rossiya" informasiya sistemi (1991), regional vəziyyətin təhlili (Rusiyanın 12 regionu üçün yaradılan "Region" informasiya sistemi) (1991-1994), şəhərin inkişafının təhlili (Rusiya və MDB ölkələrinin 8 şəhəri üçün) (1991-1995), əhalinin dairədəki (Şişli, İstanbul) yaşayış şəraitindən məmnunluq dərəcəsinin qiymətləndirilməsi və s.

F.Ələsgərov S.İ.Vavilov adına Elmi Cəmiyyətin birinci mükafatına (1986), Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin gümüş medalına (1989), Popov adına Elmi Cəmiyyətin birinci mükafatına (1989), elmdə nailiyyətlərinə görə "Ali İqtisadiyyat Məktəbi"nin "Qızıl Vışka" mükafatına (2004), "Ali İqtisadiyyat Məktəbinin" I dərəcəli fəxri nişanına (2013), II dərəcəli "Vətən qarşısında xidmətlərə görə" mükafatına (2013) və s. layiq görülüb.

2011-ci ildə F.Ələsgərova "Rusiya Federasiyasının fəxri elm və texnika işçisi" adı verilib. Professorun adı "Who is Who in Russia" nəşrində qeyd olunub.



## Əliyev
## Elçin Həmzə oğlu

*İqtisad elmləri doktoru, professor.*
*Sankt-Peterburq Dövlət Universitetinin və Baltik Turizm və Sahibkarlıq Akademiyasının professoru*

Əliyev Elçin Həmzə oğlu 1963-cü il fevralın 1-də Azərbaycan Respublikasının Ağdam rayonunda anadan olub.

1986-cı ildə A.A.Jdanov adına Leninqrad Dövlət Universitetinin iqtisadiyyat fakültəsini “siyasi iqtisad” ixtisası üzrə bitirib, iqtisadçı, iqtisadi fənlər müəllimi ixtisasına yiyələnib.

1986-1989-cu illərdə E.Əliyev Azərbaycan Xalq Təsərrüfatı İnstitutunun (indiki Azərbaycan Dövlət İqtisad Universiteti) iqtisadiyyat tarixi kafedrasının müəllimi işləyib.

1989-1991-ci illərdə A.A.Jdanov adına Leninqrad Dövlət Universitetinin iqtisadiyyat fakültəsinin aspiranturasında oxuyub və təhsilini başa vurduqdan sonra “XX əsrin ilk 30 ilində Avropa sosial-demokratlarının və sovet iqtisadçılarının əsərlərində imperializmin əsas xarakteristikası” mövzusunda dissertasiya müdafiə edib. Sonra Azərbaycan İqtisadiyyat İnstitutunun (indiki Azərbaycan Dövlət İqtisad Universiteti) siyasi iqtisad kafedrasında işləyib.

1994-1998-ci illərdə E.Əliyev Azərbaycan Sahibkarlıq və Hüquq İnstitutunun iqtisadiyyat kafedrasının baş müəllimi olub. 1998-ci ildə onu Sankt-Peterburq Dövlət Universitetinə iqtisadiyyat tarixi və iqtisadi təfəkkür kafedrasında dosent vəzifəsinə dəvət ediblər.

1999-cu ildə E.Əliyev “Ümumrusiya bazarı strukturunda “Milli ucqar bazarların” yaranma əsasları (Azərbaycanın nümunəsində: 1810-1917-ci illər)” mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. Bu iş Azərbaycanın Rusiya imperiyasının tərkibinə daxil edildiyi vaxtdan 1917-ci ilin oktyabr ayınadək bazar iqtisadiyyatının formalaşma tarixini əks etdirən ilk cəhdlərdən biridir.

E.Əliyev 2005-ci ildə Sankt-Peterburq Xarici İqtisadi Əlaqələr, İqtisadiyyat və Hüquq İnstitutunun hüquq fakültəsini qiyabi bitirib. 2004-cü ildə ona professor elmi adı verilib. Universitetin Elmi və İxtisaslaşdırılmış Doktorluq Şurasının üzvüdür. Onun rəhbərliyi altında 3 elmlər doktoru və 8 elmlər namizədi hazırlanıb.

E.Əliyev 60-dan çox elmi işin, o cümlədən 9 monoqrafiyanın, pedaqoji praktikada istifadə olunan 8 tədris-metodiki işin müəllifi və həmmüəllifidir.

Onun elmi maraq dairəsinə Rusiya və Azərbaycanda iqtisadiyyatın dövlət tənzimlənməsi, Rusiya və Azərbaycanın neft-qaz sahəsində qarşılıqlı regional əlaqələri daxildir.



## Əliyev
## Eldar Ağabala oğlu

*Mariinsky Teatrının Primorye səhnəsinin baş baletmeysteri*

Əliyev Eldar Ağabala oğlu 1957-ci il dekabrın 9-da Bakıda doğulub. O, 1966-cı ildə Bakı Xoreoqrafiya Məktəbinə (indiki Bakı Xoreoqrafiya Akademiyası) daxil olub və 1975-ci ildə oranı əla qiymətlərlə bitirib. Məktəbin son sinfində oxuyarkən M.F.Axundov adına Azərbaycan Dövlət Opera və Balet Teatrının (indiki Azərbaycan Dövlət Akademik Opera və Balet Teatrının) truppasına balet artisti vəzifəsinə dəvət alıb, 1975-ci ildə isə solist vəzifəsinə keçirilib. Elə həmin il E.Əliyev Leninqradda SSRİ Xoreoqrafiya Məktəbləri Məzunlarının V Müsabiqəsində iştirak edib və ikinci yerə çıxıb.

O, 1977-ci ildə S.M.Kirov adına Leninqrad Dövlət Akademik Opera və Balet Teatrının truppasına dəvət edilib. Kirov teatrında çalışdığı müddətdə (1979-1992) görkəmli pedaqoqlarla işləyərək truppanın aparıcı solisti olub. Teatrın cari repertuarında aparıcı partiyaları, o cümlədən "Bayaderka"da Solor, "Məhəbbət əfsanəsi"ndə Fərhad, "Don Kixot"da Bazil, "Spartak"da Spartak, "Korsar"da Konrad, "Pələng dərisi geymiş pəhləvan"da Tariel, Avtandil və digər rolları oynayıb.

E.Əliyev 1988-ci ildə Böyük Teatrın baş baletmeysteri Y.N.Qriqoroviç tərəfindən Azərbaycan bəstəkarı Arif Məlikovun "Məhəbbət əfsanəsi" baletində Fərhadın partiyasını ifa etməyə dəvət olunub və Böyük Teatrın prima-balerinası M.Bılova ilə birgə çıxış edib.

1989-cu ildə Moskvada A.V.Lunaçarski adına Dövlət Teatr Sənəti İnstitutunun (indiki Rusiya Dövlət Teatr Sənəti Universitetinin) baletmeyster fakültəsinin pedaqoji bölməsində professor Q.P.Valukinin sinfinə qəbul olunub.

1991-ci ildə Avstraliya baletinin bədii rəhbərinin dəvətilə Sidney Opera Teatrının səhnəsində yerli truppa ilə bir sıra tamaşalarda çıxış edib. Elə həmin il əfsanəvi rəqqaslar, Böyük Teatrın solistləri Y.Maksimova və V.Vasilyevin dəvətilə Kirov Teatrının və Böyük Teatrın səkkiz aparıcı solisti ilə birgə ABŞ, Kanada və Meksikada "Kirov Teatrı və Böyük Teatrın ulduzları" dördaylıq qastrolda, 1992-ci ildə isə həmin heyətin tərkibində İtaliya və İsveçrədə olub.

E.Əliyev, həmçinin Monrealda dünyanın ən yaxşı rəqqasları ilə birgə "Le Gala Des Etoiles" illik balet qala-konsertində iştirak edib. O, 1992-ci ildə bu qala-konsertə

təkrar dəvət edilib və orada amerikalı rəqqasə Lesli Braunla birgə argentinalı xoreoqraf M.Vaynrotun məxsusi onlar üçün hazırladığı yeni işi təqdim edib.

Kirov teatrında işlədiyi müddətdə E.Əliyev dəvət edilmiş solist kimi dünyanın ən məşhur teatrlarında, o cümlədən Paris Operası, Vaşinqtonda Kennedi Mərkəzi, Roma Operası, Milanda La Skala Teatrı, Nyu-Yorkda Metropoliten Operası, Londonda Kovent Qarden və Kolizeum Teatrı, Berlin Opera Teatrı, Meksikada Bellas Artes Teatrı və digər teatrların səhnələrində çıxış edib. O, Qabriela Komleva, Silvi Qiyem, Tatyana Terexova, Amanda Mak Kerrou və başqa görkəmli balerinalarla tərəf-müqabil olub.

E.Əliyev 1992-ci ildə ABŞ-a köçüb, orada “Indianapolis Ballet Theater” amerikan truppasına aparıcı solist dəvət olunub. Bu truppa sonradan “Ballet Internationale” adlandırılıb. 1994-cü ildən isə E.Əliyev truppaya rəhbərlik edib.

ABŞ-da işlədiyi müddətdə E.Əliyevin yaradıcılıq repertuarı “Yatmış gözəl”də Dezire, “Jizel”də Albert, “Şelkunçik”də Şahzadə, “Romeo və Cülyetta”da Romeo, “Qızılgülün ruhu”nda eyniadlı rol, “Karmen”də Xoze, “Yay gecəsində yuxu”da Oberonun partiyaları ilə zənginləşib.

Truppada E.Əliyevlə işləmək üçün Yaponiya, Rusiya, Türkiyə, Kanada, Ukrayna, Bolqarıstan, Özbəkistan, İtaliya, Latviya, Avstriya və Amerikadan artistlər dəvət edilib. Kirov teatrının əfsanəvi sənətkarı İ.Kolpakova direktor assistenti, teatr truppası nəzdində balet akademiyasının direktoru isə keçmişdə tanınmış rəqqas, Kirov Teatrının aparıcı pedaqoqu V.Semyonov olub.

E.Əliyev işə dünyanın hər yerindən görkəmli incəsənət xadimlərini, o cümlədən bəstəkar A.Petrov, xoreoqraf O.Vinoqradov, F.Flint, A.Alonso, D.Bryantsev, P.Teylor, N.Kasatkina, V.Vasilyev, rəssamlar Q.Solovyova, S.Pastux, V.Okunev, Y.Dvorkina və başqalarını dəvət edib.

O, azərbaycanlı bəstəkar Fikrət Əmirovun “Min bir gecə” baletinin səhnəyə qoyulmasında xoreoqraf kimi debüt edib. Tamaşada, həmçinin əsas partiya olan Şəhriyarı oynayıb. Tamaşa “Arts & Entertainment Almanac” incəsənət almanaxına salınıb. Səhnə əsəri bu almanaxda Amerikanın rəqs dünyasında mühüm hadisələrdən biri adlandırılıb. E.Əliyev bu tamaşa ilə 1996-cı ildə öz rəqs karyerasını başa çatdırıb, “Ballet Internationale” truppasına rəhbərliyi davam etdirib.

E.Əliyev rəqs yaradıcılığı dövründə “Sovet baletinin ulduzları” və “Rus baletinin parlaq ulduzları” silsilə qastrollarında iştirak edib. Onun çıxışı Asiya, Avropa və Amerikanın aparıcı televiziya kanallarında yayımlanıb və “Bəyaz gecədə rəqs” (Rusiya və Fransanın birgə istehsalı), “Kirov baleti Londonda” (Böyük Britaniya), “Kirov baletinin klassikləri” (Danimarka), “Korsar” (Yaponiya) film-baletlərinin videosunda

yer alıb. Onun iştirak etdiyi "Qu gölü" baleti (ABŞ istehsalı) isə Amerikanın Bravo kanalının "Görkəmli ifalar" seriyasına daxil edilib.

E.Əliyev 1999-cu ildə Buenos-Ayresin Kolon Teatrı rəhbərliyinin dəvətilə "Şopeniana" baletini səhnələşdirib. Elə həmin il Detroyt şəhərinə "Yevgeni Onegin" və "Samson və Dalila" operalarına xoreoqraf kimi dəvət olunub, 2001-ci ildə isə bu şəhərə qayıdıb.

"Ballet Internationale" (1994-2005) truppasına rəhbərliyi dövründə E.Əliyevin redaksiyasında təxminən 30 balet səhnəyə qoyulub. Onların sırasında "Jizel", "Yatmış gözəl", "Don Kixot", "Paxita", "Raymonda", "Silfida", "Bayaderka", "Kavaleri düşərgəsi" baletlərini qeyd etmək olar. Həmçinin "Simurq quşu", "Şelkunçik" və "Korsar" orijinal baletləri hazırlanıb. "Korsar" baleti 2007-ci ildə Denverdə "Kolorado Balet" truppasına köçürülüb.

E.Əliyevin quruluşunda "Şelkunçik" baleti Amerika televiziyası tərəfindən çəkilib və 2004-2005-ci illərdə Nyu-York, Los-Anceles, San-Fransisko, Atlanta, Boston, Çikaqo, Mayami və Detroyt şəhərlərinin televiziya kanallarında yayımlanıb.

2004-cü ildə E.Əliyev incəsənətin inkişafına töhfəsinə görə və "Ballet Internationale" truppasının 10 illiyi ilə əlaqədar İndiana ştatının xüsusi fərmanı ilə təltif edilib. İndianapolis şəhərinin meri isə iyunun 21-ni burada Eldar Əliyev günü elan edib.

E.Əliyev 2006-cı ildən Avropa, Asiya və Amerikada aparıcı truppa və balet akademiyalarında dəvət olunmuş konsultant, pedaqoq, baletmeyster və xoreoqraf işləyib. Onların sırasında İsveç Kral baleti, Macarıstan, Çin, Kanada Milli baletləri, ABŞ-da Boston və Sinsinati baletləri, Seulda Koreya Yuniversal Baleti, Honq-Konq baleti, Pekin Rəqs Akademiyası, İtaliyada Massimo Teatrı və başqalarını qeyd etmək olar.

E.Əliyev 2007-ci ilin yanvar ayından iyunadək Boston Balet Məktəbində direktor vəzifəsini icra edib. Bu məktəbin 3500 tələbəsi var və Şimali Amerikada ən böyük balet məktəbidir. E.Əliyev 2010-cu ildə Budapeşt Opera və Balet Teatrına konsultant dəvət edilib, yanvarın sonunda isə teatrın bədii rəhbəri olub.

O, 2010-2016-cı illərdə balet üzrə pedaqoq-repetitor, Novosibirsk Dövlət Opera və Balet Teatrında bədii rəhbərin müavini işləyib. 2016-cı ildə Mariinsky Teatrının Primorye səhnəsində (2016-cı yanvarın 1-dək Vladivostok üzrə Primorye Opera və Balet Teatrı) baş baletmeyster təyin olunub.

E.Əliyev klassik rəqsin təbliği və inkişafı üzrə beynəlxalq balet birliyində fəal iş aparır və müntəzəm olaraq nüfuzlu beynəlxalq müsabiqələrə (Praqa, 2002; Seul, 2004, 2005, 2008; Nyu-York, 2007; Varna, 2008) münsiflər heyətinin üzvü kimi dəvət edilir.



## Əliyev
## Əli Veys oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*M.T.Kalaşnikov adına İjevsk Dövlət Texniki Universitetinin istilik mühərrikləri və qurğuları kafedrasının müdiri*

Əliyev Əli Veys oğlu 1950-ci il martın 20-də Gürcüstan Respublikasının Bolnisi rayonunun Daştikullar kəndində anadan olub.

1973-cü ildə Leninqrad Mexanika İnstitutunu, 1978-ci ildə Udmurtiya Dövlət Universitetini qiyabi bitirib. 1973-1977-ci illərdə İjevsk maşınqayırma zavodunda mühəndis-konstruktor işləyib. 1977-1979-cu illərdə İjevsk Mexanika İnstitutunun aspiranturasında oxuyub. Namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə edəndən sonra İjevsk Mexanika İnstitutunda (indiki İjevsk Dövlət Texniki Universiteti - İjDTU) mühərriklərin layihələndirilməsi kafedrasında işə başlayıb.

Ə.Əliyev 1987-ci ildən İjDTU-nun istilik mühərrikləri və qurğuları kafedrasının müdiri, 2011-ci ildən İjDTU-nun riyaziyyat və təbiət elmləri fakültəsinin dekanıdır. 1992-ci ildə fizika-riyaziyyat elmləri doktoru elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. 1992-ci ildə Ə.Əliyevə professor elmi adı verilib. Onun namizədlik və doktorluq dissertasiyaları müasir uçuş aparatları üçün mühərrik istehsal edən sahə müəssisələri ilə silsilə işlər əsasında hazırlanıb.

Ə.Əliyev uçuş aparatları mühərriklərinin kameradaxili proseslər mexanikası sahəsində mütəxəssisdir. Bərk yanacaqlı raket mühərriklərinin (BYRM) riyazi modelləri və qeyri-stasionar iş rejimləri mexanikası onun elmi tədqiqatlarının əsas istiqamətləridir.

Ə.Əliyev BYRM-in daxili ballistikası məsələlərinin həlli texnologiyasını işləyib hazırlayıb. Bu texnologiya mürəkkəbliyinə və dəqiqliyinə görə bir-birindən fərqlənən müxtəlif riyazi modellərdən istifadə etməklə, sərbəst konstruktiv sxemli mühərrikin işini tədqiq etməyə imkan verir. O, həmçinin tətbiqi daxili ballistika məsələlərinin həllində daha səmərəli olan orijinal hesablama alqoritmlərini də işləyib hazırlayıb. Məsələn, qaz dinamikası məsələlərinin həllində istifadə olunan iri hissəciklər metodu alqoritmlərinin Eyler mərhələsində modifikasiya olunan (Eyler mərhələsində qeyri-aşkar sonlu fərqlər sxemləri, metodun Eyler mərhələsinə Riman invariantlarının tətbiqi və s.) iri hissəciklər metodunun sonlu həcm versiyaları.

Ə.Əliyev tərəfindən müxtəlif təyinatlı istilik mühərriklərində proseslərin təhlili ilə bağlı bir sıra praktiki məsələlərin həllində sınaqdan çıxarılan yüksək sürətli qaz və maye axınında akustik fon yaratmağa imkan verən riyazi modellər və alqoritmlər yaradılıb. Müasir iri BYRM-in işinin başlanğıc mərhələsində qanunauyğunluqlarının analizi qəza ilə nəticələnə bilən faktorları müəyyən etməyə imkan yaradıb.

Ə.Əliyev iri mühərriklərin deformasiyaya uğrayan dar boşluqlarında yerləşən bərk yanacağın alovlanması və yayılması qanunauyğunluqlarının analizi üzrə silsilə tədqiqatlar aparıb. Bu da rezonans hallarının mühərrikin kamerasında inkişafına və başqa ştatdankənar variantlarına təsir göstərən amilləri müəyyən etməyə imkan verib. Tənzimlənən BYRM tərkibində istifadə olunan orijinal məsrəf tənzimləyiciləri konstruksiyaları seriyası üçün qeyri-standart şəraitdə məsrəf əmsallarının qiymətlərinin müəyyən edilməsi üzrə silsilə tədqiqatlar aparılıb. Qazvurma stansiyaları tərkibində tətbiq edilən rekuperativ qurğuları olan qaz-turbin kompressorları qurğularının qeyri-normal iş rejimi tədqiq edilib. Onlarda qəza hallarını istisna edən konstruktiv həllər təklif edilib.

Ə.Əliyev 180-dən çox elmi işin, o cümlədən 3 monoqrafiyanın, ali məktəblər üçün 2 dərs vəsaitinin, 18 ixtiranın və patentin müəllifi və həmmüəllifidir. Rusiya Elmlər Akademiyasının akademiki A.M.Lipanov ilə birgə yazdığı "Bərk yanacaqlı raket mühərriklərinin layihələndirilməsi" dərsliyi uçuş aparatları ilə bağlı ixtisaslar üzrə təhsil alan tələbələr üçün nəzərdə tutulub. Ə.Əliyevin Rusiya Raket və Artilleriya Elmləri Akademiyasının (RRAEA) dəstəyi ilə 2007-ci ildə "Maşinostroyeniye" nəşriyyatında çapdan çıxan "BYRM-in daxili ballistikası" monoqrafiyası praktiki əhəmiyyət daşıyır.

Ə.Əliyev məhsuldar alimdir. O, doktorluq dissertasiyalarının müdafiəsi üzrə dörd ixtisaslaşdırılmış şuranın, REA-nın Kimyəvi Fizika İnstitutu, REA-nın Ural bölməsinin Tətbiqi Mexanika İnstitutu və Baltik Dövlət Texniki Universiteti tərəfindən təşkil edilən yanma və daxili ballistika məsələləri üzrə beynəlxalq və Rusiya miqyaslı ənənəvi konfransların təşkilat komitələrinin üzvü, habelə bu konfransların əsərlərinin redaktoru və tərtibçisidir. Ə.Əliyev 1997-ci ildə Rusiya Raket-Artilleriya Elmləri Akademiyasının müxbir üzvü, 2006-cı ildə RF Hərbi Elmlər Akademiyasının akademiki seçilib.

Ə.Əliyevin rəhbərliyi ilə 2 elmlər doktoru, 5 elmlər namizədi hazırlanıb. O, İjDTU-nun aspiranturası və doktoranturasında müvəffəqiyyətlə "istilik mühərrikləri" və "maye, qaz və plazma mexanikası" ixtisasları üzrə elmi kadrlar hazırlayır.

Ə.Əliyev digər ölkələrdə də tanınır. O, müxtəlif illərdə Çin (Pekin, Şanxay), Misir (Qahirə), Suriya (Dəməşq, Hələb) və Slovakiyada (Trençin) mühazirələr oxuyub.

Ə.Əliyev elmi və pedaqoji fəaliyyətində qazandığı uğurlara görə hökumət və sahə mükafatlarına layiq görülüb. 2000-ci ildə ona “Udmurtiya Respublikasının Əməkdar Elm Xadimi” adı verilib, 2002-ci ildə “Rusiya Federasiyasının fəxri ali peşə təhsili işçisi” döş nişanı ilə təltif edilib. “Sankt-Peterburqun 300 illiyi şərəfinə” medalı, RRAEA-nın “Silahlanmanın və hərbi texnikanın inkişafında xidmətlərinə görə” medalı, Rusiya Kosmonavtika Federasiyasının akademiklər S.P.Korolyov, V.P.Qluşko və M.V.Keldış adına medalları ilə mükafatlandırılıb. Onun adı “Kosmonavtika” Ensiklopediyasına (müəllif A.Jeleznyakov), “Rusiya raket-artilleriya elmləri” sorğu nəşrinə, “D.F.Ustinov adına Baltik Dövlət Hərbi Mexanika Texniki Universiteti və onun məzunları” kitabına (müəlliflər A.R.Romanov, M.V.Tribel, S.P.Çernixov, 2006, 2008) daxil edilib.

ra edib. Bu məktəbin 3500 tələbəsi var və Şimali Amerikada ən böyük balet məktəbidir. E.Əliyev 2010-cu ildə Budapeşt Opera və Balet Teatrına konsultant dəvət edilib, yanvarın sonunda isə teatrın bədii rəhbəri olub.

O, 2010-2016-cı illərdə balet üzrə pedaqoq-repetitor, Novosibirsk Dövlət Opera və Balet Teatrında bədii rəhbərin müavini işləyib. 2016-cı ildə Mariya Teatrının Primorye səhnəsində (2016-cı yanvarın 1-dək Vladivostok üzrə Primorye Opera və Balet Teatrı) baş baletmeyster təyin olunub.

E.Əliyev klassik rəqsin təbliği və inkişafı üzrə beynəlxalq balet birliyində fəal iş aparır və müntəzəm olaraq nüfuzlu beynəlxalq müsabiqələrə (Praqa, 2002; Seul, 2004, 2005, 2008; Nyu-York, 2007; Varna, 2008) münsiflər heyətinin üzvü kimi dəvət edilir.



## Əliyev
## Fazil Zabid oğlu

*"RİMSKO" Rus ekspert və dəniz syurveyer korporasiyasının prezidenti*

Əliyev Fazil Zabid oğlu 1960-cı il fevralın 14-də Bakıda anadan olub.

1979-cu ildə Bakı Dənizçilik Məktəbini qırmızı diplomla bitirib, Primoryeyə üçüncü köməkçi göndərilib, 26 yaşında Uzaq Şərq hövzəsinin ən gənc kapitanı olub. Ümumiyyətlə, onun öhdəsinə tez-tez ilk cığır açmaq vəzifəsi düşüb. F.Əliyevin idarə etdiyi "Lukomorye" tankeri Cənubi Koreya ilə diplomatik münasibətlərin qurulmasından sonra bu ölkəyə gəlmiş ilk sovet gəmisi olub. O, Cənubi Koreyaya kömək edərək Vladivostokda Cənubi Koreya şirkətinin Rusiyada ilk nümayəndəliyini açıb.

F.Əliyev 1982-ci ildə Uzaq Şərq Balıq Sənayesi İnstitutunu, 1997-ci ildə isə Uzaq Şərq Dövlət Universitetini bitirib. 1991-ci ildə syurveyer şirkəti yaradıb. Şirkətin lakonik, lakin məzmunlu devizi olub: "Uğura doğru kursu ilə". 1992-ci il sentyabrın 9-da isə "RİMSKO" rus ekspert və dəniz syurveyer korporasiyasını yaradıb. Donanmanın ilk gəmisi neftdaşıyan "Saxalinneft" olub və onun adı dəyişdirilərək "Diokl" qoyulub.

Sonralar F.Əliyev çıxdaş edilmiş gəmiləri almaqda, onları təmir etməkdə davam edib. F.Əliyevin şirkəti əvvəlki laqeyd rəhbərləri tərəfindən baxımsız qalmış bərə donanmasını uzun illər boyu, demək olar, zərrə-zərrə yığıb.

"RİMSKO" QSC bu gün həm öz gəmilərini, həm də cəlb etdiyi 50-dən çox gəmi işlədir. Bu, refrijeratorlar, neftdaşıyan tankerlər və donanmanın köməkçi gəmiləridir. "RİMSKO" Rusiyadakı özəl şirkətlər sırasında gəmi sayına görə birinci yeri tutur.

F.Əliyevin rəhbərlik etdiyi "RİMSKO" korporasiyası göstərdiyi xidmət keyfiyyətinə görə Rusiyada ilk dəfə ICO 9001 beynəlxalq standart sisteminə uyğunluq sertifikatını bir dəfəyə beş istiqamət - syurveyer, dəniz yükdaşımaları, gəmilərin agentləşdirilməsi və kirayəsi, Rusiya Dəniz Gəmiçiliyi Registri Sistemində və Rusiya Dövlət Standartlarında qiymətləndirmə fəaliyyəti üzrə alıb. "RİMSKO" Rusiyada gəmilərin təhlükəsiz idarə olunması və dənizin çirklənməsinin qarşısının alınmasına dair Beynəlxalq Məcəllənin tələblərinə uyğunluq sertifikatını alan ilk korporasiyalardan biridir.

"RİMSKO" korporasiyası Rusiya Gəmi Sahibləri İttifaqının, Rusiya Ticarət və Sənaye Palatasının, Uzaq Şərq Dənizçilik Kapitanları Assosiasiyasının, Baltik və Beynəlxalq Dənizçilik Şurasının, Beynəlxalq Dənizçilik Syurveyerlər İnstitutu və Beynəlxalq Dənizçilik İnstitutunun üzvüdür. "RİMSKO"nun nümayəndəliyi təkcə Primoryedə və Uzaq Şərqdə deyil, həm də Çin, Koreya, Moskva və Kiprdə açılıb.

"RİMSKO" QSC 30-dan çox xidmət növü təklif edir. Bu sıraya syurveyer, gəmilərin kirayəsi və agentləşdirilməsi, yükdaşıma və bunkerə tökmə, portoflot, ekspertiza və qiymətləndirmə, o cümlədən hava gəmilərinin, qəza-xilasetmə və dalğıc işlərinin qiymətləndirilməsi, gömrük brokeri xidmətləri, gəmiqayırma və yüklərin boşaldılıb yüklənməsi üzrə xidmətlər aiddir. Korporasiyanın öz yük terminalı var.

"RİMSKO"nun parlaq narıncı rəngli gəmiləri həm Rusiya limanlarında, həm də Asiya-Sakit okean regionu ölkələrində məşhurdur. Onları təkcə rəng deyil, həm də "RİMSKO" emblemi birləşdirir - şirkətin bütün gəmilərində Rusiyanın bayrağı dalğalanır. Korporasiyanın prezidentinin prinsipial mövqeyi belədir: Rusiya gəmiləri bu ölkənin bayrağı altında üzməlidir.

F.Əliyev "2004-cü ilin ən yaxşı sahibkarı" (1-ci yer) adına, "Ticarət markası-2004" Uzaq Şərq Beynəlxalq müsabiqəsinin "Brendin gücü" və "Ticarət markasının ən yaxşı peşəkar həlli" kateqoriyalarında qızıl mükafata layiq görülüb, "Century international quality ERA AWARD" beynəlxalq mükafatının platin kateqoriyasında qalib olub. O, Rusiya Gəmi Sahibləri İttifaqının medalı, "Sovet İttifaqı Donanmasının admiralı N.Q.Kuznetsov" medalı, habelə qüsursuz işgüzar reputasiyasına görə Rusiya-İsveçrə biznes-klubunun fəxri diplomu və qızıl medalı ilə təltif edilib.

F.Əliyev Rusiyanın fəxri vətəndaşıdır.



## Əliyev
## Fuad Şamil oğlu

*Tibb elmləri doktoru, professor.*
*Tümen Dövlət Tibb Akademiyasının ümumi cərrahiyyə kafedrasının müdiri*

Əliyev Fuad Şamil oğlu 1965-ci il yanvarın 1-də Gürcüstan Respublikasının Bolnisi rayonunun Darbaz kəndində anadan olub.

1981-ci ildə Dmanisi rus orta məktəbini bitirdikdən sonra Tümen Dövlət Tibb İnstitutunun müalicə fakültəsinə daxil olub və 1987-ci ildə oranı bitirib.

1987-1988-ci illərdə Tümen Şəhər Klinik Xəstəxanasında cərrahiyyə ixtisası üzrə internatura təhsili alan F.Əliyevin sonrakı fəaliyyəti, mütəxəssis və peşəkar kimi formalaşması şəhər əhalisinə təcili cərrahiyyə yardımının göstərildiyi 1 nömrəli klinik xəstəxana ilə bağlı olub. O, ordinatordan ali kateqoriyalı cərrahadək, cərrahiyyə bölməsinin müdiri vəzifəsinədək yol keçib, Tümen Dövlət Tibb Akademiyasının ümumi cərrahiyyə kafedrasının müdiri təyin edilib.

F.Əliyevin klinisist və elmi işçi kimi taleyinə ilk növbədə onun müəllimi, görkəmli alim, cərrahiyyə fakültəsində kafedra müdiri, Tümen cərrahiyyəsinin patriarxı sayılan professor R.V.Ziqanşinin böyük təsiri olub.

Cərrahın praktik gərgin işi və elmi yaradıcılığı bir-birini tamamlayırdı. F.Əliyev 1992-ci ildə "Forma yaddaşlı implantatların köməyi ilə kompression hemorroidektomiyanın tədqiqi və tətbiqi" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib. Babasil xəstəliyinin müalicəsinin aktual probleminə həsr edilmiş bu tədqiqat eksperimental-klinik xarakter daşıyırdı. Beləliklə, ilk dəfə Rusiyada yüksək əməliyyat riski olan adamlarda babasil xəstəliyinin radikal cərrahiyyə imkanları, habelə ambulator şəraitdə cərrahi müalicəyə yeni prinsipial yanaşma əsasında - "forma yaddaşlı" unikal xüsusiyyətə malik yeni tibb materiallarından istifadə etməklə müalicə imkanını göstərdi. Düz bağırsağın damarlı arxitektonikasının unikal eksperimental tədqiqi əsasında əldə edilən böyük klinik materialda cərrahi müdaxilənin asanlığının, sadəliyinin, təhlükəsizliyinin və radikallığının birləşmə imkanını göstərdi.

F.Əliyevin sonrakı elmi fəaliyyəti nanostrukturlaşdırılmış nikelid-titan tibb materiallarının tətbiqi əsasında yoğun bağırsaq cərrahiyyəsində yeni istiqamətin inkişafına həsr olunub.

F.Əliyev koloproktologiyada yeni elmi istiqamət yaradan müəlliflərdən biridir. İlk dəfə olaraq onlar tərəfindən xüsusi qurğu və əməliyyat yolları hazırlanıb və bu, mədə-bağırsaq traktının müxtəlif yerlərində borulu orqanların ilgəkləri arasında tikişsiz kompression anastomoz yaratmağa imkan verir.

1998-ci ildə F.Əliyev Tümen Dövlət Tibb Akademiyasının ümumi cərrahiyyə kafedrasının dosenti seçilib. Elə həmin ildə Rusiya alimlərinin orqanizm toxumalarına (biokimyəvi və biomexaniki) uyğunluq baxımından yaxın olan nikelid-titan qarışığı əsasında yeni texnologiyalar hazırlanmasına dair elmi nailiyyətləri “Tibb materialları və forma yaddaşlı implantatlar” monoqrafiyasında ümumiləşdirilib. Bu kitabın müəlliflərindən biri də F.Əliyev olub. Hazırda bu istiqamətdə elmi nailiyyətlər dünyada fundamental hesab edilir, təxirəsalınmaz və planlı cərrahiyyədə böyük elmi və praktik əhəmiyyətə malikdir.

F.Əliyev orqanizmə implantasiya oluna bilən prinsipial yeni materiallardan istifadə etməklə yeni cərrahiyyə üsullarını işləyib hazırlamasına görə 1998-ci ildə Beynəlxalq Elm, Texnika və Təhsil Forumunda (Moskva) “Səhiyyə” nominasiyasında nüfuzlu “Qızıl diplom” mükafatına layiq görülüb.

O, 2000-ci ildə nüfuzlu alimlərin həmmüəllifliyi ilə ingilis dilində Avropa və Amerika ölkələrində yayılan “Delay Law and New Class of Materials and Implants in Medicine” fundamental əsəri nəşr etdirib.

Koloproktologiyada yeni tədqiqat istiqamətinin inkişafı F.Əliyevin “Yoğun bağırsaq cərrahiyyəsində nikelid-titan qatışığı əsasında yeni texnologiyalar” mövzusunda doktorluq dissertasiyasının əsasını təşkil edir. 2007-ci ildə doktorluq dissertasiyasını uğurla müdafiə edən F.Əliyevə RF Ali Attestasiya Komissiyası tərəfindən tibb elmləri doktoru elmi adı verilib.

O, 2007-ci ildə Rusiya, Cənubi Koreya, Almaniya və Kanadada nümayəndəliyi olan Beynəlxalq SMI (Shape Memory Implant) Akademiyasının həqiqi üzvü, 2008-ci ildə isə Tümen Dövlət Tibb Akademiyasının ümumi cərrahiyyə kafedrasının müdiri və professoru seçilib.

F.Əliyevin rəhbərliyi ilə aparılan əsas elmi tədqiqatlar “yaddaş” implantatlarının ən elastik formasından istifadə edilməsi əsasında müxtəlif kəskin cərrahi xəstəliklərin müalicəsində minimal invaziv texnologiyaların, mədə-bağırsaq traktatının cərrahiyyəsi zamanı kompression anastomozların qoyulmasında klapan strukturlarının işlənib hazırlanması və yaradılmasına, kolostoma qoyulmuş xəstələrin reabilitasiyasının yeni cərrahiyyə üsullarının işlənib hazırlanmasına, abdominal sepsis xəstələrində immunkorreksiya məsələlərinin araşdırılmasına həsr olunub.

F.Əliyev 150-dən çox elmi məqalənin, Rusiya Federasiyasında 6 ixtira patentinin müəllifidir. O, RF Həkim-koloproktoloq Assosiasiyasının, RF Ümumi Cərrahlar Assosiasiyasının, Tümen Vilayəti Cərrahlar Assosiasiyasının, "Cərrahlıq" Problem Komissiyasının və Tümen Dövlət Tibb Akademiyasında elmlər namizədi və doktor elmi dərəcələrinin verilməsi üzrə ixtisaslaşdırılmış şuranın üzvüdür. Cərrahiyyə, koloproktologiya, onkologiya üzrə ixtisas kateqoriyalarına malikdir. Yoğun bağırsaq cərrahiyyəsində yeni istiqamətin inkişafına verdiyi töhfəyə görə çoxsaylı mükafatlar alıb. Tümen vilayəti qubernatoru qrantı müsabiqəsinin (2006) qalibidir.



## Əliyev
## İsmayıl Məhərrəm oğlu

*İqtisad elmləri doktoru, professor.*
*Sankt-Peterburq Dövlət İqtisadiyyat və Maliyyə Universitetinin əməyin və əmək resurslarının iqtisadiyyatı kafedrası müdirinin müavini*

Əliyev İsmayıl Məhərrəm oğlu 1966-cı il mayın 6-da Azərbaycan Respublikasının Ordubad rayonunun Behrud kəndində anadan olub.

İ.Əliyev 1984-1986-cı illərdə Silahlı Qüvvələrdə xidmət edib. 1992-ci ildə Sankt-Peterburq Dövlət İqtisadiyyat və Maliyyə Universitetini (SPbDİMU) bitirib. 1993-cü ildə SPbDİMU-nun aspiranturasına daxil olub. "Sənaye müəssisələri rəhbərlərinin və mütəxəssislərinin əməyinin ödənilməsi və stimullaşdırılması" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək aspiranturanı bitirib.

İ.Əliyev müdafiədən sonra geniş elmi və pedaqoji fəaliyyətlə məşğul olub. O, müsabiqə yolu ilə əməyin və əmək resurslarının iqtisadiyyatı kafedrasının assistenti, böyük müəllimi, daha sonra dosenti seçilib. 2002-ci ildə ona dosent elmi adı verilib.

İ.Əliyev 2007-ci ildə "Rusiya Federasiyasının sosial siyasətinin təkmilləşdirilməsi şəraitində əhalinin gəlirlərinin və həyat səviyyəsinin artması (federal və regional aspektlər)" aktual mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 2008-ci ildə Elmi Şura İ.Əliyevi SPbDİMU-nun əməyin və əmək resurslarının iqtisadiyyatı kafedrasının professoru vəzifəsinə seçib. 2009-cu ildə ona professor elmi adı verilib.

İ.Əliyev tələbə, magistr və aspirantlarla böyük elmi, tədris və tərbiyəvi iş aparır. O, 4 elmlər namizədi hazırlayıb, bazar iqtisadiyyatı şəraitində Rusiya iqtisadiyyatının inkişafının ən mühüm həlləri mövzusunda elmi tədqiqatlarda fəal iştirak edir.

Professor İ.Əliyev əməyin iqtisadiyyatı, insan resurslarının idarə olunması və dövlətin sosial siyasəti sahəsində tanınmış mütəxəssisdir. Onun 100-dən çox elmi əsəri - monoqrafiyaları, dərslikləri, tədris vəsaitləri, o cümlədən RF Təhsil Nazirliyinin qrifi ilə "Əməyin iqtisadiyyatı", milli iqtisadiyyat və əməyin iqtisadiyyatı sahəsində Tədris-Metodiki Birləşmənin qrifi ilə "Gəlirlər və əməkhaqqı siyasəti", habelə "Müasir Rusiyada əhalinin həyat səviyyəsi və gəlirləri", "Sosial siyasət, əhalinin gəlirləri və həyat səviyyəsi", "Əmək bazarı və insan resurslarının idarə olunması", "İnsan resurslarının böhrana qarşı idarə olunması" və digər əsərləri çapdan çıxıb.

İ.Əliyevin çap olunmuş əsərləri ilə tanış olanda diqqəti onun yaratdığı üç mühüm istiqamət cəlb edir. Bu istiqamətlər ideya yeniliyi, təhlilin dərinliyi, habelə məsələnin qoyuluşu və həllinin qeyri-adiliyi ilə seçilir: müəssisədə əməyin idarə olunması, audit və kontrollinq, böhrana qarşı idarəetmə problemlərini əhatə edən əməyin iqtisadiyyatı; əsas problemləri kompensasiya siyasətinin yaradılması, işçilərin mükafatlandırılması sistemlərinin qurulması, istifadə səmərəliliyinin artmasında istehsalat faktorlarının qarşılıqlı təsirinin və kompensasiya siyasətinin rolunun öyrənilməsi olan kompensasiya menecmenti; Rusiya müəssisələrində əməyin ödənilməsinin idarə edilməsi. İdarəetmə prosesi müəssisənin məqsəd və vəzifələri ilə qırılmaz surətdə bağlı nəzərdən keçirilir və sosial tərəfdaşlıq sistemi ilə əlaqələndirilir.

Bütün bu istiqamətlərdə iqtisadiyyatın real sektoru ilə sıx əlaqə, müəssisələrə, bilavasitə işçiyə çıxış izlənilir.

İ.Əliyevə tanınmış mütəxəssis kimi dövlət büdcəsindən maliyyələşən ən əhəmiyyətli elmi-tədqiqat mövzularına rəhbərlik tapşırılıb. Onu ekspert və məsləhətçi qismində rəhbər orqanların ən mühüm qərar layihələrinin hazırlanması işinə dəvət edirlər. Məsələn, o, əmək məhsuldarlığının artmasının və sənaye istehsalının səmərəliliyinin yüksəldilməsinin elmi təminatı, region iqtisadiyyatında islahatların aparılması, müəssisələrin restrukturizasiyası üzrə layihələrdə iştirak edib. O, aşağıdakı mövzular üzərində işləyib: iş yerlərinin yaradılması və saxlanılması sisteminin regional bölmələrində islahatların metodoloji əsasları; əmək bazarının tarazlığının metodiki təminatı.

İ.Əliyev 2002-ci ildən indiyə qədər əməyin iqtisadiyyatı və əmək resursları kafedrası müdirinin müavini, "əməyin iqtisadiyyatı" magistr proqramının "iqtisadiyyat" istiqaməti üzrə rəhbəridir. Alim, həmçinin Sankt-Peterburq Dövlət İqtisadiyyat və Maliyyə Universitetinin əməyin iqtisadiyyatı və heyətin idarə olunması fakültəsinin Elmi Şurasının, axşam və qiyabi fakültəsinin Elmi Şurasının, Dissertasiya Şurasının və Metodiki Komissiyasının üzvüdür.



## Əliyev
## Mehrəli Mirzəli oğlu

*Texnika elmləri doktoru, professor.*
*Almetyevsk Dövlət Neft İnstitutunun mexanika mühəndisliyi fakültəsinin dekanı*

Əliyev Mehrəli Mirzəli oğlu 1951-ci il noyabrın 7-də Azərbaycan Respublikasının Göyçay rayonunda anadan olub.

M.Əliyev 1968-ci ildə Çingiz İldırım adına Azərbaycan Politexnik İnstitutunun (indiki Azərbaycan Texniki Universiteti) nəqliyyat fakültəsinə daxil olub. Ali məktəbi qırmızı diplomla bitirən M.Əliyev Leninqrada, daha sonra Pskova təyinat alıb.

M.Əliyev 1979-cu ildə Moskvada Mərkəzi Elmi-Tədqiqat İnstitutu nəzdində aspiranturanı bitirib, 1980-ci ilin əvvəlində namizədlik dissertasiyası müdafiə edib. Aspiranturadan sonra Bakıya gələrək, seysmodavamlı inşaat laboratoriyasında kiçik elmi işçi işləyib. 1983-cü ildə Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun (indiki Azərbaycan Memarlıq və İnşaat Universiteti) dosenti olub, bu ali məktəbdə 11 il işləyib, tələbələrə, o cümlədən Vyetnam, Laos və Madaqaskardan olan tələbələrə körpülərin layihələndirilməsindən dərs deyib.

M.Əliyev 1994-cü ildə həyat yoldaşının anadan olduğu Tatarıstana köçüb, Almetyevsk Dövlət Neft İnstitutunda (ADNİ) dərs deməyə başlayıb. 2006-cı ildən neftin və qazın nəqli və saxlanması kafedrasına başçılıq edib.

M.Əliyev 2002-ci ildə "Qeyri-bircins anizotrop cisimlərdə həddi gərginlik halları nəzəriyyəsi və məsələləri" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Onun dissertasiyasının mövzusu son dərəcə mürəkkəb düstur və hesablamalar tələb edirdi. M.Əliyevin yerinə yetirdiyi hesablamalara otuz il ərzində heç kəs yaxın dura bilmirdi. İyirmi iki ildən sonra onun doktorluq dissertasiyası tam başa çatıb və artıq üç aydan sonra M.Əliyev onu müdafiə edib. Sənədləri Moskvaya göndəriləndən 28 gün sonra M.Əliyevə professor elmi adı verilib. Onun dissertasiyasının nəticələrindən maşınqayırma texnologiyalarında, ev tikintisində, quyuların qazılmasında və s. istifadə etmək olar. M.Əliyev tətbiqi plastiklik nəzəriyyəsinin klassik məsələsini zərgər dəqiqliyi ilə həll edib. Alim öz düstur və hesablamalarında materialın reallığa yaxın bir neçə xassəsini nəzərə ala bilib.

M.Əliyev 2000-ci ilin fevralından ADNİ-nin mexanika mühəndisliyi fakültəsinin dekanıdır. 2002-ci ildən "deformasiyaya uğrayan bərk cisim mexanikası" ixtisası üzrə texnika elmləri doktoru, 2004-cü ildən professordur. M.Əliyev 1995-2006-cı illərdə tətbiqi riyaziyyat kafedrasının müdiri işləyib, 2006-cı ildən neftin və qazın nəqli və saxlanması kafedrasının müdiridir.

M.Əliyev 80-dən çox elmi əsərin və tədris-metodiki tədqiqatın müəllifidir. O, qeyri-bircins anizotrop səpkin mühit üçün ümumiləşmiş Kulon-Mor kriterisini işləyib hazırlayıb, yetirmələri ilə birlikdə yüksək hidrostatik təzyiq şəraitində işləyən materiallar üçün polinominal möhkəmlik kriterisini təklif edib.

M.Əliyevin elmi rəhbərliyi ilə "deformasiyaya uğrayan bərk cisim mexanikası" ixtisası üzrə 4 texnika elmləri namizədi hazırlanıb.

M.Əliyevin ən mühüm məqalələri: "İzotrop materiallar üçün möhkəmlik kriterisi variantı", "Boru materialının anizotropluğu nəzərə alınmaqla, polad boru kəmərlərinin hesablanması", "İkitərəfli təzyiqlə yüklənmiş qeyri-simmetrik anizotrop dənəvər pazın həddi müvazinəti" , "Koordinatların funksiyası daxili sürtünmə bucağı olan anizotrop dənəvər mühitin həddi gərginlik halları", "Laylı plastik və anizotrop materiallar üçün Qəniyev möhkəmlik kriterisinin tətbiqi imkanları haqqında", "Möhkəmlik xarakteristikaları istiqamət və koordinat funksiyaları olan qeyri-bircins anizotrop dənəvər mühitin həddi müvazinəti" və s.

M.Əliyev Tatarıstan Respublikası Təhsil Nazirliyinin, "Tatneft" ASC, ADNİ, RF Təhsil və Elm Nazirliyinin fəxri fərmanları ilə mükafatlandırılıb. O, Rusiya Federasiyasının fəxri Ali Peşə Təhsili İşçisidir.



## Əliyev
## Məmmədbağır Cavad oğlu

*Tibb elmləri doktoru, professor.*
*Rusiya Tibb Elmləri Akademiyasının N.N.Bloxin adına Rusiya Onkoloji Elmi Mərkəzi direktorunun elmi və müalicə işi üzrə müavini. RTEA-nın Elmi-Tədqiqat Uşaq Onkologiya və Hematologiya İnstitutunun direktoru*

Əliyev Məmmədbağır Cavad oğlu 1955-ci il aprelin 8-də Tacikistan Respublikasının Kurqan-Tübə şəhərində həkim ailəsində anadan olub.

1979-cu ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) bitirib. 1979-1980-ci illərdə Bakıda A.Caparidze adına 3 nömrəli şəhər kliniki xəstəxanasının bazasında “cərrahiyyə” ixtisası üzrə internatura keçib. 1980-1983-cü illərdə Bakıda, Respublika kliniki xəstəxanasında reanimatoloq işləyib.

M.Əliyev 1984-1987-ci illərdə N.N.Priorov adına Mərkəzi Elmi-Tədqiqat Travmatologiya və Ortopediya İnstitutunun aspiranturasında oxuyub. Aspiranturanı bitirəndən sonra “Anadangəlmə bud çıxığının konservativ müalicəsindən sonra bud sümüyü başının aseptik nekrozu (klinika, diaqnostika, müalicə)” mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

M.Əliyev sonrakı illərdə Ə.Əliyev adına Azərbaycan Dövlət Həkimləri Təkmilləşdirmə İnstitutu klinikasının travmatologiya məntəqəsində həkim-travmatoloq, həmin klinikanın torakal bölməsinin (1989-cu ildə bölmənin adı dəyişdirilərək ortopediya bölməsi adlandırılıb) müdiri, Azərbaycan Onkoloji Elmi Mərkəzinin böyük elmi işçisi vəzifələrində çalışıb. SSRİ Tibb Elmləri Akademiyasının Ümumittifaq Onkoloji Elmi Mərkəzində “Dayaq-hərəkət aparatı şişlərinə görə radikal müalicə aparılmış xəstələrin tibbi-sosial reabilitasiyası” mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

M.Əliyev 1998-ci ildə “Osteogen sarkomanın kombinə olunmuş müalicə üsullarının işlənib hazırlanmasına və kliniki təcrübəyə tətbiq edilməsinə görə” RF-nin elm və texnika sahəsində birinci Dövlət Mükafatına layiq görülüb. Ona “onkologiya” ixtisası üzrə professor elmi adı verilib. Dünya şöhrətli akademik N.N.Trapeznikov vəfat etdikdən sonra bu böyük alimin elmi məktəbinə M.Əliyev başçılıq edib.

2003-cü ilin sonunda M.Əliyev Rusiya Tibb Elmləri Akademiyasının (RTEA) müxbir üzvü seçiləndə onun namizədliyini Rusiya Onkoloji Mərkəzinin direktoru

M.Davıdov dəstəkləyib. N.N.Bloxin adına Rusiya Onkoloji Elmi Mərkəzində (ROEM) Elmi-Tədqiqat Uşaq Onkologiya və Hematologiya İnstitutuna başçılıq edən M.Əliyev Rusiyanın ən yaxşı uşaq onkoloqları cərgəsində yer tutur.

Professor M.Əliyev müasir onkologiyanın ən mühüm və yüksək texnoloji istiqamətlərindən biri olan multidistiplinar elm – ortopedik onkologiya sahəsində görkəmli alimdir.

M.Əliyevin əsas əsərləri onkologiyada sümük, yumşaq toxuma sarkomasının, rekonstruktiv və damar cərrahiyyəsinin və bədxassəli dəri şişlərinin kompleks müalicəsi məsələlərinə həsr edilib. M.Əliyevin başçılıq etdiyi klinikada aparılan müasir kimyəvi terapiya sümüklərin ağır dərəcəli sarkomasından əziyyət çəkən xəstələrin 80 faizinin sağ qalmasına imkan yaradır. Orqanqoruyucu müalicə endoprotezləşdirmədən (onu praktiki olaraq dünya standartları səviyyəsinə çatdırmaq mümkün olub) və sümük-damar plastikasının müxtəlif metodlarından geniş istifadə etməklə sarkomadan əziyyət çəkən xəstələrin 85 faizindən çoxunun ətrafını qorumağa imkan verir.

M.Əliyev iri oynaqların endoprotezləşdirilməsi, borulu uzun sümüklərin endoprotezlərlə tam əvəzlənməsi, ətrafların şişlərində çoxkomponentli rekonstruktiv cərrahiyyə kimi orqanqoruyucu əməliyyatların işlənməsinə xüsusi diqqət yetirir. Son illər orqanqoruyucu əməliyyatlardan sonra erkən və gec ağırlaşmaların müalicəsi istiqamətinə M.Əliyevin rəhbərliyi ilə yeni təkan verilib. Bu gün belə əməliyyatlar uşaq onkologiyasında tətbiq edilir. Yəni, orqanqoruyucu müalicə uşaqlarda da cərrahi yolla müalicə standartına çevrilib. Sümük və yumşaq toxuma şişlərindən əziyyət çəkən uşaqların 90 faizində orqanqoruyucu əməliyyatlar aparılır. İnfeksion ağırlaşmaların müasir profilaktika və müalicə rejimləri işlənib hazırlanıb, iri oynaqların təkrar endoprotezləşdirilməsinə tövsiyələr müəyyən olunub. Mikrodamar anastomozlarda endoprotezləşdirmə ilə yanaşı, sümük və sümük-əzələ autotransplantatlardan istifadə etməklə, rekonstruktiv-plastik əməliyyatlar geniş tətbiq edilir. Yerli-yayılmış sarkomalarda damar plastikasının yerinə yetirilməsi ilə əməliyyatlar işlənib hazırlanıb.

M.Əliyevin elmi-praktiki fəaliyyətinin digər istiqaməti aksial skeletin birincili və metastatik şişlərinin (çanaq, döş qəfəsi divarı, onurğa şişləri) müalicəsi strategiyası və taktikasının işlənib hazırlanmasıdır. Onurğaya operativ müdaxiləni ədəbiyyatda çox vaxt "XXI əsrin cərrahiyyəsi" adlandırırlar. Bölmədə işlənib hazırlanan, müasir kimyəvi-şüa terapiyası rejimləri ilə dekompressiv və dekompressiv-sabitləşdirici əməliyyatlar, habelə vertebroplastika həcmində cərrahi müdaxiləni uzlaşdıran

müalicəvi yanaşmalar metastatik onurğa zədələnmələrindən əziyyət çəkən xəstələrin 80 faizindən çoxunun nevroloji statusunu və həyat keyfiyyətini yaxşılaşdırmağa imkan verir. Proqnoz faktorlarını nəzərə almaqla, onurğa şişlərinin cərrahi müalicəsi üçün tövsiyələrin işlənməsinə xüsusi diqqət yetirilir. Bu zaman təkcə proqnoz xarakterli xarici tədqiqatlardan deyil, həm də məxsusi tədqiqatlardan istifadə olunur.

Professor M.Əliyevin rəhbərliyi ilə çanaq və oma sümüyü sarkomaları cərrahiyyəsinin inkişafına yeni təkan verilib. Bu, onkoloji cərrahiyyənin əməliyyat zamanı travma hallarının yüksək olması, böyük qan itkisi və çanaq sümüklərinin qüsurlarının aradan qaldırılması zərurəti ilə bağlı olan ən mürəkkəb bölməsidir. Şişin vizuallaşdırılmasının yeni metodlarının geniş tətbiqi (kompyuter tomoqrafiyası, maqnit-rezonans tomoqrafiya), rezeksiya həcminin ciddi planlaşdırılması, optimal istifadə yollarının işlənib hazırlanması, cərrahiyyə texnikasının təkmilləşdirilməsi – bütün bunlar erkən və gec ağırlaşmalar tezliyinin xeyli azalmasına, habelə bu cür çətin xəstələrdə onkoloji radikalizm səviyyəsinin artmasına kömək edib. Klinikada işlənib hazırlanmış regionar damarların qabaqcadan endoskopik liqaturaya alınması ilə şişlərin kəsilib götürülməsi metodikası tətbiq ediləndən sonra oma sümüyü şişlərinin cərrahi yolla müalicəsində unikal nəticələr əldə olunub. Bu da əməliyyatdaxili qan itkisinin həcmini xeyli azaltmağa, yaxşı kosmetik nəticə əldə etməyə imkan verib. Bir sıra cərrahi müdaxilələr Rusiyada ilk dəfə edilib.

M.Əliyevin rəhbərliyi ilə birincili sümük şişləri olan onkoloji xəstələrdə Rusiya üçün prioritet olan İlizarov metodundan istifadə göstərişləri işlənib hazırlanıb və onkoloji terapiyada ümumi təcrübədən keçirilib. Patoloji sınıqların İlizarov aparatının köməyi ilə fiksasiya edilməsi xəstələri tez fəallaşdırmağa və şişə qarşı müalicəni vaxtında aparmağa imkan verir ki, bu da pasiyentin həyatının keyfiyyətini xeyli yaxşılaşdırır. Onun rəhbərliyi ilə bədxassəli dəri şişlərinin müalicəsində kombinə olunmuş yanaşma imkanlarının öyrənilməsi istiqamətində də tədqiqatlar davam etdirilir. Müasir rekonstruktiv-plastik cərrahiyyə və mikrocərrahiyyə metodlarından istifadə olunması ilə yanaşı, əməliyyatdan əvvəlki kimyəvi-şüa terapiyası ilə neoadyuvant yanaşma bir tərəfdən böyük onkoloji radikalizmə, digər tərəfdən ən yaxşı funksional nəticələrə müvəffəq olmağa imkan verib. Klinikada disseminasiyaya uğramış dəri melanomasının müalicəsində vaksinoterapiyanın roluna dair yeni beynəlxalq protokol çərçivəsində tədqiqatlar aparılır.

Professor 2005-ci ilin dekabrından ROEM-in Uşaq Onkologiya və Hematologiya İnstitutunun direktorudur. Onun rəhbərliyi ilə xəstələrin müalicəsi ən yüksək səviyyədə təşkil edilib, onkoloji pediatriyanın ən müasir nailiyyətləri nəzərə alınıb, ins-

titutun sıx elmi əlaqələr saxladığı dünyanın aparıcı onkoloji mərkəzlərinin işləyib hazırladığı beynəlxalq elmi proqramlardan istifadə olunur.

M.Əliyev 2006-cı ildə ikinci dəfə RF-nin elm və texnika sahəsində Dövlət Mükafatının laureatı olub. Bir il sonra Rusiya Tibb Elmləri Akademiyasını akademiki seçilib.

O, dərc olunmuş 222 elmi əsərin (215-i həmmüəllif kimi), o cümlədən 2 monoqrafiyanın (həmmüəllif), 1 kitabın (həmmüəllif), habelə 7 ixtiranın və 6 səmərələşdirici təklifin müəllifidir

M.Əliyev RTEA-nın N.N.Bloxin adına ROEM-in Birgə Elmi Şurasının və doktorluq dissertasiyalarının müdafiəsi üzrə Elmi Şurasının, N.N.Priorov adına Mərkəzi Elmi-Tədqiqat Travmatologiya və Ortopediya İnstitutunun Elmi Şurasının, Beynəlxalq Protokolların Aparılması üzrə Avropa Onkoloqlar Təşkilatının (EORTC), Beynəlxalq Ortoped-Travmatoloqlar Cəmiyyətinin (SICOT), Avropa Ortoped-Onkoloqlar Cəmiyyətinin (EMSOS) üzvüdür.

RF Hökumətinin "Rusiya Federasiyası Hökumətinin 2006-cı ilin elm və texnika sahəsində mükafatlarının verilməsi haqqında" 2007-ci il 22 fevral tarixli 121 nömrəli qərarı ilə M.Əliyevin daxil olduğu alimlər qrupu bakterial produsentlərin yaradılmasına, insanın rekombinant sitokinləri əsasında substansiya və preparatların biotexnoloji istehsalının təşkilinə və "Betaleykin" tibb preparatının tətbiqinə görə mükafata layiq görülüb. 2011-ci ildə M.Əliyev REA-nın həqiqi üzvü seçilib.

O, Azərbaycanın "Şöhrət" ordeni (2006), Azərbaycan Respublikası Prezidentinin fəxri diplomu (2015) ilə təltif edilib. M.Əliyevə "Rusiya Federasiyasının Əməkdar Elm Xadimi" adı verilib.



## Əliyev
## Ruslan Allahverdi oğlu

*İqtisad elmləri namizədi.*
*Moskva Dövlət Beynəlxalq Münasibətlər İnstitutunun təbiətdən istifadə və ekologiya sahəsində beynəlxalq kompleks problemlər kafedrasının müdiri*

Əliyev Ruslan Allahverdi oğlu 1974-cü il yanvarın 24-də Moskvada anadan olub.

1990-cı ildə Moskva Dövlət Beynəlxalq Münasibətlər İnstitutunun (MDBMİ) beynəlxalq hüquq fakültəsinə daxil olub. 1996-cı ildə oranı bitirib. 1998-ci ildə MDBMİ-nin beynəlxalq iqtisadi münasibətlər fakültəsinin sığorta kafedrasında "Ticarətin sığorta xidmətləri ilə tənzimlənməsinin beynəlxalq standartları və praktikası" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

R.Əliyev 1996-cı ilin sentyabrından Azərbaycan Respublikası Xarici İşlər Nazirliyinin Hüquq İdarəsində çalışıb. Müxtəlif illərdə Xəzər dənizinin hüquqi statusu haqqında Konvensiyanın işlənib hazırlanması üzrə Xüsusi işçi qrupunda işləyib, Avropa Şurası ilə əməkdaşlığa cavabdeh olub.

R.Əliyev 2000-ci ilin martında Azərbaycan Respublikasının Dövlət Neft Şirkətində (ARDNŞ) Xarici İnvestisiya İdarəsi rəisinin sığorta məsələləri üzrə müavini vəzifəsinə təyin edilib. "Atəşgah" (Azərbaycan-Rusiya) Birgə Səhmdar Sığorta Şirkətinin Müşahidə Şurasının üzvü olub.

R.Əliyev 2004-cü ilin iyununda "Kapital perestraxovaniye" Qapalı Səhmdar Cəmiyyətinin Moskva filialına icraçı direktor vəzifəsinə dəvət edilib. İri sığorta şirkəti olan "Kapital perestraxovaniye" hələ 1996-cı ilin ortalarında Rusiyanın 10 ən yaxşı sığorta şirkəti sırasına daxil olub. O, korporativ sığorta bazarının ən iri oyunçularından biri mövqeyini bu günə qədər qoruyub saxlayır. Şirkətin uğurla fəaliyyət göstərdiyi illər ərzində yanacaq-energetika kompleksinin bir çox müəssisələri, məsələn, "LUKoyl" Neft Şirkəti, "RusQidro" ASC və "İNTER RAO YEES" ASC kimi nəhəng şirkətlər, habelə böyük zavodlar, fabriklər və Rusiyanın digər iri və orta biznes müəssisələri onun müştəriləri olub.

R.Əliyev 2007-ci ilin oktyabrında "Kapital" sığorta qrupunun prezidenti, 2008-ci ilin noyabrında "Kapital straxovaniye" ASC-nin baş direktoru təyin edilib.

R.Əliyev 2010-cu ilin aprelindən "Kapital straxovaniye" ASC-nin baş direktorunun müşaviridir.

O, 2009-cu ildə Rusiya Menecerlər Assosiasiyasının və "Kommersant" Nəşriyyat Evinin versiyasına görə Rusiyanın ən peşəkar yüksək vəzifəli rəhbərləri sırasına daxil olub.

Moskvada yaşayan R.Əliyev Azərbaycan və Azərbaycan diasporu ilə sıx əlaqə saxlayır. O, Rusiyanın ən nüfuzlu ali məktəblərindən biri olan MDBMİ-nin həyatında fəal iştirak edir. MDBMİ-nin İnkişaf Fondunun investisiya komitəsinin və MDBMİ-nin məzunlarının maliyyə komitəsinin tərkibinə daxildir, ali məktəbin müxtəlif layihələrinin və tədbirlərinin həyata keçirilməsinə kömək edir. R.Əliyev 2011-ci ildə MDBMİ-nin təbiətdən istifadə və ekologiya sahəsində beynəlxalq kompleks problemlər kafedrasının müdiri təyin edilib.



## Əliyev
## Zahid Səməd oğlu

*Texnika elmləri doktoru, professor.*
*İ.M.Qubkin adına Rusiya Dövlət Neft və Qaz Universitetinin qaz və qaz-kondensat yataqlarının işlənməsi və istismarı kafedrasının professoru*

Əliyev Zahid Səməd oğlu 1935-ci il martın 10-da Azərbaycan Respublikasının Şamxor rayonunun (indiki Şəmkir) Sabirkənd kəndində anadan olub.

1957-ci ildə Məşədi Əzizbəyov adına Azərbaycan Sənaye İnstitutunu (sonralar M.Əzizbəyov adına Neft və Kimya İnstitutu, indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) "neft yataqlarının istismarı" ixtisası üzrə bitirib. 1957-ci ildən 1958-ci ilədək Azərbaycan Elmlər Akademiyasının neft ekspedisiyasının kiçik elmi işçisi, 1958-ci ildən 1960-cı ilədək Azərbaycan Elmi-Tədqiqat Neftçıxarma İnstitutunun (AzərETNÇİ) kiçik elmi işçisi işləyib. Z.Əliyev 1964-cü ildə Ümumittifaq Elmi-Tədqiqat Təbii Qaz İnstitutunda (ÜETTQİ) "Lay təzyiqi saxlanılmadan qaz-kondensat yataqlarının işlənməsinin bəzi məsələləri" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

Z.Əliyev 1965-1968-ci illərdə Bolqarıstanda Çiren və Novo-Oryaxovo qaz-kondensat yataqları layihəsinin baş mühəndisi işləyib. 1965-1973-cü illərdə qaz yataqlarının işlənməsi layihələrinin rəhbəri və qaz yataqlarının mənimsənilməsi üzrə Hökumətlərarası Komissiya sədrinin müavini kimi Bolqarıstanda və Almaniyada xidməti ezamiyyətdə olub. 1961-1979-cu illərdə ÜETTQİ-də işləyib. 1979-cu ildə İ.M.Qubkin adına Moskva Neft-Kimya və Qaz Sənayesi İnstitutuna (MNKQSİ) dəvət edilib. Hazırda bu institutda professor vəzifəsində çalışır.

Z.Əliyev 1984-cü ildə İ.M.Qubkin adına MNKQSİ-də texnika elmləri doktoru elmi dərəcəsi almaq üçün "İlkin məlumat almağın qaz-hidrodinamik metodlarının işlənməsi və tətbiqi, qaz və qaz-kondensat quyularının istismarının texnoloji rejiminin əsaslandırılması" mövzusunda dissertasiya müdafiə edib.

Z.Əliyev "Qazprom", "LUKoyl", "Yurxarovneftqaz", "TransNafta", "Taymırneftqaz", habelə Latviya, Qazaxıstan, Əlcəzair, İran, İraq, Vyetnam, Çin və s. ölkələrin şirkətlərinin tədqiqat layihələrinin, elmi-tədqiqat mövzularının rəhbəri və məsul icraçısıdır. O, qaz sənayesində qəbul edilmiş normativ sənədlərin (təlimat, tövsiyə və standartlar) müəllifidir.

Z.Əliyev 1996-cı ildən Təbiət və Cəmiyyət Beynəlxalq Elmlər Akademiyasının (TCEBA) və Rusiya Təbiət Elmləri Akademiyasının (RTEA) akademikidir.

Z.Əliyev üfüqi və şaquli quyular vasitəsilə neft-qaz yataqlarının tədqiqi, istismarı və işlənməsi məsələlərinə həsr olunmuş 327 elmi əsərin, o cümlədən 27 monoqrafiyanın və 23 tematik kitabçanın müəllifidir.

O, İ.M.Qubkin adına Rusiya Dövlət Neft və Qaz Universitetində "Üfüqi quyuların tətbiqi texnologiyaları"nın elmi əsaslarını hazırlayıb. Bu texnologiyaların bazasında yeni fənn yaradıb və yeni tədris proqramını tədris prosesinə tətbiq edib. Bu tədris proqramı universitetdə neft-qaz texnologiyaları sahəsində ən müasir istiqamət sayılır. O, təkcə üfüqi texnologiyaların ayrı-ayrı aspektlərini nəzərdən keçirmir, həm də Rusiyanın və xarici ölkələrin neftqazçıxarma şirkətlərinin konkret sifarişlərini yerinə yetirərək, ayrı-ayrı quyuların və ya quyular kompleksinin əsaslandırılması və layihələndirilməsi ilə məşğul olur.

Z.Əliyevin fəaliyyəti nəticəsində çoxsaylı kitablar, habelə "Üfüqi quyuların tədqiqinə dair tövsiyə" və "Qaz siqnalizatoru vasitəsilə yataqların işlənməsinin layihələndirilməsinə dair tövsiyə" kimi tədris vəsaitləri nəşr olunub.

Neft-qaz yataqlarının işlənməsinin layihələndirilməsinə lisenziyası olan Z.Əliyev bu yataqları geoloji-riyazi modellər yaratmaq yolu ilə layihələndirir.

Alim Almaniya Demokratik Respublikasının (ADR, indiki Almaniya Federativ Respublikası) "Vətən qarşısında xidmətlərə görə" ordeni (1972), ADR-in "Əməkdə fərqlənməyə görə" medalı (1973), SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin gümüş medalı (1981), "Qaz sənayesi əlaçısı" (1982) və "Yanacaq-energetika kompleksinin fəxri işçisi" (2005) nişanları, RTEA-nın Vernadski adına medalı (2005) ilə təltif edilib, İ.M.Qubkin adına mükafatın laureatıdır (2008). 2004, 2005, 2007 və 2008-ci illərdə ABŞ-da "İlin adamı" seçilib. Fəxri qızıl medal və Rusiya üçün qızıl medal (2007, ABŞ), "Beynəlxalq sülh elçisi" ordeni ilə təltif edilib (2006, ABŞ), Beynəlxalq sülh mükafatı laureatıdır (2005, ABŞ).

Z.Əliyev "İlin professionalı" (2005, İngiltərə), dünyanın 100 ən görkəmli adamından biri (2004, İngiltərə), XX əsrin 2000 ən görkəmli adamından biri (2005, İngiltərə) seçilib. Ona "Canlı əfsanə" (2005, İngiltərə) və "Zati-həzrətləri" (2006, İngiltərə) titulları verilib.



## Əliyeva
## Adilə Seyfulla qızı

*Pianoçu.*
*Azərbaycanın Əməkdar Artisti*

Əliyeva Adilə Seyfulla qızı Bakıda anadan olub.

Fortepiano ilə məşğul olmağa beş yaşından başlayıb. Radioda ilk dəfə altı yaşında çıxış edib. İlk konserti Leo Qinzburqun rəhbərliyi altında simfonik orkestrlə yeddi yaşında olub. Sonra ekranlara çıxan "Dostluq melodiyaları" sənədli filmində A.Əliyeva Niyazinin rəhbərliyi altında D.Şostakoviçin ikinci konsertini ifa edib.

O, Moskvada P.İ.Çaykovski adına Konservatoriyanı qırmızı diplomla, sonra isə orada aspiranturanı əla qiymətlərlə başa vurub.

A.Əliyeva Qara Qarayev, Edison Denisov, Boris Çaykovski kimi bəstəkarların əsərlərinin ilk ifaçısı olub. R.Şedrin, D.Bayers (BBC radiosunun musiqi departamentinin direktoru), Q.Dmitriyev, O.Rəcəbov, A.Dadaşov, R.Mirişli, V.Mustafazadə və başqaları onun üçün əsərlər yazıblar.

A.Əliyeva, həmçinin P.İ.Çaykovski adına Moskva Konservatoriyası professorlarını və məşhur solistlər Lev Mixaylov, Rodion Azarxin və başqalarını birləşdirən "Zvezdı Rossii" ansamblının lideri olub.

A.Əliyeva öz parlaq çıxışları dövründə "Melodiya", "Cascavell", "Qallo", "Disque office" səsyazma firmalarında 30 DVD yazdırıb.

İngiltərə (BBC), Almaniya (Deutchland Funk və başqaları), Belçika (RTBF, BRT), İsveçrə (DRS, RSI, RSR), İsveç, Norveç, Finlandiya, İslandiya, Hollandiya, Fransa, Danimarka və İrlandiyanın 200-dən çox radio və televiziya kanalı onun ifaçılıq sənətinə həsr edilən müntəzəm proqramlar yayımlayır.

Dünyanın 50-dən çox ölkəsində keçirilmiş nüfuzlu konsertlər sırasında A.Əliyeva, həmçinin Lütserndə (İsveçrə) Beynəlxalq Musiqi Festivalında, Stokholmda (İsveç) Kral Musiqi Festivalında, Sibelius adına Beynəlxalq Musiqi Festivalında, Visbadendə (Almaniya) Reyn Beynəlxalq Musiqi Festivalında, Danimarka, Finlandiya və digər ölkələrdə bir çox festivallarda çıxış edib. A.Əliyeva beynəlxalq radio festivallarında, o cümlədən Fransa Beynəlxalq Dini Musiqi Festivalında, Flandriya (Belçika) Beynəlxalq Festivalında, Amsterdamda Niderland Filarmonik Orkestrinin

silsilə konsertlərində, habelə ən nüfuzlu konsert zallarında, o cümlədən Konsertqebaumda (Hollandiya), İtaliyada Santa Çeçiliya Akademiyasının ən yaxşı konsert zalında və s. çıxış edib. A.Əliyeva BBC radiosunun Yay-Dəvət Konsertlərində, "Skryabin-plyus" nüfuzlu festivalın birinci açılış konsertində iştirak edib. İkisaatlıq konsert proqramı canlı efirdə yayımlanıb.

A.Əliyeva yeganə azərbaycanlıdır ki, onun adına 1998-ci ildən Fransa hökumətinin dəstəyilə müntəzəm olaraq Pianoçuların Beynəlxalq Musiqi Festivalı keçirilir. Hər dəfə bu festivalda 40-dan çox ölkənin, o cümlədən Azərbaycanın nümayəndələri iştirak edirlər. Bəstəkar Rodion Şedrin, əfsanəvi balerina Mayya Plisetskaya, Avropanın ən böyük radio və televiziya stansiyalarının direktorları, Şarl Dyutua, Rudolf Barşay və başqaları, Avropanın ən böyük qəzetlərinin musiqi tənqidçiləri A.Əliyeva adına Pianoçuların Beynəlxalq Müsabiqəsi Komitəsinin fəxri üzvləri olublar.

2009-cu ildə İsveçrə televiziyası A.Əliyevanın həyat və yaradıcılığı haqqında iki sənədli film çəkib. Bu filmlər Biarris (Fransa), Nion (İsveçrə) Beynəlxalq kinofestivallarında, habelə Yaponiyada və Amerikada nümayiş olunub.

"The New York Times" (ABŞ) qəzetinin ən nüfuzlu musiqi tənqidçilərindən biri, "The Great Pianists: From Mozart to the Present" ("Motsartdan dövrümüzədək böyük pianoçular" ensiklopediyasının müəllifi H.Şonberq A.Əliyevanın səsyazmaları haqqında "Amerika səsyazma bələdçisi" ("American record guide") nəşrində yazıb: "Adilə Əliyeva gözəl pianoçudur. O, müstəsna barmaqları, kamil musiqisi və heyrətamiz emosiyası ilə musiqinin zirvəsində dayanır". Fransanın "Dofine Libere" qəzeti A.Əliyeva haqqında yazıb: "...virtuoz, fortepiano şahzadəsi: müstəsna dərəcədə beynəlxalq karyera... Adilə Əliyeva ilə hər şey qeyri-adidir, musiqi ulduz kimi şölə saçır. Onun barmaqları – pərilər fortepianonun çoxsaylı dillərində zərif və ya ehtirasla sürüşərək, tamaşaçıları onun böyük istedadının alovunun parladığı başqa bir aləmə aparır".

Hazırda A.Əliyeva İsveçrə və Fransada fortepiano professorudur.



## Əmiraslanov Yusif Əbülfət oğlu

*Tibb elmləri doktoru, professor.*
*A.V.Vişnevski adına Cərrahiyyə İnstitutunun irinli cərrahiyyə şöbəsinin baş elmi işçisi*

Əmiraslanov Yusif Əbülfət oğlu 1949-cu il aprelin 30-da Azərbaycan Respublikasının Kəlbəcər rayonunda anadan olub.

1972-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Dövlət Tibb Universiteti) bitirib. Təhsil aldığı vaxt Bakıdakı Caparidze adına xəstəxanada üç il feldşer kimi çalışıb. 1972-ci ildən iki il Tula vilayətinin Şekino rayon mərkəzi xəstəxanasında cərrah işləyib. 1974-cü ildən Rusiya Tibb Elmləri Akademiyasının (RTEA) A.V.Vişnevski adına Cərrahiyyə İnstitutuna işə götürülüb və orada ordinatorluqdan baş elmi işçi, cərrahi infeksiya kafedrasının professoru vəzifəsinədək yüksəlib.

Y.Əmiraslanovun müəllim və hamiləri RTEA-nın akademiki M.İ.Kuzin, RTEA-nın müxbir üzvü A.M.Svetuxin kimi məşhur cərrah-alimlər olub. Onların təsiri altında Y.Əmiraslanov müstəqil alim və istedadlı cərrah kimi formalaşıb.

1978-ci ildə Y.Əmiraslanov “İrinli cərrahi infeksiyası olan xəstələrdə hemokoakulyasiya göstəricilərinin dəyişməsi” mövzusunda namizədlik, 1986-cı ildə “İdarəolunan abakterial şəraitdə böyük irinli yaralarla açıq sınıqları olan xəstələrin aktiv cərrahi müalicəsi” mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Y.Əmiraslanov 1997-ci ildə professor, 1998-ci ildə Nyu-York Akademiyasının akademiki seçilib, 2001-ci ildən isə RTEA-nın akademikidir.

O, yumşaq toxumaların kəskin irinli xəstəliklərinin, irinli travmatologiyanın (osteomielit, qasıq oynaqları, əzələlərin irinli zədələnməsi) diaqnostikası və müalicəsi, hematogen osteomielitin müalicəsi, dayaq-hərəkət aparatının rekonstruksiya-bərpa və plastik əməliyyatları, yumşaq toxumalar və sümüklərdə qüsurların dəyişdirilməsi, sümüklərin uzadılması və regenerasiyası məsələlərində və müalicəsində ixtisaslaşıb. Dermotenziya, “sakvoyaj” kimi əməliyyatlar hazırlayıb.

Y.Əmiraslanov irinli cərrahiyyə və travmatologiyada rekonstruksiya-bərpa problemi üzrə məktəb yaradıb. Onun rəhbərliyi altında 3 doktorluq və 8 namizədlik dissertasiyası müdafiə olunub.

Y.Əmiraslanov 250-dən çox elmi əsərin müəllifidir. O, həkimlər üçün iki ("Yaralar və yara infeksiyası", 1981, 1990) vəsaitin müəlliflərindən biridir. Bununla yanaşı, o, "Cərrahi infeksiyalar üzrə praktik vəsait"in (2006) "Klinik cərrahiyyə üzrə federal vəsait"in, 3 dərsliyin, 5 elmi-praktiki sənədli filmin, 1 multimedia vəsaitinin ("İrinli cərrahi infeksiya"), 4 monoqrafiya tipli icmal informasiya buraxılışının, eləcə də 3 müəlliflik şəhadətnaməsi və 4 səmərələşdirici təklifin müəllifidir.

O, "İnfeksii v xirurqii" jurnalının redaksiya heyətinin, habelə "Yanıqlar və yaralar", "Plastik cərrahiyyə" problem komissiyalarının üzvüdür.

Y.Əmiraslanov Arzamas və Başqırdıstanda texnogen fəlakətlər (1988) və Ermənistanda zəlzələ (1988) qurbanlarının, Şimali Osetiyada terror hücumlarında (2004) və Cənubi Osetiyadakı silahlı münaqişədə (2008) yaralananların müalicəsində fəal iştirak edib.

O, "Əməkdə fərqlənməyə görə", "A.V.Vişnevski", "R.Vikxrov" medalları ilə təltif olunub. 2003-cü ildə irinli-septik xəstəliklərin cərrahi müalicəsində yeni texnologiyaların hazırlanması və kliniki praktikaya tətbiqinə görə Y.Əmiraslanov Rusiya Federasiyası Hökumətinin mükafatı ilə təltif olunub.



## Əsədov
## Şuriyyə Gülmalı oğlu

*"AlyansAvtoQrupp" MMC-nin baş direktoru*

Əsədov Şuriyyə Gülmalı oğlu 1946-cı il iyunun 1-də Azərbaycan Respublikasının Füzuli rayonunun Qurdlar kəndində anadan olub.

1953-1964-cü illərdə Qurdlar orta məktəbində təhsil alıb. 1965-ci ildə sovet ordusunda hərbi xidmətə çağırılıb və Kozelskdə (Kaluqa rayonu) xidmət edib. 1968-ci ildə hərbi xidməti başa vurub Keşlə maşınqayırma zavodunda sürücü kimi işə başlayıb.

1969-cu ildə Ş.Əsədov Qərbi Sibirin neft-qaz komplekslərinin mənimsənildiyi Tümen vilayətinin Nefteyuqansk rayonundakı Mamontovo qəsəbəsində yaşamağa və çalışmağa başlayıb. On üç il istidə və soyuqda ağır texnikanın sükanı arxasında neftçilərə avadanlıq və materialların fasiləsiz çatdırılması üçün sutkada 16-18 saat işləyib. Mamontovodakı texnoloji nəqliyyat idarəsinin rəhbərliyi Ş.Əsədovun əməksevərliyini və əzmkarlığını qiymətləndirərək onu istismar şöbəsinin rəhbəri təyin edib.

1984-cü ildə Ş.Əsədov əmək fəaliyyətini Nyaqan şəhərində (Xantı-Mansi Muxtar Vilayəti) davam etdirib. Burada o, Yol-tikinti, daha sonra Krasnoleninsk mexanikləşdirilmiş işlər idarələrinə rəhbərlik edib. 1986-cı ilin oktyabrında "Krasnoleninsknefteqaz" İstehsalat Birliyi 2 saylı Texnoloji Nəqliyyat İdarəsini yaradıb, Ş.Əsədov ora rəhbər təyin olunub və bu günədək həmin müəssisəyə başçılıq edir.

Gərgin əmək fəaliyyətinə baxmayaraq, 1993-cü ildə Ş.Əsədov Tümen Sənaye İnstitutunu "istehsalın təşkili" ixtisası üzrə bitirib.

Uzunmüddətli əmək fəaliyyətinə görə dəfələrlə mükafatlandırılıb: "Fəxri neftçi" (1995), "Rusiya Federasiyasının Yanacaq-Energetika Nazirliyinin Əməkdar İşçisi" (1996), "Yanacaq-energetika kompleksinin fəxri işçisi" (1999), "Xantı-Mansi Muxtar Vilayətinin əməkdar nəqliyyat işçisi" (2002), "Nyaqan şəhərinin fəxri vətəndaşı" (2007) fəxri adları, "Rusiya neft sənayesinin 40 ili" yubiley medalı (2005).

2006-cı ilin martında Ş.Əsədov "Yedinaya Rossiya" siyasi partiyasından Nyaqan Şəhər Dumasının üzvü seçilib.



## Əsgərov
## Mirzağa Səftər oğlu

*Pedaqoji elmlər namizədi.*
*M.V.Lomonosov adına MDU-nun Akademik Xorunun bədii rəhbəri və dirijor*

Əsgərov Mirzağa Səftər oğlu 1959-cu ildə Dərbənd şəhərində (Dağıstan) anadan olub.

Altı yaşından Pionerlər Sarayında xalq çalğı alətləri dərnəyinə gedib, əvvəlcə nağara çalıb, rəqs edib, məktəb xorunda solist kimi çıxış edib və hətta “Dərbənd qartalları” milli rəqs ansamblının solisti olub, sonra. 1978-ci ildə Dərbənd Musiqi Məktəbinin xor dirijorluğu şöbəsini bitirib.

1983-cü ildə M.Əsgərov Həştərxan Dövlət Konservatoriyasını “xor dirijoru, xor fənləri müəllimi” ixtisası üzrə bitirib. Dərbənddəki Respublika Musiqi Məktəbində dərs deyib. 1984-cü ildə şəhər və respublika festivallarının laureatı olmuş kamera xorunu yaradıb.

1986-cı ildən M.Əsgərov Moskva Dövlət Mədəniyyət İnstitutunda (indiki Moskva Dövlət Mədəniyyət və İncəsənət Universiteti) xor dirijorluğu kafedrasında müəllim, sonra baş müəllim vəzifələrində çalışıb. 1993-cü ildə pedaqoji elmlər namizədi alimlik dərəcəsi almaq üçün “Mədəniyyət idarələrində bədii-publisistik fəaliyyətin təkmilləşdirilməsinin pedaqoji şərtləri” mövzusunda dissertasiya müdafiə edib. Eyni zamanda, nüfuzlu nəşrlərdə (o cümlədən Rusiya Federasiyası Təhsil və Elm Nazirliyinin “Vısieye obrazovaniye v Rossii” elmi-pedaqoji jurnalında) bir sıra elmi məqalələr dərc edib.

1990-cı ilin sentyabrından Rusiya Federasiyasının Əməkdar İncəsənət Xadimi, professor B.V.Baranovun tövsiyəsi ilə M.Əsgərov Moskva Dövlət Universitetinin Akademik Xorunda işləməyə başlayıb. Bu, Rusiyanın ən qədim xorlarından biridir, onun tarixi Moskva universitetinin əsasının qoyulduğu 1775-ci ildən başlayır. XVIII-XIX əsrlərin kəsişməsində universitet xor ifası Moskvada ən yaxşılardan biri hesab olunurdu. Müxtəlif vaxtlarda universitet xoruna M.M.İppolitov-İvanov, K.K.Albrext kimi dahi musiqiçilər rəhbərlik edib. Universitet xorunu P.İ.Çaykovski də yüksək qiymətləndirib. O, təkcə “Gaudeamus” tələbə himninə düzəlişlər etməyib, həm də böyük knyaz Konstantin Romanovun sözlərinə “Gülümsəyən xoşbəxtdir” əsərini yazıb.

M.Əsgərovun rəhbərliyi ilə MDU xoru Rusiya və beynəlxalq festival və müsabiqələrində uğurla iştirak edib və laureat diplomları qazanıb. "Rossiya pravoslavnaya" Milad incəsənət festivalları çərçivəsində, Böyük knyaz Daniil Moskovskinin vəfatının 700 illiyi münasibətilə dini musiqi konsertlərində, Şəhər Günü münasibətilə bayram tədbirlərində dəfələrlə iştirak edib. Ümumən MDU xoru 20-dən çox nüfuzlu beynəlxalq və Rusiya müsabiqə və festivallarının laureatı adını alıb.

Bundan əlavə, M.Əsgərovun rəhbərlik etdiyi xor MDU-da hesabat konsertlərində də eyni uğurla çıxış edir, bütün universitet şənliklərində, Moskvanın Şəhər Günü və Slavyan Yazısı və Mədəniyyəti Günü tədbirlərində iştirak edir. Xorun A.Puşkinin anadan olduğu gün şairin Tver meydanındakı abidəsi önündə çıxışları gözəl ənənəyə çevrilib.

MDU xorunun uğurlu və intensiv yaradıcılıq fəaliyyəti son illər Moskvanın ən nüfuzlu konsert zallarının dinləyicilərinin diqqətini cəlb edib. Bədii rəhbər və dirijor M.Əsgərovun rəhbərliyi altında xor İttifaqlar Evinin Sütunlu Zalı, Moskva konservatoriyasının Böyük və Raxmaninov zallarında, Çaykovski adına Konsert Zalında, Qnesinlər adına Akademiyanın zalında, Moskva Beynəlxalq Musiqi Evində, Elmlər Akademiyasının Fizika İnstitutunun konsert zalında, Kremlin Qurultaylar Sarayında, Xilaskar İsa Kilsəsinin zalında, Moskva və Bütün Rusiya Patriarxının Moskva Danilov monastırındakı iqamətgahında, Rusiya Elmlər Akademiyası Mərkəzi Alimlər Evinin Böyük Zalında, A.S.Puşkin adına Dövlət Muzeyində çıxış edib.

MDU xoruna rəhbərlik etməklə yanaşı, M.Əsgərov pedaqoji fəaliyyətini də davam etdirir. O, Rusiya Federasiyasının Əməkdar Mədəniyyət İşçisi, Ümumrusiya Musiqi Cəmiyyətinin Əməkdar Xadimidir.

Parlaq və temperamentli musiqiçi, vokal-xor sənətinin bilicisi, fortepiano və xalq çalğı alətlərinin ifaçısı, gənclərin və peşəkar həmkarlarının sevimlisi olan M.Əsgərov son illər musiqi müsabiqələrinin münsiflər heyətinə və ustad dərslərinin keçirilməsinə dəvət olunur. O, "Şöhrət, Mədəniyyət" (Niderland, 2005) festivalında ustad dərsləri keçib.

M.Əsgərov "Büllur lira" müsabiqəsində (Qus-Xrustalnı, 2007) və "Chorus İnside 2008" beynəlxalq festivalında (Moskva, 2008) münsiflər heyətinin sədri, habelə "Moskva – sülh şəhəri" (Moskva, 2007), "Gaudemus" VI universitet xorları festivalı (İjevsk, 2010) və "Festis" (hər il, 2009-2014) festivallarında münsiflər heyətinin üzvü olub.

Ali məktəbdə iş stajı, elmi və ifaçılıq fəaliyyətində uğurlar M.Əsgərova aparıcı Moskva ali məktəblərində dərs demək imkanı yaradıb. O, 2002-2005-ci illərdə

M.V.Lomonosov adına MDU-nun incəsənət fakültəsinin musiqi sənəti kafedrasının, 2006-2007-ci illərdə Moskva Pedaqoji Universitetinin musiqi-pedaqoji fakültəsinin xor dirijorluğu kafedrasının dosenti olub, 2007-ci ildən Moskva Dövlət Mədəniyyət və İncəsənət Universitetinin rus xalq müğənnilik kafedrasının dosentidir.

2009-cu ildə M.Əsgərov "Xalq musiqi mədəniyyəti sahəsində mütəxəssislərin peşəkar hazırlanmasına səriştəli yanaşma" dərs vəsaitini nəşr edib. 2011-ci ildə isə "Bədii təhsil sistemi üçün bakalavrların hazırlanmasının qloballaşdırma aspektləri" mövzusunu işləyib. Hər iki elmi əsər Moskva Dövlət Mədəniyyət və İncəsənət Universiteti tərəfindən nəşr olunub.



## Əsgərov
## Şahrəddin İsabala oğlu
*"Aerostar" Ukrayna aviasiya şirkətinin prezidenti*

Əsgərov Şahrəddin İsabala oğlu 1966-cı il oktyabrın 7-də Ermənistan Respublikasının Artanış kəndində anadan olub.

1984-cü ildə Ş.Əsgərov S7 sinfində raket modelləşdirməsi ilə peşəkarcasına məşğul olmağa başlayıb. Bu sahədə əla nəticələr əldə edib. SSRİ, Avropa və dünya çempionu olub.

1984-cü ildə Bakıda orta məktəbi qızıl medalla bitirib. Elə həmin il Kiyev Mülki Aviasiya İnstitutuna daxil olub və 1992-ci ildə təhsilini "aviasiya avadanlığının texniki istismarı" ixtisası üzrə qırmızı diplomla bitirib və mühəndis-elektrik ixtisası alaraq 1992-ci ildə aspiranturaya qəbul edilib.

Əmək fəaliyyətinə 1992-ci ildə "Aviatexnika" müəssisəsində başlayıb, burada kommersiya direktoru vəzifəsində çalışıb. 1993-cü ildə aviabrokerliklə məşğul olmağa başlayıb. Bu biznesin mahiyyəti kiçik "An-28", "Yak-40" sovet təyyarələri, yaxud Çexoslovakiya istehsallı "L-410" təyyarələrinə sahib olan daşıyıcılar üçün fərdi müştərilər tapmaqdan ibarət idi. Hər bir belə reys üçün vasitəçi sifariş məbləğinin 5-6 faizini əldə edirdi. İki il ərzində əsasən Zaporojye, Mariupol, Xarkov, Donetsk və Dnepropetrovsk kimi iri sənaye şəhərlərinə 3 min biznes uçuş təşkil edən Ş.Əsgərov 750 min dollar qazanıb. 1995-ci ildə o, "Tsentr delovoy aviatsii" Qapalı Tipli Səhmdar Cəmiyyətinə rəhbərliyə gəlib.

Ş.Əsgərov Ukraynada işgüzar aviasiyanın banisi, biznes-sərnişinlərə xidmətin müasir Ukrayna konsepsiyasının müəllifidir. Uzun illər boyu fəal elmi fəaliyyətlə məşğuldur və bir sıra elmi əsərlərin müəllifidir. Bir neçə xarici dil bilir.

1997-ci ildən Ş.Əsgərov "Aerostar" Ukrayna aviasiya şirkətinin prezidentidir. Bu gün biznes-klass təyyarələrində şəxsi uçuşların həyata keçirilməsi üçün "Aerostar" şirkətinin sərəncamında böyük hava donanması var.

2010-cu ildə Ş.Əsgərov nüfuzlu "Luxury Lifestyle Awards" mükafatının nominantı olub. "Dəbdəbə bazarına peşəkar töhfə" nominasiyasında mükafat Ukraynanın dəbdəbə bazarının inkişafına əhəmiyyətli töhfə verən şəxsə təqdim olunur. Qiymət-

ləndirmə meyarları sırasında Ukraynanın dəbdəbə bazarında şəxsin məşhurluğu, nüfuzu (sahə üzrə həmkarların gözəl rəyləri) yer alıb. “Luxury Lifestyle Awards” Ukraynada dəbdəbə sənayesində nailiyyətlərə görə təqdim edilən ilk və yeganə mükafatdır.

2012-ci ildə “Aerostar” şirkəti, başda prezidenti Ş.Əsgərov olmaqla, “Ukraynanın milli liderləri” Ümumukrayna proqramının təqdimatında Ukraynanın ən yaxşı müəssisə və təşkilatları sırasında fəxri yer tutub.



## Əsgərova
## Sevinc Müstəcəb qızı

*Tibb elmləri doktoru.*
*Həkimləri Təkmilləşdirmə İnstitutunun N.İ.Piroqov adına Milli Tibbi-Cərrahi Mərkəzinin göz xəstəlikləri kafedrasının professoru*

Əsgərova Sevinc Müstəcəb qızı 1968-ci il oktyabrın 13-də Bakı şəhərində anadan olub.

1985-ci ildə 111 saylı orta məktəbi fərqlənmə ilə bitirib və N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Dövlət Tibb Universiteti) müalicə-profilaktika fakültəsinə daxil olub.

1991-ci ildə ali məktəbdə təhsilini qırmızı diplomla bitirib, 1992-ci ildə isə Azərbaycan Göz Xəstəlikləri Elmi-Tədqiqat İnstitutunun internaturasını "oftalmologiya" ixtisasında başa vurub.

1993-2001-ci illərdə S.Əsgərova Ə.Əliyev adına Azərbaycan Dövlət Həkimləri Təkmilləşdirmə İnstitutunun göz xəstəlikləri kafedrasında çalışıb. Kafedrada assistent olduğu dövrdə o, elmi-pedaqoji fəaliyyətlə, oftalmoloji xəstələrin cərrahi və terapevtik müalicəsi və kafedranın elmi-tədqiqat işləri planına uyğun olaraq dakriologiya problemləri ilə məşğul olub.

1997-ci ildə S.Əsgərova "Gözyaşı nöqtəsi və gözyaşı kanalcığının lateral üçdəbirinin patologiyası zamanı xəstələrin cərrahi müalicəsinin yeni üsulları" mövzusunda namizədlik dissertasiyası (elmi rəhbər - Ə.Əliyev adına Azərbaycan Dövlət Həkimləri Təkmilləşdirmə İnstitutunun göz xəstəlikləri kafedrasının müdiri, professor M.Sultanov) müdafiə edib.

2002-ci ildə o, IATP beynəlxalq təşkilatının tibb üzrə internet layihələr müsabiqəsində birinci yeri tutub və qrant qazanaraq, ilk mərhələdə görmə qabiliyyətinin mühafizəsinə dair sayt yaradıb.

2001-2004-cü illərdə S.Əsgərova akademik S.N.Fyodorov adına "Göz mikrocərrahiyyəsi" Sahələrarası Elmi-Texniki Kompleksinin (SETK) tədqiqatçısı olub. S.Əsgərovanın apardığı tədqiqatların tematikası SETK əməkdaşları ilə həmmüəlliflikdə elmi-tədqiqat işləri planına daxil edilib və SETK-nın konkret elmi-kliniki layihələrində əksini tapıb.

2005-ci ildə S.Əsgərova "Gözyaşı sisteminin ilkin və induksiyalı patologiyasının kompleks cərrahi müalicəsi" mövzusunda doktorluq dissertasiyası (elmi məsləhətçi – akademik S.N.Fyodorov adına Göz Mikrocərrahiyyəsi İnstitutunun direktoru, professor X.P.Taxçidi) müdafiə edib. 2005-2012-ci illərdə o, akademik S.N.Fyodorov adına "Göz Mikrocərrahiyyəsi" SETK-nın (Moskva) həkim-oftalmoloqu, böyük elmi işçisi, rekonstruktiv-plastik oftalmoloji cərrahiyyə və onkologiya şöbəsinin müdiri olub.

S.Əsgərova ixtiralara 16 patentin (SSQ ilə birlikdə qlaukoma zamanı cərrahi kəsik aparılması üsulu; katarakta və əməliyyat olunmuş sabitləşməmiş qlaukoma və İOL implantasiyası ilə birlikdə quru göz sindromunun eynivaxtlı cərrahi müalicə üsulu; əsas gözyaşı miqdarının ölçülməsi və stimullaşdırılmayan gözyaşının götürülməsi üsulu və s.) və 21 faydalı modelə (gözyaşı kanalcığının intubasiyası və blokatorun girişi üçün zond, zond-pərgar, gözyaşı yolları xəstəliklərinin diaqnostikası və müalicəsi üçün kanyula-zond, gözyaşı yolları üçün universal zond, gözyaşı yolları üçün blokator və s.) şəhadətnamənin sahibidir.

O, Rusiya və digər ölkələrin jurnallarında çap edilən 100-dən çox əsərin müəllifidir. Dəfələrlə beynəlxalq oftalmoloji forumlarda iştirak edib, Beynəlxalq Oftalmologiya Konqresində (İsrail, 2000), "Tenth İranian national congress of ophthalnology" (Tehran, 2000), "XIII Congress of the European Society of ophthalmology" (İstanbul, 2001), Ukrayna Qftalmoloqlarının X Qurultayında (2002) və s. tədbirlərdə elmi məruzələrlə çıxış edib.

S.Əsgərova Avropa Plastik və Rekonstruktiv Cərrah-oftalmoloqlar Cəmiyyətinin (ESOPRS) həqiqi üzvü, Beynəlxalq Dakrioloji Cəmiyyətin, Beynəlxalq Uşaq Oftalmoloqlar Cəmiyyətinin, Rusiya Plastik, Rekonstruktiv və Estetik Cərrahlar Cəmiyyətinin, Oftalmoloqlar Cəmiyyətinin və s. təşkilatların üzvüdür.

O, gözyaşı yolları patologiyasının endonaral və endoskopik cərrahiyyə əməliyyatları, endoskopik rinosinusocərrahiyyə, lazer-endoskopik okul-plastik cərrahiyyəsi, orbit və göz qapağının kombinə edilmiş zədələrinin plastik cərrahiyyəsi, çəpgözlüyün mürəkkəb növlərinin cərrahiyyəsi üzrə kurslarda iştirak etmək üçün Avropanın aparıcı klinikalarına ezam olunub. Okul-plastik patologiyanın müxtəlif müalicə metodları üzrə 7 beynəlxalq sertifikata malikdir.

2013-cü ildən indiyədək S.Əsgərova Həkimləri Təkmilləşdirmə İnstitutunun N.İ.Piroqov adına Milli Tibbi-Cərrahi Mərkəzin göz xəstəlikləri kafedrasının professoru, "Tibb" Açıq Səhmdar Cəmiyyəti klinikasının həkimidir.



## Fərəcov
## Füzuli Ataş oğlu

*Texnika elmləri namizədi.*
*"Texno-Svar TMZ" ASC-nin baş direktoru*

Fərəcov Füzuli Ataş oğlu 1958-ci il avqustun 15-də Azərbaycan Respublikasının Ağsu rayonunun Ərəbuşağı kəndində çoxuşaqlı traktorçu ailəsində anadan olub.

Hələ məktəbdə oxuyarkən o, fizikaya maraq göstərib. Odur ki, onillik təhsilini başa çatdırmaq üçün Bakıya gəlib, 1 saylı fizika-riyaziyyat təmayüllü internat-məktəbə daxil olub.

Məktəbi bitirəndən sonra M.V.Lomonosov adına Moskva Dövlət Universitetinə qəbul imtahanlarını uğurla verən F.Fərəcovu rus dilini bilmədiyinə görə universitetə qəbul etməyiblər. Buna baxmayaraq, o, ruhdan düşməyib, Bakıya qayıdaraq peşə məktəbinə daxil olub, üzümçülük və şərabçılıq üzrə aqronom-texnoloq ixtisasına yiyələnib.

1976-cı ildə Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsinin təşəbbüsü ilə digər istedadlı azərbaycanlılar sırasında F.Fərəcov Moskvaya oxumağa göndərilib və imtahanlardan uğurla çıxaraq Moskva Aviasiya İnstitutunun təyyarəqayırma fakültəsinə daxil olub. Müsabiqə böyük olub – 3 yerə 65 namizəd. Amma F.Fərəcov bütün sınaqlardan uğurla keçib və müasir qırıcı təyyarələrin layihələndirilməsinin və istehsalının sirlərini öyrənməyə başlayıb. Paralel olaraq o, Moskva İdarəetmə İnstitutunu da bitirib.

İki diploma yiyələnən F.Fərəcov Bakıya gəlib, amma burada öz ixtisası üzrə iş tapa bilmədiyindən 1982-ci ildə Moskvaya qayıdıb və Tuşino Maşınqayırma Zavodunda (TMZ) sahə ustası kimi işə düzəlib. Tezliklə F.Fərəcov yığma sexi rəisinin müavini, sonra isə rəisi təyin edilib.

Onun işi ciddi surətdə məxfiləşdirilmişdi, heç kim, hətta ailə üzvlərinin də bundan xəbəri olmamışdı, adı-soyadı gizli saxlanılırdı, çünki "Buran" çoxistifadəli kosmik gəmisinin füzelyajının yığımı məhz F.Fərəcovun sahəsində həyata keçirilirdi.

Bir müddət sonra F.Fərəcov yığma-qaynaq sexinə keçirilir. Burada ona "Buran"ın hermokabinəsinin – tam hermetikliyi təmin edərək, bütün idarəetmə sistemlərini qoruyan və aparatla insanın əlaqəsini yaradan kosmik gəminin əsas hissəsinin istehsalı

etibar edilib. "Buran"ın üzərinə şəxsən istiliyə davamlı plitələri F.Fərəcov quraşdırıb. Bu, ən yüksək keyfiyyətli iş idi.

İnadkarlığı və aviasiya texnologiyasını dərindən bilməsi F.Fərəcova aerokosmik sənayenin bir çox mütəxəssisləri ilə birlikdə qısa müddət ərzində çoxistifadəli kosmik gəmi yaratmağa imkan verib və bu gəmi Amerikanın "Speys Şattl" layihəsindən geri qalmayıb. Əksinə, bir çox aerokosmik xarakteristikalarda "Buran" "Şattl"dan üstün olub. "Buran" üzərində işləyərkən termomüdafiə plitələrindən tutmuş, plastmasa qədər 180 yeni material yaradılıb.

1988-ci ildə "Buran" kosmik gəmisi real uçuş şəraitində uğurla sınaqdan çıxarılıb. "Buran"ın Yer kürəsi ətrafında dövrə vurması və "Baykonur" kosmodromunda enməsi təxminən saat yarımdan çox vaxt aparıb. Güclü raket daşıyıcısı "Energiya" ilə o, məhz "Baykonur"dan start götürüb. Həm də "Şattl"dan fərqli olaraq, "Buran" uçuşu pilotsuz, göyərtə avtomatikasının kompyuterinə quraşdırılan proqrama uyğun olaraq avtomatik rejimdə həyata keçirib.

"Buran" heç bir ciddi zədə almadan yerə enib. Yalnız atmosferin qalın qatlarına daxil olduqda korpusun qoruyucu örtüyünü təşkil edən istiliyə davamlı on minlərlə plitənin cəmi bir neçəsi qopub. Plitələrin unikal texnologiyası ondan ibarət idi ki, onlar +1000 ° C temperatura davam gətirirdi, eyni zamanda onlara hətta əllə toxunmaq olardı. Bu texnologiya sayəsində "Buran"ın korpusu atmosferin sıx qatlarına girərkən yanmırdı.

Pilotlu Kosmik Raketlərin Uçuşu üzrə Dövlət Komissiyasının sədri K.Kərimov F.Fərəcovun sovet kosmonavtikasının inkişafına töhfəsini belə qiymətləndirib: "Füzuli Fərəcov özünü XXI əsrin uçuş aparatlarının hazırlanması və istehsalına həsr edib. O, qarşısına məqsəd qoyub: təyyarələri təkcə atmosferdə yox, həm də kosmik məkanda uçmağa məcbur etmək".

Sonralar "Texno-Svar TMZ" ASC-nin baş direktoru F.Fərəcovdan soruşanda ki, "Buran" öz davamını niyə tapmadı, o, cavab verib ki, hər şey pula bağlı idi. Bu, çox bahalı layihə idi və onun həyata keçirilməsi zamanı SSRİ artıq çökmək ərəfəsində idi.

Bu gün elmi və konstruktor fəaliyyəti ilə yanaşı, F.Fərəcov fəal ictimai işlə məşğuldur. O, Moskva "Azərbaycan" Cəmiyyətinin idarə heyətinin üzvüdür, eləcə də Məhəmməd Əmin Rəsulzadə adına Məclisə rəhbərlik edir. 1992-ci ildə Tallinndə Azərbaycanlılar Assosiasiyasının birinci iclasında, 1998-ci ildə Vaşinqtonda Dünya Azərbaycanlılarının II konqresində iştirak edib və orada DAK-ın Rusiyadakı Azərbaycan diasporunu təmsil edib. 2004-cü ildə DAK-ın Kölndə, 2005-ci ildə Stokholmda keçirilən forumlarına qatılıb.

"Texno-Svar TMZ"nin baş direktoru Moskva Sahibkarlar Assosiasiyasının təşkil etdiyi "Yaxşıların yaxşısı" müsabiqəsi çərçivəsində "2003-cü ilin ən yaxşı sahibkarı" nominasiyasına layiq görülüb. Bundan əlavə, həmin il Rusiya Federasiyasının Kosmonavtika Federasiyası F.Fərəcovu "K.E.Tsiolkovski" fəxri medalı ilə təltif edib.

2010-cu il iyunun 11-də İctimai Mükafatlar Milli Komissiyanın qərarı ilə İctimai Elmlər Akademiyasının həqiqi üzvü F.Fərəcova Moskvada, Şöhrət meydanında sağ ikən büst ucaltmaq qərara alınıb. Onun "Buran" kosmik gəmisinin yaradılmasına töhfəsi belə yüksək qiymətləndirilib. Bu mükafata – sağ ikən büstünün ucaldılmasına yalnız bir neçə nəfər layiq görülüb.



## Fətiyev
## Mirəşrəf Mircəfər oğlu

*İqtisad elmləri doktoru.*
*Rusiya Xalqlar Dostluğu Universitetinin landşaft memarlığı və dizayn kafedrasının professoru.*
*"Moszelenstroy" QSC-nin baş direktoru*

Fətiyev Mirəşrəf Mircəfər oğlu 1966-cı il fevralın 7-də Bakıda anadan olub.

1984-1986-cı illərdə sovet ordusu sıralarında xidmət edib. 1986-cı ildə tərxis olunduqdan sonra "Mosinjzelenstroy"un 21 saylı inşaat idarəsində işə düzəlib, müxtəlif illərdə fəhlə, usta, iş icraçısı, baş iş icraçısı, idarə rəisi və "Moszelenstroy" QSC-nin baş direktoru vəzifələrdə çalışıb.

1994-cü ildə "sənaye və mülki tikinti" ixtisası üzrə Moskva Kommunal Təsərrüfat və İnşaat İnstitutunu bitirib və mühəndis-inşaatçı diplomu alıb. 1994-cü ildə Moskva Kommunal Təsərrüfat və İnşaat İnstitutunun aspiranturasına daxil olub. 1999-cu ildə namizədlik dissertasiyası müdafiə edib. 2000-ci ildə ona texnika elmləri namizədi alimlik dərəcəsi verilib.

2006-cı ildə Ali Attestasiya-İxtisaslaşdırma Komitəsinin qərarı ilə M.Fətiyevə "iqtisad nəzəriyyəsi" ixtisası üzrə iqtisad elmləri doktoru elmi dərəcəsi verilib. M.Fətiyevin elmi-praktik tədqiqatlarının mövzusu yeni binaların tikildiyi rayonlarda yaşıllaşdırma, Moskva və paytaxt regionunun meşə-park zonaları və yaşıllıqlarının bərpası üzrə işlərin təşkilinin effektiv metodlarının hazırlanması və tətbiqi ilə bağlı olub.

2009-cu ildən M.Fətiyev Rusiya Xalqlar Dostluğu Universitetinin aqrar fakültəsinin landşaft memarlığı və dizayn kafedrasının professoru kimi "landşaft memarlığı obyektlərinin tikintisi və istismarı" və "sahə iqtisadiyyatı" fənlərindən dərs deyir.

Kafedrada işlədiyi dövrdə M.Fətiyev tədris planları, iş proqramları və fənlərin tədris-metodik kompleksinin hazırlanmasında fəal iştirak edib. O, "landşaft memarlığı obyektlərinin tikintisi və istismarı" və "sahənin iqtisadiyyatı" fənləri üzrə mühazirələr oxuyur, praktik məşğələlər keçir. Kurs və diplom layihələrinə, tələbə elmi işlərinə rəhbərlik edir.

M.Fətiyev "Şəhər mənzil-kommunal təsərrüfatının innovasiyalı inkişafı" monoqrafiyasının (2006), "Kənd təsərrüfatı məhsullarının sığortalanması zamanı aqroekspertiza" dərs vəsaitinin (2012), "Müşahidə nöqtəsi" kitabının (2012) və digər əsərlərin müəllifidir.

M.Fətiyev bütün gücünü Moskvanın yaşıllaşdırılması işinə sərf edir. Bu insanda təkcə hüdudsuz enerji yox, həm də problemin həllinə qeyri-adi yanaşma, fikir orijinallığı, əla təhsil və böyük sevgi birləşir. Özü haqqında deyir ki, ata-babadan bağbandır: atası da ağac əkib və uşaqlıqdan oğluna təbiətə qarşı sevgi aşılayıb. Ümumilikdə, Moskvanın yaşıllaşdırılmasına o, 30 il sərf edib. M.Fətiyevin rəhbərliyi ilə yaşıllaşdırılmış obyektlər arasında "Aleksandovskiy sad", "Poklonnaya qora" və Moskvanın digər məşhur yerləri var.

2005-ci ildə M.Fətiyevə "Şəhərin Fəxri İnşaatçısı" adı verilib. O, Moskva gül sərgi-festivalının II dərəcəli qızıl medalı (2005), şəhər tikinti siyasəti departamentinin, eləcə də Moskva hökumətinin Moskva şəhərində kompleks abadlaşdırma üzrə işlərdə fəal iştirakına görə (2012), Moskva hökumətinin Moskvanın Cənub İnzibati Rayonunda mədəni və mənəvi irs obyektlərinin abadlaşdırılması üzrə həyata keçirilən ən yaxşı layihəyə görə fəxri fərmanları ilə təltif edilib (2013).



## Gülməmmədov
## Fərman İbrahim oğlu

*Tibb elmləri doktoru.*
*M.Qorki adına Donetsk Milli Tibb Universitetinin*
*1 nömrəli ümumi cərrahiyyə kafedrasının müdiri*

Gülməmmədov Fərman İbrahim oğlu 1939-cu il noyabrın 7-də Gürcüstan Respublikası Bolnisi rayonunun Darbaz kəndində anadan olub.

1957-ci ildə orta məktəbi bitirdikdən sonra kolxozda işləyib. 1958-ci ildə Stalin Tibb İnstitutunun (indiki M.Qorki adına Donetsk Milli Tibb Universiteti) pediatriya fakültəsinə qəbul edilib. Ali məktəbdə oxuyarkən feldşer işləyib, 1964-cü ildən - ali məktəbi qurtarandan sonra Volnovaxa Rayon Mərkəzi Xəstəxanasının sahə xəstəxanasında həkim-pediator kimi çalışıb.

1965-ci ildən F.Gülməmmədov Volnovaxa şəhərində Rayon Mərkəzi Xəstəxanasında işləyib. 1969-cu ildə Donetsk Tİ-nin 1 nömrəli ümumi cərrahiyyə kafedrasında klinik ordinaturaya qəbul olunub, 1971-ci ildə oranı bitirib. Sonra F.Gülməmmədov Kalinin adına Vilayət Klinik Xəstəxanasında IV cərrahiyyə bölməsinin müdiri vəzifəsini tutub. "Mədə rezeksiyasından sonra ilkin ağırlaşmaların profilaktikası" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib.

1985-1988-ci illərdə F.Gülməmmədov Donetsk Tİ-nin ümumi cərrahiyyə kafedrasında assistent işləyib. 80-ci illərin ortalarında "Yoğun bağırsaq xəstəliklərinin çoxmərhələli cərrahi müalicəsi" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib.

1990-cı ildə F.Gülməmmədova professor elmi adı verilib. Bu dövrdə o, Azərbaycan Elmi-Tədqiqat Koloproktologiya İnstitutunda işləyib. ETİ-də iş professorun elmi fəaliyyətini müəyyənləşdirib. 1996-cı ildə Donetsk Tİ-nin 1 nömrəli ümumi cərrahiyyə kafedrasının müdiri təyin edilib.

Ümumi cərrahiyyə klinikasının yetirməsi, Ali Məktəb Əməkdar İşçisi - professor L.Q.Zavqorodinin şagirdi F.Gülməmmədov onun ən yaxşı ənənələrini, güclü həkim və elmi potensialını qoruyub.

O, əla diaqnost, yüksək kateqoriyalı cərrah-proktoloqdur, müxtəlif cərrahi xəstəliklərdə bir çox operativ əməliyyatlar aparır. Bütün yeni, qabaqcıl təcrübəni klinikada fəal tətbiq edir.

F.Gülməmmədov 16 ixtiranın və 32 səmərələşdirici təklifin müəllifidir, 550-dən çox elmi məqalə, 3 monoqrafiya yazıb. Onun rəhbərliyi altında 13 namizədlik dissertasiyası müdafiə edilib.

F.Gülməmmədovun əmək fəaliyyəti 2002-ci il oktyabrın 4-də "Ukrayna Əməkdar Elm və Texnika Xadimi" fəxri adı ilə qiymətləndirilib. O, Ukrayna Ali Məktəb Elmlər Akademiyasının akademiki, namizədlik və doktorluq dissertasiyaları müdafiə şurasının üzvü, SSRİ Səhiyyə Əlaçısıdır, Ukrayna Prezidenti tərəfindən Jukov medalı ilə təltif olunub.



## Hacıqasımov Ağalar Sultan oğlu

*Geologiya-mineralogiya elmləri doktoru, professor. İ.M.Qubkin adına Rusiya Dövlət Neft və Qaz Universitetinin neft və qazın axtarış və kəşfiyyatının nəzəri əsasları kafedrasının əməkdaşı*

Hacıqasımov Ağalar Sultan oğlu 1935-ci il martın 5-də Bakı şəhərində anadan olub.

1957-ci ildə M.Əzizbəyov adına Azərbaycan Sənaye İnstitutunun (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) geoloji kəşfiyyat fakültəsini "Neft və qaz yataqlarının geologiyası və kəşfiyyatı" ixtisası üzrə bitirib.

A.Hacıqasımov əmək bioqrafiyasına "Azdənizneftkəşfiyyat" trestində 3 nömrəli buruq kontorunda məhlulölçən kimi başlayıb, sonradan "Leninneft" trestində geoloq, baş geoloq, 11 nömrəli neft mədəni müdirinin müavini işləyib.

1963-cü ildə doğma universitetin aspiranturasında təhsilini başa vurduqdan və namizədlik dissertasiyasını müdafiə etdikdən sonra neft və qaz yataqlarının geologiyası və kəşfiyyatı kafedrasında geologiya-geofizika problem laboratoriyasının mühəndisi, elmi-tədqiqat işləri sektorunun rəhbəri, böyük elmi işçi, dosent, professor (1969), kafedra müdiri vəzifələrində fəaliyyət göstərib. 1968-ci ildən tədris işləri üzrə prorektor işləyib.

1981-ci ildə A.Hacıqasımov İ.M.Qubkin adına Moskva Neft-Kimya və Qaz Sənayesi İnstitutunun neft və qaz axtarışı və kəşfiyyatının nəzəri əsasları kafedrasına dəvət edilib və orada professor vəzifəsində işləyib, kafedra müdirinin müavini olub. 1992-ci ildə "buruq qazmasının texnikası və təşkili" Elmi İstehsalat Kompaniyası" (TOBUS EİK) Səhmdar Cəmiyyətinə baş geoloq vəzifəsinə keçib, sonradan baş direktorun müavini, vitse-prezident təyin olunub. 1998-ci ildə "Nefteotdaça" Rusiya sahələrarası elmi-texniki kompleks" ASC-nin Xarici İqtisadi Əlaqələr Mərkəzinə başçılıq edib. 2001-ci ildən bu kompaniyanın vitse-prezidentidir. 2012-ci ildə pensiyaya çıxaraq müəllimlik fəaliyyətində 20 illik fasilədən (1992-ci ildən 2011-ci ilə qədər) sonra yenidən kafedraya qayıdıb.

Geologiya-mineralogiya elmləri doktoru, professor A.Hacıqasımov dərc edilmiş 179 elmi işin, o cümlədən 13 monoqrafiya, dərslik və dərs vəsaitinin müəllifidir. Alim 15 elmlər namizədi, o cümlədən Vyetnam, Suriya, Kuba, Yəmən və Sudandan olan mütəxəssislər hazırlayıb.

Bu sahədə çalışdığı müddət ərzində Xalqlar dostluğu ordeni, "Şərəfli əməyə görə. V.İ.Leninin anadan olmasının 100 illiyi münasibətilə" medalı, kadr hazırlığında xidmətlərinə görə ADR-in nişanı, Azərbaycan SSR Ali Sovetinin fəxri fərmanı, "Neft sənayesi əlaçısı", "Yer təkinin kəşfiyyatı əlaçısı", "Ali məktəb əlaçısı", "Fəxri neftçi" nişanları ilə təltif olunub.



## Hacıyev
## Çingiz Məmməd oğlu

*Texnika elmləri doktoru, professor.*
*İstanbul Texniki Universitetinin aviasiya və kosmonavtika fakültəsinin professoru*

Hacıyev Çingiz Məmməd oğlu 1958-ci il noyabrın 29-da Azərbaycan Respublikasının Kəlbəcər rayonunda anadan olub.

1981-ci ildə Moskva Aviasiya İnstitutunu fərqlənmə ilə bitirib. 1981-1983-cü illərdə həmin institutun avtomatika və informasiya sistemləri kafedrasının tədqiqatçı-stajoru olub. 1983-1986-cı illərdə "Neftqazavtomat" (Sumqayıt) Azərbaycan Elm-İstehsalat Birliyinin aspiranturasında oxuyub. Namizədlik dissertasiyasını uğurla müdafiə etdikdən sonra 1986-1989-cu illərdə "Neftqazavtomat" Azərbaycan Elm-İstehsalat Birliyində işləyib. 1989-1990-cı illərdə böyük elmi işçi, 1990-1991-ci illərdə şöbə müdirinin müavini, 1991-1995-ci illərdə informasiya-ölçü qurğuları laboratoriyasının müdiri olub.

1992-ci ildə Ç.Hacıyev texnika elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya işini uğurla müdafiə edib. 1994-cü ildə 1988-1992-ci illər ərzində beynəlxalq elmi jurnallarda dərc edilən elmi məqalələrin təsir amillərinə görə Beynəlxalq Elm Fondunun (ABŞ) mükafatına layiq görülüb.

O, 1995-1996-cı illərdə Azərbaycan Elmlər Akademiyasının Kibernetika İnstitutunun aparıcı elmi işçisi işləyib. 1995-1996-cı illərdə Azərbaycan Texniki Universitetinin elektron-hesablama sistemlərinin layihələndirilməsi kafedrasının professoru vəzifəsində çalışıb. Doktorluq dissertasiyalarının müdafiəsi üzrə ixtisaslaşmış şuranın üzvü, avtomatik idarəetmə üzrə Azərbaycan Milli Komitəsinin katibi, Azərbaycan Elm və Texnika Komitəsi nəzdində energetika, avtomatik idarəetmə və modelləşdirmə üzrə komissiyanın üzvüdür. 1996-cı ildən indiyə qədər İstanbul Texniki Universitetinin aviasiya və kosmonavtika fakültəsinin professorudur.

Ç.Hacıyev uçan aparatların avtomatik idarə edilməsi sahəsində mütəxəssisdir. Dinamik sistemlərin riyazi modellərinin identifikasiyası, Kalman filtrləmənin nəzəriyyəsi, inteqrasiya olunmuş naviqasiya sistemləri, kiçik peyklərin oriyentasiyasının müəyyən edilməsi və idarə olunması, uçan aparatların texniki diaqnostikası, uçuşun avtomatik idarə olunmasının imtinaya davamlı sistemləri onun elmi tədqiqatlarının əsas istiqamətidir.

Ç.Hacıyev tərəfindən yerin süni peyklərinin xarici həyəcanlaşma şəraitində fırlanma hərəkətinə operativ nəzarət etmək imkanı verən parametrlərinin müəyyənləşdirilməsi və hərəkətinin proqnozlaşdırılması əsasında onun fırlanma hərəkətinin dinamikasına nəzarət metodu hazırlanıb. O, orbital ölçülərin müəyyənləşdirilməsinə yeni yanaşma təklif edib. Ç.Hacıyev, həmçinin peyklərin bucaq vəziyyətini müəyyən edən və telemetrik ölçü məlumatları üzrə onların dəqiqliyinin müəyyən edilməsi alqoritmlərini hazırlayıb. Göstərilən alqoritmlər "Kosmos" seriyalı sovet peyklərinə daxil edilib.

Ç.Hacıyev tərəfindən kontinental şelfdə qazma və istismar işlərinin aparılmasında tələb olunan effektivliyi təmin edən üzən dəniz platformalarının idarə edilməsi və nəzarətinin informasiya təchizatı yaradılıb. Tullantılar haqda nəzəriyyənin tətbiqi əsasında texniki sistemlərin işəsalmadan öncəki ölçülərin diskretizasiyasına yeni yanaşma təqdim edilib.

O, üzən dəniz platformalarının yerləşməsinin icazə verilən müvəqqəti nəzarət intervalının müəyyən edilməsinə nəzarətin dəqiqliyini təmin edən metodları hazırlayıb. Üzən dəniz platformalarının yerləşməsinə nəzarətin dəqiqliyini artırmağa imkan verən minimum orta risk şərtlərindən qazma işlərinin imkan verilən sahədə aparılmasının optimallaşdırması alqoritmini təklif edib. Həmçinin səhv qərarlar qəbul edilməsi ehtimalını aşağı salmağa imkan verən məhdud hesablama resurslarını nəzərə alaraq üzən dəniz platformalarının hərəkətinin çoxmərhələli operativ nəzarət metodunu hazırlayıb. Ç.Hacıyev tərəfindən üzən dəniz platformalarının aşağı tezlikli hərəkətinin parametrlərinin adaptiv müəyyən olunma alqoritmi hazırlanıb, üzən dəniz platformalarının aşağı tezlikli hərəkətinin parametrlərinin çoxkanallı müəyyənləşdirilməsi alqoritmi və ölçü kanalında imtinaya invariant qiymətləndirilməsi alqoritmi təklif olunub.

Ç.Hacıyev Kalman filtrləməsi nəzəriyyəsini yeni möhkəm, adaptiv və qeyri-xətti Kalman filtrləri ilə zənginləşdirib, çoxkanallı Kalman filtrlərinin informasiyalılığına qiymət verib. Kalman filtrlərinin imtina etməsinin aşkarlanması və diaqnostikası üçün operativ üsullar hazırlayıb. Ç.Hacıyev tərəfindən təsadüfi Uişart matrisasının bəzi skalyar tədbirlərin paylanması aşkarlanıb və onların əsasında Kalman filtrinin yenilənmə ardıcıllıqlı kovariasion matrisasının yoxlanması üçün yeni üsullar təklif olunub. Kalman filtrlərinin Ç.Hacıyev tərəfindən təklif olunan imtinayadavamlı yeni sinfi idarə sisteminin sensor və ötürücülərində imtina zamanı sistem parametrlərinin etibarlı qiymətləndirilməsinə imkan verir. Bu filtrlər təyyarələrdə, pilotsuz uçan aparatlarda, pilotsuz sualtı qurğularda və yerin süni peyklərində geniş istifadə olunur. Peyk naviqasiya sistemlərinin siqnallarının təhlil edilməsi üçün Ç.Hacıyev tərəfindən

təklif olunan yeni xətti Kalman filtri istehlakçının yerini yüksək dəqiqliklə müəyyən etməyə imkan verir və bu zaman peyk naviqasiya sistemlərinin qeyri-xətti ölçü xəttiləşdirilməsini tələb etmir. O, Kalman filtrini ilk dəfə ölçü vasitələrinin kalibrlənməsində tətbiq edib.

Alim tərəfindən ölçmə xətalarının statistik xarakterinin avtomatik korreksiya ilə fasiləsiz fəaliyyət göstərən informasiya-ölçmə sistemlərinin yeni struktur və alqoritmik təminatı hazırlanıb. Ölçmədə sistematik xətalar zamanı anomal ölçmələrə davamlı alqoritm filtrləməsi, həmçinin daxilolma təsirlərinin xətalarını nəzərə alan ölçü sistemlərinin kalibrlənməsinin ardıcıl üsulu təqdim edilib.

Bundan başqa Ç.Hacıyev tərəfindən işəsalmadan öncəki sahənin düzgün formaya malik olmadığı halda, idarəolunan parametrlərarası əlaqəni nəzərə alaraq çoxölçülü obyektlərin işlək qabiliyyətinin yeni nəzarət üsulu hazırlanıb.

Alim sensor və ötürücülərdə və rekonfiqurasiya idarəsində imtinaların aşkarlaması və lokallaşdırılması inteqrasiyasına əsaslanan uçuşun avtomatik idarə edilməsi üçün imtinaya davamlı sistemlərin layihələndirilməsinə yeni yanaşma hazırlayıb.

Ç.Hacıyev 400-dən artıq elmi işin, o cümlədən ali məktəblər üçün 4 dərsliyin, 5-i dünyada məşhur olan “Kluwer Academic Publishers”, “Springer Verlag Publishers” və “Lap Lambert Academic Publishing” beynəlxalq nəşrlərində dərc edilmiş 7 monoqrafiyanın müəllifi və həmmüəllifidir. Onun 60-dan çox elmi məqaləsi dünyanın ən nüfuzlu “Science Citation Index” (SCI) indeksinə daxil olan beynəlxalq elmi jurnallarda dərc olunub. 2003-cü ildə “Kluwer Academic Publishers” (Boston, ABŞ) beynəlxalq nəşriyyatı tərəfindən buraxılan və 2007-ci ildə “Springer” beynəlxalq nəşriyyatı tərəfindən yenidən nəşr olunan “Fault Diagnosis and Reconfiguration in Flight Control Systems” monoqrafiyası elm üçün vacib əhəmiyyət kəsb edir. Bu monoqrafiya avtomatik idarəetmə nəzəriyyəsində yeni istiqamət olan uçuşun idarə edilməsi sistemində rekonfiqurasiya məsələsinə həsr olunan dünyanın ilk kitabıdır. Həmin monoqrafiya dünyanın 100-ə yaxın kitabxanasının kitab fondlarında var və ABŞ və Avropanın bəzi universitetlərində “İdarəetmənin imtinayadavamlı sistemləri” üzrə kursların təşkil olunmasında əsas mənbə kimi istifadə edilir.

Ç.Hacıyev 30-dan çox beynəlxalq və milli konfransın təşkilat və proqram komitələrinin üzvüdür, ümumdünya konqreslərində və beynəlxalq konfranslarda elmi seksiyaların iclaslarına sədrlik edib. 2012-ci ildə “13th International Carpathian Control Conference” konfransının ən yaxşı məruzəsi mükafatına layiq görülüb.

Ç.Hacıyev 2001-ci ildə Beynəlxalq Naviqasiya və Hərəkətin İdarəedilməsi Akademiyasının (Rusiya) həqiqi üzvü seçilib. O, 7 beynəlxalq elmi jurnalın redaksiya

kollegiyasının üzvü, ABŞ-da dərc olunan “Contemporary Who's Who” ensiklopediyasının məsləhətçi redaktoru, “EleCoKS – International Electronics and Communication Knowledge Society” elmi məsləhət şurasının üzvü, “WSEAS (World Scientific and Engineering Academy and Society) Turkish Chapter of Automatic Control” akademiyasının idarə heyətinin üzvüdür.

Ç.Hacıyev Türkiyənin dövlət əhəmiyyətli elmi-texniki layihələrində aktiv iştirak edir: 2009-cu ildə fəzaya buraxılan Türkiyənin ilk İTÜpSAT-1 piko-peykinin və nano-peyklər üçün oriyentasiyalı idarəetmə ilə yüksək performanslı platforma yaradılması üzrə layihələrin konsultantıdır, ilk türk helikopterinin yaradılması və F-16 qırıcı təyyarələrinin imtinalarını və rekonfiqurasion idarəetməsinin aşkarlanması və diaqnostikası üzrə layihədə tədqiqatçı qismində iştirak edib, pilotsuz uçan aparatlar və pilotsuz sualtı qurğular üçün fasiləsiz işləyən idarəetmə və nəzarət sistemlərinin yaradılması üzrə layihələrə rəhbərlik edib.

Ç.Hacıyevin rəhbərliyi altında 3 fəlsəfə doktoru, 13 aviasiya və kosmonavtika üzrə elmlər magistri və 1 texnika elmləri namizədi hazırlanıb. O, İstanbul Texniki Universitetinin doktorantura və magistraturasında “aviasiya və kosmik texnika” ixtisası üzrə uğurla elmi kadrlar hazırlayır.



## Hacıyeva
## Çeşmə Sabir qızı

*Biologiya elmləri doktoru.*
*İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin böyük elmi işçisi*

Hacıyeva Çeşmə Sabir qızı 1959-cu il avqustun 1-də Ermənistan Respublikasının Basarkeçər rayonunun Böyük Məzrə kəndində anadan olub.

1982-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) biologiya fakültəsini əla qiymətlərlə bitirib. Diplom işini Kiyevdə Ukrayna Elmlər Akademiyasının Molekulyar Biologiya İnstitutunda hazırlayıb və müdafiə edib. 1982-1983-cü illərdə Azərbaycan Elmlər Akademiyasının Zoologiya İnstitutunda çalışıb.

1983-cü ildə Ç.Hacıyeva təcrübə keçmək üçün SSRİ Elmlər Akademiyasının Ümumittifaq Helmintologiya İnstitutuna göndərilib. 1985-1990-cı illərdə SSRİ Elmlər Akademiyasının Təbiət Elmləri və Texnologiyası İnstitutunun aspirantı olub. 1990-cı ildə biologiya elmləri namizədi alimlik dərəcəsi almaq üçün namizədlik dissertasiyasını müdafiə edib.

O, 1990-1991-ci illərdə SSRİ İctimai Ekspertiza Komitəsində aparıcı ekspert olub, sonradan SSRİ Ali Sovetinin Çernobıl komissiyasında ekspert qrupu sədrinin köməkçisi vəzifəsinə göndərilib.

Ç.Hacıyeva 1991-1995-ci illərdə Rusiya Tibb Elmləri Akademiyasının "Tibb muzeyi" Elmi-Tədqiqat Mərkəzinin əvvəlcə elmi redaktoru, sonra isə böyük elmi işçisi vəzifəsində çalışıb və eyni vaxtda "Spaseniye" ekoloji qəzetinin ştatdankənar müxbiri olub. 1995-1996-cı illərdə həmin qəzetin elmi şərhçisi, 1996-cı ildən indiyədək isə qəzetin baş redaktorunun elmi iş üzrə müavinidir (əvəzçiliklə).

1996-1999-cu illərdə Ç.Hacıyeva N.İ.Piroqov adına Moskva Dövlət Tibb Universitetində çalışıb. Bu universitetdə onun rəhbərliyi altında 1998-ci ildə ali məktəblərarası olimpiadada mükafatlar alan və "Vestnik Rossiyskoqo qosudarstvennoqo meditsinskoqo universiteta" jurnalında dərc olunan tələbə işləri yerinə yetirilib.

Ç.Hacıyeva 2000-ci ildən indiyədək İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin histologiya, sitologiya və embriologiya kafedrasının böyük elmi

işçisidir. 2006-cı ildə biologiya elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib.

Ç.Hacıyeva tibbi-biologiya elmləri (histologiya, biologiya, tibb) və elm tarixi sahələrində (tibb, histologiya, biologiya və fənlərarası istiqamətlər sahəsində) mütəxəssisdir. O, 67-dən artıq elmi işin və 5 dərs vəsaitinin müəllifi və həmmüəllifidir. 2012-ci ildə "İmperator Moskva Universitetinin – MDU-nun tibb fakültəsində histologiyanın elm və tədris predmeti kimi inkişafı. Rusiyada histologiyanın həm koqnitiv sistemdə, həm də institusional strukturda təkamül inkişafı" monoqrafiyası Almaniyada elektron şəkildə çap olunub.

Biologiya elmləri doktoru Ç.Hacıyeva elmi konqreslərin, konfransların və qurultayların: Kosmik biologiya və aviakosmik təbabət üzrə beynəlxalq konfransın, "İnterastma" beynəlxalq konqresin, Rusiya pediatrları konqresinin, tibbi və yeni informasiya texnologiyaları konfransının, toksikoloqların qurultayının və s. işində mütəmadi iştirak edir.

Bundan başqa, Ç.Hacıyeva Rusiya Jurnalist Cəmiyyətinin aktiv üzvüdür. 1998-ci ildə o, Rusiya Jurnalistlər İttifaqına qəbul edilib, sonradan Beynəlxalq Jurnalistlər Federasiyasının üzvü, "Prostranstvo i vremya" elmi-analitik və təhsil jurnalının redaksiya kollegiyasının üzvü, "Obşestvo i ekologiya" qəzetinin elmi icmalçısı, həmçinin Rusiya Elmlər Akademiyasının Rusiya Fəlsəfə Cəmiyyətinin üzvü olub.

Ç.Hacıyeva RF Federal Məclisi Dövlət Dumasının parlament müxbiri kimi çoxsaylı müsahibə, məqalə və reportajların müəllifidir. Onun bu sahədəki işləri jurnalist həmkarları tərəfindən yüksək qiymətləndirilib. Ç.Hacıyeva Dövlət Dumasında akkreditə olmuş parlament müxbirləri arasında iki dəfə jurnalist işləri müsabiqəsinin laureatı olub. "Təbii resurslar" beynəlxalq informasiya agentliyi və Rusiya federal ekoloji informasiya agentliyi onu "Qızıl qələm" müsabiqəsinin qalibi elan edib. Ç.Hacıyeva 2009-cu ildə Rusiyanın "Rusiya tarixinə qayğıkeş münasibətə və əsərlərində ifadə olunan tarixi gerçəkliyə görə" milli mükafatına və "Dünyanın xeyirxah insanları" ictimai xeyriyyə hərəkatının "Yer kürəsində həyat naminə" medalına layiq görülüb.



## Hadıyev
## Hüseyn Əsgər oğlu

*Federal Dövlət Qeydiyyatı, Kadastr və Xəritəçəkmə Xidmətinin Federal Kadastr Palatasının Smolensk vilayəti üzrə filialının direktoru*

Hadıyev Hüseyn Əsgər oğlu 1959-cu il iyulun 1-də Azərbaycan Respublikasının Masallı rayonunun Sirabil kəndində anadan olub.

1984-cü ildə Smolensk Dövlət Bədən Tərbiyəsi İnstitutunu bitirib, 1997-ciilədək təhsil sahəsində çalışıb. 1998-ci ildə Ümumrusiya Qiyabi Maliyyə-İqtisad İnstitutunu "maliyyə və kredit" ixtisası üzrə bitirib və 1997-2001-ci illərdə "Smolenskaudit" MMC-nin direktor müavini işləyib.

H.Hadıyev 2001-ci ildən texniki inventarizasiya sistemində çalışır, "Smolensk DTİB"in direktoru olub, 2003-cü ildən (yarandığı vaxtdan) "Rostexinventarizasiya – Federal TİB"in Smolensk filialının direktoru olub, 2006-cı ildən "Rostexinventarizasiya – Federal TİB"in Mərkəzi Federal Dairə nümayəndəliyinə rəhbərlik edib (əvəzçiliklə).

H.Hadıyev təhsilini davam etdirərək 2005-ci ildə RF Daxili İşlər Nazirliyinin Moskva Universitetini "hüquqşünaslıq" ixtisası üzrə bitirib. Hüquq elmləri namizədi elmi dərəcəsinə malikdir, 2009-cu ilin iyun ayında ona dosent elmi rütbəsi verilib.

Texniki inventarizasiya sistemində çalışarkən H.Hadıyev Mərkəzi Federal Dairəsinin ərazisində "Dövlət torpaq kadastrının və daşınmaz əmlak obyektlərinin dövlət qeydiyyatının aparılmasının avtomatlaşdırılmış sisteminin qurulması (2002-2008)" federal proqramının texniki inventarizasiya təşkilatlarının arxivlərinin elektronlaşdırılması üzrə "Daşınmaz əmlakın kadastr sisteminin qurulması (2006-2011-ci illər)" altproqramı tədbirlərinin yerinə yetirilməsini koordinasiya edir. Mərkəzi Federal Dairədə daşınmaz əmlak obyektləri üzrə elektron məlumat bazalarının yaradılması və əsaslı tikinti obyektlərinin və Daşınmaz Əmlakın Dövlət kadastrının (DƏDK) vahid Dövlət reyestrinin (KTOVDR) tətbiq edilməsinə hazırlıq işlərinin koordinasiyasında iştirak edir.

Qeyd olunan Federal səviyyəli vəzifələrin uğurla yerinə yetirilməsi ilə yanaşı, H.Hadıyev texniki inventarizasiya sahəsinin inkişafında, müəssisənin vahid elmi-texniki siyasətinin və metodoloji platformasının formalaşmasında aktiv iştirak edir,

RF İqtisadi İnkişaf Nazirliyi və Rostnedvijimost tərəfindən formalaşdırılan vəzifələrin yerinə yetirilməsi üçün şərait yaradılması və tədbirlərin reallaşdırılması məqsədilə RF Mərkəzi Federal Dairəsinin regionlarında bütün maraqlı dövlət strukturları ilə səmərəli qarşılıqlı fəaliyyət həyata keçirir.

H.Hadıyev müəssisə fəaliyyətinin torpaq quruluşu, qiymətləndirmə fəaliyyəti, layihə işləri kimi yeni növlərinin inkişafına mühüm töhfə verib. Onun istehsalat fəaliyyətinin müsbət nəticələrindən danışarkən, 2005-ci ildə "Rostexinventarizasiya – Federal TİB" Smolensk filialının bazasında uğurlu işi ilə xidmət spektrinin genişlənməsinə imkan verən Layihə İnstitutunun yaradılmasını qeyd etmək lazımdır.

H.Hadıyevin sosial infrastrukturun inkişafı, filial işçilərinin əmək və istirahət şəraitinin yaxşılaşdırılması sahəsində gördüyü işlər barədə növbəti faktlar: 2004-cü ilin aprelində Smolensk filialının 1200 kvadratmetr sahəsi olan birinci binası, 2007-ci ilin fevralında isə yüksək effektli kompyuter texnikası ilə təchiz edilmiş, ümumi sahəsi 6000 kvadratmetr olan ikinci müasir inzibati binası istifadəyə verilib. Avadanlıqlarla təchiz olunmuş kompyuter sinifləri, akt və konfrans zalları, yeməkxana və trenajor zalı filial əməkdaşlarının istifadəsinə verilib.

2014-cü ildən H.Hadıyev Federal Dövlət Qeydiyyatı, Kadastr və Xəritəçəkmə Xidmətinin Federal Kadastr Palatasının Smolensk vilayəti üzrə filialının ("FKP Rosreestr" Smolensk vilayəti üzrə filialı) direktorudur.

Texniki inventarizasiya sahəsinin inkişafına verdiyi böyük töhfəyə və vicdanlı əməyə görə o, Daşınmaz Əmlak Obyektlərinin Federal Kadastr Agentliyi, RF Regional İnkişaf Nazirliyi, "Rostexinventarizasiya – Federal TİB", Smolensk Vilayət Dumasının fəxri fərmanlarına layiq görülüb. "Ümumrusiya əhalinin siyahıya alınmasının keçirilməsində xidmətlərinə görə" döş nişanı və "Ümumrusiya kənd təsərrüfatının siyahıya alınmasının keçirilməsində xidmətlərinə görə" medalı ilə təltif olunub. H.Hadıyev 2010-cu ildə II dərəcəli "Vətən qarşısında xidmətlərinə görə" ordeninə layiq görülüb.



## Həbibov
## Aleksandr Həbib oğlu

*Kimya elmləri doktoru, professor.*
*Rusiya Elmlər Akademiyasının akademiklər M.M.Şemyakin və Y.A.Ovçinnikov adına Bioüzvi Kimya İnstitutunun biokataliz laboratoriyasının rəhbəri*

Həbibov Aleksandr Həbib oğlu 1955-ci il avqustun 31-də Moskvada anadan olub.

1977-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin kimya fakültəsini bitirib. 1982-ci ildə "molekulyar biologiya" ixtisası üzrə kimya elmləri namizədliyi, 1992-ci ildə isə doktorluq dissertasiyasını müdafiə edib. 1996-cı ildən professordur.

1977-1997-ci illərdə Rusiya Elmlər Akademiyasının Molekulyar Biologiya İnstitutunda əvvəlcə stajor tədqiqatçı, E.S.Severin və A.Y.Braunşteynin rəhbərliyi altında kiçik elmi işçi, sonra isə böyük elmi işçi və biokatalizin kimyəvi əsasları laboratoriyasının müdiri işləyib.

1986-cı ildə müəllif kollektivi heyətində Lenin komsomolu mükafatını alıb.

1997-ci ildən M.M.Şemyakin və Y.A.Ovçinnikov adına Bioüzvi Kimya İnstitutunun biokataliz laboratoriyasının müdiri, M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin kimya fakültəsinin təbii birləşmələr kimyası kafedrasının professoru, Rusiya Elmlər Akademiyasının Biokimyaçılar və Molekulyar Bioloqlar Cəmiyyətinin üzvü, Hyustonda İmmun Kimyası Tibb Mərkəzi İnstitutunun (ABŞ) əcnəbi üzvü, bir sıra elmi jurnalların redaksiya kollegiyalarının üzvüdür. Onun tələbələri arasında 12 elmlər namizədi var.

O, 100-dək elmi məqalənin müəllifi, habelə 3 monoqrafiyanın həmmüəllifi, bir neçə beynəlxalq patentin sahibidir. A.Həbibov tərəfindən sürətli kinetika üsullarının tətbiqi ilə ilk dəfə zülalların kataliz fosforlaşdırılması prosesinin elementar mərhələsinin konstantı müəyyənləşdirilib, zülalların sAMR-asılı fosforlaşdırılmasının molekulyar-kinetik fəaliyyət mexanizmi təklif edilib.

Onun rəhbərliyi altında avidin-biotin sistem əsasında biopolimerlər, zülallar və nuklein turşularının qeyri-izotop deteksiyası üçün yüksək həssaslı reagentlərin alınmasının yeni üsulları hazırlanıb, üzvi həlledicilərin tətbiqi ilə avedinin təmizlənməsinin ilk orijinal üsulları təklif və tətbiq olunub və avidinin müxtəlif fermentlərlə yüksək təmizlənmiş konyuqatları əldə edilib.

A.Həbibovun antiidiotip anticisimlərdə fermentlərə qarşı kataliz aktivliyinin induksiyası barədə irəli sürdüyü hipotezi və təbii kataliz anticisimlərinin mövcudluğu barədə konsepsiyanı xarici alimlər də təsdiqləyib.

Onun tərəfindən genetik aparatın əsas fermentlərindən biri - DNT-I topoizomerazlar hüceyrəsinin fəaliyyəti mexanizminin molekulyar-kinetik tədqiqatı aparılıb, insanda autoimmun prosesinin inkişafında yaranan və autoanticisimləri fermentlə bağlanmasına cavabdeh olan domenin strukturu müəyyən olunub, DNT-I topoizomerazda antiidiotip anticisimlər aşkarlanıb, onların spesifik yüksək DNT-bağlanması və diaqnostik testlər qismində istifadə olunması imkanları yerinə yetirilib.

İmmunologiyada olan anticisimlərin funksiyası barədə təsəvvürlər A.Həbibovun insanın antiimmun xəstəliklərinin inkişafı zamanı hidrolizə edilmiş DNT katalitik anticisimlərin aşkarlanması, endonukleaz reaksiyanın molekulyar mexanizm və spesifikliyinin müəyyənləşdirilməsi, anticisimlərlə katalizə olunmuş esterolitik və proteolitik reaksiyası işlərini genişləndirib. Alim tərəfindən kəşf olunan təbii anticisimlərin katalitik aktivlik fenomeni anticisimləri prinsipial yeni biokatalizator kimi istifadə etmək və insanda patoloji proses zamanı onların aktivliyini tədqiq etmək imkanı verir.

A.Həbibovun rəhbərlik etdiyi kollektivdə "katalitik vaksinlərin" – virus hissəciklərinin qabığının zülallarına, xüsusilə gpl20 QİÇS qlikoproteininə nisbətdə proteolitik aktivliyə malik abzimlərin əldə olunması istiqamətində işlər aparılır. Tədqiqatın gedişində dağınıq skleroz xəstəliyinə tutulmuş insanlarda və yaxın patologiyalı model heyvanlarda autoanticisimlərin təsiri altında mielinin əsas zülalının spesifik deqradasiya effekti aşkar edilib.



## Həbibov
## Sabir Qaçay oğlu

*Tibb elmləri doktoru, professor.*
*Moskva şəhəri 79 nömrəli Şəhər Klinik Xəstəxanasının endoskopik cərrahiyyə bölməsinin müdiri*

Həbibov Sabir Qaçay oğlu 1951-ci il yanvarın 1-də Azərbaycan Respublikasının Kəlbəcər rayonunda anadan olub.

1973-cü ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) bitirib. Ali məktəbi bitirdikdən sonra 1973-1974-cü illərdə Elmi-Tədqiqat Kliniki və Eksperimental Tibb İnstitutunda cərrahiyyə üzrə internatura keçib. 1974-1977-ci illərdə ETKETİ-də torakal cərrahiyyə bölməsində cərrah-həkim işləyib.

1978-ci ildə S.Həbibov SSRİ Tibb Elmləri Akademiyasının Ümumittifaq Onkologiya Elmi Mərkəzində əyani torakal onkologiya bölməsinin aspiranturasına qəbul olub. 1980-ci ildə "Ağciyərin yuxarı hissəsinin xərçənginin klinikası, diaqnostikası və müalicəsi" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib. Bu, həmin xəstəlik növü üzrə ilk namizədlik işi olub. S.Həbibov 1981-ci ildən indiyədək Moskva 79 nömrəli Şəhər Klinik Xəstəxanasında cərrah, sonradan endoskopik cərrahiyyə bölməsinin müdiri işləyir.

1989-cu ildə S.Həbibov İ.M.Seçenov adına Moskva Tibb Akademiyasının həkimlərin ali təhsildənsonrakı peşə təhsili fakültəsinin cərrahiyyə şöbəsində "Cərrahi qastroenterologiyanın aktual məsələləri" mövzusunda, 1999-cu ildə elə orada "Qarın boşluğu orqanlarının təxirəsalınmaz əməliyyatı" mövzusunda ixtisasartırma kursu keçib. S.Həbibov 1993-cü ildən qarın boşluğu və kiçik taz orqanlarında endovideocərrahiyyə əməliyyatlarını xəstəxananın praktikasına tətbiq edib. Sonradan onun rəhbərliyi altında ixtisaslaşmış endoskopik cərrahiyyə bölməsi yaradılıb.

S.Həbibov 2000-ci ildə Rusiyada ilk dəfə olaraq varikoz xəstəlikləri zamanı venanın endoskopik transillüminasiya ilə götürülməsini praktikaya tətbiq edib. Hazırda belə əməliyyatlar artıq Moskva, Sankt-Peterburq və Rusiyanın başqa şəhərlərində yerinə yetirilir.

2003-cü ildə Rusiya Diplomdansonrakı Təhsil Tibb Akademiyasının cərrahiyyə kafedrasında endocərrahiyyə üzrə ixtisasartırma kursları, ABŞ və Avropanın aparıcı klinikalarında dəfələrlə ustad dərsləri kursu keçib.

S.Həbibov 2000-ci ildə doktorluq dissertasiyasını müdafiə edib, 2004-cü ildə Beynəlxalq Elmlər Akademiyasının, 2005-ci ildə isə Rusiya Tibbi-Texniki Elmlər Akademiyasının həqiqi üzvü seçilib.

O, praktiki cərrahiyyədə 50-dən artıq elmi işin, 2 səmərələşdirici təklifin müəllifidir.

S.Həbibov nəzəri və praktiki tibbi praktikadakı nailiyyətlərinə görə Səhiyyə Nazirliyinin "Səhiyyə əlaçısı" döş nişanı ilə təltif edilib. Moskva hökumətinin tibb sahəsində mükafatının (2004) laureatıdır. 2006-cı ildə o, "A.Çijevski qızıl medalı"na layiq görülüb. 2009-cu ildə S.Həbibova səhiyyə sahəsindəki xidmətlərinə və çoxillik vicdanlı işinə görə "Rusiya Federasiyasının əməkdar həkimi" fəxri adı verilib.



## Həmidov
## Səfər İsrail oğlu

*Tibb elmləri doktoru, professor.*
*Rusiya Milli Tədqiqat Tibb Universitetinin urologiya kafedrasının professoru*

Həmidov Səfər İsrail oğlu 1968-ci il martın 5-də Azərbaycan Respublikasının Ağcabədi rayonunun Yeni Qaradolaq kəndində anadan olub.

1993-cü ildə İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin müalicə fakültəsini fərqlənmə diplomu ilə bitirib. Ali məktəbi bitirdikdən sonra Rusiya Dövlət Tibb Universitetinin N.İ.Piroqov adına 1 nömrəli şəhər klinik xəstəxanasının nəzdindəki urologiya və operativ nefrologiya kafedrasının bazasında klinik ordinatura, sonradan isə həmin kafedrada tibb elmləri doktoru, professor Y.B.Mazonun rəhbərliyi altında aspirantura keçib.

1998-ci ildə "Xəstələrdə paçanın küt zədələnməsi və kiçik taz orqanlarında radikal əməliyyatlardan sonra erektil disfunksiyanın patogenezi və diaqnostikasının xüsusiyyətləri" mövzusunda namizədlik dissertasiyasını, 2006-cı ildə isə "Metabolik sindromlu xəstələrdə erektil disfunksiya: epidemiologiya, patogenez, diaqnostika, müalicə və profilaktika" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. Hazırda N.İ.Piroqov adına RMTTU-nun urologiya kafedrasının professorudur.

S.Həmidov Rusiya və xarici nəşrlərdə dərc olunmuş 180-dən çox elmi əsərin müəllifi, Rusiya və beynəlxalq elmi konqres və qurultayların iştirakçısıdır. Onun işləri "International Journal of Sexual Medicin", "International Journal IR", "British Journal Urology", "European Urology Today" kimi beynəlxalq jurnallarda tam həcmdə dərc olunub.

2002-2011-ci illərdə S.Həmidov 35 Beynəlxalq elmi konqresdə (Avstriya, Almaniya, İspaniya, Niderland, Fransa, Yunanıstan, Danimarka, İngiltərə, Portuqaliya, İtaliya və s.) məruzələrlə çıxış edib. Vaskulogen erektil disfunksiyanın diaqnostikası üzrə RF-nin patentini alıb. "Erektil disfunksiya" və "Urologiyada metabolik sindrom" adlı 2 kitabın müəllifidir.

S.Həmidov uroloqların Rusiya və Avropa assosiasiyalarının, Beynəlxalq Androloqlar Assosiasiyasının, Beynəlxalq Seksual Tibb Assosiasiyasının üzvüdür.

Onun hesabında minlərlə uğurlu əməliyyat var. O, Mərmərə üsulu üzrə mikrocərrahi varikoselektomiyanın, həm cinsiyyət orqanlarında, həm də sidik sistemi orqanlarında plastik əməliyyatın mükəmməl texnikasına yiyələnib. Belə əməliyyatlara faloprotezləmə, venoakklyuziv tip üzrə erektil disfunksiya zamanı cinsiyyət üzvünün dərin dorsal venasının legirləşdirilməsi, Mərmərə əməliyyatı, cinsiyyət üzvünün oleoqranuleması zamanı Rayx əməliyyatı, əvəzedici korporoplastika, Nesbit əməliyyatı, sidik kanalının bukkal plastikası və bir çox başqaları aiddir. S.Həmidov hamıya bəlli operativ vəsaitlərin həm əməliyyat zamanı, həm də əməliyyat sonrası dövrdə özünü doğruldan məxsusi modifikasiyalarından istifadə edərək fərdi bacarığını daim təkmilləşdirir.

Hazırda S.Həmidov bir çox məşhur tibb müəssisələrində çalışır, həmçinin elmi və praktiki fəaliyyətlə məşğul olur. Rusiya Dövlət Tibb Universitetinin urologiya kafedrasının professoru, İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin mamalıq, ginekologiya, perinatologiya və reproruktologiya kafedrasının professoru, V.İ.Kulakov adına Mamalıq, Ginekologiya, Perinatologiya Elmi Mərkəzinin professorudur. Həmçinin "İntelmed", "Avroved C" və "Medana" klinikalarının həkim-uroloq kimi konsultantı, tibb elmləri doktorudur.

Professor S.Həmidov əsas fəaliyyəti ilə yanaşı "İntelmed" klinikalar şəbəkəsinin baş rəhbəri və aparıcı androloqudur.



## Həsənov
## Ayət Muxtar oğlu

*Kənd təsərrüfatı elmləri doktoru, professor.*
*Moskva Dövlət Təbiətin Abadlaşdırılması Universitetinin professoru*

Həsənov Ayət Muxtar oğlu 1937-ci il yanvarın 1-də Gürcüstan Respublikasında anadan olub.

1967-ci ildə M.V.Lomonosov adına MDU-nun biologiya-torpaq fakültəsini bitirdikdən sonra işləmək üçün Moskva Hidromeliorasiya İnstitutunun elmi-tədqiqat sektoruna göndərilib. 1967-1975-ci illərdə kiçik elmi işçi vəzifəsində tacik və türkmən ekspedisiyalarının tərkibində pambıq vilti və torpaq duzlaşması ilə mübarizəyə yönələn tədqiqatlar apardığı, həmçinin karbonatlı torpaqlarda mineral gübrələrin istifadəsinin effektivliliyinin əsaslandırılması məsələləri ilə məşğul olduğu çöl işlərinə çıxıb.

1971-ci ildən Moskva Hidromeliorasiya İnstitutunun aspirantı olarkən arid zonada qapalı suvarma şəbəkəsindən istifadə zamanı mineral gübrələrin suvarma suyu ilə daxil edilməsi problemi üzərində işləyib və 1975-ci ildə "Azot-fosfor gübrələrinin suvarma suyu ilə və quru şəkildə daxil edilməsi effektivliliyinin aydınlaşdırılması" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib.

1976-cı ilin sentyabr ayından A.Həsənov Moskva Hidromeliorasiya İnstitutunun meliorativ torpaqşünaslıq və kənd təsərrüfatı kafedrasında assistent, 1979-cu ildən dosent, 1993-cü ildən isə kafedra professoru vəzifələrində işləyib. O, kafedrada çalışarkən münbit zonada – bataqlıq-kültorpaqların kompleks meliorasiyası, Mərkəzi-qaratorpaqlı zonalarda – qaratorpaqların suvarılması, rütubətli-subtropik zonalarda – sarıtorpaqlarda meliorasiyanın effektivliliyi, Qafqazın dağətəyi rayonlarında düyü becərilməsinin resurs qənaəti texnologiyası kimi elmi problemlərlə məşğul olub. A.Həsənov 1992-ci ildə "Ağır gilcə – yüngül gilcə karbonatlı morenlərdə formalaşan bataqlıq-kültorpaqların kompleks meliorasiyası" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək kənd təsərrüfatı elmləri doktoru elmi dərəcəsini alıb. Bu dissertasiya onun çoxillik tədqiqatlarının nəticəsidir.

A.Həsənov 138 elmi-metodiki iş, həmçinin Toqo və Suriyadan olan 4 elmlər namizədi hazırlayıb. 1983-cü ildə "Tropik və subtropik torpaqşünaslıq" dərs vəsaiti

dərc etdirib və bu dərs vəsaiti 1988-ci ildə yenidən çap olunub, 2007-ci ildə torpaqşünaslıq üzrə dərsliyi çap edilib.

O, 1976-cı ildə Moskvada mineral gübrələr üzrə 8-ci Beynəlxalq konqresdə iştirak edib, 1977-ci, 1981-ci, 1985-ci, 1989-cu illərdə SSRİ torpaqşünaslar qurultayının nümayəndəsi olub.

A.Həsənov Efiopiya, Macarıstan, Gürcüstan, Moldova və Belarusda elmi mühazirələr oxuyub. 1994-cü ildə Rusiya Su Təsərrüfatı Elmlər Akademiyasının müxbir üzvü seçilib. 1994-2008-ci illərdə Moskva Təbiətə Qayğı Universitetinin torpaqşünaslıq və kənd təsərrüfatı kafedrasının müdiri olub.

A.Həsənovun meliorasiya elminin inkişafında xidmətləri SSRİ Kənd Təsərrüfatı Nazirliyinin fərmanları, “Sosializm yarışının qalibi” nişanı, “Əmək veteranı”, “Moskvanın 850 illiyinə xatirə medalı”, “Universitet qarşısında xidmətlərinə görə” medalları ilə qeyd olunub.



## Həsənov
## Elmir Vahid oğlu

*"Ali İqtisadiyyat Məktəbi" Milli Tədqiqat Universiteti Biznes-informatika fakültəsinin informatikanın əsasları və tətbiqi proqram təminatı kafedrasının dosenti*

---

Həsənov Elmir Vahid oğlu 1961-ci il aprelin 16-da Ermənistan Respublikasının İcevan rayonunun Vurğun (Haqqıxlı) kəndində anadan olub.

1978-ci ildə Sumqayıt şəhərindəki 26 nömrəli orta məktəbi, 1984-cü ildə isə Moskva Poliqrafiya İnstitutunu fərqlənmə ilə bitirib.

1984-1988-ci illərdə E.Həsənov təhsilini Moskva Poliqrafiya İnstitutunun qiyabi aspiranturasında texnika elmləri doktoru, professor M.İ.Voskresenkinin təşkilatçılığı və rəhbərliyi altında davam etdirib, mühəndis-proqramçı vəzifəsində "Soyuz" mətn informasiyasının emalının avtomatlaşdırılmış sisteminin hazırlanmasında fəal iştirak edib. Bu sistem SSRİ-nin ən böyük poliqrafiya kombinatlarında tətbiq olunub. 1988-ci ilin dekabrında Moskva Poliqrafiya İnstitutunun nəzdindəki şuranın qərarı ilə ona SSRİ Nazirlər Soveti yanında Ali Attestasiya Komissiyası tərəfindən təsdiqlənmiş texnika elmləri namizədi elmi dərəcəsi verilib.

1989-cu ildə E.Həsənov müəllimlik işinə keçib və 1993-cü ilədək assistent, sonra Moskva Poliqrafiya İnstitutunda tətbiqi riyaziyyat və hesablama texnikası kafedrasının baş müəllimi olub.

1993-1995-ci illərdə E.Həsənov İnformasiya Texnologiyaları Kollecinin direktoru işləyib. 1995-1997-ci illərdə Moskvada 682 nömrəli orta ümumtəhsil məktəbinin direktoru olub. 1997-1999-cu illərdə "İntellektual texnologiyalar" QSC-də (rəhbər – Rusiya Elmlər Akademiyasının müxbir üzvü V.L.Arlazarov) redaksiya-nəşriyyat şöbəsinin müdiri vəzifəsində işləyib.

1999-cu ildən bu günədək E.Həsənov "Ali İqtisadiyyat Məktəbi" Milli Tədqiqat Universitetinin biznes-informatika fakültəsinin informatikanın əsasları və tətbiqi proqram təminatı kafedrasının dosentidir. Biznes-informatika, tətbiqi politologiya fakültələrində, işgüzar və siyasi jurnalistika şöbəsində dərs deyir.

E.Həsənov mühazirələr oxuyur və "İnformatika və riyaziyyat", "Məlumatlar bazası idarəetmə sistemləri", "Ofis fəaliyyəti sahəsində informasiya texnologiyaları", "Web-dizayn", "Mətbu və elektron KİV-lərin hazırlanmasının informasiya texnolo-

giyaları", "Elektron PR", "İşgüzar təqdimatların hazırlanmasının informasiya texnologiyaları" fənləri üzrə praktik məşğələlər aparır. Son dörd fənn bilavasitə E.Həsənov tərəfindən hazırlanıb.

E.Həsənovun müəllimlik fəaliyyəti kurs proqramlarının, dərs vəsaitlərinin, çalışma toplularının hazırlanması üzrə böyük metodik işlərlə müşayiət olunur. Fənlərin metodiki təminatı üçün E.Həsənov tərəfindən üç tədris-metodik vəsait, biznes-informatika, hüquq, tətbiqi politologiya fakültələri, işgüzar və siyasi jurnalistika şöbəsi üçün kursların səkkiz tədris proqramı hazırlanıb. Ümumilikdə alimin çap olunmuş 30 elmi və tədris-metodik əsəri var.

E.Həsənov təkcə müəllimliklə deyil, həm də elmi işlə fəal məşğul olur. O, 2001-ci ildə Rusiyada qəbul imtahanlarının VDİ (Vahid dövlət imtahanı) formatında test şəklində keçirilməsinin ilk avtomatlaşdırılmış sistemlərindən birinin proqram təminatını hazırlayan əsas şəxslərdən biri olub. Sistem sənaye istismarına uğurla tətbiq edilib və hazırda "Ali İqtisadiyyat Məktəbi" Milli Tədqiqat Universitetində qəbul imtahanlarının keçirilməsində istifadə olunur.

E.Həsənov "Ali İqtisadiyyat Məktəbi" Milli Tədqiqat Universitetinin internat-məktəbinin distant tədris sisteminin proqram təminatını işləyib hazırlayıb ki, bu da 2003-cü ilin oktyabrından uğurla fəaliyyət göstərir və Rusiyada abituriyentlər üçün ən böyük distant tədris sistemlərindən biridir. 2004-cü ildə E.Həsənov professor Y.Q.Yasinin rəhbərliyi altında "Rusiyada iqtisadi siyasətin inkişafı sahəsində müstəqil ekspertlər" proqramı çərçivəsində Rusiya sənayesinin əsas sahələrində transformasiya proseslərinin tədqiqi - USAID layihəsində proqram təminatının hazırlanmasında iştirak edib. Layihə ABŞ hökuməti tərəfindən maliyyələşdirilib.

E.Həsənov müasir informasiya texnologiyalarının gənclər arasında populyarlaşdırılması ilə fəal məşğul olur. 1998-ci ildə Maltada Uşaq Kompyuter Forumu keçirib, 2004-cü ildə "Ali İqtisadiyyat Məktəbi" Milli Tədqiqat Universitetinin məktəblilər üçün biznes-informatika yay məktəbini təşkil edib.



## Həsənov
## Elyar Eldar oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor. M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsinin intellektual sistemlərin riyazi nəzəriyyəsi kafedrası müdirinin müavini*

Həsənov Elyar Eldar oğlu 1959-cu il noyabrın 14-də Moskvada anadan olub.

1982-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin (MDU) hesablama riyaziyyatı və kibernetika fakültəsini bitirib. 1986-cı ildə "İnformasiya axtarışının mürəkkəbliyi haqqında" mövzusunda namizədlik dissertasiyası, 1999-cu ildə isə "Verilənlərin informasiya-universal modelində baza tapşırıqlarının axtarışı və saxlanılmasının optimal həlli" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

1982-ci ildən E.Həsənov M.V.Lomonosov adına MDU-nun mexanika-riyaziyyat fakültəsinin intellektual sistemlərin riyazi nəzəriyyəsi kafedrasında dərs deyir.

E.Həsənov 2003-cü ildən mexanika-riyaziyyat fakültəsinin intellektual sistemlərin riyazi nəzəriyyəsi kafedrasının professorudur. MDU-da "İntellektual sistemlər nəzəriyyəsi", "Verilənlər bazalarının və informasiya axtarışının nəzəriyyəsi", "Diskret riyaziyyatın və riyazi kibernetikanın əlavə fəsilləri" mövzularında xüsusi kurslar keçir, "Axtarış alqoritmlərinin mürəkkəbliyi məsələləri" mövzusunda xüsusi seminar aparır.

Onun elmi maraq dairəsinə diskret riyaziyyat, idarəetmə sistemlərinin nəzəriyyəsi, verilənlər bazalarının nəzəriyyəsi, axtarış alqoritmlərinin mürəkkəbliyi və çox böyük inteqral sxemlərin sintezi daxildir.

E.Həsənov tərəfindən informasiya axtarışı və saxlanılmasının ümumi nəzəriyyəsi qurulub ki, bunun da əsasını verilənlərin yeni informasiya-universal modeli təşkil edir. O, məlumat bazalarında ən çox istifadə olunan axtarış məsələlərinin geniş sinfi üçün informasiya qrafalarının optimal sintezi problemini həll edib. Alim tərəfindən qurulmuş nəzəriyyə konkret məlumat bazaları üçün bütün özəl tapıntıları örtür və yeni tipli məlumat bazalarının yeni sintez texnologiyalarını və alqoritmləri verir ki, bu da məlum olanlardan daha səmərəlidir.

E.Həsənovun əsas əsərləri: "İnformasiyanın axtarışı və saxlanması nəzəriyyəsi" (həmmüəllif, 2002), "İnformasiya axtarışının mürəkkəbliyi nəzəriyyəsi" (2005), "Məntiqi qurğuların testləşdirilməsi nəzəriyyəsi" (həmmüəllif, 2006), "İntellektual

sistemlər nəzəriyyəsinə giriş" (həmmüəllif, 2006) dərs vəsaiti. O, həm də "İntellektual sistemlər" jurnalının redaksiya heyətinin üzvüdür.

E.Həsənov 14 elmlər namizədi hazırlayıb. 140-dan çox elmi əsər, o cümlədən üç monoqrafiya, dörd dərs vəsaiti nəşr etdirib. O, ABŞ-ın 40-dan çox patentinin sahibidir.

Jurnallarda məqalələrinə 8 istinad olunub (Scopusun məlumatına görə).



## Həsənov
## Eyvaz Əli oğlu

*İqtisad elmləri doktoru, professor.*
*Xabarovsk Dövlət İqtisadiyyat və Hüquq Akademiyasının iqtisadi nəzəriyyə kafedrasının professoru*

Həsənov Eyvaz Əli oğlu 1959-cu il yanvarın 1-də Azərbaycan Respublikasının Şamxor rayonunun (indiki Şəmkir rayonu) Bitdili kəndində anadan olub.

Əmək fəaliyyətinə 1976-cı ildə Şamxor su-elektrik stansiyasının tikinti idarəsində başlayıb. 1978-1980-ci illərdə Sovet Ordusu sıralarında xidmət edib. 1981-1986-cı illərdə V.V.Kuybışev adına Tomsk Dövlət Universitetinin iqtisadiyyat fakültəsinin siyasi iqtisad şöbəsinin tələbəsi olub.

Universiteti bitirdikdən və iqtisadçı, siyasi iqtisad müəllimi ixtisasına yiyələndikdən sonra E.Həsənov Xabarovsk Xalq Təsərrüfatı İnstitutunun (XXTİ) (indiki Xabarovsk Dövlət İqtisadiyyat və Hüquq Universiteti - XDİHU) siyasi iqtisad kafedrasına təyin olunub.

1986-1989-cu illərdə E.Həsənov XXTİ-nin siyasi iqtisad kafedrasında müəllim işləyib. 1989-1992-ci illərdə Moskva İqtisadiyyat-Statistika İnstitutunun aspirantı olub. 1992-ci ildə "HTP (nəzəriyyə və metodologiya məsələləri) şəraitində ictimai istehsalın intensivləşdirilməsi" mövzusunda siyasi iqtisad üzrə namizədlik dissertasiyası müdafiə edib.

1993-1995-ci illərdə E.Həsənov Xabarovsk Dövlət İqtisadiyyat və Hüquq Akademiyasının (XDİHA) iqtisadi nəzəriyyə kafedrasının baş müəllimi, 1995-ci ildən dosenti olub. 1998-2000-ci illərdə doktoranturada öz peşəkar səviyyəsini yüksəldib və 2000-2003-cü illərdə XDİHA-nın Elmi-Tədqiqat Problem Laboratoriyasının baş elmi işçisi vəzifəsində çalışıb.

E.Həsənov 2005-ci ildə Tomsk Dövlət Universitetində iqtisadi nəzəriyyə üzrə "Rusiyada iqtisadi artımın informasiya modeli potensialı" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

2003-2006-cı illərdə E.Həsənov XDİHA-nın iqtisadi nəzəriyyə kafedrasının dosenti olub, 2006-cı ildən kafedranın professoru, 2013-cü ilin sentyabrından isə kafedranın müdiridir.

E.Həsənov kafedra tərəfindən iqtisadi nəzəriyyə ixtisası və analitik iqtisadiyyat profili üzrə tələbələrin hazırlanmasına böyük töhfə verib. Fəaliyyəti dövründə bütün

növ tədris işlərini yerinə yetirib: mühazirələrin oxunması, praktiki məşğələlərin keçirilməsi, tələbələrin biliklərinin attestasiya və reytinq yoxlanması üçün hazırlanması. Alim tərəfindən iqtisadi nəzəriyyə ixtisası və analitik iqtisadiyyat profili üçün "aralıq səviyyəsinin mikro və makroiqtisadiyyatı", "bazar iqtisadiyyatının müasir sistemi", "informasiyanın, qeyri-müəyyənliyin və risklərin iqtisadi nəzəriyyəsi", "uzunmüddətli iqtisadi artım", "iqtisadiyyatın müasir sistemləri", "bilik iqtisadiyyatı və innovasiya", "Rusiyada innovasiya iqtisadiyyatı, formalaşma ziddiyyətləri", "informasiya nemətləri bazarı" və s. üzrə xüsusi təlim kursları hazırlanıb.

E.Həsənov kurs, diplom və dissertasiya işlərinə uğurla rəhbərlik edir. Elmi rəhbər kimi o, "iqtisadiyyat" istiqaməti üzrə magistr hazırlığı proqramını və tədris planını hazırlayıb. (2013-cü ildə "Müasir Rusiyanın iqtisadi nəzəriyyəsi və problemləri" proqramının adı dəyişdirilib və "Analitik iqtisadiyyat və müasir sahibkarlıq" adlanır).

2013-cü ildən E.Həsənov həm də "Logistika" magistr proqramının elmi rəhbəridir. O, magistr proqramları çərçivəsində beş yaradıcı təlim kursu hazırlayıb.

E.Həsənov akademiyada işlədiyi dövrdə assistent vəzifəsindən iqtisadi nəzəriyyə kafedrasının professoru vəzifəsinədək yüksəlib. O, zəngin elmi təcrübəyə və potensiala malikdir, 143 elmi və tədris işləri dərc etdirib. İqtisadi nəzəriyyə üzrə 26 dərslik və dərs vəsaitinin, 9 monoqrafiyanın müəllifi və həmmüəllifidir.

Məsul icraçı və rəhbər kimi 2003-2013-cü illərdə E.Həsənov Rusiya Federasiyasının və Xabarovsk diyarının innovasion sosial-iqtisadi inkişafı üçün aktual olan bir sıra elmi-tədqiqat işlərini yerinə yetirib.

E.Həsənov iqtisad elmləri namizədi və doktoru elmi dərəcələri almaq üçün dissertasiya müdafiəsi üzrə dissertasiya şurasının üzvüdür, namizədlik dissertasiyalarının yazılması üzrə aspirantların işinə rəhbərlik edir, XDİHA-da Dövlət Attestasiya Komissiyasının (DAK) işində iştirak edir. Həmçinin Sakit Okean Dövlət Universiteti və Uzaq Şərq Dövlət Nəqliyyat Universitetinin DAK-ın sədridir.

E.Həsənov "Rosobrnadzor"un və "Uzaq Şərq Federal Universitetinin Elm Fondu" Proqramının eksperti, Uzaq Şərq regional tədris-metodik mərkəzinin iqtisadi nəzəriyyə üzrə şurasının sədridir.

E.Həsənov beynəlxalq (Rusiya, Yaponiya, Çin), ümumrusiya, respublika, regional, ali məktəblərarası və ali məktəblərin elmi, elmi-praktik və elmi-metodik konfrans və seminarlarında mütəmadi iştirak edir.

2006-2008-ci illərdə E.Həsənov Uzaq Şərq "Tələbə baharı" festivalının tətbiqi iqtisadi araşdırmalar sahəsində tələbə elmi işləri müsabiqəsinin diyar komissiyasının üzvü olub. O, 2006-2013-cü illərdə "Tələbə baharı" üçün XDİHA tələbələrinin iq-

tisadi tədqiqatlar sahəsində elmi işlərinin qiymətləndirilməsi üzrə komissiyanın üzvü, 2008-ci ildə Ümumrusiya Gənclər Forumu çərçivəsində iqtisadi nəzəriyyə (11 tur) üzrə Ümumrusiya tələbə olimpiadasının münsiflər heyətinin sədri olub.

E.Həsənov öz elmi-metodik potensialını və pedaqoji ustalığını daim təkmilləşdirir. İstehsalatdan ayrılmadan Respublika Humanitar Universitetinin Xabarovsk filialında iqtisadi nəzəriyyə üzrə ixtisasartırma kursları keçib və "Müasir iqtisadi nəzəriyyələr" kursunun tədrisi hüququ qazanıb. 2004-cü və 2011-ci illərdə Rusiya İqtisadiyyat Məktəbinin Əlavə Peşə Təhsili Mərkəzində və Tomsk Dövlət Universitetində ixtisasartırma kursu keçib.

2008-ci ildə E.Həsənov Rusiya Federasiyası Təhsil və Elm Nazirliyinin fəxri fərmanı ilə təltif edilib. Yüksək ixtisaslı mütəxəssislərin hazırlanması işinə verdiyi töhfəyə görə 2010-cu ildə Xabarovsk merinin fəxri fərmanına layiq görülüb. Çoxillik fəal və vicdanlı əməyinə görə dəfələrlə XDİHA-nın fəxri fərmanlarını alıb. XDİHA rəhbərliyindən, Xabarovsk diyarı Krasnoflotsk rayon administrasiyasından və Xabarovsk diyarı Administrasiyasının gənclər siyasəti komitəsindən çoxsaylı təşəkkürnamələri var. E.Həsənov Rusiya Federasiyasının fəxri ali peşə təhsili işçisidir. Avropa elm-sənaye konsorsiumunun "Avropa keyfiyyəti" Qızıl medalı ilə təltif edilib.

Alimin fəaliyyətinin əsas istiqamətlərini endogen iqtisadi artım nəzəriyyəsi, informasiya iqtisadiyyatı nəzəriyyəsi, bilik iqtisadiyyatı nəzəriyyəsi, innovasiya iqtisadiyyatı nəzəriyyəsi, iqtisadiyyatın innovasiya konversiyası nəzəriyyəsi təşkil edir. O, həmçinin iqtisadi artımın informasiya modeli (tipli) konsepsiyasını hazırlayıb.

Məsul icraçı kimi E.Həsənov Rusiya Federasiyasının və Xabarovsk diyarının inkişafı üçün aktual olan bir sıra elmi-tədqiqat işlərini yerinə yetirib. Onların sırasına "Xabarovsk diyarında ali təhsilin və elmin inteqrasiyasının yeni texnologiyalarının yaradılması və problemlərin tədqiqi", "İqtisadi artımın informasiya tipinin trayektoriyası və genezisi, onun sistemyaradıcı amilləri", "Bilik iqtisadiyyatı fəaliyyətinin fundamental prinsiplərinin formalaşması qanunauyğunluqlarının tədqiqi informasiya texnologiyaları inqilabı kontekstində", "Rusiya iqtisadiyyatının innovasiya konversiyasının fundamental qanunauyğunluqlarının, mexanizm və amillərinin nəzəri-metodoloji aspektlər", "Rusiya iqtisadiyyatının innovasiya konversiyası: potensial, şərait və amillər", "İnformasiya texnologiyaları inqilabı şəraitində innovasiya iqtisadiyyatının intellektləşdirilməsinin prinsip və mexanizmlərinin öyrənilməsi" daxildir.



## Həsənov
## Ələmdar İbrahim oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*İzmir Universitetinin riyaziyyat və kompyuter elmləri kafedrasının müdiri*

Həsənov Ələmdar İbrahim oğlu 1954-cü il mayın 29-da Azərbaycan Respublikasının Ağstafa rayonunda anadan olub.

Hələ 1 nömrəli məktəbdə oxuduğu zaman respublika riyaziyyat olimpiadasında iki dəfə mükafata layiq yer tutub (1969-1970). 1971-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) mexanika-riyaziyyat fakültəsinə qəbul olunub. 1974-cü ildə M.V.Lomonosov adına MDU-da görkəmli rus riyaziyyatçısı A.N.Kolmoqorovun sədrliyi ilə keçirilən birinci Ümumittifaq tələbə riyaziyyat olimpiadasının mükafatçısı olub.

1977-1978-ci illərdə ali məktəbi bitirən və riyaziyyatçı ixtisasına yiyələnən Ə.Həsənov SSRİ EA-nın Tətbiqi Riyaziyyat İnstitutunda elmi işçi vəzifəsində işləyib. 1982-ci ildə M.V.Lomonosov adına MDU-nun riyazi hesablama və kibernetika fakültəsində "Elastiklik nəzəriyyəsinin əlaqə məsələlərində ədədi üsullar" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib.

1983-cü ildə Ə.Həsənov doğma Azərbaycan Dövlət Universitetinə qayıdaraq 1985-ci ilədək orada professor assistenti işləyib. 1983-cü ildə S.M.Kirov adına ADU-da ən yaxşı elmi işə görə mükafat alıb.

1986-1988-ci illərdə Ə.Həsənov M.V.Lomonosov adına MDU-da doktorant işləyib. 1988-ci ildə həmin universitetdə akademik A.N.Tixonovun sədrliyi altında "Diaqnostikanı pozmayan elastik-plastik materiallara aid birbaşa və tərs məsələlərin riyazi metodları" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. Bir il sonra XTNS-də ona ən yaxşı elmi işə görə SSRİ Elmlər Akademiyasının medalı və fəxri fərmanı təqdim olunub.

1989-1991-ci illərdə Ə.Həsənov Azərbaycan Dövlət Universiteti və Moskva Dövlət Universitetində professor işləyib. 1992-ci ildə Türkiyəyə, "Marmara Research Centre" Elmi-Tədqiqat Mərkəzinə (TÜBİTAK) dəvət olunub. 1993-cü ildən 2009-cu ilədək Nebraska ştatının universitetində (ABŞ) və Kocaeli Universitetində (Türkiyə) Elmi Tədqiqat Tətbiqi Riyaziyyat Tədqiqatları Mərkəzində direktor kimi çalışıb.

2009-cu ildən indiyədək İzmir Universitetinin riyaziyyat və kompyuter elmləri kafedrasının təşkilatçısı və müdiridir.

Professor Ə.Həsənovun elmi maraq dairəsi genişdir: tərs məsələlər, qeyri-xətti diferensial tənliklər, tibb də daxil olmaqla, elm və texnologiyanın ən müxtəlif sahələrində riyazi və kompyuter modelləşdirilməsi.

Ə.Həsənov müxtəlif beynəlxalq təltiflərin, həmçinin Türkiyə mükafatlarının sahibidir. Hazırda beynəlxalq (Impact Factor) "Applicable Analysis", "Inverse Problems in Science and Engineering", "Inverse and Ill-Posed Problems" jurnallarının redaksiya heyətlərinin üzvü, tanınmış "Inverse Problems: Modeling and Simulation" beynəlxalq konfransın təşkilatçısı və 2002-ci ildən sədridir. Ə.Həsənov 100-dən çox elmi işin, o cümlədən 10 monoqrafiyanın müəllifi və həmmüəllifidir.



## Həsənov
## Məhərrəm Əli oğlu

*İqtisad elmləri doktoru, professor.*
*Tomsk Milli Tədqiqat Politexnik Universitetinin iqtisadiyyat kafedrasının professoru*

Həsənov Məhərrəm Əli oğlu 1963-cü il noyabrın 4-də Azərbaycan Respublikasının Şamxor rayonunun (indiki Şəmkir rayonu) Bitdili kəndində anadan olub.

1989-cu ildə Tomsk Dövlət Universitetini bitirib. 1989-1991-ci illərdə Tomsk Politexnik Universitetinin siyasi iqtisad kafedrasında assistent işləyib. 1991-1994-cü illərdə Tomsk Dövlət Universitetinin aspiranturasında təhsil alıb. 1994-1996-cı illərdə "Mednord" Elm-İstehsalat Birliyində investisiya fondlarının müdiri işləyib. 1996-1999-cu illərdə baş direktorun iqtisadiyyat üzrə müavini, Tomsk şəhər administrasiyasının torpaq ehtiyatlarının idarə edilməsi üzrə məsləhətçisi olub.

2005-ci ildə Tomsk Dövlət Universitetində namizədlik dissertasiyasının müdafiəsindən sonra M.Həsənov iqtisadiyyat kafedrasında dosent vəzifəsində işləməyə davam edib. 2006-cı ildə M.Həsənova dosent elmi adı verilib. 2009-cu ildə o, Tomsk Dövlət Universitetinin nəzdində əyani doktoranturaya qəbul olunub və 2012-ci ildə iqtisad elmləri doktoru alimlik dərəcəsi almaq üçün uğurla dissertasiya müdafiə edib. M.Həsənov 2013-cü ildən Tomsk Politexnik Universitetinin iqtisadiyyat kafedrasının professorudur. O, 2013-cü ildə Moskvada Rusiya Təbiətşünaslıq Akademiyasının müxbir üzvü seçilib. Professorun dissertasiyaları və elmi əsərləri struktur dəyişiklikləri, struktur, texnoloji və klaster inkişafı, regional inkişaf məqsədli proqramlar, sahələrarası balans və bələdiyyə idarəçiliyi sahəsindəki problemləri əhatə edir. Onun elmi tədqiqatlarının əsas istiqamətləri iqtisadiyyatın struktur inkişafı, texnoloji üsullar, iqtisadiyyatda struktur konvergensiyası, şəbəkə iqtisadiyyatı və klasterləşdirmə mövzuları ilə bağlıdır.

M.Həsənov tərəfindən mikroiqtisadiyyat, makroiqtisadiyyat, regional iqtisadiyyat, bələdiyyə iqtisadiyyatı, təşkilat iqtisadiyyatı, qiymətləndirmə fəaliyyəti, qiymətli kağızlar fənləri üzrə tədris-metodik işləmələr kompleksi hazırlanıb.

Alimin istehsalat təcrübəsi və onun müdafiəsi üzrə yaratdığı işlənmələr, həmçinin tələbələrin buraxılış ixtisas işlərinin təkmilləşdirilməsi iqtisadi təcrübə üçün əhəmiyyətlidir.

M.Həsənov 100-dən çox elmi əsərin, o cümlədən 15 monoqrafiyanın, ali məktəblər üçün 6 dərsliyin müəllifi və həmmüəllifidir. O, doktorluq dissertasiyalarının müdafiəsi üzrə dissertasiya şurasının üzvü, innovasiya iqtisadiyyatı üzrə Tomsk Politexnik Universiteti və Tomsk Dövlət Universiteti tərəfindən təşkil edilən beynəlxalq və Rusiya konfranslarının təşkilat komitələrinin üzvüdür. Elmi rəhbər kimi o, iki doktorluq, beş namizədlik dissertasiyasına rəhbərlik edib.

M.Həsənov Çin, Almaniya, ABŞ, Fransa, Şimali Koreya universitetlərindəki aparıcı iqtisadçı alimlərlə fəal əməkdaşlıq edir.

M.Həsənov elmi və pedaqoji fəaliyyətdəki uğurlarına görə "Təhsilə və elmə verdiyi töhfəyə görə" medalı ilə təltif edilib.



## Həsənov
## Yaşar Kərim oğlu

*(1939-2013)*

*RTEA-nın akademik N.N.Burdenko adına Elmi-Tədqiqat Neyrocərrahiyyə İnstitutu direktorunun sabiq müavini*

Həsənov Yaşar Kərim oğlu 1939-cu il aprelin 1-də Azərbaycan Respublikası Naxçıvan Muxtar Respublikasının Culfa rayonunda anadan olub.

Orta məktəbi qızıl medalla, daha sonra 1963-cü ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) fərqlənmə ilə bitirən Y.Həsənov bütün həyatını Moskva Neyrocərrahiyyə İnstitutu ilə bağlayıb. Ötən əsrin 60-cı illərində o, burada klinik neyrofiziologiya üzrə ordinaturanı və aspiranturanı bitirib. Professor V.E.Mayorçikin elmi rəhbərliyi altında "Uşaqlarda arxa kəllə çuxurunun zədələnməsi zamanı beyincik və beyincik qabığının qarşılıqlı münasibətlərinin elektrofizioloji tədqiqi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

Y.Həsənov tətbiqi neyrofiziologiya üzrə böyük mütəxəssis idi. O, neyrocərrahiyyə klinikası üçün mühüm əhəmiyyət kəsb edən beyin və periferik qan dövranının mərkəzi requlyasiyası, bioelektrik fəallığın, mərkəzi qan dövranının və kəllədaxili təzyiqin qarşılıqlı əlaqəsi, beyinciyin, gövdənin və digər beyin strukturlarının funksional vəziyyətinin qiymətləndirilməsi ilə intraoperativ monitorinq və s. problemlərin öyrənilməsinə böyük töhfə verib. Alim baş-beynin damar və şiş xəstəlikləri olan xəstələrdə adrenergik maddələrin beyin qan dövranına təsiri ilə bağlı kompleks eksperimental və kliniki-fizioloji tədqiqatlar aparıb.

Y.Həsənov 70-dən çox elmi əsər, o cümlədən fundamental dərsliklər çap etdirib.

Alim institutun ictimai həyatında fəal iştirakı ilə də seçilirdi. Uzun illər partiya bürosunun katibi, daha sonra əmək kollektivi şurasının sədri işləyib. Onun işgüzar və insani keyfiyyətləri layiqincə qiymətləndirilib: 1993-cü ildə Y.Həsənov institut direktorunun sosial və iqtisadi məsələlər üzrə müavini olub. Bu vəzifədə 20 il çalışıb. O, daim dəyişən çətin və mürəkkəb iqtisadi şəraitdə ölkənin ən iri neyrocərrahiyyə müəssisəsinin tam fəaliyyət göstərməsi və inkişafı üçün çox işlər görüb. Yeni 300 çarpayılıq əsas binanın, radiocərrahiyyə və radioloji korpusların tikilməsində, institutun kompyuterləşdirilməsinin həyata keçirilməsində, diaqnostik, cərrahiyyə və

digər avadanlıqların modernləşdirilməsində, köməkçi xidmətlərin işinin qurulmasında A.N.Konovalovun etibarlı köməkçisi idi.

Alim və təşkilatçı kimi Y.Həsənov Rusiya Federasiyasının Əməkdar səhiyyə işçisi və "Dostluq" ordeninin kavaleri olub.

Y.Həsənov 2013-cü ildə vəfat edib.



## Həsənli
## Nizami Məmməd oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*Orta Şərq Texniki Universitetinin professoru*

Həsənli Nizami Məmməd oğlu 1941-ci il sentyabrın 15-də Gürcüstanın Bolnisi rayonunda anadan olub.

1958-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika fakültəsinə, sonradan SSRİ Elmlər Akademiyasının Leninqrad Fizika-Texnika İnstitutunun (indiki Rusiya Elmlər Akademiyasının A.F.İoffe adına Fizika-Texnika İnstitutu) aspiranturasına qəbul olub. 1972-ci ildə fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almaq üçün "İndium antimonid əsasında sərt məhlulların rəqsi spektri və udma kənarı" mövzusunda dissertasiyasını, 1986-cı ildə "A3B6 tipli anizotrop yarımkeçirici kristalların rəqsi vəziyyətinin optik spektroskopiyası" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib.

N.Həsənli əmək fəaliyyətinə 1964-cü ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin fizika fakültəsində elmi işçi kimi başlayıb. 1972-ci ildən 1991-ci ilədək həmin universitetin müəllimi, baş müəllimi, dosenti, fizika fakültəsinin professoru olub, 1989-1991-ci illərdə fizika fakültəsinin dekan müavini işləyib.

1992-ci ildə professor qismində indiyədək çalışdığı Orta Şərq Texniki Universitetinın (Ankara) fizika fakültəsinə dəvət olunub.

Çoxsaylı konfranslarda (Böyük Britaniya, Almaniya, Rusiya, Yunanıstan, Macarıstan, Azərbaycan və başqa ölkələrdə) iştirak edib. Bir çox xarici universitetlərdə, o cümlədən Sərt Cismin Fizikası İnstitutu, Regensburq Universiteti (Almaniya, 1984), Vihuri Fizika Laboratoriyası, Turku Universiteti (Finlandiya, 1991) və başqalarında mühazirələr oxuyub.

N.Həsənli 250-dən çox elmi işin müəllifidir. Bakıda onun rəhbərliyi altında 2 elmlər doktoru, 8 elmlər namizədi, Türkiyədə 1992-2013-cü illərdə 24 Ph.D hazırlanıb.



## Hüseynov
## Arif Ziyad oğlu

*Tibb elmləri doktoru, professor.*
*Tula Dövlət Universitetinin tibb fakültəsinin 1 nömrəli cərrahi xəstəliklər kafedrasının müdiri*

Hüseynov Arif Ziyad oğlu 1956-cı il iyulun 7-də Azərbaycan Respublikasının Tovuz rayonunda anadan olub.

1979-cu ildə akademik İ.P.Pavlov adına 1-ci Leninqrad Tibb İnstitutunu müalicə həkimi ixtisası üzrə fərqlənmə diplomu bitirib. 1979-1980-ci illərdə A.Hüseynov Bryansk vilayət xəstəxanasında cərrahlıq üzrə interna keçib. İnternaturanı bitirdikdən sonra 1980-1983-cü illərdə Bryansk vilayət səhiyyə şöbəsinin Sevsk Mərkəzi Rayon Xəstəxanasında cərrahiyyə bölməsinin müdiri olub.

1983-1989-cu illərdə Tulanın 2 nömrəli TSH-də cərrah-həkim, 1989-1997-ci illərdə Tula Vilayət Onkologiya Dispanserində cərrah işləyib. 1990-cı ildə A.Hüseynov tibb elmləri namizədi, 1999-cu ildə isə tibb elmləri doktoru alimlik dərəcələri almaq üçün dissertasiyalarını müdafiə edib.

1997-ci ilin avqustundan indiyədək Tula Dövlət Universitetinin tibb fakültəsinin 1 nömrəli cərrahi xəstəliklər kafedrasının müdiridir. Yüksək kateqoriyalı həkim-cərrah ixtisasına malikdir.

2009-cu ildən A.Hüseynov RTEA-nın müxbir üzvü, 2010-cu ildən isə RTEA-nın həqiqi üzvüdür. 2010-cu ilin iyununda RF Prezidentinin fərmanı ilə A.Hüseynova “Rusiya Federasiyasının əməkdar həkimi” adı verilib.

A.Hüseynov kafedra müdiri işlədiyi dövr ərzində həkim kadrların hazırlanması işinə əhəmiyyətli töhfə verib, bütün növ təhsil məşğələlərini həyata keçirir, ümumi cərrahiyyə və cərrahi xəstəliklər üzrə mühazirələr oxuyur. Onkologiya və cərrahiyyə üzrə klinik internlərin, cərrahiyyə üzrə klinik ordinatorların, sertifikasiya siklində diplomdansonrakı təhsil proqramı üzrə cərrah-həkimlərin praktiki hazırlığı və öyrədilməsi məsələləri ilə aktiv məşğul olur.

A.Hüseynovun elmi işləri tibbi nəşrlərdə mütəmadi dərc olunur. O, cərrahiyyə və klinik tibb sahələrində 181 elmi əsərin, o cümlədən klinik cərrahiyyənin aktual məsələləri üzrə 5 monoqrafiyanın, 15 tədris və tədris-metodiki vəsaitin, praktiki həkimlər üçün 2 vəsaitin müəllifi və həmmüəllifidir.

A.Hüseynov müalicə işi ilə aktiv şəkildə məşğul olur: müntəzəm olaraq məsləhət üçün xəstələri qəbul edir və kafedranın klinik bazalarında müxtəlif diapazonlu cərrahiyyə əməliyyatları yerinə yetirir.

RF Təhsil Nazirliyi, Tula Vilayəti Səhiyyə Departamentinin medalları və Fəxri fərmanları, Teodor Bilrot adına Avropa Təbiət Elmləri Akademiyasının "Görkəmli elmi nailiyyətlərə və elmə verdiyi töhfəyə görə" nüfuzlu diplomu ilə təltif olunub.



## Hüseynov
## Çingiz Sahib oğlu

*Texnika elmləri doktoru, professor.*
*İ.M.Qubkin adına Rusiya Dövlət Neft və Qaz Universitetinin neft və qaz sənayesi qurğularının layihələndirilməsinin avtomatlaşdırılması kafedrasının professoru*

Hüseynov Çingiz Sahib oğlu 1932-ci il iyunun 23-də Bakıda anadan olub.

1957-ci ildə M.Əzizbəyov adına Azərbaycan Sənaye İnstitutunu (sonralar Azərbaycan Neft və Kimya İnstitutu, indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) "neft yataqlarının istismarı" ixtisası üzrə bitirib. 1957-1960-cı illərdə Sumqayıtda Elmi-Tədqiqat Neft Kimya Avtomat və Layihə İnstitutunda mühəndis işləyib. 1963-cü ildə İ.M.Qubkin adına Moskva Neft-Kimya və Qaz Sənayesi İnstitutunun aspiranturasına qəbul olunub, 1964-cü ildə isə "Mayenin magistral qaz kəmərlərinin işinin effektivliyinə təsiri" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib.

1963-1966-cı illərdə Ç.Hüseynov İrkutsk Politexnik İnstitutunda assistent, baş müəllim işləyib, dosentin səlahiyyətlərini icra edib. Ç.Hüseynov Moskvada olanda Qaz Sənayesi Nazirliyinə müraciət edərək onun üçün maraqlı olan praktik məsələlərlə məşğul olmaq istəyini bildirib. Onu Xarkov Elmi-Tədqiqat Qaz İnstitutuna göndəriblər.

1966-1979-cu illərdə Ç.Hüseynov Ukrayna Elmi-Tədqiqat Qaz İnstitutunda (Xarkov) laboratoriya müdiri, qaz tədarükü şöbəsinin müdiri işləyib. Xarkovda qaz kondensatı yataqlarında qaz və kondensatın mədən üsulu ilə işlənməsi, separasiya texnikasının təkmilləşdirilməsi, qaz və kondensatın nəqli məsələləri ilə məşğul olub. Ç.Hüseynov ölkədə ən böyük qaz separatorlarını yaradıb. Bunlar bir çox qaz yataqlarında, o cümlədən Qərbi Sibirdə tətbiq edilib. Qazın təmizlənməsi üçün ixtira etdiyi xüsusi filtr isə Ukraynada indiyədək istehsal olunur.

Ç.Hüseynov 1979-cu ildə Qaz Sənayesi Nazirliyinin qərarı ilə Moskvaya Dəniz Neft-Qaz Yataqlarının Mənimsənilməsi İnstitutuna elmi işlər üzrə direktor müavini və dəniz yataqlarının təchizi şöbəsinin müdiri vəzifəsinə göndərilib. Orada dəniz neft-qaz yataqlarının mənimsənilməsi, istismara hazırlanması və hasil edilən məhsulun nəqli sisteminin seçilməsi ilə məşğul olub.

1981-ci ildə Ç.Hüseynov "Qaz separasiyasının effektivliyi nəzəriyyəsi və yeni separasiya aparatlarının yaradılması" mövzusunda doktorluq dissertasiyası müdafiə

edib. 1997-ci ildən İ.M.Qubkin adına Rusiya Neft və Qaz Universitetinin neft və qaz sənayesi qurğularının layihələndirilməsinin avtomatlaşdırılması kafedrasının professorudur. "İxtisasa giriş", "Dəniz neft-qaz yataqlarının mənimsənilməsi" tədris fənlərindən mühazirələr oxuyur.

Ç.Hüseynov 300-dən çox işin, o cümlədən "Dəniz neft-qaz yataqlarının istismara hazırlanması" (2003) dərsliyinin, "Dəniz neft-qaz yataqlarının təchizatı üzrə layihələndiricilər üçün vəsait"in (2004), habelə "Dəniz neft sənayesi terminləri lüğəti"nin müəllifi (2005), 30-dan çox müəlliflik şəhadətnaməsi və patentinin sahibidir.

"Əmək igidliyinə görə" (1970) yubiley medalı ilə təltif edilib, qaz sənayesi əlaçısıdır (1972), İ.M.Qubkin (2004) və N.K.Baybakov (2006) adına mükafatların laureatıdır.



## Hüseynov
## Eldar Musa oğlu

*Texnika elmləri doktoru, professor.*
*Sankt-Peterburq Dövlət Meşə Təsərrüfatı Akademiyasının ağac tədarükü istehsal texnologiyaları kafedrasının professoru*

Hüseynov Eldar Musa oğlu 1949-cu il fevralın 24-də Azərbaycan Respublikası Tovuz rayonunun Qaraxanlı kəndində anadan olub.

1972-ci ildə Meşə Təsərrüfatı Akademiyasının (MTA) meşə mexanikası fakültəsini bitirib. 1973-cü ildən akademiyada işləyir. Bu müddətdə o, baş laborantdan professor vəzifəsinədək yüksəlib, texnika elmləri doktorudur.

E.Hüseynov tələbə olarkən görkəmli alim, SSRİ Dövlət mükafatı laureatı, dünyada ilk treyler traktorun yaradıcısı, texnika elmləri doktoru, professor, xüsusi meşə maşınlarının layihələndirilməsi kafedrasının müdiri S.F.Orlovla tanış olub. Onun təklifi əsasında yeni təkərli meşə traktorunun layihələndirilməsi ilə məşğul olub. E.Hüseynovun tələbə çertyojlarının bazası əsasında akademiyanın emalatxanasında ilk Rusiya meşə təsərrüfatı traktoru hazırlanıb. 9-cu semestrin sessiyasından sonra E.Hüseynovu Kirov zavoduna diplomqabağı təcrübəyə göndəriblər. Həmin vaxt zavodun konstruktor bürosunda K-703 meşə sənayesi traktorunun hazırlanmasına başlanılmışdı. E.Hüseynov bu traktorun texnoloji təchizatının çertyoj və texniki hesablamalarının hazırlanması ilə məşğul idi. Buna görə də onun diplom işi “K-703 traktorunun bazasında oxlu və qısqaclı təkərli meşə nəqliyyatının layihəsi” adlanıb.

1972-ci ilin mayında S.F.Orlov E.Hüseynovun çertyojları və hesablamaları bazasında xüsusi meşə maşınlarının layihələndirilməsi kafedrasında RSFSR meşə təsərrüfatı nazirinin müavini R.V.Bobrova məruzə edib. Kafedra kollektivinin nazir müavini ilə bu görüşünün nəticəsində seriyalı buraxılan sovet təkərli traktorlarının bazasında meşə sahəsi üçün energetik vasitələrin hazırlanması üzrə işlərin davam etdirilməsi haqqında qərar qəbul olunub.

1972-ci ildə E.Hüseynov diplom layihəsini “əla” qiymətlə müdafiə edib, MTA-da ağac tədarükünün mexanikləşdirilməsi problemləri laboratoriyasında baş laborant vəzifəsinə işə götürülüb. E.Hüseynov burada təkərli meşə təsərrüfatı traktorlarının dartıcı-qoşqu parametrlərinin eksperimental tədqiqatlarının keçirilməsinin metodik proqramını hazırlayıb. 1973-cü ilin martında istehsal şəraitində eksperimental tədqi-

qatlar keçirilib. Eksperimental tədqiqatların nəticələrinin təkmilləşdirilməsindən sonra traktorun konstruksiyasını tamamlayıblar. Tezliklə problem laboratoriyası MTA-nın eksperimental istehsal laboratoriyasında beş traktorun hazırlanmasını sifariş edib.

1973-cü ilin sonunda E.Hüseynovun işlədiyi problem laboratoriyasının yeni layihəsi ilə Latviya Elmi-Tədqiqat Meşə Təsərrüfatı Problemləri İnstitutunun (ETMTPİ) mütəxəssisləri maraqlanıblar. Latviya ETMTPİ-nin, demək olar ki, bütün rəhbərliyi yeni meşə təsərrüfatı maşınına baxmağa gəlib. Qonaqlar qarşısında traktorun ilk nümayişi yaxşı təəssürat yaradıb. Razılığa gəliblər ki, problem laboratoriyası onlara bir meşə təsərrüfatı traktoru, çertyoj kompleksi və digər texniki sənədləşdirməni verəcək, latviyalı mütəxəssislər isə öz növbəsində Riqalesmaş zavodunda traktorun seriyalı buraxılışını təmin edəcək. Belə də oldu. İki təşkilatın entuziast kollektivinin köməyi ilə ideyadan tətbiqə gedən yol əhəmiyyətli dərəcədə qısaldıldı.

Riqalesmaş zavodu Lipetsk Traktor Zavodunun T-40AM seriyalı kənd təsərrüfatı traktorunun bazasında T-40L traktorunu hazırladı. T-40L “çoker” (sürüşkən qarmaqlı) texnoloji avadanlıqla, yəni, sipər və bucurqadla buraxıldı. Traktorlardan biri Moskvada Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisində (XTNS) nümayiş etdirildi, E.Hüseynov isə müəlliflərdən biri kimi SSRİ XTNS-nin bürünc medalı ilə təltif olundu.

Paralel olaraq maşının yol maneələrini aşma qabiliyyəti, manevr qabiliyyəti, davamlılığı, etibarlılığı, təmirə yararlılığı, məhsuldarlığı istiqamətində elmi tədqiqatlar aparılıb. Maşının əsas hissə və elementlərinin, operator və torpağın dinamik yüklənməsinin tədqiqi daha çox zəhmət aparıb. Bu zaman eyni vaxtda istehsal şəraitində 32 parametr qeydiyyatdan keçib (8 parametr üzrə 4 osilloqram).

İlk dəfə meşə təsərrüfatı traktorunun zərbə yüklərinə yüklənməsi tədqiq edilib. Həmçinin bu sahədə ilk dəfə “maşın-əmək predmeti-təbii mühit” sisteminin ekoloji-səmərəli faydası elmi cəhətdən əsaslandırılıb və həyata keçirilib, bu zaman sistemin bütün elementlərinin stoxastik hadisələri nəzərə alınıb.

Latviya mütəxəssisləri ilə birgə iş təkcə elmi və istehsal proseslərinin həllinə yönəlməyib. Bu iş tədris prosesinin təkmilləşdirilməsi, dərslik və elmi-metodiki vəsaitlərin yaradılması, elmi-pedaqoji kadrların hazırlanması ilə bağlı idi. “Meşə təsərrüfatında xüsusi aktiv yarımqoşquların layihələndirilməsi və tətbiqi” adlı ilk birgə dərs vəsaiti 1979-cu ildə yazılıb. Müəllifləri S.F.Orlov, İ.K.İyevin, E.M.Hüseynov və başqaları olub.

1982-ci ilədək aparılmış tədqiqatların nəticələri E.Hüseynovun “Meşə təsərrüfatı traktorunun onun material həcminin azaldılması və meşəbərpa qırmanın səmərəsinin artırılması məqsədilə konstruksiyalarının hazırlanması və tədqiqi” mövzusunda namizədlik dissertasiyasında ümumiləşdirilib və 1983-cü ildə MTA-da müdafiə edilib.

Dissertasiyanın müdafiəsindən sonra E.Hüseynov MTA-nın ağac tədarükünün mexanikləşdirilməsi problem laboratoriyasının müdiri təyin edilib və 1988-ci ilədək orada çalışıb.

Laboratoriya Ümumrusiya Elmi-Tədqiqat Meşəçilik və Meşə Təsərrüfatının Mexanikləşdirilməsi İnstitutu, "Silava" QHT (Latviya), Elmi-Tədqiqat Traktor İnstitutu, Kareliya Elmi-Tədqiqat Meşə Sənayesi İnstitutu, Leninqrad Elmi-Tədqiqat Meşə Təsərrüfatı İnstitutu, Riqalesmaş Zavodu, Lipetsk Traktor Zavodu, Xarkov Traktor Samoxod Şassi Zavodu, Oneqa Traktor Zavodu, Minsk Traktor Zavodu, Vladimir Traktor Zavodu, Altay Traktor Zavodu ilə əməkdaşlıq edib.

Laboratoriya zavodlarla birlikdə traktor-sortimentovoz, sipər və bucurqadlı, hidromanipulyatorlu və qısqac konstruksiyalı, ağacların daşınması üçün dəst ağızlı, kuzovlu, kotanlı, ikioxlu qoşqulu traktorlar, habelə ağacların aşırılması, düyünlərin, budaqların kəsilməsi üçün maşınlar yaradıb.

E.Hüseynovun fəal iştirakı ilə hazırlanmış bütün meşə traktor və maşınları meşə maşınlarının unifikasiya edilmiş hissələri və detalları əsasında yaradılmışdı. Məqsəd meşə təsərrüfatını çətin meşə şəraitində (eyni zamanda, meşə mühiti və ekologiyanı qorumaq baxımından meşəçilik və ekoloji tələblərə maksimum cavab verən), istismarda etibarlı, manevrli, məhsuldar, sürətli maşınlarla təmin etmək idi.

1988-ci ilin oktyabrında E.Hüseynov aşağı keyfiyyətli oduncaqların istifadəsi üzrə iqtisadi problem laboratoriyasına keçirilib. Qarşıya "Leninqrad vilayəti şəraitində işləyən perspektivli meşəqıran texnikanın parametrlərinin ekoloji-iqtisadi əsaslandırılması. Növündən və qırılacaq meşə sahəsinin mənimsənilməsi dövründən asılı olaraq ağac kütləsinin əməliyyat itkisi normativlərinin hazırlanması" tapşırığı qoyulmuşdu.

Bu işə rəhbər və məsul E.Hüseynov təyin edildi. Bu cür çətin vəzifə yüksək səviyyədə həllini tapdı. İş başa çatdırıldıqdan sonra E.Hüseynova dosent vəzifəsi təklif olundu. 1991-ci ildən bu günədək E.Hüseynov Sankt-Peterburq Dövlət Meşə Təsərrüfatı Akademiyasının ağac tədarükü texnologiyaları kafedrasında işləyir.

2005-ci ildə Arxangelsk Dövlət Texniki Universitetində "Təkərli meşə təsərrüfatı maşınlarının dinamik yüklənməsini aşağı salmaqla onların işinin səmərəsini artırmaq" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 2008-ci ildə RF AAK ona professor elmi adını verib.

E.Hüseynov ağac tədarükü texnikasının hazırlanması və tətbiqi, ağac tədarükü müəssisələrinin layihələndirilməsi, texnoloji inkişafı, iqtisadiyyatı və menecmenti üzrə 3 monoqrafiyanın, 3 dərsliyin və 8 dərs vəsaitinin həmmüəllifidir. O, qeyd edilən elmi istiqamətlər üzrə 100-dən çox elmi və elmi-metodik əsərlər dərc etdirib. 14 müəlliflik şəhadətnaməsi var.



## Hüseynov
## İbrahim Səfər oğlu

*"Pritok" MMC-nin icraçı direktoru*

Hüseynov İbrahim Səfər oğlu 1953-cü il iyunun 22-də Azərbaycan Respublikasının Tovuz rayonunda anadan olub.

1975-ci ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunu (indiki Azərbaycan Texniki Universiteti) "körpülərin və tunellərin inşaat mühəndisi" ixtisası üzrə bitirib. Təhsilini başa çatdırdıqdan sonra "Mostotrest" ASC-nin filialı - "Mostootryad №22" Ryazan ərazi firmasına gənc mütəxəssis kimi işə göndərilib. O, ustadan tutmuş iş icraçısınadək müxtəlif vəzifələrdə işləyərək Rusiya ərazisində körpülərin tikintisində bilavasitə iştirak edib.

Əmək fəaliyyətinə 1975-ci ildə Mamadiş şəhərində (Tatarıstan) Vyatka çayı üzərində körpü tikintisində usta kimi başlayıb. 1978-ci ildə Kerd çayı üzərində körpü tikintisində işləyərək Moskva vilayətinin Boskresensk şəhərində avtomobil yolu ötürücüsünün bloklarının qəlibində körpülərin səki bloklarının hazırlanması üzrə öz təklifini reallaşdırıb. İ.Hüseynov 1982-ci ildə Kirov vilayəti Kirov şəhərinin Vyatka çayı üzərində körpü tikintisində D-XX blokunun şaquli əvəzinə üfüqi vəziyyətdə hazırlanması ideyasını reallaşdırıb. Ryazan vilayətinin Şilovo qəsəbəsində Tırnitsa çayı üzərində körpü tikintisində körpünün dəmir-beton "stəkanı"nın hazırlanmasının yeni texnologiyasından istifadə edib. 1983-cü ildə Ryazan vilayətinin Kasimov şəhərində İ.Hüseynov körpü bloklarının aşağı tavalarının hazırlanmasının qeyri-standart həllini, habelə blokun dəmir-beton tilinin ankerli boltların köməyi ilə yerdəyişmədən şaquli vəziyyətə qalxma vaxtı metal qəlibə bərkidilməsi həllini təklif edib.

1998-ci ildən İ.Hüseynov "Mostootryad №22" inşaat firmasında direktor müavini vəzifəsində işləyib. Onun bilavasitə iştirakı ilə firma Moskvada körpü-tunel tikintisində, habelə Moskva dairəvi avtomobil yolunun bərpasında fəal iştirak edib.

İ.Hüseynov 2000-ci ildən "Pritok" inşaat firmasında rəhbər vəzifələri tutub - əvvəlcə direktor müavini olub, indi isə icraçı direktor işləyir. MMC bu müddətdə Moskva Üçüncü Nəqliyyat Dairəsi obyektlərinin - Avtozavod küçəsində Üçüncü Nəqliyyat Dairəsi üzərindən estakadanın, Uqreş piyada körpüsünün, Velozavod ba-

zarı yaxınlığında estakadanın, Avtozavod küçəsi tərəfdən Trofimov küçəsində ikiyaruslu estakadanın tikintisində iştirak edib.

2001-2002-ci illərdə İ.Hüseynov tərəfindən Domodedovo aeroportunun 36-cı kilometrində, "Ural" M-5 avtomobil yolunun 78-ci kilometrində piyada körpüləri tikilib, Moskvada Teatr Meydanına qranit döşənilib, Setun üzərində Oçakov körpüsünün əsaslı təmiri, Yauzanın Serebryanik və Bernikov sahillərinin əsaslı təmiri, Yauza üzərində körpülərin bərpa və tikintisi, Lenin prospektinin "Dom obuvi" mağazası yanında piyada tunelinin əsaslı təmiri həyata keçirilib. "Sentralnaya Rossiya" Avtomobil Yolları Federal İdarəsi, Moskvada "Qormost"un qurğularının istismarı və təmiri üzrə müəssisələr və s. "Pritok" MMC-nin sifarişçisidir.

Rusiya Yol Agentliyi, Rusiya Federasiyası Dövlət Tikinti Komitəsi, Ryazan vilayəti administrasiyasının dövlət təsərrüfathesablı ekspert-lisenziya idarəsi tərəfindən verilmiş 6 lisenziya rəhbərliyin texniki potensialını, yaradıcı səviyyəsini və kollektivin imkanlarını təsdiqləyir.

Sonrakı illərdə firma tərəfindən Moskvada Lixoborka çayı üzərində iki piyada körpüsü tikilib, Şeremetyevo aeroportuna və Qorodnya körpüsünə gedən yolda Klyazma üzərində avtomobil yolları əsaslı təmir edilib.

"Tsaritsınskaya plotina" körpüsünün təmir-bərpa işləri başa çatdırılıb, "Kosmos" mehmanxanasına giriş pandusu təmir edilib, Xilaskar İsa Məbədi ərazisində Yakimanka sahilindən Bersenevədək piyada keçidi tikilib və istifadəyə verilib, sərnişinləri Şeremetyevo-2 aeroportuna aparmaq üçün 1260 metr uzunluğunda dəmir yolu estakadası, Leninqrad və Qolovin şosesinin kəsişməsində yol ötürücüsü tikilib. Vnukovo-2 aerovağzal kompleksinin sərnişin-yük terminalının tikintisi və Vnukovo-3 anqarında kran təchizatının montaj işləri aparılıb.

İ.Hüseynovun əməyi də layiqincə qiymətləndirilib. O, dəfələrlə Moskva vilayəti Luxovits bələdiyyə başçısının fərmanları, 1988-ci ildə "Za preobrazovaniye Neçernozemya RSFSR" medalı, 2006-cı ildə Ryazan Vilayət Dumasının fəxri fərmanı, 2008-ci ildə Moskva vilayəti qubernatorunun "Za trudı i userdiye" nişanı ilə təltif edilib.



## Hüseynov
## Şərif Elbəyi oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*Latviya Riyaziyyat Elmləri və İnformasiya Texnologiyaları İnstitutunun baş elmi işçisi.*
*Liyepaya Universitetinin professoru*

Hüseynov Şərif Elbəyi oğlu 1967-ci il yanvarın 13-də Ermənistan Respublikası Yexeqnadzor rayonunun Güluduz kəndində anadan olub.

1983-cü ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) tətbiqi riyaziyyat fakültəsinə qəbul edilib. 2-ci kursu bitirdikdən sonra Sovet Ordusuna çağırılıb. 3-cü kursdan sonra təhsilini M.V.Lomonosov adına MDU-nun hesablama riyaziyyatı və kibernetika fakültəsində XX əsrin görkəmli riyaziyyatçılarından biri - SSRİ EA-nın akademiki A.N.Tixonovun rəhbərlik etdiyi riyazi fizika kafedrasında davam etdirib.

1991-ci ildə Ş.Hüseynovun SSRİ EA-nın akademiki A.N.Tixonov və fakültənin professoru V.İ.Dmitriyevin elmi rəhbərliyi ilə yazdığı “Birinci növ Fredholm inteqral tənliklərinin həlli üçün bir tənzimləyici metodun ayırdetmə qabiliyyətinin və həllin müfəssəlliyinin tədqiqi” diplom işinin fakültənin diplom işlərinin müdafiəsi Komissiyası tərəfindən “Vestnik MQU. Seriya 15: Vıçislitelnaya matematika i kibernetika” elmi jurnalında dərc edilməsi tövsiyə olunub.

Ş.Hüseynov 1991-ci ildə MDU-nu müvəffəqiyyətlə bitirdikdən sonra fakültənin həmin kafedrasının əyani aspiranturasına qəbul edilib. Hələ aspiranturaya qəbul edilən zaman onun “Maqnit-tellurik zondlaşdırma tərs məsələlərinin həlli metodlarının işlənməsi” adlı gələcək namizədlik dissertasiyasının 35-40 faizi hazır idi. O, dissertasiyasını aspiranturada oxuduğu ilk 9 ayda tamamlayıb. Dissertasiya 1995-ci ildə müdafiə edilib.

1995-1997-ci illərdə Ş.Hüseynov öz fakültəsində assistent işləyib, riyazi fizikanın tərs və qeyri-korrekt məsələlərində, habelə xüsusi törəmələrin qeyri-xətti tənliklər sahəsində elmi tədqiqatlarını davam etdirib. 1997-1999-cu illərdə Moskva vilayətinin Dubna şəhərində Atom Tədqiqatları Birləşmiş İnstitutunda əvvəlcə stajor-tədqiqatçı, sonra kiçik elmi işçi işləyib, riyazi fizikanın düz və tərs qeyri-xətti məsələlərinin həlli üçün dayanıqlı analitik-ədədi metodların hazırlanması ilə məşğul olub.

2001-ci ildən indiyədək Ş.Hüseynov Riqada yaşayır, elm və təhsil sahəsində çalışmaqda davam edir, Latviya Riyaziyyat və İnformasiya Texnologiyaları İnstitutunun baş elmi işçisi və Latviyanın Liyepaya Universitetinin professorudur.

2003-cü ildə Ş.Hüseynov Latviya Dövlət Universitetinin fizika-riyaziyyat fakültəsinin doktoranturasına qəbul olunub və 2006-cı ildə “Riyazi fizikanın bəzi xətti və qeyri-xətti tərs məsələlərinin həlli yolları” mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. O, riyazi fizikanın tərs və qeyri-korrekt məsələləri sahəsində, xüsusi törəmələrdə xətti və qeyri-xətti tənliklər sahəsində, qeyri-stasionar proseslər və mürəkkəb obyektlərin, o cümlədən iqtisadi proseslərin, ekoloji proseslərin və obyektlərin, poladın səmərəli bərkimə proseslərinin, nəqliyyat axını və logistikanın və s. riyazi modelləşdirilməsi sahəsində, geofizika və seysmologiyada, rəqs və tədqiqat əməliyyatları nəzəriyyəsində, çoxkriterili optimallaşdırma sahəsində, istismar prosesində mürəkkəb qarşılıqlı əlaqəli texniki sistemlərin diaqnostikası üzrə mütəxəssisdir.

Ş.Hüseynov nüfuzlu beynəlxalq jurnallarda dərc edilmiş 261 elmi məqalənin, beynəlxalq konqres və konfransların toplularında 73 məqalənin, 4 monoqrafiyanın, onlardan biri (“Regularizing algorithms for diagnosing: Applied to gas turbine engines in operation”, tələbəsi S.A.Andreyevin həmmüəllifliyi ilə) 2013-cü ildə Almaniyada nüfuzlu “Lambert Academic Publishing” nəşriyyatında çap edilib, ali məktəblər üçün 5 dərsliyin müəllifi və həmmüəllifidir.

Ş.Hüseynovun rəhbərliyi altında 6 namizədlik və 2 doktorluq dissertasiyası, habelə çoxsaylı magistr və bakalavr işləri müdafiə edilib. Onlardan 1 doktorluq və 3 namizədlik dissertasiyası beynəlxalq müsabiqələrdə iştirak edib və 1-ci yeri tutub. Hazırda Ş.Hüseynov 2 namizədlik və 1 doktorluq dissertasiyasına rəhbərlik edir.

2001-ci ildən Ş.Hüseynov maliyyələşdirilməsinin summar həcmi 8 milyon avrodan çox olan 6 beynəlxalq elmi layihənin rəhbəri, Latviyanın 4 elmi layihəsinin rəhbəri, 3 beynəlxalq və Latviyanın 10 elmi layihələrində baş icraçı olub və olmaqdadır. Bütün bu beynəlxalq layihələr Avropa Tədqiqat Şurasının təşkil etdiyi Avropa açıq müsabiqələrində qazanılıb. Müsabiqələrdə, həmçinin Avropa İttifaqı ölkələri, Oksford və Kembric universitetlərinin, Cenevrə Universitetinin, Sorbonna Universitetinin, Amsterdam Universitetinin və s. dünya şöhrətli ali məktəblərin təqdim etdikləri layihələr iştirak edib. Yuxarıda sadalanan Latviya layihələri də Latviya Elm Şurasının təşkil etdiyi açıq müsabiqələrdə qazanılıb.

Ş.Hüseynov 15 beynəlxalq jurnalın redaksiya kollegiyasına daxildir, Latviyanın Liyepaya Universiteti tərəfindən nəşr edilən “Methods and Applications of Mathe-

matics" beynəlxalq jurnalının baş redaktorudur, 11 beynəlxalq təşkilat və cəmiyyətin ("American Mathematical Society", "European Mathematical Society", "Society for Industrial and Applied Mathematics", "International Society of Difference Equations", "IAENG Society of Operations Research", "Heat Treating Society", "American Society for Metals" və s.) və Latviyanın 2 elmi cəmiyyətinin - "Latvian Mathematical Society" və "Latvian Operation Research Society"nin üzvüdür.

Ş.Hüseynov 50-dən çox konfrans və konqresə elmi və ya təşkilat komitəsinin üzvü olub, beynəlxalq konfranslarda xüsusi bölmələrin dəfələrlə təşkilatçısı olub, 12 beynəlxalq konfrans və konqresə xüsusi məruzəçi kimi dəvət edilib.

Onun elmi nailiyyətləri 2010-cu ildə Amerikanın məşhur "Marquis" nəşriyyatının "Who's Who in the World" ensiklopedik nəşrində qeyd edilib. Ş.Hüseynov 2011-ci ildə Latviya Respublikası Təhsil Nazirliyinin "Elmə sanballı töhfəsinə görə" mükafatının laureatı olub.



## Hüseynzadə Namiq Hüseynağa oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor. Rusiya Elmlər Akademiyasının A.M.Proxorov adına Ümumi Fizika İnstitutunun Elmi-Təhsil Mərkəzinin rəhbəri*

Hüseynzadə Namiq Hüseynağa oğlu 1963-cü il dekabrın 9-da Bakıda anadan olub.

1987-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin fizika fakültəsini bitirib. Universiteti bitirdikdən sonra Nəsirəddin Tusi adına Şamaxı Astrofizika Rəsədxanasının nəzəriyyə şöbəsində kiçik elmi işçi vəzifəsində çalışıb. 1989-cu ildə SSRİ Elmlər Akademiyasının Ümumi Fizika İnstitutunda (Moskva) təcrübə keçib. Tədqiqat tematikası plazma-dəstə qeyri-sabitliyi olub. Müəllimlərinin, görkəmli alimlər A.A.Ruxadze və A.M.İqnatovun təkidi ilə N.Hüseynzadə Elmlər Akademiyasının A.M.Proxorov adına Ümumi Fizika İnstitutunun (ÜFİ) aspiranturasında təhsilini davam etdirib. Silindrik metal dalğaötürəndə diokotron qeyri-sabitliyin inkişafı sahəsində tədqiqatın nəticələrini N.Hüseynzadə 1993-cü ildə namizədlik dissertasiyasında ümumiləşdirib.

1995-ci ildən N.Hüseynzadə Rusiya Elmlər Akademiyasının A.M.Proxorov adına Ümumi Fizika İnstitutunun nəzəriyyə şöbəsində işləyir, 2008-ci ildən isə ÜFİ-nin Elmi-Təhsil Mərkəzinə rəhbərlik edir.

Hələ 1990-cı illərin sonunda Hüseynzadə güclü skorreliasiya strukturları ilə (tələlərdə ion kristallar, kolloid kristallar və plazma-toz kristalları) maraqlanıb. Bu işlər onun 2006-cı ildə müdafiə etdiyi doktorluq dissertasiyasının əsasını təşkil edib.

Plazma kristalları müxtəlif mühitlərdə yarana bilər. Aşağı temperaturlu plazmada (toz plazma) aerozol hissəciklərin, sulu məhlullardakı (xüsusilə bioloji məhlullarda) kolloid hissəciklərin, habelə elektromaqnit tələlərdə ion ansamblların əmələ gətirdikləri strukturlar daha çox tədqiq edilib. Belə sistemlər həm fundamental, həm də tətbiqi baxımdan maraq doğurur. Onların köməyi ilə müxtəlif təzahürləri, məsələn, ayrı-ayrı hissəciklərin hərəkətini qeyd edərək, kinetik səviyyədə faza keçidlərini tədqiq etmək olar. Müzakirə olunan sistemlərin əlavələri fövqəladə dərəcədə genişdir. Məhz plazma kristalları mikroelektron texnologiyalarda sıçrayış üçün əsas ola bilər, onlar yeni materialların sintezləşdirməyə, yeni tezlik standartları hazırlamağa imkan

verə bilər, onların köməyi ilə antimaddənin saxlanması üçün cihaz düzəltmək, habelə törəmə səbəbləri zülalların kolloid faza keçidi ilə bağlı olan bəzi xəstəlikləri tədqiq etmək olar.

N.Hüseynzadə plazma kristallarının rəqslər və sabitlik nəzəriyyəsinə böyük töhfə verib. O, müxtəlif çəkili toz törəmə konfiqurasiyalarının nəzəri tədqiqatları ilə məşğul olan ilk alimlərdən biridir. O, iki ölçülü simmetrik plazma-toz klasterlər üçün kiçik rəqslərin nəzəriyyəsini yaradan ilk alimdir, helikoidal kristalların formalaşması şəraiti, sabitliyi və kiçik rəqslərini tədqiq və təhlil edib.

N.Hüseynzadə həmçinin kiçik simmetrik üç ölçülü klasterlərin rəqslərinin və sabitliyinin öyrənilməsinin tədqiqi üçün də çox iş görüb. Nöqtəvi qruplar nəzəriyyəsini tətbiq edərək, o, ixtiyari qarşılıqlı təsir potensialı üçün üç ölçülü klasterlərin analitik rəqs nəzəriyyəsini inkişaf etdirib. Həmçinin klasterlərin rəqslərinin zərbə həyəcanı zamanı ayrı-ayrı hissəciklərin koordinatlarına əsasən potensialın bərpası metodikasını təklif edib.

Onun bu mövzulara həsr edilən bir sıra elmi əsərləri Rusiya Elmlər Akademiyası ÜFİ-nin elmi iş müsabiqəsində qalib gəlib və N.Hüseynzadə fəxri fərmanla təltif edilib.

Son illər alim digər problemlərə – anomal keçirmə prosesləri, habelə avtomobil nəqliyyatı və sosiafizika kimi motivasiyalı sistemlərə maraq göstərir.

N.Hüseynzadə pedaqoji fəaliyyətə də böyük diqqət verir. O, Moskva Texnologiya Universitetində kafedra müdirinin müavini, M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin fizika fakültəsinin professoru vəzifələrini tutur. Onun rəhbərliyi ilə 3 namizədlik dissertasiyası və 50-dən çox diplom işi hazırlanıb. N.Hüseynzadənin elmi-pedaqoji fəaliyyətinin nəticələri 6 dərs vəsaitində əksini tapıb.



## Hüseynzadə
## Sabir Məcid oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin ali həndəsə və topologiya kafedrasının professoru*

Hüseynzadə Sabir Məcid oğlu 1950-ci il iyulun 29-da Moskvada, tanınmış alim-hidromexanik Hüseynzadə Məcid Əziz oğlunun ailəsində anadan olub.

1966-cı ildə 2 saylı ixtisaslaşdırılmış riyaziyyat məktəbini bitirdikdən sonra S.Hüseynzadə Məktəblilərin Beynəlxalq Riyaziyyat Olimpiadasının qalibi kimi M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin (MDU) mexanika və riyaziyyat fakültəsinə imtahansız qəbul edilib.

MDU-nun mexanika-riyaziyyat fakültəsini və elə orada aspiranturanı bitirdikdən sonra S.Hüseynzadə 1975-ci ildə fizika-riyaziyyat elmləri namizədi, 1991-ci ildə isə fizika-riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün doktorluq dissertasiyası (hər ikisi M.V.Lomonosov adına MDU-da) müdafiə edib. 1974-1996-cı illərdə S.Hüseynzadə həmçinin tətbiqi riyazi məsələlər ilə məşğul olaraq, MDU-nun coğrafiya fakültəsində işləyib.

1996-cı ildən S.Hüseynzadə MDU-nun mexanika-riyaziyyat fakültəsinin ali həndəsə və topologiya kafedrasının professorudur. 1991-ci ildən həmçinin Müstəqil Moskva Universitetində professor vəzifəsində çalışır.

S.Hüseynzadə cəbri topologiya, cəbri həndəsə və xüsusiyyətlər nəzəriyyəsi sahələrində işləyir. O, təxminən 175 elmi əsərin (təxminən 115-i sırf riyaziyyat və təxminən 60-ı tətbiqi riyaziyyat üzrə), bir neçə kitabın, o cümlədən V.İ.Arnold və A.Varçenko ilə birgə 2 cildlik "Diferensiallaşdırılmış təsvirlərin xüsusiyyətləri" monoqrafiyasının müəlliflərindən biridir.

S.Hüseynzadə 8 riyazi jurnalın redaksiya heyətinin, habelə "Moscow Mathematical Journal"ın baş redaktorudur. O, bir sıra beynəlxalq konfranslarda dəvətli məruzəçi, 2012-ci ildə Krakovda keçirilən 6-cı Avropa Riyaziyyat Konqresinin Proqram Komitəsi də daxil olmaqla, proqram komitələrinin üzvü olub.



## Xəlilov
## Firudin Xəlil oğlu

*Texnika elmləri doktoru, professor. Sankt-Peterburq Dövlət Politexnik Universitetinin elektromexanika fakültəsinin yüksək gərginliklər texnikası kafedrasının professoru*

Xəlilov Firudin Xəlil oğlu 1939-cu il sentyabrın 7-də İrəvan şəhərində anadan olub.

1961-ci ildə o, M.Əzizbəyov adına Azərbaycan Neft və Kimya İnstitutunun (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) energetika fakültəsini "sənaye müəssisələri və qurğularının elektrikləşdirilməsi" ixtisası üzrə bitirib. 1964-cü ildən Sankt-Peterburqda yaşayır.

Əmək karyerasına F.Xəlilov 1961-ci ildə Azərbaycan Elmlər Akademiyasının Energetika İnstitutunda kiçik elmi işçi kimi başlayıb və orada 1964-cü ilə qədər işləyib. Sonra o, Kalinin adına Leninqrad Politexnik İnstitutunun aspiranturasında oxuyub. 1969-cu ildə aspiranturanı bitirdikdən sonra o, elektrik mexanikası fakültəsinin yüksək gərginlikli texnika kafedrasında işləyib. 1968-ci ildə namizədlik, 1990-cı ildə doktorluq dissertasiyası müdafiə edib.

1966-1991-ci illərdə F.Xəlilov kafedrada kiçik elmi işçi, baş elmi işçi, kafedra müdirinin müavini, dosent vəzifələrini tutub. 1991-ci ildən kafedranın professorudur.

O, elektrik sistemləri və sənaye obyektlərində 0,22-750 kilovolt şəbəkələrdə yaranan şimşəyin təsirinin və daxili ifrat gərginliklərin istifadəsi ilə bağlı tədqiqatlarda iştirak edib. Yüksək, həddən artıq yüksək və ultra-yüksək gərginlikli elektrik şəbəkələrində meydana gələn gərginliklərin normal istismarı şəraitində keçid proseslərinin tədqiqat metodikasının yaradıcılarından biridir. O, "yüksək gərginliklərin texnikası" ixtisası üzrə təhsil alan tələbələr üçün birbaşa riyazi təhsil planının yaradılmasında iştirak edib.

F.Xəlilov Sankt-Peterburq Dövlət Politexnik Universitetinin iqtisadi tədris komissiyasının üzvüdür. 700-dən çox əsərin, o cümlədən 60-dan çox monoqrafiyanın, 20-dən çox dərslik və dərs vəsaitinin, 15 ixtiranın müəllifidir.

1994-cü ildən F.Xəlilov Beynəlxalq Energetika Akademiyasının, Elektrotexnika Elmləri Akademiyasının, Sankt-Peterburq Dövlət Politexnik Universitetinin iki dissertasiya şurasının, "RusQidro" ASC-nin elektrik avadanlığı üzrə seksiyasının, "KABEL-news" jurnalının redaksiya heyətinin üzvüdür. 20 elmlər namizədi hazırlayıb.



## İbrahimov
## Fikrət Rəhim oğlu
*"Donelektromontaj" QSC-nin baş direktoru*

İbrahimov Fikrət Rəhim oğlu 1962-ci il iyulun 10-da Azərbaycan Respublikasının Mirbəşir (indiki Tərtər) rayonunda anadan olub.

1988-ci ildə Rostov Kənd Təsərrüfatı Maşınqayırma İnstitutunu bitirib. Kafedrada qalıb elmi fəaliyyətini və müəllimlik işini davam etdirmək təklifindən imtina edən F.İbrahimov "Selxozenerqo" trestinin kollektivində əmək fəaliyyətinə başlayıb. Dörd il ərzində bütün Rostov vilayətini və Kalmıkiyanı qarış-qarış gəzib dolaşıb, kənd yerlərində elektrik yarımstansiyaları tikintisində avadanlığın quraşdırılması ilə məşğul olaraq, son dərəcə qiymətli əməli iş təcrübəsi qazanıb.

Sonradan "Selxozenerqo" tresti "Rostovaqropromteploenerqo" Səhmdar Cəmiyyətinə çevrildi və F.İbrahimov burada aparıcı mühəndis vəzifəsində işləməyə başladı. Bu cəmiyyətin səhmdarlarından biri öz kommersiya firmasını yaratdı və F.İbrahimovu öz müavini vəzifəsinə dəvət etdi. 1993-cü ilin yanvarında "Donelektromontaj" QSC-nin kollektivi ümumi yığıncaqda F.İbrahimovu yekdilliklə baş direktor seçdi.

Yeni işə sözün hərfi mənasında "quru yerdə" – hətta minimum zəruri istehsal bazası olmayan, kirayə götürülmüş 60 kvadratmetrlik yarımzirzəmi sahədə başlamalı oldu. Amma insanların işləmək arzusu, sifarişçilər arasında daha əvvəl qazanılmış nüfuz, əməkdaşların öz rəhbərinə inamı çox güclü idi.

1994-cü ildə Xoprıdakı iri R-20 yarımstansiyasının işini tamamilə dayandırmadan həmin yarımstansiyadakı 74 köhnə ayırıcını yeniləri ilə əvəz etmək mümkün olandan sonra firmanın imici xüsusilə möhkəmləndi. Bu unikal texniki əməliyyat müvəffəqiyyətlə yerinə yetiriləndən sonra sonuncu skeptiklər də kollektivə inandılar.

F.İbrahimovun və onun həmfikirlərinin birlikdə yaratdığı müəssisə daha adlısanlı firmaların bəzilərini sıxışdıraraq bu gün öz biznes sektorunda görkəmli yer tutur. "Donelektromontaj" QSC 10 kilovoltdan yuxarı gərginlikli elektrik yarımstansiyalarında işləri praktiki olaraq eksklüziv şəkildə həyata keçirir. Buna görə ən müasir R-3A yarımstansiyasının tikintisi və montajı üçün elan olunmuş tenderdə məhz bu müəssisə qalib gəldi və baş podratçı kimi, qarşıya qoyulmuş vəzifəni yük-

sək səviyyədə yerinə yetirdi. TP R-3A yarımstansiyasının texniki xarakteristikaları onun unikallığına dəlalət edir. Bu yarımstansiya transformatorlarla, mikroprosessor aparatları, elektrik açarları, ayırıcılar və son nəslə aid başqa yüksəktexnologiyalı avadanlıqla təchiz edilib.

Bu güclü mühəndis qurğusunun arxitektura həlləri, tikintinin keyfiyyəti, onun bütün sanitariya, yanğından mühafizə normalarına və başqa normativlərə uyğunluğu barədə də yüksək tələblər təqdim edilmişdi, axı bu elektrik yarımstansiyası bir milyon əhalisi olan şəhərin mərkəzində yerləşir.

Sonra Rostov-Don şəhərində, Don çayı sahilində yerləşən R-22 yarımstansiyası inşa edildi. Bu unikal qurğunun layihəsi "Yujenerqosetproyekt" institutu tərəfindən bütün texnoloji və ekoloji təhlükəsizlik tələbləri nəzərə alınmaqla hazırlanmışdı.

"Donelektromontaj" QSC yaxın vaxtlara qədər özünün ən güclü sifarişçi olan "Rostovenerqo" ASC-dən əlavə, bir çox kommersiya strukturları və özəl şirkətlərlə də fəal əməkdaşlıq edir. Təkcə son illərdə "Yuq Rusi", "Baltika-Don", "Atlantis-Pak", "Koka-kola", "Tavr" korporasiyalarının obyektlərinin, həmçinin Zernoqradda hərbi qulluqçular və onların ailələri üçün şəhərciyin, Labinskdə (Krasnodar vilayəti) və Morozovskda yağ-ekstraksiya zavodlarının, Taqanroqda iri nasos stansiyasının, Salsk şəhərində və Artyom qəsəbəsində xəstəxana komplekslərinin, Krasnodar və Stavropol diyarlarında, Şimali Osetiyada və Ryazanda bir sıra başqa ciddi obyektlərin elektrik təchizatı işləri yerinə yetirilib.

"Donelektromontaj" QSC hazırda Rusiyanın ən müxtəlif regionlarında layihə-axtarış, elektrik təchizatı şəbəkələrinin tikintisi, tikinti-quraşdırma, işəsalma-tənzimləmə və sair işləri həyata keçirir.

Müəssisənin baş direktoru F.İbrahimov Yanacaq və Energetika Nazirliyinin fəxri energetikidir, ona "Donun ən yaxşı meneceri" adı verilib. F.İbrahimov "Rusiyanın professionalı" medalı ilə təltif olunub, onun xidmətləri çoxsaylı fərmanlar və təşəkkür məktubları ilə qeyd edilib.



## İmamov
## Rafiq Məmməd oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*A.V.Şubnikov adına Kristalloqrafiya İnstitutunun*
*kristal layların difraktometriyası laboratoriyasının müdiri*

İmamov Rafiq Məmməd oğlu 1938-ci il yanvarın 7-də Bakıda anadan olub.

1961-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika fakültəsini maddənin quruluşu kafedrası üzrə bitirib. Fakültənin elmi şurası ona SSRİ EA Kristalloqrafiya İnstitutunun aspiranturasına daxil olmaq üçün zəmanət verib. 1962-ci ildə həmin institutun aspiranturasına – hələ tələbə olarkən sovet elektronoqrafiya məktəbinin banisi Z.Q.Pinskerin rəhbərliyi altında diplom işi yazdığı elektronoqrafiya laboratoriyasına qəbul edilib. Bu dövrdə R.İmamov elektronoqrafik struktur analiz metodu ilə yarımkeçirici birləşmələrin nazik təbəqələrinin quruluşunun tədqiqatına başlayıb. Yerinə yetirilmiş işlərin nəticələrinə əsasən 1965-ci ildə namizədlik dissertasiyası müdafiə edib və struktur elektronoqrafiya sahəsində tədqiqatlarını davam etdirmək üçün SSRİ EA Kristalloqrafiya İnstitutunda saxlanılıb.

1965-1978-ci ildə R.İmamov Z.Q.Pinsker, S.A.Semiletov və elektronoqrafiya laboratoriyasının başqa əməkdaşları ilə birlikdə elektronların difraksiyasının tədqiqatı və çoxsaylı ikikomponentli və üçkomponentli yarımkeçirici birləşmələrin nazik təbəqələrinin atom strukturunun müəyyən edilməsi üzrə əhəmiyyətli silsilə araşdırmalar aparıb.

R.İmamovun bir neçə model struktur üzərində apardığı tədqiqatlar elektronoqrafik struktur analizi (ESA) üçün bir sıra mühüm məsələlərə əhəmiyyətli dərəcədə aydınlıq gətirib. Polikristal təbəqələrdə elektronların səpələnməsinin xarakterinin tədqiqatı vaxtı alınmış nəticələr tamamilə və kifayət qədər inandırıcı şəkildə sübut etdi ki, kinematik yaxınlaşma ESA praktikasında mürəkkəblik dərəcəsi müxtəlif olan kristalların atom strukturunun şifrini açmaq üçün tətbiq edilə bilər. R.İmamov alınmış struktur nəticələri kristal-kimyəvi baxımdan ümumiləşdirib, çoxsaylı yarımkeçirici fazaların kristallik strukturlarının quruluş qanunauyğunluqlarını üzə çıxarıb, kompozisiya politipizmi kimi spesifik hadisənin mövcud olmasını müəyyən edib. Bu nəticələr R.İmamovun 1978-ci ildə müdafiə etdiyi “Elektronların difraksiyası və

onun yarımkeçiricilərin strukturunun şifrini açılmasına tətbiqi" mövzusunda doktorluq dissertasiyasının predmetini təşkil etdi.

1976-cı ildən başlayaraq, R.İmamov kristalların ən nazik qatlarının struktur mükəmməlliyinin tədqiqatı üçün rentgen şüalarının difraksiyasının və ikinci şüaların (fotoelektronlar, flüoresent kvantlar və s.) çıxışının qeyri-standart sxemlərinə əsaslanan yeni metodlar yaradılması ilə müntəzəm məşğul olur. R.İmamovun müəllimi Z.Q.Pinskerin mükəmməl monokristallarda rentgen şüalarının səpələməsinin dinamik nəzəriyyəsi sahəsində aktiv fəaliyyəti bu işdə ona xeyli kömək edirdi. Mikroelektronika problemləri üçün bu tədqiqatların böyük əhəmiyyəti nəzərə alınaraq, 1980-ci ildə SSRİ EA Rəyasət Heyətinin və SSRİ Elektron Sənayesi Nazirliyinin birgə əmr-sərəncamı ilə SSRİ EA Kristalloqrafiya İnstitutunda R.İmamovun rəhbərlik etdiyi tədqiqat qrupu bazasında kristal təbəqələrin difraktometriyası laboratoriyası yaradıldı. Qısa vaxt ərzində kollektiv yaradıldı, rentgen şüalarının difraksiyasının fizikası sahəsində fundamental tədqiqatlar aparıldı, nazik layların və ayırıcı sərhədlərin öyrənilməsində durğun rentgen dalğaları (DRD) metodunun imkanları aşkar edildi.

Bu tədqiqatların nəticələri əsasında R.İmamov və laboratoriyanın digər əməkdaşları nano-ölçülü kristal qatların strukturunun tədqiqatı üçün yeni metodlar və bu metodların reallaşdırılması üçün müvafiq aparatlar yaradıblar.

R.İmamovun A.M.Afanasyev və P.A.Aleksandrovla birgə yazdığı və 1989-cu ildə nəşr edilən "Submikron layların rentgen-difraksion diaqnostikası" adlı monoqrafiya məhz belə hərtərəfli fəaliyyətin nəticəsi oldu.

R.İmamovun elmi maraqları çox geniş və müxtəlifdir. O, akademik K.A.Valiyevlə birlikdə sərt şüa optikası üçün səth və dərinlik üzrə aperiodik çoxqatlı rentgen güzgüləri, yüksək dərəcədə hamar səthlərin nahamarlıqlarına və faza kontrastlarına nəzarət aparatları yaradıb.

Son zamanlar R.İmamov, A.M.Afanasyev və iki laboratoriyanın əməkdaşları rentgen eksperimental məlumatların işlənməsi probleminə yeni yanaşmaları inkişaf etdirirlər. Həmin tədqiqatlar diaqnostikanın bu və ya digər metodunun əhəmiyyəti haqqında təsəvvürləri kökündən dəyişdirir. Nəticədə yarım əsrdən artıq müddətdə yaxşı məlum olan ikikristallı rentgen difraktometriyası və reflektometriya kompleks halda nanostrukturların və nanokompozitlərin diaqnostikasının güclü metoduna çevrilir.

R.İmamovun rəhbərliyi altında çoxsaylı diplom işləri yerinə yetirilib, 18 namizədlik və 4 doktorluq dissertasiyası müdafiə edilib. 1987-ci ildə R.İmamova "kristalloqrafiya və kristallar fizikası" ixtisası üzrə professor elmi adı verilib. Rusiyanın bir çox şəhərlərindən və xarici ölkələrdən, o cümlədən Azərbaycandan (AMEA-nın

Fizika İnstitutundan və AMEA-nın Fotoelektronika İnstitutundan) onun laboratoriyasında təcrübə keçmək, birgə işlər aparmaq və məsləhətlər almaq üçün bu instituta gəlirlər. Elmi fəaliyyətlə məşğul olduğu illər ərzində R.İmamovun 300-dən çox məqaləsi dərc edilib.

R.İmamov 22 ixtiranın həmmüəllifidir. Onun əsərləri Rusiyada və başqa ölkələrdə geniş məlumdur və submikron layların quruluşunun rentgen-difraksiya tədqiqatı sahəsində eksperimentlərin qoyuluşunda bu işlərdən istifadə olunur. R.İmamov dəfələrlə kristalloqrafiya, mikroelektronika və nanoelektronika üzrə Rusiya və beynəlxalq miqyaslı konfranslarda məruzələrlə çıxış edib.

R.İmamov elmlər doktoru alimlik dərəcəsi verilməsi üzrə iki ixtisaslaşdırılmış şuranın üzvüdür, uzun illər Rusiya EA yanında "Səthin fizikası" problemi üzrə Elmi Şuranın üzvü olub, Rusiya EA-nın Y.S.Fyodorov adına mükafatının verilməsi üzrə Komissiyanın elmi katibidir.

R.İmamovun elmi fəaliyyətdə xidmətlərinə görə 2005-ci ildə ona "Rusiya Federasiyasının Əməkdar Elm Xadimi" fəxri adı verilib. 2009-cu ildə Rusiya Elmlər Akademiyası Rəyasət Heyətinin qərarı ilə durğun rentgen dalğaları metodunun hazırlanması və kristalların strukturunun tədqiqatı üçün bu metoddan istifadə edilməsi üzrə silsilə işlərinə görə R.İmamova Y.S.Fyodorov adına mükafat təqdim edilib.



## İsayev
## Eyvaz İsa oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*Moskva Polad və Ərintilər İnstitutunun nəzəri fizika kafedrasının professoru*

İsayev Eyvaz İsa oğlu 1959-cu il martın 3-də Azərbaycan Respublikasının Qazax rayonunun Aslanbəyli kəndində anadan olub.

1976-cı ildə orta məktəbi bitirib. Uşaqlıqdan riyaziyyat sahəsində qeyri-adi qabiliyyətə malik idi. "Azərbaycan Gəncləri" qəzetinin keçirdiyi riyaziyyat müsabiqələrində iştirak edib. Moskvada nəşr olunan "Matematika v şkole" jurnalının səhifələrində onun soyadı dəfələrlə qeyd edilib.

1976-cı ildə E.İsayev Moskva Polad və Ərintilər İnstitutunun (MPƏİ) fiziki kimya fakültəsinə daxil olur. İnstitutda oxuyarkən fizikaya böyük maraq göstərir. Ali məktəbi bitirəndə onda belə bir qəti inam yaranır ki, əgər metalların elektron strukturu məlumdursa, onların bütün xüsusiyyətlərini izah etmək olar.

E.İsayev hələ tələbəlik illərində MPƏİ-nin və M.V.Lomonosov adına MDU-nun fizika fakültəsinin axşam fizika-riyaziyyat məktəbində məşğələlər aparırdı. Nəzəri fizikaya meyli, tədqiqat işinə marağı 1985-ci ildə onu yenidən MPƏİ-yə qaytardı, amma bu dəfə müasir dövrün görkəmli fiziki, hazırda Nobel mükafatı laureatı (2003-cü il), akademik A.A.Abrikosovun müdir olduğu nəzəri fizika kafedrasının aspirantı kimi.

E.İsayevin elmi maraq dairəsi olduqca genişdir: yarımkeçiricilər fizikası, spintronika üçün maqnit yarımkeçiriciləri, kvazikristallar, istiliyə davamlı ərintilər, kristal qəfəsinin dinamikası. Adsorbsiya olunmuş metallarla yarımkeçirici kristalların səthinin elektron strukturunun tədqiqatına həsr edilmiş elmi işlərin yekunu kimi 1995-ci ildə E.İsayev "Adsorbsiya olunmuş metallarla kovalent kristalların səthlərinin elektron quruluşu" mövzusunda dissertasiya müdafiə edir və ona fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi verilir.

E.İsayev 1995-1997-ci illərdə MPƏİ-nin nəzəri fizika kafedrasının elmi işçisi, 1997-2002-ci illərdə həmin kafedranın doktorantı, 2002-2004-cü illərdə böyük elmi işçisi olub, 2004-cü ildən bu kafedranın aparıcı elmi işçisidir.

E.İsayevin işlərinin əksəriyyəti kondensasiya edilmiş vəziyyət fizikasının ən müasir metodlarının köməyi ilə yerinə yetirilib və ən əhəmiyyətlisi, bu işlərdə materiallarda tədqiq edilən hadisələrin fiziki əsasları aydınlaşdırılır.

E.İsayev göstərib ki, Al-Si və Al-Ge ərintilərində ifrat keçiricilik temperaturunun yüksəlməsi Fermi səthinin sahələrinin nestinqi ilə bağlıdır, bu isə fonon spektrində müəyyən xüsusiyyətlər yaranması və beləliklə, elektron-fonon qarşılıqlı təsiri sabitinin artması ilə nəticələnir. FeH sisteminin tədqiqatlarının əhəmiyyəti ondan ibarətdir ki, Yer qabığındakı şəraitə (təqribən 100 QPa) yaxın şəraitdə bu birləşmənin mövcud ola bilməsi göstərilib, FeH-in nəzəri və eksperimental strukturu arasında fərqlər aradan qaldırılıb, göstərilib ki, məhz hidrogen atomlarının rəqsi hərəkəti eksperimental yolla aşkar edilmiş ikiqat heksaqonal (altıbucaqlı) strukturun sabitləşməsində mühüm rol oynayır.

E.İsayevin fəaliyyətinin daha bir mühüm istiqaməti 1100°C-dən yuxarı temperaturda işləmək üçün yararlı olan istiliyə davamlı ərintilərin fiziki və mexaniki xüsusiyyətlərinin tədqiqatıdır (bu, təyyarə mühərriklərində detalların istehsalı üçün istifadə edilən nikel-alüminium ərintilərinin işçi temperaturlarının yuxarı həddidir). E.İsayev istiliyə davamlı materiallar kimi, öz mexaniki xarakteristikalarına görə nikel-alüminium ərintilərini əhəmiyyətli dərəcədə üstələyən Pt-Sc və Ru-Al ərintilərindən istifadə olunmasını və rutenium əsasında ərintilərin xüsusi çəkisinin azaldılması üçün nikellə aşqar vurulmasını təklif edib. Alınmış ərintilərin elastiklik xarakteristikaları əsasında göstərilib ki, nikellə aşqar vurmanın hüdudu elektron topologiya keçidləri və Fermi səviyyəsində valentlik elektronlarının sayının azalması ilə bağlıdır. Keçid metallarının karbidlərinin və nitridlərinin böyük qrupunun kristal qəfəsi dinamikasının tədqiqatı əsasında Mendeleyevin dövri cədvəlində metalların nitridlərinin və karbidlərinin strukturlarının yaranması qanunauyğunluğu müəyyən edilib. Bu qanunauyğunluq elmi cəmiyyət tərəfindən artıq tanınıb və elmi nəşrlərdə istifadə olunur.

Materialların yeni bir sinfi – klassik kristalloqrafiyada qadağan edilmiş simmetriyanın oxlarına, məsələn, beşinci tərtib simmetriya oxuna malik olan kvazikristallar ilə bağlı tədqiqatlar E.İsayevin elmi fəaliyyətində ayrıca yer tutur.

E.İsayev "Proceedings of the National Academy of Science of the USA", "Physical Review Letters", "Applied Physics Letters", "Journal of Applied Physics", "Fizika tvyordoqo tela" və başqa nüfuzlu beynəlxalq nəşrlərdə və Rusiya jurnallarında dərc olunmuş 60-a yaxın elmi işin müəllifidir. Bu işlərin bir qismi E.İsayevin fizika-

riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün təqdim etdiyi "Mürəkkəb simmetriyalı və pozulmuş uzaq nizamlı sistemlərin elektron və fonon induksiyalanmaları və maqnit xüsusiyyətləri" mövzusunda dissertasiyanın əsasını təşkil edib.

E.İsayev doktorluq dissertasiyası müdafiə edəndən sonra MPƏİ-nin nəzəri fizika kafedrasının professoru kimi pedaqoji işlə məşğul olub:18 tələbənin diplom işinə rəhbərlik edib, onun 4 aspirantı dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi olub. Diplom işlərinə yaradıcı şəkildə rəhbərlik etdiyi üçün MPƏİ-nin diplomu ilə təltif olunub.

Bundan başqa E.İsayev RFAF-ın (Rusiya Fundamental Araşdırmalar Fondu) 3 qrantının elmi rəhbəri, RFAF-ın Rusiya Fundamental Araşdırmalar Fondunun 6 qrantının əsas icraçısı olub, bir sıra birgə qrantların, o cümlədən INTAS (Avropa Birliyi), NWO (Niderland Elmi Araşdırmalara Dəstək Fondu), KVA (İsveç Kral Elmlər Akademiyası) qrantlarının icrasında iştirak edib.

E.İsayev Uppsala və Linçepinq (İsveç), Naymeqen (Niderland), Qamburq (Almaniya) universitetlərini təmsil edən elmi qruplarla, həmçinin Kral Texnologiya İnstitutu (Stokholm, İsveç) ilə səmərəli əməkdaşlıq edir. 2007-ci ildən Linçepinq Universitetinin dəvət edilmiş elmi işçisidir.

E.İsayev bərk cisimlərin fiziki xassələrinin prinsipial hesablamaları sahəsində ekspertdir. Quantum ESPRESSO proqramları kompleksini yaradanlarından biridir. O, məsələn, metal sistemlərdə Fermi səthinin hesablanması üçün proqramın, həmçinin mütləq sıfır temperaturda deyil, daha yüksək temperaturlarda bərk cisimlərin termodinamik xassələrinin hesablaması üçün QHA proqramının müəllifidir. Bu şərt modelləşdirmə prinsiplərini eksperimental şəraitə yaxınlaşdırır. Bu proqramlardan bütün dünyada bir sıra universitetlərin tədqiqat qruplarında istifadə olunur.

E.İsayev – bütün dünyada fizikaya aid tanınmış elmi nəşrlər olan "Physical Review Letters", "Physical Review B", "Philosophical Magazine B", "Physica B" kimi jurnalların rəyçisidir.



## İsgəndərov
## Bəhram Hüseynağa oğlu

*Tibb elmləri doktoru, professor.*
*Penza Həkimləri Təkmilləşdirmə İnstitutunun terapiya, kardiologiya və funksional diaqnostika kafedrasının professoru*

İsgəndərov Bəhram Hüseynağa oğlu 1957-ci il dekabrın 5-də Azərbaycan Respublikasının Quba rayonunun 1-ci Nügədi kəndində anadan olub.

1975-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) müalicə-profilaktika fakültəsinə daxil olub və 1981-ci ildə bu ali məktəbi fərqlənmə diplomu ilə bitirib. Həmin il Azərbaycan KP MK-nın birinci katibi H.Ə.Əliyevin təşəbbüsü ilə təşkil edilmiş, N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun məzunlarından ibarət böyük dəstənin tərkibində RSFSR-də işə göndərilib.

B.İsgəndərov həkim-kardioloq kimi tibbi fəaliyyətinə 1981-ci ildə Q.A.Zaxaryin adına Penza mərkəzi şəhər xəstəxanasında başlayıb. 1982-1989-cu illərdə o, Penza vilayətində ilk dəfə yaradılmış təxirəsalınmaz kardioloji yardım şöbəsinə – kardioreanimasiya şöbəsinə rəhbərlik edib.

1989-cu ilin yanvar ayından bu günə qədər B.İsgəndərov Penza Həkimləri Təkmilləşdirmə İnstitutunun 1 №-li terapiya kafedrasında, 2008-ci ildən – həmin institutun terapiya, kardiologiya və funksional diaqnostika kafedrasında müəllim işləyir.

B.İsgəndərov 1990-cı ildə Sverdlovskda "Ürək ritmi süni idarə olunan xəstələrin qan dövranının vəziyyəti və onların reabilitasiyası" mövzusunda namizədlik dissertasiyası, 1998-ci ildə isə Moskvada "Ürək ritmi süni idarə olunan xəstələrin dispanser müşahidəsi və onların müalicəvi reabilitasiyası" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

2002-ci ildə B.İsgəndərova professor elmi adı verilib. O, kardiologiya üzrə ali ixtisas kateqoriyasına malikdir və 1996-cı ildən Penza şəhərindəki Q.A.Zaxaryin adına Təcili Tibbi Yardım Klinik Xəstəxanasının kardioloji xidmətinin kuratorudur.

Professor B.İsgəndərov səmərəli elmi-tədqiqat işi ilə məşğul olur. Onun rəhbərliyi altında 8 namizədlik dissertasiyası müdafiə olunub. Onun elmi araşdırmalarının nəticələri Penza vilayətinin və Rusiyanın başqa vilayətlərinin müalicə-profilaktika müəssisələrinin işində tətbiq edilib.

B.İsgəndərov 300-dən çox elmi işin müəllifidir. Onun çoxillik elmi araşdırmalarının nəticələri "Daimi elektrokardiostimulyasiyanın fəsadları: diaqnostika, müalicə və profilaktika" (2000); "Elektrokardiostimulyasiyanın terapevtik aspektləri" (2002), "Arterial hipertoniya və ürəyin aritmiyaları" (2007), "Arterial hipertoniyanın müalicəsində kalsiumun antaqonistləri" (2008) və "Arterial hipertoniya zamanı ürəyin elektrik qeyri-sabitliyi" (2009) adlı 5 monoqrafiyada ümumiləşdirilib.

B.İsgəndərov Penza Dövlət Universiteti yanında "kardiologiya" ixtisası üzrə doktorluq dissertasiyalarının müdafiəsi üzrə dissertasiya şurasının üzvü, Penza Həkimləri Təkmilləşdirmə İnstitutunun elmi şurasının və həmin institutun terapevtik fakültəsinin problem komissiyasının üzvü, həmçinin Penza Həkimləri Təkmilləşdirmə İnstitutu yanında etika komitəsinin sədridir. 2004-cü ildə RF Təhsil və Elm Nazirliyinin qərarına əsasən, B.İsgəndərov "kardiologiya" ixtisası üzrə aspirantların rəhbəri kimi təsdiq edilib.

2009-cu ildən B.İsgəndərov – kardioloqların Ümumrusiya Elmi Cəmiyyətinin mətbu orqanı olan "Rossiyskiy kardioloqiçeskiy jurnal"ın redaksiya şurasının üzvüdür. 2006-cı ildə o, BMT yanında UNESCO-nun assosiasiyalı orqanı olan Beynəlxalq Ekologiya və Həyat Fəaliyyətinin Təhlükəsizliyi Elmləri Akademiyasının (BEHFTEA) akademiki seçilib. 2004-cü ildə B.İsgəndərovun adı Amerikadakı "Marques" nəşriyyatında çapdan çıxmış "Kim kimdir" ("Who`s Who") Ensiklopediyasına daxil edilib. Bu Ensiklopediyada, o cümlədən, tibb və səhiyyə sahəsində aparıcı mütəxəssislər barədə məlumatlar ("Who`s Who in Medicine and Healthcare Marques") əksini tapıb.

B.İsgəndərov Rusiya Kardiosomatik Reabilitasiya və İkincili Profilaktika Cəmiyyətinin Penza bölməsinin sədri və Kardioloqların Penza elmi cəmiyyəti sədrinin müavinidir. 2007-ci ildə Penzada onun məsul katib kimi fəal iştirakı ilə Penza vilayəti hökumətinin və kardioloqların Ümumrusiya Elmi Cəmiyyətinin himayəsi altında təşkil edilmiş I Volqayanı kardioloji qurultayı keçirilib.

2007-ci ildə B.İsgəndərov RF Səhiyyə və Sosial İnkişaf Nazirliyinin Fəxri Fərmanı ilə təltif edilib, 2009-cu ildə ona "Səhiyyə Əlaçısı" fəxri adı verilib.

Hazırda B.İsgəndərov Penza Həkimləri Təkmilləşdirmə İnstitutunun terapiya, kardiologiya və funksional diaqnostika kafedrasının professoru vəzifəsində çalışır.



## İsmayılov
## Elxan Eyyub oğlu

*Pedaqoji elmlər doktoru, professor.*
*Baltik Dövlət Balıqçılıq Donanması Akademiyasının xarici dillər kafedrasının müdiri*

İsmayılov Elxan Eyyub oğlu 1953-cü ildə Bakıda anadan olub.

1981-ci ildə Azərbaycan Pedaqoji Dillər İnstitutunun ingilis dili fakültəsini bitirib. 1985-ci ildə M.Torez adına Moskva Dövlət Pedaqoji Xarici Dillər İnstitutunda, 1989-cu ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetində xarici dillərin intensiv öyrənilməsi mərkəzində, 1994-cü ildə Kembric Dil Mərkəzində (Böyük Britaniya) ixtisasartırma kursları keçib.

1982-1984-cü illərdə E.İsmayılov Almaniya Demokratik Respublikasında hərbi tərcüməçi kimi xidmət edib. 1984-cü ildən Azərbaycan Pedaqoji Dillər İnstitutunun Suqqestopediya Mərkəzində ingilis dili müəllimi işləyib, orada yaşlılara xarici (milli) dillərin sürətlə öyrədilməsi məsələlərini tədqiq edib. Bununla əlaqədar, Fransada xarici dillərin intensiv öyrədilməsi mərkəzində (Paris), Redinq Universitetində (Böyük Britaniya), M.V.Lomonosov adına MDU-da (Moskva) yaşlılara xarici dillərin sürətlə öyrədilməsi metodlarına həsr olunmuş beynəlxalq konfranslarda iştirak edib.

1992-1994-cü illərdə E.İsmayılov "British Petroleum – STATOIL Alliance" Britaniya-Norveç neft şirkətinin Bakıdakı nümayəndəliyində tərcüməçi işləyib, 1995-ci ildə Bakıda AIOC Beynəlxalq Neft Konsorsiumu (Azərbaycan Beynəlxalq Əməliyyat Şirkəti – ABƏŞ) yaradılandan sonra bu konsorsiumun prezidentinin şəxsi tərcüməçisi və köməkçisi vəzifəsinə təyin edilib. Həmin illərdə o, həm də Azərbaycan Milli Məclisinin (parlamentinin) beynəlxalq münasibətlər şöbəsinin məsləhətçisi olub. İki dəfə (1994-cü ildə Vyanada, 1995-ci ildə Ottavada) Azərbaycan parlamentinin nümayəndə heyətinin tərkibində ATƏT-in illik assambleyasında iştirak edib. 1995-1996-cı illərdə Türkiyənin "Turkish Petroleum" neft şirkətinin baş ofisində (Ankara) beynəlxalq layihələr bölməsində tərcüməçi işləyib.

1996-cı ildə E.İsmayılov ailəsi ilə birlikdə Kalininqrada köçüb və Baltik Dövlət Balıqçılıq Donanması Akademiyasında ingilis dili müəllimi vəzifəsində işə düzəlib.

E.İsmayılovun elmi maraqları iki istiqamətdə cəmləşib – mütəxəssislərə xarici dillərin öyrədilməsinin intensiv metodlarının işlənib hazırlanması və bütövlükdə

müxtəlif ölkələrin təhsil sistemlərinin müqayisəli təhlili, o cümlədən xarici dillərin öyrədilməsinin didaktik sistemlərinin işlənib hazırlanması. Bu tədqiqatları reallaşdırmaq üçün E.İsmayılov Almaniya, İsveç, İngiltərə, Polşa, Macarıstan, İran, Türkiyə və digər ölkələrin təhsil müəssisələrində xarici pedaqoji təcrübəni öyrənib.

E.İsmayılov xarici dillərin sürətlə öyrədilməsi metodlarına dair ilk bitkin tədqiqat işini Moskva Dövlət Pedaqoji Xarici Dillər İnstitutunda aparıb. Baltik Dövlət Balıqçılıq Donanması Akademiyasında "Lisey - ali məktəb kompleksində dənizçilik üzrə ali texniki təhsilli mütəxəssislər hazırlanmasının sistemliyinin artırılması problemi" mövzusu üzrə kompleks elmi-tədqiqat işində iştirak edib.

1998-ci ildə E.İsmayılov "Rusdilli mühitdə mütəxəssislərə milli dilin intensiv öyrədilməsi prosesinin pedaqoji şərtləri" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. İngilis dili kafedrası üzrə dosentdir.

E.İsmayılov İsveçin və Rusiyanın orta peşə təhsili sistemlərinin müqayisəli-pedaqoji tədqiqatını (doktorluq dissertasiyası çərçivəsində) tamamlamaq üçün ali riyaziyyat və peşə pedaqogikası kafedrasına böyük elmi işçi vəzifəsinə keçirilib. Dissertasiya üzərində işlədiyi dövrdə o, dəvət edilmiş tədqiqatçı kimi dəfələrlə İsveçdə olub, bu ölkədəki müxtəlif orta və ali təhsil müəssisələrində ümumi təhsilin və peşə təhsilinin təşkili xüsusiyyətlərini araşdırıb.

E.İsmayılovun bir sıra mühüm işləri Rusiyada, İsveçdə, Polşada, Böyük Britaniyada dərc edilib. O, Rusiyada, İsveçdə, Polşada, Macarıstanda keçirilən müxtəlif pedaqoji konfranslarda fəal iştirak edib, Kalmar Universitetinin Pedaqogika İnstitutunun, Çapmen adına gimnaziyanın (Karlskruna) və Staqnelius adına gimnaziyanın (Kalmar), Vekşyö şəhəri Universitetinin (İsveç), Kalininqrad Texniki Kollecinin və Kalininqrad Ticarət-İqtisadi Kollecinin, Kalininqrad Dəniz Liseyinin müəllimləri qarşısında mühazirələrlə çıxış edib, Pedaqogika İnstitutunun və Qdansk Universitetinin (Polşa) Skandinaviya dilləri bölməsinin tələbələri və müəllimləri üçün seminarlar təşkil edib.

E.İsmayılovun 20 illik elmi-pedaqoji stajı var. Bu müddətin təxminən 15 ilini müxtəlif ölkələrin milli təhsil sistemlərinin müqayisəli-pedaqoji təhlili problemi üzərində işə sərf edib. Tədqiqatın tamamlanması mərhələsində pedaqoji sistemlərin müqayisəli təhlili üzrə Rusiya, İsveç, Polşa, Böyük Britaniyanın alim və müəllimlərinin iştirak etdiyi genişmiqyaslı beynəlxalq eksperimentin təşkilatçısı və rəhbəri olub.

2004-cü ildə E.E.İsmayılov "İsveçin və Rusiyanın orta peşə təhsili sistemlərinin müqayisəli-pedaqoji təhlili" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Həmin ilin aprel ayından Baltik Dövlət Balıqçılıq Donanması Akademiyasının professoru və xarici dillər kafedrasının müdiridir.



## İsmayılzadə
## Reyman Sadıq oğlu

*Tibb elmləri doktoru.*
*Belarus Respublikası Səhiyyə Nazirliyinin Respublika Uşaq Onkologiya, Hematologiya və İmmunologiya Elmi-Praktiki Mərkəzinin onkologiya şöbəsinin müdiri*

İsmayılzadə Reyman Sadıq oğlu 1955-ci il sentyabrın 26-da Gürcüstan Respublikasının Marneuli rayonunun Kiraç-Muqanlo kəndində anadan olub.

1972-ci ildə Gürcüstanda orta məktəbi bitirib və N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) müalicə fakültəsinə daxil olub. 1978-ci ildə həmin ali məktəbi fərqlənmə diplomu ilə bitirib. İnstitutu bitirəndən sonra 1978-1979-cu illərdə Qomel vilayət xəstəxanasında (Belarus) cərrahiyyə üzrə internatura keçib. 1979-1982-ci illərdə Qomel vilayət onkoloji dispanserində cərrah-onkoloq vəzifəsində çalışıb. 1981-ci ildə N.N.Aleksandrov adına Elmi-Tədqiqat Onkologiya və Tibbi Radiologiya İnstitutunda (ETOTRİ, Minsk) onkologiya üzrə təkmilləşmə kursu keçib, sonra orada işə dəvət edilib. 1983-1991-ci illərdə N.N.Aleksandrov adına ETOTRİ-nin elm şöbəsində, hipertermiya və şişin kompleks terapiyası laboratoriyasında işləyib (1984-1990-cı illərdə kiçik elmi işçi, 1990-1991-ci illərdə böyük elmi işçi vəzifəsində).

1989-cu ildə R.İsmayılzadə Ukrayna EA R.Y.Kavetski adına Onkologiya Problemləri İnstitutunun (Kiyev) qapalı elmi şurasında "Yumşaq toxumaların yerli yayılmış sarkomalarının kompleks müalicəsində termokimyəvi radioterapiya" mövzusunda dissertasiya müdafiə edərək "onkologiya" ixtisası üzrə tibb elmləri namizədi alimlik dərəcəsi alıb.

1991-1997-ci illərdə, Belarus Respublikası Uşaq Onkologiya, Hematologiya və İmmunologiya Elmi-Praktiki Mərkəzi (RUOHİEPM) açılana qədər, R.İsmayılzadə N.N.Aleksandrov adına ETOTRİ-nin uşaq onkologiya şöbəsinin müdiri və Belarus Respublikası Səhiyyə Nazirliyinin ştatdankənar baş uşaq onkoloqu vəzifəsində işləyib. 1997-ci ildən RUOHİEPM-in onkologiya şöbəsinin müdiridir.

1991-ci ildə R.İsmayılzadə Ümumittifaq Onkoloji Elmi Mərkəzin (ÜİOEM, Moskva) Uşaq Onkologiyası İnstitutunda, 1992-ci ildə – Lübek Universitetinin klinikasında (Almaniya), 1994-1995-ci illərdə – Kral VII Edvard adına Uşaq xəstəxanasında (Birminhem, İngiltərə) uşaq onkologiyası üzrə təcrübə keçib.

1996-cı ildə R.İsmayılzadəyə ali ixtisaslı onkoloq-cərrah həkim dərəcəsi, 2005-ci ildə dosent elmi adı verilib. Elə həmin il R.İsmayılzadə uşaq onkologiyası sahəsində çoxillik qüsursuz elmi-praktiki fəaliyyətinə görə "Belarus Respublikasının Səhiyyə Əlaçısı" nişanı ilə təltif olunub.

R.İsmayılzadə RUOHİEPM-in Qomel şəhəri üzrə idarəsinin elmi şurasının üzvüdür, Belarus Respublikası Diplomdansonrakı Tibbi Təhsil Akademiyasının uşaq onkologiyası və hematologiya kafedrasında elmi-pedaqoji fəaliyyətlə məşğul olur.

2008-ci ildə R.İsmayılzadə "onkologiya" ixtisası üzrə tibb elmləri doktoru alimlik dərəcəsi almaq üçün "Uşaqlarda bədxassəli şişlərin ağırlaşmış və refrakter formalarının kompleks müalicəsində idarə olunan ümumi hipertermiya" mövzusunda dissertasiya müdafiə edib. R.İsmayılzadəyə tibb elmləri doktoru diplomu təntənəli surətdə, şəxsən Belarus Prezidenti A.Q.Lukaşenko tərəfindən təqdim edilib.

R.İsmayılzadə bədxassəli şişlərin ağırlaşmış və refrakter formalarından əziyyət çəkən uşaqların müalicəsinin orijinal və yüksək effektivliyə malik metodlarını (ümumi hipertermiya, sitokinlər və LAK-terapiyası) işləyib hazırlayıb və bu müalicə metodlarını eksperimental və klinik şəraitdə əsaslandırıb. O, ümumi hipertermiya seansları keçirilərkən limfositlərin apoptotik şəkildə məhv olması fenomenini müəyyən edib. Bu mühüm fakt ümumi hipertermiyanın insanın immun sisteminə təsiri haqqında formalaşmış təsəvvürü kökündən dəyişdirib.

R.İsmayılzadə 160-dan çox elmi işin, 2 monoqrafiyanın müəllifi və həmmüəllifidir. O, xərçəngin müalicəsi üsullarına görə 3 patent alıb. Ümumdünya Uşaq Onkoloqları Assosiasiyasının üzvü (SIOP, 1993), Avropa Hipertermik Onkologiya Assosiasiyasının üzvü (ESHO, 2006), həmçinin Böyük Britaniyada uşaq xərçənginin öyrənilməsi üzrə tədqiqat qrupunun müxbir üzvüdür (UKCCSG, 1998).

R.İsmayılzadə başqa ölkələrdə də tanınır. O, müxtəlif illərdə dünyanın bir sıra ölkələrində, o cümlədən Almaniya, Çexiya, İtaliya, Portuqaliya, Gürcüstan və başqa dövlətlərdə keçirilən iri beynəlxalq forumlarda, seminar, konfrans və simpoziumlarda şifahi məruzələrlə iştirak edib.



## Kərimov
## Kərim Əli oğlu

*(1917-2004)*
*General-leytenant*
*Pilotlu Kosmik uçuşlar üzrə Dövlət Komissiyasının sabiq sədri*

Kərimov Kərim Əli oğlu 1917-ci il noyabrın 14-də Bakıda anadan olub.

Onun Azərbaycan Sənaye İnstitutunu bitirməsi Böyük Vətən müharibəsinin başlaması ilə eyni vaxta düşüb, K.Kərimovu Səmərqəndə evakuasiya edilən Artilleriya Akademiyasına göndəriblər. 1943-cü ilin payızında, o, "minaatan istehsalı üzrə sex" mövzusunda diplom işi müdafiə edib və Silahların Dövlət Qəbulu Baş İdarəsində xidmətə göndərilib, Moskva zavod qruplarında sənayedən "Katyuşa" tipli qvardiya minaatan qurğuları və onlar üçün mərmilərin qəbulu ilə məşğul olub. Bu işə görə 1945-ci ildə K.Kərimov "Qırmızı Ulduz" ordeni ilə təltif olunub.

Müharibədən sonra K.Kərimov Müdafiə Nazirliyinin aparatında iyirmi il xidmət edib. 1946-cı ildə o, raket texnologiyası üzrə bir çox ekspertlər kimi Nordhausenə (Almaniya) göndərilib, orada "Fau-2" ballistik raketinin "qalıqları" ilə tanış olub.

K.Kərimov "Molniya-1", "Meteor" və "Zenit" aparatlarının sifarişçisi olan idarəyə rəhbərlik edib. Məhz "Zenit" kosmik raket kompleksinin istismara verilməsinə görə "Lenin" mükafatına layiq görülüb. "Don" radioölçmə sisteminin tətbiqinə görə K.Kərimov 1950-ci ildə Stalin mükafatı alıb.

1965-ci ildə o, yeni yaradılan Ümumi Maşınqayırma Nazirliyinə keçirilib, orada kosmik raket tematikası üzrə işlərin təşkili ilə birbaşa məşğul olan 3-cü şöbəyə rəhbərlik edib. 1966-cı ildə bu vəzifədə olarkən, o, Pilotlu Uçuşlar üzrə Dövlət Komissiyasının sədri təyin olunub. Müxtəlif vaxtlarda V.P.Mişin, V.P.Qluşko, Y.P.Semyonov onun müavinləri olub.

1967-ci ilin oktyabrında iki pilotsuz kosmik aparatın ("Kosmos-186" və "Kosmos-188") orbitdə uğurlu birləşməsinə görə K.Kərimova general-leytenant rütbəsi verilib.

1975-ci ildə K.Kərimov "Soyuz-Apollon" Sovet-Amerika birgə uçuşunun hazırlanmasına kuratorluq edib.

Pilotlu Uçuşlar üzrə Dövlət Komissiyasına 25 il rəhbərlik etmə kimi məsul iş dövründə K.Kərimov dəfələrlə mürəkkəb vəziyyətlərdən çıxmalı, qəzaların səbəblərini araşdırmalı, məsuliyyətli, bəzən də riskli qərarlar qəbul etməli olub. Axı risk

olmadan kosmos fəth edilə bilməz. K.Kərimov bütün bunlardan keçib. "Soyuz" uçmağı öyrənib və 1979-cu ildə K.Kərimov SSRİ Dövlət Mükafatına layiq görülüb.

1974-cü ildə İdarəolunan uçuşlar üzrə Dövlət Komissiyasının sədri vəzifəsində qalaraq K.Kərimov Mərkəzi Elmi-Tədqiqat Maşınqayırma İnstitutunun direktor müavini vəzifəsinə keçirilib. 1987-ci ildə "Mir" Orbital Kompleksinin buraxılışı və istismarı ilə bağlı işə görə K.Kərimov Sosialist Əməyi Qəhrəmanı adına layiq görülüb və "Lenin" ordeni ilə təltif edilib. Daha bir "Lenin" ordenini K.Kərimov kosmosa ilk pilotlu uçuşun hazırlanmasında iştirakına görə alıb. Bundan əlavə, o, iki "Qırmızı Əmək Bayrağı" ordeni və bir çox medallarla, o cümlədən "Döyüş xidmətlərinə görə" və "1941-1945-ci illər Böyük Vətən müharibəsində Almaniya üzərində Qələbəyə görə" və digər medallarla təltif edilib.

Bu gözəl insanın həyatı uzun illər gizli qalıb. O, kosmik gəmilərin ekipajlarını şəxsən özü yola salıb. Kosmodromda məhz ona uçuşa hazırlıq barədə və endikdən sonra tapşırığın yerinə yetirilməsi barədə məruzə edilirdi. Lakin telereportajlarda K.Kərimovu yalnız arxadan göstərirdilər, adı KİV-lərdə çəkilmir və məxfi saxlanılırdı. Pilotlu Uçuşlar üzrə Dövlət Komissiyası sədrinin şəxsiyyəti yalnız 1987-ci ilin yayında, SSRİ-də yenidənqurma və aşkarlıq başlayanda "Pravda" və "Sovetskaya Rusiya" qəzetlərindən məlum oldu.

1991-ci ildə, 74 yaşında o, təqaüdə çıxır, lakin kosmonavtika ilə əlaqələri kəsməyir, Uçuşları İdarəetmə Mərkəzində məsləhətçi işləyir. Əməliyyatçılar əvvəlki kimi ona məruzə edirdilər və o, hər şeyi sistemləşdirirdi, məsləhət almaq üçün yanına gələnlərə həmişə açıq olurdu.

2001-ci ildə Rusiya Federasiyasının Prezidenti Vladimir Putinin Fərmanı ilə rus kosmonavtikası və raketqayırma sənayesinin təşəkkülünə və inkişafına verdiyi böyük töhfəyə görə K.Kərimov IV dərəcəli "Vətən qarşısında xidmətlərə görə" ordeni ilə mükafatlandırılıb.

K.Kərimov 1995-ci ildə Bakıdakı "Azərbaycan" Nəşriyyatında rus dilində nəşr edilən avtobioqrafik "Doroqa v kosmos" (Zapiski predsedatelya Qosudarstvennoy komisii) kitabının müəllifidir. O, Azərbaycan Milli Elmlər Akademiyasının fəxri üzvü seçilib.

Moskvadakı Azərbaycan etnomədəni komponentli 157 saylı məktəb (indiki 1583 saylı gimnaziya) onun adını daşıyır. 2007-ci ildə Azərbaycanda K.Kərimova həsr olunan poçt markası buraxılıb.

Sovet və Rusiya kosmonavtikasının əfsanəsi olan K.Kərimov 2003-cü ildə vəfat edib.



## Kərimov
## Qasım Məmməd oğlu

*Tarix elmləri doktoru, professor.*
*Rusiya Federasiyasının Prezidenti yanında Dövlət Qulluğu Akademiyasının dinşünaslıq kafedrasının professoru*

Kərimov Qasım Məmməd oğlu 1930-cu il mayın 10-da Azərbaycan Respublikasının Kirovabad (indiki Gəncə) şəhərində anadan olub.

Orta məktəbi bitirib, 1948-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinə (indiki Bakı Dövlət Universiteti) daxil olub. Hələ yeniyetmə vaxtında Şərq ölkələrinin tarixinə və mədəniyyətinə böyük maraq göstərib. Atası oğlunun təkidli xahişlərini nəzərə alıb ona ərəb dilinin əsaslarını öyrədib. Bunun nəticəsində gənc tələbə universitetin iki fakültəsini seçib: günün birinci yarısında filologiya (ərəb, fars və ingilis dillərini öyrənib), axşamlar isə şərqşünaslıq fakültəsinin məşğələlərinə gedib.

Xarici dillərə, hər şeydən əvvəl ərəb və fars dillərinə maraq az qala Q.Kərimovun peşə taleyində xəyalına gətirmədiyi dönüş nöqtəsi olacaqdı: hələ üçüncü kursda oxuyarkən onu Moskvada Xarici Dillər Hərbi İnstitutuna keçməyə və Sovet Ordusunun peşəkar zabiti olmağa yönəldirdilər.

Universiteti bitirdikdən sonra Q.Kərimov həqiqi hərbi xidmətə çağırılıb, orada gənc leytenant-poliqlot iki il əvəzinə beş il xidmət edib. 1959-cu ildə sovet ordusunun hərbi qulluqçularının sayı 1 milyon 200 min nəfər azaldılmasaydı, onun xidmətdə hələ nə qədər qalacağını demək çətindir.

Universiteti bitirməsindən səkkiz il keçsə də, Q.Kərimovun elmlə məşğul olmaq həvəsi zəifləməyib və 1960-cı ildə, otuz yaşında o, Moskvada SSRİ Elmlər Akademiyasının Asiya Xalqları İnstitutunun aspiranturasına daxil olub. Burada böyük sovet alimi E.A.Belyayevin rəhbərliyi ilə elmi tədqiqatlarının əsas sahəsi müəyyən edilib – islamşünaslıq. E.A.Belyayevin məsləhəti ilə İslamda sufizm cərəyanını namizədlik dissertasiyasının predmeti seçib. Bu baxımdan, demək olar ki, dərhal çətinliklər yaranıb: birincisi, bu mövzuda hər hansı sanballı sovet araşdırmalarının yoxluğu və sufizm problematikası üzrə xarici müəlliflərin əsərlərinin əlçatmaz olması; ikincisi, N.S.Xruşşovun ölkəyə rəhbərliyi dövründə Sov.İKP-nin dinə qarşı mübarizəsinin xüsusilə kəskinləşməsi nöqteyi-nəzərindən institut partiya təşkilatı rəhbərliyinin mövzuya şübhə ilə yanaşması.

İlk problemi uğurla adlamaq mümkün olub. Q.Kərimov bir qrup gənc alimlə birgə ərəb dilini təkmilləşdirmək və dissertasiya materialları toplamaq üçün Misirə göndərilib. Q.Kərimovun elmi marağının xüsusiyyətlərini nəzərə alaraq, Misir Ali Təhsil Nazirliyi onu təcrübə üçün dünyanın ən qədim universitetlərindən biri olan "Əl-Əzhər" universitetinə (onuncu əsrdə yaradılıb) göndərib, Q.Kərimov orada iki il mühazirələrdə iştirak edib və tədqiqat aparıb.

Sovet elmi-tədqiqat institutunda sufizm mövzusunun münasibliyinə gəldikdə isə, N.S.Xruşşovun istefası ilə "ateist ekstremizm" geri çəkilməyə və dini mövzulara "allergiya" azalmağa başlayıb. 1964-cü ildə Q.Kərimov "Ortodoksal İslamda sufizm və əl-Qəzalinin ona münasibəti" (əl-Qəzali - fars müsəlman ilahiyyatçısı, hüquqşünas, filosof, sufizmin X-XI əsrlərdə yaşamış ən nüfuzlu yaradıcılarından biri olan mistik) mövzusunda namizədlik dissertasiyası müdafiə edib. Sovet dinşünaslığında İslamdakı bu istiqamətə həsr edilən, orta əsr İslam teoloji-fəlsəfi fikrinə dair unikal sənədlər və XIX-XX əsrlərin nüfuzlu müsəlman din alimlərinin əsərləri əsasında yerinə yetirilən ilk tədqiqat işi ərsəyə gəlib. Doğrudur, bu əsər yalnız beş il sonra və cəmi 850 nüsxə tirajla, həm də Moskvada yox, Bakıda nəşr edilib (kitab açıq satışa çıxarılmayıb, əsasən kitabxanalara paylaşdırılıb).

Aspiranturanı bitirdikdən sonra Bakıya qayıdan Q.Kərimov 1967-ci ilin sonuna qədər Azərbaycan Elmlər Akademiyasının Yaxın və Orta Şərq Xalqları İnstitutunda işləyib. SSRİ-nin ərəb-müsəlman dünyası ölkələri ilə dövlətlərarası əlaqələri və iqtisadi əməkdaşlığın genişlənməsi və bunun nəticəsi olaraq ölkə daxilində müsəlman dini icmaların müəyyən aktivləşdirilməsi İslam, onun müxtəlif istiqamətləri və hüquq məktəblərinin bir daha dərindən öyrənilməsinə diqqətin artırılmasını tələb edirdi. Bununla bağlı ölkənin partiya rəhbərliyinin təşəbbüsü ilə müəyyən kadr qərarları qəbul edilib, onlar Q.Kərimovdan da yan keçməyib: 1967-ci ildə o, Sov.İKP MK yanında İctimai Elmlər Akademiyasının Elmi Ateizm İnstitutunda işləmək üçün Moskvaya dəvət olunub.

"Əl-Qəzali və sufizm" kitabından (1969) başqa, Q.Kərimov fundamental "Şəriət və onun sosial mahiyyəti" (1978) əsərini, "Yaxın Şərq xalqlarının ictimai-siyasi həyatına İslamın təsiri" (1982), "İslamın dövlət və siyasət haqqında təlimi" (1986) monoqrafiyalarını, eləcə də yüzdən çox elmi məqalə dərc edib.

Q.Kərimovun "Şəriət və onun sosial mahiyyəti" kitabı Sovet dinşünaslığında ticarəti, maliyyə, vergi sistemi, ailə-nikah münasibətlərini, ayin və bayram çərçivəsində, gündəlik məişətdə möminlərin davranışını tənzimləyən İslam hüququnun əsas müddəalarına dair ilk tədqiqat olub. Ərəb, fars, türk və digər mənbələrdən əxz edilən

zəngin faktiki materialda şəriət normalarının sosial-tarixi inkişafı ilə şərtlənən təkamülü, Yaxın və Orta Şərq ölkələrinin ictimai-siyasi həyatında şəriətin rolu müqayisəli təhlil edilib.

10 min tirajla nəşr edilən bu kitab geniş əks-səda doğurub. "Elm" nəşriyyatına, Elmi Ateizm İnstitutuna, Sov.İKP MK-ya partiya işçiləri, təbliğatçılar və din xadimlərindən yüzlərlə məktub gəlib. Məktubların çoxunda İslamın ən mühüm ehkam sənədləri haqqında səhih təsəvvür əldə etmək imkanı qazanıldığına görə müəllifə minnətdarlıq bildirilib. Sov.İKP MK yanında İctimai Elmlər Akademiyasının elmi əsərlər müsabiqəsində "Şəriət və onun sosial mahiyyəti" ilin ən yaxşı kitabı seçilib.

1980-ci ildə Q.Kərimov doktorluq dissertasiyası müdafiə edib. Akademiyanın Dissertasiya Şurasında İslam üzrə mütəxəssislərin olmaması ilə bağlı müdafiə, 16 il əvvəl namizədlik dissertasiyası ilə olduğu kimi, SSRİ Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunda keçirilib.

70-80-ci illərdə ölkədə Q.Kərimovun elmi nüfuzu son dərəcə yüksəlir: o, universitetlərə mühazirə oxumağa, müttəfiq respublikaların akademik institutlarının keçirdiyi tədbirlərə, "Bilik" Cəmiyyətinin təşkil etdiyi elmi-praktiki konfranslara dəvət olunur, partiya işçiləri məsləhətləşmə üçün ona müraciət edir. O, xaricdə akademik və dini dairələrdə tanınıb, Böyük Britaniya, Fransa, ABŞ, Hindistan, Pakistan, İran və digər ölkələrdə tədqiqat mərkəzlərinin təşkil etdiyi müxtəlif tədbirlərdə iştirak edir. SSRİ-də İslam üzrə ekspert kimi çıxış edib və daimi əsasda UNESCO, Hollandiyadakı Sovet İttifaqı və Orta Asiya (Mərkəzi Asiya nəzərdə tutulur) xalqlarının din və mədəniyyətinin Tədqiqi Mərkəzi, Osmanlı imperiyasının öyrənilməsi və Tunisdə Əndəlisdən gəlmə müsəlmanların tarixinin tədqiqi mərkəzi ilə əməkdaşlıq edib.

Q.Kərimov 1994-cü ildə İctimai Elmlər Akademiyasının varisi olan Rusiya Federasiyası Prezidenti yanında Dövlət Qulluğu Akademiyasının dinşünaslıq kafedrasının yaradıcılarından biri olub. Onun tarix, ilahiyyat və İslam fəlsəfəsi sahəsində dərin biliyi, mühazirəçi məharəti, elmi müzakirələr aparmaq bacarığına bu gün də tələb var. Q.Kərimov Rusiya Dövlət Qulluğu Akademiyasının dövlət-din münasibətləri kafedrasının və M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin dini fəlsəfə və dinşünaslıq kafedrasının aspirant və tələbələrinə dərs deyir, mühazirələr oxuyur və Moskvada sayı qırxdan çox olan müsəlman xalqlarının milli mədəni muxtariyyətlərinin təşkil etdiyi tədbirlərdə dini-maarifçi söhbətlər aparır. Uzun illər Q.Kərimov Otradnoyedə Ənənəvi Dinlər Mərkəzindəki "Yadran" məscidi yanında İslam Mədəniyyəti Universitetinə rəhbərlik edib.

Q.Kərimov elmi-tədqiqat işləri ilə intensiv məşğul olur. O, şəriət haqqında monoqrafiyanın (ilk nəşri 1978-ci ildə işıq üzü görüb) fəsillərini xeyli genişləndirib və yenidən işləyib, ideoloji səbəblərə görə sovet dövründə qəbul olunmayan bölmələrlə tamamlayıb. Yenilənmiş şəkildə və konkret adı ilə "Şəriət: müsəlmanların həyat qanunu. Şəriətin müasir dövrün suallarına cavabları" kitabı 2007-2010-cu illərdə dörd dəfə nəşr olunub. XX əsrin sonu - XXI əsrin əvvəllərində professor Q.Kərimov, həmçinin İslamın müasir ictimai-siyasi proseslərdə rolu, İslam mədəniyyətinin Avrasiya sivilizasiyasında yeri, müsəlman ilahiyyatında ekoloji aspektlər və s. mövzularda tədqiqatla məşğul olub.



## Kərimov
## Tapdıq Hafiz oğlu

*Fəlsəfə elmləri doktoru.*
*A.M.Qorki adına Ural Dövlət Universitetinin sosial fəlsəfə kafedrasının professoru*

Kərimov Tapdıq Hafiz oğlu 1964-cü il avqustun 29-da Azərbaycan Respublikasının Füzuli şəhərində anadan olub.

1982-ci ildə A.M.Qorki adına Ural Dövlət Universitetinin (UDU) fəlsəfə fakültəsinə daxil olub. 1983-1986-cı illərdə Hərbi Dəniz Donanmasında xidmət edib. 1986-cı ildə UDU-nun fəlsəfə fakültəsində təhsilini davam etdirib.

1990-cı ildə T.Kərimov UDU-nun fəlsəfə fakültəsini bitirib və elə həmin il bu universitetin əyani aspiranturasına daxil olub.

1992-ci ildən assistent işləyib, 1995-ci ildən USU-nun fəlsəfə fakültəsinin sosial fəlsəfə kafedrasının dosenti olub. 2000-ci ildən T.Kərimov USU-nun sosial fəlsəfə kafedrasının professorudur.

1993-cü ildə T.Kərimov "Sosial məişət strukturunda fərdilik" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1999-cu ildə doktorantura keçmədən "Sosial geterologiya: tədqiqatın metodologiyası və nəzəriyyəsi" mövzusunda doktorluq dissertasiyası hazırlayıb və müdafiə edib. Onun inkişaf etdirdiyi sosial fəlsəfə və sosial elmlərin geteroloji istiqaməti müasir fəlsəfə və ictimaiyyətşünaslıq, elmi-pedaqoji və sosial praktiki layihələr sahələrində perspektiv tədqiqatları təmin edir.

T.Kərimov sosial fəlsəfə kafedrasının nəzdində "Sosial sahədə menecment (sosial menecment)" tədris-metodiki laboratoriyasının rəhbəridir. Laboratoriya çərçivəsində bu ixtisaslaşmanı həyata keçirən əsas və ixtisaslaşdırılmış kurslar sistemi hazırlayıb.

T.Kərimov "Postmodernizm şəraitində sosial fəlsəfə", "Dekonstruksiyaya giriş", "İstedadın qənaəti", "Sosial geterologiya", "Sosial sahədə menecment" xüsusi kurslarının müəllifidir. O, "Sosial geterologiya" (Yekaterinburq, 1999), "Sosiallığın sərhədləri: postklassik baxış" (Yekaterinburq, 2000, həmmüəllif), "Sosial fəlsəfə üzrə müntəxəbat" (həmmüəllif), "Zamanın poetikası" (Moskva, 2004) monoqrafiyalarını hazırlayıb və nəşr edib.

T.Kərimov "Müasir fəlsəfə lüğəti"nin (Moskva, 1-ci nəşr, 1996; London, 2-ci nəşr, 1998; Moskva, 3-cü nəşr, 2004) məsul katibi, sosial fəlsəfə üzrə lüğətin (Moskva, 2003) redaktorlarından biridir. Bundan başqa, T.Kərimov "Sotsiemı" sosial-fəlsəfi jurnalının redaktorudur.

O, Ural Dövlət Universitetinin elmi əsərə görə (1997), "Müasir fəlsəfi lüğət"ə görə V.N.Tatişev və de Genin mükafatı laureatıdır (1999). Rusiya Federasiyasının Təhsil və Elm Nazirliyinin Fəxri fərmanı ilə təltif edilib.

T.Kərimov elmi kollektiv tərkibində kafedraların inkişafı layihələri üzrə "Açıq Cəmiyyət" İnstitutunun (2000-2003), "İctimaiyyətşünaslığın humanistləşdirilməsi" layihəsi üzrə Rusiya Federasiyası Prezidentinin (2003-2005), "Sosial fenomenologiya: nəzəri motivlər və tarixi ilkin şərtlər" layihəsi üzrə Rusiya Dövlət Elm Fondunun (2002-2004), "Sosial-humanitar dərketmənin inteqrasiyasının əsaslandırılmasının fəlsəfi problemi" layihəsi üzrə Rusiya Fundamental Tədqiqatlar Fondunun (2004-2005) qrantlarını qazanıb.



## Kərimov
## Vaqif Eldar oğlu

*İqtisad elmləri doktoru, professor.*
*Rusiya Dövlət Aqrar Universiteti – K.A.Timiryazev adına Moskva Kənd Təsərrüfatı Akademiyasının mühasibat uçotu kafedrasının və G.V.Plexanov adına Rusiya İqtisad Universitetinin mühasibat uçotu kafedrasının professoru*

Kərimov Vaqif Eldar oğlu 1956-cı il noyabrın 4-də Azərbaycan Respublikasının Ucar rayonunun Bərgüşad kəndində anadan olub.

1981-ci ildə "mühasibat uçotu" ixtisası üzrə Moskva Kooperativ İnstitutunu bitirib və həmin il ali məktəbin Elmi Şurasının qərarı ilə imtahanları uğurla verərək əyani aspiranturaya daxil olub.

1985-ci ildə V.Kərimov Moskva Kooperativ İnstitutunda "İstehlak kooperasiyasında pivə istehsal edən müəssisələrin istehsal xərcləri və maya dəyərinin hesablanması üçün uçotun təkmilləşdirilməsi" mövzusunda dissertasiya müdafiə edib.

2001-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetində "mühasibat uçotu, statistika" ixtisası üzrə "İstehlak kooperasiyasının istehsal müəssisələrində idarəetmə uçotu" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

1985-2003-cü illərdə V.Kərimov Moskva İstehlak Kooperasiyası Universitetində assistent, baş müəllim, dosent, uçot fakültəsinin dekan müavini vəzifələrində çalışıb. 2003-2011-ci illərdə professor, Rusiya Federasiyası Hökuməti yanında Maliyyə Universitetinin mühasibat uçotu kafedrası müdirinin elmi iş və magistratura üzrə müavini olub.

2011-ci ilin dekabrından bu günə qədər Rusiya Dövlət Aqrar Universitetinin – K.A.Timiryazev adına Moskva Kənd Təsərrüfatı Akademiyasının mühasibat uçotu kafedrasının professorudur. Eyni zamanda, ştat əvəzçiliyi ilə G.V.Plexanov adına Rusiya İqtisad Universitetinin mühasibat uçotu kafedrasının professorudur.

2001-2006-cı illərdə V.Kərimov əvəzçiliklə Beynəlxalq Biznes və İdarəetmə Akademiyasında mühasibat uçotu və audit kafedrasının, 2006-2011-ci illərdə isə Moskva Humanitar-Texniki Akademiyasının iqtisadiyyat kafedrasının müdiri olub.

V.Kərimov dəvətlə M.V.Lomonosov adına Moskva Dövlət Universitetində dərs deyir və iqtisadiyyat fakültəsinin magistr buraxılışı üzrə Dövlət Attestasiya Komissiyasına sədrlik edir.

V.Kərimov mühasibat uçotu və idarəetmə uçotu, iqtisadi təhlil və audit sahəsində mütəxəssisdir. Onun elmi-tədqiqatlarının əsas istiqaməti idarəetmə uçotu və iqtisa-

diyyatın müxtəlif sahələrində strateji inkişaf perspektivləridir. Rusiya alimləri arasında idarəetmə uçotu sahəsində ilk dəfə doktorluq dissertasiyası müdafiə edən V.Kərimov olub.

Alimin apardığı elmi-tədqiqatlar aşağıdakı nəticələrə və tövsiyələrə gətirib çıxarıb. İdarəetmə uçotu – iqtisadi biliklərin yeni kompleks sahəsidir, onun əsas məqsədi effektiv idarəetmə qərarlarının qəbulu üçün menecerlərini və müəssisələri informasiya-analitik baxımdan təmin etməkdir. İdarəetmə uçotu məlumatı operativ, taktiki və strateji idarəetmə qərarlarının qəbulundan ötrü, müstəsna olaraq menecmentin istifadəsi üçün nəzərdə tutulub. İdarəetmə uçotunda operativ, statistik, vergi və mühasibat uçotu, eləcə də digər funksional xidmətlərin informasiyasından istifadə olunur. Bu xidmətə, bir qayda olaraq, təşkilatın maliyyə direktoru rəhbərlik edir və özlüyündə o, matris idarəetmə formasını ehtiva edir, orada müxtəlif bilik sahələrinin mütəxəssislərinin - iqtisadçılar, mühəndislər, texnoloqlar, hüquqşünaslar, vergi mütəxəssisləri, mühasiblər, maliyyəçilər, analitiklər, marketoloqlar və başqalarının əməyindən istifadə olunur. İdarəetmə uçotu təşkilatın əsas informasiya sistemidir və uçotun digər növlərindən fərqli olaraq, proqnozlaşdırma və planlaşdırma kimi funksiyaların sayəsində təkcə baş vermişi yox, həm də baş verə biləni əks etdirir. İdarəetmə uçotu təşkilatın proqram məhsuludur, yəni "nou-hau"dur, çünki onun tətbiqi qaydaları beynəlxalq, milli standartlarla deyil, təşkilatın özü tərəfindən tənzimlənir. Uçotun rəsmi növlərindən fərqli olaraq, idarəetmə uçotu subyektiv və məxfidir, lakin məhz o, idarəetmə qərarlarının qəbulunun əsas yükünü öz üzərində daşıyır və onunla yüksək səviyyəli peşəkarlar məşğul olurlar.

Hazırda, o cümlədən V.Kərimovun əsərləri sayəsində, Rusiya mühasibat uçotu nəzəriyyəsi və təcrübəsində idarəetmə uçotunun yaradılması və inkişafı, onun təsərrüfat subyektlərinin iqtisadi fəaliyyətinin sərbəst növü kimi tanınması baş verir. Peşəkar mühasiblərin və auditorların rəsmi hazırlığı və attestasiyasında, bakalavr və magistrlərin "iqtisadiyyat" və "menecment" sahələri üzrə ali peşəkar təhsilin dövlət təhsil standartlarında "idarəetmə uçotu" termininin meydana gəlməsini bu istiqamətdə mühüm addım saymaq olar.

V.Kərimov 400-dən çox elmi əsərin, o cümlədən 7 monoqrafiya, Rusiya Federasiyasının Təhsil və Elm Nazirliyinin qrifi ilə ali məktəblər üçün 7 dərsliyin, Rusiya Federasiyasının Təhsil və Elm Nazirliyinin maliyyə, uçot və dünya iqtisadiyyatı üzrə elmi-metodiki birliyinin qrifi ilə 10 dərs vəsaitinin müəllifi və həmmüəllifidir. "Mühasibat uçotu" və "Maliyyə uçotu" dərsliklərini o, Rusiya Federasiyası Hökuməti yanında Maliyyə Universitetinin mühasibat uçotu kafedrasının müdiri, iqtisad elm-

ləri doktoru, professor V.Q.Getmanla birlikdə yazıb. M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin maliyyə kafedrasının müdiri, iqtisad elmləri doktoru, professor A.N.Xorin ilə birgə yazılan "Strateji təhlil" dərs vəsaiti isə "maliyyə və kredit", "mühasibat uçotu, təhlil və audit" və "menecment" ixtisası üzrə təhsil alan tələbələrin istifadəsi üçün tövsiyə olunub.

V.Kərimov fəal alimdir. O, doktorluq dissertasiyalarının müdafiəsi üzrə dörd ixtisaslaşmış şuranın üzvüdür, o cümlədən M.V.Lomonosov adına Moskva Dövlət Universitetində, Rusiya Federasiyası Hökuməti yanında Maliyyə Universitetində, Rusiya Dövlət Aqrar Universiteti - K.A.Timiryazev adına Moskva Kənd Təsərrüfatı Akademiyasında və V.G.Plexanov adına Rusiya İqtisad Universitetində. Onun rəhbərliyi ilə 7 aspirant, o cümlədən İraqdan 1 və Vyetnamdan 1 aspirant uğurla namizədlik dissertasiyası müdafiə edib.

Hazırda V.Kərimov maliyyə, mühasibat və dünya iqtisadiyyatı sahələrində dərs vəsaitlərinə Rusiya ali məktəbləri elmi-metodiki birliyinin qrifinin verilməsi, eləcə də məzunların ixtisas (hazırlıq profili) üzrə təlim keyfiyyətini təmin etmək üçün nəzarət tədbirlərinin aparılması üzrə ekspertidir, Rusiya Federasiyası Maliyyə Nazirliyinin Peşəkar Mühasiblər və Auditorlar İnstitutunun Moskva regionunun peşə hazırlığı komitəsinin, "Sodrujestvo" Peşəkar Mühasiblər və Auditorlar Assosiasiyasının, M.V.Lomonosov adına Moskva Dövlət Universiteti nəzdində "Uçot, analiz i audit" jurnalının redaksiya heyətinin üzvüdür.



## Kərimov Vaqif Yunus oğlu

*Geologiya-mineralogiya elmləri doktoru, professor. İ.M.Qubkin adına Rusiya Dövlət Neft və Qaz Universitetinin neft və qaz axtarışı və kəşfiyyatının nəzəri əsasları kafedrasının müdiri*

Kərimov Vaqif Yunus oğlu 1949-cu il iyulun 5-də Bakıda anadan olub.

1971-ci ildə M.Əzizbəyov adına Azərbaycan Neft və Kimya İnstitutunun (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) geoloji kəşfiyyat fakültəsini "dağ mühəndisi-geoloq" ixtisası üzrə bitirib.

1975-ci ildə V.Kərimov "Cənub-Şərqi Qafqazda stratiqrafik və litoloji neft və qaz yataqlarının kəşfiyyatı" mövzusunda dissertasiya müdafiə edib, 1983-cü ildə isə İ.M.Qubkin adına Moskva Neft-Kimya və Qaz Sənayesi İnstitutunda "Stratiqrafik, litoloji və kombinəli neft və qaz yığımlarının formalaşması şərtləri, yerləşdirilməsi nümunələri, axtarış metodikası və kəşfiyyatı" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

2001-ci ildən V.Kərimov İ.M.Qubkin adına Rusiya Dövlət Neft və Qaz Universitetinin professoru, 2009-cu ildən həmin universitetin neft və qaz axtarışının nəzəri əsasları və kəşfiyyatı kafedrasının müdiridir.

V.Kərimov Rusiya Federasiyası Dağ Elmləri Akademiyasının həqiqi üzvüdür. 1989-1992-ci illərdə o, "İnkişaf" Respublikalararası İqtisadi Assosiasiyasının (Moskva, Bakı) prezidenti və Direktorlar Şurasının sədri, 1992-2002-ci illərdə "Morneft" QSC-nin (Moskva) geologiya və geofizika üzrə vitse-prezidenti, 2002-2003-cü illərdə "Orenburqneft" TNK ASC (Orenburq, Buzuluk) baş direktorunun müşaviri, 2003-2004-cü illərdə "Yamalneft" ASC-nin Moskva nümayəndəliyinin direktoru (Moskva), eləcə də Saraktaş neft-qaz kəşfiyyat dərin qazma ekspedisiyasının və Orenburq neft-qaz kəşfiyyatı şirkətinin baş direktoru olub.

V.Kərimov 140-dan çox elmi məqalənin, 22 monoqrafiya və dərsliyin müəllifidir. Onun əsərləri sırasına "Neft-qaz yığımı əsasları, axtarış metodları və kəşfiyyatı", "Neft-qaz axtarıcı və mədən geologiyası", "Ümumi və regional geotektonika", "SSRİ-nin geologiyası" daxildir. Monoqrafiyaların arasında "Şelf, onun tədqiqi və neft-qaz yığımının axtarışı və kəşfiyyatında əhəmiyyəti", "Stratiqrafik və litoloji tələlərdə neft yataqlarının kəşfiyyatı", "Dənizdə neft və qaz yataqlarının axtarış və kəşfiyyatı" xüsusilə seçilir.

V.Kərimov 30-dan çox geologiya və mineralogiya elmləri namizədi hazırlayıb. Dağ Elmləri Akademiyasının həqiqi üzvü seçilib. O, “Qırmızı Əmək Bayrağı” ordeni (1976), “Şərəfli əməyə görə” medalı (1970), Azərbaycan Respublikası Ali Sovetinin iki Fəxri Fərmanı (1971, 1977), Orenburq vilayətinin qubernatorunun Fəxri Fərmanı (2008) ilə təltif edilib.



## Kəsəmənli
## Fəqam Paşa oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*Sankt-Peterburq Dövlət Politexnik Universitetinin eksperimental fizika kafedrasının professoru*

Kəsəmənli Fəqam Paşa oğlu 1932-ci il aprelin 19-da Azərbaycan Respublikasının Kirovabad (indiki Gəncə) şəhərində anadan olub.

1949-cu ildə orta məktəbi bitirdikdən sonra S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika-riyaziyyat fakültəsinə daxil olub. 1952-ci ilin payızından eyni zamanda Sabunçu qəsəbəsindəki 58 saylı orta məktəbdə fizika və riyaziyyatdan dərs deyib.

1954-cü ilin avqustundan F.Kəsəmənli Azərbaycan Elmlər Akademiyasının Fizika və Riyaziyyat İnstitutunun istilik fizikası laboratoriyasının baş laborantı işləyib. O dövrdə laboratoriyada üzvi mayelərin özlülük və sıxlığının onların tərkibi və temperaturundan asılılığı öyrənilirdi. F.Kəsəmənliyə bir sıra mayelərin xassələrinin temperatur asılılığına dair eksperimental məlumatlar əsasında mövcud özlülük nəzəriyyələrinin tətbiqi hədlərini yoxlamaq tapşırılır. Onun əsasən hesablama xarakteri daşıyan "A.İ.Baçinski, Y.İ.Frenkel, Q.M.Pançenkovun mayelərin özlülük formullarının yoxlanması" adlı diplom işi 1955-ci ilin mayında dövlət komissiyası tərəfindən "əla" qiymətləndirilib.

Universiteti bitirdikdən sonra F.Kəsəmənli "fizik" ixtisası alıb, 1956-cı ilin fevralında Fizika və Riyaziyyat İnstitutunda kiçik elmi işçi vəzifəsinə keçirilib və həmin il onun ilk elmi əsrləri nəşr olunub. 1957-ci ildə Azərbaycan Elmlər Akademiyasının aspiranturasına qəbul edilib.

F.Kəsəmənli elmi mühitə alışdığı və lazımi ədəbiyyata göz gəzdirdiyi müddətdə onun elmi baxışları bir qədər dəyişib və o, özünü yarımkeçiricilər fizikasına həsr etmək qərarına gəlib. 1959-cu ildə namizədlik imtahanını verdikdən sonra F.Kəsəmənli Leninqrad Fizika-Texnika İnstitutuna (LFTİ) ezam olunub. LFTİ-də olduğu üç il ərzində o, termoeds yarımkeçiricilərinin ekspress dəqiq ölçülməsi üçün cihaz hazırlayıb, termoedsin müxtəlif elektron sıxlıqlı kristallarda temperaturdan asılılığı öyrənib, namizədlik dissertasiyası yazıb və 1962-ci ildə S.M.Kirov adına ADU-da müdafiə edib. Müdafiədən sonra o, elmi işini davam etdirmək üçün yenidən LFTİ-yə ezam olunub.

1969-cu ildə F.Kəsəmənli Ukraynanın Kirovoqrad vilayətindəki təmiz metallar zavodunda (TMZ) laboratoriya müdiri vəzifəsinə təyin edilib. Zavodda işləyə-işləyə F.Kəsə-

mənli A3B5 yarımkeçiricilərinin xassələrinin tədqiqi ilə məşğul olub və SSRİ Elmlər Akademiyasının A.F.İoffe adına Fizika-Texniki İnstitutunun alimləri ilə birgə işlər yerinə yetirib. F.Kəsəmənlinin elmi fəaliyyəti mürəkkəb almazabənzər yarımkeçiricilərin zona strukturunun, bu yarımkeçiricilərdə aşqarların davranışının öyrənilməsinə və yarımkeçiricilərin parametrlərini müəyyənetmənin yeni metodlarının hazırlanmasına istiqamətlənib.

1969-1970-ci illərdə F.Kəsəmənli mürəkkəb almazabənzər yarımkeçiricilərə dair bütün işləri ümumiləşdirərək, doktorluq dissertasiyası yazıb və 1971-ci ildə A.İ.Gertsen adına Leninqrad Dövlət Pedaqoji İnstitutunun yarımkeçiricilərin fizikası şurasında müdafiə edib. 1972-ci ilin yanvarında SSRİ AAK ona fizika-riyaziyyat elmləri doktoru alimlik dərəcəsi verir, 1974-cü ildə isə o, professor adı alır.

F.Kəsəmənlinin LFTİ və TMZ-də apardığı tədqiqatlar onu almazabənzər yarımkeçiricilər sahəsində tanınmış alimlər cərgəsinə çıxarır.

1975-ci ildən bu günə qədər F.Kəsəmənli Sankt-Peterburq Dövlət Politexnik Universitetinin eksperimental fizika kafedrasının professorudur. Burada o, həmçinin təhsil və elm tarixinin problemlərinə dair əsərləri ilə tanınır.

F.Kəsəmənli 300-dən çox elmi əsərin, o cümlədən yarımkeçiricilər, onların əldə edilməsi və xassələri haqqında monoqrafiyaların müəllifi və həmmüəllifidir. Onun rəhbərliyi ilə 8 nəfər namizədlik dissertasiyası hazırlayıb və müdafiə edib, 3 nəfər elmlər doktoru olub.

Elmi fəaliyyəti metodiki işlə birləşdirən F.Kəsəmənli tələbə elmi işlərinin sərbəst formalarının təkmilləşdirilməsi və ali texniki tədris müəssisələrində fizikanın tədrisinə dair metodiki tövsiyələr üzərində çalışır.

Sankt-Peterburq Dövlət Politexnik Universitetində ilk dəfə məhz o, "nobelşünaslıq" adı alan yeni bilik istiqamətində işləməyə başlayıb. Onun bu mövzuda ilk məqalələri mətbuatda 2000-ci ildə çap olunub, alim bu gün də həmin istiqamətdə çalışmaqda davam edir. F.Kəsəmənli nobelşünaslığın ən müxtəlif aspektlərini müfəssəl tədqiq edir. Həm də o, fizika çərçivələri ilə məhdudlaşmır, kimya, iqtisadiyyat, təbabət və digər elm sahəsi laureatları haqqında da yazır. Sankt-Peterburqun 300 illiyinə o, unikal "Elm sahəsində Nobel mükafatı laureatı olan peterburqlular" kitabını qələmə alıb. Bu əsər dərhal nadir tapılan kitaba çevrilib.

F.Kəsəmənli həmvətənlərini də unutmur. "Rusiyanın Əməkdar Xadimləri – Sankt-Peterburq azərbaycanlıları" kitabı üzərində işləyə-işləyə o, qəzet və jurnallarda xalqımızın Sankt-Peterburqda yaşayan görkəmli nümayəndələri haqqında oçerklər dərc edir.

Zəhmətkeş insan, istənilən işə özünü tam səfərbər edən professor F.Kəsəmənli "Əmək veteranı" medalı, eləcə də "SSRİ ixtiraçısı", ali təhsil sahəsində "Əməkdə əla nailiyyətlərə görə", "Rusiya Federasiyasının ali peşə təhsilinin fəxri işçisi" döş nişanları ilə təltif edilib.



## Qarayev
## Fərəc Qara oğlu

*P.İ.Çaykovski adına Moskva Dövlət Konservatoriyasının musiqi nəzəriyyəsi kafedrasının professoru*

Qarayev Fərəc Qara oğlu 1943-cü il dekabrın 19-da Bakıda anadan olub.

1966-cı ildə məşhur Azərbaycan bəstəkarı, atası professor Qara Qarayevin kompozisiya sinfi üzrə Ü.Hacıbəyli adına Azərbaycan Dövlət Konservatoriyasını fərqlənmə diplomu ilə bitirib. 1971-ci ildə F.Qarayev elə onun sinfində aspiranturanı bitirib. F.Qarayev 1994-cü ildə professor elmi adını alıb.

1966-2003-cü illərdə Ü.Hacıbəyli adına Azərbaycan Dövlət Konservatoriyasında (1991-ci ildən Ü.Hacıbəyli adına Bakı Musiqi Akademiyası) kompozisiya, instrumentovka və polifoniyadan dərs deyib.

1991-ci ildən F.Qarayev Moskvada yaşayır. 1999-cu ildən P.İ.Çaykovski adına Moskva Dövlət Konservatoriyasının musiqi nəzəriyyəsi kafedrasının professorudur, 2003-2005-ci illərdə N.Jiqanov adına Kazan Dövlət Konservatoriyasının polifoniya kafedrasının professoru olub.

1994-1996-cı illərdə Moskva Müasir Musiqi Assosiasiyasının (MMA) vitse-prezidenti olub. 1995-ci ildən Bakıda təsis etdiyi "Yeni Musiqi" Müasir Musiqi Cəmiyyətinin prezidentidir. 1980-1994-cü illərdə "BaKaRA-ENSEMBLE"nin (Bakı) bədii rəhbəri olub. 1991-1992-ci illərdə A.Krupp Mədəniyyət Fondunun (Essen, Almaniya) təqaüdçüsü, 2007-2008-ci illərdə Azərbaycan Mədəniyyət və Turizm Nazirliyinin "Zamanla üz-üzə" layihəsinin bədii rəhbəri olub.

F.Qarayev müxtəlif janrlarda təxminən 50 əsərin müəllifidir. Onun əsərləri MDB, Avropa, Cənubi Amerika ölkələrində, ABŞ və Yaponiyada keçirilən festival və konsertlərdə ifa olunub. Bu əsərlərin ifaçıları sırasında dirijorlar A.Lazarev, M.Şostakoviç (SSRİ/Rusiya), G.Rojdestvenski, V.Sinayski, V.Polyanski, V.Ponkin, R.Abdullayev (Azərbaycan), İ.Metsmaher (Almaniya), E.Bağırov (Türkiyə/Azərbaycan), de Leu və E.Şpaanyard (Niderland), R.Frayzittser (Avstriya), D.Saks (ABŞ), Böyük Teatr Orkestrinin solistləri ansamblı (Moskva), "Studiya Novoy Muzıki" (Moskva, dirijor İ.Dronov), Moskva Müasir Musiqi Ansamblı (dirijor A.Vinoqradov), "Ensemble Modern" (Frankfurt, Almaniya), "Nieuw Ensemble" və

"Schönberg Ensemble" (Amsterdam, Niderland), "Ensemble Reconsil Wien" (Avstriya), "Quatuor Danel" (Fransa), "Continuum" (Nyu-York, ABŞ) və digərlərini göstərmək olar.

F.Qarayev Ü.Hacıbəyli adına Azərbaycan Dövlət Akademik Simfonik Orkestrinin ifasında 5 qrammofon valı, o cümlədən "Tristessa I" ("Vida simfoniyası") və 4 kompakt-disk yazdırıb.

Bəstəkarlıq sənətinin bütün incəliklərinə bələd olan F.Qarayev bütün yaradıcılığı boyu müxtəlif musiqi üslubları və istiqamətlərinə müraciət edir, yaradıcı özəlliklərini itirmədən müxtəlif janrlarda əsərlər yaradır. Onun musiqisini fərdi orijinal intonasiya, bəstəkar düşüncəsinin dolğunluğu, forma və məzmunun heyrətamiz uyğunluğu fərqləndirir.

F.Qarayev intellektual bəstəkardır. Onun əsərləri çox vaxt bir neçə bədii istiqamətin kəsişməsinin məhsuludur: musiqidən başqa, bu əsərlərdə səhnə sənəti və rəssamlıq, ədəbiyyat və plastik incəsənət elementləri var.



## Qarayev
## Nazim Əliheydər oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor. "Geoloqorazvedka" Elmi-İstehsalat Müəssisəsinin baş elmi işçisi*

Qarayev Nazim Əliheydər oğlu 1927-ci il martın 6-da Bakıda anadan olub.

Moskva Geoloji Kəşfiyyat İnstitutunu bitirib. 1950-1955-ci illərdə Leninqradda "Geofizuqlerazvedka" trestinin texniki rəhbəri, sonra isə seysmik və kompleks partiyanın baş mühəndisi vəzifəsində işləyib.

1955-ci ildən N.Qarayev Ümumittifaq Elmi-Tədqiqat Geofizika İnstitutunun (ÜİETGİ) Leninqrad filialında nöqtəvi seysmik zondlama metodu ilə regional tədqiqatlar geofiziki partiyasının texniki rəhbəri, sonra isə seysmik laboratoriyanın rəhbəri olub, 1961-ci ildə bu laboratoriya Ümumittifaq Geoloji Kəşfiyyat İnstitutuna (ÜİGKİ) köçürülüb.

1956-1959-cu illərdə N.Qarayev öz müəllimləri – görkəmli alimlər İ.S.Berzon və İ.P.Kosminskayanın təkidi ilə Leninqrad Dağ-Mədən İnstitutunun aspiranturasında təhsilini davam etdirib.

N.Qarayevin elmi fəaliyyəti mədənlərin seysmik kəşfiyyatının əsaslarının işlənib hazırlanmasına və mürəkkəb dislokasiyalı mühit şəraitində seysmik metodların tətbiqinə həsr edilib. O, mürəkkəb quruluşlu geoloji obyektlərin öyrənilməsində seysmik metodların tətbiqinin fiziki və geoloji əsaslandırılması üzrə kompleks araşdırmalar, özünün təklif etdiyi heterogen tipli seysmik modellərin yeni sinfi üçün seysmik dalğavarı sahələrin yayılmasına dair nəzəri və model xarakterli tədqiqatlar aparıb. Bu tədqiqatlar mədən rayonlarında və yer qabığının dərin şüalandırılması zamanı yerüstü müşahidələrin və quyularda seysmik müşahidələrin nəticələrinin uğurlu interpretasiyasına imkan yaradır.

1967-ci ildə N.Qarayev texnika elmləri namizədi alimlik dərəcəsi almaq üçün, 1978-ci ildə isə fizika-riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. 1989-cu ildə ona professor elmi adı verilib, 1995-ci ildə o, Rusiya Təbiət Elmləri Akademiyasının müxbir üzvü seçilib, 1996-cı ildə isə ona Çançun Yer Elmləri Universitetinin (Çin Xalq Respublikası) professoru fəxri adı verilib.

Hazırda N.Qarayev “Geoloqorazvedka” Elmi-İstehsalat Müəssisəsinin baş elmi işçisidir.

N.Qarayev 170-ə yaxın elmi işin, o cümlədən 9 monoqrafiyanın müəllifi və həmmüəllifidir, öz araşdırmalarına görə bir neçə patent alıb.

N.Qarayev uzun illər SSRİ Geologiya Nazirliyinin və Rusiya Federasiyası Geologiya və Yerin Təkindən İstifadə Komitəsinin (Roskomnedra) mədənlərin seysmik kəşfiyyatı üzrə işlərinin elmi rəhbəri və kuratoru, Rusiya EA-nın geofiziki kəşfiyyat metodları üzrə Birləşmiş Elmi Şurasının üzvü, Rusiya EA-nın almazlar üzrə İdarələrarası Şurasının, “Rudgeofizika” ÜİGKİ-nin (Ümumittifaq (hazırda Ümumrusiya) Geofiziki Kəşfiyyat İnstitutu) və Sankt-Peterburq Dağ-Mədən İnstitutunun, “Okeangeologiya” Ümumrusiya Elmi-Tədqiqat İnstitutunun dissertasiya şuralarının üzvüdür.

N.Qarayevin elmi araşdırmalarının əsas istiqamətləri:

- mədən seysmik kəşfiyyatı. Yer qabığının konsolidə edilmiş yuxarı hissəsinin öyrənilməsi zamanı əks etdirilən dalğaların seysmik metodunun filiz axtarışı məsələlərinin həlli üçün tətbiq edilməsinin prinsipcə mümkün olmasını ilk dəfə sübut edən N.Qarayev olub. O, SSRİ-nin əsas filiz yataqlarında müxtəlif proqnoz-axtarış məsələləri nümunələrində mədənlərin seysmik kəşfiyyatı texnologiyasının fiziki əsaslarının inkişafına mühüm töhfələr verib. N.Qarayevin çoxillik nəzəri və eksperimental tədqiqatlarının nəticələri “Mədən seysmik kəşfiyyatı” adlı sanballı monoqrafiyada ümumiləşdirilib. Dünya geofiziki ədəbiyyatında analoqu olmayan bu monoqrafiya Rusiya Geologiya Cəmiyyətinin xüsusi diplomuna layiq görülüb.

- mürəkkəb quruluşlu mühitlərin seysmik geterogenliyi. N.Qarayev ilk dəfə olaraq, heterogen tipli seysmik modellərinin prinsipcə yeni, qeyri-ənənəvi, ən ümumi sinfini yaradıb və beləliklə, yer qabığının müxtəlif ranqlı strukturlarının öyrənilməsi zamanı seysmik məlumatların işlənməsi və interpretasiyasının ümumi konsepsiyasının qurulması üçün dalğavarı sahənin dalğın komponentini reallaşdırmağın əsasını qoyub. Bu tədqiqatlar yer qabığının seysmik “obrazları”nın təbiətinin şifrinin açılması və regional seysmik kəşfiyyat məlumatlarının interpretasiyası probleminin həlli üçün böyük əhəmiyyət kəsb edirdi. N.Qarayevin fizika-riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün təqdim etdiyi “Mürəkkəb dislokasiyalı mühitlərdə seysmik modellərin və dalğavarı sahələrin tədqiqatı” mövzusu üzrə dissertasiyasında (SSRİ EA Yer Fizikası İnstitutu, 1978) və bir sıra başqa, o cümlədən xarici nəşrlərdə dərc olunmuş əsərlərində mürəkkəb geoloji mühitlərin təsviri vaxtı seysmik modellərin yeni sinfi nəzərdən keçirilib;

- kristal süxurlarda quyuların seysmik akustikası. ÜİGKİ (indiki FQUNPP "Geoloqorazvedka" Federal Dövlət Unitar Elmi-İstehsalat Müəssisəsi) filizli rayonlarda şaquli seysmik profilləmənin polyarizasiya metodunun (ŞSP PM) inkişafı ilə bağlı texnoloji tədqiqatlar aparıb. Kristallik qalın süxurlarda aparılmış quyudaxili və quyulararası seysmik tədqiqatlar filizlərin seysmik kəşfiyyatının tətbiqi məsələlərinin fiziki əsasların inkişafında və həllində böyük əhəmiyyət kəsb edirdi. ŞSP PM-in tətbiqinin nəticələrinə əsasən "Filizli rayonlarda ŞSP polyarizasiya metodunun tətbiqinə dair metodik tövsiyələr" hazırlanıb (SSRİ EA Yer Fizikası İnstitutu və ÜİGKİ-nin birgə nəşri, 1984). Şaquli seysmik profilləmə metodunun yaradılmasına görə N.Qarayev 1988-ci ildə həmin metodun müəllif kollektivi arasında SSRİ Dövlət Mükafatına layiq görülüb. 1991-1993-cü illərdə N.Qarayev Kola yarımadasındakı çox dərin SQ-3 quyusunda ŞSP PM müşahidələri əsasında quyuətrafı sahənin kristal qabığının öyrənilməsi ilə bağlı Beynəlxalq seysmik layihənin elmi rəhbəri təyin edilmişdi. Qalın kristallik süxurlarda formalaşan dalğavarı sahələrin təbiətinin öyrənilməsində fundamental əhəmiyyətə malik olan bu tədqiqatların nəticələri müəllifin Rusiyada və xaricdə nəşr olunmuş bir sıra əsərlərində şərh edilib;

- karbohidrogen kollektorlarının seysmik kəşfiyyatı, axtarışı və diaqnostikası problemlərinin həlli zamanı fiziki modelləşdirmə. Ultrasəs fiziki modelləşdirmə metodunun inkişafı ilə əlaqədar, ÜİGKİ tərəfindən aparılan çoxillik tədqiqatlar axtarış məsələlərinin həlli zamanı karbohidrogen kollektorlarının diaqnostikası əlamətlərinin tədqiqatı və müasir seysmik texnologiyaların testləşdirilməsi üçün unikal fiziki modelləşdirmə sisteminin yaradılması və aprobasiyası ilə başa çatdı. Rusiya Fundamental Araşdırmalar Fondunun qrantlarının dəstəyi ilə yaradılmış tədqiqat üsullarının və metodlarının yeniliyi RF patentləri ilə təsdiq edilib.

N.Qarayev bir sıra hökumət təltiflərinə layiq görülüb. Sovet və Rusiya geofizika elminə verdiyi böyük töhfələrə görə 1994-cü ildə ona "Rusiya Federasiyasının Əməkdar Elm və Texnika Xadimi" adı verilib. O, Rusiyanın dörd ən yüksək və nüfuzlu elmi mükafatına - I Pyotr adına, həmçinin akademiklər A.P.Kapitsa, V.V.Fedınski və Q.A.Qamburtsevin xatirəsinə həsr olunmuş diplomlara və gümüş medallara layiq görülmüş yeganə azərbaycanlıdır. O, həmçinin, "Əməkdə fərqlənməyə görə" medalı ilə təltif edilib.

N.Qarayevin adı Rusiya Federasiyasının "Rusiya geoloqları və mədən mühəndisləri", "Rusiya geofizikləri" kimi nüfuzlu ensiklopedik nəşrlərinə və "Rusiya Təbiət Elmləri Akademiyasının akademikləri və müxbir üzvləri" texniki sorğu-məlumat kitabına daxil edilib.



## Qarayev
## Vaqif Məmmədvəli oğlu

*Rusiya Federasiyasının Bəhreyn Krallığında fövqəladə və səlahiyyətli səfiri*

Qarayev Vaqif Məmmədvəli oğlu 1955-ci il yanvarın 24-də Azərbaycan Respublikasının Mingəçevir şəhərində anadan olub.

1978-ci ildə Moskva Dövlət Beynəlxalq Münasibətlər İnstitutunu (MDBMİ), 1997-ci ildə Rusiya XİN-in Diplomatiya Akademiyası nəzdində ali diplomatiya kurslarını bitirib. 1978-ci ildən diplomatik xidmətdədir, XİN-in mərkəzi aparatında və xaricdə böyük iş təcrübəsinə malikdir. Ərəb, fransız, Azərbaycan, türk və erməni dillərini mükəmməl bilir.

V.Qarayev 1994-1999-cu illərdə Rusiya XİN-in Konsulluq departamentinin şöbə rəisi işləyib. 1999-2003-cü illərdə Rusiyanın Hələbdə (Suriya) baş konsulu olub.

2004-2007-ci illərdə Rusiya XİN-in Yaxın Şərq və Şimali Afrika Departamentinin baş müşaviri vəzifəsində çalışıb. 2007-2011-ci illərdə Rusiyanın Ərbildə (İraq) baş konsulu, 2011-2014-cü illərdə Rusiyanın Bəsrədə (İraq) baş konsulu işləyib.

RF Prezidentinin 2014-cü il 29 dekabr tarixli fərmanı ilə V.Qarayev Rusiya Federasiyasının Bəhreyn Krallığında fövqəladə və səlahiyyətli səfiri təyin edilib. O, I dərəcəli fövqəladə və səlahiyyətli səfir diplomatik rütbəsinə malikdir.



## Qarayev
## Yəhya Hüsən oğlu

*Kənd təsərrüfatı elmləri doktoru, fizika-riyaziyyat elmləri namizədi. "ASK-da Elmi-Tədqiqat İnformasiya Texnologiyaları İnstitutu" MMC-nin direktoru*

Qarayev Yəhya Hüsən oğlu 1951-ci il aprelin 1-də Azərbaycan Respublikasının Cəbrayıl rayonunun Mərcanlı kəndində kolxozçu-kəndli ailəsində anadan olub.

1973-cü ildə "tətbiqi riyaziyyat" ixtisası, "riyaziyyatçı" kvalifikasiyası üzrə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) tətbiqi riyaziyyat fakültəsini "tətbiqi riyaziyyat" ixtisası, "riyaziyyatçı" kvalifikasiyası üzrə bitirib.

1999-cu ildə Y.Qarayev "qeyri-maddi aktivlər və intellektual mülkiyyətin qiymətləndirilməsi" proqramı üzrə hazırlıq, 2005-2006-cı illərdə isə RF hökuməti nəzdində Maliyyə Akademiyasının Peşəkar Qiymətləndirmə İnstitutunda "Müəssisənin (biznesin) dəyərinin qiymətləndirilməsi" proqramı üzrə peşəkar təkrar hazırlıq keçib.

Y.Qarayev 1979-cu ildə SSRİ Elmlər Akademiyasının Hesablama Mərkəzinin ixtisaslaşmış şurasında SSRİ Elmlər Akademiyasının akademiki N.N.Moiseyevin rəhbərliyi altında "Kənd təsərrüfatında resursların səmərəli istifadəsinin bəzi qeyri-xətti məsələləri" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib. 2005-ci ildə "Yem istehsalı və çəmənçilik" ixtisası üzrə kənd təsərrüfatı elmləri doktoru alimlik dərəcəsi almaq üçün "ASK-da texnoloji proseslərin optimallaşdırılmış modelləri əsasında elmi əsaslandırılması və təkmilləşdirilməsi" mövzusunda dissertasiya müdafiə edib. Müdafiə Rusiya Kənd Təsərrüfatı Elmlər Akademiyasının V.R.Vilyams adına Ümumrusiya Elmi-Tədqiqat Yem İnstitutunun nəzdində dissertasiya şurasında baş tutub.

Y.Qarayev 1996-cı ildən indiyədək "ASK-da Elmi-Tədqiqat İnformasiya Texnologiyaları İnstitutu" MMC-nin direktorudur. Onun rəhbərliyi altında institut bazar tərəfindən diktə olunan yeni iqtisadi şəraitə uğurla keçib, ASK-da texnoloji proseslərin elmi-praktiki əsaslarının aparıcı yaradıcısı kimi öz əhəmiyyətini gücləndirib. Y.Qarayevin elmi fəaliyyəti institutun kənd təsərrüfatında informasiya texnologiyalarının sahə mərkəzi kimi statusunun yüksəlməsinə səbəb olub.

2000-ci ildən Y.Qarayev qiymətləndirici işləyir, qeyri-kommersiya "Özünütənzimləyən Rusiya qiymətləndirmə magistrləri Assosiasiyası təşkilatı" tərəfdaşlığının üzvüdür.

Y.Qarayev kənd təsərrüfatı istehsalatının planlaşdırılması və idarə olunması məsələlərində riyazi metodların və EHM-in tətbiqi sahəsində yüksək ixtisaslı mütəxəssislərdən biridir.

Onun tədqiqatlarının istiqamətlərindən biri kənd təsərrüfatı bitkilərinin məhsuldarlığının torpaq-iqlim faktorlarından qeyri-xətti asılılığından istifadə edilməsinə əsaslanan kənd təsərrüfatında qıt resursların rasional paylanmasının riyazi modellər sisteminin qurulması və su resurslarının və onların istifadəçilərinin ərazi paylanması üsulu ilə bağlıdır. Qeyri-xətti məsələlərin maksimin meyarlarla həlli üçün Y.Qarayev tərəfindən effektivliyi praktikada yoxlanmış rəqəmli metodları hazırlanıb. Qıt resursların paylanmasının Y.Qarayev tərəfindən qurulan modeli inkişaf etmiş suvarma əkinçiliyi regionlarında kənd təsərrüfatı məhsulları buraxılışının proqnozlaşdırılması üçün istifadə olunur.

Y.Qarayev LAÜKTEA-nın QİYŞ-yə üzv ölkələrin elmi-texniki tərəqqisinin "Kənd təsərrüfatının elektronlaşdırılması sisteminin hazırlanması və tətbiqi" kompleks proqramı (1986) üzrə elmi-tədqiqat işləri tematik planı çərçivəsində iri regionların ərazisində kənd təsərrüfatı bitkiləri arasında gübrələrin paylanmasının müxtəlif strategiyalarının effektivliyinin qiymətləndirilməsi üçün nəzərdə tutulan proqram vasitələrinin iqtisadi-riyazi kompleks və modelləri sistemini yaradıb. Qeyd olunan sistemin köməyi ilə mineral gübrələrin ümumdövlət səviyyəsində təklif olunan bir sıra istifadə üsullarının kompleks qiymətləndirilməsi aparılıb. Hesablamaların nəticələri mineral gübrələrin rasional istifadəsinin Y.Qarayev tərəfindən yaradılan riyazi modellər sisteminin kifayət qədər effektiv olduğunu göstərib.

Y.Qarayev, həmçinin yem bitkilərinin becərilməsi texnologiyasının, müxtəlif yaş qrupları və məhsuldar kənd təsərrüfatı heyvanları üçün tutumlu yem hazırlanması və mədəni otlaqlarda effektiv texnologiyaların tətbiqi ilə otlaq və təbii yem sahələrinin rasional istifadəsi əsasında yem bazasının optimallaşdırılmasının ilk riyazi modellər sistemini təklif edib. Yem istehsalının qeyd olunan riyazi modellər sistemi əsasında optimallaşdırılması rentabelliliyi əhəmiyyətli dərəcədə yüksəltməyə imkan verir.

Yem bitkilərinin yığım müddətindən, bitki kütləsinin konservasiyasından və maddi-texniki təminatdan asılı olaraq yüksək keyfiyyətli və ucuz tutumlu yemlərin hazırlanmasının yeni texnologiyalarının müqayisəli qiymətləndirilməsinin Y.Qarayev tərəfindən işlənib hazırlanan ekspert-riyazi metodları maddi-texniki vasitə və əmək xərclərinin xeyli azaldılması ilə qidaların enerji dəyərinin və çoxillik otlarda xam protein tərkibinin artırılması üçün onlardan daha etibarlı olanların istifadəsini tövsiyə etməyə və əsaslandırmağa imkan yaradır.

Y.Qarayev tərəfindən təşkilatın elmi texniki və innovasiya layihələrinin elmi strukturunun formalaşdırılmasının və müsabiqə yolu ilə seçilməsinin və kənd təsərrüfatında inno-

vativ fəaliyyətin elmi təminatının effektivliyinin artırılmasına yönələn çoxvariantlı hesablamalarının aparılması üçün onların operativ idarə olunmasının riyazi modeli təklif edilib ki, bu da onların həyata keçirilməsi üçün zəruri olan maliyyə vəsaitləri ilə vacib elmi-texniki və innovasiya layihələrinin çatışmazlığı riskini minimuma endirməyə imkan verir.

Y.Qarayevin əldə etdiyi əhəmiyyətli elmi nəticələr RF Kənd Təsərrüfatı Nazirliyi, RF Elm və Təhsil Nazirliyinin elm və innovasiya üzrə Federal Agentliyi, RKTEA Ümumrusiya soyuducu sənayesi ETİ, RKTEA V.M.Qorbatov adına Ümumrusiya ət sənayesi ETİ, RKTEA Ümumrusiya quş emalı sənayesi ETİ və RF Kənd Təsərrüfatı Nazirliyinin “Raduqa” Ümumrusiya suvarma və kənd təsərrüfatının su təchizatı ETİ tərəfindən tətbiq edilib. Onlar yaxın perspektivdə aqrar sənaye kompleksinin, elmi-tədqiqat işlərinin planlaşdırılması, yaş-cins qrupları nəzərə alınaraq iribuynuzlu mal-qaranın qida maddələrinə və ayrı-ayrı yemlərə tələbatının hesablanması, heyvandarlıq təsərrüfatında istehsalat strukturunun və yem bazasının optimallaşdırılması, RF ət, soyuducu və quş emalı sənayesində texnologiyaların müqayisəli qiymətləndirilməsi, innovasiya layihələri portfelinin və elmi strukturun formalaşdırılması və onlarla operativ idarəetmə, Rusiya və xarici çiləmə texnikasının istismarı prosesində suvarmanın norma və müddətinin tərtib olunması və suvarma texnikasının çoxməqsədli istifadəsi zamanı mineral gübrələrin və üzvi maddələrin daxiledilmə dozasının hesablanması sahəsində RF Kənd Təsərrüfatı Nazirliyinin elmi-texniki siyasəti formalaşdırılarkən nəzərə alınıb.

Y.Qarayev tərəfindən əldə edilən tədqiqat nəticələri, həmçinin RF Elm Nazirliyi, RF Sənaye Elm Nazirliyi və RKTEA-nın aqrar-sənaye kompleksi sahələrinin informasiya-analitik təminatının analizi və qiymətləndirilməsi üzrə metodikası (1996), aqrar-sənaye kompleksi sahələrində elmi layihələrin iqtisadi əsaslandırılması üzrə metodik tövsiyələr (1999), aqrar-sənaye kompleksinin emal sahələrində elmi-texniki fəaliyyət və intellektual mülkiyyət obyektlərinin nəticələrinin qiymətləndirilməsi və istifadə olunmasının müəyyənləşdirilməsi üzrə metodik tövsiyələr (2000) kimi normativ sənədlərin hazırlanmasında istifadə olunub.

Y.Qarayev dərc olunmuş 70-ə yaxın işin, o cümlədən “ASK-da texnoloji proseslərin optimallaşdırılmış modellər əsasında elmi əsaslandırılması və təkmilləşdirilməsi” adlı bir monoqrafiyanın müəllifidir. O, 2003-cü ildən BMT-nin baş məşvərətçi statusunda Beynəlxalq İnformasiyalaşdırma Akademiyasının akademikidir.

2006-cı ildə Y.Qarayev Rusiya elminin və texnikasının inkişafına verdiyi böyük şəxsi töhfəsinə görə RF Elm və Təhsil Nazirliyinin əmri ilə “Rusiya Federasiyasının elm və texnika fəxri işçisi” döş nişanı ilə təltif edilib.

Dünya Azərbaycanlıları Konqresi qurultayının nümayəndəsi olub.



## Qasımov
## Adil Xəlil oğlu
*"Mosoblinjstroy" ASC-nin prezidenti*

Qasımov Adil Xəlil oğlu 1937-ci il mayın 26-da Azərbaycan Respublikasının Kirovabad (indiki Gəncə) şəhərində anadan olub.

Əmək fəaliyyətinə 1960-cı ildə Bauman adına Moskva Ali Texniki Məktəbini bitirdikdən sonra Moskva Vilayət Tikinti Komitəsi sistemində başlayıb. Diplom aldığı vaxtdan bu günədək Mıtışi eksperimental avtomexaniki zavodunda mühəndislikdən Moskva vilayət tikinti komitəsi sədrinin müavini, daha sonra "Mosoblinjstroy" Açıq Səhmdar Cəmiyyətində prezidentliyə qədər yol keçib.

Xalq təsərrüfatının inkişafında nailiyyətlərə görə A.Qasımov dəfələrlə hökumət mükafatları ilə təltif edilib: "Qırmızı Əmək Bayrağı" ordeni, "Xalqlar dostluğu" ordeni. Həmçinin SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin üç qızıl, gümüş və bürünc medalları ilə təltif olunub. 1992-ci ildə A.Qasımov Ümumrusiya Sərgi Mərkəzi tərəfindən "ÜSM laureatı" medalına layiq görülüb.

Dəmir-beton konstruksiyaların daşınması üçün ixtisaslaşdırılmış nəqliyyat vasitələrinin elmi işlənməsi və inşaata tətbiqə layihələndirməsinə görə A.Qasımov 1980-ci ildə SSRİ Nazirlər Sovetinin mükafatına, 1989-cu ildə isə çoxməqsədli ixtisaslaşmış avtonəqliyyat vasitələrinin tikintiyə tətbiqinə görə SSRİ Nazirlər Sovetinin ikinci mükafatına layiq görülüb.

Tikinti sahəsində xidmətlərinə və çoxillik vicdanlı əməyinə görə A.Qasımova 1987-ci ildə "RSFSR-in Əməkdar İnşaatçısı" adı verilib. Onun iştirakı ilə Moskva vilayətində mühəndis təyinatlı obyektlərin (qazanxanalar, mərkəzi istilik məntəqələri, təsərrüfat çirkab axınlarının təmizləyici qurğuları, nasos stansiyaları, transformator yarımstansiyaları, qazpaylayıcı məntəqələri və s.) iri bloklu tikintisi metodu geniş yayıldı.

Yalnız son bir neçə ildə Moskva vilayətində ümumi gücü saatda 700 giqakalori olan 50-dən çox iri qazanxana, 19 mərkəzi istilik məntəqəsi, ümumi gücü sutkada 100 min kubmetrdən çox olan 8 böyük təmizləyici qurğu tikilib.

Rusiyada ilk dəfə istehsalat binalarının qaz-hava şüalı parlaq istilik sistemi tətbiq edilib ki, bu da müəssisələrdə istilik xərclərini xeyli (ümumən 30 faiz) azaltmağa, eyni zamanda fəhlələrin rahatlığının yaxşılaşdırılmasına imkan verib.

A.Qasımovun iştirakı ilə bahalı istilik şəbəkəsi və onlara xidmət sistemlərinin tikintisindən imtina etmək məqsədi ilə Moskva vilayətinin çoxmənzilli yaşayış evlərinin tikintisində fərdi istilik təchizatı mənbələri tətbiq edilir. Yalnız bu tədbir Moskva vilayətinin yaşayış sektorunun istilik xərclərini gələcəkdə 2-2,5 dəfə azaltmağa imkan verəcək.

Uzun illər A.Qasımov su təchizatı, kanalizasiya, qaz şəbəkələrinin tikintisi ilə məşğul olur. Onların sırasına sutkada 126 min kubmetr gücü olan Şərq su təchizatı sistemi, yeni texnologiya ilə bütünlüklə polietilen borulardan hazırlanan “Axrikin” zavodunun kanalizasiya kollektoru, bir hissəsi polietilendən hazırlanmış 1000 kilometrdən çox qaz şəbəkəsi daxildir.

A.Qasımov prezident vəzifəsini icra etdiyi “Şerrizon” azad iqtisadi zonası yaradılmasının təşəbbüskarıdır.

İstehsalat fəaliyyəti ilə yanaşı, A.Qasımov fəal ictimai fəaliyyətlə məşğul olur, hazırda Rusiya Federasiyası İnşaatçılarının Elmi-Texniki Cəmiyyəti sədrinin müavini, Moskva Ticarət-Sənaye Palatasının vitse-prezidenti, “Mexanizasiya stroitelstva” jurnalının redaksiya heyətinin üzvüdür.



## Qasımov Ramiz Əlicavad oğlu

*Texnika elmləri doktoru, professor.*
*Şimali Qafqaz Elmi-Tədqiqat Layihə Təbii Qazlar İnstitutunun baş direktoru*

Qasımov Ramiz Əlicavad oğlu 1958-ci il avqustun 23-də Azərbaycan Respublikasının Kürdəmir rayonunun Qarasu kəndində anadan olub.

1981-ci ildə M.Əzizbəyov adına Azərbaycan Neft-Kimya İnstitutunun (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) neft-qaz mədəni fakültəsini fərqlənmə diplomu ilə bitirib. 1981-1991-ci illərdə SSRİ Qaz Sənayesi Nazirliyinin "Türkmənqazsənaye" Ümumittifaq Sənaye Birliyində müxtəlif rəhbər vəzifələrdə çalışıb, Türkmənistanda yeni qaz yataqlarının mənimsənilməsində iştirak edib.

1987-ci ildə R.Qasımov SSRİ Ümumittifaq İxtiraçılar və Səmərələşdiricilər Cəmiyyətinin, eləcə də SSRİ Elm, texnika və gənclərin elmi-texniki yaradıcılığı Komitəsinin mükafatları laureatı olub.

1991-ci ildə R.Qasımov müsabiqə əsasında Şimali Qafqaz Elmi-Tədqiqat Layihə Təbii Qazlar İnstitutuna baş elmi işçi vəzifəsində işə götürülüb. 1996-cı ildən R.Qasımov quyuların əsaslı təmiri və yeraltı qaz anbarı şöbəsinin müdiri olub. 1998-ci ildə onun təşəbbüsü ilə "Quyuların əsaslı təmiri" adlı yeni elmi istiqamət yaradılıb. R.Qasımov quyuların əsaslı təmiri və yeraltı qaz anbarı sahəsində baş direktorun elmi işlər üzrə müavini vəzifəsini tutmaqla yeni istiqamətə rəhbərlik edib.

Bu elmi istiqamət çərçivəsində həyata keçirilən layihələrin köməyi ilə Urenqoy, Yamburq, Vınqapurovsk, Komsomolsk, Bovanenkov, Vuktılski və digər qaz, qaz-kondensat yataqlarında quyuların qazılması və mənimsənilməsi texnoloji proseslərinin təkmilləşdirilməsinə dair böyük işlər yerinə yetirilib.

2002-ci ildə R.Qasımov baş direktorun elmi və layihə-tədqiqat istiqamətlərini koordinasiya edən elm üzrə birinci müavini təyin edilib. 2005-ci ildə "SevKavNİPİqaz" ASC-nin baş direktoru vəzifəsini tutub.

Quyuların qazılması və əsaslı təmiri sahəsində toplanan təcrübə 1994-cü ildə müdafiə edilən namizədlik və 1999-cu ildə doktorluq dissertasiyalarında R.Qasımov tərəfindən nəzəri cəhətdən ümumiləşdirilib və sistemləşdirilib.

2002-ci ildə R.Qasımov Rusiya Təbiət Elmləri Akademiyası və Dağ Elmlər Akademiyası, 2006-cı ildə Beynəlxalq İnformasizasiya Akademiyası, 2007-ci ildə Rusiya Tə-

biətşünaslıq Elmləri Akademiyası, 2008-ci ildə Texnoloji Elmlər Akademiyasının həqiqi üzvü seçilib.

2003-cü ildə R.Qasımova neft və qaz quyularının qazılması kafedrasının professoru adı verilib, 2004-cü ildə isə o, "qazma və quyuların mənimsənilməsi texnologiyası" ixtisası üzrə professor adı alıb.

R.Qasımov Şimali Qafqaz Dövlət Texniki Universitetinin neft və qaz quyularının qazılması kafedrasının və Kuban Dövlət Texnologiya Universitetinin sənaye maşınları və avadanlıqları kafedrasının professoru olub. 2004-cü ildə "qazılma texnologiyası və buruqların mənimsənilməsi" ixtisası üzrə professor elmi dərəcəsi verilib.

R.Qasımov Şimali Qafqaz Dövlət Texniki Universitetində doktorantura və aspiranturaya rəhbərlik edir. Onun rəhbərliyi altında 15-dən çox adam namizədlik və doktorluq dissertasiyası hazırlayıb.

Alim Rusiya Federasiyası və digər ölkələrin müxtəlif elmi nəşrlərində dərc olunan 360-dan çox elmi məqalənin həmmüəllifi, 79 ixtiranın şəhadətnamə və patentinə sahibdir.

2001-ci ildə R.Qasımov "Quyuların məhsuldarlığının artırılmasına yönəldilən kompleks texnologiyalar (texnoloji həllər)" işinə görə "Qazprom" ASC mükafatının laureatı adına layiq görülüb.

2006-cı, 2008-ci, 2009-cu, 2011-ci və 2013-cü illərdə R.Qasımov N.K.Baybakov adına "Energetika və cəmiyyətin davamlı inkişafı probleminin həllində böyük nailiyyətlərə görə" mükafatının laureatı olub. O, dəfələrlə "Qazprom" ASC İdarə Heyəti sədrinin və Stavropol vilayəti qubernatorunun fəxri diplomları ilə təltif edilib. Yanacaq-energetika kompleksi sistemində uzunmüddətli və məhsuldar işinə, neft və qaz sənayesinin inkişafına böyük töhfəsinə görə 2006-cı ildə R.Qasımov Rusiya Federasiyası Sənaye və Energetika Nazirliyinin diplomu ilə təltif olunub. 2011-ci ildə Stavropol diyarının "Şərəfli əməyə görə" medalı ilə təltif edilib.

2006-cı ildə o, "Rusiya qaz sənayesinin yüz ən yaxşı rəhbəri" Ümumrusiya Müsabiqəsinin qalibi elan olunub, "Rusiya iqtisadiyyatının inkişafına töhfəsinə görə" medalı ilə təltif edilib və "Rusiyanın sosial-iqtisadi inkişafı məsələləri üzrə Ali Koordinasiya Şurası"nın tərkibinə daxil edilib, "Baş ekspert" statusu ilə Rusiya iqtisadi onlayn Birliyinə qəbul olunub. 2009-cu ildə R.Qasımova ""Rusiya Federasiyasının Əməkdar Elm Xadimi" fəxri adı verilib.

Hazırda R.Qasımov Şimali Qafqaz Elmi-Tədqiqat Layihə Təbii Qazlar İnstitutunun baş direktorudur.



## Qasımov
## Rauf Cabbar oğlu

*Tibb elmləri doktoru, professor.*
*Professor A.L.Polenov adına Rusiya Elmi-Tədqiqat Neyrocərrahiyyə İnstitutunun şöbə müdiri*

Qasımov Rauf Cabbar oğlu 1943-cü il martın 5-də Azərbaycan Respublikasının Tovuz rayonunun Qoşa kəndində anadan olub.

1968-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Dövlət Tibb Universiteti) fərqlənmə diplomu ilə bitirib. Elə həmin il Azərbaycan Səhiyyə Nazirliyinin təyinatı ilə professor A.L.Polenov adına Leninqrad Neyrocərrahiyyə İnstitutunun (ölkənin qocaman elmi müəssisəsi və dünyada ilk elmi-praktiki neyrocərrahiyyə institutu 1926-cı ildə yaradılıb; hazırda professor A.L.Polenov adına Rusiya Elmi-Tədqiqat Neyrocərrahiyyə İnstitutu adlanır, 2015-ci ildən Şimal-Qərb Federal Tibbi Tədqiqat Mərkəzinin filialıdır) ordinatura və aspiranturasına göndərilib.

1973-cü ildə R.Qasımov ağır kəllə-beyin zədəsi ilə beyin oksidləşdirmə-reduksiya proseslərinin pozuntusuna həsr edilmiş namizədlik dissertasiyası müdafiə edib. Əldə edilmiş məlumatlar əsasında, o, bu pozuntuların medikamentoz korreksiyası metodlarını işləyib hazırlayıb. Dağılmış beyin ocaqlarının mövcudluğu ilə ağır kəllə-beyin zədələrinin diaqnostikası və müalicəsinə həsr olunan doktorluq dissertasiyasını R.Qasımov 1989-cu ildə müdafiə edib.

Professor R.Qasımov tərəfindən tibbi praktikada ilk dəfə beyin yarımkürələrinin böyük dağılma ocaqlarının mövcudluğu ilə ağır kəllə-beyin zədələrinin kliniki gedişi tipi nəzərə alınmaqla ilkin diaqnoz və fərqli cərrahi taktika sistemi hazırlanıb. Klinik və cərrahi mövqedən beynin dağılma ocaqlarının xarakterik formaları və kliniki gedişi tədqiq və təsvir edilib. Onun klinik-fizioloji, klinik-bioloji və neyrohistoloji araşdırmaları əsasında beyin yarımkürələrinin dağılma ocaqlarının kompleks müalicəsi metodu hazırlanıb.

R.Qasımovun tətbiq etdiyi yeni reanimasiya metodları – dərman vasitələrinin regional daxili arterial infuziyaları – qan dövranının təkrar yaranan pozuntularının qarşısını almaqla beyin toxumasının nekrozunun artmasını dayandıra bilər.

R.Qasımovun təşəbbüsü ilə onun rəhbərlik etdiyi şöbədə reanimasiya və intensiv terapiya palataları təşkil olunub, kəllə qübbəsi və onurğa sümüklərində bərpa əmə-

liyyatları kompleksi, eləcə də bir sıra reabilitasiya tədbirləri hazırlanıb və tətbiq olunub.

1999-cu ildə R.Qasımov "Rusiya Federasiyasının Əməkdar Həkimi", 2007-ci ildə "Rusiya Federasiyasının Əməkdar Elm İşçisi" fəxri adları ilə təltif olunub. İnstitut isə 2015-ci ildə, o cümlədən R.Qasımovun əməyi sayəsində, "nevrologiya", "neyrocərrahiyyə" nominasiyalarında Sankt-Peterburqun ən yaxşı klinikaları reytinqinin laureatı diplomu alıb.

Professor R.Qasımov 300-dən çox elmi məqalənin, neyrocərrahiyyənin müxtəlif aspektlərinə həsr olunan 4 monoqrafiyanın müəllifidir. Onun patentlə müdafiə olunan neyrocərrahiyyə praktikası sahəsinə aid 19 ixtirası var. O, elmlər doktoru dərəcəsi verilməsi üzrə Rusiya Elmi-Tədqiqat Neyrocərrahiyyə İnstitutunun Elmi Şurasının üzvüdür. Onun rəhbərliyi altında onlarla magistr və doktorluq dissertasiyası hazırlanıb və müdafiə edilib.

R.Qasımov - əməliyyat aparan cərrahdır. Bir çox xəstə onun "qızıl əllər"i və unikal həkim həssaslığı haqqında tərifli rəylər və minnətdarlıq sözləri yazıb. Elmi-Tədqiqat İnstitutunun pasiyentlərindən biri qeyd edib: "Rauf Qasımov Azərbaycanın qürurudur". Onun yolunu professor A.L.Polenov adına Rusiya Elmi-Tədqiqat Neyrocərrahiyyə İnstitutunda işləyən oğlu Vüqar Qasımov davam etdirir.

R.Qasımov "Sankt-Peterburqun 300 illiyi xatirəsinə" medalı ilə təltif edilib.



## Qasımova
## Lalə Nəriman qızı

*Tibb elmləri doktoru, professor.*
*Nijni Novqorod Dövlət Tibb Akademiyasının psixiatriya və tibbi psixologiya kafedrasının müdiri*

Qasımova Lalə Nəriman qızı 1955-ci ildə Dnepropetrovskda (Ukrayna) anadan olub.

1973-cü ildə İ.P.Pavlov adına 1-ci Leninqrad Tibb İnstitutunu bitirib və təyinatla Novqorod vilayətində psixiatr işləyib. Sonra Volqoqrad Elmi-Tədqiqat İnstitutunda çalışıb.

1981-ci ildə L.Qasımova S.M.Kirov adına Qorki Tibb İnstitutunun psixiatriya kafedrasında psixiatriya üzrə aspirantura bitirib. 1986-cı ildə "Uzun sürən nevrozların kliniki dinamika və proqnozu" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1987-ci ildən Qorki Tibb İnstitutunun (sonralar Nijni Novqorod Dövlət Tibb Akademiyası) psixiatriya kafedrasının assistenti, 1994-cü ildən dosenti işləyib. 1998-ci ildən Nijni Novqorod Dövlət Tibb Akademiyasının psixiatriya və tibbi psixologiya kafedrasının müdiridir.

2001-ci ildə L.Qasımova "İri sənaye mərkəzi əhalisinin psixi sağlamlığı, klinik-epidemioloji və sosio-mədəni aspektlər" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 2003-cü ildə professor elmi adı alıb.

L.Qasımova Privoljsk federal dairəsində psixiatrik istiqamətlər üzrə Mərkəzi Attestasiya Komissiyasının və Nijni Novqorod Psixiatrlar və Psixiatrik Liqasının sədridir.

82 elmi əsər və tədris-metodiki tövsiyənin, o cümlədən "Şəxsiyyətin spesifik pozuntuları", "Uşaqlıq dövrünün psixopatoloji sindromları" və digər elmi əsərlərin müəllifidir.

Onun elmi rəhbərliyi altında 9 namizədlik dissertasiyası müdafiə olunub. Elmi fəaliyyətinin əsas istiqamətləri psixi sağlamlıq, psixomatik pozuntular, defisitar pozuntular problemləridir.



## Qasımzadə
## Azər Ərəstun oğlu

*Texnika elmləri doktoru, professor.*
*On doqquz Mayıs Universitetinin inşaat qurğular kafedrasının müdiri*

Qasımzadə Azər Ərəstun oğlu 1955-ci il fevralın 23-də Azərbaycan Respublikasının Bərdə şəhərində anadan olub.

1972-ci ildə Şuşada Ü.Hacıbəyov adına 1 saylı orta məktəbi qızıl medalla bitirib, 1978-ci ildə Azərbaycan İnşaat Mühəndisləri İnstitutunu (indiki Azərbaycan Memarlıq və İnşaat Universiteti) "Sənaye və mülki tikililəri konstruktoru" ixtisası üzrə ali təhsilini bitirib. 1978-ci ildə təyinatla SSRİ Neft və Qaz Sənayesi Nazirliyinin "Dənizneftqaz" Elmi-Tədqiqat və Layihə İnstitutunun dəniz qurğuları şöbəsinə göndərilib və orada mühəndis-konstruktor kimi işləyib, Xəzər, Azov və Qara dənizlərdəki yataqların hesablama-layihə, maket və modelləşdirmə sahəsindəki tədqiqatlarda iştirak edib.

1980-1983-cü illərdə A.Qasımzadə V.V.Kuybışev adına Moskva İnşaat Mühəndisləri İnstitutunun inşaat mexanikası kafedrasının aspiranturasında təhsil alıb. Paralel olaraq "Dənizneftqaz" Dövlət Elmi-Tədqiqat və Layihə İnstitutu ilə müqavilə əsasında Moskva İnşaat Mühəndisləri İnstitutunda neft-qaz hasilatı sənayesi üçün dəniz platformalarının üst hissələrinin hesablanmasının etibarlılığı tədqiqatlarını davam etdirib.

1983-cü ildə namizədlik dissertasiyasının müdafiəsindən sonra A.Qasımzadə "Dənizneftqaz" Dövlət Elmi-Tədqiqat və Layihə İnstitutunun hesablama mərkəzinin avtomatlaşdırılmış layihələndirmə sistemləri şöbəsində işini davam etdirib və əvəzçilik əsasında İnşaat Mühəndisləri İnstitutunda mühazirələr oxuyub.

1987-1991-ci illərdə A.Qasımzadə Moskva İnşaat Mühəndisləri İnstitutunda inşaat mexanikası kafedrasının doktoranturasında təhsil alıb. "Dənizneftqaz" Dövlət Elmi-Tədqiqat və Layihə İnstitutu ilə elmi və yaradıcı əməkdaşlıq müqaviləsi əsasında o, Moskva İnşaat Mühəndisləri İnstitutunda neft və qaz sənayesi üçün qazma qurğularının anker bərkitmələrinin etibarlılığının hesablanması tədqiqatlarını davam etdirib. 1991-ci ildə o, texnika elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. Dissertasiya neft və qaz sənayesi və hərbi sənayedə tətbiqi nümunələrlə

müasir xüsusi qurğuların yaradılmasında inşaat mexanikasının etibarlılıq nəzəriyyəsi sahəsində müəllifin fundamental əsərləri əsasında hazırlanıb. Bu tədqiqatların əsas nəticələri "İzvestiya AN SSSR. Mexanika tvyordoqo tela", "Stroitelnaya mexanika i rasçyot soorujeniy" jurnallarında, habelə müəllifin monoqrafiyasında nəşr edilib. Sonralar onlar üzən qazma qurğuları, "PPNO-600" dartılmış dayaqla yarımdalma platformaları, stasionar dəniz təməl platformaları, anten qurğuları, avtomobil yolları, neft-qaz sənayesi və hərbi sənayedə digər xüsusi qurğuların layihələndirilməsində tətbiq edilib.

1991-ci ildə A.Qasımzadə təcrübə mübadiləsi üçün Nyu-Cersi Texnologiya İnstitutunun inşaat fakültəsinə və Prinston Universitetinə (ABŞ) dəvət olunub. 1992-1995-ci illərdə Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun inşaat mexanikası kafedrasında professor vəzifəsində çalışıb.

1995-ci ildə Türkiyənin On doqquz Mayıs Dövlət Universitetinin dəvəti ilə A.Qasımzadə inşaat fakültəsinin əsasını qoyub və o vaxtdan inşaat qurğuları kafedrasına rəhbərlik edir. İnşaat fakültəsinin laboratoriya bazasını yaratmaq üçün A.Qasımzadənin rəhbərliyi ilə bir sıra layihələr həyata keçirilib. Əsas layihələrdən biri 250 min avro büdcəli "Non-Destructive Dynamic Properties of Building Structures and Health Monitoring" qurğuların müasir dinamikasına (modial analizə dayaqlanan tikililərin seysmik davamlılığının təyin edilməsi) həsr olunub. Bu layihə 2002-2007-ci illərdə həyata keçirilib.

Həmin tədqiqatlar əsasında tikililərin dinamika və seysmik davamlılığı mobil (səyyar) laboratoriyası yaradılıb. Bu laboratoriya mövcud qurğuların seysmik davamlılığı vəziyyətini qiymətləndirir. Bu nəzəri və tətbiqi tədqiqatların nəticələri Türkiyə, Yaponiya, İngiltərə, İsveçrə, Amerika, Portuqaliya, İtaliya və digər ölkələrdə keçirilən beynəlxalq konfranslarda açıqlanıb.

2008-ci ildən A.Qasımzadə həmçinin tikililərin zəlzələdən seysmik müdafiəsinin yeni nəsil cihazlarının hazırlanması və yaradılması ilə məşğul olub. Onun yaradılma ideyası təxminən səkkiz əsr boyu İstanbulun seysmik cəhətdən ən aktiv sahəsi olan Sultan Əhməd meydanında güclü zəlzələlərin təsirindən tarixi "Orme Dikilitaş" (təxminən 1200-cü ildə inşa edilib) sütununun seysmik sabitlik riyazi sonlu element modelləşdirməsi zamanı ortaya çıxıb. Hərtərəfli riyazi modelləşdirmə nəticəsində müəyyən olunub ki, sütunun daxilində seysmik izolyator tipli gizli qurğu var, həmin qurğunun sayəsində o, ziyan görməyib. Həmçinin bu fərziyyənin yeganəliyi sübut edilib.

Aşkar edilən "seysmik izolyator tipli gizli qurğu" əsasında tikililərin seysmik mühafizəsi üçün seysmik izolyator modelləşdirilib. Tədqiqatların nəticələri Portu-

qaliyada, ABŞ-da beynəlxalq konfranslarda təqdim edilib, Yaponiyadakı konfransa isə A.Qasımzadə əsas məruzəçi kimi dəvət olunub.

2012-2016-cı illərdə əvvəlki işləri ilə paralel olaraq A.Qasımzadə NATO layihəsinin (300 min avroluq büdcə ilə) direktoru kimi geodinamik monitorinqin yeni beynəlxalq vahid sisteminin və sürüşmə zonalarında təhlükənin erkən xəbərdarlıq sisteminin işlənib hazırlanması və yaradılmasına başlayıb.

A.Qasımzadə inşaat mexanikası sahəsində mütəxəssisdir. Onun tədqiqatlarının əsas istiqaməti qeyri-bircins əsasların riyazi modelləri, qurğuların zəlzələdən müdafiəsinin yeni nəsil seysmik cihazların riyazi sonlu-element modelləri, sonlu-element modal təhlilə və say modelinin kalibrləmə əsasında qurğuların seysmik sabitlik vəziyyətini təyinetmənin riyazi modelləridir.

A.Qasımzadə 100-dən çox elmi əsərin, o cümlədən 1 monoqrafiyanın, ali məktəblər üçün 8 kitab və dərsliyin müəllifi və həmmüəllifidir. İki kitabın ikinci nəşri ("Finite Element Method: Fundamentals and Application on Structural Mechanic, Second edition" (2004) və "Structural Dynamics: Fundamentals and Application on Earthquake Engineering, Second Edition" (2005) "MathWorks" proqram və riyazi təminatı sahəsində ABŞ-ın dünya şöhrətli aparıcı təşkilatları tərəfindən dəstəklənib və təşviq edilib və Beynəlxalq şəbəkədə altı dildə təqdim olunur.

A.Qasımzadə bir çox beynəlxalq təşkilatların üzvüdür: "European Association for Earthquake Engineering-EAEE", "Turkish American Scientists and Scholars Association-TASSA", "International Association for Bridge Maintenance and Safety –IABMAS", "European Science Foundation-ESF", "World Organization for Scientific Cooperation – WOSCO" və sair.

A.Qasımzadənin bioqrafiyası Markusun "Dünyada kim kimdir" Ensiklopediyasının ("Who's Who in the World", A.N.Marquis publication in USA) 31-ci nəşrində dərc olunacaq.

## Qasımzadə
## Fəridə Nadir qızı

*"Medtronic, Inc" metallurgiya laboratoriyasının müdiri*



Qasımzadə Fəridə Nadir qızı Bakı şəhərində anadan olub.

Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunun metallurgiya fakültəsini bitirib. Ümumittifaq Neft Maşınqayırması Elmi-Tədqiqat və Layihə-Texnoloji İnstitutunda (ÜNMETLTİ) elmi işçi, Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunda müəllim işləyib.

F.Qasımzadə ikinci nəsildə mühəndis-metallurqdur. Onun atası professor, elmlər doktoru Nadir Qasımzadə Azərbaycanda metallurgiya sənayesinin inkişafına böyük töhfələr vermiş Azərbaycan Politexnik İnstitutunun metallurgiya fakültəsinin banisidir.

1994-cü ildə Minnesota ştatına (ABŞ) köçdükdən sonra F.Qasımzadə öz ixtisası üzrə işləməyi davam etdirir. 10 il ərzində o, aviamaşınqayırma və maşınqayırma üçün mürəkkəb alüminium tökmələr istehsal edən şirkətdə baş metallurq olub. Bu dövrdə o, "Boeing", "Lockheed Martin", "Honda", "Harley Davidson" kimi dünyada tanınan şirkətlər ilə sıx əməkdaşlıq edib.

Hazırda F.Qasımzadə tibbi texnologiya və xidmətlərin köməyi ilə insanların həyat keyfiyyətini yaxşılaşdırma istiqamətində işləyən qabaqcıl qlobal şirkətin (155 ölkədə 85 min işçi) "Medtronic, Inc" metallurgiya laboratoriyasına rəhbərlik edir. F.Qasımzadənin rəhbərlik etdiyi laboratoriya kardiologiya, nevrologiya və diabet sahəsində bir çox tibbi implantların, habelə maqnit-rezonans tomoqrafiyasının (MRT) köməyi ilə analizlə uyğunlaşan dünyada ilk ən kiçik kardiostimulyatorun və ilk stimulyator üçün batareyanın hazırlanmasında birbaşa iştirak edib.

F.Qasımzadə gənc nəslin, xüsusilə qadınların materialşünaslıq sahəsinə cəlb edilməsində fəal iştirak edir, Minnesotadakı "ASM International"ın ("America Society for Materials") Direktorlar Şurasının üzvüdür. 2005-2006-cı illərdə Direktorlar Şurasının sədri olub.

F.Qasımzadə 20-dən çox elmi məqalənin müəllifidir və bir neçə patent alıb.



## Qocayev
## Zahid Adıgözəl oğlu

*Texnika elmləri doktoru, professor.*
*Ümumrusiya Elmi-Tədqiqat Kənd Təsərrüfatının Mexanikləşdirilməsi İnstitutu direktorunun innovasiya və tətbiq fəaliyyəti üzrə müavini*

Qocayev Zahid Adıgözəl oğlu 1951-ci il avqustun 8-də Azərbaycan Respublikasının Bərdə rayonunda anadan olub.

N.E.Bauman adına Moskva Dövlət Texniki Məktəbinin aspiranturasını bitirdikdən və 1979-cu ildə namizədlik dissertasiyası müdafiə etdikdən sonra Elmi Avto-Traktor İnstitutunda (EATİ) işləyib. 1982-ci ildən mobil maşınların yüklənməsi və möhkəmliyi nəzəriyyəsi, hesablama metodları və proqram təminatının yaradılması və mobil maşınların möhkəmliliyi sahəsində kompyuter hesablamalarının hazırlanmasında çoxmeyarlı optimallaşdırmanın tətbiqi və eksperimental məlumatların emalı üzərində işləyib. Konstruksiyaların struktur elementlərinin yüksəlməsinin statistik tədqiqat metodlarını, traktor və yük maşınlarının hədd rejimlərini modelləşdirməyi öyrənən Z.Qocayev 1994-cü ildə EATİ-də doktorluq dissertasiyası müdafiə edib.

Z.Qocayev avtotraktor texnikasının hesablama-eksperimental tədqiqatları sahəsində aparıcı mütəxəssislərdən biridir. Bu sahədə onu Elmi-Tədqiqat İnstitutunun işgüzar, məqsədyönlü rəhbəri, təcrübəli müəllim və bütöv elmi istiqamətin yaradıcısı kimi tanıyırlar.

Onun rəhbərliyi və EATİ-də fəal iştirakı ilə 100-dən çox elmi hesabat nəşr olunub. Z.Qocayev “T-150K”, “K-701M”, “T-25.01”, “T-4A”, “LTZ-155”, “T-170”, “T-10”, “VTZ-30” traktorları və “ZİL-133QY” avtomobillərinin təkmilləşdirilməsi işlərində birbaşa iştirak edib.

2002-ci ildən Z.Qocayev Federal Tədqiqat Sınaq Kənd Təsərrüfatı Maşınqayırması Mərkəzinin (FTSKTMM) (2004-cü ildə mərkəzin özəlləşdirilməsindən sonra “FTSKTMM M” ASC-nin) baş direktoru olub. Həmin vaxtdan o, ekstremal temperatur rejimlərində (+ 50 ° -60 ° C) mobil maşınların etibarlılığının və konstruksiyaların iş qabiliyyətliliyinin tədqiqi, Rusiya Federasiyasının Sənaye Elmi Nazirliyi və Sənaye Energetikası Nazirliyi ilə müqavilələr əsasında yerinə yetirilən və ölkənin maşınqayırma sənayesi üçün mühüm əhəmiyyətə malik kənd təsərrüfatı məqsədləri üçün mobil nəqliyyat vasitələrinin yaradılması və sınağı üzrə elmi işlərə rəhbərlik edir.

2007-ci ildən Z.Qocayev "2007-2012-ci illərdə Rusiya elmi-texnoloji kompleksinin prioritet istiqamətləri üzrə tədqiqat və layihələr" Federal Məqsədli Proqram çərçivəsində (Rusiya Federasiyası Təhsil Nazirliyi) maşınqayırma nanotexnologiyaların tətbiqi üzrə bir sıra dövlət müqavilələrinin elmi rəhbəridir.

Əsas fəaliyyəti ilə yanaşı, son 17 ildə Z.Qocayev N.E.Bauman adına Moskva Dövlət Texniki Universitetində və Moskva Dövlət Açıq Universitetində "dinamika və maşınların möhkəmliyi", "tətbiqi riyaziyyat və informatika" ixtisaslarında pedaqoji iş aparır. 120-dən çox elmi məqalə, məruzə, ixtira və monoqrafiyanın müəllifidir.

Z.Qocayev "təkərli və tırtıllı maşınlar" ixtisası üzrə Xüsusi Dissertasiya Şurasının üzvüdür.

2000-ci ildə Z.Qocayev Rusiya Federasiyası Prezidentindən təşəkkürnamə alıb. Dəfələrlə SSRİ Kənd Təsərrüfatı Avtomobilləri Nazirliyinin fəxri fərmanları ilə təltif edilib. 2011-ci ildə "Rusiyanın fəxri maşınqayırmaçısı" nişanı ilə mükafatlandırılıb.

2012-ci ildən Ümumrusiya Elmi-Tədqiqat Kənd Təsərrüfatının Mexanikləşdirilməsi İnstitutu direktorunun innovasiya və tətbiq fəaliyyəti üzrə müavinidir.



## Qədiməliyev
## Davud Əli oğlu

*Biologiya elmləri doktoru, professor.*
*N.P.Oqaryov adına Mordoviya Dövlət Universitetinin biologiya fakültəsinin biotexnologiya kafedrasının professoru*

Qədiməliyev Davud Əli oğlu 1952-ci il noyabrın 7-də Azərbaycan Respublikasının Mingəçevir şəhərində anadan olub.

1975-ci ildə M.P.Oqaryov adına Mordoviya Dövlət Universitetinin fizika fakültəsini bitirib. 1976-cı ildən həmin universitetdə əvvəlcə tədris ustası, sonra mühəndis, kiçik elmi işçi, müəllim, baş müəllim vəzifələrində işləyib.

1980-1985-ci illərdə D.Qədiməliyev M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin aspiranturasında oxuyub və "biofizika" ixtisası üzrə namizədlik dissertasiyası müdafiə edib. 1992-ci ildə ona dosent elmi adı verilib.

1983-1986-cı illərdə D.Qədiməliyev M.P.Oqaryov adına Mordoviya Dövlət Universitetinin biologiya fakültəsinin dekan müavini olub. 2003-cü ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetində "biotexnologiya" ixtisası üzrə "Bitki xammalı və mikrobiologiya sənayesi tullantılarından alınan qeyri-toksik kompozisiya materiallarının biotexnologiyası" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Elə həmin il biotexnologiya kafedrasının professoru vəzifəsinə seçilib.

Alim elmi-pedaqoji fəaliyyət illəri ərzində biotexnologiya sahəsində təxminən 200 diplomçu-mütəxəssis yetişdirib. Onun elmi rəhbərliyi altında 5 namizədlik dissertasiyası müdafiə edilib.

D.Qədiməliyev 9 patentin sahibi, 140-dan çox elmi işin, o cümlədən 2 monoqrafiyanın (həmmüəllif kimi), 3 dərs vəsaitinin müəllifidir. Bu dərs vəsaitlərindən 2–si Rusiya universitetlərinin biologiya üzrə tədris-metodik şöbəsinin qrifi ilə nəşr edilib.

D.Qədiməliyevin rəhbərliyi altında aparılan tədqiqatlar RF Təhsil və Elm Nazirliyinin, Fundamental Araşdırmalar Mərkəzinin, Mordoviya Respublikası Hökumətinin "Rusiya Universitetləri" və "Ali məktəbin elmi potensialının inkişafı" qrantlarının və proqramlarının dəstəyi ilə yerinə yetirilib və indi də bu qayda ilə yerinə yetirilir.

D.Qədiməliyev doktorluq dissertasiyalarının müdafiəsi üzrə dissertasiya şurasının üzvü, fakültə elmi şurasının üzvü, fakültə attestasiya komissiyasının sədri, biologiya

elmləri üzrə ekspert şurasının sədridir. RF Təhsil və Elm Nazirliyi onu dəfələrlə "Rosobrnadzor"un və "Rossakredaqentstvo"nun müvəkkili kimi ali məktəblərin və kolleclərin attestasiyası üçün cəlb edib.

D.Qədiməliyev "Talina" Aqroholdinqinin biotexnologiya və ekologiya sahəsində elmi məsləhətçisidir. Onun bilavasitə iştirakı ilə Mordoviyadakı "Mordovski bekon" Qapalı Səhmdar Cəmiyyətinin donuzçuluq komplekslərində döşənəksiz peyinin bioloji üsullarla emalı və səmərəli istifadəsi texnologiyası tətbiq edilib. Probiotik xassələrə malik olan kolbasa məmulatının yeni istehsal texnikası onun iştirakı ilə tətbiq olunub. D.Qədiməliyev Mordoviyada su emalı sistemlərinin yaradılmasında və reallaşdırılmasında, həmçinin təmizləyici qurğuların yenidən qurulmasında da fəal iştirak edib. O, Mordoviya Respublikasının Dövlət Ekspertiza İdarəsinin ştatdankənar eksperti və məsləhətçisidir. Kafedranın əməkdaşları ilə birlikdə "Bioximik" Açıq Səhmdar Cəmiyyətində mikrobioloji və tibbi sənaye tullantılarından yapışqan kompozisiyalarının alınması texnologiyasının işlənib hazırlanmasında iştirak edib.

D.Qədiməliyev həm bilavasitə müəssisələrdə, həm də ali məktəbdənsonrakı təhsil sistemi vasitəsilə Mordoviya müəssisələri üçün mütəxəssislərin ixtisas səviyyəsinin və elmi potensialının artırılmasında, eləcə də kadrların yenidən hazırlanmasında fəal iştirak edir.

Təbii Ehtiyatlar Nazirliyində, Rusiya Dövlət Təbiətə Nəzarət Komitəsində, "Talina" Aqroholdinqində, Mordoviya Respublikası Dövlət Ekspertizası İdarəsində mühazirələr oxuyur və mütəxəssislərlə məşğələlər aparır. Dəfələrlə Mordoviya Respublikası Hökumətinin, Mordoviya Respublikası Dövlət Məclisinin Ekologiya Komitəsinin səyyar iclaslarında biotexnologiya və ekologiya sahəsində yeni nailiyyətlər haqqında məlumatlarla çıxış edib.

D.Qədiməliyev universitetin, Respublika Hökumətinin və ÜİLKGİ MK-nın fəxri fərmanları ilə təltif olunub. Oqaryov mükafatı laureatı, biotexnologiya və ekologiya sahəsində "İlin mühəndisi" Ümumrusiya müsabiqəsinin qalibidir.



## Qəmərli
## Arif Paşa oğlu

*Baytarlıq elmləri doktoru, professor.*
*K.İ.Skryabin adına Qırğızıstan Milli Aqrar Universitetinin heyvanların infeksion və invazion xəstəlikləri kafedrasının professoru*

Qəmərli Arif Paşa oğlu 1929-cu il yanvarın 5-də Azərbaycan Respublikasının Kirovabad (indiki Gəncə) şəhərində anadan olub.

1951-ci ildə S.Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun baytarlıq fakültəsini fərqlənmə diplomu ilə bitirib və Moskva Dövlət Baytarlıq Dermatologiyası İnstitutu (Ümumittifaq Elmi-Tədqiqat Baytarlıq Sanitariyası İnstitutu) nəzdində aspiranturaya göndərilib.

1955-ci ildə A.Qəmərli baytarlıq elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib (Ümumrusiya Elmi-Tədqiqat Eksperimental Baytarlıq İnstitutu, Moskva). 1956-cı ildə A.Qəmərli SSRİ Kənd Təsərrüfatı Nazirliyinin göndərişi ilə Qırğızıstana, Elmi-Tədqiqat Heyvandarlıq və Baytarlıq İnstitutuna daimi işləməyə gəlib və kənd təsərrüfatı heyvanlarının parazitlərinin öyrənilməsi laboratoriyasının rəhbəri təyin edilib.

1970-ci ildə A.Qəmərli doktorluq dissertasiyası müdafiə edib. 1987-ci ildə ona professor elmi adı verilib.

A.Qəmərli 1982-ci ildən Qırğızıstan Kənd Təsərrüfatı İnstitutunda (indiki K.İ.Skryabin adına Qırğızıstan Milli Aqrar Universiteti) heyvanların infeksion və invazion xəstəlikləri kafedrasının müdiri vəzifəsində işləyir, 1984-1988-ci illərdə həm də baytarlıq fakültəsinin dekanı olub. 1993-cü ildən kafedranın professorudur.

A.Qəmərlinin elmi tədqiqatlarının əsas istiqaməti kənd təsərrüfatı heyvanlarının mozalandan keçən xəstəliklərinin öyrənilməsidir. O, iribuynuzlu mal-qaranın və keçilərin mozalandan keçən dərialtı xəstəliklərinin, qoyunların estroz, heyvanların qastrofiloz xəstəliklərinin öyrənilməsinə böyük töhfə verib. Mozalandan keçən xəstəliklərin erkən kimyəvi profilaktikası metodunu dünyada ilk dəfə işləyib hazırlayan və istehsalata tətbiq edən A.Qəmərli olub. Hazırda bu metod dünyanın bir çox ölkələrində tanınıb. Kənd təsərrüfatı heyvanlarının entomozlarına qarşı mübarizənin A.Qəmərli tərəfindən işlənib hazırlanmış kompleks metodları baytarlıq təbabəti fakültələrinin tələbələri üçün "Parazitologiya" dərsliyinə daxil edilib.

A.Qəmərli uzun illər boyu Qırğızıstan Elmi-Tədqiqat Heyvandarlıq və Baytarlıq İnstitutunun laboratoriya müdiri, son illərdə institutun direktorunun elmi işlər üzrə müavini olub.

A.Qəmərlinin 110 elmi işi, o cümlədən parazitologiyaya aid 10 monoqrafiyası və dərs vəsaiti dərc olunub. Onun rəhbərliyi altında 10 namizədlik və 4 doktorluq dissertasiyası müdafiə edilib.

MDB-nin elmi dairələrində A.Qəmərlini yaxşı tanıyırlar. O, 5 doktorluq və 18 namizədlik dissertasiyasının rəsmi opponenti olub.

A.Qəmərli çoxsaylı beynəlxalq və ümumittifaq elmi konfransların iştirakçısı olub, həmin konfranslarda məruzələrlə çıxış edib. O, Qırğız Respublikasının Kənd Təsərrüfatı Əlaçısıdır. Ümumittifaq Kənd Təsərrüfatı Sərgisinin (ÜİKTS) bürünc medalı (Moskva, 1957), "Rəşadətli əməyə görə" medalı (1970), "Sosializm yarışının qalibi" nişanı (1974) və başqa təltifləri var.



## Qəmərli
## Zakir Paşa oğlu

*Tibb elmləri doktoru, professor.*
*B.N.Yeltsin adına Qırğızıstan-Rusiya Slavyan Universitetinin onkologiya, şüa diaqnostikası və terapiya kafedrasının müdiri*

Qəmərli Zakir Paşa oğlu 1942-ci il oktyabrın 12-də Azərbaycan Respublikasının Kirovabad (indiki Gəncə) şəhərində anadan olub.

1960-cı ildə həmin şəhərdə orta məktəbin rus bölməsini bitirib. 1961-ci ildə Qırğızıstan Dövlət Tibb İnstitutuna daxil olub, 1967-ci ildə ali məktəbi bitirib. Həmin ildən başlayaraq, Z.Qəmərlinin bütün fəaliyyəti Qırğızıstan onkologiya xidməti ilə ayrılmaz surətdə bağlıdır. O, 30 il Qırğızıstan Elmi-Tədqiqat Onkologiya və Radiologiya İnstitutunda işləyib. Adi həkimlikdən başlayıb, sonra şöbə müdiri olub, əyani aspiranturada oxuyub (1971-1974), institutun elmi katibi (1974-1978), direktorun elmi işlər üzrə müavini (1978-1985) olub.

1985-ci ildə Z.Qəmərli Moskvaya doktoranturaya göndərilib, 1986-cı ilin dekabrında isə Moskvadan geri çağırılıb və Qırğızıstan Elmi-Tədqiqat Onkologiya və Radiologiya İnstitutunun direktoru təyin edilib, 1997-ci ilə qədər orada işləyib. 1997-ci ildən indiyə qədər – B.N.Yeltsin adına Qırğızıstan-Rusiya Slavyan Universitetinin Tibbi Mərkəzinin kafedra müdiri və eyni zamanda direktorudur.

Z.Qəmərli 1975-ci ildə Daşkənddə tibb elmləri namizədi alimlik dərəcəsi almaq üçün, 1988-ci ildə isə Moskvada tibb elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. 1995-ci ildə Z.Qəmərliyə professor elmi adı verilib.

Z.Qəmərli onkologiya sahəsində respublikada və onun hüdudlarından kənarda tanınmış alim və mütəxəssisdir. Epidemiologiya, onkoloji xəstələrin müalicəsi və reabilitasiyası problemləri ilə məşğul olur. O, bədxassəli şişlərdən əziyyət çəkən xəstələrin ambulator müalicəsinin iqtisadi və elmi cəhətdən əsaslandırılmış metodikalarını hazırlayıb. Bu metodikaların geniş tətbiq edilməsi nəticəsində Elmi-Tədqiqat Onkologiya və Radiologiya İnstitutunda çarpayıların sayını azaldaraq 700-dən 425-ə qədər endirmək mümkün olub, bu isə həm xəstələr, həm də tibbi ictimaiyyət tərəfindən böyük məmnunluqla qarşılanıb.

Qırğızıstanda uşaq onkologiya şöbəsini Z.Qəmərli yaradıb. SSRİ-də ilk uşaq onkologiya şöbələrindən biri olmuş bu şöbə indi də fəaliyyət göstərir. Orta dağ iqlimi

şəraitində onkoloji xəstələrin reabilitasiyası üçün Z.Qəmərli tərəfindən işlənib hazırlanmış metodika onkoloqlar arasında böyük rəğbətlə qarşılanıb.

1992-1997-ci illərdə Z.Qəmərli Kanzas Universitetinin (ABŞ) tibbi mərkəzi ilə Qırğız Respublikasının Elmi-Tədqiqat Onkologiya və Radiologiya İnstitutu arasında tərəfdaşlığın əlaqələndiricilərindən biri olub. Bu uğurlu tərəfdaşlıq nəticəsində institutun 30-dan çox həkimi və elmi işçisi Kanzas Universitetinin tibbi mərkəzində təcrübə keçib, respublikaya humanitar kömək şəklində müxtəlif tibbi texnika, ofis təchizatı vasitələri və avadanlıq cəlb edilib.

Orta dağ iqlimi şəraitində onkoloji xəstələrin reabilitasiyası üçün Z.Qəmərli tərəfindən (1986-1987-ci illərdə uşaqlar üçün və 1994-1995-ci illərdə böyüklər üçün) işlənib hazırlanmış sistem bədxassəli şişlərdən əziyyət çəkən xəstələrin radikal müalicəsindən sonra onların həyat keyfiyyətini yaxşılaşdırmağa imkan verir.

Z.Qəmərli 1995-ci ildən onkoloji xəstələrin reabilitasiyası və immunoterapiyası sahəsində tədqiqatlara rəhbərlik edir. Onun elmi rəhbərliyi altında 20-dən çox namizədlik və 2 doktorluq dissertasiyası müdafiə edilib. Z.Qəmərli rəhbərlik etdiyi kafedrada aspirantura və kliniki ordinatura təşkil edib.

Z.Qəmərli fəal alimdir. Uzun illər Qırğızıstan Ali Attestasiya Komissiyasının üzvü və cərrahlıq ixtisasları üzrə ekspert şurasının sədri olub. Hazırda iki dissertasiya şurasının – Rusiya Ali Attestasiya Komissiyasının (cərrahiyyə və onkologiya) və Qırğızıstan Ali Attestasiya Komissiyasının (pediatriya və uşaq cərrahiyyəsi) üzvü, "Voprosı onkoloqii" jurnalının (Sankt-Peterburq) redaksiya heyətinin üzvüdür.

Alimin 170-dən çox elmi işi, o cümlədən 5 monoqrafiyası dərc edilib, o, həm də Qırğızıstanda ali məktəb tələbələri üçün ilk onkologiya dərsliyinin müəllifidir.

Z.Qəmərli – 20-dən çox beynəlxalq, 35 ümumittifaq və respublika miqyaslı, o cümlədən ABŞ, Almaniya, Böyük Britaniya, Fransa, Avstriya, Yunanıstan, Çexiya, İsrail və başqa ölkələrdə keçirilmiş elmi konfrans və qurultayların iştirakçısı olub, dəfələrlə belə tədbirlərdə məruzələrlə çıxış edib, təşkilat komitələrinin üzvü olub. 2012-ci ildə onun iki məruzəsi Kanadada keçirilən Ümumdünya xərçəng əleyhinə konqresin proqramına daxil edilib.

Z.Qəmərli təşkilatçılıq və elmi fəaliyyəti ilə yanaşı, cərrah-onkoloq kimi onkoloji xəstələrin müalicəsi üzrə böyük iş aparır. Ali məktəbi bitirəndən bu günə qədər müxtəlif onkoloji xəstələr üzərində 5 mindən çox cərrahiyyə əməliyyatı aparıb.

Z.Qəmərli Qırğız Respublikasının Səhiyyə Əlaçısıdır. 2003-cü ildə ona "Qırğız Respublikasının Əməkdar Elm Xadimi" fəxri adı verilib.



## Qəribov
## Rafail Bəşir oğlu

*Texnika elmləri doktoru.*
*"Volqapromstroybezopasnost" ETM QSC-nin baş direktoru*

Qəribov Rafail Bəşir oğlu 1961-ci il noyabrın 21-də Azərbaycan Respublikasının Tovuz rayonunun Sofular kəndində anadan olub.

1986-cı ildə Azərbaycan Mühəndis-Tikinti İnstitutunu "sənaye və mülki tikinti" ixtisası üzrə bitirib. 1980-1982-ci illərdə Sovet Ordusunda xidmət edib. 1978-1988-ci illərdə Bakı Baş Tikinti İdarəsi sistemində işçi, mühəndis, baş mühəndis işləyib. 1988-1990-cı illərdə 11 nömrəli "Sosialmədənitikinti" tresti partiya komitəsinin katibi olub. 1990-cı ildən Bakı Ali Partiya Məktəbinə göndərilib.

1992-ci ildə R.Qəribov Bakı Sosial İdarəetmə və Politologiya İnstitutunu bitirib və həmin il Rusiyanın Saratov şəhərinə köçüb. Baş mühəndis, tikinti müəssisəsinin direktoru vəzifəsində çalışıb və paralel surətdə hələ 1983-cü ildə tələbə olarkən başladığı elmi fəaliyyətlə məşğul olub.

O, 1999-cu ildə Saratov Dövlət Texniki Universitetinin aspiranturasına qəbul edilib, dissertasiya hazırlamaqla yanaşı, müəllimlik fəaliyyəti ilə məşğul olub. 2003-cü ildə "Konstruksiyanın dəmir-beton elementlərinin aqressiv mühitin təsirinə müqaviməti" mövzusunda dissertasiyasını müdafiə etdikdən və texniki elmlər namizədi alimlik dərəcəsi aldıqdan sonra körpülər və nəqliyyat qurğuları kafedrasının dosenti olub.

Saratov Dövlət Texniki Universitetində fəaliyyəti ilə paralel olaraq tikinti mövzusu üzrə eksperimental və nəzəri tədqiqatlar aparıb.

R.Qəribov həm Rusiyada (Moskva, Samara, Saransk, Penza, Tula, Volqoqrad və başqa şəhərlərdə), həm də digər ölkələrdə (İspaniya, Tunis, Cənubi Koreya, Yunanıstan, Çin, Almaniya, Ukrayna və digər dövlətlərdə) keçirilən 20-dən çox beynəlxalq elmi konfransda iştirak edib.

2008-ci ildə Penza Dövlət Memarlıq və Tikinti Universitetinin dissertasiya şurasına "Ətraf mühitin aqressiv təsirləri zamanı daşıyıcı dəmir-beton konstruksiyalarının möhkəmliyi və deformativliyi" mövzusunda müdafiə etdiyi doktorluq dissertasiyasını təqdim edib.

Elmi fəaliyyəti zamanı 50-dən çox elmi iş, o cümlədən 4 dərs vəsaiti və 4 monoqrafiya, həmçinin kütləvi informasiya vasitələrində 20-dən artıq məqalə hazırlayıb.

2003-cü ildən Rusiya dağıtmayan nəzarət və texniki diaqnostika cəmiyyətinin, 2006-cı ildən Beynəlxalq tikinti materialları, sistem və konstruksiyaların sınağı sahəsində laboratoriya və mütəxəssislər ittifaqının (RILEM) üzvü, 2008-ci ildən Beynəlxalq İctimai Elmlər Akademiyasının həqiqi üzvüdür.

R.Qəribovun elmi marağı aşağıdakı mövzuları əhatə edir: aqressiv mühitlərin təsiri şəraitində konstruksiyaların dəmir-beton elementlərinin möhkəmliyi və uzunömürlülüyü, dəmir-beton konstruksiyaların korroziyadan qorunması, aqressiv mühitlərdə istismar olunan dəmir-beton konstruksiyaların möhkəmlik monitorinqi, dəmir-beton konstruksiyaların möhkəmlik monitorinqinin təşkili zamanı informasiya texnologiyalarının tətbiqi.

Çoxsaylı eksperimental işlərin analizi nəticəsində R.Qəribov xlor və sulfat tərkibli mühitin, həmçinin radiasiya sahələrinin dəmir-beton komponentlərinin möhkəmlik və deformativ xüsusiyyətlərinə təsirini tədqiq edib, müxtəlif növ aqressiv mühit və radiasiya sahələrinin həcminə görə müxtəlif tərkibli mexaniki deqradasiya xassələrini göstərib. Dəmir-betonun deformasiya nəzəriyyəsinin istifadəsinə və struktur parametrlər üsuluna əsaslanan konstruksiyanın dəmir-beton elementlərinin istismarının aqressiv və radiasiya şərtlərinin təsirinə müqaviməti modellərinin qurulmasına ümumi yanaşmanı inkişaf etdirib, eksperimental məlumatlar üzrə dəmir-betonun aqressiv və radiasiya mühitinə müqaviməti modellərinin identifikasiya metodikasını hazırlayıb. R.Qəribovun təklif etdiyi yanaşmadan istifadə olunmaqla, konstruksiyanın fibrobeton və dəmir-beton elementlərinin radiasiya sahələrinin təsirinə müqaviməti modelləri qurulub, onların identifikasiyası aparılıb.

R.Qəribov tərəfindən tədqiqatı aparılan konstruksiyaların mil və plitə elementlərinin daşıyıcı qabiliyyətlərinə və uzunömürlülüyünün dəyişməsinə xlor və sulfat tərkibli mühitlərin təsirinin, həmçinin radiasiya faktorlarından istifadə olunmaqla, aqressiv və radiasiya mühitləri nəzərə alınmaqla sıxılan və əyilən dəmir-beton mil konstruktiv elementlərin, habelə əyilən plitə elementlərinin hesablanması metodikası hazırlanıb.

Elmi fəaliyyətinin gedişində R.Qəribov tərəfindən ağırlığın müştərək təsiri, aqressiv və radiasiyalı istismar mühitləri şəraitində işləyən dəmir-beton konstruksiyaların möhkəmlik monitorinqinin təşkili problemi nəzərdən keçirilib.

"Sulfat təsiri şəraitində dəmir-beton konstruksiyaların möhkəmliyi və uzunömürlülüyü", "Xlor tərkibli mühitlərin təsiri şəraitində polad-dəmir-beton konstruksiyaların iş qabiliyyəti", "Konstruksiyanın dəmir-beton elementlərinin aqressiv

mühitlərin təsirinə müqaviməti", "Dəmir-beton konstruksiyaların xlorid korroziyasına və karbonlaşmanın təsirinə müqaviməti", "Nəqliyyat qurğularının daşıyıcı konstruksiyalarının işinin modelləşdirilməsi", "Nəqliyyat qurğularının (avtomobil yolları, körpülər, tunellər, suötürücü borular), aqressiv mühitlərdə istismar olunan bina və qurğuların tikintisinin layihələndirilməsi" R.Qəribovun elmi işləri arasında yer alır.

R.Qəribov 2003-cü ildə əsasını qoyduğu "Volqapromstroybezopasnost" Elmi-Texniki Mərkəzinin baş direktorudur. Onun uğurlu rəhbərliyi ilə "Volqapromstroybezopasnost" ETM bina və qurğuların yoxlanması və möhkəmlik monitorinqi, qəzalı konstruksiyaların tikinti-montaj və gücləndirilməsinin yerinə yetirilməsinin layihələndirilməsi (o cümlədən təməlinin gücləndirilməsi), qruntlarda xüsusi işlərlə məşğul olur, həmçinin yoxlama materialları və texniki hesabatlar üzrə tövsiyə və qərarlar verir.

"Volqapromstroybezopasnost" ETM-də patenti 2007-ci ildə alınan avtomobil yollarının qar yığınlarından unikal mühafizə metodu hazırlanıb. Bu metodun təməlində yol boyunca laminar hava axınlarını təmin edən torpaq təpəciklər yaradılması vasitəsilə yolun köndələn profilinin aerodinamikasının dəyişdirilməsi dayanır.

Təklif olunan üsul qarın yolun hərəkət hissəsinə düşməsini istisna edir. Belə təpəciklər bir neçə il əvvəl Saratov vilayətində trasın 20 kilometrlik hissəsində quraşdırılıb və həmin üsulun qar yığınlarından müdafiədə yüksək effektivliliyini nümayiş etdirib. Bu cür təpəciklər yaradıldıqdan sonra həmin sahədə qarın sovrulması nəticəsində nəqliyyatın hərəkətində heç bir fasilə qeydə alınmayıb. Halbuki, əvvəllər belə hallar mütəmadi baş verirdi.

Məhsuldar fəaliyyəti zamanı ona fərdi şəxslərdən tutmuş, iri zavod və müəssisələrədək geniş sifarişçi dairəsi üçün işləri yüksək peşəkar səviyyədə yerinə yetirməyə qadir olan təşkilat yaratmaq məqsədi ilə birləşən alim, mühəndis, konstruktorlardan ibarət həmfikirlər kollektivi formalaşdırmaq nəsib olub.

ETM rəhbərinin və onun rəhbərlik etdiyi "Volqapromstroybezopasnost"un xidmətləri "Rusiya torpağının abadlaşdırılmasına görə" mükafatının "Prioritet milli layihələrin həyata keçirilməsinə töhfəsinə görə" nominasiyasında laureatı diplomu, "İqtisadi və sosial inkişaf üzrə dövlət proqramının həyata keçirilməsində aktiv fəaliyyətə görə" diplomu ilə qiymətləndirilib. O, həmçinin "Rusiya iqtisadiyyatının lideri"dir.

R.Qəribovun şəxsi xidmətləri çoxsaylı mükafatlarla qeyd olunub. Belə ki, o, I dərəcəli "Rusiyanın mühəndis şöhrəti" şərəf nişanının sahibidir. I dərəcəli "Derjava" ordeni, "Elmə töhfəyə görə" ordeni, "Dünyanın xeyirxah mələyi" qızıl medalı ilə təltif edilib.



## Quliyev
## Arif Cəmil oğlu

*Hüquq elmləri doktoru, professor.*
*Kiyev Milli Aviasiya Universiteti Beynəlxalq Münasibətlər İnstitutunun beynəlxalq hüquq kafedrasının professoru*

Quliyev Arif Cəmil oğlu 1952-ci il iyulun 4-də Azərbaycan Respublikasının Bərdə rayonunun Böyük Qacar kəndində anadan olub.

1978-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) tarix fakültəsini, 1984-cü ildə Bakı Ali Partiya Məktəbini fərqlənmə diplomu ilə, 1989-cu ildə Kiyevdəki Suvorov Hərbi Məktəbinin 10-cu kursunu, 2002-ci və 2004-cü ildə isə Ukrayna Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının magistratura və aspiranturasını bitirib.

1998-ci ildən A.Quliyev Ukraynada işləyir. "Xalq qəzeti"nin Ukraynadakı müxbiri, 2001-2006-cı illərdə Azərbaycan Respublikasının Ukraynadakı səfirliyində işləyib, diplomatik rütbəyə malikdir.

2005-ci ildə "Ukrayna və Azərbaycan Respublikasında prezidentlik institutunun xüsusiyyətləri: dövlət-idarəetmə aspekti" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 2005-ci ildə dövlət İdarəçilik elmləri namizədi (Ukrayna), 2006-cı ildə hüquq elmləri namizədi (Azərbaycan Respublikası) elmi dərəcəsi alıb.

2007-ci ildən A.Quliyev elmi-pedaqoji fəaliyyətlə məşğul olur. Həmin ildən Kiyev Milli Aviasiya Universitetinin Beynəlxalq Münasibətlər İnstitutunun beynəlxalq hüquq kafedrasının dosenti, 2009-cu ildən bu günədək həmin kafedranın professorudur.

2012-ci ildə A.Quliyev Ukrayna Ali Radasının Qanunvericilik İnstitutunda "Beynəlxalq terrorizmlə mübarizədə prezidentlik institutunun rolunun müqayisəli hüquqi təhlili (Ukrayna və Azərbaycan Respublikasının timsalında)" mövzusunda doktorluq dissertasiyası müdafiə edib və hüquq elmləri doktoru elmi dərəcəsi alıb.

A.Quliyev "Qloballaşma şəraitində xarici əlaqələrin beynəlxalq-hüquqi konteksti" monoqrafiyası (2011), "Xarici əlaqələr hüququ" (Ukrayna və rus dillərində, 2012), "Beynəlxalq terrorizmlə mübarizədə prezidentlik institutu: Ukrayna və Azərbaycan Respublikası qanunvericiliklərinin müqayisəli hüquqi təhlili" (2012) dərsliklərinin, "Ukrayna-Azərbaycan münasibətləri: hüquq, siyasət, diplomatiya" (2014) elmi əsərlər toplusunun 1-ci cildinin müəllifidir.

O, həmçinin xarici siyasət, dövlət idarəçiliyi, Ukrayna və Azərbaycan Respublikasının beynəlxalq və ictimai əlaqələrinə dair 110-dan çox elmi-populyar və publisistik məqalənin müəllifi və həmmüəllifidir.

A.Quliyev doktorluq dissertasiyalarının müdafiəsi üçün ixtisaslaşdırılmış şuraların üzvü, "Ukrayna Azərbaycanlıları Elmi Şurası" ictimai təşkilatının təsisçisi və rəhbəridir.

Onun rəhbərliyi ilə 5 hüquq elmləri namizədi hazırlanıb, 3 hüquq elmləri doktorunun rəsmi opponenti olub.

A.Quliyevin Azərbaycanın dövlət və diplomatik xidmətində, eləcə də tədqiqat və tədris sahəsində çoxillik təcrübəsi var. O, terrorizmə qarşı mübarizədə beynəlxalq hüquqi tənzimlənmə mexanizminin kompleks tədqiqi mövzusunda bir sıra elmi məqalələrin, terrorizmə qarşı mübarizədə prezidentlik institutunu aktivləşdirmə modellərinin müəllifidir.

A.Quliyev tərəfindən Ukraynada və Azərbaycan Respublikasında antiterror fəaliyyəti sisteminin nəzəri modelinin zəruriliyi sübut edilib. Bu sistem iki başlıca struktur komponentinə əsaslanmalıdır: antiterror fəaliyyətinin dövlət alt sistemi və antiterror fəaliyyətinin ictimai alt sistemi.

A.Quliyevin elmi nailiyyətlərinə "terror" tərifinə dair mövqeyi, terrorla mübarizədə prezidentin fəaliyyətinin struktur, funksional və prosessual aspektlərinin qabardılması, terrorizmin qarşısının alınması sahəsində prezidentlik institutu səlahiyyətlərinin sistemləşdirilməsi daxil edilməlidir. O, Ukraynada və Azərbaycan Respublikasında antiterror fəaliyyəti sisteminin nəzəri modelinin hazırlanması zərurətini və terrorçuluğun qarşısının alınması və onun yeni növləri ilə mübarizə üzrə koordinasiya orqanının yaradılmasını dəlillərlə sübut edib.

A.Quliyevin tədqiqatlarında elmi yenilik danılmazdır, çünki bu iş (Ukraynanın və Azərbaycan Respublikasının timsalında) beynəlxalq terrorizmlə mübarizədə prezidentlik institutunun roluna aid Ukraynada ilk elmi tədqiqatdır.

Onun elmi əsərində həm ümumi elmi, həm də elmi tədqiqatların xüsusi metodları istifadə olunub: tarixi, sistemli, dialektik, sosioloji, müqayisəli hüquqi, struktur-funksional və proqnostik. Onların köməyi ilə müvafiq olaraq, dissertasiyasının müddəalarının və nəticələrin yetərincə yüksək səviyyəsi təmin edilib.

Tədqiqatlara əsaslanaraq A.Quliyev hüquq mühafizə və milli təhlükəsizlik kontekstində "terror" anlayışına nəzəri və hüquqi yanaşmaları, Ukraynada və Azərbaycan Respublikasında milli səviyyədə terrorizmə qarşı mübarizənin təşkilati-hüquqi xüsusiyyətləri, Ukraynada və Azərbaycan Respublikasında terrorizmə qarşı müba-

rizənin hüquqi tənzimlənməsi sistemində prezidentlik institutunun yeri, terrorizmlə mübarizədə beynəlxalq hüquqi öhdəliklərin təkamülünü nəzərdən keçirib.

Elmi və pedaqoji fəaliyyətindəki nailiyyətlərə görə A.Quliyev hökumət və sahə mükafatları alıb. O, dövlət quruculuğu, ölkənin sosial-iqtisadi, elmi-texniki, mədəni-təhsil inkişafına böyük töhfəsinə, əhəmiyyətli əmək nailiyyətləri və yüksək peşəkarlığına görə Ukrayna Prezidentinin 2013-cü il 24 avqust tarixli Fərmanı ilə “Ukraynanın Əməkdar Təhsil İşçisi” fəxri adı alan ilk azərbaycanlıdır.

A.Quliyev “Ukrayna-Azərbaycan dostluq körpüləri” beynəlxalq layihəsinin laureatıdır (2005). O, “Mədəniyyət və incəsənətin inkişafında nailiyyətlərə görə” fəxri nişanı və Ukrayna Mədəniyyət Nazirliyinin fəxri fərmanları ilə təltif edilib (2006, 2012). Həmçinin Ukrayna Aviasiya Universiteti rektorunun (2009, 2013), Kiyev merinin (2011), Kiyev Şəhər Dövlət Administrasiyasının Baş Elm və Təhsil İdarəsinin (2012), Azərbaycan Respublikasının Ukraynadakı səfirliyinin (2006, 2013) fəxri fərmanları ilə təltif edilib.

A.Quliyev ictimai fəaliyyətə böyük diqqət yetirir, Ukraynadakı Azərbaycan diasporunun fəal üzvüdür. Heydər Əliyev adına Ukrayna-Azərbaycan təhsil, elmi-mədəni, idman Mərkəzinin rəhbəri, eləcə də “Ukrayna Azərbaycanlıları Konqresi” ictimai birliyi sədrinin müavini və “Ukrayna Azərbaycanlıları Konqresinin Kiyev regional təşkilatı” sədrinin müavini olub. Hazırda “Xalq Diplomatiyası İnstitutu” və “Ukrayna Azərbaycanlılarının Elmi Şurası” ictimai təşkilatlarına rəhbərlik edir. “Azərbaycançılıq İnstitutu” beynəlxalq ictimai təşkilatının, “Ukrayna Azərbaycanlıları Ağsaqqallar Şurası” ictimai təşkilatının həmtəsisçisi, “Beynəlmiləl İttifaq” beynəlxalq ictimai təşkilatının, Beynəlxalq Jurnalistlər Federasiyasının üzvü (2012), Ukrayna Hüquqşünaslar Assosiasiyasının həqiqi üzvü (2007), Ukrayna Jurnalistlər İttifaqının üzvüdür (2002).



## Quliyev
## Bəhmən Hidayət oğlu

*Tibb elmləri doktoru.*
*İ.İ.Meçnikov adına Şimal-Qərb Dövlət Tibb Universitetinin urologiya kafedrasının professoru*

Quliyev Bəhmən Hidayət oğlu 1969-cu il fevralın 14-də Azərbaycan Respublikasının Xanlar rayonunun (indiki Göygöl rayonu) Qırıxlı kəndində anadan olub.

1986-cı ildə C.Naxçıvanski adına Hərbi Məktəbi (indiki C.Naxçıvanski adına Hərbi Lisey) fərqlənmə ilə bitirib və təhsilini davam etdirmək üçün Leninqrada göndərilib. 1993-cü ildə İ.P.Pavlov adına Sankt-Peterburq Tibb Universitetinin müalicə fakültəsini bitirib. O, 1993-1996-cı illərdə "urologiya" ixtisası üzrə internatura və klinik ordinaturada təhsil alıb. 1996-cı ildən Rusiyanın Şimal-Qərb bölgəsinin ən böyük stasionarlarından biri olan 2 saylı şəhər çoxprofilli xəstəxanasının urologiya şöbəsinin ordinatoru vəzifəsində çalışır. 2010-cu ildə bu şöbənin bazası əsasında Rusiyanın bütün regionlarının, eləcə də MDB ölkələrinin xəstələrinə yüksək ixtisaslı yardım göstərən Elmi-Praktik Urologiya Mərkəzi yaradılıb. B.Quliyev bu elmi-praktik mərkəzin direktor müavinidir. 2003-cü ildə ona tibb elmləri namizədi, 2008-ci ildə tibb elmləri doktoru elmi dərəcəsi verilib. 2006-cı ildə "urologiya" ixtisası üzrə ali ixtisas dərəcəsi alıb. 2010-cu ildən B.Quliyev İ.İ.Meçnikov adına Şimal-Qərb Dövlət Tibb Universitetinin urologiya kafedrasının professorudur.

B.Quliyevin cərrahi fəaliyyətinin əsas istiqamətlərindən biri sidik axarının, sidik kanalının rekonstruktiv-plastik cərrahiyyəsi və sidik kisəsinin çıxarılmasından sonra onu əvəz etmə əməliyyatlarıdır. Bu məqsədlə sidik yollarının dəyişməz toxumalarının, mədə-bağırsaq traktının, dəri-faskial parçalarından və yanağın selik hissələrindən istifadə olunur. B.Quliyevin təmsil etdiyi urologiya klinikası Rusiya və MDB ölkələrində sidik axarlarının və sidik kisəsinin bağırsaq plastikasında böyük təcrübəyə malikdir. Sidik axarının rekonstruktiv əməliyyatlarının nəticələri B.Quliyevin "Sidik axarlarının ölçüsü olan daralmasının cərrahiyyəsi" monoqrafiyasında ətraflı əksini tapıb.

Alim sidik kisəsində daş olan xəstələrin müalicəsində müasir endoskopik və laparoskopik metodların aktiv istifadəsinə böyük diqqət yetirir. Bu, həmin xəstəlikdə açıq əməliyyatların sayının azaldılmasına səbəb olub. Klinik praktikada yeni endos-

kopik metodlardan istifadə yuxarı və aşağı sidik yolları şişlərini, sidik axarlarının daralmasının diaqnostikası və müalicəsinə imkan verir.

B.Quliyevin 500-dən çox endovideocərrahi əməliyyat təcrübəsi var, o cümlədən laparoskopik nefrektomiya, böyrəyin rezeksiyası, böyrək kistasının aradan qaldırılması, nefropeksiya, pieloureteral seqmentin plastik strikturası və s.

B.Quliyevin çalışdığı urologiya kafedrası və klinika böyrək şişləri və yuxarı sidik yollarının cərrahi müalicəsi ilə fəal məşğul olur. Həmin kafedranın və 2 saylı şəhər çoxprofilli xəstəxanasının bazalarında son illərdə böyrək-hüceyrə xərçəngi və yuxarı sidik yolları şişlərinin, o cümlədən 400-dən çox orqanları saxlayan əməliyyatlar da daxil olmaqla, 3500-dən artıq radikal cərrahiyyə əməliyyatı yerinə yetirilib. Sonradan autotransplantasiya ilə böyrəyin ekstrakorporal əməliyyatı işlənib hazırlanıb. Bu zaman böyrəyin kəsilib götürülməsi lapaskopik metodla həyata keçirilir. Böyrək və aşağı cinsi venanın şiş trombozu ilə böyrək parenximası xərçəngi ilə bağlı yeni cərrahiyyə əməliyyatları tətbiq edilib.

Yoğun bağırsaq və sidik axını obstruksiyası ilə qadın cinsi orqanlarının xərçəngi zamanı B.Quliyev tərəfindən müxtəlif implantların (stentlər, endoprotezlər, şuntlar) tətbiqi ilə yeni derivasiya metodları hazırlanıb. Alimin Rusiyada sidik borusu və sidik axarlarının endoprotezləşdirmə və nefrovezikal şuntlama üzrə böyük təcrübəsi var. Bu tədqiqatların nəticələri onun "Yuxarı sidik yollarının rekanalizasiyası" monoqrafiyasında ətraflı əks olunub.

S.İ.Vavilov adına Dövlət Optika İnstitutu və "Endomaster" müəssisəsi ilə birlikdə B.Quliyev tərəfindən urologiyada endoskopiya üçün yeni alətlərin klinik praktikaya hazırlanması və tətbiqi həyata keçirilir. O, hazırda təcrübədən keçən, sərt və çevik endoskopların üstünlüyünü özündə birləşdirən müasir nefroskop hazırlayıb.

B.Quliyev yeni texniki həllərin müəllifi və həmmüəllifidir. O, sidik axarı plastikası modifikasiyaları və perkutan nefrolitotprisiya zamanı böyrəyin modifikasiya edilmiş drenaj üsulunu işləyib hazırlayıb.

B.Quliyev 7 ixtira patentinin, 230 elmi əsərin, 8 elmi-metodoloji tövsiyənin, "Sidik axarının ölçüsü olan daralmasının cərrahiyyəsi" (2005), "Yuxarı sidik kisəsi yolunun rekanalizasiyası" (2011) adlı 2 monoqrafiyanın müəllifidir. Son bir neçə ildə B.Quliyev beynəlxalq "Uronefroloji fundamental tədqiqatlar" (Saratov, 2011), endourologiya və yeni texnologiyalar üzrə III Rusiya Konqresi (Rostov-Don, 2012) elmi-praktik konfranslarında, "Endourologiyada ziddiyyətlər" Beynəlxalq Konqresində (Paris, 2011, 2013), Avropa Uroloqlar Assosiasiyasının 26-cı konqresində (Vyana, 2011), Avropa Uroloqlar Assosiasiyasının 27-ci konqresində (Paris, 2012),

S.P.Fyodorov adına Uroloji Cəmiyyətin 919 saylı iclasında (Sankt-Peterburq, 2012), Dünya Endouroloqlar Cəmiyyətinin 31-ci konqresində (Yeni Orlean, 2013), sidik kisəsində daşın müalicəsi üzrə Avropa Uroloqlar Assosiasiyasının 2-ci yığıncağında (Kopenhagen, 2013) məruzələrlə çıxış edib.

1996-cı ildən B.Quliyev Rusiya və Sankt-Peterburq uroloqlar cəmiyyətlərinin, 2006-cı ildən Avropa Uroloqlar Assosiasiyasının və Dünya Endouroloqlar Cəmiyyətinin üzvüdür. O, urologiya kafedrasının elmi iş üzrə məsul katibi, Rusiya Uroloqlar Cəmiyyəti İdarə Heyətinin və S.P.Fyodorov adına Sankt-Peterburq Uroloqlar Elmi Cəmiyyəti İdarə Heyətinin üzvüdür. Onun rəhbərliyi ilə 3 namizədlik dissertasiya müdafiə edilib və 4 dissertasiya müdafiəyə hazırlanır.



## Quliyev
## Ənvər Məmmədqulu oğlu
*Tibb elmləri doktoru, professor.*
*Çikaqo Reproduktiv Genetika İnstitutunun elmi direktoru*

Quliyev Ənvər Məmmədqulu oğlu 1943-cü il iyunun 28-də Azərbaycan Respublikasında anadan olub.

1966-cı ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Dövlət Tibb Universiteti) bitirdikdən sonra N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun Mərkəzi Elmi-Tədqiqat Laboratoriyasının baş elmi işçisi vəzifəsində çalışıb. 1977-1979-cu illərdə Tibb Elmləri Akademiyasının Tibbi Genetika İnstitutunun insanın sitogenetikası laboratoriyasının baş elmi işçisi olub.

1979-1980-ci illərdə Ə.Quliyev Dünya Səhiyyə Təşkilatının (Cenevrə) qeyri-yoluxucu xəstəliklər şöbəsində məsləhətçi olub. 1980-1986-cı illərdə Dünya Səhiyyə Təşkilatının irsi xəstəliklər proqramının rəhbəri olub. 1986-1990-cı illərdə SSRİ Tibb Elmləri Akademiyasının Tibbi Genetika İnstitutunun prenatal diaqnostika şöbəsinin müdiri olub.

1990-cı ildən bu günə qədər Çikaqo Reproduktiv Genetika İnstitutunun elmi işlər üzrə direktorudur. Bu, insan nəslinin yaradılması üzrə bütün əsas yeniliklərin yayıldığı unikal müəssisədir.

İnstitutda ilk dəfə olaraq "rüşeym qişasının nazik tükcüklərinin biopsiyası" qəribə adı altında analiz aparmağa başlayıblar. Bu, hamiləliyin çox erkən mərhələlərində uşağın sağlam olub-olmadığını müəyyən etmək imkanı yaradıb. Hamiləlikdən əvvəl sınaq borusundakı rüşeym halında olan embriona genetik diaqnoz qoymağı, hələ mayalanmadan əvvəl uşağa lazımi parametrləri ötürməyi öyrəniblər.

Burada, institutun öz məlumatına görə, dünyada ən böyük gövdə hüceyrələri koloniyası var. Bütün bunlar Ə.Quliyev və həmkarı Y.S.Verlinskinin – genetikanı saxta elm elan edən ölkədən çıxmış insanlar sayəsində mümkün olub.

Çikaqo Reproduktiv Genetika İnstitutundakı bu nadir işlə yanaşı, klinik sitogenetika sahəsində yüksək dərəcəli və dünya şöhrətli mütəxəssis olan Ə.Quliyev 2009-cu ildən indiyə qədər gövdə hüceyrələri sahəsində Y.S.Verlinski Fondunun (Çikaqo, ABŞ) direktoru, habelə Mayamidəki Florida Beynəlxalq Universitetinin professorudur.

Ə.Quliyev Nyu-York Elmlər Akademiyasının, Amerika Reproduktiv Təbabət Cəmiyyətinin, "RBMOnline" jurnalının redaksiya heyətinin üzvü, implantasiya öncəsi genetik diaqnostika üzrə Beynəlxalq Elmi Cəmiyyətin icraçı direktoru, implantasiya öncəsi genetik diaqnostika üzrə xüsusi elmi qrupun elmi katibidir.

Ə.Quliyev ingilis və rus dillərində 200-dən çox elmi əsərin müəllifidir.



## Quliyev
## Valeh Cəfər oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor. Moskva Dövlət Açıq Universitetinin ali riyaziyyat kafedrasının müdiri*

Quliyev Valeh Cəfər oğlu 1943-cü il dekabrın 26-da Azərbaycan Respublikasının Salyan rayonunun Şorsulu kəndində anadan olub.

1969-cu ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) mexanika-riyaziyyat

fakültəsini bitirib. 1974-cü ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsinin dissertasiya şurasında V.Quliyev fizika-riyaziyyat elmləri namizədi, 1980-ci ildə isə fizika-riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib.

1983-cü ildə SSRİ Nazirlər Sovetinin elm və texnika sahəsində mükafatı laureatı olub. 1987-ci ildə ona professor elmi adı verilib. 1994-cü ildə V.Quliyev Beynəlxalq Mineral Resurslar Akademiyasının, 1996-cı ildə Çuvaşiya Respublikasının Texnologiya Mühəndis Akademiyasının, 2000-ci ildə K.E.Tsiolkovski adına Rusiya Kosmonavtika Akademiyasının həqiqi üzvü (akademiki) seçilib. 2004-cü ildən V.Quliyev Təhlükəsizlik, Müdafiə və Hüquq Mühafizə Akademiyasının həqiqi üzvü (akademiki) və professorudur.

1987-ci ildən V.Quliyev Moskva Dövlət Açıq Universitetinin (MDAU) ali riyaziyyat kafedrasının müdiri, 1992-ci ildən ali riyaziyyat kafedrasının müdiri və fundamental hazırlıq üzrə tədris-metodiki birliyin dekanı, 1988-ci ildən ali riyaziyyat kafedrasının müdiri və tətbiqi riyaziyyat fakültəsinin dekanı işləyir. 1988-ci ildən o, MDAU-nun iki dissertasiya şurasının və Elmi Şurasının üzvüdür.

Elmi istiqamət və elmi məktəb yaratdığına görə 1987-ci ildə V.Quliyev "Deformasiya olunan bərk cismin mexanikası" ixtisası üzrə professor adına layiq görülüb. Onun rəhbərliyi ilə 20 elmlər doktoru və 36 elmlər namizədi müdafiə edib.

V.Quliyev 2 müəlliflik şəhadətnaməsinin sahibi, 175 elmi əsərin müəllifidir, onlardan 7-si kitab, 3-ü Moskvada nəşr edilən monoqrafiyadır ("Singular sərhəd məsələləri", "Çoxlaylı konstruksiyaların stoxastik istilik mexanikası" və "Yorğunluq dağılmasının mexanikası"). 10 prioritet əsər "SSRİ Elmlər Akademiyasının məru-

zələri"ndə dərc olunub, onun redaktorluğu ilə 40-dan çox tədris-metodiki vəsait çap edilib.

V.Quliyev riyaziyyat və mexanikanın dağılma mexanikası və elastiklik nəzəriyyəsinin riyazi məsələləri, yorğunluq dağılması mexanikası, hissəli-bircinsli mühitlərin (N sinif sərhəd məsələləri) dağılma mexanikası, laylı kompozisiyalı materialların dağılma mexanikası kimi sahələrin inkişafına əhəmiyyətli töhfə verib.

O, elastiklik nəzəriyyəsinin əksər sinqulyar məsələlərinin və bircinsli izotop mühitlərin həlli zamanı yaranan bir cüt funksiyanın Riman probleminin həlli üçün (bəzi hallarda isə iki cüt funksiya üçün) inteqral çevirmə metodları kimi effektiv üsul təklif edib və bu, Qaxov-Musxelişvili metodu ilə müqayisədə həll prosedurunu xeyli asanlaşdırır. Bu vahid yanaşma konstruksiya elementlərinin ümumi möhkəmlik və davamlılıq probleminin öyrənilməsində yaranan yeni məsələlərin əksərinin həllini qurmağa imkan yaradıb.

V.Quliyev hissəli-bircinsli mühitlərin dağılma mexanikasında tez-tez rast gəlinən Riman sərhəd məsələsinin əmsalı müəyyən xüsusi formaya malik olduqda iki cüt funksiya üçün Riman məsələsinin təxmini həll qurmağa imkan verən Koyter teoreminin ümumiləşdirməsini isbat edib.

O, yetərincə geniş Koşi tipli 1-ci növ sinqulyar sinif inteqral tənliklərin 2-ci növ Fredholm (və ya kvazifredholm) inteqral tənliklərinə çevirməyin fundamental metodlarını hazırlayıb. Bu metodlar A.Puankare, D.Hilbert, F.D.Qaxov, İ.N.Vekua, T.Karleman, N.İ.Musxelişvili tərəfindən hazırlanan yanaşmaları xeyli sadələşdirir.

O, hissəli-bircinsli mühitlər üçün yastı elastiklik nəzəriyyəsinin kanonik sinqulyar məsələlərinin həlli üçün yeni metod təklif edib. M.Vilyams, Q.P.Çerepanov, D.Rays, F.Ərdoğan, Q.Si və A.İ.Kalandinin məlum metodlarından V.Quliyevin metodu həllərin qapalılığı, dəqiqliyi, həmçinin öz funksiyalarının aydın müəyyən edilən fiziki mənası ilə fərqlənir.

Termoelastiklik nəzəriyyəsində V.Quliyev tərəfindən stasionar qızma zamanı sərbəst birbağlılıq sahəsində toxunan gərginliklərin yoxluğu haqqında ümumi teorem isbat edilib, bu halda çatların maksimal ölçüsünü hesablama prosedurunu xeyli asanlaşdırmaq imkanı yaranıb.

Ümumi enerji yanaşmasına əsaslanaraq son plastik deformasiyanın çatının sonundakı əlaqələrin qırılmasının termoaktivləşdirici kimyəvi mexanizmdən sərbəstliyi ehtimalı əsasında V.Quliyev (Q.P.Çerepanovla birlikdə) 1972-ci ildə yorğunluq makroçatlarının böhran öncəsi artımı nəzəriyyəsini təklif edib. Makroçatların yorğunluğunun artım sürətinin eksperimental təsdiqlənmiş formulu əldə edilib. O,

"Çerepanov-Quliyev formulu" adı ilə bir çox tədris vəsaiti və sorğu kitabına daxil olunub.

V.Quliyev və Q.P.Çerepanovun yuxarıda adı çəkilən nəzəriyyəsi əsasında konstruksiya elementlərinin yorğunluq möhkəmliyini müəyyən etmək üçün effektiv metod hazırlanıb.

V.Quliyev tərəfindən Leonov-Panasyuk-Daqdeyl modeli əsasında yorğunluq mikroçatlarının artım sürəti formulu əldə edilib və onların yerinə yetirilməsi zamanı yorğunluq mikroçatlarının yorğunluq makroçatlarına keçməsinin reallaşma şərtləri müəyyən olunub.

O, sübut edib ki, təyyarələrin hermofüzelyajında daxili təzyiqin tsiklik dəyişikliyi ilə akustik yükün birləşməsi çatabənzər qüsurları artıra bilər, deməli, hermofüzelyaj panelinin davamlılığının təhlili zamanı akustik yük nəzərə alınmalıdır.

1974-cü ildə V.Quliyev (Q.P.Çerepanovla birlikdə) "isti" çatların artımının kinematikası nəzəriyyəsini təklif edib. Sonralar bu nəzəriyyə əsasında V.Quliyev qalıq qaynaq gərginliyinin yastı qaynaq birləşmələrinə təsirinin qiymətləndirilməsi üçün formul əldə edilib. O, həmçinin qalıq gərginliklərinin, material xassələrinin, davamlılıq xarici yükün ölçüsü və xarakterinin qaynaq birləşmələrinin möhkəmliyi və davamlılığına təsirini tədqiq edib. Əldə edilən nəticələr qaynaq və termik emalın optimal texnoloji proseslərinin hazırlanmasında, termogərgin konstruksiyaların daşıyıcı qabiliyyətinin və çata davamlılığının təhlilində xüsusilə vacibdir.

Son illər V.Quliyev termomexaniki yükləmələrin konstruksiyaların çoxlaylı elementlərində yorğunluq çatlarının artımına təsirini araşdırıb.

Hissəli-bircinsli mühit dağılmalarının mexanikasında V.Quliyev tərəfindən xeyli nəticələr əldə edilib, onlar layihə mərhələsində materialların seçimində istifadə olunur. Onlar həmçinin armaturlaşdırılmış materialların yorğunluq dağılma mexanizminin təhlilində zəruridir, çünki bu hal materialların möhkəmliyini idarə etməyə imkan verir.

V.Quliyev $n \geq 1$ laylı materiallardan hazırlanmış konstruksiyaların möhkəmliyini və yorğunluğunu qiymətləndirmək üçün metodoloji yanaşma hazırlayıb.

1982-1990-cı illərdə V.Quliyev SSRİ Dövlət Standard Komitəsinin Elmi-Texniki Şurasının "hesablamalar və möhkəmlik sınağı" seksiyasının dağılma mexanikası sahəsində standartlaşdırma üzrə elmi-metodiki komissiyasının üzvü olub və çata davamlılıq üzrə hesablama və sınaqlar üzrə normativ sənədlərin, dövlət standartlarının və metodik göstərişlərin hazırlanmasında fəal iştirak edib.

1996-2001-ci illərdə V.Quliyev Rusiya, ABŞ, birləşmiş Avropa və Yaponiya arasında beynəlxalq əməkdaşlıq proqramı çərçivəsində həyata keçirilən nüvə enerjisi

reaktorlarının çoxlaylı konstruksiya elementlərinin müvəqqəti meyarlarını hazırlayanlardan biri olub.

Son illər V.Quliyev tətbiqi riyaziyyat fakültəsində yeni informasiya texnologiyalarının yaradılması və dərs prosesinə tətbiqinə xüsusi diqqət yetirir. Onun rəhbərliyi və birbaşa iştirakı ilə 5 elektron kitab, "informatika" və "alqoritmik dillər və proqramlaşdırma" fənləri üçün nəzarət-tədris proqramları kompleksi yaradılıb.

V.Quliyev ali məktəb tələbələri üçün Rusiya Federasiyası Təhsil Nazirliyinin qrifi ilə "İnformatikanın əsasları" və "Menecment. İdarəetmə qərarları" dərsliklərinin müəlliflərindən biridir.

Son beş ildə V.Quliyevin rəhbərliyi ilə 5 namizədlik və 1 doktorluq dissertasiyası müdafiə olunub, 37 elmi əsər nəşr edilib.

Rusiya Federasiyası Prezidentinin 2005-ci il tarixli Fərmanı ilə elm sahəsində xidmətlərinə, yüksək ixtisaslı mütəxəssislərin hazırlanmasına əhəmiyyətli töhfələrinə görə V.Quliyev "Rusiya Federasiyası Ali Məktəbinin Əməkdar İşçisi" fəxri adına layiq görülüb. Rusiya kosmonavtikası qarşısında xidmətlərinə görə "K.E.Tsiolkovski", "M.V.Keldış", "G.S.Titov", "Y.A.Qaqarin", "akademik M.N.Yangel" medalları ilə təltif edilib. Görkəmli nailiyyətləri, Rusiya elmi və təhsilinin inkişafına böyük şəxsi töhfəsinə görə V.Quliyev "Lomonosov" ordeni ilə təltif edilib. Ona "Kosmik texnologiyanın Əməkdar Sınaqçısı" fəxri adı verilib. Bundan əlavə, V.Quliyev "1941-1945-ci illər Böyük Vətən müharibəsində Qələbənin 20 illiyi" və "Moskvanın 850 illiyi xatirəsinə" medalı ilə təltif edilib.



## Quliyev
## Yədulla İman oğlu

*Texnika elmləri namizədi.*
*REA-nın Proqram Sistemləri İnstitutunun*
*Tibbi İnformatika Tədqiqat Mərkəzinin direktoru*

Quliyev Yədulla İman oğlu 1959-cu il mayın 3-də Azərbaycan Respublikasında anadan olub.

1987-ci ildə M.V.Lomonosov adına MDU-nun mexanika-riyaziyyat fakültəsini "riyaziyyat" ixtisası üzrə bitirib. 1987-ci ildən indiyədək Rusiya Elmlər Akademiyasının Proqram Sistemləri İnstitutunda işləyir.

1987-1994-cü illərdə Y.Quliyev Süni İntellekt Tədqiqat Mərkəzində müxtəlif vəzifələrdə çalışıb, proqram təminatının tədqiqatlarında və hazırlanmasında iştirak edib. 1994-cü ildə inteqrasiya olunmuş tibbi informasiya sistemlərinin hazırlanması üzrə "İnterin" laboratoriyasının və "İnterin" layihəsinin rəhbəri olub.

1999-cu ildə Y.Quliyev "İnteqrasiya olunmuş informasiya sistemləri düzülüşünün əsas texnoloji həlli prinsiplərinin və hazırlanmasının tədqiqi" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib.

2003-cü ildən Y.Quliyev "İnterin" laboratoriyasının nəzdində yaradılan Tibbi İnformatika Tədqiqat Mərkəzinin direktorudur. Onun rəhbərliyi altında İnterin - inteqrasiya olunmuş tibbi informasiya sistemlərinin yaradılması texnologiyası hazırlanıb, həmçinin iri müalicə-profilaktika müəssisələrində bir sıra informasiya sistemləri yaradılıb və uğurla tətbiq edilib.

Tibbi informasiya sistemlərinin hazırlanmasının texnologiyaları, metodları və instrumental vasitələri, tibbi informasiya sistemlərində məlumatın təqdim olunması üsulları Y.Quliyevin elmi maraq sahəsinə daxildir.

Y.Quliyev 50-dən çox dərc olunmuş məqalənin müəllifidir. Elmi və praktiki konfranslarda mütəmadi olaraq çıxışlar edir.



## Quliyev
## Yusif Alıqulu oğlu

*Moskva İqtisad və Hüquq Akademiyasının Smolensk filialının direktor müavini*

Quliyev Yusif Alıqulu oğlu 1956-cı il fevralın 28-də Azərbaycan Respublikasının Zəngilan rayonunun Zərnəli kəndində anadan olub.

Zəngilan rayonunun Məmmədbəyli orta məktəbini, sonra isə Şuşa Kənd Təsərrüfatı Texnikumunu "baytarlıq" ixtisası üzrə bitirib. Zəngilan rayonunun Kalinin adına sovxozunda baytar həkim, sonradan isə həmin rayonun Aqrar-İstehsalat Birliyində baş baytar vəzifəsində çalışıb.

1978-ci ildə Y.Quliyev daimi yaşamaq üçün Smolensk vilayətinə köçüb və burada vilayət icraiyyə komitəsi Dİİ-də sahə müvəkkili işləyib. 1982-1985-ci illərdə SSRİ DİN-in Kalininqrad xüsusi orta milis məktəbinin hüquq bölməsində, sonra Moskva İqtisad və Hüquq Akademiyasının Smolensk filialında təhsil alıb.

Bu biliklər Y.Quliyevə gələcəkdə müxtəlif müəssisə və təşkilatlarda tutacağı məsul vəzifələrdə gərək olub. 1988-ci ildən 2000-ci ilədək o, ardıcıl olaraq "Smolenskstroymaterialı" İB-nin direktor müavini, "Qarant" istehsalat müəssisəsinin direktoru, Smolensk "Qortop" İB-nin direktor müavini, "Stroydetal" SC-nin direktor müavini, "Proqress-aqro" MMY-nin direktoru, Rusiya Menecment və Aqrar Biznes Mühəndislik Akademiyasının Smolensk filialının direktor müavini işləyib.

Y.Quliyev 2004-2007-ci illərdə Moskva İqtisad və Hüquq Akademiyasının Smolensk filialının direktor müavini olub və hazırda da bu vəzifədə çalışır. Smolenskdə bu ali təhsil müəssisəsinin formalaşmasında Y.Quliyevin xidmətləri böyükdür. Bundan başqa, o, 2007-ci ildən "Qaqarin" AST MMC-nin direktor müavinidir.

Y.Quliyev "Nizami" Smolensk Azərbaycan mədəniyyət mərkəzi" ictimai təşkilatı şurasının sədri, "Smolensk vilayəti Milli İctimai Birliklər Konqresi" regional ictimai assosiasiyası şurasının sədridir. Assosiasiyaya Smolensk vilayətinin milli ictimai birlikləri – almanların, polyakların, latışların, tatarların, qaraçıların və regionda yaşayan bir çox başqa millətlərin diasporları daxildir. Ümumilikdə assosiasiyada 15 mindən çox insan birləşir.

Y.Quliyev “Smolensk vilayəti Milli İctimai Birliklər Konqresi” assosiasiyasının “Mı vmeste” qəzetinin redaksiya heyətinin üzvü, Smolenskdə 2000-ci ildən ənənə halını almış “Milli mədəniyyətlər günləri” bayramının, həmçinin Azərbaycan və dünyanın digər xalqlarının mədəniyyətinə və ənənələrinə həsr olunan bir çox başqa tədbirlərin keçirilməsinin təşəbbüskarıdır.

Y.Quliyev Smolensk Vilayət İctimai Palatasının (birinci və ikinci çağırış) üzvü, İP-nin insan hüquqları üzrə komissiyasının sədr müavinidir. O, Smolensk vilayəti qubernatorunun, Smolensk şəhər administrasiyasının, Smolensk Vilayət Dumasının və Smolensk şəhər şurasının çoxsaylı Fəxri fərmanları və təşəkkürnamələri ilə təltif olunub.

Y.Quliyev Ümumrusiya Azərbaycan Konqresinin Smolensk regional bölməsinin sədridir.



## Quluzadə
## Tofiq Salman oğlu

*Fizika-riyaziyyat elmləri namizədi.*
*Moskva Dövlət Dəmir Yolu Universitetinin fizika kafedrasının dosenti*

Quluzadə Tofiq Salman oğlu 1935-ci il mayın 19-da Bakıda anadan olub.

1954-cü ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) geologiya fakültəsinə qəbul olunub. Daha sonra fizika fakültəsinin tələbəsi olarkən 1959-cu ildən Lökbatandakı axşam məktəbində, Buta qəsəbəsində, daha sonra Bakıdakı 85 saylı məktəbdə fizika və riyaziyyat müəllimi kimi çalışıb.

1961-ci ildə T.Quluzadə Azərbaycan Elmlər Akademiyasının Fizika İnstitutunun kiçik elmi işçisi, 1963-1964-cü illərdə Azərbaycan Elmlər Akademiyası Fizika İnstitutunun aspirantı, 1964-cü ildə SSRİ Elmlər Akademiyasının Ümumi və Qeyri-üzvi Kimya İnstitutunun aspirantı olub. 1971-ci ildə T.Quluzadə "Üzvi liqandlarla palladiumun bəzi kompleks birləşmələrinin rentgen struktur tədqiqatları" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1969-1974-cü illərdə Azərbaycan Elmi-Tədqiqat Elmi-Texniki İnformasiya və Texniki-İqtisadi Tədqiqatlar İnstitutunda patent informasiyasının rəhbəri vəzifəsində işləyib və respublika milli patent fondunun komplektləşdirilməsi və emalı, patent materialların informasiyası və təbliği, respublika müəssisələrində ixtiraların tətbiqi, respublika müəssisə və təşkilatlarının mühəndis-texniki və patent xidməti işçilərinin ixtisas hazırlığının artırılmasında böyük işlər görüb.

1976-cı ildən bu günədək T.Quluzadə Moskva Dövlət Dəmir Yolu Universitetində dosent, holoqrafik nəzarət metodları laboratoriyasında baş elmi işçi vəzifələrində çalışır.

T.Quluzadə dəmir yol nəqliyyatı texnikası və Müdafiə Nazirliyinin nəzarət-ölçü lazer aparaturası nümunələrinin yaradılması üzrə dövlət büdcəsi və təsərrüfat müqavilələri əsasında işlərdə fəal iştirak edib. Onun fəal iştirakı ilə metropolitenlərin və gəmi qurğularının enerji təminat sistemlərinə nəzarət üçün yüksək cərəyanlı maqnit-optik ötürücü hazırlanıb.

1991-ci ildə T.Quluzadə tunel və körpü tikililəri sahəsində mütəxəssis kimi limanların kompleks layihələndirilməsində "Soyuzmorminproyekt" Elmi-Tədqiqat Dəniz Nəqliyyatı İnstitutu tərəfindən işə cəlb edilib.

1984-cü ildən Pnompendə Kampuçiya-Sovet Dostluğu Ali Texniki İnstitutunun fizika kafedrasına rəhbərlik edib. Kampuçiya Xalq Respublikasında (KXR) işlədiyi müddətdə T.Quluzadə tərəfindən mexanika, molekulyar fizika və elektrostatika üzrə laboratoriya işləri təşkil olunub.

KXR-də o, fizika üzrə 4 metodik tövsiyə, rus-fransız-kxmer dillərində fiziki terminlər lüğəti hazırlayıb və nəşr edib.

T.Quluzadə həmçinin elmi-fiziki dərnəyə rəhbərlik edib, fizika üzrə 3 olimpiada keçirib. Nəticədə, 1987-ci ildə o, KXR Ali Təhsil Nazirliyi tərəfindən KXR iqtisadiyyatı üçün ixtisaslı mütəxəssislərin hazırlanmasına görə fəxri fərmanla təltif edilib.

T.Quluzadə Moskva Dövlət Dəmir Yolu Universitetində tələbələrin distant təhsili formasının banisidir.

Moskva Dövlət Dəmir Yolları Universiteti ilə Milli Aviasiya Akademiyası arasında əməkdaşlıq haqqında 2012-ci il tarixli saziş çərçivəsində T.Quluzadə Moskva Dövlət Dəmir Yolu Universiteti tərəfindən məsul icraçı təyin edilib.

Uzun illər T.Quluzadə Moskva Dövlət Texniki Tərəqqi və İqtisadi Biliklər Universitetinin keyfiyyəti idarəetmə fakültəsinin dekan müavini olub.

T.Quluzadə 35 məqalə, məruzə, metodik tövsiyə hazırlayıb və nəşr edib. "Moskvanın 850 illiyi" medalı ilə təltif olunub, əmək veteranıdır.



## Qurbanov
## Fazil Səməd oğlu

*Tibb elmləri doktoru, professor.*
*N.A.Semaşko adına Mərkəzi Kliniki Xəstəxananın cərrahiyyə şöbəsinin müdiri*

Qurbanov Fazil Səməd oğlu 1944-cü il fevralın 18-də Bakıda qulluqçu ailəsində anadan olub.

1973-cü ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) müalicə-profilaktika fakültəsini bitirib, Respublika Uroloji Xəstəxanası nəzdində internatura keçib. 1975-ci ildən Azərbaycan Elmlər Akademiyasının (EA) Fiziologiya İnstitutunun cərrahiyyə qrupunun elmi işçisi (elmi rəhbəri SSRİ Tibb Elmləri Akademiyasının (TEA) akademiki M.A.Topçubaşov) olub.

F.Qurbanov 1980-ci ildə SSRİ TEA-nın Ümumittifaq Elmi-Cərrahiyyə Mərkəzi (ÜECM, indiki Rusiya Tibb Elmləri Akademiyasının Elmi-Cərrahiyyə Mərkəzi) nəzdində aspiranturaya daxil olub. 1983-cü ildə "Cərrahi müalicədən sonra kardiospazm residivində pnevmatik kardiodilatasiya" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

F.Qurbanov 1984-cü ildə Azərbaycan EA-nın Fiziologiya İnstitutunun cərrahiyyə qrupunun böyük elmi işçisi olub. Elə həmin il SSRİ TEA ÜECM nəzdində cərrahiyyə üzrə doktoranturaya göndərilib.

1987-ci ildə "Qida borusu xərçəngində və xoşxassəli strikturalarında birmomentli ezofaqoplastika" mövzusunda doktorluq dissertasiyası (elmi məsləhətçi - RTEA-nın müxbir üzvü A.F.Çernousov) müdafiə edib.

F.Qurbanov 1989-cu ildə Azərbaycan Elmi-Tədqiqat Qastroenterologiya İnstitutunda qida borusu, mədə və onikibarmaq bağırsaq cərrahiyyəsi bölməsinin rəhbəri kimi fəaliyyətə başlayır və N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun fakültə cərrahiyyəsi kafedrasının professoru olur. F.Qurbanov RTEA ECM-də təhsil aldığı illərdə mükəmməl mənimsədiyi qida borusu orqanları xəstəliklərinin operativ və konservativ müalicəsi metodlarını burada uğurla tətbiq edib, elmi-pedaqoji işlə, elmi kadrların hazırlanması ilə məşğul olub.

F.Qurbanov 1999-cu ildə Moskvaya köçüb. RF Yollar Nazirliyinin N.A.Semaşko adına Mərkəzi Kliniki Xəstəxanasında cərrahiyyə bölməsinin müdiri vəzifəsini

tutub, eyni zamanda Rusiya Xalqlar Dostluğu Universitetinin hospital cərrahiyyəsi kafedrasının professoru olub.

Xora xəstəliyi cərrahiyyəsi və əməliyyat olunmuş mədə xəstəliklərində bərpa əməliyyatları, kardiospazm və əməliyyat olunmuş qida borusu xəstəlikləri, xoşxassəli çapıq strikturaları və qida borusu xərçəngi, qarın boşluğu və peritonarxası sahə orqanlarının mini invaziv cərrahiyyəsi, donor qanından istifadə olunmadan həcmli torakal və abdominal əməliyyatların aparılması F.Qurbanovun elmi maraqları dairəsinə daxildir.

F.Qurbanov 130-dan çox dərc edilmiş elmi əsərin, o cümlədən 3 monoqrafiyanın, 6 ixtiranın və 7 səmərələşdirici təklifin müəllifidir. Onun rəhbərliyi ilə 2 doktorluq və 7 namizədlik dissertasiyası müdafiə olunub. F.Qurbanov N.İ.Piroqov adına Cərrahlar Assosiasiyasının, Rusiya Endoskopik Cərrahlar Assosiasiyasının, Beynəlxalq Cərrahlar Kollecinin üzvü, cərrahların və qastroenteroloqların beynəlxalq konqreslərinin iştirakçısıdır.

F.Qurbanov 2003-cü ildə Nyu-York Elmlər Akademiyasının həqiqi üzvü seçilib.



## Qurbanov
## Namiq Qurban oğlu

*Geologiya-mineralogiya elmləri doktoru, professor. Mərkəzi Elmi-Tədqiqat Geoloji Kəşfiyyat İnstitutunun əlvan və qiymətli metallar şöbəsinin müdiri*

Qurbanov Namiq Qurban oğlu 1932-ci il aprelin 29-da Azərbaycan Respublikasının Naxçıvan Muxtar Respublikasında anadan olub.

1954-cü ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin "faydalı qazıntı yataqlarının geologiyası və kəşfiyyatı" ixtisası üzrə geologiya fakültəsini bitirib.

1954-1964-cü illərdə N.Qurbanov kiçik elmi işçi, 1964-1970-ci illərdə baş elmi işçi olub. 1972-ci ildə N.Qurbanov "filiz və qeyri-filiz yataqlarının geologiyası, axtarışı və kəşfiyyatı" ixtisası üzrə professor elmi adı alıb.

1970-1982-ci illərdə laboratoriya müdiri, 1982-ci ildən Rusiya Federasiyası Təbii Ehtiyatlar Nazirliyinin Mərkəzi Elmi-Tədqiqat Geoloji Kəşfiyyat İnstitutunun (METGKİ) əlvan və qiymətli metallar şöbəsinin müdiri olub.

METGKİ-də elmi fəaliyyəti dövründə N.Qurbanov dəfələrlə Birləşmiş Ərəb Respublikası, İraq, Misir, Rumıniya, İran, Pakistan, Hindistan, Çexoslovakiyaya texniki rəhbər, baş mütəxəssis, ekspert və kontrakt rəhbəri qismində səfərlər edib.

N.Qurbanovun elmi fəaliyyətinin əsas istiqamətləri bunlardır: əlvan və qiymətli metal yataqlarının proqnozlaşdırılması, kəşfiyyatı və qiymətləndirilməsi məqsədləri üçün struktur-formasiya analizi və rayonlaşdırma metodlarının işlənib hazırlanması və tətbiqi. Əlvan və qiymətli metal yataqlarının lokallaşdırma və genezis şərtlərinin tədqiqi əsasında N.Qurbanov tərəfindən bu metal yataqlarının müxtəlif növləri üçün geoloji-genetik, proqnoz-axtarış və çoxfaktorlu modelləri hazırlanıb və nəşr olunub.

1970-1991-ci illərdə N.Qurbanov SSRİ Faydalı Qazıntı Ehtiyatları üzrə Dövlət Komissiyasının eksperti olub. Daha sonralar Rusiya Federasiyası Təbii Sərvətlər və Ekologiya Nazirliyinin ekspert şuralarının daimi üzvü və kuratoru, Cənubi Uraldakı böyük Uzelqinsk mis-kolçedan yataqlarının kəşf edilməsi və qiymətləndirilməsi, Böyük Qafqazda (Cigix-altı, Filizçay II, Katex II) kolçedan-polimetal yataqlarının və Kiçik Qafqazda (Qızılbulaq), Qırğızıstanda (Kumtor III), Muruntau cinahlarındakı (Özbəkistan) qızıl yataqlarının kəşfiyyatı və qiymətləndirilməsinin iştirakçılarından biri olub.

1964-1971-ci illərdə N.Qurbanov M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin geologiya fakültəsində "Geoloji-filiz formasiyaları əyalətləri" kursunu tədris edib. Yuxarıda sözügedən yataqların kəşfi və qiymətləndirilməsinə görə N.Qurbanov 1982-ci ildə SSRİ Dövlət Mükafatı laureatı adına layiq görülüb.

1982-1989-cu illərdə SSRİ Geologiya Nazirliyinin İxtisasartırma İnstitutunda əlvan və qiymətli metalların axtarışı və proqnozu üzrə mühazirələr oxuyub.

N.Qurbanovun 3 kəşfə müəlliflik şəhadətnaməsi var. 1994-cü ildən o, Mineral Ehtiyatlar Beynəlxalq Akademiyasının, 1995-ci ildən Rusiya Təbii Elmlər Akademiyasının və FYGBA-nın (Filiz Yataqlarının Genezisi üzrə Beynəlxalq Akademiya, ABŞ, Nyu-York) həqiqi, həmçinin METGKİ Böyük Elmi Şurasının və dissertasiya müdafiəsi üzrə iki elmi şuranın, "Sovetskaya geologiya", "Oteçestvennaya geologiya" və "Rudı i metalı" jurnallarının redaksiya heyətlərinin üzvüdür.

N.Qurbanov 4 monoqrafiya və Moskva, Novosibirsk, Kiyev, Daşkənd, Praqa və digər şəhərlərdə nəşr olunan müxtəlif jurnallarda 230 elmi məqalə dərc edib. Alimin ən böyük elmi əsərləri sırasında "Cənubi Uralın kolçedan yataqlarının müfəssəl çəkilişində geoloji tədqiqatların metodikasının bəzi məsələləri" (Moskva, 1965), "Jurassic-Greace deposits and mineral resources of the Zeblani – Rayak area (Syria). Knabib Publ. House" (London-Paris-Dəməşq, 1968), "Kolçedan yataqlarının proqnozu və axtarışında geoloji müşahidə sistemi" (Moskva, 1982), "SSRİ-nin kolçedan yataqları" (Moskva, 1983), "Qızıl yataqlarının proqnozlaşdırılması və axtarışı" (Moskva, 1989) və "Filiz-enerji sistemləri qızıl yataqlarının geterogenliyi və konvergent cərgələri"ni (Moskva, 1996) qeyd etmək olar.

1985-ci ildə N.Qurbanova "SSRİ-nin yeraltı sərvətlərinin fəxri kəşfiyyatçısı" adı verilib, 1973-cü ildə alim "Yeraltı sərvətlər kəşfiyyatının əlaçısı" adına layiq görülüb.



## Qurbanov
## Seyfəddin Əli oğlu

*Ukraynanın Xalq Rəssamı, dosent.*
*Xarkov Dövlət Dizayn və İncəsənət Akademiyasının heykəltəraşlıq kafedrasının müdiri*

Qurbanov Seyfəddin Əli oğlu 1962-ci il oktyabrın 19-da Azərbaycan Respublikasının Naxçıvan MR-in Siyaqut kəndində anadan olub.

1989-cu ildə Xarkov Bədii-Sənaye İnstitutunun (indiki Xarkov Dövlət Dizayn və İncəsənət Akademiyası) heykəltəraşlıq bölməsini fərqlənmə diplomu ilə bitirib. Əmək fəaliyyətinə 1989-cu ildə Xarkov Bədii-Sənaye İnstitutunun heykəltəraşlıq kafedrasında müəllim kimi başlayıb. 1991-ci ildə Sankt-Peterburq Bədii Akademiyasında təcrübə keçib.

1992-ci ildən S.Qurbanov Ukrayna Rəssamları Milli İttifaqının Xarkov təşkilatının üzvüdür. 2000-2003-cü, 2005-2008-ci illərdə Şərqi-Ukrayna Biznes Akademiyasının baş heykəltəraşı, 2003-2005-ci illərdə Şərqi-Avropa İnnovasiyalar Mərkəzinin baş heykəltəraşı olub. 2008-ci ildən indiyədək Xarkov Dövlət Dizayn və İncəsənət Akademiyasının heykəltəraşlıq kafedrasının müdiridir.

2004-cü ildə S.Qurbanova "Ukraynanın əməkdar rəssamı", 2005-ci ildə isə "Ukraynanın xalq rəssamı" adları verilib. Təmiz qızıldan hazırlanan Xatirə nişanını ona Ukrayna Prezidenti təqdim edib. 2007-ci ildə "Ukrayna təhsil əlaçısı" nişanı ilə mükafatlandırılıb.

S.Qurbanov Xarkov vilayət şurasının "Slobojanskaya slava" Fəxri fərqlənmə nişanı, Beynəlxalq "Müqəddəs Sofiya" ordeni, marşal Jukov ordeni, Beynəlxalq "Sokrat" mükafatı (Oksford Universiteti, Böyük Britaniya) ilə təltif olunub.

S.Qurbanov "İlin xarkovlusu" regional reytinqinin və "İlin xarkovlusu" regional mükafatının laureatı (2008), "Ukraynanın iş adamı" Ümumukrayna reytinqinin laureatıdır. 2005-ci ildə Maltanın Yerusəlimli müqəddəs İoann ordeninin cəngavərliyinə qəbul edilməklə ona Malta ordeni verilib (Valletta, Malta).

2006-cı ildə S.Qurbanov Azərbaycan Prezidenti İlham Əliyev tərəfindən "Tərəqqi" medalı ilə təltif olunub. 2007-ci ildə ona "Slavyan Universitetinin professoru" fəxri adı verilib.

2009-cu ildə "Xarkovun ali məktəbi - ən yaxşı adlar" vilayət müsabiqəsinin qalibi olub. 2011-ci ildə S.Qurbanova "Xarkov vilayətinin fəxri vətəndaşı" adı, 2013-cü ildə isə XDDİA-nın heykəltəraşlıq kafedrasının dosenti elmi adı verilib. 2014-cü ildə o, "Ən yaxşı kafedra müdiri" nominasiyasında qalib olub.

S.Qurbanovun heykəltəraşlıq işləri Ukraynanın bir çox şəhərlərini bəzəyir, onların sırasında Səməd Vurğunun (Kiyev), Zərifə Əliyevanın (İrpen), Aleksandr Nevskinin, memar A.N.Beketovun, İlya Meçnikovun da heykəlləri var. Kompozisiyalar arasında "İlk müəllimə", "DAM müfəttişi", "Yaroslav Mudrı", "Xarkovun yeddi möcüzəsi", "Əsrlərdə farmasiya" (Xarkov) və başqaları xüsusilə fərqlənir. Heykəltəraş Xarkovda qoyulan "Damdakı skripkaçı" heykəlinə görə 2005-ci ildə xüsusi mükafata layiq görülüb.

S.Qurbanov Azərbaycanın Milli Qəhrəmanı V.V.Seryogin, görkəmli siyasi xadim Yevgeni Kuşnaryov, Klavdiya Şuljenko (Xarkov) kimi məşhur xarkovluların, həmçinin dünya şöhrətli alim L.D.Landau və Qurban Səidin (Berlin, Almaniya) xatirə lövhələrinin müəllifidir. Balakleyanin mərkəzində Ukrayna xalqının mənəvi atası Taras Şevçenkonun, Pəçənəkdə - polşalı Henrix Semiradskinin, Volçanskda - Vasili Kolokolsevin bürünc heykəlləri ucalır. Bundan başqa S.Qurbanov "Qızıl yaquar", "Avropa keyfiyyəti", "Yüksək əyar", "Qızıl merkuri", "1000 illik" mükafatlarının müəllifidir.

S.Qurbanov İşgüzar Dairələr Məclisinin baş heykəltəraşıdır. Nüfuzlu ictimai təşkilatın dünyanın aparıcı siyasətçilərinə, sənayeçilərinə, sahibkarlarına, alimlərinə, mədəniyyət xadimlərinə təqdim edilən 20-dək milli və beynəlxalq mükafat artıq 20 ilə yaxındır ki, onun tərəfindən hazırlanıb. Döş nişanları (ordenlər, medallar) ənənəvi olaraq zərgərlik müəssisələrində hazırlanırsa, stolüstü mükafat atributunun hazırlanması bilavasitə müstəsna müəllif hüququdur.



## Lütfi Zadə
### *(Ələsgərzadə Lütfi Rəhim oğlu)*

*Riyaziyyat elmləri doktoru, professor.*
*Kaliforniya Universitetinin professoru. Qeyri-səlis çoxluqlar və qeyri-səlis məntiq nəzəriyyəsinin banisi*

Lütfi Zadə 1921-ci il fevralın 4-də Bakıda anadan olub.

Bir neçə il Bakıdakı rus məktəbində oxuyub. 1931-ci ildə ailəsi İrana köçüb. L.Zadə əvvəlcə Tehranda Amerika kollecini (Alborts kolleci), daha sonra Tehran Universitetini bitirərək, "elektrotexnika" ixtisası üzrə bakalavr dərəcəsi alıb.

1944-cü ildə L.Zadə ABŞ-a gedir, burada məşhur Massaçusets Texnoloji İnstitutuna (MIT) daxil olur. 1946-cı ildə institutu "elektrotexnika" ixtisası üzrə magistr dərəcəsi ilə bitirir. Sonra Kolumbiya Universitetində elektrotexnika müəllimi vəzifəsinə işə qəbul edilir. 1949-cu ildə Ph.D doktorluq dərəcəsi alır və hələ təxminən 10 il də burada işləyir, qısa müddətdə assistentdən 1957-ci ildə professor vəzifəsinədək yüksəlir. Qeyri-stasionar zəncirlərin tezlik analizi məsələlərinə həsr olunmuş dissertasiya L.Zadənin ilk əhəmiyyətli elmi işi olub. Burada o, qeyri-stasionar ötürmə funksiyası anlayışını tətbiq edib. Sonralar qeyri-stasionar xətti sistemlərin analizində bu anlayışa çoxlu əlavələr edilib. Beləcə, L.Zadə beynəlxalq miqyasda ilk uğurunu qazanıb. 1950-ci ildə Con Raqazini ilə birlikdə Vinerin proqnozlaşdırma nəzəriyyəsinin maraqlı ümumiləşməsini təklif edib. Hazırda klassika sayılan bu iş sonlu yaddaşlı süzgəclərin layihələndirilməsinə tətbiq edilib. Alim 1952-ci ildə yenə də C.Raqazini ilə birlikdə diskret sistemlər üçün z-çevrilmələr metodunu işləyib hazırlayıb. Bu metod da sistemlərin analizində klassika olub və avtomatik idarəetmə və rəqəmsal süzgəc sistemlərinin yaradılmasına geniş tətbiq edilib.

1953-cü ildə L.Zadə qeyri-xətti filtrasiyaya yeni yanaşma işləyib hazırlayıb və Volterra-Viner təsəvvürlərinə əsaslanan qeyri-xətti sistemlər iyerarxiyasını qurub. Beləliklə, küydə faydalı siqnalları tutmaq üçün optimal qeyri-xətti prosessorların layihələndirilməsinin təməli qoyulub.

L.Zadə 1959-cu ildə Kaliforniyaya köçüb və Berklidə, Kaliforniya Universitetinin elektrotexnika kafedrasında işləməyə başlayıb. Burada onun elmi maraqları əsasən xətti sistemlər və avtomatik idarəetmə nəzəriyyələri üzərində cəmləşib. Çarlz Dezoyerlə birlikdə yazdıqları "Xətti sistemlər nəzəriyyəsi (vəziyyətlər fəzası metodu)"

kitabının 1963-cü ildə çapdan çıxması əhəmiyyətli nəticə oldu. Burada xətti sistemlər nəzəriyyəsinə keyfiyyətcə yeni yanaşma şərh edilib. Əsərdəki ideyalar sistemlərin analizinə və avtomatik idarəetməyə bir çox müasir yanaşmaların mənbəyinə çevrilib.

L.Zadə 1963-1968-ci illərdə Kaliforniya Universitetində elektrotexnika kafedrasına başçılıq edib. Həmin vaxt o, artıq sistemlər və avtomatik idarəetmə nəzəriyyələri və onların əlavələri sahəsində tanınmış mütəxəssis idi. Lakin təbiətinə xas novatorluq ruhu arxayınlaşmasına imkan vermir və o, 1965-ci ildə 44 yaşında "Information and Control" jurnalında həyatının başlıca əsərini – qeyri-səlis çoxluqlara dair məqalə dərc etdirir: "Fuzzy Sets". Böyük tarixi əhəmiyyət daşıyan bu əsər yeni elmi istiqamətə təkan verir və bütün dünyada güclü əks-səda doğurur. L.Zadənin əsas ideyası bundan ibarət idi ki, insanların təbii dilə dayanan elmi fikirləri ənənəvi riyazi formalizmlər çərçivəsində təsvir edilə bilməz. Qeyri-səlis çoxluqların - mənsubluq funksiyaları ilə təsvir edilən və sərhədləri qeyri-səlis müəyyən olunan siniflərin (adi çoxluqların xarakteristik funksiyalarını ümumiləşdirən) tətbiqi davranışı ədədi dəyişənlərdən daha çox linqvistik dəyişənlərlə təsvir edilən mürəkkəb humanist sistemlər mühakimələrinin analizinə və modelləşdirilməsinə daha çevik yanaşmanın inkişafının əsasını qoyur.

Bu məqalənin qeyri-səlis riyaziyyat sahəsində yaratdığı yazı seli bu günə qədər səngimək bilmir. Ötən əsrin 60-70-ci illərində L.Zadənin qeyri-ortodoksal ideyaları müxtəlif elmi dairələrdə, xüsusən "əsl riyaziyyatçılar" arasında çox ehtiyatla, bəzən isə soyuq qarşılanırdı. Amma qeyri-səlis çoxluqlar və qeyri-səlis məntiq nəzəriyyəsinin praktiki potensialı, çevik və qeyri-səlis məhdudiyyətləri modelləşdirmək bacarığı, xassələrinin qismən təzahür etməsi, bir vəziyyətdən başqa vəziyyətə rəvan keçməsi tətbiqçilərin bütöv bir ordusunu bu sahəyə cəlb edir. Son 20 ildə obrazların tanınmasında, təsvirlərin analizində, ekspert sistemlərində, qərarların qəbuluna dəstək sistemlərində və bir çox digər sahələrdə, xüsusən məişət texnikasından (qeyri-rəsmi məntiqli tozsoranlar, paltaryuyan maşınlar) tutmuş mürəkkəb texnoloji proseslərin (domen prosesinin, atom enerji bloklarının idarə olunması) və dinamik obyektlərin (metro qatarları, avtomobillər, helikopterlər, robotlar və s.) idarə olunmasınadək sənayedə geniş tətbiq edilən qeyri-səlis idarəetmə modellərində qeyri-səlis riyaziyyatın metod və modellərinin əlavələri işlənib hazırlanıb.

Bu gün qeyri-səlis çoxluqlar və qeyri-səlis məntiq nəzəriyyəsi həqiqətən dünyanı fəth edib. Bu işdə ideyalarını bütün dünyada fəal təbliğ edən L.Zadənin özünün böyük xidmətləri var. O, Berklidə daimi işi ilə yanaşı, uzun illər Massaçusets Texnoloji İnstitutunda (1963, 1968), IBM korporasiyasının San-Xosedəki elmi-tədqiqat

laboratoriyasında (1968, 1971, 1974, 1977), Stenford Universitetində (1987) dəvətli professor kimi işləyib. Fransa, İngiltərə, Kanada, Almaniya, Yaponiya, Çin, İtaliya, İspaniya, Portuqaliya, İsveç, İsveçrə, Avstriya, Rumıniya, Macarıstan, Yuqoslaviya, SSRİ, Polşa, Türkiyə, Hindistan, Braziliya, Sinqapur, Səudiyyə Ərəbistanı və digər ölkələrdə mühazirələr oxuyub.

L.Zadə orijinal elmi ideyalar generasiya edən, yeni elmi istiqamətlər yaradan, elmdə ilk cığır açan çox az sayda alimlər sırasına daxildir. 1970-ci illərdə onun ən məşhur əsərləri sırasında "Qərarların qəbulunun mürəkkəb sistem və proseslərinin analizinə yeni yanaşmanın əsasları" (1973), "Linqvistik dəyişən anlayışı və onun təqribi qərarların qəbuluna tətbiqi" (1975-1976), "Qeyri-səlis çoxluqlar mümkünlük nəzəriyyəsinin əsası kimi" (1978) əsərlərinin adlarını çəkmək olar. Adı çəkilən ilk iki əsərdə linqvistik dəyişən anlayışı tətbiq və təsvir edilib, intellektual sistemlərdə və idarəetmədə onun tətbiqi yolları nəzərdən keçirilib, qeyri-səlis məntiq əsasında idarəetmə ideyaları formalaşdırılıb və bütün bunlar sonralar qeyri-rəsmi tənzimləyicilər texnologiyasında həyata keçirilib. L.Zadə "Qeyri-səlis çoxluqlar və sistemlər" beynəlxalq jurnalının birinci nömrəsini açan üçüncü məqaləsində qeyri-additiv mümkünlük ölçüsünə, məsələn, imkanların paylanması funksiyası kimi qeyri-səlis çoxluqların interpretasiyasına dayanan qeyri-müəyyənliklərin hesablanması variantını təklif edib. Müəyyən atributun qeyri-səlisliyinin qiymətləndirilməsini ifadə edən qeyri-səlis çoxluqdan fərqli olaraq, mümkünlük ölçüsü bu və ya digər səlis hadisənin əmələ gəlməsi ilə bağlı informasiyanın qeyri-müəyyənliyini, natamamlığını təsvir edir. Mahiyyət etibarilə bu, interval analizi ilə səhvlər nəzəriyyəsinin ümumiləşməsi olan ekspert mühakimələrinin kəmiyyət təsviri (mənanın təsviri) üsuludur. Hazırda mümkünlük ölçüsü və ikili zərurət ölçüsü intellektual sistemlərdə qeyri-müəyyənliyin modelləşdirilməsinin əsas vasitələridir.

1980-ci illərdə L.Zadə qeyri-rəsmi məntiq və mümkünlük nəzəriyyələrinin inkişafı, habelə intellektual sistemlərdə onların tətbiqi problemləri üzərində işləyib. Məsələn, "Ekspert sistemlərində qeyri-müəyyənliyin idarə olunmasında qeyri-rəsmi məntiqin rolu" (1983) əsərində qeyri-səlis məntiqin qeyri-səlis informasiyanın verilməsi xeyrinə tətbiqi üsulu təsvir edilib və dəlillərin kombinə edilməsi əsasında nəticə çıxarmağın bir sıra qaydaları hazırlanıb. Sonra o, sağlam düşüncə mühakimələrinin modelləşdirilməsi məsələlərinə həsr olunmuş bir sıra əsərlər yazıb: "Sağlam düşüncə bilikləri nəzəriyyəsi" (1984), "Qeyri-səlis məntiqdə sillogizmlər və onların adi mühakimələrə və dispozisiyalı mühakimələrə tətbiqi" (1985), "Dispozisiyaların hesablama nəzəriyyəsi" (1986) və s.

L.Zadəni cəsarətlə İ.Priqojin, G.Haken, R.Tom, B.Mandelbrot ilə bərabər, sinergetik paradiqmanın banilərindən saymaq olar. Bir tərəfdən sinergetik metodologiya çərçivəsində qeyri-müəyyənlik daha sistemin davranışında mübarizə aparılmasını tələb edən xarici anomaliya kimi nəzərdən keçirilmir, onun ayrılmaz xarakteristikası kimi şərh olunur. Göründüyü kimi, L.Zadənin “sistemlərin mürəkkəblik dərəcəsi artdıqca onların səlis təsvirinin mümkünlüyünün azalması” barədə uyuşmazlıq (qeyri-birgəli) prinsipi sinergetika ideyaları ilə sıx bağlıdır. Əlbəttə, L.Zadənin humanist sistemlərində qeyri-səlisliyin və qeyri-müəyyənliyin adekvat modelləşdirilməsi məqsədi ilə təklif etdiyi anlayış və yanaşmaların bütün geniş spektrini fənlərarası elmi hərəkat kimi sinergetikanın ümumi metodologiyasına mühüm töhfə saymaq olar. Digər tərəfdən, onun 1991-1993-cü illərdə tətbiq etdiyi yumşaq hesablamalar sxemi (soft computing) sinergetika prinsiplərindən süni intellektdə bilavasitə istifadə etmək variantından ibarətdir.

İnformasiyanın simvol emalına və bul məntiqinə əsaslanan klassik intellektual sistemlərdə qeyri-müəyyənliyi və qeyri-səlisliyi nəzərə almaq üçün ədədi metodlardan istifadə olunmur, sərt hesablamalar (hard computing) texnologiyasına əsaslanırlar. Buna görə də müvafiq kompyuter proqramları çətinliklə modifikasiya olunan qapalı sistemlər nümunəsi olur. Bu sistemlər komponentlərin özünütəşkiletməsi, kooperasiyası və təkamülü imkanlarından tamamilə məhrumdur. L.Zadə “Yumşaq hesablamalar, qeyri-səlis çoxluqlar və neyron şəbəkələr” əsərində (1992) müxtəlif modellərdən onların qüsurlarının qarşılıqlı kompensasiyası və üstünlüklərinin birləşdirilməsi, nəticədə sinergetik (qeyri-xətti) effektlər əldə edilməsinin mümkünlüyü xeyrinə birgə istifadə olunması yolu ilə hibrid intellektual sistemin qurulması variantını təklif edən ilk alimlərdən biridir. Yumşaq hesablamalar çərçivəsində intellektin üç aspekti – təkamül prosesində qeyri-müəyyənliyin idarə olunması, təhsil və uyğunlaşma öyrənilən, genetik alqoritmlərin köməyi ilə optimallaşan neyron şəbəkəsində qeyri-səlis məhsul modellərinin təqdim edilməsi yolu ilə birləşir. Amma göstərilən komponentlərdən başqa xaotik modelləri, təkamül xarakterli hesablamaları, mümkünlük mühakimələrini, Bayes şəbəkələrini və onların genişlənməsini, tədris modellərini və s. ehtiva edən daha mürəkkəb hibridlər də ola bilər.

1990-cı illərdə L.Zadənin maraqları yumşaq hesablamalarla yanaşı, sözlər üzərində hesablama, habelə perseptiv qiymətləndirmənin hesablama nəzəriyyəsi metodologiyasının işlənib hazırlanması ilə bağlı olub.

Onun dərc olunmuş əsərləri arasında aşağıdakıları qeyd etmək olar: “Qeyri-səlis məntiq = Sözlər üzərində hesablama” (1996), “Qeyri-səlis məntiq və qeyri-səlis qay-

daların və qeyri-səlis qrafların hesablanması" (1997), "Ədədi hesablamalardan sözlər üzərində hesablamalara, ölçülərlə manipulyasiyalardan perseptiv qiymətləndirmələrlə manipulyasiyalara doğru" (1999-2001), "Perseptiv qiymətləndirmələrin sözlər üzərində hesablamalara əsaslanan hesablama nəzəriyyəsi haqqında qeydlər" (2000).

Hər bir nəzəriyyə təkamül potensialı, əsas anlayış və konstruksiyalarının genişlənməsi imkanları, habelə bu nəzəriyyəyə qoşulan, bəzən isə onunla rəqabət aparan yeni yanaşmaların əmələ gəlməsi ilə özünü təsdiq edir. L.Zadənin qeyri-səlis çoxluqlar ilə bağlı elmdə ilk cığır açan əsərlərinin doğurduğu hərəkat səmərəli inkişaf etməyə davam edir: onun davamçıları distributiv qəfəsdə mənsubluq qiymətləri olan L-qeyri-səlis çoxluqlar, hər bir nöqtədə interval mənsubluq qiymətləri olan P-qeyri-səlis çoxluqlar, mümkün ola bilən çoxluqlar, səviyyənin qeyri-səlis çoxluqları, intuisiyaya əsaslanan qeyri-səlis çoxluqlar və s. təklif ediblər. Eyni zamanda, alternativ yanaşmalar – təsadüfi çoxluqlar, kəsilməz məntiqlər, sübutlar nəzəriyyəsi, yaxınlaşdırılmış çoxluqlar, qeyri-müəyyən çoxluqlar bu və ya digər dərəcədə uğurla tətbiq edilir.

Hazırda professor Lütvi Zadə dünya şöhrətli alim, Elektrotexnika və Elektronika Mühəndisləri İnstitutunun (IEEE), Amerika Süni İntellekt Assosiasiyasının (AAAI) , ACM-nin, ABŞ Milli Mühəndislik Akademiyasının üzvü, Rusiya Təbiət Elmləri Akademiyasının əcnəbi üzvü, Azərbaycan Milli Elmlər Akademiyasının, Avstriya Kibernetika Tədqiqatları Cəmiyyətinin fəxri üzvüdür.

O, Nyu-York Universitetinin, Mərkəzi Florida Universitetinin (Orlando, ABŞ), "Paris 6" və Pol Sabatye (Tuluza, Fransa), Dortmund və Hamburq (Almaniya), Ovyedo və Qranada (İspaniya), Toronto (Kanada), Ostrava (Çexiya) universitetlərinin, Sileziya Texniki Universitetinin (Qlivitse, Polşa), Bakı Dövlət Universitetinin (Azərbaycan), habelə bir sıra digər universitetlərin fəxri doktorudur.

L.Zadə "İnformatikaya, qeyri-səlis məntiqin və onun əlavələrinin inkişafına böyük töhfəyə görə" Yaponiyanın "Honda" və "Okava" korporasiyalarının mükafatlarının (1996), Fransanın Kampe de Ferye mükafatının (1992), fundamental tədqiqatlara görə Rumıniya Elmlər Akademiyasının Qriqore Moyzila adına mükafatının (1993), ABŞ-ın idarəetmə sahəsində R.Bellman adına mükafatının (1998), IEEE-nin qeyri-səlis sistemlər üzrə mükafatının (2000), "Qeyri-səlis məntiqi inkişaf etdirmək yolu ilə süni intellektdə əsaslı töhfəyə görə" ACM-nin Alan Nyuel adına mükafatının (2001) laureatıdır.

L.Zadənin Elektrotexnika və Elektronika Mühəndisləri İnstitutunun təhsil sahəsində medalına (1973), bu institutun yaradılmasının 100 illik yubileyi münasibətilə medala (1984), "İnformatikaya və informasiya sistemlərinə böyük töhfəyə görə" Ri-

çard Hemminq adına medala, qeyri-səlis sistemlər nəzəriyyəsinin yaradılmasına görə Minilliyin medalına (2000), "Sistemlər nəzəriyyəsinə, həllərin analizinə, qeyri-səlis çoxluqlar nəzəriyyəsinə və onun tətbiqinə böyük töhfəsinə görə" Amerika Maşınqayırma Cəmiyyətinin Rufus Oldenburger adına medalına (1993), "Qeyri-səlis riyaziyyatda böyük nailiyyətlərinə görə" Çexiya Elmlər Akademiyasının B.Boltsano adına medalına (1997), Beynəlxalq İntellektual Sistemlər Cəmiyyətinin Edvard Feygenbaum adına medalına (1998) layiq görülüb. 2011-ci ildə L.Zadə Azərbaycanın "Dostluq" ordeni ilə təltif edilib, informasiya-kommunikasiya texnologiyaları nominasiyasında Avropanın 2012-ci il üçün "BBVA Foundation Frontiers of Knowledge Awards" mükafatına layiq görülüb.

L.Zadə fəxri redaktor, assosiasiyalı üzv və ya redaksiya heyətinin üzvü kimi bir çox elmi jurnalların fəaliyyətində iştirak edir. Onların arasında "Fuzzy Sets and Systems", "Fuzzy Mathematics", "Cybernetics and Systems", "Journal of Fuzzy Systems and Artificial Intelligence", "International Journal of Computational Intelligence", "Soft Computing", "Intelligent Automation and Soft Computing" kimi məşhur nəşrlərin adlarını çəkmək olar.

L.Zadə 1991-ci ildən Kaliforniya Universitetinin fəxri professorudur. O, əvvəlki kimi tələbələrə mühazirələr oxuyur, beynəlxalq konfranslarda iştirak edir, çox sevdiyi Berklidə yumşaq hesablamalar sahəsində bir sıra təşəbbüslərin direktoru kimi elmi-təşkilati fəaliyyətini davam etdirir.



## Mahmudov
## Nazim İdris oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*Şərqi Aralıq Dənizi Universitetinin*
*riyaziyyat kafedrasının müdiri*

Mahmudov Nazim İdris oğlu 1958-ci il iyunun 10-da Azərbaycan Respublikasının Cəbrayıl rayonunun Sultanlı kəndində anadan olub.

1980-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) mexanika-riyaziyyat fakültəsini bitirib. 1980-1984-cü illərdə Azərbaycan EA Kibernetika İnstitutunun aspiranturasında oxuyub. “Hilbert fəzasında stoxastik optimal idarəetmə” mövzusunda namizədlik dissertasiyası müdafiə edəndən sonra Azərbaycan EA Kibernetika İnstitutunun riyazi kibernetika laboratoriyasında işləməyə başlayıb.

N.Mahmudov 1993-cü ildən Şimali Kipr Türk Respublikasının Şərqi Aralıq dənizi Universitetinin riyaziyyat kafedrasında işləyir. 2004-cü ildə ona professor elmi adı verilib. 2011-ci ildən Şərqi Aralıq dənizi Universitetinin riyaziyyat kafedrasının müdiridir.

N.Mahmudov determinə olunmuş və stoxastik sistemlərin optimal idarə edilməsi, stoxastik diferensial tənliklər nəzəriyyəsi, xüsusi funksiyalar nəzəriyyəsi və pozitiv xətt operatorlar nəzəriyyəsi sahəsində mütəxəssisdir.

O, aktiv alim, ABŞ, Kanada, Almaniya və başqa xarici ölkələrin bir çox mərkəzi jurnallarında dərc edilmiş 100-dən artıq elmi işin müəllifi və həmmüəllifidir. Xarici ölkələrin bir sıra elmi riyaziyyat jurnallarının redaksiya heyətinin üzvüdür.

Onun rəhbərliyi altında 2 professor, 7 elmlər namizədi (Ph.D) hazırlanıb. N.Mahmudov Şərqi Aralıq dənizi Universitetinin aspiranturasında “riyazi analiz”, “diferensial tənliklər və xüsusi funksiyalar nəzəriyyəsi” ixtisasları üzrə elmi kadrlar hazırlayır. N.Mahmudov başqa ölkələrdə də tanınır. Alim müxtəlif illərdə ABŞ, Fransa, Belçika, Türkiyə və Avstriyada mühazirələr oxuyub.



## Mahmudov
## Zakir Əli oğlu

*Tibb elmləri doktoru.*
*A.İ.Yevdokimov adına Moskva Dövlət Tibbi Stomatologiya Universitetinin insan anatomiyası kafedrasının professoru*

Mahmudov Zakir Əli oğlu 1947-ci il dekabrın 31-də Azərbaycan Respublikasının Gədəbəy rayonunun Arıxdam kəndində, kəndli ailəsində anadan olub.

1971-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) bitirib. 1971-1976-cı illərdə kənd sahə xəstəxanasında pediatr, uşaq cərrahı, baş həkim vəzifələrində çalışıb.

1976-1979-cu illərdə Z.Mahmudov İ.M.Seçenov adına Birinci Moskva Tibb İnstitutunun insan anatomiyası kafedrası nəzdində aspiranturada oxuyub. 1981-ci ildə "Yaşlı insanda mezenteriumlu üst limfatik düyünlərin anatomiya və topoqrafiyası" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1979-1995-ci illərdə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunda insan anatomiyası fənnindən dərs deyib. 1984-1986-cı illərdə İ.M.Seçenov adına Birinci Moskva Tibb İnstitutunun nəzdində doktoranturada oxuyub və sonradan həmin institutda insan anatomiyası fənnindən dərs deyib. 1995-2002-ci illərdə Rusiya Xalqlar Dostluğu Universitetinin tibb fakültəsinin insan anatomiyası kafedrasının dosenti olub.

2002-2004-cü illərdə Z.Mahmudov Rusiya Tibb Elmləri Akademiyasının Elmi-Tədqiqat İnsan Morfologiyası İnstitutunun böyük elmi işçisi olub və həmin dövrdə doktorluq dissertasiyası üzərində işləyib. 2004-cü ildə Z.Mahmudov İ.M.Seçenov adına Birinci Moskva Tibb Akademiyasının ixtisaslaşdırılmış şurasında "insan anatomiyası" ixtisası üzrə doktorluq dissertasiyası müdafiə edib. Z.Mahmudovun elmi araşdırmalar sahəsi – yoğun bağırsağın ileosekal bölməsinin orqandaxili kiçik vəzilərinin anatomiyasıdır.

2002-ci ildən indiyə kimi Z.Mahmudov A.İ.Yevdokimov adına Moskva Dövlət Tibbi Stomatologiya Universitetinin (MDTSU) insan anatomiyası kafedrasında işləyir. MDTSU-nun insan anatomiyası kafedrasının muzeyinə rəhbərlik edir, müalicə və stomatologiya fakültələrində məşğələlər aparır, özünəməxsus emosionallığı ilə fərqlənən mühazirələr oxuyur və tələbə forumunun xəbərlərindən göründüyü kimi, tələbələrin böyük sevgisini qazanıb.

Z.Mahmudov vəzifə borcunun nümunəvi icrasına və qüsursuz işinə görə rektorluğun Fəxri Fərmanı ilə təltif olunub. Rusiya Təbiət Elmləri Akademiyasının müxbir üzvüdür.



## Mehdiyev
## Cəmaləddin İsa oğlu

*Tibb elmləri doktoru, professor.*
*Başqırdıstan Dövlət Tibb İnstitutunun professoru*

Mehdiyev Cəmaləddin İsa oğlu 1956-cı il noyabrın 23-də Azərbaycan Respublikasının Qasım İsmayılov (indiki Goranboy) rayonunun Səfikürd kəndində anadan olub.

1981-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) bitirib və 1988-ci ilədək Başqırdıstanın Kumertau şəhərində mərkəzi rayon xəstəxanasında işləyib. 1989-cu ildən Ufada 21 nömrəli xəstəxanada çalışıb.

C.Mehdiyev 1991-ci ildən Təcili Tibbi Yardım Xəstəxanasında (TTYX) bölmə müdiri, eyni vaxtda 1994-cü ildən Başqırdıstan Dövlət Tibb Universitetinin (BDTU) müəllimi, sonralar isə professoru olub.

Elmi fəaliyyəti abdominal cərrahiyyənin, koloproktologiyanın, cərrahi infeksiyaların problemlərinə, az-invaziv texnologiyaların tətbiqi ilə yoğun bağırsağın divertikulyar xəstəliyinin, bağırsaq keçməzliyinin, xroniki kolostazların, babasilin, öd daşının müalicəsinə həsr edilib.

C.Mehdiyevin iştirakı ilə yoğun bağırsaq xəstəliklərinin müalicə üsulları, mədə fistulalarının ölçülməsi üçün qurğu, bağlı yaraların drenajlanması, dərman maddələrinin yeridilməsi, yarılma dərinliyi verilmiş cərrah bıçağı və s. işlənib hazırlanıb.

O, 349-dan çox elmi məqalə və tezisin, 6 monoqrafiyanın, 14 tədris vəsaitinin, 1 faydalı modelin müəllifidir, ixtiraya görə 8 patentin, 4 müəllif şəhadətnaməsinin sahibidir, habelə onun 64 səmərəli təklifi tətbiq edilib. 3 elmlər doktoru hazırlayıb.

C.Mehdiyev TTYX-də ümumi cərrahiyyə və koloproktologiya bölməsinin müdiridir, 2001-ci ildən Başqırdıstan Respublikasının Əməkdar həkimidir. Rusiya Cərrahlar Cəmiyyətinin həqiqi üzvüdür.

Rusiya Federasiyası Səhiyyə Nazirliyinin "Əhaliyə tibbi yardımın göstərilməsi işində əldə etdiyi uğurlara görə" fərmanı, "Səhiyyə sahəsində xidmətlərinə və çoxillik vicdanlı əməyə görə" fəxri fərmanı ilə təltif edilib. 2013-cü ildə "Ən yaxşı həkim" XII Respublika Müsabiqəsində "Ən yaxşı cərrah" nominasiyasının qalibi olub.



## Mehdiyev
## Vurğun Heybət oğlu

*Filologiya elmləri doktoru, professor.*
*Uzaq Şərq Dövlət Humanitar Universitetinin ədəbiyyat və jurnalistika kafedrasının müdiri*

Mehdiyev Vurğun Heybət oğlu 1962-ci il mayın 12-də Azərbaycan Respublikasının Lənkəran rayonunun Girdəni kəndində anadan olub.

1990-cı ildə Xabarovsk Dövlət Pedaqoji İnstitutunu bitirib. 1990-1992-ci illərdə bu ali məktəbdə ədəbiyyat kafedrasında assistent işləyib. 1992-1995-ci illərdə N.K.Krupskaya adına Moskva Pedaqoji Universitetinin aspiranturasında oxuyub. Namizədlik dissertasiyasının müdafiəsindən sonra Xabarovsk Dövlət Pedaqoji Universitetinin (XDPU) ədəbiyyat kafedrasında işləməyə başlayıb. V.Mehdiyev 2000-ci ildən XDPU-nun ədəbiyyat kafedrasının (indiki Uzaq Şərq Dövlət Humanitar Universitetinin (UŞDHU) ədəbiyyat və jurnalistika kafedrası) müdiridir.

V.Mehdiyev 2005-ci ildə Moskva Dövlət Vilayət Universitetində filologiya elmləri doktoru elmi dərəcəsini almaq üçün dissertasiya müdafiə edib. Namizədlik dissertasiyası N.S.Leskovun nəsrinin tədqiqi əsasında hazırlanıb, doktorluq dissertasiyasının mövzusu isə M.Y.Lermontovun yaradıcılığı və 1840-cı illərin jurnal polemikası ilə bağlıdır. 2010-cu ildə ona professor adı verilib.

V.Mehdiyev rus klassik ədəbiyyatı, ədəbiyyat nəzəriyyəsi, habelə humanitar problemlər sahəsində mütəxəssisdir. Onun elmi tədqiqatlarının əsas istiqamətləri M.Y.Lermontovun, N.A.Qonçarovun, N.S.Leskovun, F.M.Dostoyevskinin, N.A.Nekrasovun yaradıcılığı ilə bağlıdır. Eyni zamanda, onun elmi maraqları XIX əsr rus ədəbiyyatı tarixində slavyanpərəst estetikaya, bədii yaradıcılıqda dini və estetik dərketməyə, nihilizmə, mənəvi birliyə, habelə M.M.Baxtinin hermenevtikasına və dialoq konsepsiyasına əsaslanır.

V.Mehdiyev Rusiya ədəbiyyatşünaslığında rus yazıçılarının bədii yaradıcılığında dini və nihilizm probleminə ilk müraciət edənlərdən biridir, XIX əsr rus "antinihilist" romanı məsələsini yeni nöqteyi-nəzərdən araşdırıb. XIX əsr rus ədəbiyyatı və ədəbi tənqid tarixində dini və estetik ənənələrin tarixi-ədəbi və nəzəri təhlili, bu ənənələrin polemik əks etdirilməsi ona məxsusdur. Onun əsərlərində 1840-cı illərdə slavyanpərəstlərin tərəfdarlarının "qərb estetikləri" hesab edilən apoloqetlərlə mü-

bahisəsi zamanı intensiv araşdırdıqları "rus estetikası", "xristian estetikası" spesifikasını nəzərə alan elmi metodologiyanın əsl mahiyyəti verilir.

V.Mehdiyevin müəllimlik və elmi fəaliyyəti M.M.Baxtin tərəfindən işlənmiş dialoq konsepsiyasının estetik və fəlsəfi aspektlərinə qayğı ilə yanaşmasına söykənir. O, M.M.Baxtin ideyalarının davamçısı olaraq dialoqun Baxtin dərki kriterilərinin təkcə bədii ədəbiyyat əsərlərinin interpretasiyası üçün deyil, həm də etniklərarası və mədəniyyətlərarası qarşılıqlı əlaqəni qurmaq üçün aktual olduğunu əsaslandırır. Alimin bədii əsər haqqında mürəkkəb "xorlu", "çoxsəsli" dünya kimi; məhəbbət və şəfqətin istənilən humanitar mətnin dərk edilməsinin dəyər şərti olması kimi düşüncələri dərinləşir.

V.Mehdiyev eyni vaxtda Harbində rus mühacirətinin ədəbi-tənqidi irsinin, Rusiya Uzaq Şərqində müasir ədəbi prosesin öyrənilməsi ilə məşğul olur. "Dalnıy Vostok" jurnalında məqalələri dərc edilir. Onun elmi redaktəsi ilə 2005-ci ildə Xabarovsk Diyarı Təhsil Nazirliyinin qrifi altında Uzaq Şərq ədəbiyyatı dərsliyi çap olunub, məktəb və ali məktəb təhsilində geniş istifadə edilir.

V.Mehdiyev 100-dək elmi işin, o cümlədən monoqrafiyaların, məktəb və ali məktəb dərsliklərinin, 2 dərs vəsaitinin müəllifidir. Onun "Mayak" jurnalı (1840-1845): 1840-cı illər jurnalistikasına və M.Y.Lermontov romantizminə dini müxalifət" monoqrafiyası, "N.S.Leskovun "Heç yerə" romanı və 1860-cı illərin əvvəllərində rus nəsrində mənəviyyat və nihilizm problemləri" dərs vəsaiti, "Ədəbiyyatşünaslığa giriş. Ədəbiyyat nəzəriyyəsi" müntəxəbat-praktikumu tarixi-ədəbi və nəzəri-ədəbi silsilənin tədrisində mühüm rol oynayır.

V.Mehdiyev doktorluq və namizədlik dissertasiyalarının müdafiəsi üzrə ixtisaslaşdırılmış şuranın (Uzaq Şərq Federal Universiteti, Vladivostok) üzvü, rus ədəbiyyatı problemlərinə həsr edilən ənənəvi beynəlxalq və Rusiya konfranslarının təşkilat komitələrinin üzvüdür.

Onun rəhbərliyi ilə 3 magistr və 2 elmlər namizədi dissertasiyası yazılıb və müdafiə edilib. O, namizədlik və doktorluq dissertasiyalarının müdafiəsində tez-tez rəsmi opponent kimi çıxış edir. V.Mehdiyev hazırda 3 aspirantın elmi rəhbəridir.

Filoloq alim müxtəlif illərdə Çində (Harbin) mühazirələr deyib, Heyluntszyan Universitetinin Rus Dili və Ədəbiyyatı İnstitutuna (Harbin), Bakı Slavyan Universitetinə dəvət edilib.

V.Mehdiyevə elmi və pedaqoji fəaliyyətinə görə təşəkkürnamələr, mükafatlar verilib. 2006-cı ildə Rusiya Federasiyası Təhsil Nazirliyinin Fəxri fərmanı ilə təltif edilib.



## Məhərrəmova
## Həqiqət Ələsgər qızı

*Sənətşünaslıq üzrə fəlsəfə doktoru.*
*Ərzurumda Atatürk Universitetinin incəsənət fakültəsinin professoru*

Məhərrəmova Həqiqət Ələsgər qızı 1948-ci il martın 8-də Azərbaycan Respublikasının Şəki rayonunda anadan olub.

1971-ci ildə Üzeyir Hacıbəyli adına Azərbaycan Dövlət Konservatoriyasını bitirib. 1972-1974-cü illərdə təhsilini Leninqrad Konservatoriyasının (indiki Sankt-Peterburq Konservatoriyası) əyani aspiranturasında (assistentura-təcrübə) SSRİ Xalq Artisti P.A.Serebryakovun sinfində davam etdirib. 1974-cü ildə təhsilini fərqlənmə diplomu ilə bitirərək, Azərbaycan Dövlət Konservatoriyasının ixtisas fortepiano kafedrasında pedaqoji fəaliyyətə başlayıb.

1980-1994-cü illərdə Azərbaycan Dövlət Konservatoriyasının fortepiano fakültəsinin metodiki seksiyasına başçılıq edib. 1997-1998-ci illərdə Pakistanın Lahor şəhərində pianoçu-solist işləyib. 1999-cu ildən bu günə qədər Türkiyənin Atatürk Universitetinin (Ərzurum) incəsənət fakültəsində dərs deyir. H.Məhərrəmova sənətşünaslıq üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün 2008-ci ildə müvəffəqiyyətlə dissertasiya müdafiə edib. 2013-cü ildə ona professor elmi adı verilib.

H.Məhərrəmova tələbəlik illərindən bu günə qədər öz repertuarını daim yeniləyir və genişləndirir, həm Azərbaycanda, həm də onun hüdudlarından kənarda müntəzəm çıxışlar edir. Hələ konservatoriyada təhsil aldığı zaman - 1969-cu ildə Azərbaycan bəstəkarlarının kamera əsərlərinin ən yaxşı ifası üzrə müsabiqədə birinci yeri tutub, 1979-cu ildə isə nəfəs alətləri ifaçılarının I Zaqafqaziya müsabiqəsində ən yaxşı konsertmeyster fəxri diplomuna layiq görülüb. Onun konsert proqramına müxtəlif üslub və janrlarda əsərlər daxildir.

Azərbaycan bəstəkarlarının yeni əsərlərinin ilk ifaçısı çox vaxt H.Məhərrəmova olur. Onun interpretasiyasında həmişə inandırıcı olan bu əsərlər pianoçunun müasir düşüncə tərzini əks etdirir. Musiqi Fondunda onun ifasında Azərbaycan bəstəkarlarının əsərlərindən ibarət yazılar, habelə Qara Qarayev və Oqtay Zülfüqarovun prelüdlərinin yazıları olan CD-disklər var. H.Məhərrəmovanın pianoçuluq sənətinin xarakterik cəhətlərini səciyyələndirən tənqidçilər onun qüsursuz musiqi zövqünü,

fortepiano musiqisi çalarlarını mükəmməl bilməsini, virtuozluğunu, ən başlıcası isə ifasının emosional təsir gücünü və dolğunluğunu vurğulayırlar.

H.Məhərrəmova fəaliyyət göstərdiyi illər ərzində həm Azərbaycanda, həm də onun hüdudlarından kənarda müvəffəqiyyətlə işləyən xeyli musiqiçi yetişdirib. Onun yetirmələri arasında müxtəlif müsabiqələrin laureatları və beynəlxalq festivalların iştirakçıları var.

H.Məhərrəmovanın elmi fəaliyyəti geniş spektrli istiqamətləri əhatə edir. Bunlar həm elmi-metodiki məqalələr, həm Azərbaycan bəstəkarlarının ayrı-ayrı əsərlərinin ifasına dair metodiki tövsiyələr, həm müxtəlif fortepiano ifaçılarının bədii yaradıcılıq ənənələrinin şərhi, həm də tədris proqramıdır. Bundan əlavə, H.Məhərrəmova "Azərbaycanda fortepiano-ifaçılıq mədəniyyətinin təşəkkülü və inkişafı" adlı tədris vəsaitində Azərbaycan fortepiano mədəniyyətinin ən mühüm paradiqmalarını (ifaçılıq, pedaqogika, bəstəkarlıq yaradıcılığı) ahəngdar düzərək onlar arasında üzvi əlaqəni göstərib. Tədris vəsaitinə bir sıra çox maraqlı və mühüm aspektlər daxil edilib. Bunlar həm fortepianonun texniki təkamülünün xronologiyası, həm də fortepiano ifaçılığı və yaradıcılığı ənənələrinin istər qorunub saxlanmasına, istərsə də inkişafına təsir göstərən kreativ amillərdir.

H.Məhərrəmova layihələr müəllifi, "I.Ulusal Erzurum Piano Günleri" (2007) və "II.Ulusal Erzurum Piano Günleri" (2010), I və II Milli fortepiano musiqisi festivallarının, habelə "I.Ulusal Erzurum Klasik Müzik Festivalı"nın (Türkiyə, 2012) münsiflər heyətinin üzvüdür.



## Məlikov İbrahim Mustafa oğlu

*Fəlsəfə elmləri doktoru, professor. Rusiya Dövlət Sosial Universitetinin sosial fəlsəfə kafedrasının professoru*

Məlikov İbrahim Mustafa oğlu 1963-cü il martın 7-də Azərbaycan Respublikasının Quba rayonunda anadan olub.

1985-ci ildə T.Q.Şevçenko adına Kiyev Dövlət Universitetinin fəlsəfə fakültəsini bitirib. 1985-1988-ci illərdə M.V.Lomonosov adına MDU-nun humanitar fakültələrinin fəlsəfə kafedrasının aspiranturasında təhsil alıb, 1988-ci ildə fəlsəfə elmləri namizədi elmi adını almaq üçün dissertasiya müdafiə edib.

Sonra Moskva ali məktəblərində müəllimlik etməyə başlayıb. 1989-1995-ci illərdə Moskva Elektronika və Riyaziyyat İnstitutunun (MERİ) fəlsəfə kafedrasında assistent, baş müəllim, dosent işləyib. 1996-2002-ci illərdə Moskva Dövlət Mətbuat Universitetinin (MDMU) fəlsəfə kafedrasının dosenti olub. 2002-2003-cü illərdə Dövlət Yerquruluşu Universitetinin tarix, fəlsəfə və politologiya kafedrasının dosenti olub. 2003-cü ildən Rusiya Dövlət Sosial Universitetində (RDSU) dosent, 2007-ci ildən isə professor vəzifəsində işləyir.

İ.Məlikov 2005-ci ildə fəlsəfə elmləri doktoru adını almaq üçün dissertasiya müdafiə edib. 2011-ci ildə ona professor elmi adı verilib.

O, sosial fəlsəfə sahəsində mütəxəssisdir. Tədqiqatlarının əsas istiqaməti insan varlığının mənəvi aspektləridir.

İ.Məlikov əsərlərində üç hissədən ibarət azadlıq konsepsiyasını hazırlayıb: xarici aləmdən və özgə iradəsindən asılı olmamaq, insanın öz iradəsini bildirməsi, Tanrıdan gələn və insan iradəsinin mütləq başlanğıcı olan xoş məram və ya xeyirxahlıq əzmi. O, belə bir ideyanı əsaslandırıb ki, mənəvi həyatın kriterisi məhz azadlıqdır.

İ.Məlikovun təklif etdiyi mənəvi həyatın idealı kimi çıxış edən azadlıq prizmasından nəzərdən keçirilməsi üsulu mənəvi həyatın mahiyyətini daha dərindən dərk etməyə və bu haqda adekvat təsəvvür yaratmağa imkan verir.

İ.Məlikov belə bir ideyanı müdafiə edir ki, yaradıcılığın sosial şərtlənməsi onun mənəvi mahiyyətini dəyişmir: hərçənd cəmiyyət yaradıcılığın vacib şərti kimi çıxış edir, lakin yaradıcılığın mahiyyəti mənəvi olaraq qalır. Onun mövqeyinə əsasən,

elmi yaradıcılıqda azadlığın reallaşdırılması elmə yaradıcı münasibət bəslənilməsi, incəsənətdə azadlığın reallaşdırılması isə onda əxlaq, sevgi və gözəlliyin vəhdətini nəzərdə tutan mənəvi idealın həyata keçirilməsi ilə bağlıdır. Bu üç amilin sintezi elə bədii yaradıcılıqda həqiqətin mahiyyətini müəyyən edir.

İ.Məlikov tərəfindən irəli sürülmüş ideyaya müvafiq olaraq ictimai həyatda azadlıq mədəniyyət vasitəsilə təsdiqini tapır. Cəmiyyət - insanların varlığının birgə formasıdır, mədəniyyət isə ictimai həyatın məzmunudur. Mədəniyyət ənənələr ilə təcəssüm olunan zamanla sıx əlaqədardır, mədəniyyətdə ənənələr və tarixi abidələr keçmişin ifadə edilməsi formasında çıxış edir, incəsənət gələcəyi təcəssüm etdirir, indiki zaman - keçmiş və gələcək arasında sərhəddir, mədəniyyət isə əbədiyyətdə öz mənbələrinə malikdir.

İ.Məlikov, həmçinin milli varlığın üç komponentini irəli sürən müəllif konsepsiyasını hazırlayıb: milli ideya, təbii-torpaq əsaslı və milli mədəniyyət.

İ.Məlikovun görüşlərinə əsasən, şəxsiyyət azadlığının müəyyənedici əlaməti qismində onun universallığının və unikallığının vəhdətinə nail olunması çıxış edir. O, əsaslandırıb ki, şəxsiyyət azadlığının strukturu xeyir və şər arasında seçim azadlığını istisna edir. Həqiqi azadlıq yalnız xeyri qəbul edir və pisliyi reallaşdırmaq imkanını inkar edir.

İ.Məlikov əsərlərində şəxsiyyətin əsasında psixi mədəniyyət anlayışını irəli sürür. Bu anlayışın əsasını insan mənəviyyatı fenomenində öz kökləri olan mənəvi rahatlıq təşkil edir.

Onun rəhbərliyi ilə 2 elmlər namizədi və 1 elmlər doktoru hazırlanıb. O, RDSU-nun aspirantura və doktoranturasında “sosial fəlsəfə” ixtisası üzrə elmi kadrlar hazırlayır. Namizədlik və doktorluq dissertasiyalarının müdafiəsi üzrə ixtisaslaşdırılmış şuranın üzvüdür. Tələbələr arasında yüksək reytinqə - 5 ballıq şkalada 4,8 bala malikdir.

İ.Məlikov 1500-dən çox elmi işin müəllifidir. Onların sırasına monoqrafiya, dərs vəsaiti, çoxsaylı elmi əsərlər, o cümlədən AAK-ın tövsiyə etdiyi məqalələr, kollektiv monoqrafiyalarda bölmələr, metodiki işlər, publisistika daxildir. Monoqrafiyalar sırasında “Mənəvi həyatda azadlıq” (Moskva, 2002), “Azadlığın mənəvi varlığı” (Moskva, 2013), “Fəlsəfə. İnsanın mənəvi fəaliyyəti” (Moskva, 1998) xüsusilə fərqlənir.



## Məmmədov
## Adil Əsgər oğlu

*Tibb elmləri doktoru, professor.*
*İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin uşaq stomatologiyası və ortodontiya kafedrasının müdiri*

Məmmədov Adil Əsgər oğlu 1948-ci il martın 18-də Özbəkistan Respublikasının Sırdərya qəsəbəsində repressiya olunmuşların ailəsində anadan olub.

1971-ci ildə Alma-Ata Dövlət Tibb İnstitutunun stomatologiya fakültəsini həkim-stomatoloq ixtisası üzrə bitirib. Kənd məntəqə və mərkəzi rayon xəstəxanasında işləyib.

A.Məmmədov 1975-1977-ci illərdə Mərkəzi Elmi-Tədqiqat Stomatologiya İnstitutunun (METSİ) uşaq cərrahi stomatologiyası bölməsinin kliniki ordinaturasında oxuyub. Kliniki ordinatura keçəndən sonra 1978-ci ildən METSİ-də əvvəlcə kiçik elmi işçi, sonra böyük elmi işçi işləyib.

1986-cı ildə professor L.Y.Frolovanın rəhbərliyi ilə "Uşaqlarda uronoplastikadan sonra damaq-udlaq həlqəsi funksiyasının endoskopik qiymətləndirməsi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1989-cu ildə "Stafilopalatofarinqometr" aparatının işlənib hazırlanmasına görə SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin bürünc medalına layiq görülüb.

1995-1998-ci illərdə Yekaterinburqda anadangəlmə üz-çənə patologiyalı və ağır nitq pozuntuları olan uşaqların tibbi-sosial reabilitasiyası üzrə "BONUM" Respublika Elmi–Praktiki Mərkəzində tədqiqatçı həkim işləməklə yanaşı, elmi tədqiqatlarını davam etdirib. 1997-ci ilin dekabrında tibb elmləri doktoru elmi dərəcəsi almaq üçün S.İ.Bloxinanın elmi rəhbərliyi ilə "Uronoplastikadan sonra damaq-udlaq qüsurundan və nitqin pozulmasından əziyyət çəkən xəstələrin kompleks reabilitasiyası" mövzusunda dissertasiya müdafiə edib.

Müdafiədən və monoqrafiya üzərində iş başa çatandan sonra 1998-ci ildən yenə də METSİ-də uşaq üz-çənə cərrahiyyəsi bölməsində böyük elmi işçi işləməyə başlayıb.

2002-ci ildə A.Məmmədov İ.M.Seçenov adına Moskva Tibb Akademiyasında (indiki İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universiteti) stomatologiya fakültəsinin təşkili ilə əlaqədar uşaq xəstəlikləri kafedrasına professor vəzifəsinə dəvət edilib, sonra stomatologiya fakültəsinin uşaq stomatologiyası kafedrasının

müdiri işləyib. Bu müddət ərzində İ.M.Seçenov adına MTA-nın Uşaq Xəstəlikləri Klinikasında otaqların uşaq stomatologiyası kafedrası və klinikası üçün yenidən qurulması, pedaqoji kadrların seçilməsi və uşaq stomatologiyası ambulator–poliklinika bölməsinin açılması üzrə böyük təşkilati iş aparılıb.

A.Məmmədov Rusiyanın digər stomatoloqları ilə birlikdə "Detskaya stomatologiya" jurnalını təsis edib və baş redaktorun müavini olub. Hazırda "Detskaya stomatologiya i profilaktika" adlanan həmin jurnalın elmi redaktorudur. Bundan əlavə, o, stomatologiya üzrə Rusiyada çıxan 5 və xaricdə nəşr olunan 2 jurnalın (Azərbaycan, Qazaxıstan) redaksiya şuralarının üzvüdür.

A.Məmmədov məruzə və mühazirələr oxumaq, məsləhətlər vermək və əməliyyatlar aparmaq üçün vaxtaşırı yerli mütəxəssislərlə birlikdə Rusiyanın müxtəlif regionlarına (Yekaterinburq, Volqoqrad, Yujno-Saxalinsk, Maqadan, Orenburq, Tula, Tver, Samara, Lipetsk, Barnaul, Xabarovsk, Voronej) və MDB ölkələrinə (Daşkənd, Almatı, Çimkənd, Səmərqənd, Düşənbə) səfərlər edir.

A.Məmmədovun təşəbbüsü ilə Yujno-Saxalinsk, Maqadan, Tula və Lipetskdə kəllə-üz-çənə patologiyalı uşaqların reabilitasiyası mərkəzləri yaradılıb. O, həm də bu mərkəzlərin məsləhətçisidir. Volqoqrad, Orenburq, Samara, Altay (Barnaul) və Tverdə üz-çənə nahiyəsində anadangəlmə patologiyası olan uşaqların dispanserləşdirilməsi mərkəzlərinin elmi-praktiki potensialını dəstəkləyir.

METSİ-də işini davam etdirən A.Məmmədov 1998-ci ildən uşaq stomatologiyasının, uşaq cərrahi stomatologiyasının və üz-çənə cərrahiyyəsinin aktual məsələləri ilə bağlı uşaq üz-çənə cərrahiyyəsi bölməsində müntəzəm mühazirələr oxuyur, kliniki ordinator və aspirantlarla seminarlar aparır, ustad dərsləri keçir.

Bu günə qədər onun rəhbərliyi ilə 18 namizədlik və 3 doktorluq dissertasiyası müdafiə olunub, digər elmi tədqiqatlar aparılır.

A.Məmmədovun bütün elmi fəaliyyəti üz-çənə nahiyəsinin anadangəlmə patologiyasından əziyyət çəkən uşaqların müalicəsinə həsr olunub. O, həmin patologiyadan əziyyət çəkən körpədən tutmuş müxtəlif yaşda olan 4 mindən çox uşaq üzərində cərrahiyyə əməliyyatı aparıb.

A.Məmmədov Çernobıl AES-də qəzanın (1986) nəticələrinin aradan qaldırılmasının iştirakçısıdır. "Sərhədsiz həkimlər" missiyası ilə lokal münaqişə zonalarında olub (1998), Rusiya DİN–in Döyüş Əməliyyatları Veteranları Assosiasiyasının üzvüdür.

A.Məmmədov Elmi Kəşf və İxtira Müəllifləri Beynəlxalq Akademiyasının (EKİMBA), Beynəlxalq İnformasiyalaşdırma Akademiyasının (BİA), Rusiya Tibbi-

Texniki Elmlər Akademiyasının (RTTEA) akademiki, Rusiya Təbiət Elmləri Akademiyasının müxbir üzvü, Rusiyanın Səhiyyə Sahəsində Nəzarət üzrə Federal Xidmətinin ştatdankənar baş mütəxəssis-ekspertidir.

A.Məmmədov dodaq və damaq yarığı problemləri ilə məşğul olan “International Cleft Lip and Palate Foundation” Beynəlxalq Xeyriyyə Fondu ilə əməkdaşlıq edir. 2001-ci il iyunun 1-də - Uşaqların Beynəlxalq Müdafiəsi Günündə müalicə etdiyi xəstələrin valideynləri ilə birlikdə öz saytı olan “Anadangəlmə dodaq və damaq yarığı” Rusiya Uşaqlara Yardım Xeyriyyə Fondunu yaradıb və onun sədridir.

2014-cü ildə Hanoyda professor A.Məmmədovun başçılıq etdiyi komanda Ümumdünya Konqresinin Rusiyada keçirilməsi üçün müsabiqədə qalib gəlib. Monqolustan konqresində 2015-ci ildə Moskvada Ümumrusiya Konqresi ilə birlikdə keçirilən Ümumdünya Konqresinin prezidenti vəzifəsində təsdiq edilib.

“Vrojdyonnaya rasşelina qubı i nyoba” jurnalının redaktoru olub.

“Anadangəlmə dodaq və damaq yarığı” Beynəlxalq Təşkilatının keçirdiyi birinci (Sürix, İsveçrə, 2000), ikinci (Münxen, Almaniya, 2002), üçüncü (Qalifaks, Kanada, 2004), dördüncü (İstborn, İngiltərə, 2006), beşinci (Dallas, Texas, 2008), yeddinci (Seyşel Adaları Respublikası), səkkizinci (Hanoy, Vyetnam, 2013), doqquzuncu (Ulan-Bator, Monqolustan, 2014) dünya konqreslərində məruzələrlə çıxış edib.

A.Məmmədov Avropa Kəllə-Üz-Çənə Cərrahları Assosiasiyasının, Rusiya Stomatoloji Assosiasiyasının, Rusiya Plastik, Rekonstruktiv və Estetik Cərrahlar Cəmiyyətinin üzvüdür.

Bundan əlavə, alim İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin və Moskva Dövlət Tibbi Stomatologiya Universitetinin dissertasiya və elmi şuralarının üzvüdür. 2014-cü ilin sentyabrından Rusiya Ali Attestasiya Komissiyasının “Cərrahiyyə elmləri” fənni üzrə ekspertidir. Dəfələrlə xeyriyyə aksiyalarında iştirak edib. Bu aksiyalar zamanı toplanan vəsait anadangəlmə dodaq və damaq yarığından əziyyət çəkən uşaqların müalicəsinə yönəldilib.

A.Məmmədov İ.M.Seçenov adına Birinci MDTU-nun uşaq stomatologiyası kafedrası nəzdində elmi qrupun aparıcı elmi işçisi və rəhbəri, Rusiya Tibb Elmləri Akademiyasının Uşaq Sağlamlığı Elmi Mərkəzinin Elmi-Tədqiqat Pediatriya İnstitutunun uşaq cərrahiyyəsi bölməsinin aparıcı elmi işçisidir.

A.Məmmədov Rusiyanın və MDB ölkələrinin uşaq stomatoloqları ilə fəal əməkdaşlıq edir. Bakı, Almatı, Çimkənd, Daşkənd və Düşənbənin üz-çənə nahiyəsində anadangəlmə və irsi patologiyalı uşaqların müalicəsi sahəsində alimləri və pedaqoqları ilə birlikdə elmi-praktiki tədqiqatlar aparır.

A.Məmmədov 300-dən çox elmi əsərin, 6 tədris-metodiki tövsiyənin və vəsaitin, uşaq stomatologiyası problemlərinin informasiya-kompyuter həllinə dair materialların müəllifi, ixtira üçün 10 müəlliflik vəsiqəsinin və 2 patentin sahibidir. O, anadangəlmə dodaq və damaq yarığından əziyyət çəkən uşaqların müalicəsi problemlərinə dair 90-dan çox cərrahi tədqiqatın müəllifidir.

A.Məmmədov professor L.Y.Frolova ilə birlikdə 1985-ci ildə "Anadangəlmə dodaq və damaq yarığından əziyyət çəkən uşaqların müalicəsinin cərrahi üsullarının atlası"nı nəşr etdirib. 1998-ci ildə alimin "Anadangəlmə dodaq və damaq yarığı" monoqrafiyası dərc olunub. Monoqrafiyada həm müəllif tədqiqatları, həm də Rusiyanın və MDB ölkələrinin klinikalarında 20 ildən çox iş təcrübəsinin materialları, adı çəkilən problemlərlə bağlı informasiya-kompyuter materialları yer alıb. Elə həmin problemlə əlaqədar A.Məmmədov tərəfindən sistemli intellektual köməkçi, kompyuter məlumat bazası yaradılıb. Hazırda anadangəlmə dodaq və damaq yarığı olan uşaqların müalicəsinə dair rəhbər tövsiyələr nəşrə hazırlanır. Burada anadangəlmə üz-çənə patologiyalı uşaqlarla iş üzrə 36 illik təcrübə əksini tapacaq.

2008-ci ildə A.Məmmədova "Ali məktəb müəllimi" əlavə ixtisası verilib. Ali dərəcəli həkim ixtisası var. İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin inkişafına böyük şəxsi töhfəsinə görə adı "Şərəf Kitabı"na (2012) salınıb.

Rusiya Stomatologiya Assosiasiyasının I dərəcəli "Stomatologiya qarşısında xidmətlərə görə" ordeni (2008), "Səhiyyə sahəsində xidmətlərinə və çoxillik vicdanlı əməyinə görə" Səhiyyə Nazirliyinin Fəxri fərmanı (2011) ilə təltif olunub, əmək veteranıdır. RF Prezidentinin 2014-cü il 29 sentyabr tarixli Fərmanı ilə ona "Rusiyanın Əməkdar Həkimi" fəxri adı verilib.



## Məmmədov Əliş Zabid oğlu

*"Yakutsement" İstehsalat Birliyi Açıq Səhmdar Cəmiyyətinin baş direktoru*

Məmmədov Əliş Zabid oğlu 1958-ci il fevralın 10-da Azərbaycan Respublikasının Şəki rayonunun Oraban kəndində anadan olub.

1979-cu ildə Azərbaycan İnşaat Mühəndisləri İnstitutunu bitirəndən sonra Uzaq Şərqdə, Moxsoqollox qəsəbəsində "Yakutpromstroymaterialı" İstehsalat Birliyinin təmir-tikinti sexinin ustası vəzifəsində əmək fəaliyyətinə başlayıb. O vaxtdan etibarən onun həyatı Yakutiya və Xanqalas ulusu ilə bağlı olub.

Ə.Məmmədov 1980-1981-ci illərdə Yakutiyanın Tiksi qəsəbəsində Sovet Ordusu sıralarında xidmət edib. Sonra doğma müəssisəyə qayıdıb və 1982-ci ildən əsaslı tikinti şöbəsinin rəisi vəzifəsində işləməyə başlayıb. 1987-ci ildən "Yakutpromstroymaterialı" İstehsalat Birliyinin (İB) baş direktorunun əsaslı tikinti üzrə müavini olub. 1989-cu ildə müəssisənin kollektivi onu müsabiqə əsasında "Yakutsement" İstehsalat Birliyi Açıq Səhmdar Cəmiyyətinin (ASC) baş direktoru seçib.

Ə.Məmmədov yeni ideyalarla zəngin, qeyri-standart düşüncə tərzinə malik təcrübəli və peşəkar yeni formasiya rəhbəridir. Onun rəhbərliyi, işini mükəmməl bilməsi, problemlərin optimal həlli yollarını tapmaq və müəssisənin işgüzar tərəfdaşlıq əlaqələrini qurmaq bacarığı sayəsində müəssisənin kollektivi bazar iqtisadiyyatına keçidlə bağlı ağır sınaqlardan şərəflə çıxıb. "Yakutsement" İB ASC tənəzzüldən qurtulub və məhsul istehsalını genişləndirməyə başlayıb. Sement və əmtəəlik çınqıl istehsalını ildən-ilə artırmaqla bərabər, kollektiv Ə.Məmmədovun təşəbbüsü ilə baş podratçı rolunda çıxış edib, Saxa Respublikasının (Yakutiya) Xanqalas, Lena, Nyurbin, Amgin uluslarında sosial-mədəni təyinatlı obyektlər, o cümlədən məktəb və xəstəxana binaları, evlər, idman qurğuları inşa etməyə başlayıb. Respublikanın nümayəndə heyətlərinin tərkibində tez-tez başqa ölkələrdə səfərlərdə olan Ə.Məmmədov xarici təcrübədən faydalanır və istehsalata yeni texnologiyalar tətbiq etməyə çalışır.

2003-cü ildə "Yakutsement" dünyada analoqu olmayan sulfata və şaxtaya davamlı texnologiya işləyib hazırlayıb. Yeniliyin müəlliflərindən biri zavodun direktoru Ə.Məmmədov idi. Opoka (silisiumlu gil) yerinə narın üyüdülmüş kvars qumu

tətbiq etmək qərarı elm-istehsalat axtarışlarında inqilab edib. Amgin ulusundan gətirilən kvars qumunun təcrübi üyüdülməsinin nəticələri bütün gözləntiləri geridə qoyub. Mütəxəssislərin hesablamalarına görə, müəssisənin köhnə daşqıranı üçfaizli üyütmə verməli idi, amma faktiki olaraq birfaizli üyütmə əldə olunur. Başqa sözlə desək, üyüdülmüş təbii şistdən daha keyfiyyətli "un" əldə olundu. Bu, prinsipcə yeni xammal sobada bişiriləndən sonra eksperimentatorların əldə etdiyi opoka təkcə sulfata deyil, həm də şaxtaya davamlı sementi, habelə yol tikintisi üçün xüsusi sementi sənaye miqyasında istehsal etməyə imkan verir.

2008-ci ildə Xanqalas ulusunun sakinləri xalqın elçisi kimi ulusa və respublikaya daha böyük fayda gətirəcəyi ümidi ilə Ə.Məmmədova yüksək etimad göstərərək onu Saxa Respublikasının (Yakutiya) Dövlət Məclisinin (İl Tumen) deputatı seçiblər. Yakutiyanın inşaat sənayesində əldə etdiyi nailiyyətlərə görə 1995-ci ildə Ə.Məmmədova "Saxa Respublikasının (Yakutiya) Əməkdar İnşaatçısı" adı verilib. O, SR(Y)in "2000-ci ilin iki min xeyirxah işi", "Yakutiyanın Rusiya ilə 375 ili", "Saxa Respublikasının (Yakutiya) fəxri vətəndaşı" xatirə nişanları, habelə SR(Y) prezidentinin fəxri fərmanı, "Vətəndaşlıq şücaəti", "SR(Y)in təhsil əlaçısı" nişanları, "Stroitelnaya slava" fəxri nişanı, "Yakutiyanın fəxri inşaatçısı" idarə fərqlənmə nişanı ilə mükafatlandırılıb. Ə.Məmmədova maddi istehsal sahəsində 2007-ci ilin Saxa Respublikasının (Yakutiya) Yuri Nikolayeviç Prokofyev adına Dövlət Mükafatı verilib. Ə.Məmmədov 2009-cu ildə "SR(Y)da bədən tərbiyəsi və idmanın inkişafına töhfəyə görə" fəxri nişanı ilə təltif edilib. 2012-ci ilin mayında onun adı "Ən yaxşı insanlar" Beynəlxalq Ensiklopediyasına daxil edilib.



## Məmmədov Fəxrəddin Sadıq oğlu

*Texnika elmləri doktoru, professor. Yaxın Şərq Universitetinin vitse-prezidenti, mühəndislik fakültəsinin dekanı*

Məmmədov Fəxrəddin Sadıq oğlu 1947-ci il sentyabrın 30-da Azərbaycan Respublikasının Naxçıvan Muxtar Respublikasının Ordubad rayonunda anadan olub.

1970-ci ildə M.Əzizbəyov adına Azərbaycan Neft-Kimya İnstitutu (AzNKİ, indiki Azərbaycan Neft və Sənaye Universiteti) bitirib və iki il Məlumatların ötürülməsi sistemləri elmi-tədqiqat laboratoriyasında kiçik elmi işçi vəzifəsində çalışıb.

1972-1977-ci illərdə F.Məmmədov M.Əzizbəyov adına AzNKİ-nin aspiranturasında oxuyub. 1982-ci ildə texnika elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. Onun dissertasiya işi neft sənayesində informasiyanın ötürülməsi və emalı sisteminin yaradılmasına həsr edilmişdi. 1986-cı ildə F.Məmmədov dosent seçilib. O, müəllimlik fəaliyyəti ilə yanaşı, magistral neft-qaz boru kəmərlərinin texniki vəziyyətinə nəzarət sistemi elmi-tədqiqat qrupuna başçılıq edirdi. “Quyuların profilemetriyası” və “Magistral neft-qaz boru kəmərlərinin texniki vəziyyətinə nəzarət” adlı mövzular üzrə tədqiqatlar SSRİ Neft və Qaz Sənayesi Nazirliyinin və SSRİ Dövlət Elm və Texnika Komitəsinin qərarlarına uyğun olaraq yerinə yetirilmişdi.

1987-1988-ci illərdə T.Şevçenko adına Kiyev Dövlət Universitetində intensiv fransız dili kursunu öyrənib, həmçinin Pol Valeri adına III Monpelye Universitetində (Fransa) dil kursu keçib.

1988-1994-cü illərdə Əlcəzairdə, Sidi-Bel-Abbes və Bumerdes universitetlərində işləyib. F.Məmmədov müəllimlik fəaliyyəti ilə yanaşı, sistemlər və siqnallar elmi-tədqiqat laboratoriyasını yaradıb. 1990-cı ildə Əlcəzairdə işləyən sovet mütəxəssislərinin İttifaqının sədri seçilib və 1995-ci ilə qədər orada işləyib.

1993-cü ildə F.Məmmədova informasiya texnologiyaları sahəsində professor elmi adı verilib. 1995-ci ildə o, Yaxın Şərq Universitetində işləmək üçün Şimali Kipr Türk Respublikasına (ŞKTR) dəvət edilib.

1997-2000-ci illərdə elektronika və telekommunikasiya kafedrasının müdiri olub. 2001-ci ildən bu günə qədər ŞKTR Yaxın Şərq Universitetinin vitse-prezidenti, həmçinin mühəndislik fakültəsinin dekanıdır.

Son 20 ildə F.Məmmədov məlumatların işlənməsi və ötürülməsi sistemləri ilə bağlı elmi-tədqiqat və müəllimlik fəaliyyəti ilə məşğul olur. Telekommunikasiyalara, nəzarət sistemlərinə, peyk sistemlərinə, optik-lifli rabitə sistemlərinə dair mühazirələr oxuyur.

Onun elmi məqalələri ingilis, fransız və rus dillərində indeksləşdirilmiş referativ jurnallarda dərc edilib. 5 patentin sahibi, ingilis dilində nəşr edilmiş dərs vəsaitlərinin, həmçinin "Telekommunikasiya", "Nəzarət sistemləri", "Əsas rabitə sistemləri", "Məlumatların işlənməsi sistemləri", "Kriptoqrafiya və kodlaşdırma nəzəriyyəsi" adlı 5 kitabın müəllifidir.

F.Məmmədov müxtəlif illərdə elektronika və kompyuter texnologiyaları sahəsində çoxsaylı beynəlxalq elmi-texniki konfransların sədri olub.

F.Məmmədov elmi işlə bərabər, ŞKTR-də Azərbaycan diasporunun işində fəal iştirak edir. 2005-ci ildə Azərbaycan mədəniyyət mərkəzini təsis edib, "Məhəmməd Füzuli və türk mədəniyyəti və incəsənəti tarixində onun rolu", "Dədə Qorqud və türk dastanları: keçmiş və gələcək" beynəlxalq konfranslarının təşkilat komissiyasının sədri olub. Həmin konfranslarda Azərbaycan alimləri ilə yanaşı, dünyanın iyirmi ölkəsindən nümayəndələr iştirak edirdilər. F.Məmmədov dəfələrlə Azərbaycan tarixi və mədəniyyəti ilə bağlı toplantılar, konfranslar və başqa sosial tədbirlər təşkil edib. Onun fəaliyyətinin nəticələrindən biri də Şimali Kipr Türk Respublikasının paytaxtı Nikosiyanın mərkəzi prospektinə Heydər Əliyevin adının verilməsi olub.



## Məmmədov
## Mahir Cəfər oğlu

*Biologiya elmləri doktoru, professor.*
*M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin A.N.Belozerski adına Elmi-Tədqiqat Fiziki-Kimyəvi Biologiya İnstitutunun bioenergetika şöbəsinin aparıcı elmi işçisi*

Məmmədov Mahir Cəfər oğlu 1958-ci mayın 1-də Azərbaycan Respublikasının Qubadlı rayonunda anadan olub.

1980-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (Bakı Dövlət Universiteti) biologiya fakültəsini bitirib. 1980-1983-cü illərdə Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunun fotosintezin biofizikası laboratoriyasında elmi işçi vəzifəsində çalışıb.

M.Məmmədov 1984-1987-ci illərdə M.V.Lomonosov adına MDU-nun biologiya fakültəsinin əyani aspiranturasında oxuyub. "Biokimya" ixtisası üzrə namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə edəndən sonra 1987-ci ildə M.V.Lomonosov adına MDU-nun A.N.Belozerski adına Fakültələrarası problem laboratoriyasının bioenergetika şöbəsində işə başlayıb.

O, 1991-1993-cü illərdə M.V.Lomonosov adına MDU-nun biologiya fakültəsinin doktorantı olub, eyni zamanda Yaponiyanın Milli Ümumi Biologiya İnstitutunda (Okazaki) işləyib. 1993-cü ildən bu günədək M.V.Lomonosov adına MDU-nun A.N.Belozerski adına Elmi-Tədqiqat Fiziki-Kimyəvi Biologiya İnstitutunun aparıcı elmi işçisidir.

M.Məmmədov biologiya elmləri doktoru elmi dərəcəsi almaq üçün 1995-ci ildə M.V.Lomonosov adına MDU-nun biologiya fakültəsində "biokimya" ixtisası üzrə dissertasiyasını uğurla müdafiə edib.

Onun namizədlik və doktorluq dissertasiyaları fotosintez edən orqanizmlərdə işıq enerjisinin elektrik potensiallarının transmembran fərqinə çevrilməsinin molekulyar mexanizmlərinin öyrənilməsinə həsr olunmuş silsilə tədqiqatlar əsasında yazılıb.

M.Məmmədovun elmi maraqları fotosintez və bioloji membranların energetikası sahəsində cəmləşib. Birbaşa elektrometrik metoddan və zamana görə yüksək ayırdetməli optik metodlardan istifadə yolu ilə fotosintetik membran zülallarının struktur və funksional xüsusiyyətlərinin öyrənilməsi onun tədqiqatlarının əsas istiqamətidir.

M.Məmmədov 1-ci və 2-ci tipli fotosintetik reaksiya mərkəzlərində və bc1/b6f sitoxrom kompleksində yüklərin daşınması ilə şərtlənən elektrik potensiallarının

transmembran fərqinin generasiyası mexanizminin öyrənilməsinə dair fundamental əsərlərin müəllifidir. Onun bu sahədə araşdırmalarını mühüm kəşflər sırasına aid etmək olar.

O, inteqral membran fermentinin – 1-ci fotosistemin və suda həll olan hidrogenaza fermentinin köməyi ilə günəş enerjisini molekulyar hidrogenə çevirmək iqtidarında olan sistemlərin işlənib hazırlanmasına sanballı töhfə verib.

Son illər M.Məmmədovun elmi marağı əsasən molekulyar oksigen və hidrogen əmələ gəlməsi ilə su molekulunun oksidləşməsinin katalizinə qadir bitkilərdən ibarət 2-ci fotosistemin piqment-zülal kompleksinin işləmə mexanizminin tədqiqinə yönəlib.

M.Məmmədov Rusiyanın fotosintez sahəsində aparıcı alimlərindən biridir. O, Rusiya və beynəlxalq jurnallarda dərc olunan 110-dan çox elmi məqalənin müəllifi və həmmüəllifidir.

M.Məmmədov başqa ölkələrdə də yaxşı tanınır. O, elmi işi ilə bağlı müxtəlif illərdə ABŞ, İsveç, Almaniya, Yaponiya və İtaliyada olub, ABŞ, Yaponiya, Almaniya, İsveç, İtaliya, Portuqaliya və Azərbaycanda nüfuzlu beynəlxalq konfranslarda və simpoziumlarda məruzələrlə çıxış edib.

O, 1996-cı ildən "Frontiers in Bioscienc" jurnalının (ABŞ) biologiya bölməsinin redaktoru, 2011-ci ildən "The Scientific World Journal" (ABŞ) jurnalının redaksiya heyətinin üzvüdür. M.Məmmədov 1996-cı ildən Ümumrusiya Biokimyaçılar və Molekulyar Bioloqlar Cəmiyyətinin üzvü, 2008-ci ildən Ümumrusiya Fotobioloqlar Cəmiyyətinin vitse-prezidentidir.

M.Məmmədov M.V.Lomonosov adına MDU-nun aspiranturası və doktoranturasında "biokimya" və "biofizika" ixtisasları üzrə elmi kadrlar hazırlayır. Onun rəhbərliyi ilə 7 elmlər namizədi hazırlanıb.

Alim Azərbaycandan olan həmkarları ilə sıx elmi əlaqələr saxlayır. O, 2004-cü ildə professor R.Ə.Həsənovun laboratoriyasının (AMEA-nın Botanika İnstitutu) əməkdaşları, Açıq Berlin Universitetinin fizika kafedrasının professoru K.Möbius və Bolonya Universitetinin biotexnologiya kafedrasının professoru S.Ciurli ilə birlikdə Avropa Birliyinin proqramlarından birinin – Yeni Müstəqil Dövlətlərin Alimləri ilə Əməkdaşlığa dair Beynəlxalq Assosiasiyanın (INTAS) üç il müddətinə qrantını qazanıb.

M.Məmmədovun Moskva qrupunda müxtəlif illərdə AMEA-nın gənc əməkdaşları və aspirantları işləyiblər. Onların çoxu hazırda ABŞ, İngiltərə, İsveç və Finlandiyanın aparıcı laboratoriyalarında çalışırlar. M.Məmmədov 1996-cı ildən bu günə

qədər dəfələrlə Milli Elmlər Akademiyası və Bakı Dövlət Universiteti nəzdində namizədlik və doktorluq dissertasiyalarının müdafiəsi üzrə ixtisaslaşmış şuraların üzvü kimi dəvət edilib.

1996-cı ildə M.Məmmədovun adı Rusiyanın 100 gənc elmlər doktoru siyahısına daxil edilib və o, RF Prezidentinin qrantını (1996-1998) alıb. 2006-cı ildə "Fotosintezdə elektrogen reaksiyalar" mövzusunda silsilə işlərə görə M.V.Lomonosov adına MDU-nun alimlərinə dəstək üçün qrantlar müsabiqəsinin qalibi olub. M.Məmmədovun tədqiqatları RF Təhsil və Elm Nazirliyinin Federal Məqsədli Proqramının (dövlət müqaviləsi), Beynəlxalq Elmi-Texniki Mərkəzin, Rusiya Fundamental Tədqiqatlar Fondunun, INTAS və ABŞ Mülki Tədqiqatlar və İnkişaf Fondunun maliyyə dəstəyi ilə həyata keçirilir.



## Məmmədov
## Mehman Niyazi oğlu

*Tibb elmləri doktoru, professor.*
*Rusiya Dövlət Elmi-Tədqiqat Tibbi-Profilaktika Mərkəzinin yoluxucu olmayan xroniki xəstəliklərin profilaktikasına fənlərarası yanaşmanın işlənib hazırlanması üzrə laboratoriyanın müdiri*

Məmmədov Mehman Niyazi oğlu 1970-ci il yanvarın 10-da Bakıda anadan olub.

1993-cü ildə İ.M.Seçenov adına Moskva Tibb Akademiyasını (indiki İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universiteti) bitirib. 1993-1995-ci illərdə Rusiya Federasiyası Prezidentinin İşlər İdarəsinin Tibb Mərkəzində "kardiologiya" ixtisası üzrə kliniki ordinatura keçib.

M.Məmmədov təhsilini Rusiya Dövlət Elmi-Tədqiqat Tibbi-Profilaktika Mərkəzinin əyani aspiranturasında davam etdirib. Paralel olaraq intensiv terapiya şöbəsində həkim-kardioreanimatoloq işləyib.

M.Məmmədov 1997-ci ildə "Arterial hipertoniyalı xəstələrdə metabolik sindromun komponentləri" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək, aspiranturanı vaxtından əvvəl bitirib. Həmin vaxtdan etibarən məruzə və məlumatlarla beynəlxalq konqreslərdə fəal iştirak edib. Belə ki, Almaniya, Fransa, ABŞ, İtaliya və İranda gənc alimin elmi tədqiqatlarına böyük maraq göstəriblər. 1998-ci ildə Tibbi-Profilaktika Mərkəzinin böyük elmi işçisi işləyəndə "Metabolik sindromun kliniki-biokimyəvi xüsusiyyətləri və müalicəsi" mövzusunda doktorluq dissertasiyasını təsdiq edib və 2001-ci ildə Ali Attestasiya Komissiyasının qərarı ilə ona tibb elmləri doktoru elmi dərəcəsi verilib. M.Məmmədov Rusiya kardiologiyasında ən gənc elmlər doktorudur.

2002-ci ildə Rusiya Dövlət Elmi-Tədqiqat Tibbi-Profilaktika Mərkəzinin bazasında ürək-damar riskinin qiymətləndirilməsi və korreksiyası laboratoriyası yaradılıb. M.Məmmədovun başçılıq etdiyi bu laboratoriya altı aktual istiqamətdə - ümumi ürək-damar riskinin qiymətləndirilməsi, metabolik sistem, karbohidrat mübadiləsinin erkən pozulması, kişi sağlamlığı məsələləri, şəkərli diabetdən əziyyət çəkən xəstələrdə kardial avtonom neyropatiya və lipid mübadiləsinin pozulması istiqamətlərində elmi tədqiqatlar aparıb.

Rusiya kardiologiyasının ən yeni tarixində M.Məmmədovun bilavasitə iştirakı və təşəbbüsü ilə ilk dəfə Çuvaşiya Respublikasında ürək-damar xəstəlikləri riskinin 15 faktorunun üzə çıxarılması üzrə epidemioloji tədqiqat aparılıb. Rusiyanın yaşlı əhalisi

arasında metabolik sindromun real yayılması və aktuallığı ilk dəfə göstərilib. Əldə olunan nəticələr əsasında yaşlı adamlar arasında ölüm hallarının ümumi strukturunda birinci yeri tutan ürək-damar xəstəliklərinin azalması üzrə profilaktik proqram işlənib hazırlanıb. Bu iş Rusiyanın və xarici ölkələrin tibb dairələrində geniş əks-səda doğurub. Nəticələr beynəlxalq konqreslərdə açıqlanıb və nüfuzlu tibbi jurnallarda dərc olunub.

M.Məmmədovun rəhbərliyi ilə 2 namizədlik dissertasiyası müdafiə olunub, 6 tədqiqat işi aparılır.

M.Məmmədov Azərbaycan kardiologiya məktəbinin nümayəndələri ilə sıx əməkdaşlıq edir. 2008-ci ildə onun təşəbbüsü ilə Bakıda və Gəncədə arterial hipertoniyanın diaqnostikası və müalicəsi üzrə sertifikatlaşdırma məktəbi keçirilib. Mühazirəçi dördsaatlıq məktəbi doğma Azərbaycan dilində aparıb. Bakıda M.Məmmədovun üç kitabı Azərbaycan dilində nəşr olunub. Bu kitablardan biri məxsusi olaraq yerli həkimlər üçün hazırlanıb.

Alim 150-dən çox elmi işin, o cümlədən 10 monoqrafiyanın və həkimlər üçün vəsaitin müəllifidir. Paralel olaraq rəyçi kimi Rusiyanın aparıcı jurnalları ilə əməkdaşlıq edir.

M.Məmmədov 2007-ci ildən bu günə qədər Rusiya Kardioloqları Milli Konqresinin məsul katibidir. Hər il konqresdə Rusiya, MDB ölkələri və digər ölkələrdən 4 mindən çox həkim və nümayəndə iştirak edir. O, həmçinin Ümumrusiya Kardioloqları Elmi Cəmiyyətinin Avropa Kardioloqlar Konqresindəki pavilyonunun təşkilatçısıdır. Ümumrusiya Kardioloqları Elmi Cəmiyyətinin Avropa Konqresində fəallığı başqa milli cəmiyyətlər və dünyanın aparıcı ekspertləri ilə sıx əməkdaşlıq yaratmağa imkan verib.

Hazırda M.Məmmədov Rusiya Dövlət Elmi-Tədqiqat Tibbi-Profilaktika Mərkəzinin yoluxucu olmayan xroniki xəstəliklərin profilaktikasına fənlərarası yanaşmanın işlənib hazırlanması üzrə laboratoriyanın müdiridir.

M.Məmmədov Rusiyanın bir çox regionlarında və MDB ölkələrində gözlənilən mühazirəçidir. Rusiya, Ukrayna, Qazaxıstan, Qırğızıstan və Belarusun müxtəlif şəhərlərində onun bilavasitə iştirakı ilə maarifləndirmə tədbirləri keçirilir. Son bir neçə ildə onun konfrans və forumlarda oxuduğu mühazirələrin, etdiyi məruzələrin sayı 100-ə yaxınlaşır.

Rusiya Dövlət Elmi-Tədqiqat Tibbi-Profilaktika Mərkəzinin Elmi Şurası 2009-cu ilin yekunlarına görə M.Məmmədovu ən çox dərc olunan müəllif adlandırıb.

M.Məmmədovun elmi mükafatları və diplomları var. O, “I Pyotr” və “Pasiyentlərin müdafiəçiləri liqası” medallarına layiq görülüb.



## Məmmədov Mübariz İsa oğlu

*Kənd təsərrüfatı elmləri doktoru, professor. Ümumrusiya Elmi-Tədqiqat Tərəvəz Bitkilərinin Seleksiya və Toxumçuluğu İnstitutunun quşüzümü fəsiləsinə aid bitkilərin seleksiya və toxumçuluğu laboratoriyasının müdiri*

Məmmədov Mübariz İsa oğlu 1963-cü il yanvarın 5-də Azərbaycan Respublikasının Tovuz rayonunda anadan olub.

1985-ci ildə Səmədağa Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunu (indiki Azərbaycan Dövlət Aqrar Universiteti) qırmızı diplomla bitirib. Sonra qısa müddət Azərbaycanın Xaçmaz Rayon Aqrar-Sənaye Birliyində aqronom işləyib. 1986-1989-cu illərdə Ümumittifaq Elmi-Tədqiqat Tərəvəz Bitkilərinin Seleksiya və Toxumçuluğu İnstitutunun (ÜETTBSTİ, Moskva vilayəti) əyani aspiranturasında oxuyub. 1988-ci ildə Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyasının (RKTEA) akademiki V.F.Pivovarovun rəhbərliyi ilə "Seleksiya və bəzi toxumçuluq məsələlərinin işlənib hazırlanması üçün ilkin materialın ayrılması məqsədi ilə cır havuc sortunun ekoloji baxımdan öyrənilməsi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

M.Məmmədov 1989-1994-cü illərdə ÜETTBSTİ-nin ekologiya şöbəsinin kiçik elmi işçisi, elmi işçisi, böyük elmi işçisi işləyib. Bu dövrdə onun elmi fəaliyyəti müxtəlif istiqamətli seleksiya və toxumçuluğun bütün mərhələlərində ekoloji-coğrafi faktorlardan istifadə metodları sistemindən ibarət olan ekoloji seleksiya metodologiyasının işlənib hazırlanması ilə bağlı olub. Sistem özündə məkik seleksiyanın sürətinin artırılmasını, biotik və abiotik stressorlara davamlı olan ilkin seleksiya materialının qiymətləndirilməsi və seçilməsi üçün ekoloji fonlardan (rütubətli subtropiklər (Azərbaycan, Lənkəran) və quru subtropiklər (Özbəkistan, Termez) istifadə olunmasını, tərəvəz bitkilərinin adaptiv toxumçuluğunun ekoloji əsaslandırmasını birləşdirib.

M.Məmmədov 1994-cü ildə ÜETTBSTİ-nin quşüzümü bitkilərinin seleksiyası və toxumçuluğu laboratoriyasının müdiri seçilib və bu günə qədər həmin laboratoriyaya başçılıq edir.

O, quşüzümü bitkilərinin seleksiya və toxumçuluğuna dair tədqiqatların elmi rəhbəridir. M.Məmmədovun və onun başçılıq etdiyi laboratoriyanın tədqiqat işinin prioritet istiqamətləri aşağıdakı mövzulardır: quşüzümü bitkilərinin nəzəri və metodoloji əsaslarının işlənib hazırlanması, bu bitkilərin sortlarının və F1 heterozis hibridlərinin

seleksiyasının yüksək kombinasiya və adaptiv qabiliyyətli genetik xətlərinin yaradılmasından, calaq üçün cütün seçilməsi prinsiplərinin təkmilləşdirilməsindən və ekoloji faktordan istifadənin optimallaşdrılmasından ibarət adaptivliyi və sabitliyi üçün metod və üsullarının əsaslandırılması. Hazırda ayrı-ayrı əlamətlər, yaxud onların quşüzümü bitkilərinin yeni sortlarının, xətlərinin və F1 heterozis hibridlərinin mənbəyi olan kompleksi ilə səciyyələnən əlamət və gen konsepsiyaları əsasında genetik baxımdan müxtəlif keyfiyyətli ilkin material yaradılıb.

M.Məmmədovun təklif etdiyi metodologiya əsasında quşüzümü bitkilərinin müasir sortları və F1 heterozis hibridləri yaradılıb və Rusiyanın müxtəlif regionlarında, habelə MDB ölkələrində istifadəsinə icazə verilən seleksiya nailiyyətlərinin dövlət reyestrinə daxil edilib.

Quşüzümü bitkilərinin və digər tərəvəz bitkilərinin genetikası və seleksiyası sahəsində toplanmış nəzəri və eksperimental tədqiqatlar, müxtəlif ekoloji-coğrafi zonalardan və kultivasiya qurğularından təbii fitotron kimi səmərəli istifadə olunması və onların quşüzümü bitkilərinin sortları və heterozis hibridləri şəklində müvəffəqiyyətlə reallaşması M.Məmmədovun kənd təsərrüfatı elmləri doktoru elmi dərəcəsi almaq üçün "Quşüzümü bitkiləri sortlarının və F1 heterozis hibridlərinin seleksiyasının adaptivlik metodlarının elmi əsaslandırması və işlənib hazırlanması" mövzusunda dissertasiya müdafiə etməsinə imkan verib. 2002-ci ildə RF-nin Ali Attestasiya Komissiyasının qərarı ilə M.Məmmədova kənd təsərrüfatı elmləri doktoru elmi dərəcəsi verilib.

Öz tədqiqatlarının, habelə həmkarlarının, aspirantların, Rusiya və xarici alimlərin elmi işlərinin nəticələrinin ümumiləşdirilməsi M.Məmmədovun institutun və laboratoriyanın işçiləri ilə birlikdə "Rusiyanın qeyri-qaratorpaq zonasında quşüzümü bitkiləri (pomidor, bibər, badımcan, fizalis)" (1997) və "Pomidor, bibər və badımcanın adaptivlik üçün seleksiyası" (2002) adlı fundamental monoqrafiyaları dərc etməsinə imkan verib.

M.Məmmədovun və onun başçılıq etdiyi kollektivin sonrakı elmi fəaliyyəti quşüzümü bitkilərinin seleksiyasında məhsulun keyfiyyətinə, yəni tərkibində yüksək miqdarda bioloji aktiv maddələrin və antioksidantların olmasına tuşlanan yeni istiqamətin inkişafı ilə bağlıdır. Elmi-tədqiqat işləri nəticəsində tərkibində yüksək miqdarda likopin olan pomidorun, C və E vitaminləri, karatinoidlər, selen olan şirin bibərin, kapsaisin və başqa kapsaisinlər olan acı bibərin, fenol birləşmələri və s. olan badımcanın yeni sortları yaradılıb.

M.Məmmədovun və laboratoriyanın kollektivinin tədqiqatlarının daha bir istiqaməti quşüzümü bitkiləri fəsiləsində (bibər, badımcan) yabanı növlərin qiymətli əlamətlərinin

genetik divergentliyini genişləndirmək və ötürmək üçün uzaq növlərarası hibridləşmədən istifadə etmək, bununla da mədəni bitkiləri yaxşılaşdırmaq, yəni onların xəstəliklərə və ziyanvericilərə, ətraf mühitin stress faktorlarına davamlılığını artırmaqdır.

M.Məmmədovun tədqiqatlarının nəticələri Rusiya, MDB və başqa ölkələrin (İtaliya, İspaniya, Türkiyə, Fransa və s.) aparıcı akademik jurnallarında dərc olunub. O, 260-dan çox elmi məqalənin, o cümlədən 2 monoqrafiyanın, 3 kitabçanın, 12 metodiki tövsiyənin müəllifi və həmmüəllifidir.

M.Məmmədov quşüzümü bitkilərinin açıq torpaq, müxtəlif kultivasiya qurğuları və kiçik həcmli hidroponika şəraitində yetişdirməyə uyğunlaşdırılmış 52 sortunun və F1 heterozis hibridinin də müəllifi və həmmüəllifidir.

Onun tərəfindən işlənib hazırlanmış seleksiya metodları, ayrı-ayrı sortların seleksiyası və toxumçuluğuna dair metodiki göstərişlər və tövsiyələr, əsas seleksiya fondu Rusiya, Azərbaycan, Belarus, Özbəkistan, Qazaxıstan və başqa ölkələrin elmi-tədqiqat institutlarının seleksiyaçıları tərəfindən istifadə olunur.

2008-ci ildə Rusiya Təhsil və Elm Nazirliyinin Ali Attestasiya Komissiyasının qərarı ilə M.Məmmədova “seleksiya və toxumçuluq” ixtisası üzrə professor elmi adı verilib.

M.Məmmədov ÜETTBSTİ-nin doktorluq və namizədlik dissertasiyalarının müdafiəsi üzrə dissertasiya şurasının, nəzəri məsələlər və toxumçuluq üzrə elmi və elmi-metodiki şuraların daimi üzvü, quşüzümü bitkilərinin seleksiya və toxumçuluğu üzrə metodiki komissiyanın sədridir. 2002-ci ildən Bitkilərin Seleksiyası üzrə Avropa Tədqiqatlar Assosiasiyasının (EUCARPIA) , “The Chile Pepper Institute” institutunun (ABŞ, 1997), ÜETTBSTİ-nin elmi işlərdən ibarət məcmuələrinin və “Ovoşşi Rossii” jurnalının redaksiya heyətinin üzvüdür.

M.Məmmədov elmi kadrlar yetişdirir. Onun rəhbərliyi ilə 5 kənd təsərrüfatı elmləri namizədi hazırlanıb.

M.Məmmədov EUCARPIA-nın və Macarıstan, Fransa, Türkiyə, İspaniya, ABŞ və başqa ölkələrdən olan beynəlxalq elmi təşkilatların himayəsi ilə keçirilən quşüzümü fəsiləsindən olan tərəvəz bitkilərinin genetikası, seleksiyası, emalı və toxumçuluğuna dair müxtəlif beynəlxalq konqreslərin, simpoziumların və konfransların daimi iştirakçısıdır. O, 2008-ci ildə EUCARPIA-nın İspaniyanın Valensiya şəhərində keçirilən XVIII Beynəlxalq konqresində EUCARPIA Şurasına Rusiyadan nümayəndə seçilib.

M.Məmmədovun xidmətləri Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin qızıl və gümüş medalları, RKTEA-nın fəxri fərmanları və digər mükafatlarla qeyd olunub.



## Məmmədov
## Tahir Əbdüləli oğlu

*"ProBiznesKonsaltinq" şirkətlər qrupunun baş direktoru*

Məmmədov Tahir Əbdüləli oğlu 1967-ci il yanvarın 21-də Azərbaycan Respublikasının Ağdaş rayonunda anadan olub.

1984-cü ildə Ağdaşda S.M.Kirov adına orta məktəbi bitirəndən sonra daimi yaşamaq üçün Rusiyanın Kirov vilayətinə köçüb. 1984-1985-ci illərdə Slobodskoy şəhərindəki "Belka" xəz fabrikində fəhlə işləyib və oradan hərbi xidmətə çağırılıb. 1985-1987-ci illərdə Çexoslovakiyada müddətli hərbi xidmətdə olub.

T.Məmmədov 1988-1993-cü illərdə Kirov Dövlət Pedaqoji İnstitutunun xarici dillər fakültəsinin tələbəsi olub. İnstitutu qırmızı diplomla bitirəndən sonra "Belka" Xəz Birliyində işə başlayıb, burada xarici-iqtisadi əlaqələr şöbəsi təşkil edib və ona başçılıq edib. Həmin dövrdə "Belka" fabriki Avropanın ən iri xəz təchizatçısı idi. T.Məmmədov fabrikin xarici-ticari müqavilələrinin bağlanması və icrası ilə məşğul olur, müəssisənin gömrük və valyuta məsələləri ilə bağlı işini təşkil edirdi.

T.Məmmədov 1993-cü ildə Moskva Dövlət Hüquq Akademiyasının hüquqşünaslıq fakültəsinə daxil olub və bu ali məktəbi də qırmızı diplomla bitirib. O, 2002-ci ilədək vilayətin ali hüquq məktəblərində beynəlxalq özəl hüquqdan dərs deyib.

1997-ci ildə Kirov vilayətinin Vyatka Ticarət-Sənaye Palatası (VTSP) prezidentinin dəvəti ilə Vyatka TSP-nin nəzdində yaradılan "Vyatyurservis" Sahibkarların Hüquqlarını Müdafiə Agentliyinə başçılıq edib. 1998-ci ildən VTSP nəzdində iqtisadi mübahisələrin həlli ilə məşğul olan Münsiflər Məhkəməsinin sədri olub. VTSP Rusiya Federasiyasının TSP sistemində ən yaxşı ticarət-sənaye palatalarından biri adını qazanıb.

T.Məmmədov 2002-ci ildə Povoljyedə ən iri məsləhət holdinqini - "ProBiznes-Konsaltinq" şirkətlər qrupunu yaradır və ona başçılıq edir.

T.Məmmədov ictimai fəaliyyətlə də fəal məşğul olur. Onun iştirakı ilə "Rusiya Hüquqşünaslar Assosiasiyası" Ümumrusiya İctimai Təşkilatının Kirov regional bölməsi yaradılıb. Müxtəlif illərdə RF TSP-nin təsərrüfat mübahisələrini həll edən Münsiflər Məhkəməsinin üzvü olub, hazırda Vyatka Ticarət-Sənaye Palatasının idarə heyətinin rəyasət heyətinin üzvüdür.

2009-cu ilin fevralından "OPORA Rossii" Ümumrusiya İctimai Təşkilatının Kirov şəhər bölməsinin sədridir. T.Məmmədovun həmin vəzifəyə gəlişi ilə Kirov vilayəti sahibkarlarının maraqlarını müdafiə edən bu nüfuzlu təşkilatın fəaliyyəti xeyli fəallaşıb və güclənib. T.Məmmədov təşkilatın fəallarının, habelə "ProBiznes-Konsaltinq" şirkətlər qrupunun intellektual resursunun köməyi ilə Kirovda sahibkarlığın inkişaf modelini təklif edib. O, regionda müxtəlif fəaliyyət sahələrində irimiqyaslı tədqiqatlar aparır.

2009-cu ilin iyulunda Kirov vilayəti İctimai Palatası yaradılıb və Kirov vilayətinin qubernatoru vətəndaşların hüquq və azadlıqlarını təmin etmək məqsədi daşıyan bu ictimai təşkilatın üzvü qismində T.Məmmədovun namizədliyini irəli sürüb.

T.Məmmədov Kirov şəhəri və vilayəti administrasiyasının, Rusiya Federasiyası Ticarət-Sənaye Palatasının müxtəlif diplomları və təşəkkürnamələri ilə mükafatlandırılıb.



## Məmmədov
## Tərlan Nəzərpaşa oğlu

*Biologiya elmləri doktoru, professor.*
*Fraunhofer Molekulyar Biotexnologiya Mərkəzində qrup rəhbəri*

Məmmədov Tərlan Nəzərpaşa oğlu 1958-ci il mayın 2-də Azərbaycan Respublikasının Dəvəçi rayonunda (indiki Şabran) anadan olub.

1980-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) kimya fakültəsini bitirib. 1980-1999-cu illərdə Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunda məhsuldarlıq proseslərinin molekulyar-genetik əsasları şöbəsində işləyib. 1986-cı ildə akademik Cəlal Əliyevin rəhbərliyi ilə namizədlik dissertasiyası, 2008-ci ildə biologiya elmləri doktoru elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. Onun dissertasiyası Azərbaycanda molekulyar biologiya sahəsində ilk doktorluq dissertasiyası idi. Sonralar T.Məmmədova molekulyar biologiya sahəsində professor elmi adı verilib.

T.Məmmədov 1998-2002-ci illərdə Yaponiyaya dəvət edilib və burada bir sıra elmi-tədqiqat mərkəzlərində çalışıb. 2002-ci ildə isə ABŞ-ın Nebraska-Linkoln Universitetinin Bidl Mərkəzinin biokimya şöbəsinə dəvət edilib. İşlədiyi həmin təşkilatlarda onun elmi maraqları fotosintezin və fototənəffüsün molekulyar mexanizmlərini müəyyənləşdirmək üzərində cəmləşib. O, bu mövzular üzərində hələ Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunda işləməyə başlayıb.

T.Məmmədov 2005-2009-cu illərdə Nebraska-Linkoln Universitetinin kimya və biomolekulyar mühəndislik kafedrasında professor vəzifəsində çalışıb. Onun elmi-tədqiqatları əsasən mayanın ekspressiyası sistemindən istifadə etməklə, terapevtik zülalların layihələndirilməsinə, işlənib hazırlanmasına və istehsalına yönəlib. T.Məmmədov elə həmin kafedrada “de novo” genlərinin sintezləşdirilməsinə həsr olunmuş layihəyə rəhbərlik edib, sürətli polimeraz zəncirvarı reaksiyadan istifadə etməklə, genlərin sintezi üçün rasional platformanın layihələndirilməsinə və işlənib hazırlanmasına cavabdeh olub.

Hazırda T.Məmmədov ABŞ-ın Fraunhofer Molekulyar Biotexnologiya Mərkəzində qrup rəhbəridir. Onun tədqiqatlarının əsas istiqaməti yeni vaksin və terapevtik preparatlar üçün funksional baxımdan aktiv rekombinant zülallar almağın yeni texnologiyalarını işləyib hazırlamaqdır.

T.Məmmədov biokimya sahəsində böyük iş təcrübəsi olan alimdir. O, 150-dən çox elmi işin müəllifi və həmmüəllifidir. Yüksək impakt faktorlu beynəlxalq və nüfuzlu jur-

nallarda 50-dən çox məqaləsi dərc olunub. Molekulyar biologiya, biokimya və biotexnologiyalar sahəsində bir sıra kəşflər və ixtiralar etmiş T.Məmmədov tədqiqatlar sahəsində böyük nailiyyətləri sayəsində beynəlxalq səviyyədə tanınmış alimdir. Onun 2001, 2005, 2007, 2008, 2011 və 2012-ci illərə aid məqalələri, habelə əsərlərinə istinadlar bunu təsdiq edir. Alimin tədqiqatları elm və texnologiyanın inkişafına əhəmiyyətli təsir göstərib.

T.Məmmədov 2008-ci ildə, Nebraska-Linkoln Universitetinin kimyəvi və biomolekulyar mühəndislik kafedrasında işlədiyi zaman yüksək quanin-sitozin tərkibli DNT-ni müvəffəqiyyətlə amplifikasiya etmək üçün tabalma müddətinin əhəmiyyətini kəşf edib. Bu da terapevtik zülal və vaksinlərin işlənib hazırlanması üçün çox əhəmiyyətlidir. T.Məmmədovun işləyib hazırladığı texnologiya biotəbabət, kənd təsərrüfatı və ekologiya sahələrində müxtəlif genlərin tez və avtomatlaşdırılmış şəkildə sintezinə kömək edir.

T.Məmmədov 2011-ci ildə mühüm kəşf edib. O, aşkar edib ki, "Chlamydomonas reinhardtii" yaşıl yosunu sialilləşdirmə terminalından N-qlikollaşdırma funksiyasını yerinə yetirməyə qadirdir. Bu da biotexnoloji məqsədlər üçün istifadədə, o cümlədən bioloji aktiv terapevtik qlikoproteinlərin istehsalında həmin yosunun böyük potensialı olduğunu göstərir.

T.Məmmədov 2012-ci ildə PNGase bakterial deqlikollaşdırma fermentinin birgə ekspressiyası yolu ilə təbii şəraitdə hədəf zülalların fermentativ deqlikollaşdırılmasının mühüm strategiyasını işləyib hazırlayıb. Bu da eukariotların ekspressiyası sistemində ilk dəfə qeyri-qlikollaşdırılmış formada rekombinant zülallar əldə etməyə imkan verib. Bu kəşf böyük maraq doğurub. Alimin elmi işi biotexnologiyalar sahəsində gözəl innovasiya nümunəsi kimi "MSBioworks" veb-saytının xəbərlərində dərc olunub, habelə ABŞ-ın digər nəşrlərində ("NewsRX" и "ReportLinker") müzakirə olunub. T.Məmmədovun işləyib hazırladığı strategiyanın tibbdə, habelə kənd təsərrüfatı biotexnologiyasında tətbiq etmək üçün böyük potensialı var. Bu da deqlikollaşdırılmış formada vaksin, terapevtik zülal və antisimlərin istehsalının təşkilinə kömək edəcək.

Azərbaycan, Yaponiya və ABŞ-da apardığı tədqiqatlar sayəsində dünya şöhrətli alimlərlə qarşılıqlı əlaqələr saxlamaq imkanı olan T.Məmmədov ölkələr arasında dostluq və əməkdaşlığın möhkəmlənməsinə töhfə verib. Bundan əlavə, o, biokimya, molekulyar biologiya və biotexnologiyanın yeni metodlarının müzakirə olunduğu bir çox beynəlxalq konfrans və seminarlarda fəal iştirak edib.

T.Məmmədov yüksək impakt faktorlu nüfuzlu beynəlxalq jurnalların rəyçisidir. 1998-ci ildə və 1999-2001-ci illərdə Yaponiya Elm və Texnologiyalar Agentliyinin, 2001-2002-ci illərdə Yaponiya Beynəlxalq Elmi-Tədqiqat Kənd Təsərrüfatı Elmləri Mərkəzinin qrantlarını alıb.



## Məmmədov
## Nizami Mustafa oğlu

*Fəlsəfə elmləri doktoru, professor.*
*RF Prezidenti yanında Rusiya Xalq Təsərrüfatı və Dövlət Qulluğu Akademiyasının professoru.*
*UNESCO-nun mədəniyyət və təhsil məsələləri üzrə eksperti*

Məmmədov Nizami Mustafa oğlu 1946-cı il yanvarın 1-də Azərbaycan Respublikasının Qazax rayonunda anadan olub.

1967-ci ildə Çingiz İldırım adına Azərbaycan Politexnik İnstitutunun (indiki Azərbaycan Texniki Universiteti) avtomatika və hesablama texnikası fakültəsini bitirib. 1968-1971-ci illərdə həmin institutun elmi işçisi olub. 1972-ci ildə "təbiətşünaslığın fəlsəfi məsələləri" ixtisası üzrə SSRİ Elmlər Akademiyasının Fəlsəfə İnstitutunun aspiranturasına daxil olub. 1972-1975-ci illərdə aspiranturada təhsil almaqla yanaşı, M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin fəlsəfə fakültəsinin sərbəst dinləyicisi olub.

N.Məmmədovun elmi fəaliyyətinin birinci dövrü idrak, məntiq və elmin metodologiyası nəzəriyyəsi məsələlərinin işlənib hazırlanması ilə bağlı olub. N.Məmmədov 1977-ci ildə SSRİ Elmlər Akademiyasının Fəlsəfə İnstitutunda "Biliklərin modelləşdirilməsi və sintezi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. Burada modelləşdirmə metodunun mahiyyəti və əsasları, onun qneseoloji, inteqrativ və optimallaşdırıcı funksiyaları nəzərdən keçirilib. Dissertasiya 1979-cu ildə Bakıda monoqrafiya şəklində dərc olunub.

N.Məmmədov 1976-1986-cı illərdə Azərbaycan Elmlər Akademiyasının Fəlsəfə və Hüquq İnstitutunun elmi işçisi, böyük elmi işçisi və şöbə müdiri olub. O, elmi fəaliyyətinin ikinci dövründə ekoloji problemin dərk edilməsi və elmin ekologiyalaşdırılması ilə bağlı məsələlər üzərində işləyib.

1984-cü ildə o, SSRİ Elmlər Akademiyasının Fəlsəfə İnstitutunda "Ekoloji problem və texniki elmlər (fəlsəfi-metodoloji aspektlər)" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Həmin dissertasiyada ekoloji problemin sistemli nəzəriyyəsi əsaslandırılıb, texnikanın inkişafının cəmiyyətin sosiomədəni faktorları, dəyər-dünyagörüşü məqsədləri ilə əlaqəsi açılıb, texniki elmlərin ekologiyalaşdırılmasının metodoloji xüsusiyyətləri göstərilib.

N.Məmmədov doktorluq dissertasiyasını müdafiə edəndən sonra onun elmi fəaliyyətinin üçüncü dövrü başlanıb. O, bilavasitə ekologiya və ekoloji təhsil ilə bağlı fəlsəfi məsələlərlə məşğul olub. Bu, müəyyən mənada onun təhsil sahəsində işə keçməsi ilə bağlı idi. N.Məmmədov 1987-ci ildə V.İ.Lenin adına Moskva Dövlət Pedaqoji İnstitutuna dəvət edilib və 1995-ci ilə qədər burada professor vəzifəsində çalışıb.

N.Məmmədov 1995-ci ildən bu günə qədər RF Prezidenti yanında Rusiya Xalq Təsərrüfatı və Dövlət Qulluğu Akademiyasının professorudur. 2003-cü ildən bu günə qədər o, əvəzçilik əsasında həm də Moskva Dövlət İşgüzar İnzibatçılıq Akademiyasının fəlsəfə kafedrasının müdiridir. 2009-cu ildən Beynəlxalq Müstəqil Ekologiya-Politologiya Universitet Akademiyasının Qloballaşma və Sabit İnkişaf İnstitutunun direktorudur.

O, bu müddət ərzində elmin müxtəlif istiqamətlərinə - ekologiyanın ayrı-ayrı istiqamətlərinin təsnifatının əsaslarının müəyyən olunmasına, ekologiyanın genezisinin fəlsəfi-metodoloji və məntiqi aspektlərinin üzə çıxarılmasına, postklassik tipli elm kimi sosial ekologiyanın statusunun əsaslandırılmasına, ekologiyanın bölünməzliyini, onun ayrı-ayrı istiqamətlərinin dərin əlaqəsini göstərməyə imkan verən ümumi ekoloji anlayışların arqumentləşdirilməsinə, müxtəlif səviyyələrdə ekoloji təhsilin elmi-nəzəri məzmununun dəqiqləşdirilməsinə, sosial-iqtisadi və ekoloji inkişafın harmonizasiyasının mənəvi zəmini kimi ekoloji mədəniyyətin əsaslandırılmasına, sabit inkişaf üçün təhsilin metodoloji əsaslarının işlənib hazırlanmasına və digər elmi müddəaların qoyuluşuna sanballı töhfə verib.

Həmin dövrdə N.Məmmədovun fəaliyyətində ekoloji təhsilin pedaqoji məsələləri xüsusi yer tutub. Ekoloji təhsilin alim tərəfindən əsaslandırılmış prinsipləri Rusiyada ekoloji təhsilin məzmununun dəqiqləşdirilməsinə kömək edib, Fransa, Çexiya, Türkiyə və MDB ölkələrində müsbət əks-səda doğurub, ekologiyaya dair bir sıra dərsliklərin konseptual əsaslarını təşkil edib.

N.Məmmədov ali təhsil məktəbləri üçün sosial ekologiyaya dair tədris vəsaitinin, üç dəfə nəşr olunmuş və bir sıra xarici dillərə tərcümə edilmiş ekologiya üzrə məktəb dərsliyinin müəllifi, ayrı-ayrı fənlərin ekologiyalaşdırılmasına dair beynəlxalq pedaqoji ictimaiyyət tərəfindən yüksək qiymətləndirilən müəllimlər üçün elmi-metodiki vəsaitin hazırlanmasının təşəbbüskarıdır.

N.Məmmədov son illər insan və mədəniyyət problemlərinə xüsusi diqqət yetirir. O, bu problemlərə müraciət etməsini elmi araşdırmalarının kvintessensiyası adlandırır. Alim sabit inkişaf mədəniyyəti anlayışı və onun təşkili yollarını, mədəniyyətin ekoloji

konsepsiyasını hərtərəfli əsaslandırıb, tarixi prosesin "K.Marks – M.Veber paradoksu"na aydınlıq gətirən kulturoloji modelini təklif edib. O, öz əsərlərində göstərir ki, insanın idrak, dəyişdirici (texniki) və maarifləndirici fəaliyyəti onun mədəniyyətinin əsl mahiyyətini və mənasını başa düşməyə imkan verən təbiətinin təzahürləridir.

UNESCO N.Məmmədovun müasir dünyada yeni humanizmin əsaslarına, sosial kapitalın inkişafının ilkin şərait və şərtlərinə dair elmi işlərinə xüsusi diqqət yetirib. Bu işlərin bəzi müddəaları UNESCO-nun rəsmi sənədlərinə daxil edilib.

N.Məmmədovun elmi məktəbi onun yetirmələrinin fəaliyyətində uğurla inkişaf edir. Onun rəhbərliyi ilə 40-dan çox namizədlik və doktorluq dissertasiyası müdafiə olunub.

N.Məmmədov "Elmi-texniki inqilab və elmi idrakın inkişafı" (1-ci və 2-ci buraxılışlar, Bakı, 1993-1995), "Ekologiya, mədəniyyət, təhsil" (Moskva, 1989), "Fəlsəfə və ekoloji problem" (Moskva, 1990), "Fəlsəfə fənləri: proqramlar, məsələlər, testlər" (Moskva, 1993), "Ekoloji təhsil: konsepsiyalar və metodiki yanaşmalar" (Moskva, 1996), "Ekologiya və təbiətdən istifadənin idarə olunması" (Moskva, 2000), "Sabit inkişaf nəzəriyyəsinə giriş" (Moskva, 2002), "Sabit inkişaf və məktəb təhsilinin ekologiyalaşdırılması" (Moskva, 2003), "Qlobal dəyişikliklər dövrü" (Moskva, 2004), "Qloballaşma və ekoloji təhlükəsizlik" (Moskva, 2005), "Ekoloji siyasət: reallaşmanın əsasları, səviyyələri və metodologiyası" (Moskva, 2006), "Elm və təhsil sabit inkişafın maraqları keşiyində" (Moskva, 2006), "Sosial tərəfdaşlığın hüdudları" (Moskva, 2007), "Meqapolis: təhsil və həyatın keyfiyyəti" (Moskva, 2009), "Qloballaşma şəraitində mədəniyyətlərin dialoqu" (Moskva, 2010) və digər kollektiv əsərlərin tərtibçi redaktorudur.

N.Məmmədov "Vek qlobalizatsii", "Neprerıvnoye obrazovaniye", "Vestnik ekoloqiçeskoqo obrazovaniya v Rossii", "Bioloqiya v şkole" jurnallarının, Türkiyənin "Ekologiya" jurnalının redaksiya heyətinin üzvü, 2012-ci ildən "Vestnik MQADA" jurnalının baş redaktorudur.

N.Məmmədov 2002-ci ildən Sabit İnkişaf üzrə Dünya Sammitinin (Yohannesburq, 2002) qərarları əsasında yaradılan "Sabit inkişaf üçün təhsil" seriyasının redaksiya kollegiyasının sədridir. Həmin seriya çərçivəsində sabit inkişafın konsepsiyalarına cavab verən keyfiyyətcə yeni dərs vəsaitləri nəşr olunub.

N.Məmmədov 1995-2005-ci illərdə Avropa İttifaqının ekoloji təhsil üzrə eksperti olub. 2007-ci ildən bu günə qədər UNESCO-nun mədəniyyət və təhsil məsələləri üzrə ekspertidir.

N.Məmmədovun elmi-pedaqoji fəaliyyəti "Əmək şücaətinə görə" medalı, "Moskvanın 850 illiyi" xatirə medalı və RF Təhsil və Elm Nazirliyinin fəxri fərmanı ilə mükafatlandırılıb. O, təhsilin elm və texnologiyalar sahəsində "Moskva qrantı" müsabiqələrinin laureatıdır, "Rusiya Federasiyası ali peşə təhsilinin fəxri işçisi" adına layiq görülüb.

N.Məmmədov Azərbaycanın filosof və ekoloqları ilə sıx əlaqələr saxlayır, AMEA-nın müxbir üzvü, professor Sevda Məmmədəliyevanın, professorlar Adil Əsədov, Hüseyn Zeynalov, Zakir Məmmədəliyev və Nazim Hüseynlinin elmi məsləhətçisi olub.

Qarabağ böhranının ağır günlərində "Bakinski raboçi" qəzetində (oktyabr 1993-cü il) N.Məmmədovun "Qarabağ sindromu" sərlövhəli məqaləsi dərc olunub. Sonralar həmin məqalə Beynəlxalq Jurnalistlər İttifaqı tərəfindən bu məsələyə həsr olunmuş ən yaxşı analitik yazı sayılıb.

N.Məmmədov böyük elm, ədəbiyyat və incəsənət xadimlərinə həsr olunmuş bir sıra bədii-publisistik əsərlərin müəllifi kimi də tanınır. O, Beynəlxalq Yazıçılar və Publisistlər Assosiasiyasının həqiqi üzvüdür.



## Məmmədov
## Oqtay Yusif oğlu

*İqtisad elmləri doktoru, professor.*
*Rostov Dövlət Universitetinin siyasi iqtisad və iqtisadi siyasət kafedrasının müdiri*

Məmmədov Oqtay Yusif oğlu 1946-cı ildə Bakıda anadan olub.

1967-ci ildə Rostov Dövlət Universitetini "tarix" ixtisası üzrə bitirib. 1970-ci ildə həmin universitetin əyani aspiranturasına daxil olub, 1972-ci ildə iqtisad elmləri namizədi elmi dərəcəsi alaraq aspiranturanı vaxtından əvvəl bitirib. Aspiranturadan dərhal sonra siyasi iqtisad kafedrasının assistenti vəzifəsinə qəbul olunub. O.Məmmədov 1973-cü ildə kafedranın dosenti seçilib, 1979-cu ildə ona dosent elmi adı verilib.

O.Məmmədov 1984-cü ildə "İstehsal münasibətləri siyasi-iqtisadi tədqiqatların obyekti kimi" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 1985-ci ildə siyasi iqtisad kafedrasının müdiri seçilib. 1987-ci ildə ona siyasi iqtisad kafedrasının professoru elmi adı verilib. 1988-ci ildə Rostov Dövlət Universitetinin ictimai elmlər kafedrasının dekanı seçilib.

O.Məmmədovun rəhbərliyi ilə kafedrada tədqiqat predmeti iqtisadi-siyasi proseslərin müasir imperativləri olan "Qloballaşma və regionlaşma dövründə qarışıq iqtisadiyyat" elmi məktəbi təşkil edib.

O.Məmmədov 10 elmi monoqrafiyanın, 5 populyar dərsliyin və bir sıra tədris vəsaitinin müəllifidir. Onun bəzi tədris vəsaitləri akademik dairələr tərəfindən yüksək qiymətləndirilib. Ötən əsrin 90-cı illərində və 2000-ci illərdə O.Məmmədovun rəhbərliyi və redaktəsi ilə "Müasir iqtisadiyyat" seriyasından dərsliklər nəşr olunub. Bu seriyadan olan dərsliklər 90-cı illərdə tirajına və populyarlığına görə xarici dillərdən tərcümə olunmuş dərslikləri qabaqlayıb. O.Məmmədovun mətbuatda, o cümlədən "Akademiya" qəzetində xeyli əsəri dərc olunub.

O, həmçinin "Ekonomiçeskiy vestnik Rostovskoqo qosudarstvennoqo universiteta" jurnalının baş redaktoru, "tətbiqi makroiqtisadiyyat və iqtisadi siyasət" ixtisası üzrə magistraturanın yaradıcısı və rəhbəridir. 70-dən artıq İqtisad elmləri namizədi, 7 iqtisad elmləri doktoru O.Məmmədovun rəhbərliyi ilə müvəffəqiyyətlə dissertasiya müdafiə ediblər.

2007-ci ildə O.Məmmədova "Rusiya Federasiyasının Əməkdar Elm Xadimi" fəxri adı verilib.

O, 2008-ci ildən "Ekonomiçeskiye nauki" jurnalının redaksiya heyətinin üzvüdür. 2012-ci ildən əlaqələndirici kimi Beynəlxalq Siyasi İqtisad Assosiasiyasının konqreslərində iştirak edir. O, 2014-cü ildə "Pyatiqorsk Dövlət Dilçilik Universitetinin fəxri professoru" adına layiq görülüb.



## Məmmədov
## Vahid Abdulla oğlu

*Kimya elmləri doktoru, professor.*
*Kazan Elm Mərkəzinin A.Y.Arbuzov adına Üzvi və Fiziki Kimya İnstitutunun heterotsiklik birləşmələr kimyası laboratoriyasının müdiri*

Məmmədov Vahid Abdulla oğlu 1959-cu il iyulun 1-də Azərbaycan Respublikasının Zaqatala rayonunun Lahıc kəndində anadan olub.

V.Məmmədov Bakıdakı 5 nömrəli kimya-biologiya təmayüllü internat məktəbini bitirəndən sonra S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) kimya fakültəsinə daxil olub. 1981-ci ildə universiteti fərqlənmə diplomu ilə bitirib. Hərbi xidmətlə bağlı ikiillik fasilə ilə 1981-1985-ci illərdə Azərbaycan Elmlər Akademiyasının bir sıra kimya institutlarında işləyib.

V.Məmmədov 1985-ci ildə SSRİ Elmlər Akademiyasının Kazan filialının (indiki Rusiya Elmlər Akademiyasının Kazan Elm Mərkəzi (REA KEM) A.Y.Arbuzov adına Üzvi və Fiziki Kimya İnstitutunun (ÜFKİ) aspiranturasına daxil olub və 1989-cu ildə "α-xlorketonların sintezi və xassələri" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək aspiranturanı bitirib.

1997-1998-ci illərdə Yaponiyanın Okayama Universitetində professor Sadao Tsuboyun yanında elmi təcrübə keçib. Bu zaman yapon həmkarları ilə birlikdə şişə qarşı yüksək səmərəli müasir preparatlar olan taksolun və doketaksolun C-13 yan zəncirinin sintezi üçün yanaşmaların işlənib hazırlanması ilə məşğul olub.

V.Məmmədov 1999-cu ildə "α,α-dixlorkarbonil birləşmələr – aldehid (keton, azometin) - əsas" sistemində reaksiyalar və əmələ gələn məhsulların sintetik potensialı" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. V.Məmmədov 2002-ci ildə REA KEM-in A.Y.Arbuzov adına ÜFKİ-nin üzvi sintez laboratoriyası nəzdində yaradılan və 1994-cü ilə qədər neft-kimya sintezi laboratoriyası adlanan heterotsiklik birləşmələr kimyası laboratoriyasının müdiri olub. Bu gün V.Məmmədov heterotsiklik birləşmələr kimyası sahəsində tanınmış mütəxəssisdir.

Onun 3-, 5-, 6- və 7- üzvlü müxtəlif heterotsiklik sistemlərin sintezi, strukturu, reaksiyaya girmək bacarığı və mexanizmləri problemlərinə, təbii dərman preparatları kimyasına və fermentativ sintez metodlarına həsr olunmuş 150-dən çox elmi məqaləsi və icmalı dərc olunub.

V.Məmmədovun adı elm aləminə yaxşı tanışdır. Onunla həmmüəllif olanlar arasında Yekaterinburq (Rusiya), Drezden (Almaniya), Okayama, Osaka və Tokioda (Yaponiya) işləyən heterotsiklik kimya üzrə məşhur mütəxəssislər var. O, dəfələrlə heterotsiklik birləşmələr kimyası, üzvi sintez, tibbi kimya və bioloji aktiv maddələrə dair beynəlxalq konfranslarda (Latviya, 1990; Hollandiya, 1994; ABŞ, 1997; Yaponiya, 1997, 2000; Almaniya, 2002; İtaliya, 2006; Ukrayna, 2006; Belçika, 2008; Norveç, 2010) çıxış edib, dəvətli professor kimi Osaka, Tokio, Okayama, Kioto, Kobe (Yaponiya, 2000) universitetlərində "Heterotsikllər asimmetrik sintezin induktorları kimi" mövzusunda mühazirələr oxuyub, Koçi, İvaki, Meisey, Kitasato, Osaki (Yaponiya, 2008) universitetlərində "Darzan reaksiyası – köhnə reaksiya, yeni imkanlar" və "Xinoksalin-2(1H) üzvi sintezin əvəzolunmaz reagentləridir" mövzularında məruzələr edib.

V.Məmmədov böyük elmi-pedaqoji iş aparır. Uzun illərdir Kazan (Privoljsk) Federal Universitetinin (KFU) A.M.Butlerov adına Kimya İnstitutunun üzvi kimya kafedrasında "Heterotsiklik kimyanın nəzəri əsasları" və "Heterotsiklik birləşmələrin sintezində məntiq" mövzularında xüsusi kurslar, Kazan Milli Tədqiqat Texnoloji Universitetinin (KMTTU) üzvi kimya kafedrasında "Üzvi kimya" və "Üzvi birləşmələrin reaksiya qabiliyyəti" mövzularında ümumi kurslar üzrə mühazirə oxuyur.

V.Məmmədov üzvi sintezdə yüksək və məhsuldar kreativliyi ilə diqqəti özünə cəlb edən parlaq alimdir. Onun tələbələri ilə birlikdə işləyib hazırladığı reaksiyalar, təkrar qruplaşmalar, sintez metodları son 11 il ərzində hər il REA KEM-in A.Y.Arbuzov adına ÜFKİ-nin fundamental nəticələri reytinqinə daxil olur.

2012-ci ildə onun təkrar qruplaşmalarından biri "Mamedov Heterocycle Rearrangement" adı ilə A.Hassner və I.Namboothirinin "Organic Syntheses Based on Name Reactions" ("Elsevier Science" nəşriyyatı) monoqrafiyasına daxil edilib.

KFU, KMTTU və Mari Dövlət Universiteti tələbələrinin onun rəhbərliyi ilə yazılmış 45-dən çox kurs və diplom işi tələbə elmi işlərinin Ümumittifaq və Ümumrusiya müsabiqələrinin diplom və medallarına layiq görülüb.



## Mərdanlı
## Seyfəddin Həşim oğlu

*Tibb elmləri namizədi.*
*Dövlət Humanitar-Texnologiya Universitetinin farmakologiya və əczaçılıq fənləri kafedrasının dosenti.*
*"EKOlab" Qapalı Səhmdar Cəmiyyətinin prezidenti*

Mərdanlı Seyfəddin Həşim oğlu 1955-ci il iyunun 1-də Azərbaycan Respublikasının Naxçıvan Muxtar Respublikasında anadan olub.

1978-ci ildə "həkim-epidemioloq" ixtisası üzrə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti), 1984-cü ildə isə Rusiya Tibb Elmləri Akademiyasının N.F.Qamaleya adına Elmi-Tədqiqat Epidemiologiya və Mikrobiologiya İnstitutunun (ETEMİ) aspiranturasını bitirib. Hepatitlərin diaqnostikası üçün immunoferment test sistemləri mövzusunda dissertasiya müdafiə edərək, tibb elmləri namizədi alimlik dərəcəsi alıb, HİV-infeksiyanın təyini üçün test sisteminin hazırlanmasında iştirak edib.

1985-ci ildə S.Mərdanlı istehsalatda - Elektroqorskdakı İ.İ.Meçnikov adına Mərkəzi Elmi-Tədqiqat Vaksinlər və Zərdablar Epidemiologiya İnstitutunda (METVZİ müəssisəsi, sonradan "Antigen" müəssisəsi adlanıb, daha sonra "Fereyn" Əczaçılıq Səhmdar Cəmiyyətinin (ƏSC) filialı olub) əmək fəaliyyətinə başlayıb. Əvvəlcə mikrobioloq, az sonra böyük mikrobioloq, daha sonra sex rəisi olub.

1991-ci ildə S.Mərdanlı bir qrup həmfikirləri ilə birlikdə fərdi müəssisə – "EKOlab" məhdud məsuliyyətli ortaqlığı (MMO) yaradıb. Əvvəlcə bu, çox sadə müəssisə idi. Neft Məhsulları İnstitutunun Elektroqorsk filialından icarəyə götürülmüş bir neçə otaqda yerləşən kiçik laboratoriya olduqca məhdud çeşidli və az sayda diaqnostik preparatlar – HİV-infeksiyanın və sifilisin diaqnostikası üçün immunoferment test sistemləri buraxmağa başladı. Amma yeni firmanın məhsuluna tələbat çox oldu, onun təşkilatçıları, ilk növbədə S.Mərdanlı özü, qeyri-adi sahibkarlıq bacarığı nümayiş etdirdilər.

1992-ci ildən S.Mərdanlı firmanın daimi prezidenti olur, müəssisə ilbəil öz məhsullarının nomenklaturunu genişləndirərək və məhsul buraxılışının həcmini artıraraq sürətlə böyüməyə başlayır. 1993-cü ildə "EKOlab" artıq on beş adda immunoferment test sistemləri, farmakopeya üçün etil spirti, kliniki biokimya üçün təxminən iyirmi adda məhsul dəsti istehsal edir.

Bu gün müəssisədə 150-dən çox adda məhsul, o cümlədən HİV-infeksiyanın, B və C virus hepatitlərinin, sifilis, xlamidioz, toksoplazmoz, məxmərək xəstəliklərinin, sitomeqalovirus infeksiyasının, mikoplazmozların, xelikobakteriozun diaqnostikası üçün

immunoferment test sistemləri, passiv hemaqlyutinasiya reaksiyasının, immunoflüoresensiya reaksiyasının, lateksdə aqlütinasiya reaksiyasının köməyi ilə yoluxucu və qeyri-yoluxucu patologiyanın aşkar edilməsi üçün diaqnostikumlar, qanın 24 göstəricisinin biokimyəvi müayinəsi üçün dəstlər və zərdablar, qanın, sidiyin, nəcisin, bel mayesinin, bəlğəmin ümumi klinik analizi üçün dəstlər, mikrobioloji və histoloji tədqiqatlar üçün boyalar, geniş tələbat olan çoxlu sayda maye dərman vasitələri istehsal edilir.

S.Mərdanlı istehsal problemlərinin həlli ilə bərabər, elmi işlə məşğul olmağı da unutmur. O, üç tədqiqat laboratoriyasının fəaliyyətinə bilavasitə rəhbərlik edir və istehsal olunan məhsulun nomenklaturunun daim genişlənməsi məhz bu iş sayəsində təmin edilir. Bu işin aşkar nəticələrindən biri də odur ki, yeni diaqnostik preparatların yaradılmasının nəticələri barədə bir sıra məqalələr dövri elmi mətbuatda nəşr edilib, həmçinin TORCH qrupu infeksiyalarının diaqnostikası problemi barədə S.Mərdanlının bir sıra məşhur alimlərlə həmmüəllif kimi hazırladığı 5 monoqrafiya çapdan çıxıb. Onun dərc edilmiş əsərlərinin ümumi siyahısında 120-dən çox elmi məqalə və metodik vəsait var. O, 8 ixtira üçün patent alıb.

S.Mərdanlı 2014-cü ildən Moskva Dövlət Vilayət Humanitar İnstitutunda (2015-ci ildən – Dövlət Humanitar-Texnologiya Universiteti adlanır) farmakologiya və əczaçılıq fənləri kafedrasının dosenti vəzifəsində işləyir. Mikrobiologiya, ümumi gigiyena, narkomaniyanın və QİÇS-in profilaktikası kimi fənlərdən dərs deyir.

S.Mərdanlı iki dəfə Elektroqorsk bələdiyyə qurumunun Deputatları Sovetinə üzv seçilib, orada elm, təhsil, səhiyyə, mədəniyyət, idman məsələləri və sosial məsələlər üzrə Komissiyaya başçılıq edir.

S.Mərdanlı Rusiya Tibbi-Texniki Elmlər Akademiyasının akademiki, "İmmunogen" Assosiasiyasının prezidentidir. İşdə yüksək göstəricilər üçün "Moskvanın 850 illiyi" yubiley medalı ilə (1998), "Moskva vilayətinin 70 illiyi şərəfinə" fəxri nişanı ilə (2003) təltif olunub. 2002-ci ildə əczaçılıq sahəsinin peşəkarlarının açıq müsabiqəsində ona "İlin meneceri" diplomu, "Rusiya iqtisadiyyatının inkişafı problemlərinin həllində böyük nailiyyətlərə görə" A.N.Kosıgin adına mükafat və Elektroqorsk başçısının Fəxri Fərmanı təqdim edilib. "Moskva vilayətinin Əməkdar Səhiyyə İşçisi" (2001), "Rusiya Federasiyasının Səhiyyə Əlaçısı" (2003), "Rusiya Federasiyasının Əməkdar Səhiyyə İşçisi" (2005) fəxri adlarına, "Rusiyanın ən yaxşı meneceri" diplomuna (2003) layiq görülüb.

Bundan başqa, S.Mərdanlı – elmin dəstəklənməsi və elmi kadrlar hazırlığına kömək üzrə ictimai təşkilatların Beynəlxalq Akademiyalararası İttifaqının ali mükafatının – II dərəcəli "Vernadski ulduzu"nun (2005) və tibbi biotexnologiyalar sahəsində işlərinə görə İ.N.Bloxina adına mükafatın (2005) sahibidir.



## Mirzəyev
## Arif Abdulla oğlu

*Bəstəkar, orqançı, pianoçu.*
*Azərbaycanın Əməkdar Artisti*

Mirzəyev Arif Abdulla oğlu 1944-cü il aprelin 10-da Bakıda, zəngin musiqi ənənələrinə malik ailədə anadan olub.

1961-ci ildə Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyası (indiki Ü.Hacıbəyli adına Bakı Musiqi Akademiyası) nəzdində musiqi məktəbini bitirib. A.Zeynallı adına Bakı musiqi məktəbinin nəzəriyyə-bəstəkarlıq bölməsində təhsilini davam etdirib.

A.Mirzəyev bəstəkarlıq sənətini Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyasında Q.Qarayevin sinfində öyrənib.

2000-2002-ci illərdə P.İ.Çaykovski adına Moskva Konservatoriyasında orqan nəzəriyyəsi və tarixi üzrə professor N.Malinanın, orqan ifaçılığı sənəti üzrə professorlar C.Dijura və N.Qureyevanın yanında staj keçib. A.Mirzəyev Bakı, Lənkəran və Sumqayıt məktəb və kolleclərində işləyərək bəstəkarlıq və pedaqoji fəaliyyətini birləşdirib. Sonra Rusiyada - T.Xrennikov adına Yelets musiqi məktəbində, Moskva Qiyabi Musiqi-Pedaqoji Universitetində təhsil alıb. Sonralar konsert verən orqançı və pianoçu olur.

A.Mirzəyev Azərbaycan dini-memorial orqan və polifonik musiqisinin, habelə qədim islam şəhidləri musiqisinin əsasını qoyub. O, müasir musiqidə polistilistika ustasıdır. 2000-ci və 2002-ci illərdə "İ.S.Baxın xatirəsinə orqan simfoniyası" və "Yanvar passionu" İslam matəm messasına görə musiqi sənəti sahəsində Rusiya Federasiyasının Dövlət Mükafatına layiq görülüb.

A.Mirzəyev İ.S.Bax musiqisi sahəsində mütəxəssisdir, onun yaradıcılığının fəal təbliğatçısıdır. 1979-cu ildən Rusiya və Azərbaycan Bəstəkarlar ittifaqlarının üzvüdür, 1994-cü ildən "İ.S.Bax adına Yeni Beynəlxalq Musiqi Cəmiyyəti"nin (Almaniya, Leypsiq) üzvü, 2006-cı ildən Avropa Bəstəkarlar və Orqançılar Assosiasiyasının üzvüdür. Avropa Azərbaycanlıları Konqresinin (Berlin əlaqələndirmə mərkəzi) fəxri üzvüdür.

A.Mirzəyev MDB ölkələri mədəniyyət və incəsənət xadimləri arasında "İohann Sebastyan Baxın varisləri" beynəlxalq xatirə gümüş medalı ilə təltif edilmiş (Ayze-

nax, Almaniya, 1994) ilk şəxsdir. Onun xidmətləri RF Mədəniyyət Nazirliyinin, Azərbaycan Respublikası Diasporla İş üzrə Dövlət Komitəsinin, Azərbaycan Respublikasının Almaniyadakı səfirliyinin Fəxri fərmanları ilə qiymətləndirilib.

A.Mirzəyevin əsərləri hələ tələbəlik illərində “Sovetskiy kompozitor” və “Muzıka” SSRİ mərkəzi musiqi nəşriyyatlarında dəfələrlə çap edilib. Hazırda onun əsərləri Almaniyanın musiqi nəşriyyatlarında, o cümlədən “Xans Sikorskiy” (Hamburq) nəşriyyatında çapa hazırlanır.

A.Mirzəyevin əsərlərinin ifaçıları sırasında görkəmli musiqiçilər - beynəlxalq müsabiqələr laureatları Y.Adıgözəlov, F.Bədəlbəyli, N.Qavrilova, T.Göyçayev, N.Qureyeva, L.Dedova, D.Zaretski, N.Koqan, M.Makarova, A.Markov, A.Sevidov, A.Slobodyanik, M.Stefanski, A.Fiseyski, F.Xrets, N.Yaşvili var.

Rusiya və Qərbi Avropa mətbuatında böyük musiqiçilər - professor və orqançı A.Kotlyarevski, dirijor professor Kurt Mazur, bəstəkar-avanqardçı Udo Tsimmerman A.Mirzəyevi “Şərqin İohann Sebastyan Baxı”, habelə dünya faciələrini əks etdirən memorial musiqinin böyük ustası adlandırırlar. Bu sahədə A.Mirzəyev əsərlərinin sayına görə dünyada mütləq rekordçudur.

A.Mirzəyev - ornamental-muğam, xoral və polifonik variasiyalar formasında Şərq polifonik solo orqan musiqisi yazan ilk azərbaycanlıdır, dünya musiqi ədəbiyyatında ilk İslam matəm musiqisi “Yanvar passionu”nu (Yanvar mərsiyələri) bəstələyib (1992). Bu əsərlərdə mərsiyə - müsəlman ənənəsində matəm musiqisinin ayin elementi alman matəm musiqisi ənənələri ilə - İ.S.Baxın “Matfey əzabları” və “İohann əzabları” əsərləri ruhunda sintez edilib.

“Fortepiano üçün 24 prelüd silsiləsi” (1966-1989), “Skripka və fortepiano üçün “Leypsiq” sonatası” (1969), “İ.S.Baxın xatirəsinə solo orqan simfoniyası” (1984, Baxın 300 illiyinə), orqan üçün “Xocalı uşaqlarına - Qarabağ qurbanlarına layla” (1996), “Şahzadə Dianaya sarabanda” (1997), 2001-ci il 11 sentyabr Nyu-York faciəsi qurbanlarının xatirəsinə həsr edilən “Nyu-York passionu” (2001), ümummilli lider Heydər Əliyevin xatirəsinə həsr etdiyi skripka və orqan üçün “Dahi Prezidentə kədərli dualar” (2004), “Üzeyir Hacıbəyov” İkinci orqan simfoniyası (2008) bəstəkarın ən məşhur əsərləri hesab olunur.

Müəllif bəstəkar layihəsi olan “Baxın xatirəsinə orqan simfoniyası”nın dünyanın ən böyük kilsələrində təqdimatı çərçivəsində bu əsər Londonda məşhur Vestminster abbatlığı kilsəsində, Şotlandiyanın paytaxtında - Dünya İncəsənət Festivalının keçirildiyi Edinburqda, York (İngiltərə) şəhərinin baş kilsəsi olan Yorkminsterdə, Va-

şinqtonda dünyanın yalnız seçilmiş musiqiçilərinin iştirak etmək hüququ olduğu ABŞ Milli Kafedal Kilsəsində səsləndirilib.

Bakı Lüteran kirxasında və Moskvada Roma katolik kilsəsində A.Mirzəyevin müəllif yubiley konsertləri də olub (1994, 2014). A.Mirzəyev 2008-ci ildə Bakıda Azərbaycanda Almaniya Mədəniyyəti İlini açaraq solo orqan konserti verib.

Bəstəkar yaradıcılıq bioqrafiyasındakı bir faktla çox qürur duyur. 1996-cı ildə A.Mirzəyevin Böyük Britaniyaya ilk qastrol səfəri ərəfəsində Şotlandiyadan tanımadığı orqançı Maykl Koll ona zəng edib. Dünya şöhrətli bəstəkar və orqançı və "memorial musiqi ustası"nın Edinburqda öz simfoniyasını ifa edəcəyi barədə xəbəri internetdə oxuyan M.Koll A.Mirzəyevə gözlənilməz xahişlə müraciət edib: Şotlandiyanın kiçik Dambleyn şəhərində terrorçunun avtomat atəşi ilə öldürdüyü on altı məktəblinin və onların müəlliminin xatirəsinə orqan üçün qəmli pyes bəstələsin.

"Dambleyn uşaqlarına layla" orqan pyesi qaralama halında bir gündə yazıldı, üzü isə Şotlandiyada çıxış ərəfəsində təmiz köçürüldü. Sonra məlum oldu ki, bu əsər Dambleyndə Böyük Britaniya kraliçası II Yelizaveta və şahzadə Çarlz Uelsin iştirak etdikləri memorial liturgiya xidməti zamanı səsləndirilib.

A.Mirzəyevin çoxşaxəli yaradıcılığı təkcə xoral prelüd, sonata, simfoniya və passionlar formasında klassik musiqi janrında təqdim edilməyib. Nadir istedada malik bəstəkar həm də estrada mahnısı və caz kompozisiyalarının müəllifidir. Məsələn, Rəsul Həmzətovun sözlərinə bəstələdiyi "Qar üzərində izlər" (Yaak Yoalanın ifasında) 1974-cü ildə Tallində Ümumittifaq estrada mahnıları müsabiqəsində 2-ci mükafatı qazanıb. A.Mirzəyevin mahnılarını sovet dövründə L.Leşenko, İ.Kobzon, Z.Tutov, habelə ADR-də də tanınan Q.Uletova ifa ediblər.

A.Mirzəyev 2011-ci ildə "Azərbaycanın Əməkdar Artisti" fəxri adına layiq görülüb.

O, hazırda Fulda (Almaniya) şəhərində yaşayır.



## Mirzəyev
## Dilican Allahverdi oğlu

*Texnika elmləri doktoru, professor.*
*"Dəniz neft-qaz yataqları" Mərkəzinin direktoru*

Mirzəyev Dilican Allahverdi oğlu 1940-cı il dekabrın 27-də Ermənistan Respublikasının İcevan rayonunun Salah kəndində anadan olub.

Ordu sıralarında tank qoşunlarında təlimatçı kimi xidmət etdikdən sonra Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunun (indiki Azərbaycan Texniki Universiteti) hidrotexnika fakültəsinə daxil olub. 1964-cü ildə V.V.Kuybışev adına Moskva İnşaat Mühəndisləri İnstitutunda (MİMİ) SSRİ neft sənayesi nazirinin birinci müavini Sabit Orucov tərəfindən yaradılan "dəniz neftqazmədən mühəndis qurğuları" ixtisası üzrə qrupa keçirilib.

D.Mirzəyev 1968-ci ildə MİMİ-ni fərqlənmə diplomu ilə bitirib, 1972-ci ildə S.Orucovun rəhbərliyi ilə "Qeyri-müntəzəm dalğaların silindrik dayaqlar üzərində yerləşən dərin dəniz qurğularına təsirinin tədqiqi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

D.Mirzəyev aspiranturanı bitirəndən və dissertasiya müdafiə edəndən sonra SSRİ Qaz Sənayesi Nazirliyinin mərkəzi aparatının qazma idarəsində işləyib. 1973-1977-ci illərdə Ümumittifaq Elmi-Tədqiqat Layihə Qaz İnstitutunda (ÜETLQİ) qaz sənayesi sistemində ilk dəfə yaradılan "Dəniz qaz-mədən işi" laboratoriyasına başçılıq edib.

1978-ci ildə Ümumittifaq Dənizneftqaz Elmi-Tədqiqat və Layihə İnstitutunda (ÜDNQETLİ) dəniz qaz-mədən işi şöbəsi yaradılır. D.Mirzəyev burada şöbə rəisi vəzifəsini tutur. Sonra şöbə SSRİ Nazirlər Sovetinin Qərarı ilə 1978-ci ildə yaradılan "Soyuztexmornefteqaz"ın təcrübi-konstruktor-texnoloji bürosunun (TKTB) tərkibinə keçir. D.Mirzəyev TKTB-nin baş konstruktorunun müavini vəzifəsinə təyin edilir. 1982-ci ildə ÜDNQETLİ direktorunun elm üzrə müavini vəzifələrini icra edib.

D.Mirzəyev 1995-ci ildə "Donan dənizlərin dayaz şelfində neft-qaz ehtiyatlarının işlənməsi üçün hidrotexnoloji qurğular" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 1998-ci ildə ÜETLQİ-də şöbə rəisi vəzifəsinə keçib, 2003-cü ildən bu günə qədər "Dəniz neft-qaz yataqları" Mərkəzinin direktorudur. Mərkəz "Ştokmanovskoye", "Severo-Kamennomısskoye", "Kamennomısskoye-more" kimi qaz ya-

taqlarının və "Prirazlomnoye" neft yatağının işlənməsi və mənimsənilməsi layihələri ilə məşğuldur.

D.Mirzəyev Rusiya neft-qaz sənayesinin dəniz neft-qaz yataqlarının mənimsənilməsi üçün texniki vasitə və texnologiyaların yaradılması sahəsində aparıcı alim və mütəxəssislərdən biridir. O, Rusiya şelfinə uyğun layihələndirilən buzadavamlı platformaların müxtəlif konstruksiyalarını işləyib hazırlayıb. Alimin elmi rəhbərliyi ilə dəniz neft-qaz yataqlarının təchizat obyektlərinin layihələndirilməsi üzrə federal normativ baza hazırlanıb. D.Mirzəyev Saxalin adası şelfində "Saxalin-1" və "Saxalin-2", Peçora dənizində "Prirazlomnoye" və Barens dənizində "Ştokmanovskoye" layihələrinin işlənib hazırlanmasının iştirakçısı, habelə "Cənubi Pars" (Fars körfəzi, İran) beynəlxalq layihəsinin rəhbəridir.

D.Mirzəyev 1993-cü ildən "Qazprom" Rusiya Səhmdar Cəmiyyətinin tək illərdə Sankt-Peterburqda keçirilən "Arktika dənizləri şelfinin mənimsənilməsi" beynəlxalq konfransının icraiyyə komitəsinin sədri və təşkilat komitəsinin üzvüdür. Alim Rusiyanın Beynəlxalq Standartlaşdırma Komitəsinin (ISO) "Arktika qurğularının layihələndirilməsi" layihəsindəki nümayəndəsidir.

D.Mirzəyev kontinental şelfin mənimsənilməsi problemləri üzrə 42 müəlliflik şəhadətnaməsinin, 220-dən çox elmi işin, o cümlədən 4 monoqrafiyanın və 3 kitabçanın müəllifidir.

D.Mirzəyev "Qazprom" ASC-nin mükafatının (2006), Beynəlxalq Yanacaq-Energetika Assosiasiyasının N.K.Baybakov adına mükafatının (2005), RF Hökumətinin elm və texnika sahəsində mükafatının (2008) laureatıdır. "Əmək veteranı" medalı və "Moskvanın 850 illiyi" xatirə medalı ilə təltif edilib, qaz sənayesinin fəxri işçisidir (2000), RF YEK-in fəxri işçisidir (1998), "Qaz sənayesi əlaçısı" nişanı, Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin qızıl və gümüş medalları ilə təltif edilib.



## Mirzəyev
## Məlik Abbas oğlu

*Neft-Qaz Sənayesi və Neft-Qaz Kompleksləri Tikintisi İşçiləri Həmkarlar İttifaqlarının Beynəlxalq Konfederasiyasının baş katibi*

Mirzəyev Məlik Abbas oğlu 1940-cı il mayın 31-də Bakıda anadan olub.

Əmək fəaliyyətinə 1957-ci ilin iyununda "Neftçalaneft" Neft və Qazçıxarma İdarəsində neft hasilatı və neft quyularının tədqiqi operatoru vəzifəsində başlayıb. 1957-1962-ci illərdə Sovet Ordusu sıralarında xidmət edib.

1962-1969-cu illərdə "Azdənizneftkəşfiyyat" (Bakı) trestinin eksperimental elektroqazma kontorunun elektrik montyoru, 3 nömrəli qazma kontorunun mühəndis-dispetçeri işləyib.

M.Mirzəyev 1973-cü ildə Ümumittifaq Həmkarlar İttifaqları Mərkəzi Şurasının (ÜHİMŞ) Həmkarlar İttifaqları Hərəkatı Ali Məktəbinin (HİHAM) əyani bölməsini "əmək üzrə iqtisadçı" ixtisası üzrə bitirib.

1973-1979-cu illərdə Ümumittifaq Elmi-Tədqiqat Qaz Sənayesində İqtisadiyyat, İstehsalın Təşkili və Texniki-İqtisadi İnformasiya İnstitutunun (ÜETQSİİTTİİİ) əməyin elmi təşkili laboratoriyasının böyük mühəndisi, böyük elmi işçisi, müdiri, əməyin və istehsalın təşkili və idarə olunması şöbəsinin müdiri işləyib.

M.Mirzəyev 1979-cu ilin yanvarında Neft-Qaz Sənayesi İşçiləri Həmkarlar İttifaqı Mərkəzi Komitəsinin istehsalat işi və əməkhaqqı şöbəsi müdirinin müavini vəzifəsində təsdiq edilib. 1980-1982-ci illərdə ÜHİMŞ-in sosializm yarışı və istehsalatda kütləvi işin təşkili şöbəsinin təlimatçısı olub. 1982-1985-ci illərdə ÜHİMŞ-in Əlaqələndirmə Şurasının magistral qaz kəmərləri tikən əmək kollektivləri arasında sosializm yarışının təşkili üzrə məsul katibidir.

1985-1987-ci illərdə ÜHİMŞ-in Əlaqələndirmə Şurasının həmkarlar ittifaqlarının Qərbi Sibirdə neft-qaz sənayesinin kompleks inkişafında iştirakı üzrə məsul katibi olub.

M.Mirzəyev 1987-ci ilin dekabrında "Surqutneftqaz" (Qərbi Sibir) İstehsalat Birliyinin həmkarlar ittifaqı komitəsinin sədri seçilib, 1990-cı ilin dekabrından isə Neft-Qaz Sənayesi və Neft-Qaz Kompleksi Tikintisi İşçilərinin Həmkarlar İttifaqlarının (NQSNQKTİHİ) Mərkəzi Şurası (Moskva) sədrinin müavinidir. 1992-ci ilin mar-

tında suveren dövlətlərin Neft-Qaz Sənayesi və Neft-Qaz Kompleksi Tikintisi İşçilərinin Həmkarlar İttifaqları Birliyinin prezidenti olub.

M.Mirzəyev 1995-ci ilin dekabrından bu günə qədər Neft-Qaz Sənayesi və Neft-Qaz Kompleksləri Tikintisi İşçilərinin Həmkarlar İttifaqlarının Beynəlxalq Konfederasiyasının baş katibidir.

M.Mirzəyevin başçılıq etdiyi konfederasiyanın tərkibinə Azərbaycan, Belarus, Gürcüstan, Qazaxıstan, Moldova, Rusiya Federasiyası, Ukrayna, Özbəkistan və Türkmənistanın neft-qaz kompleksi işçilərinin həmkarlar ittifaqları, habelə "Vyetsovpetro" Rusiya-Vyetnam Birgə Müəssisəsinin və "Belarusneft" İstehsalat Birliyinin birləşmiş həmkarlar ittifaqı təşkilatları daxildir. Konfederasiya öz sıralarında həmkarlar ittifaqlarının 2 milyondan çox üzvünü birləşdirir.

M.Mirzəyev Həmkarlar İttifaqları Ümumi Konfederasiyasının (HİÜK) nümayəndə heyətinin tərkibində Müstəqil Dövlətlər Birliyinin Parlamentlərarası Assambleyasının Sankt-Peterburqda keçirilən plenar iclaslarının, HİÜK-in İcraiyyə Komitəsinin MDB ölkələrində həmkarlar ittifaqı hərəkatının aktual problemlərinə dair elmi-praktik konfranslarının və iclaslarının daimi iştirakçısıdır.

M.Mirzəyev 2003-cü ildə HİÜK-in İcraiyyə Komitəsinin və Şurasının üzvü seçilib və hazırda da üzvüdür.

"SSRİ xalq təsərrüfatının inkişafında əldə etdiyi nailiyyətlərə görə", "NQSNQKTİHİ-nin 90 ili", "Moskvanın 850 illiyi", "Rusiya Həmkarlar İttifaqlarının 100 illiyi" medalları, "Qaz Sənayesi Nazirliyinin əlaçısı", "Urenqoy–Novopskov qaz kəmərinin tikintisinin iştirakçısı", "Urenqoy-Pomarı-Ujqorod qaz kəmərinin tikintisinin iştirakçısı", "Neft Sənayesi Nazirliyinin əlaçısı", HİÜK-in "Həmkarlar ittifaqı hərəkatı qarşısında xidmətlərə görə", "Ukraynada NQHİ-nin inkişafına şəxsi töhfəsinə görə" fəxri nişanları ilə təltif edilib, Neft-Qaz Sənayesi və Neft-Qaz Kompleksləri Tikintisi İşçilərinin Həmkarlar İttifaqlarının Beynəlxalq Konfederasiyasının mükafatlarının laureatıdır.

M.Mirzəyev "Azdənizneftkəşfiyyat" tresti administrasiyasının və 3 nömrəli qazma kontorunun həmkarlar ittifaqı komitəsinin, Azərbaycan Lenin Kommunist Gənclər İttifaqının Mərkəzi Komitəsinin, Azərbaycanın neft kəşfiyyatçılarının həmkarlar ittifaqının, Surqut rayon həmkarlar ittifaqı komitəsinin, Tümen vilayəti həmkarlar ittifaqı komitəsinin, HİÜK, Türkmənistan NQHİ-nin, Qazaxıstan NQHİ-nin Atırau vilayəti şurasının, Ukrayna NQHİ-nin mərkəzi komitəsinin qrup komitəsinin fəxri fərmanları, ÜHİMŞ-in iki fərmanı ilə mükafatlandırılıb. "Qaz sənayesinin fəxri işçisi" və "Gürcüstanın neft-qaz sənayesinin fəxri işçisi" adlarına layiq görülüb.



## Mövsümzadə
## Eldar Mirsəməd oğlu

*Kimya elmləri doktoru, professor.*
*Şimal, Sibir və Uzaq Şərqin Azsaylı Xalqların Təhsili İnstitutunun direktoru*

Mövsümzadə Eldar Mirsəməd oğlu 1948-ci il sentyabrın 8-də Bakıda anadan olub.

1967-ci ildə M.Əzizbəyov adına Azərbaycan Neft və Kimya İnstitutunu (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) bitirib. 1983-cü ildə kimya elmləri doktoru elmi dərəcəsi alıb, 1985-ci ildə professor olub.

E.Mövsümzadə 1985-1993-cü illərdə ümumi kimya kafedrasının müdiri, 1987-1992-ci illərdə M.Əzizbəyov adına Azərbaycan Neft və Kimya İnstitutunda elmi iş üzrə prorektor vəzifəsini tutub. 1993-cü ildən Ufa Dövlət Neft Texniki Universitetinin (UDNTU) ümumi və analitik kimya kafedrasının professorudur. Elə həmin ildən 2011-ci ilə qədər əvəzçilik əsasında RF Təhsil Nazirliyinin Elmi-Tədqiqat Aztonnajlı Kimyəvi Məhsullar və Reaktivlər İnstitutunun direktorunun müavini işləyib.

E.Mövsümzadə 1996-cı ildə Beynəlxalq Ekologiya, İnsan Təhlükəsizliyi və Təbiət Akademiyasının müxbir üzvü, 1997-ci ildə Rusiya Təbiət Elmləri Akademiyasının akademiki, 2010-cu ildə Rusiya Dövlət Təhsil Akademiyasının akademiki seçilib.

Hazırda Şimal, Sibir, Uzaq Şərqin Azsaylı Xalqlarının Təhsili İnstitutunun direktorudur.

Rusiya Federasiyasının (2009) və Başqırdıstanın (1998) Əməkdar Elm Xadimidir. RF-nin Ali Peşə Təhsili İşçisidir.

E.Mövsümzadə 4 elmlər doktoru və 73 elmlər namizədi hazırlayıb. Onun elmi maraqları dairəsinə əvəz olunmuş nitritlər, neft emalı məhsulları, neft kimyası, yerli və xarici neft-qaz işinin tarixi daxildir.

O, metalların qeyri-üzvü duzları ilə zəif komplekslər yarada bilən və kataliz xüsusiyyətlərinə malik olan çoxfunksiyalı liqandların axtarışı ilə məşğul olub. Liqandlar homogen katalizdə və koordinasiya birləşmələri kimyasında uğurla tətbiq edilə bilər.

E.Mövsümzadənin rəhbərliyi ilə törəmə nitrillərin kompleksyaratma və ekstraksiya xüsusiyyətlərinin tədqiq edilməsi Azərbaycanda neft buruqlarından və neft-qaz yataqlarının lay sularından strateji metalın - litiumun çıxarılmasının tətbiqi məsələsini həll

etməyə imkan verib. Xüsusi üzvi birləşmələr – qeyri-üzvi duzların, məsələn, mineral gübrələrin parçalanmasının inhibitorları olan oksigen və xlor tərkibli nitrillər tapılıb.

E.Mövsümzadənin elmi-texniki tədqiqatları Başqırdıstan Respublikasının neft-kimya və neft emalı istehsalatlarına uğurla tətbiq edilib. Məsələn, yerli xammal, neft emalı və neft-kimya tullantıları (emulsollar) əsasında reagentlər seriyası – səthi-aktiv maddələr və yağlayıcı-soyuducu mayelər işlənib hazırlanıb və tətbiq edilib.

İşimbay ixtisaslaşdırılmış kimyəvi katalizatorlar zavodunda professor E.Mövsümzadənin rəhbərliyi ilə elmi mərkəz yaradılıb. Mərkəzdə katalizatorların komponentləri kimi karbohidrogenlərin bölünməsi üçün nəzərdə tutulan seolitlərin yeni siniflərinin işlənib hazırlanması ilə bağlı tədqiqatlar aparılır, habelə ana məhlul əsasında ekoloji cəhətdən təmiz, fosfatsız yuyucu vasitə və maye şüşə istehsal edilir.

O, 400-dən çox elmi yazının, o cümlədən 27 monoqrafiyanın, 34 müəlliflik şəhadətnaməsinin və patentin, xarici və yerli jurnallarda dərc olunmuş 200-dən çox elmi məqalənin müəllifidir.

E.Mövsümzadə "Başkirskiy ximiçeskiy jurnal", "Transport i xraneniye nefteproduktov i uqlevodorodnoqo sırya" jurnalının baş redaktorunun müavini, "İstoriya nauki i texniki", "Neft, qaz i biznes", "Neftepererabotka i nefteximiya", "Mir nefteproduktov", "Promışlennoye proizvodstvo i ispolzovaniye elastomerov" jurnallarının redaksiya heyətlərinin üzvüdür.

UDNTU-nun və İ.M.Qubkin adına Rusiya Dövlət Neft və Qaz Universitetinin dissertasiya şuralarının, Ümumrusiya Azərbaycanlılar Konqresinin Ekspert Şurasının üzvüdür.

RF Hökumətinin elm və texnika (2006), habelə təhsil (2007) sahəsində mükafatlarının laureatıdır.



## Mustafabəyli
## Əli Mithəd oğlu

*Rusiya Xarici İşlər Nazirliyinin Diplomatiya Akademiyasının Aktual Beynəlxalq Problemlər İnstitutunun aparıcı elmi işçisi*

Mustafabəyli Əli Mithəd oğlu 1948-ci il oktyabrın 21-də Bakıda anadan olub.

1966-cı ildə məktəbi bitirərək, S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) şərqşünaslıq fakültəsinin fars dili bölməsinə daxil olub. Onun Əbülqasim Firdovsi, Sədi Şirazi, Ömər Xəyyam kimi böyük şair və mütəfəkkirlərin dilini öyrənmək arzusu gerçəkləşir. 1969-cu ildə onun ilk peşə sınağı olur: üçüncü kursu bitirəndən sonra Ə.Mustafabəylini İrana - o dövrdə regionda ən böyük metallurgiya zavodunun tikildiyi İsfahana göndərirlər. İranlıların əsrin layihəsi hesab etdiyi zavodun tikintisi Sovet İttifaqının texniki-iqtisadi köməyi ilə həyata keçirilirdi.

İranda gənc sovet tərcüməçisi üçün yeni dünya açılır. O vaxtlar Tehranı Şərqin Parisi adlandırırdılar. Şəhərdə saysız-hesabsız rəngbərəng reklamların işıqları bərq vurur, fars yazısı isə bu mənzərəni daha əsrarəngiz edirdi.

Bir il tərcüməçi işləməsi Ə.Mustafabəyli üçün çox faydalı olur: o, Tehran və İsfahan dialektlərini öyrənir. 1970-ci ildə Bakıya qayıdır, 1971-ci ildə universiteti bitirir, sonra orduya çağırılır və artıq diplomlu hərbi tərcüməçi kimi Əfqanıstana ezam edilir. Məğrur və döyüşkən insanların yaşadığı sərt və möhtəşəm təbiətli bu maraqlı və gözəl ölkədə gənc mütəxəssis sonralar ona çox faydalı olan həyat təcrübəsi və peşəkarlıq qazanır.

1975-ci ildə atasının yeni iş yerinə keçməsi ilə əlaqədar ailə Moskvaya köçür. Ə.Mustafabəyli 1977-ci ildə SSRİ Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunun aspiranturasına daxil olur və 1979-cu ildə İranın sonuncu şahı Məhəmməd Rza Pəhləvinin sosial siyasətinə həsr olunmuş dissertasiya müdafiə edir. Tədqiqat materialı şahın hakimiyyətinin möhkəm olmadığını göstərirdi, halbuki həyata keçirilən islahatlar şahın və onun hökumətinin mövqeyini möhkəmləndirməli idi. Monarxiyanın süqutu həm sovet, həm də xarici siyasi xadimlər və iranşünas şərqşünaslar üçün tamamilə gözlənilməz oldu.

Ə.Mustafabəyli 1980-ci ildə Xarici Ölkələrlə Sovet Dostluq və Mədəni Əlaqə Cəmiyyətləri İttifaqında işə qəbul olunur və Sovet Elm və Mədəniyyət Evinin (SEME) direktoru kimi Kabilə göndərilir. O vaxt Əfqanıstanda Aprel inqilabı (1978) baş vermişdi. Sovet qoşunları və Əfqanıstanın hökumət qüvvələri ilə özlərini mücahid adlandıran müxalif qruplaşmalar arasında müharibə gedirdi.

Yaranmış mürəkkəb şərait SEME-nin fəaliyyətinə nəinki mane olmurdu, hətta stimullaşdırırdı. Burada iş elə qurulmuşdu ki, yerli əhali ona şəhər mədəniyyət mərkəzi kimi baxırdı. SEME-də əfqan gənclər teatrı, Kabil vokal-instrumental ansamblı, əfqan uşaqlar üçün musiqi məktəbi və təsviri sənət studiyası fəaliyyət göstərirdi, sovet və yerli rəssamların sərgiləri, iki ölkənin elm və mədəniyyət xadimlərinin görüşləri təşkil olunurdu. Sovet estradasının bir çox ulduzları – İ.Kobzon, V.Leontyev, E.Pyexa, A.Veski, R.Rımbayeva, "Qaya", "Vesyolıye rebyata", "Syabrı" vokal-instrumental ansamblları SEME-nin səhnəsində çıxış edirdilər.

SEME-nin populyarlığı mücahidləri çox narahat edirdi. Mədəniyyət evi üç dəfə raket atəşinə məruz qalmışdı, amma yaşamağa, proqramları ilə əfqanları, xüsusən gəncləri cəlb etməyə davam edirdi.

1987-ci ildə Kabildən qayıdan Ə.Mustafabəyli SSRİ XİN-də işləməyə başlayır və 1990-cı ildə yenə də Əfqanıstana, əvvəlcə Sovet İttifaqının, sonra Rusiya səfirliyinin müşaviri vəzifəsinə ezam edilir. Sovet qoşunları Əfqanıstandan çıxandan və mərkəzi hökumət devriləndən sonra Kabildə hakimiyyət uğrunda mübarizə aparan mücahid qruplaşmaları arasında başlanmış intensiv döyüş əməliyyatları ilə əlaqədar xarici diplomatik nümayəndəliklər, o cümlədən Rusiya səfirliyi 1992-ci ildə Kabildən təxliyyə edilir.

Ə.Mustafabəyli 1994-cü ildə uzun sürən fasilədən – 24 ildən sonra yenidən İrana gəlir. Beş il Rusiyanın Tehrandakı səfirliyində müşavir-elçi vəzifəsində çalışır.

Ə.Mustafabəyli 2001-2002-ci illərdə ATƏT-in Bişkekdəki Mərkəzində işləyir. Mərkəz əsas etibarilə Qırğızıstanda demokratik təsisatların yaradılmasına dəstək göstərirdi.

Ə.Mustafabəyli 2003-2006-cı illərdə Rusiya Federasiyasının İsfahandakı Baş konsulluğuna rəhbərlik edir. Yeni missiya uğurlu olur: diplomatik işdə topladığı təcrübə, iranlı tərəfdaşlarla ünsiyyət kömək edir.

Nəticədə 2006-cı ildə Rusiya XİN-in İkinci Asiya Departamentinin direktorunun müavini vəzifəsinə yüksək təyinat alır. Məsul olduğu sahə İran və Əfqanıstan ilə münasibətlər idi. Hər iki istiqamət mürəkkəb olduğu qədər də maraqlı idi. Bütün beynəlxalq birliyin diqqəti həmin ölkələrə yönəlmişdi. Ə.Mustafabəyli "Böyük səkkizlik" deyilən səkkiz dövlətdən ibarət qrupun (G-8) Yaponiya və İtaliyadakı tədbirlərinə, Brüsseldə Avropa İttifaqı-NATO ilə məsləhətləşmələrə ekspert səviyyəsində dəvət edilib.

Onun ikinci dərəcəli fövqəladə və səlahiyyətli diplomatik elçi rütbəsi var.

2010-cu ildə Ə.Mustafabəyli yenə Rusiya Federasiyasının İranın İsfahan şəhərində Baş konsulu vəzifəsinə təyin edilir.

Ə.Mustafabəyli 2013-cü ildən Rusiya XİN-in Diplomatiya Akademiyasının Aktual Beynəlxalq Problemlər İnstitutunun aparıcı elmi işçisidir.



## Mustafabəyli-Şereşevskaya Rəna Mithəd qızı

*Alfred Korto adına Paris Ali Musiqi Məktəbinin professoru*

Mustafabəyli-Şereşevskaya Rəna Mithəd qızı 1954-cü il iyunun 17-də Bakıda geoloqlar ailəsində anadan olub.

R.Mustafabəyli-Şereşevskayanın artıq dörd yaşında böyük musiqi qabiliyyəti və istedadı üzə çıxıb. İlk solo konsertini 14 yaşında verib. 1972-ci ildə Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyası (indiki Ü.Hacıbəyli adına Bakı Musiqi Akademiyası) nəzdində Bülbül adına Orta İxtisas Musiqi Məktəbini tanınmış pedaqoq Y.L.Filatovanın fortepiano sinfi üzrə əla qiymətlərlə bitirib. Dahi Qara Qarayevin xeyir-duası ilə elə həmin il P.İ.Çaykovski adına Moskva Dövlət Konservatoriyasında L.N.Vlasenkonun sinfinə daxil olub. Konservatoriyadan sonra aspiranturanı da fərqlənmə ilə bitirib.

Bu illərdə R.Mustafabəyli-Şereşevskaya SSRİ-də və xarici ölkələrdə çoxlu solo və simfonik konsertlər verir. Sonra əlində problemlər (peşə xəstəliyi) yarandığı üçün solo karyeradan imtina etmək məcburiyyətində qalır. Xoşbəxtlikdən, müəllimliyə məhəbbəti və həvəsi həmişə var idi. Həmin dövrdə R.Mustafabəyli-Şereşevskayanın ailəsi Moskvaya köçür. 1980-ci ildən başlayaraq o, Moskva Konservatoriyası nəzdində dünya şöhrətli Mərkəzi Orta İxtisas Musiqi Məktəbində istedadlı uşaqlara dərs deyir. Nyu-Yorkda keçirilən "Young Artists Competition" adlı iri beynəlxalq müsabiqənin laureatı oğul Aleksandr Slobodyanik onun bu məktəbdə ilk laureat yetirməsidir.

1990-cı ildə R.Mustafabəyli-Şereşevskayanı İppolitov-İvanov adına Dövlət Pedaqoji Musiqi İnstitutunun fortepiano kafedrasına müdir vəzifəsinə dəvət edirlər. Həmin dövrdə o, orta ixtisas və ali təhsil məktəblərində fortepianonun tədrisi metodikasının tərtib olunması işinə başçılıq edir. Onun təklifi və rəhbərliyi ilə gənc ifaçıların İppolitov-İvanov adına birinci Ümumittifaq müsabiqəsinə start verilir.

Elə həmin il Rusiyanın Xalq Artisti, Rusiya Milli Simfonik Orkestrinin və "Moskva virtuozları" orkestrinin baş dirijoru V.Spivakov ustad dərsləri keçməsi üçün R.Mustafabəyli-Şereşevskayanı artistik direktoru olduğu Beynəlxalq Kolmar festivalının (Fransa) yay məktəbinə dəvət edir.

1993-cü ildə R.Mustafabəyli-Şereşevskaya dəvətli professor kimi Kolmar Konservatoriyasında işləməyə başlayır, sonra beş il ərzində paralel olaraq Paris Ali Milli Konservatoriyasında işləyir, ixtisasartırma kurslarında dərs deyir. O, beynəlxalq müsabiqələrin münsiflər heyətinin üzvüdür.

O, Kolmar Konservatoriyasında Fransada ilk dəfə beş yaşından yuxarı istedadlı uşaqlar üçün xüsusi bölmə yaradır.

R.Mustafabəyli-Şereşevskaya Fransa, İtaliya, ABŞ, Kanada, Monako, Yaponiyada ustad dərsləri keçir. Onun yetirmələri beynəlxalq müsabiqələrin laureatıdırlar. Onlar dünyanın aparıcı konsert salonlarında - Pleyyel, Karneqi-Holl, Albert-Holl, Berlin Milli Filarmoniyası, Moskva Konservatoriyasının Böyük salonu və digər səhnələrdə çıxış edirlər.

R.Mustafabəyli-Şereşevskaya hazırda məşhur "Ekol Normal de Müzik"də (Alfred Korto adına Paris Ali Musiqi Məktəbi) fortepiano professorudur. O, istedadlı uşaqların musiqi təhsili sisteminin təkmilləşdirilməsinə çox diqqət yetirir, Fransa ("Pyano" jurnalı) və beynəlxalq mətbuatda ("Kreşşendo" jurnalı), Fransanın milli televiziyasında bu məsələ ilə bağlı çıxışlar edir.

R.Mustafabəyli-Şereşevskaya Fransanın və Rusiyanın istər çox gənc, istərsə də məşhur olan musiqiçi və artistlərinin iştirak etdikləri "Fransa və Rusiyanın ulduzları və gənc istedadları" mədəni mübadilə layihəsinin yaradıcısı və rəhbəridir.



## Mustafayev
## Rasim Fərman oğlu

*Kimya elmləri namizədi.*
*"Elmi tədqiqatlar və kimyəvi məhsullar"*
*Elm-İstehsalat Müəssisəsinin baş direktoru*

Mustafayev Rasim Fərman oğlu 1950-ci il avqustun 31-də Azərbaycan Respublikasının Şəki şəhərində anadan olub.

1966-cı ildə orta məktəbi gümüş medalla bitirib və elə həmin il S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) kimya fakültəsinə daxil olub. 1971-ci ildə təhsili başa vurandan sonra Azərbaycan Elmlər Akademiyasının Üzvi Kimya İnstitutuna təyinat alıb. 1973-cü ildə SSRİ Elmlər Akademiyasının Sibir bölməsinin (Novosibirsk) Qeyri-Üzvi Kimya İnstitutunun aspiranturasına daxil olub.

1977-ci ildə dissertasiya müdafiə edən R.Mustafayevə kimya elmləri namizədi elmi dərəcəsi verilib. Onun platin qrupundan olan metalların ekstraksiya üsulu ilə müxtəlif mürəkkəb məhlullardan ayrılması və onların mikro-miqdarlarının alovla olmayan atom-absorbsiya spektrofotometriya ilə müəyyən edilməsi metodlarının işlənib hazırlanmasına və tədqiqinə həsr olunmuş namizədlik işinin təkcə elmi deyil, həm də böyük praktiki əhəmiyyəti olub. Həmin tədqiqatlar bu günə qədər profil müəssisələrdə tətbiq edilir.

R.Mustafayev 1979-cu ildə sahəvi elmi-tədqiqat kimya institutunda işləməyə başlayıb. Onun sonrakı elmi və əmək fəaliyyəti 20 il ərzində müdafiə sənayesi ilə bağlı olub. R.Mustafayev institutda sektor, laboratoriya, daha sonra şöbə müdiri işləyib, 1992-ci ildə direktorun elmi iş üzrə müavini təyin edilib.

Kimya texnologiyaları sahəsində yüksək ixtisaslı mütəxəssis olan R.Mustafayev bu dövrdə suda həll olan polimerlər əsasında müxtəlif materialların tədqiqinə və onların həm müdafiə sahəsinə, həm də xalq təsərrüfatının dinc sahələrinə tətbiqinə rəhbərlik edib, həmin materialların alınması texnologiyalarını işləyib hazırlayıb, sınaqlarını və sənaye istehsalını təşkil edib. Tədqiqatların çoxu ixtiralar səviyyəsində yerinə yetirilib.

R.Mustafayev suda həll olan polimerin – polietilenoksidin hərbi texnikada istifadə olunması probleminə dair uğurlu nəticələr əldə etdiyinə görə 1987-ci ildə Sov.İKP MK-nın və SSRİ Nazirlər Sovetinin Fəxri fərmanı ilə təltif edilib.

R.Mustafayev 1983-1986-cı illərdə əsas işi ilə bərabər pedaqoji fəaliyyətlə məşğul olub, dəvətli mühazirəçi kimi Novosibirsk Yüngül Sənaye İnstitutunda kimya texnologiyaları kursunu tədris edib. 1985-ci ildə R.Mustafayevə böyük elmi işçi dərəcəsi verilib. Bundan əlavə, o, Novosibirsk vilayətinin ən yaxşı ixtiraçısı sayılıb.

R.Mustafayev 1998-ci ildə "Elmi tədqiqatlar və kimyəvi məhsullar" Elm-İstehsalat Müəssisəsi yaradıb və onun baş direktoru olub. Müəssisənin fəaliyyətinin əsas istiqaməti ekoloji baxımdan təhlükəsiz emulsol, sürtgü, yağsızlaşdırıcı və konservantların, habelə metal emalı, maşınqayırma və tikinti üçün zəruri olan digər yeni nəsil materialların işlənib hazırlanması və istehsalı ilə bağlıdır. Yeni yaradılan məhsullar ətraf mühiti çirkləndirən texnoloji vasitələri əvəzləyib.

R.Mustafayev rəhbərlik etdiyi müəssisədə yeni ideyaların müəllifi, tədqiqatçı və istehsalın təşkilatçısıdır. Müəssisənin fəaliyyət göstərdiyi dövrdə onun istehsal etdiyi məhsulun keyfiyyəti qüsursuz olduğundan Uraldan tutmuş Uzaq Şərqə qədər ərazidə geniş yayılıb. R.Mustafayev məhsulun keyfiyyətini daha da artırmaq və metal emalı istehsalatlarında tətbiq edilən vasitələrin ekoloji təhlükəsizliyini gücləndirmək problemlərini həll etmək, habelə istehlakçıların ehtiyaclarına cavab olaraq bu vasitələrin çeşidini genişləndirmək yolu ilə istehsalı daim inkişaf etdirir. R.Mustafayev yeni məhsulları ixtiralar səviyyəsində işləyib hazırlayır. Baza vasitələrinin tərkibləri patentlə müdafiə olunub.

R.Mustafayevin başçılıq etdiyi müəssisə rəqabətə davamlı yüksək keyfiyyətli məhsulun hazırlanması və istehsalına görə Rusiya Federasiyası Hökumətinin diplomuna layiq görülüb, Rusiyada və onun hüdudlarından kənarda keçirilən müxtəlif müsabiqələrdə dəfələrlə qalib gəlib, 2009-cu ildə isə Novosibirskin Şərəf lövhəsinə salınıb.

R.Mustafayev 2003-cü ildə Rusiya Federasiyası Keyfiyyət Problemləri Akademiyasının müxbir üzvü seçilib.

Alim 72 elmi işin, ikisi Almaniyanın patenti olmaqla 27 ixtiranın, 45 elmi məqalənin və tezisin müəllifidir.



## Namazova-Baranova Leyla Seymur qızı

*Tibb elmləri doktoru, professor. Rusiya Tibb Elmləri Akademiyası Uşaq Sağlamlıq Elmi Mərkəzinin Elmi-Tədqiqat Profilaktik Pediatriya və Bərpaedici Müalicə İnstitutunun direktoru. RTEA USEM direktorunun elmi iş üzrə müavini. Avropa Pediatriya Assosiasiyasının (EPA/UNEPSA) prezidenti*

Namazova-Baranova Leyla Seymur qızı 1963-cü il iyulun 18-də Moskvada elmi işçilərin ailəsində anadan olub.

Valideynləri elm adamları olduqları üçün elmə xidmət ruhu lap uşaqlıqdan onun canına hopub. Atası Namazov Seymur Əvəz oğlu (1932-2006) tanınmış radiofizik alim idi. Tarix elmləri doktoru, professor, Rusiya Elmlər Akademiyasının (REA) Ümumi Tarix İnstitutunun Avropanın yeni tarixi bölməsinin müdiri olan anası Namazova Alla Sergeyevna bu gün də Belçika tarixi üzrə aparıcı ekspert sayılır.

Nəriman Nərimanov adına Azərbaycan Tibb İnstitutuna (indiki Azərbaycan Tibb Universiteti) daxil olan L.Namazova-Baranova təhsilini Moskvada davam etdirib və 1987-ci ildə N.İ.Piroqov adına İkinci Moskva Dövlət Tibb İnstitutunun (indiki Rusiya Milli Tədqiqat Tibb Universiteti) pediatriya fakültəsini fərqlənmə diplomu ilə bitirib, habelə ictimai peşələr fakültəsində daha iki ixtisasa - fransız dili tərcüməçisi və jurnalist ixtisaslarına yiyələnib.

L.Namazova-Baranova 1987-1990-cı illərdə ölkənin qocaman pediatriya müəssisəsində - Rusiya Tibb Elmləri Akademiyasının (RTEA) Elmi-Tədqiqat Pediatriya İnstitutunda klinik ordinatura keçib. Bu illər ərzində "Uşaqlarda bronxial astma zamanı interleykinlərin müəyyən edilməsinin klinik-patogenetik əhəmiyyəti" mövzusunda namizədlik dissertasiyası üçün material toplayıb. 1992-ci ildə həmin dissertasiyanı iki ixtisas – "pediatriya" və "allerqologiya və immunologiya" ixtisasları üzrə müdafiə edib.

1990-1993-cü illərdə RTEA-nın Uşaq Sağlamlıq Elmi Mərkəzinin (USEM) Elmi-Tədqiqat Pediatriya İnstitutunun allerqoloji dispanser bölməsində həkim, 1993-1999-cu illərdə böyük elmi işçi işləyib.

L.Namazova-Baranova 2000-ci ildə adları yuxarıda çəkilən eyni ixtisaslar üzrə "Uşaqlarda bronxial astmanın diferensial müalicəsinin patogenetik əsasları" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Elə həmin il mərkəzin direktoru müəssisənin iş konsepsiyasına əhəmiyyətli dəyişiklik etmək, balaca pasiyentlərə

tibbi yardım göstərilməsinin ambulator mərhələsinə maksimum üstünlük vermək barədə qərar qəbul edir. Bu da müəssisədə əhəmiyyətli struktur dəyişikliklərinə səbəb olub. Məsələn, 2000-ci ildə ölkədə ilk çoxprofilli gündüz stasionarı (stasionarı əvəz edən texnologiyalar bölməsi) yaradılır və ona rəhbərlik gənc elmlər doktoru L.Namazova-Baranovaya həvalə edilir.

L.Namazova-Baranovanın qarşıya qoyulan vəzifənin öhdəsindən müvəffəqiyyətlə gəldiyini nəzərə alan RTEA USEM-in direktoru 2003-cü ildə onu uşaqlar üçün Məsləhət Diaqnostika Mərkəzinin baş həkimi vəzifəsinə təyin edir. 2006-cı ilin noyabrında RTEA-nın rəyasət heyətinin qərarına müvafiq olaraq o, RTEA USEM direktorunun elm üzrə müavini – Elmi-Tədqiqat Profilaktik Pediatriya və Bərpaedici Müalicə İnstitutunun direktoru olur.

L.Namazova-Baranova 2006-cı ildən İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin pediatrların ali məktəbdən sonrakı peşə təhsili fakültəsinin Rusiyada yeganə olan allerqologiya və klinik immunologiya kafedrasının müdiridir. Bundan əlavə, o, N.İ.Piroqov adına Rusiya Milli Tədqiqat Tibb Universitetinin (RMTTU) pediatriya fakültəsinin pediatriya kafedrasına başçılıq edir.

L.Namazova-Baranova çap olunmuş 586 elmi işin, 11 ixtiranın müəllifidir. Son illərdə onun 8 monoqrafiyası, o cümlədən "Ambulator-poliklinika pediatriyasına dair rəhbər göstəriş" (2006), "Uşaq xəstəliklərinin səmərəli farmakoterapiyası" (2007), "İmmunoprofilaktika-2007" (2007), "Milli pediatriya formulyarı" (2008), "Pediatrlar üçün allerqologiya və immunologiyaya dair klinik tövsiyələr" (2008-2009, 2010, 2011), "Vaksinlər" (2011), "Uşaqlarda allergiya – nəzəriyyədən təcrübəyə doğru" (2011) kimi sanballı monoqrafiyaları dərc olunub.

L.Namazova-Baranova uşaq klinik allerqoloqlarından ibarət orijinal məktəb yaradıb, onun rəhbərliyi ilə 38 namizədlik və 7 doktorluq dissertasiyası müdafiə olunub. 1996-cı ildə L.Namazova-Baranovaya "pediatriya" ixtisası üzrə dosent, 2005-ci ildə "allerqologiya və immunologiya" ixtisası üzrə professor elmi adları verilib.

L.Namazova-Baranovanın öz ixtisası üzrə böyük elmi və klinik təcrübəsi var. Onun elmi tədqiqatlarının əsas istiqaməti uşaqlarda sosial əhəmiyyətli xəstəliklərin inkişaf mexanizmlərinin öyrənilməsi, bunun üçün yeni təşkilati, profilaktik, müalicə və bərpa texnologiyalarının işlənib hazırlanması və uşaq həkimlərinin iş təcrübəsinə tətbiq edilməsi, uşaqlarda sitokin statusunun və mediatorların qarşılıqlı təsirinin öyrənilməsi, bunun üçün sitokin və antisitokin terapiyanın tətbiqinin əsaslandırılması, pediatrlar üçün pediatriyanın aktual problemlərinə dair klinik tövsiyələrin və elmi-praktik proqramların işlənib hazırlanmasıdır.

L.Namazova-Baranova Mərkəzin elmi-metodik işinin böyük hissəsinə başçılıq edir: onun fəal iştirakı və şəxsi töhfəsi ilə "Klinik tövsiyələr. Pediatriya" (2005), "Ambulator-poliklinika pediatriyasına dair tövsiyələr" (2006), "Pediatrlar üçün allerqologiya və immunologiyaya dair klinik tövsiyələr" (2008) və s. (ümumən 30-dan çox iş) nəşr olunub.

L.Namazova-Baranovanın fundamental elmi tədqiqatları uşaq allerqologiyası və klinik immunologiyasının, immunoprofilaktikanın prioritet problemlərinə, pediatriyanın və ictimai səhiyyənin aktual problemlərinə, spesifik immunoterapiyaya və bərpaedici müalicəyə həsr olunub. L.Namazova-Baranova allergiyalı uşaqlarda sitokin statusunun və mediatorların qarşılıqlı təsirinin öyrənilməsinin, sitokin və antisitokin terapiyanın pediatriyada tətbiqinin əsaslandırılmasının banisidir.

L.Namazova-Baranova pediatrlar üçün bronxial astma, allergik rinit, atopik dermatit, yod çatışmazlığı xəstəliklərinə dair klinik tövsiyələrin və elmi-praktik proqramların aparıcı təşkilatçı-tədqiqatçısıdır. O, "Sağlamlıq" və "Demoqrafiya" adlı prioritet layihələrin həyata keçirilməsində bilavasitə iştirak edir. Onun rəhbərliyi ilə uşaq allerqologiyasında, o cümlədən təxirəsalınmaz yardım göstərilməsi sahəsində yeni təşkilati, profilaktik, müalicə və bərpa texnologiyaları işlənib hazırlanıb və sınaqdan keçirilib, valideynlər və yeniyetmələr üçün maarifləndirici proqramların yaradılmasına və tətbiqinə əhəmiyyətli töhfə verilib. Həmin proqramlar Rusiya Səhiyyə və Sosial İnkişaf Nazirliyi və BMT-nin Uşaq Fondu (UNICEF) tərəfindən bəyənilib.

L.Namazova-Baranova "Pediatriçeskaya farmakologiya" jurnalının baş redaktoru, "Voprosı sovremennoy pediatrii" jurnalının elmi redaktoru, "World Journal of Pediatrics", "Asian Journal of Pediatric Practice", "Voprosı sovremennoy pediatrii", "Voprosı diaqnostiki v pediatrii", "Reproduktivnoye zdorovye detey i podrostkov", "Detskaya onkologiya", "Spravoçnik pediatra" və s. jurnalların redaksiya heyətinin üzvüdür.

L.Namazova-Baranova Rusiya Pediatrlar İttifaqının İcraiyyə Komitəsi sədrinin müavini, RTEA USEM nəzdində dissertasiya şurasının, Təhsil və Elm Nazirliyinin Ali Attestasiya Komissiyasının terapevtik elmlər üzrə ekspert şurasının üzvü, Federal Elmi-Praktik İmmunoprofilaktika Mərkəzinin rəhbəri, RTEA-nın Pediatriya üzrə Elmi Şurasının "Pediatriyada yeni texnologiyalar" problem komissiyasının sədri, RF Səhiyyə Nazirliyinin Elmi Şurasının "İmmunologiya" bölməsinin üzvü, Dünya Səhiyyə Təşkilatının müşaviri, Beynəlxalq Pediatriya Assosiasiyasının (IPA) Daimi Komitəsinin, Allergiya və Astma üzrə Qlobal Avropa Şəbəkəsinin (GA2LEN) üzvü,

RF və DST-nin "Mərkəzi Asiya və Afrika ölkələrinə pediatrik və tibbi-sanitariya dəstəyinin keyfiyyətinin artırılması" beynəlxalq layihəsinin rəhbəridir. O, 2013-cü ilin iyununda Avropa Pediatriya Assosiasiyasının (EPA/UNEPSA) prezidenti seçilib.

L.Namazova-Baranova RTEA-nın müxbir üzvü, RF Dövlət Dumasının biotexnologiyalar sahəsində qanunvericilik fəaliyyətini təmin edən Elm və Elm Tutumlu Texnologiyalar Komitəsi nəzdində Biotexnologiyalar sahəsində tənzimlənmənin təkmilləşdirilməsi üzrə Ekspert Şurasının üzvüdür. Uşaq sağlamlığının mühafizəsi məsələləri ilə bağlı fəal ictimai işlə məşğuldur, RF Dövlət Dumasının əlil uşaqların maraqlarının müdafiəsi, ağır xroniki xəstəlikləri olan pasiyentlərə mümkün yüksək texnoloji tibbi yardım məsələlərinə həsr olunmuş "dəyirmi masa"larda iştirak edib. Parlament dinləmələrində məruzələrlə çıxış edib, "Vətəndaşların sağlamlığının mühafizəsinin əsasları haqqında" federal qanun üzərində iş gedən zaman təkliflərin hazırlanmasında iştirak edib.

L.Namazova-Baranova Rusiya Federasiyasının və Dünya Səhiyyə Təşkilatının "Mərkəzi Asiya və Afrika ölkələrinə pediatrik və tibbi-sanitariya dəstəyinin keyfiyyətinin yaxşılaşdırılması" beynəlxalq layihəsinin icraçı rəhbəridir.

L.Namazova-Baranovanın elmi-pedaqoji fəaliyyəti RF Səhiyyə Nazirliyinin "Sağlamlıq əlaçısı" nişanı, RF Federal Məclisinin Federasiya Şurasının, RTEA, RF Federal Məclisinin Dövlət Duması sədrinin, Rusiya Federasiyası Hökumətinin, RF səhiyyə və sosial inkişaf nazirinin, Rusiya Tibb Elmləri Akademiyasının Rəyasət Heyətinin Fəxri fərman və təşəkkürnamələri ilə mükafatlandırılıb, habelə "Ana və uşaqların mühafizəsinə şəxsi töhfəsinə görə" nominasiyasında "Peşə həyatdır" Beynəlxalq mükafatına layiq görülüb.



## Nəbiyev
## Həsən Hilal oğlu

*"Qazprom transqaz Volqoqrad" Məhdud Məsuliyyətli Cəmiyyətinin baş direktoru*

Nəbiyev Həsən Hilal oğlu 1954-cü il iyulun 21-də Azərbaycan Respublikasının Gədəbəy rayonunun Zəhmət kəndində anadan olub.

1976-cı ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunu (indiki Azərbaycan Texniki Universiteti) "mexanika mühəndisliyi" ixtisası üzrə bitirib, 1981-ci ildə isə P.Tolyatti adına Leninqrad Mühəndis-İqtisad İnstitutunda "sənaye istehsalının təşkilatçısı" ixtisası alıb.

H.Nəbiyev institutu bitirəndən dərhal sonra Petrov adına Volqoqrad neft maşınqayırma zavoduna (1993-cü ildən "Volqoqradneftmaş" Açıq Səhmdar Cəmiyyətinə (ASC) gəlib və burada mühəndis-konstruktordan müəssisənin baş direktoru vəzifəsinə qədər əmək yolu keçib.

1986-1998-ci illərdə "Qazprom" ASC-nin "Volqoqradneftmaş" Səhmdar Cəmiyyətinin Kotelnikovo armatur zavodunun direktoru vəzifəsində çalışıb. 1998-ci ildə "Volqoqradneftmaş" ASC-nin baş direktoru təyin edilib.

1985-2003-cü illərdə "Volqoqradneftmaş" ASC H.Nəbiyevin şəxsi iştirakı, daha sonra rəhbərliyi ilə bir çox qaz və qaz-kondensat yataqlarını, o cümlədən "Zapolyarnı", "Yubileynı", "Yamburqski" və digər böyük yataqları avadanlıqla təmin etməklə, onların təchizatına sanballı töhfə verib. Müəssisə qaz emalı zavodları (Surqut, Orenburq), qaz-kimya kompleksləri (Həştərxan, Novourenqoy), qaz kəmərləri ("Yamal-Avropa", "Mavi axın", "Urenqoy-Pomarı-Ujqorod"), yeraltı qaz anbarları (YQA) (Kasimov, Nevski), kompressor stansiyaları (Poxvistnevo, Volqoqrad) və s. üçün texnoloji avadanlığın təchizatını təmin edib.

H.Nəbiyev 2004-cü ilin sentyabrından başlayaraq bütün idarəçilik təcrübəsini "Qazprom" ASC-nin Volqoqrad vilayətindəki baş müəssisəsinin - "Volqoqradtransqaz" Məhdud Məsuliyyətli Cəmiyyətin (MMC) (indiki "Qazprom transqaz Volqoqrad" MMC) rəhbəri kimi tətbiq edir. Bilavasitə onun iştirakı və şəxsi rəhbərliyi ilə üç ən müasir kompressor stansiyası - "Olxovskaya", "Kotelnikovskaya" və "Jirnovskaya" işə salınıb. "Jirnovskaya" kompressor stansiyasının açılışı "Qazprom"

Rusiya Səhmdar Cəmiyyətinin (RSC) Rusiya qazının Türkiyəyə nəqli üzrə beynəlxalq layihəsinin - "Mavi axın" kəmərinin tikintisində həlledici mərhələ olub.

"Qazprom transqaz Volqoqrad"ın yeni obyektlərinin işə salınması yeni yaşayış məntəqələrinin qazlaşdırılmasına imkan verir, rayonun infrastrukturunu inkişaf etdirir, insanları əlavə iş yerləri, sabit və yüksək əməkhaqqı ilə təmin edir. "Jirnovskaya" kompressor stansiyası əsas vəzifəsi - magistral qaz kəmərinə qaz vurmaqla bərabər, heç də az əhəmiyyətli olmayan sosial vəzifə - yaxınlıqdakı yaşayış məntəqələrini özünün istehsalı olan elektrik enerjisi ilə təmin edir.

Avrasiyada ən böyük yeraltı qaz anbarı Volqoqrad YQA-nın tikintisi H.Nəbiyevin rəhbərliyi ilə "Qazprom transqaz Volqoqrad" MMC-nin fəaliyyətinin perspektivli istiqamətlərindən biridir.

H.Nəbiyevin bilavasitə rəhbərliyi və şəxsi nəzarəti ilə qısa müddətdə Kalmıkiya Respublikasının şimalına qaz çəkilib. "Oktyabrski" (Volqoqrad vilayəti) - "Sadovoye" (Kalmıkiya) qaz kəmərinin 82 kilometr uzunluğunda hissəsi və "Sadovoye" yeni qazpaylayıcı stansiyası Kalmıkiyanın şimalına "mavi yanacağ"ın nəqli ilə bərabər Volqoqrad vilayətinin Oktyabr rayonunun Aksay və Kovalyovka yaşayış məntəqələrinin qazlaşdırılmasına da imkan yaradıb.

İstehsalın idarəetmə strukturunun təkmilləşdirilməsində, onun texniki baxımdan yenidən təchiz edilməsində də H.Nəbiyevin böyük xidmətləri var. Müəssisədə elmi iş keyfiyyətcə yeni səviyyəyə çatdırılıb. H.Nəbiyevin təşəbbüsü ilə gənc mütəxəssislərin elmi konfransları artıq "Qazprom transqaz Volqoqrad"da ənənəyə çevrilib. Gənclərin ən perspektivli tədqiqatları istehsalata tətbiq edilir. Hər bir elmi və texniki tədqiqat baş direktor tərəfindən dəstəklənir.

2006-cı ildə H.Nəbiyevin rəhbərliyi ilə "Qazprom transqaz Volqoqrad"ın mütəxəssisləri tərəfindən yaradılan böyük diametrli boruların xəndək olmadan əvəzlənməsi texnologiyasına görə müəssisə Volqoqrad vilayəti administrasiyasının elm və texnika sahəsində mükafatına layiq görülüb. Müəssisəyə, həmçinin H.Nəbiyevin rəhbərliyi ilə yaradılan, qaz istehsalatları avadanlığının istismar göstəricilərinin yüksək olmasını təmin edən yeni idxaləvəzləyici və resursqoruyucu texnologiyalar və çoxfunksiyalı örtülər kompleksinin tətbiqi texnologiyasına görə "Qazprom" ASC-nin 2006-cı il üçün elm və texnika sahəsində mükafatı verilib.

Rusiyanın qaz sənayesinin inkişafına böyük töhfəsinə görə H.Nəbiyev Jukov medalı (1996) ilə təltif edilib, ona "Qaz sənayesinin fəxri işçisi" (1998) və "Qaz sənayesinin əmək veteranı" (2004) adları verilib. H.Nəbiyev Rusiya Federasiyasının Mülki Müdafiə, Fövqəladə Hallar və Təbii Fəlakətlərin Nəticələrinin Aradan Qal-

dırılması üzrə Nazirliyinin Volqoqrad vilayəti üzrə Baş idarəsinin və iki dəfə Volqoqrad vilayəti administrasiyası başçısının fəxri fərmanlarına layiq görülüb.

H.Nəbiyev 2003-cü, 2009-cu və 2015-ci illərdə Volqoqrad vilayət Dumasının deputatı seçilib. O, Dumada büdcə, vergilər və maliyyə, iqtisadi siyasət, sənaye, nəqliyyat və rabitə məsələləri daimi komitələrinin üzvü idi. Hazırda o, Sənaye, yanacaq-energetika kompleksi, nəqliyyat və yol təsərrüfatı komitəsinin üzvüdür.

Deputat H.Nəbiyev “2006-cı il üçün sosial xərclərinin birgə maliyyələşdirilməsi üzrə vilayət fondu haqqında” vilayət qanununun işlənib hazırlanmasında fəal iştirak edib. Sənədə görə, yerli büdcələrin sosial əhəmiyyətli prioritet xərcləri siyahısına yerli büdcələrin təbii qaz üçün kredit borcunun ödənilməsi xərcləri daxildir. Volqoqrad vilayətinin 2007-ci il üçün büdcəsinin müzakirələri zamanı ona qaz təchizatı sahəsində bələdiyyə qurumlarının subsidiyalaşdırılması ilə bağlı məqsədli xərclər maddəsinin tətbiqini nəzərdən keçirmək, habelə büdcə təşkilatlarının və vətəndaşların güzəştli kateqoriyalarının qaz təchizatı ilə bağlı xərclərinin kompensasiyasına dair xərcləri büdcədə ayrıca sətir kimi nəzərdə tutmaq təklif olunub. Bundan əlavə, H.Nəbiyev 2007-ci ilin büdcəsində qaz sənayesinin mövcud tariflər üzrə qaz istehlakçıları tərəfindən real ödənilə bilməyən xərclərinin kompensasiyasını nəzərdə tutmaq təklifini irəli sürüb.



## Nəsirov
## Fikrət Nəbi oğlu

*Tibb elmləri namizədi.*
*İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin 2-ci fakültə cərrahiyyəsi kafedrasının dosenti.*
*Ali dərəcəli həkim*

Nəsirov Fikrət Nəbi oğlu 1955-ci il aprelin 1-də Azərbaycan Respublikasının Qubadlı rayonunda anadan olub.

1978-ci ildə N.İ.Piroqov adına İkinci Moskva Dövlət Tibb İnstitutunu bitirib. Cərrahiyyə üzrə internatura və ordinatura keçəndən sonra 1984-cü ildə İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb İnstitutuna keçib, əvvəlcə qaraciyər və öd yolları şöbəsinin elmi işçisi, sonra fakültə cərrahiyyəsi kafedrasının assistenti və dosenti olub.

F.Nəsirov İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb İnstitutunda işlədiyi zaman özünü daxil olan xəstələrə planlı və təcili yardım göstərilməsi üzrə öhdəliklərini tam həcmdə yerinə yetirən savadlı mütəxəssis kimi göstərib.

F.Nəsirov 1984-cü ilin dekabrında N.V.Sklifosovski adına Elmi-Tədqiqat Təcili Yardım İnstitutunda ultrasəs diaqnostika üzrə ilkin ixtisaslaşma keçib. 1985-ci ildən ultrasəs müayinənin (USM) köməyi ilə qarın boşluğu orqanlarının cərrahi xəstəliklərinin diaqnostikası və müalicəsi metodikalarını tədqiq edir. 1991 və 1992-ci illərdə USM üzrə ixtiralarına  - "Öd kisəsinin dəridən keçən punksiyası üsulu" və "Qaraciyər çatışmazlığının müəyyən edilməsi üsulu"na görə müəlliflik şəhadətnamələri alıb.

1994-cü ildə F.Nəsirov "Hepatobiliar zona orqanlarının cərrahi xəstəliklərinin müalicəsində USM nəzarəti altında dəridən keçən müdaxilə" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. USM-diaqnostika və laparoskopik cərrahiyyə sahəsində yüksək dərəcəli mütəxəssis olan F.Nəsirovun ssenarisi əsasında və onun fəal iştirakı ilə  həmin mövzuda RF Səhiyyə Nazirliyinin sifarişi ilə ali tibb məktəblərinin tələbələri və USM mütəxəssisləri üçün tədris filmi çəkilib.

F.Nəsirov 1991-1994-cü illərdə Yaponiya, Şotlandiya və İsveçrədə qısamüddətli təcrübə keçəndən sonra qarın boşluğu orqanlarında və kiçik çanaqda laparoskopik əməliyyatların müxtəlif metodikalarını mənimsəyib, Moskva və  Moskva vilayətinin bir çox  tibb müəssisələrində klinik praktikaya tətbiq edib.

F.Nəsirovun Moskvanın başqa klinikalarında, MDB şəhərlərində və digər ölkələrdə (Yunanıstan, Almaniya və s.) 60-dan çox həkim yetirməsi var. Hazırda o, universitetdə qarın boşluğu orqanları cərrahiyyəsində kiçik invaziv müdaxilələrin tədqiq edilməsi üzrə elmi-tədqiqat işinin kuratorudur.

O, çap olunmuş 68 işin, o cümlədən 2 ixtira patentinin və 3 səmərələşdirici təklifin, tədqiq edilmiş metodikaların başqa klinikalarda tətbiqi üzrə 22 aktın müəllifidir. O, bir çox beynəlxalq və Rusiya cərrahiyyə cəmiyyətlərinin üzvüdür, bir çox elmi konfrans və simpoziumlarda fəal iştirak edir.

F.Nəsirov Rusiya təbabətinin və səhiyyəsinin inkişafına və möhkəmlənməsinə böyük şəxsi töhfəsinə görə 2007-ci ildə N.İ.Piroqov ordeni ilə təltif edilib.



## Nemətov
## Yaqut Məmməd oğlu

*Pedaqoji elmlər doktoru, professor.*
*Rusiya Federasiyası İnnovasiya Texnologiyalarının İnkişafı Fondunun prezidenti*

Nemətov Yaqut Məmməd oğlu 1954-cü il fevralın 24-də Gürcüstan Respublikasının Qardabani rayonunda anadan olub.

1970-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika fakültəsinə daxil olub. 1973-cü ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin (MDU) fizika fakültəsinə keçib. 1977-ci ildə ali məktəbi müvəffəqiyyətlə bitirəndən sonra Sovet Ordusu sıralarına çağırılıb.

1979-1986-cı illərdə Ümumittifaq Elmi-Tədqiqat Fiziki-Texniki və Radiotexniki Ölçmələr İnstitutunda (ÜETFTRÖİ) mühəndis, elmi işçi işləyib. Sonra iki il SSRİ Aqrar-Sənaye Kompleksinin Ümumittifaq Elmi-Tədqiqat Texniki-İqtisadi Tədqiqatlar İnstitutunda (ÜETTİTİ) sistemli tədqiqatlar şöbəsinin böyük elmi işçisi olub.

Y.Nemətov 1984-cü ildə "Ferromaqnit metalın ümumiləşdirilmiş modelində elementar təsirlənmə nəzəriyyəsi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib və fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsinə layiq görülüb.

1988-1992-ci illərdə SSRİ Elmlər Akademiyasının A.A.Baykov adına Metallurgiya İnstitutunun böyük elmi işçisi vəzifəsində çalışıb.

1992-2002-ci illərdə RF Müdafiə Nazirliyinin Böyük Pyotr adına Strateji Təyinatlı Raket Qoşunları Hərbi Akademiyasında müqavilə əsasında aparıcı elmi işçi olub.

2001-ci ildə "Dövlət qulluqçularının distant təhsilinin akmeoloji əsasları" mövzusunda dissertasiya müdafiə edib və pedaqoji elmlər doktoru olub. Bir il sonra ona professor adı verilib.

2002-ci ildən bu günə qədər İnnovasiya Texnologiyalarının İnkişafı Fondunun prezidenti vəzifəsini tutur.

Y.Nemətov "XXI əsrdə təhsil. Tendensiyalar və proqnozlar", "İnnovasiya mədəniyyətinin formalaşdırılması və mütərəqqi texnologiyaların MDB ölkələrində tətbiqi. Problemlər, tendensiyalar və perspektivlər" kitablarının müəllifidir.



## Niyazov
## Niyazi Sabir oğlu

*Tarix elmləri doktoru.*
*Sankt-Peterburq Dövlət Universitetinin postsovet məkanında beynəlxalq münasibətlər kafedrasının dosenti*

Niyazov Niyazi Sabir oğlu 1967-ci il aprelin 1-də Azərbaycan Respublikasının Ağdam rayonunda anadan olub.

1991-ci ildə Leninqrad Dövlət Universitetinin (indiki Sankt-Peterburq Universiteti) tarix fakültəsini bitirib. 1997-ci ildə "1935-1941-ci illərdə Leninqradın hərbi-sənaye kompleksinin inkişafının sosial-iqtisadi problemləri" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 2006-cı ildə ona dosent elmi adı verilib.

N.Niyazov 2012-ci ildə "1994-2011-ci illərdə Azərbaycan Respublikasının hərbi təhlükəsizlik siyasətinin təşəkkülü və inkişafı" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

N.Niyazov 2000-ci ildən Sankt-Peterburq Dövlət Universitetinin beynəlxalq münasibətlər fakültəsində dosent vəzifəsində işləyir, "Rusiyanın beynəlxalq münasibətlər və xarici siyasət tarixi", "Beynəlxalq və milli təhlükəsizliyin əsas problemləri", "Rusiya Federasiyasının xarici siyasətinin konseptual əsasları", "Rusiyanın xarici və daxili siyasətinin əsas problemləri", "XX əsrdə - XXI əsrin əvvəlində müharibələr və silahlı münaqişələr tarixi" mövzularında mühazirə kursları oxuyur.

Bakalavr, mütəxəssis və magistrantların elmi işlərinə rəhbərlik edir. 2000-2004-cü illərdə beynəlxalq münasibətlər fakültəsinin metodiki komissiyasının üzvü olub.

Hazırda N.Niyazov beynəlxalq münasibətlər fakültəsi dekanlığının aspirantura və doktorantura şöbəsinin müdiridir. RF Təhsil Nazirliyinin "Ali məktəbin regional elmi-texniki siyasətinə dövlət dəstəyi və onun elmi potensialının inkişafı", "Beynəlxalq əməkdaşlıq çərçivəsində müqayisəli sosial-humanitar tədqiqatlar: fənn və fənlərarası aspektlər" proqramlarında iştirak edir.

O, müntəzəm olaraq beynəlxalq və Ümumrusiya elmi konfranslarında, o cümlədən "Rusiya dövlətçiliyi: tarix və müasirlik" (Sankt-Peterburq, 2002), "Rusiya parlament və prezident seçkiləri arasında: daxili və xarici siyasətin aktual məsələləri" (Sankt-Peterburq, 2004), "Rusiya və NATO: münasibətlərin yeni dinamikasına doğru" (Sankt-Peterburq, 2005), "Hərb tarixinə dair qiraətlər" (Sankt-Peterburq,

2005) mövzularında konfranslarda, "Qloballaşma proseslərində Qafqaz və Mərkəzi Asiya" II Beynəlxalq konqresində (Bakı, 2007) məruzələrlə çıxış edib.

"Radio Rossii" radiostansiyasının Sankt-Peterburq bölməsinin Sankt-Peterburq Universiteti ilə birgə hazırladığı "Beynəlxalq icmal. Peterburqdan baxış" radio verilişlərinin iştirakçısıdır.



## Novruzov
## Emil Bahadur oğlu

*Hacettepe Universitetinin riyaziyyat bölməsinin professoru*

Novruzov Emil Bahadur oğlu 1972-ci il mayın 9-da Bakıda anadan olub.

1994-cü ildə Bakı Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsini fərqlənmə diplomu ilə bitirib. 1997-ci ildə "İkiqat" qeyri-aşkar cırlaşmış qeyri-xətti tənliklərin bir tipi üçün sərbəst sərhəd məsələsi" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək Azərbaycan Elmlər Akademiyasının Riyaziyyat və Mexanika İnstitutunun aspiranturasını vaxtından əvvəl bitirib.

E.Novruzov 1996-cı ildə Azərbaycan EA-nın Riyaziyyat və Mexanika İnstitutunun qeyri-xətti analiz şöbəsinin kiçik elmi işçisi, 1997-1999-cu illərdə elmi işçisi, 1999-2004-cü illərdə böyük elmi işçisi olub.

2004-cü ildə ona dosent elmi adı verilib, 2005-2011-ci illərdə Türkiyənin ən iri ali məktəblərindən birinin – Hacıtəpə Universitetinin (Ankara) riyaziyyat bölməsində dosenti işləyib. 2011-ci ildən Hacettepe Universitetinin professorudur.

E.Novruzov qeyri-xətti diferensial tənliklər sahəsində mütəxəssisdir. Onun elmi tədqiqatlarının əsas istiqaməti həllərin keyfiyyət xassələri, cırlaşmış parabolik tənliklərin həllərinin xüsusiyyətləridir. Baş hissəsi qeyri-xətti olan tənliklərdən ibarət modellərə gətirib çıxaran qeyri-xətti problemlər çoxlu nəzəri xarakterli problem yaradır. Bu problemlərin həlli praktiki nöqteyi-nəzərdən də çox dəyərlidir.

E.Novruzov "ikiqat" qeyri-aşkar cırlaşmış qeyri-xətti tənliklər üçün sərbəst sərhəd məsələsini tədqiq edib, sərbəst sərhədin xassələrini öyrənib. Gözdən keçirilmiş tənlik üçün attraktorun mövcudluğu məsələlərini də öyrənib. E.Novruzovun silsilə işləri qeyri-Nyuton tənliklərinin tədqiqinə həsr edilib. O, həllin olub-olmamasına dair nəticələr əldə edib. Başqa bir işini yarımox üzərində "politropik" tənliyin həllinin pozulmasına həsr edib. Qeyri-Nyuton filtrasiya tənlikləri üçün Koşi məsələsi attraktorunun varlığı məsələsini öyrənib. Əmsalları və sağ hissələri sürətlə ossillyasiya edən qeyri-Nyuton filtrasiya tənlikləri attraktorlarının orta tənliyin attraktoruna yığılmasını müəyyən edib.

E.Novruzov müxtəlif ölkələrdə, o cümlədən Azərbaycanda dərc olunmuş 20 elmi işin müəllifi və həmmüəllifidir.

Böyük müəllimlik təcrübəsi var. Müxtəlif illərdə diferensial tənliklər, riyazi analiz, funksional analiz, kompleks dəyişən funksiyalar nəzəriyyəsi kurslarını, ali təhsilin bütün səviyyələrində (bakalavrlıq, magistratura, doktorantura) müxtəlif xüsusi kurslar aparıb.

E.Novruzov beynəlxalq və respublika səviyyəli konfranslarda iştirak edib. Hazırda TÜBİTAK və Ukrayna Elmlər Akademiyasının sponsorluq etdikləri Türkiyə-Ukrayna layihəsinə cəlb olunub.



## Orucov
## Aydın Səfiqulu oğlu

*"Smart Konsaltinq" Telekommunikasiya Şirkətinin prezidenti*

Orucov Aydın Səfiqulu oğlu 1976-cı il yanvarın 8-də Bakıda anadan olub.

1992-ci ildə 46 nömrəli orta məktəbi qızıl medalla bitirəndən sonra Azərbaycan Texniki Universitetinin avtomobillər və avtomobil təsərrüfatı fakültəsinə daxil olub. 1997-ci ildə universiteti fərqlənmə diplomu ilə bitirib və "mühəndis–mexanik" ixtisasına yiyələnib.

A.Orucov universitetdə təhsil almaqla bərabər, intensiv olaraq ingilis dilini öyrənib. Bu da ona 1993-cü ildə "Anglo Caspian Services Ltd" Britaniya-Azərbaycan Nəşriyyat Şirkətində ingilis dili tərcüməçisi vəzifəsində əmək fəaliyyətinə başlamaq imkanı verib.

1994-cü ildə A.Orucov direktorun köməkçisi təyin edilib, 1995-ci ildə şirkətin Britaniya ofisində ofis-menecer işləmək üçün Londona göndərilib.

1996-cı ildə "Hyundai", "Lada", "Toyota" kimi iri avtomobil istehsalçılarının baş distribüteri olan Türkiyənin "NAB otomotive" ticarət şirkətində işləməyə başlayıb. 1997-ci ilə qədər logistika üzrə menecer işləməklə bərabər, Britaniya nəşriyyatı üçün tərcümələr edib.

A.Orucov 1997-ci ilin sonunda Moskvaya köçüb və yollarda avtomobil sürücülərinə texniki yardım xidmətləri göstərən Rusiya Avtomobil Klubunda əmək fəaliyyətinə başlayıb. Avtomobil Klubunda xidmət satıcısından şirkətin müdiri vəzifəsinə yüksəlib. Həmin vaxt klub Rusiyanın məşhur "Meramed" holdinqinə daxil idi. Holdinq həm də Rusiya və MDB ölkələrinin 20 şəhərində tibbi klinikalar şəbəkəsinin, bir neçə model agentliyinin və televiziya mağazasının (TV-shop) sahibi idi.

1999-cu ilin sonunda A.Orucov bütün holdinqin baş müdiri təyin edilib və 2003-cü ilin ortalarınadək bu vəzifədə çalışıb.

Yetərincə idarəçilik təcrübəsi, ilkin kapitalı və əlaqələri olan A.Orucov 2003-cü ildə holdinqdən çıxır və "Smart Konsaltinq" adlı öz telekommunikasiya şirkətinin əsasını qoyur. Hazırda A.Orucovun prezidenti olduğu "Smart Konsaltinq" şirkəti Rusiyanın ən böyük peşəkar kommersiya call-mərkəzi olan "Wilstream"in sahibidir.

Call-mərkəz telefon zənglərini, habelə elektron məlumatları, web-sorğuları sənaye miqyasında qəbul və emal edən təşkilatdır.

A.Orucov 2005-ci ildə "Vse svoi!" stomatoloji klinikalar şəbəkəsinin əsasını qoyub. Yarım ildən çox müddət ərzində şəbəkənin Moskvanın müxtəlif rayonlarında yerləşən klinikalarının sayı 5-ə çatıb. Hazırda "Vse svoi!" şəhər əhalisinə təkcə stomatoloji deyil, həm də kosmetoloji xidmətlər göstərir.



## Orucov Zahid Məlik oğlu

*Fəlsəfə elmləri doktoru, professor.*
*Moskva Dövlət İşgüzar İnzibatçılıq Akademiyasının fəlsəfə və ictimai-hüquqi fənlər kafedrasının professoru*

Orucov Zahid Məlik oğlu 1932-ci il aprelin 4-də Bakıda anadan olub.

1955-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin (MDU) fəlsəfə fakültəsini bitirib. 1955-1967-ci illərdə Bakının müxtəlif ali məktəblərində dərs deyib. 1958-ci ildə "K.Marks və F.Engelsin baxışlarının formalaşdığı dövrdə onların Hegel fəlsəfəsinə münasibəti" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 1966-cı ildə "K.Marksın iqtisadi tədqiqatlarında dialektik məntiq problemləri" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

1967-1969-cu illərdə Moskva Dövlət Elektron Texnika İnstitutunda özü yaratdığı fəlsəfə kafedrasına başçılıq edib. 1969-1985-ci illərdə M.V.Lomonosov adına MDU-nun fəlsəfə fakültəsinin professoru işləyib. 1969-1971-ci illərdə "Filosovskiye nauki" jurnalının baş redaktorunun müavini olub.

1985-1987-ci illərdə Azərbaycan rəhbərliyinin təkidi ilə Azərbaycan Elmlər Akademiyasının Fəlsəfə və Hüquq İnstitutunun direktoru işləyib. 1987-ci ildə SSRİ Ali Partiya Məktəbinin (APM) rəhbərliyinin dəvəti ilə Moskvaya qayıdıb, əvvəlcə APM-də, sonra 1998-ci ilə qədər Rusiya Dövlət Humanitar İnstitutunda fəlsəfə professoru işləyib. 1992-ci ildən RF Prezidenti yanında Rusiya Dövlət Qulluğu Akademiyasının (RDXA) aparıcı elmi işçisi, daha sonra 1998-ci ilə qədər sosiologiya kafedrasının (adı dəyişdirilərək sosial siyasət kafedrası adlandırılıb) professoru olub.

Z.Orucov 2004-cü ildən Moskva İşgüzar İnzibatçılıq İnstitutunun (indiki Moskva Dövlət İşgüzar İnzibatçılıq Akademiyası) məsləhətçi professorudur. Almaniya, ABŞ, Kanada və Kuba universitetlərində kurslar və silsilə mühazirələr oxuyub.

Z.Orucov 20-dək fəlsəfə elmləri namizədi və doktoru hazırlayıb. O, fəlsəfə tarixi və dialektik məntiqə dair bir sıra elmi işlərin müəllifidir. Onun bəzi elmi işləri Avropada, ABŞ və başqa ölkələrdə nəşr və təkrar nəşr olunub. Ümumən 100-dən çox dərc olunmuş elmi işin, o cümlədən 5 monoqrafiyanın müəllifidir. Onun "Dialektika sistem kimi" (1973) və Berlin Universitetinin fəlsəfə fakültəsinin dekanı, professor F.Kumpf ilə həmmüəllif olduğu "Dialektik məntiq: əsas prinsiplər və problemlər"

(1979) adlı iki monoqrafiyası tərcümə olunaraq, Almaniya, Kuba, Meksika və Yaxın Şərqdə (Suriya) nəşr olunub. O, həmçinin "Dövrün düşüncə tərzi. Keçmişin fəlsəfəsi" (Moskva, 2004) kitabının müəllifidir, "Dialektik məntiq" (Moskva, 1986) kitabının redaktoru olub. Bəzi məqalələri AFR, İtaliya, Yuqoslaviya, Polşa, ABŞ, Çexoslovakiya və başqa ölkələrdə dərc olunub.

Z.Orucov XXI əsrin əvvəlində "keçmiş" və "keçmişin amilləri" anlayışlarını, habelə "keçmişin təcrübəsi" anlayışını "insan təbiətinin" substansial anlayışı kimi öyrənərək, Darvin tərəfindən irəli sürülən insanın heyvandan yaranması problemini tədqiq edir. Z.Orucov F.Nitşeyə görə, yalnız insanın sahib olduğu keçmişi artıq keçib getmiş zamanın və insanın topladığı fəaliyyətin vəhdəti kimi müəyyən edir. Keçmişin belə başa düşülməsi insana daxili zamanı öz həyat fəaliyyətinə daxil etmək imkanı verib və o, bunun sayəsində məntiqi mənimsəməyə başlayıb.



**Osmanova**
**Gülnarə Oruc qızı**
*Biologiya elmləri doktoru.*
*Mari Dövlət Universitetinin ekologiya kafedrasının professoru*

Osmanova Gülnarə Oruc qızı 1965-ci il noyabrın 12-də Ermənistan Respublikasının Noyemberyan rayonunun Baqrataşen qəsəbəsində anadan olub.

1991-ci ildə Mari Dövlət Universitetini (MarDU) "bioloq, biologiya və kimya müəllimi" ixtisası üzrə bitirib. Universiteti bitirəndən sonra botanika, ekologiya və bitkilərin fiziologiyası kafedrasında baş laborant vəzifəsində çalışıb. 1992-ci ildə təcrübəçi-tədqiqatçı olub. 1993-cü ildə müəllim, 1997-ci ildə baş müəllim vəzifəsinə seçilib.

G.Osmanova 1997-ci ildə MarDU-nun bitkilərin botanikası, ekologiyası və fiziologiyası kafedrası nəzdində aspiranturaya daxil olub. 2000-ci ilin aprelində Voronej Dövlət Universitetində "botanika" ixtisası üzrə vaxtından əvvəl namizədlik dissertasiyasını müdafiə edib. Aspiranturada oxuduğu müddətdə iki dəfə - 1998-ci və 2000-ci illərdə Soros Beynəlxalq Proqramı çərçivəsində "Soros aspirantı" adına layiq görülüb.

Aspiranturanı bitirəndən sonra 2000-2003-cü illərdə bitkilərin botanikası, ekologiyası və fiziologiyası kafedrasında baş müəllim vəzifəsində işləyib. 2003-cü ildə baş müəllim vəzifəsində ekologiya kafedrasına keçib, 2004-cü ildə həmin kafedranın dosenti vəzifəsinə seçilib.

2004-2007-ci illərdə G.Osmanova MarDU-nun ekologiya fakültəsinin "ekologiya" ixtisası üzrə doktorantı olub. 2009-cu ilin dekabrında Orenburq Dövlət Pedaqoji Universitetində "botanika" və "ekologiya" ixtisasları üzrə biologiya elmləri doktoru elmi dərəcəsi almaq üçün təqdim etdiyi "Plantago L. (Plantaginaceae Juss.) cinsindən olan növlərin senopopulyasiyalarının ekobiomorfologiyası və strukturu" mövzusunda dissertasiya müdafiə edib.

G.Osmanova MarDU-nun populyasiya-ontogenetik məktəbinin nümayəndəsidir, kafedranın elmi istiqamətinin kompleks mövzusu üzərində çalışır və Rusiyada populyar olan bir istiqaməti - dünya elmində unikal sayılan İvan və Tatyana Serebryakovların morfologiya məktəbinin, habelə Tixon Rabotnov və Aleksey Uranovun

populyasiya məktəbinin təbliğ etdiyi yanaşma və metodlara əsaslanan populyasiya-ontogenetik istiqamətini inkişaf etdirir.

G.Osmanovanın elmi tədqiqatlarının əsas istiqamətləri inkişafın biomorfologiyası, ontogenezi və polivariantlılığı, senopopulyasiyaların strukturu, biomüxtəlifliyi olan təbii ekosistemlərin qiymətləndirilməsidir.

Plantago L. cinsindən olan növlərin biomorfoloji müxtəlifliyi, o cümlədən yeni həyat formaları və biomorflar haqqında təsəvvür yaradan model növləri nümunəsində bu bitkilərin populyasiyalarının təşkilinin ətraflı təsvir edilməsi, model növlərdə zoğ və kök sistemlərinin plastikliyinin üzə çıxarılması, müxtəlif ontobiomorfların adapsion-morfoloji sıralarının düzülməsi, onların müxtəlif substratlarla əlaqələrinin aşkar edilməsi və morfoloji strukturların şəklini dəyişməsinin müxtəlif yolları G.Osmanovanın bitkilərin populyasiyası ekologiyasının və biomorfologiyasının inkişafına əhəmiyyətli töhfəsidir. G.Osmanova bitkilərin inkişafının morfoloji polivariantlılığı və morfoloji polivariantlılığın adaptiv əhəmiyyəti barədə təsəvvürləri genişləndirib, L.A.Jukovaya məxsus (1995) inkişafın polivariantlılığının təsnifatına isə vegetativ orqanların morfoloji dəyişikliklərinin dörd yeni modusunu - skelet oxlarının inkişaf etməsi üsullarının əvəzlənməsi, zoğyaranma modellərinin əvəzlənməsi, zoğun inkişaf istiqamətinin dəyişdirilməsi və zoğun tipinin əvəzlənməsi moduslarını əlavə edib.

Lansetvarı yarpaqlı bağayarpağının və qum bağayarpağısının ilk dəfə təsvir edilən tam ontogenezləri "Bitkilərin ontogenetik atlası" dövri nəşrinin (2007) 5-ci cildində dərc olunub. "Atlas" Rusiya Xalqlar Dostluğu Universitetinin (Moskva) Ümumrusiya müsabiqəsində ekologiya sahəsində 2010-cu ilin ən yaxşı kitabına görə III dərəcəli Diploma layiq görülüb.

G.Osmanovanın 110-dan çox elmi və tədris-metodiki işi dərc olunub. O, monoqrafiya müəllifi, kollektiv monoqrafiyanın həmmüəllifidir ("Nauka" nəşriyyatı). Hər il müxtəlif səviyyəli elmi konfranslarda (Moskva, Sankt-Peterburq, Kirov, Kostroma, Sıktıvkar, Yoşkar-Ola, Ufa və s.) məruzələrlə çıxış edir.

2003-cü ildə bir təsərrüfat müqaviləli elmi-tədqiqat işinin rəhbəri və 3 mövzunun, habelə müxtəlif səviyyəli 18 qrantın, o cümlədən Tempus-Tasisin "Fakültələrarası ekoloji tədqiqatlar" proqramının Beynəlxalq qrantının həmicraçısı olub.

G.Osmanova populyasiya məsələləri ilə bağlı üç Ümumrusiya seminarının (1997, 1998, 2000), "Biomüxtəlifliyin prinsipləri və qorunub saxlanılması üsulları" Ümumrusiya elmi konfranslarının (2004, 2006, 2008, 2010) təşkilində və keçirilməsində, "Biologiya, ekologiya və kimyanın aktual məsələləri" Ümumrusiya konfransı çər-

çivəsində keçirilən “Orqanizm, populyasiya və qrupların inkişafının polivariantlılığı” Ümumrusiya seminarının (Yoşkar-Ola, 2010) işində iştirak edib. “Biomüxtəlifliyin qorunub saxlanılmasının prinsip və üsulları” Ümumrusiya elmi konfransının materiallar toplusunun (2004, 2006), “Mari Çodra” Milli Parkının ekoloji sistemlərində bitkilərin biomüxtəlifliyi” (2005) və “Orqanizm, populyasiya və qrupların inkişafının polivariantlılığı” (2006) elmi nəşrlərin redaksiya heyətlərinin üzvü, Mari El Respublikasının “Qırmızı Kitabı”nın (2012) elmi redaktoru olub.

G.Osmanova doktorluq dissertasiyalarının müdafiəsi üzrə ixtisaslaşdırılmış şuranın üzvü, Rusiyanın Təhsil və Elm Sahəsində Nəzarət üzrə Federal Xidmətinin dövlət akkreditasiyası üzrə ekspert komissiyalarının üzvüdür.

Bundan əlavə, G.Osmanova Təhsil İnstitutu nəzdində ixtisasartırma kurslarında şəhər və respublika müəllimləri üçün mühazirələr oxuyur. Gənc ekoloqların IX Ümumrusiya toplantısının (2012) münsiflər heyətinin sədri olub. Uzun illər botanika və ekologiya üzrə tədqiqat işlərinin respublika müsabiqələrinin, biologiya və ekologiya üzrə müxtəlif səviyyəli olimpiadaların münsiflər heyətinin üzvü olub, Yoşkar-Olanın və respublikanın başqa məktəblərinin biologiya təmayüllü siniflərində botanikanın ayrı-ayrı fəsillərinə dair məşğələlər aparır.

G.Osmanova tələbələrlə fəal və məhsuldar elmi fəaliyyətinə görə Mari Dövlət Universitetinin Fəxri fərmanı (2005), “Biomüxtəlifliyin qorunub saxlanılmasının prinsip və üsulları” II Ümumrusiya elmi konfransının keçirilməsinə görə Yoşkar-Ola Administrasiyasının Ekologiya və Təbiətdən İstifadə Komitəsinin təşəkkürnaməsi (2006), “Ekologiya, biologiya və kimyanın aktual problemləri” Ümumrusiya konfransının işinin təşkilinə görə MarDU-nun təşəkkürnaməsi, çoxillik səmərəli fəaliyyətinə görə Korkatov bələdiyyə liseyinin təşəkkürnaməsi (2010), çoxillik vicdanlı əməyinə və ixtisaslı kadrların hazırlanması işinə əhəmiyyətli töhfəsinə görə MarDU-nun Fəxri fərmanı ilə mükafatlandırılıb.



## Ömərov
## Murad Ənvər oğlu

*Texnika elmləri doktoru, professor.*
*Xarkov Milli Radioelektronika Universitetinin beynəlxalq əlaqələr üzrə prorektoru*

Ömərov Murad Ənvər oğlu 1963-cü il martın 28-də Azərbaycan Respublikasının Kürdəmir rayonunun Xırdapay kəndində qulluqçu ailəsində anadan olub.

1980-ci ildə Xarkov Radioelektronika İnstitutuna daxil olub və Xarkova köçüb. 1985-ci ildə institutu bitirəndən sonra həmin institutun Hesablama Mərkəzində hesablama maşınlarına xidmət üzrə mühəndis vəzifəsinə təyinat alıb və radio aparatlarının istehsalı texnologiyası kafedrasında təcrübəçi-tədqiqatçı işləyib.

M.Ömərov müəllimlərinin təkidi ilə aspiranturaya daxil olub. 1991-ci ildə aspiranturanı bitirib və informasiyanın ötürülməsinin lifli-optik sistemləri sahəsində namizədlik dissertasiyası müdafiə edib. 1999-cu ildə Xarkov Milli Radioelektronika Universitetinin doktoranturasına daxil olub. 2003-cü ildə "Paylanmış və kvazi paylanmış qeyri-xətti elementli elektrodinamika qurğularının layihələndirilməsi nəzəriyyəsi və praktikasının inkişafı" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

2004-cü ilin sentyabrında M.Ömərov öz sıralarında Ukrayna, Rusiya və Belarus alimlərini birləşdirən Tətbiqi Radioelektronika Akademiyasının (Xarkov) akademiki seçilib. 2009-cu ildə ona professor adı verilib. 2009-cu ildən Xarkov Milli Radioelektronika Universitetində dekan işləyib. 2015-ci ildə Xarkov Milli Radioelektronika Universitetinin beynəlxalq əlaqələr üzrə prorektoru təyin olunub.

M.Ömərov 80-dən çox elmi işin müəllifi, üç monoqrafiyanın və Ukrayna Təhsil və Elm Nazirliyinin qrifi ilə iki tədris vəsaitinin həmmüəllifidir. İxtiraları üçün Ukraynanın 12 müəlliflik şəhadətnaməsi və patentini alıb. Hazırda xalq təsərrüfatının müxtəlif sahələrində geniş istifadə olunan informasiya-ölçmə radioelektronika sistemləri və şəbəkələrinin inkişafına böyük töhfə verib.

M.Ömərov elmi pedaqoji fəaliyyətini davam etdirməklə bərabər, Xarkovda və Xarkov vilayətində böyük ictimai iş aparır. 1990-1998-ci illərdə Xarkov vilayətində "Xətai" Azərbaycan Mədəniyyət Cəmiyyətinin idarə heyətinin üzvü olub. 2000-ci ildən "Dostluq" Azərbaycan-Ukrayna Dostluq Cəmiyyətinin Xarkov vilayəti bölməsinin idarə heyətinin üzvü olub. 2001-ci ildə bu cəmiyyətin sədri seçilib. "Dost-

luq" cəmiyyətinin əsas vəzifələri milli mədəni ənənələri dirçəltmək və qoruyub saxlamaq, Ukrayna ilə Azərbaycan arasında mədəni-iqtisadi əlaqələrin möhkəmlənməsinə kömək etmək, Ukraynada yaşayan azərbaycanlıların hüquqlarını və maraqlarını müdafiə etmək üçün azərbaycanlıların səylərini birləşdirməkdir. Onun rəhbərliyi ilə cəmiyyətin nəzdində Azərbaycan bazar günü məktəbi, "Azərbaycanın inciləri" uşaq rəqs kollektivi, "Qarabağ" folklor ansamblı, "Natəvan" qadınlar klubu, "Novruz" gənclər klubu, habelə hüquq xidməti fəaliyyət göstərir.

M.Ömərov 2002-ci ildə Ukrayna Milli Mədəni Birliklər Assosiasiyasının vitse-prezidenti seçilib. 2011-ci ildə Dünya azərbaycanlılarının III qurultayının nümayəndəsi olub, Dünya Azərbaycanlılarının Əlaqələndirmə Şurasının üzvü seçilib.

"XXI əsrin liderləri" beynəlxalq imic proqramının ekspertlər şurasının qərarı ilə Ukraynanın sosial-iqtisadi inkişafına şəxsi töhfəsinə görə "Ukraynanın işgüzar adamı" diplomu və medalı ilə təltif edilib. 2006-cı ildə "Millətlərarası sülhün və həmrəyliyin möhkəmlənməsi" nominasiyasında Xarkov Şəhər Şurası İcraiyyə Komitəsinin mükafatının laureatı olub. 2006 və 2008-ci illərdə M.Ömərova Ukraynada millətlərarası sülhün və həmrəyliyin möhkəmləndirilməsinə görə Ukrayna Millətlər və Dinlər Məsələləri üzrə Dövlət Komitəsinin Fəxri fərmanı təqdim edilib. M.Ömərov 2009-cu ildə çoxillik vicdanlı əməyinə, məhsuldar elmi-pedaqoji fəaliyyətinə görə Ukrayna Təhsil və Elm Nazirliyinin Fəxri fərmanı, 2011-ci ildə yüksək ixtisaslı mütəxəssislərin hazırlanmasına sanballı töhfəsinə, çoxillik məhsuldar elmi-pedaqoji fəaliyyətinə və yüksək səviyyəli peşəkarlıq məharətinə görə Xarkov Vilayət Dövlət Administrasiyasının və Xarkov Vilayət Şurasının Fəxri fərmanına layiq görülüb.

2011-ci ildə Azərbaycan Prezidentinin Fərmanı ilə "Tərəqqi" medalı ilə təltif edilib.

M.Ömərov 2002-2006-cı illərdə Xarkov şəhəri IV çağırış Kiyev rayon şurasının deputatı, iqtisadi inkişaf və sahibkarlıq üzrə daimi deputat komissiyasının sədri olub.



## Ömərov
## Şahin Ənvər oğlu

*İqtisad elmləri namizədi. Xarkov Milli Radioelektronika Universitetinin iqtisadi kibernetika kafedrasının dosenti. "Xəzər Ltd" Firması Məhdud Məsuliyyətli Cəmiyyətin baş direktoru. Albaniya Respublikasının Xarkovda fəxri konsulu*

Ömərov Şahin Ənvər oğlu 1968-ci il avqustun 26-da Azərbaycan Respublikasının Kürdəmir rayonunun Xırdapay kəndində qulluqçu ailəsində anadan olub.

Məktəbi bitirəndən sonra Azərbaycan Kənd Təsərrüfatı Nazirliyinin Kürdəmir rayonundakı Təmir-Tikinti İdarəsində fəhlə işləyib. 1986-1988-ci illərdə Sovet Ordusu sıralarında xidmət edib.

Ş.Ömərov 1988-ci ildə Xarkova gəlib, bir il sonra "mühasibat uçotu və təsərrüfat fəaliyyətinin analizi" ixtisası üzrə Xarkov Dövlət Dəmiryol Nəqliyyatı Akademiyasının iqtisad fakültəsinin qiyabi şöbəsinə daxil olub.

Eyni zamanda Xarkov Elmi-Tədqiqat Dəqiq Maşınqayırma İnstitutunda ("Radiorele" Xarkov İstehsalat Birliyi) lifli-optik texnika üzrə konstruktor şöbəsində çilingər vəzifəsində çalışıb, 1990-cı ildə elə həmin institutun baza elmi-tədqiqat standartlaşdırma şöbəsinə mühəndis vəzifəsinə keçib.

Ş.Ömərov 1992-1993-cü illərdə "TSK" kiçik müəssisəsində mühasib, sonra baş mühasib işləyib.

Ş.Ömərov 1993-cü ildən "Sprut" LTD Ukrayna-Türkiyə birgə müəssisəsinin baş mühasibi olub, 1994-cü ildə "İnko" Səhmdar Bankının valyuta əməliyyatları şöbəsində iqtisadçı-mühasib, 1995-ci ildə elə həmin bankın valyuta əməliyyatları şöbəsinin rəisi olub. 1996-cı ildə "Ukrayna ticari əməkdaşlıq bankı" Səhmdar Kommersiya Bankında valyuta idarəsi rəisinin müavini təyin edilib.

Ş.Ömərov 1996-2006-cı illərdə "Xəzər Ltd" Firması Məhdud Məsuliyyətli Cəmiyyətin (MMC) maliyyə direktorunun müavini, 2007-ci ildə "Xəzər Ltd" MMC-nin maliyyə direktoru olub. 2006-2010-cu illərdə Xarkov şəhər şurasının Kiyev rayon şurasının deputatı olub. 2009-cu ildən bu günə qədər "Xəzər Ltd" Firması MMC-nin baş direktorudur. 2010-2013-cü illərdə Xarkov vilayəti qubernatorunun iqtisadi məsələlər üzrə müavininin müşaviri olub. 2012-ci ildən Sənaye və Ticarət Komitəsinin rəhbəri, Avropa Ticarət-Sənaye Palatasının Xarkov vilayətindəki nümayəndəsi, 2013-cü ildən Ukrayna-Azərbaycan Biznes Şurasının prezidentidir.

Ş.Ömərov yüksək peşəkarlığına və "Xəzər Ltd" Firması MMC-nin baş direktoru kimi Xarkov vilayətinin sosial-iqtisadi inkişafına şəxsi sanballı töhfəsinə görə dəfələrlə Xarkov vilayəti dövlət administrasiyasının (2007, 2008), Xarkov şəhər şurasının (2006, 2008), "Xəzər" firması ilə əməkdaşlıq edən müəssisələrin rəhbərlərinin (2007, 2008, 2009) fəxri fərmanları və təşəkkürnamələri ilə mükafatlandırılıb.

Birbaşa vəzifə öhdəlikləri ilə bağlı işinin çox olmasına baxmayaraq, Ş.Ömərov müəssisələrin idarə olunması və maliyyə sahəsində peşəkarlıq səviyyəsini daim yüksəldir. O, 1996-cı ildə Yaroslav Mudrı adına Ukrayna Milli Hüquq Akademiyasının təsərrüfat-hüquq fakültəsinə daxil olub. 2002-ci ildə akademiyanı "hüquqşünaslıq" ixtisası üzrə bitirib.

Ş.Ömərov 2006-cı ildə Xarkov Milli Radioelektronika Universitetinin əyani bölməsinin aspirantı olub. 2008-ci ildə "İqtisadiyyat və müəssisələrin idarə olunması" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

Ş.Ömərov 11-dən çox elmi məqalənin müəllifidir. Hazırda Xarkov Milli Radioelektronika Universitetinin iqtisadi kibernetika kafedrasının dosentidir. Ukrayna Milli Elmlər Akademiyasının Elmi-Tədqiqat İnkişafın Sənaye Problemləri Mərkəzinin tədqiqatçısıdır. Beş dil bilir.

Ş.Ömərov ictimai işə də vaxt tapır. O, 1991-ci ildən Xarkov vilayətindəki "Xətai" Cəmiyyətinin İdarə heyətinin üzvüdür, 2001-ci ildən "Dostluq" Azərbaycan-Ukrayna Dostluq Cəmiyyətinin Xarkov vilayəti üzrə idarə heyətinin üzvüdür. Bu qurumların əsas vəzifələri milli mədəni ənənələri dirçəltmək və qoruyub saxlamaq üçün azərbaycanlıların səylərini birləşdirmək, Ukrayna və Azərbaycan arasında mədəni-iqtisadi əlaqələrin möhkəmlənməsinə dəstək göstərmək, Ukraynada yaşayan azərbaycanlıların hüquq və maraqlarını müdafiə etməkdir.

Ukrayna ilə Azərbaycan arasında mədəni-iqtisadi əlaqələrin genişlənməsinə yönələn irimiqyaslı tədbirlərin (elmi-praktik konfranslar, "dəyirmi masa"lar, Xarkovda Azərbaycan mədəniyyət günlərinin keçirilməsi, milli bayramlar və s.) təşkilatçısı olan "Dostluq" Cəmiyyətinin fəaliyyəti dəfələrlə Millətlər və Dinlər İşləri üzrə Ukrayna Dövlət Komitəsinin, Xarkov vilayəti dövlət administrasiyasının və Xarkov şəhər şurasının fəxri fərmanları və təşəkkürnamələri ilə qeyd edilib.

Ş.Ömərov 2015-ci ilin yanvarından Albaniya Respublikasının Xarkovda fəxri konsuludur.



# Paşayev
# Davud Hüseyn oğlu

*(1940-2010)*
*Texnika elmləri doktoru, professor.*
*Rusiya Dövlət Atom Gəmiqayırma Mərkəzinin sabiq prezidenti*

Paşayev Davud Hüseyn oğlu 1940-cı il iyulun 19-da Moskva vilayətinin Ostaşevo kəndində anadan olub.

1957-ci ildə orta məktəbi gümüş medalla bitirib və Ural Politexnik İnstitutuna daxil olub. 1963-cü ildə ali məktəbi "Atom energetika qurğularının layihələndirilməsi və istismarı" ixtisası üzrə bitirdikdən sonra təyinatla Severodvinsk şəhərindəki "Sevmaş" müəssisəsinə göndərilir. Hərçənd, onun taleyi tamam başqa cür ola bilərdi – o, hələ tələbəlik illərində üç dəfə Beloyarsk Atom Elektrik Stansiyasında (AES) təcrübə keçmişdi və institutu bitirdikdən sonra orada işləməyə hazırlaşırdı. Amma gənc məzunu hərbi komissarlığa çağırdılar və üç aylıq təlim kursu keçəndən sonra SSRİ Silahlı Qüvvələri sistemində xidmətdə qalmasını təklif etdilər. D.Paşayevin bu təklifdən imtina etməsinə baxmayaraq, onu tibbi komissiyaya göndərirlər. O, tibbi komissiyadan keçdiyi müddətdə Beloyarsk AES-də bütün vakansiyalar tutulur. İnstitutda ona Severodvinsk, Qorki və ya Uzaq Şərqdən birini seçməyi təklif edirlər. O, Severodvinski seçir.

1963-1980-ci illərdə D.Paşayev "Sevmaş"da gəmiqayırma sistemində istehsal dövrünün bütün mərhələlərini keçir – usta köməkçisi, montaj işləri üzrə usta, təhvil mexaniki (yeni mexanizm və sistemlərin sınaq prosesinin rəhbəri), sex rəisinin müavini və nəhayət, stapel-təhvil işləri üzrə istehsalat rəisinin müavini vəzifələrində işləyir.

Bundan sonra müəssisənin rəhbərliyi onu ən məsuliyyətli sahəyə – atom reaktor qurğularının avadanlıq və sistemlərinin montajı sahəsinə göndərir. Sonrakı hadisələr göstərdi ki, müəssisənin rəhbərliyi bu seçimində səhv etməmişdi.

Təhvil mexaniki vəzifəsi D.Paşayev üçün əsl yetkinlik sınağı oldu. Onun yanında çalışanlar bu insanın yorulmaq nə olduğunu bilməməsinə, gəminin maşın və mexanizmlərinin işləmə prinsiplərini anlamaq arzusuna, işin nəticəsi üçün məsuliyyəti öz üzərinə götürmək bacarığına heyran olurdular.

D.Paşayev çox qısa müddətdə sualtı qayıqların reaktor bölmələri üzrə istehsalın incəliklərini, ən mürəkkəb texnikanın işləmə prinsiplərini öyrənərək, tezliklə bu sahə üzrə ən hörmətli mütəxəssislərdən biri oldu.

Stapel-təhvil istehsalının rəis müavini vəzifəsinə təyin ediləndən sonra D.Paşayevin fəaliyyəti daha da gərgin olur: indi o, atom sualtı qayıqlarının hazırlanmasına və sınaqlarına görə cavabdeh idi, Rusiyada gəmiqayırmanın "qızıl əsrində" isə eyni vaxtda beşə qədər gəmi dənizdə sınaqdan keçirilir, bu sınaqlarda yüzlərlə mütəxəssis çalışırdı. Amma D.Paşayevə xas olan cəhətlər - işdə unikal dəqiqlik, böyük istehsal həcminə nəzarət etmək qabiliyyəti bu məsələlərin öhdəsindən gəlməsinə kömək edirdi.

1980-ci ildə D.Paşayevi stapel-təhvil istehsalatının rəisi təyin edirlər və səkkiz minlik kollektivə, sonra isə zavodun bütün mühəndislik xidmətlərinə rəhbərlik etmək ona etibar olunur – 1986-1988-ci illərdə o, "Sevmaş" istehsalat birliyinin baş mühəndisi vəzifəsini tutur.

Bu dövr, üçüncü nəslə aid "Akula", "Antey", "Bars" kimi atom sualtı qayıqlarının yaradılması vaxtı idi. Belə nəhənglərin yaradılması gəmiqayırmada modul-aqreqat metodunun tətbiqi olmadan mümkün deyildi. D.Paşayev bu metodun inkişafına əhəmiyyətli töhfə verib. Onun rəhbərliyi altında bir sıra iqtisadi problemlər, texniki təchizatın yenilənməsi, istehsal güclərinin yenilənməsi və modernləşdirilməsi, yeni texnologiyaların və konstruksiyaların işlənib hazırlanması məsələləri müvəffəqiyyətlə həll edilib.

1988-ci ildə D.Paşayev praktik olaraq yekdilliklə müəssisənin baş direktoru seçilib. "Sevmaş"ın tarixində ilk dəfə idi ki, müəssisənin rəhbəri yuxarıdan təyin olunmayıb kollektiv tərəfindən seçilirdi. D.Paşayevin bütün sələfləri üçün müvəffəqiyyətin rəhni - dövlət dəstəyi, sovet Hərbi Dəniz Donanmasının gücünün və qüdrətinin inkişafına yönəldilmiş siyasət olub. D.Paşayevin dövrü başqa vaxta düşdü – dövlət müdafiə sifarişi üzrə maliyyələşdirmə kəskin azalmışdı, bu vəsait hətta əməkdaşlara aylıq maaş ödəməyə çatmırdı, gəmilərin gövdələri stapellərdə donub qalmışdı, gələcək ödənişlər hesabına talonla çörək verilirdi, zavodu səhmdar şirkətə çevirmək və firmalara bölmək barədə şirnikləndirici təkliflər irəli sürülür, hökumətlərin dəyişməsinin və rəhbər strukturlarda islahatların sonu görünmürdü.

D.Paşayevin üzərinə 46 minlik kollektivin və donanmanın taleyi üçün böyük məsuliyyət düşürdü. Yorulmadan işləmək bacarığına malik olan D.Paşayev böhran illərində çətinliklər qarşısında geri çəkilmədi, hərbi dəniz texnikasının istehsalını qoruyub saxlamaq üçün özünün bütün təcrübəsini, biliklərini və şəxsi nüfuzunu səfərbər etdi. O, gəmiqayırma problemlərinə diqqəti cəlb etmək üçün ölkənin rəhbərləri ilə, nüfuzlu siyasətçilər, hərbi-dəniz komandanları və bankirlərlə görüşürdü. Bu sahənin dirçəldilməsinə yönəldilmiş bir sıra prezident fərmanlarının, hökumət qərarlarının təşkilatçısı və müəllifi idi. Müasir hərbi texnika nümunələrinin yaradıl-

masına prinsipcə yeni yanaşma ideyası məhz D.Paşayevə məxsus idi: o, yeni gəmilərin inşasında əvvəlki nəsillərə aid sualtı qayıqların hazırlanması və tamamlama işləri üçün nəzərdə tutulmuş avadanlıqdan, materiallardan və mexanizmlərdən istifadə olunmasını təklif etdi. Bu, əmək məsrəflərini və işlərin dəyərini əhəmiyyətli dərəcədə azaltmağa imkan verdi.

80-ci illərin sonlarında D.Paşayev, dövlət müdafiə sifarişinin azaldılacağını qabaqcadan duyaraq, "Sevmaş" müəssisəsinin yüksək texnoloji səviyyəsini qoruyub saxlamağa imkan verə biləcək başqa fəaliyyət istiqamətlərini axtarmağa başlayır. Donmaya davamlı dəniz platformalarının tikintisi üzrə yeni sənaye sahəsinin yaradılması məhz belə istiqamət olur.

2013-cü ildə müəssisə dünyada donmaya davamlı ilk stasionar dəniz platformasının tikintisini başa çatdırdı. Bu, – 50°C temperaturda işləyə bilən "Prirazlomnaya" platforması idi. "Sevmaş"da baş direktorun bilavasitə iştirakı ilə atom sualtı qayıqlarının utilləşdirilməsi üzrə genişmiqyaslı proqramlar da həyata keçirildi.

D.Paşayevin baş direktor vəzifəsində həll etməli olduğu bir problem də zavoda dəstləşdirmə məmulatlarının çatdırılması problemi idi. Keçmiş Sovet İttifaqı respublikalarında yerləşən təchizatçı zavodlarla onilliklər ərzində nizama salınmış əlaqələr SSRİ dağılandan sonra qırılmışdı. D.Paşayev "Sevmaş"da texniki cəhətdən məqsədəuyğun və iqtisadi baxımdan əlverişli məmulatlar buraxılışının təşkil olunmasını təklif etdi. Qısa vaxt ərzində su avadanlığı, gəmi armaturu və sair məmulatlar buraxılışı mənimsənildi. Paralel olaraq Rusiya zavodları ilə yeni əməkdaşlıq münasibətləri qaydaya salınırdı.

D.Paşayevin təşəbbüsü ilə "Sevmaş"ın yenidən qurulması üzrə kompleks proqram həyata keçirilib, keyfiyyət sistemi beynəlxalq standartlara uyğunlaşdırılıb, müəssisənin idarə edilməsinin yeni strukturu işlənib hazırlanıb və tətbiq edilib.

D.Paşayevin baş direktor vəzifəsində fəaliyyəti tədricən Rusiyanın və başqa ölkələrin işgüzar dairələrinin diqqətini cəlb etməyə başladı. Əməkdaşlıq haqqında təkliflər daxil olur, hərbi-texniki əməkdaşlıq və xalq təsərrüfatı xətti ilə sifarişlərin icrasına dair müqavilələr bağlanırdı. Amma 1996-cı ildə yeni nəslə aid "Yuri Dolqoruki" atom sualtı qayığının təməlinin qoyulması və tikintisi, 2002-ci ildə üçüncü minilliyin birinci gəmisi olan "Hepard" atom sualtı qayığının istismara verilməsi D.Paşayevin və onun tərəfdarlarının əlində "Sevmaş"ın xeyrinə ən tutarlı arqument oldu. Yaranan problemlərin həllinə dövlət mövqeyindən yanaşmaq, istehsalın inkişaf perspektivlərini aydın təsəvvür etmək D.Paşayevi böyük rəhbər kimi xarakterizə edən əsas xüsusiyyətdir.

1992-ci ildə D.Paşayevin şəxsi təşəbbüsü əsasında Rusiya Federasiyası Prezidentinin fərmanı ilə Rusiya Dövlət Atom Gəmiqayırma Mərkəzi (RDAGM) yaradılır. RDAGM-in tərkibinə gəmiqayırma hərbi-sənaye kompleksinin 9 aparıcı müəssisəsi daxil idi. Həmin müəssisələrin əsas istehsal profili atom sualtı qayıqlarının tikintisi, təmiri, modernləşdirilməsi və utilləşdirilməsidir.

2004-cü ildə D.Paşayev müəssisənin idarə olunmasını öz müavininə həvalə etməyi, özü isə əsas səylərini Rusiyada atom gəmiqayırma sahəsinin inkişafının dövlət problemləri üzərində cəmləşdirməyi qərara aldı. 2004-cü ildən D.Paşayev RDAGM-in prezidenti idi.

2005-ci ildə Pomorye gəmiqayıranları onu RF Prezidenti yanında İctimai Palatanın üzvlüyünə irəli çəkdilər. O, əhali ilə əks əlaqə sxemi təklif edib - İctimai Palatanın ilk işçi qrupu Arxangelskdə yaradılmışdı. Bu qrupa vilayətin ən görkəmli ictimai xadimləri daxildir, onların fəaliyyətinə dair bütün sənədlər hazırlanıb.

D.Paşayev "Sevmaş" müəssisəsində işlədiyi dövrdə Rusiya Federasiyasının Qəhrəmanı adına (1995) layiq görülüb, Oktyabr İnqilabı (1974), Qırmızı Əmək Bayrağı (1984) ordenləri, "Rusiya Donanmasının 300 illiyi" medalı (1996) ilə təltif edilib, Rusiya Federasiyasının Dövlət Mükafatı laureatı (2000), Arxangelsk vilayətinin "Dostoyaniye Severa" ictimai mükafatı laureatı (2003) olub.

Ölkənin müdafiə potensialının qorunub saxlanması və dəstəklənməsi işində xidmətlərinə, müdafiə müəssisələrinin konversiyası proqramının işlənib hazırlanmasına və müvəffəqiyyətlə reallaşdırılmasına görə D.Paşayevin əməyi "Obşestvennoye priznaniye" Milli Fondunun fəxri qızıl nişanı ilə qeyd edilib (2000). D.Paşayev hərbi gəmiqayırmanın inkişafında görkəmli xidmətlərinə görə "İlin adamı – 2002" milli mükafatı ilə, "Severodvinsk qarşısında xidmətlərinə görə" nişanı ilə təltif olunub (2004).

Atom sualtı qayıqlarının üç nəslinin işlənib hazırlanması, yaradılması və inkişafı sahəsində xidmətlərinə görə 2006-cı ildə Rusiya Federasiyası Prezidentinin fərmanı ilə D.Paşayevə elm və texnologiyalar sahəsində Rusiya Federasiyasının Dövlət Mükafatı verilib.

D.Paşayev 2010-cu ildə vəfat edib.



## Paşayev Oqtay Kamal oğlu

*Riyaziyyat üzrə professor.*
*İzmir Yüksək Texnologiyalar İnstitutunun riyaziyyat fakültəsinin banisi*

Paşayev Oqtay Kamal oğlu 1951-ci il noyabrın 21-də Bakıda anadan olub.

1971-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika fakültəsinə daxil olub, 1974-cü ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinə köçürülüb. 1978-ci ildə V.Y.Fraynberqin rəhbərliyi altında diplom işi müdafiə edərək Moskva Dövlət Universitetinin fizika fakültəsini bitirib. Bir il P.N.Lebedev adına Moskva Fizika İnstitutunda İ.Y.Tamm adına nəzəri fizika şöbəsində Azərbaycan EA Fizika İnstitutunun ezam edilmiş stajor-tədqiqatçısı kimi işləyib.

1979-cu ildən O.Paşayev Dubnada Birləşmiş Nüvə Tədqiqatları İnstitutunda (BNTİ), əvvəlcə stajor-tədqiqatçı, sonra mühəndis və kiçik elmi işçi kimi çalışıb. 1983-cü ildə nəzəri və riyazi fizika üzrə namizədlik dissertasiyası müdafiə edib. Həmin il BNTİ-də gənc alimlərin müsabiqəsində ikinci yeri tutub. 1984-1985-ci illərdə Dubnadakı Voljsk ali hərbi məktəbində dosent vəzifəsində dərs deyib. 1987-2001-ci illərdə BNTİ-nin hesablama texnikası və avtomatlaşdırma laboratoriyasının böyük elmi işçisi olub.

1990-cı ildən O.Paşayev Leççe və Salerno universitetlərinə, Triyestdəki (İtaliya) Beynəlxalq ali tədqiqatlar məktəbinə uzunmüddətli ezamiyyətə göndərilib, orada elmi araşdırmalarla məşğul olub. 1994-cü ildə İstanbul (Türkiyə) yaxınlığında yerləşən Qəbzədə Mərmərə Fundamental Tədqiqatlar İnstitutunda işləyib. 1996-2000-ci illərdə Taybeydə (Tayvan) Sinika Akademiyasının Riyaziyyat İnstitutunda dəvət edilmiş professor olub və Taybeyin Milli Tayvan Universitetində dərs deyib. 2000-ci ildən İzmir (Türkiyə) Yüksək Texnologiyalar İnstitutunun riyaziyyat üzrə professorudur.

O.Paşayev nəzəri və riyazi fizika sahəsində geniş profilli mütəxəssisdir. Onun elmi araşdırmalarının əsas istiqamətləri qeyri-xətti hadisələrin inteqrallanan modelləri, dəqiq həll edilən çoxölçülü və topoloji solitonlar, onların dinamikası və rezonanslı qarşılıqlı təsiri, topoloji kalibrləmə nəzəriyyələri, kvant nəzəriyyəsi və hidrodinamika məsələləridir.

Qeyri-kompakt və supersimmetrik simmetriya qrupları olan qeyri-xətti Şrödinger tənliyinin çoxkomponentli solitonları sahəsində bir sıra məsələləri ilk dəfə tədqiq edən o olub. Belə solitonlar qeyri-xətti optikada lifli-şüşə kabel rabitəsində informasiyanın ötürülməsinin əsas mexanizmi kimi öyrənilir. Bu nəticələr solitonlara aid bir sıra monoqrafiyalara daxil edilib. O.Paşayevin qeyri-kompakt dinamik simmetriyaya aid işi zəif qeyri-ideal Boze-qaz nəzəriyyəsində superaxıcı Boqolyubov kondensatı ilə Lobaçevski həndəsəsi arasında əlaqə yaradır. Bu iş akademik N.N.Boqolyubovun təqdimatına əsasən "Dokladı AN SSSR" nəşrində dərc edilib.

Çoxölçülü solitonlar nəzəriyyəsinə aid işlərin başqa əhəmiyyətli seriyası Devi-Stüartson tənliklərində dəqiq həllərin qurulmasına və solitonların qeyri-elastik dinamikasının öyrənilməsinə həsr edilib. O.Paşayevin aldığı nəticələr əsasında yaxın vaxtlarda solitonlar nəzəriyyəsinə aid tədqiqatların bütöv bir yeni istiqaməti yaranıb.

O.Paşayev Çern-Saymons tipli topoloji kalibrləmə meydanları nəzəriyyəsinə, onların soliton tənliklərin sonsuz iyerarxiyaları və topoloji solitonlar və anionlar fizikası ilə əlaqəsinə aid bir sıra araşdırmalar aparıb. Onun silsilə tədqiqatlarının bir qismi de Broyl-Bom kvant potensialı əsasında rezonans soliton tənliklər qurulmasına həsr edilib.

O.Paşayevin silsilə araşdırmalarından biri dissipativ hadisələrin kvant nəzəriyyəsi, topoloji baxımdan mürəkkəb kalibrləmə nəzəriyyələri, kvant qravitasiyasının kalibrləmə nəzəriyyələri və şüurun dissipativ modelləri ilə bağlıdır. Alim informasiya nəzəriyyəsi əsasında qeyri-xətti tənliklərin qurulmasının yeni metodunu hazırlayıb. O, Şturm-Liuvil kvant məsələsi adlanan dissipativ kvant məsələlərinin geniş spektrinin dəqiq həllərinin qurulması üçün yeni metod yaradıb.

O.Paşayev yeni və coşqun inkişaf edən kvant kompyuterləri və kvant informasiyası sahəsinə töhfələr verib. Məsələn, onun elmə daxil etdiyi, maksimal qeyri-klassik dolaşıqlıq xassəsinə malik olan yeni kvant koherent vəziyyətlər kvant kompyuterlərində prinsipial rol oynaya bilər. O, həmçinin, Fibonaççi analizi adlanan yeni analiz tipi yaradıb və asimptotik spektrin qızıl bölgülü kvant modellərini qurub.

O.Paşayevin işlərinin daha bir seriyası hidrodinamika ilə bağlıdır. Koaksial silindrlərlə məhdudlaşdırılmış oblastda????? Puankarenin təsvirlər metodu ilə qeyd etdiyi burağanlar haqqında məsələni O.Paşayev yeni, miqyaslı sonlu fərqlər metodu ilə dəqiq həll etdi. Eylerdən və Qaussdan başlayan bu metoddan XX əsrdə kvant qrupları və kvant inteqrasiya sistemləri nəzəriyyəsində geniş miqyasda istifadə edilir.

O.Paşayev 130-dan çox elmi işin (onların əksəriyyəti nüfuzlu elmi jurnallarda dərc edilib), o cümlədən 4 kitabın müəllifi və həmmüəllifi, 3 beynəlxalq konfransın materialları məcmuəsinin redaktorudur. Onun həmmüəlliflərinin siyahısına Avstra-

liya, Almaniya, Hindistan, İtaliya, Qazaxıstan, Rusiya, Sinqapur, Tayvan, Tacikistan və Türkiyədən olan alimlər daxildir. Onun "Kondensasiya edilmiş mühitdə inteqrallanan psevdospin modellər" monoqrafiyası akademik S.P.Novikovun redaktəsi ilə nüfuzlu "Sovet elminin icmalları" seriyasında "riyazi fizika" bölməsi üzrə sovet elminin nümayəndələrinin ən mühüm nailiyyətləri ilə yanaşı, Londonda "Harwood Academic Publisher" nəşriyyatı tərəfindən çap edilib.

O.Paşayev aktiv alimdir. Solitonlara və onların tətbiqlərinə həsr edilmiş 3 birinci və sonuncu ümumittifaq konfransın (Dubna, Yurmala, Puşşino) və 5 beynəlxalq konfransın (Dubna, Ankara, İstanbul) təşkilatçılarından biri olub. Sovet dövründə o, 1 diplomçu və 3 elmlər namizədi hazırlayıb. Hazırda Rusiya, Braziliya, Cənubi Afrika və Qazaxıstanda işləyən bu şəxslər professor və məşhur mütəxəssislərdir.

O.Paşayev İzmir Yüksək Texnologiyalar İnstitutunun ilk əcnəbi professoru, Türkiyənin bu aparıcı elmi-tədris mərkəzində riyaziyyat fakültəsinin banisidir. Onun bilavasitə rəhbərliyi ilə bu fakültədə ardıcıl olaraq magistratura, aspirantura və bakalavriatura açılıb. O, riyaziyyat, fizika, elektron mühəndisliyi və mexaniki mühəndislik fakültələrində magistr və fəlsəfə doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiəsi üzrə ixtisaslaşdırılmış şuraların üzvüdür. O, İnformasiya və Hesablama Texnikası İnstitutunda (İHTİ) 11 magistr və 2 fəlsəfə doktoru hazırlayıb. O.Paşayev İHTİ-nin iki layihəsinin və TÜBİTAK-ın (Türkiyə) üç layihəsinin rəhbəri və iştirakçısı olub.

Müxtəlif ölkələrdə çalışan mütəxəssislər O.Paşayevi yaxşı tanıyırlar. O, BNFM-də (Beynəlxalq Nəzəri Fizika Mərkəzi, Triyest), Leççe, Roma, Florensiya, Turin, Bari, Parma, Salerno, Paris, Nitsa, Taybey, Taynan, Sinju, Kaoşunq, Tayjunq, Taytunq (Tayvan), Ankara, İstanbul universitetlərində mühazirələr oxuyub, seminarlar aparıb. Avropanın, Asiyanın müxtəlif ölkələrində və Avstraliyada 60-dan çox beynəlxalq konfransda iştirak edib. İtaliya, Fransa və Tayvan hökumətlərinin elmi qrantları hesabına araşdırmalar aparıb.

O.Paşayev 15-dən çox xarici profil jurnalın və Rusiya EA Ümumrusiya Elmi və Texniki İnformasiya İnstitutunun (əvvəllər SSRİ EA Ümumittifaq Elmi və Texniki İnformasiya İnstitutu, VİNİTİ) resenzentidir. Amerika Riyaziyyat Cəmiyyətinin resenzenti və üzvü, İsveç Kral Elmlər Akademiyasının "Physica Scripta" jurnalının redaksiya heyətinin üzvüdür. Onun tərcümeyi-halı Markusun "Elmdə və mühəndislikdə kim kimdir" Ensiklopediyasının 7-ci, 8-ci və 10-cu nəşrlərinə və "Dünyada kim kimdir" Ensiklopediyasının 31-ci nəşrinə daxil edilib.



## Poladxanova
## Nərgiz Şamil qızı

*Özbəkistan Dövlət Konservatoriyasının ixtisas fortepiano kafedrasının professoru*

Poladxanova Nərgiz Şamil qızı 1957-ci il iyulun 12-də Daşkənddə anadan olub.

1981-ci ildə M.Əşrəfi adına Daşkənd Dövlət Konservatoriyasını Özbəkistanın Əməkdar İncəsənət Xadimi, professor A.M.Hekkelmanın ixtisas fortepiano sinfi üzrə fərqlənmə diplomu ilə bitirib. Konservatoriyada məşğul olmaqla bərabər, pianoçuların respublika və beynəlxalq müsabiqələrində iştirak edir və laureat adı qazanırdı.

Dövlət İmtahan Komissiyasının sədri, Rusiyanın Xalq Artisti, Moskva Konservatoriyasının professoru M.S.Voskresenskinin tövsiyəsi ilə N.Poladxanova təhsilini Qnesinlər adına Dövlət Musiqi-Pedaqoji İnstitutunun (hazırda Qnesinlər adına Rusiya Musiqi Akademiyası) aspiranturasında görkəmli pedaqoq, musiqiçi, metodist, böyük H.Q.Neyqauzun şagirdi, professor Y.Y.Libermanın sinfində davam etdirib.

N.Poladxanova aspiranturada təhsilini böyük uğurla başa vurandan sonra, 1986-cı ildən Daşkənd Dövlət Konservatoriyasının ixtisas fortepiano kafedrasında yaradıcılıq fəaliyyətinə başlayır.

N.Poladxanova pedaqoji fəaliyyətə başlayandan bu günə qədər onun sinfini bitirənlər arasında 60-dan çox bakalavriat, magistratura və aspirantura məzunu var, onlar hamısı yaxın və uzaq xarici ölkələrdə öz ixtisasları üzrə işləyir. N.Poladxanovanın tələbələrinin çoxu beynəlxalq müsabiqələrin laureatları olub: B.Allaberqanov (1999, Hollandiya), F.Haydarova (1998, Rusiya; 2000, Fransa), Y.Brovkina (1999, Qazaxıstan), V.Umarova (2005, Litva; 2005, 2007, Fransa), L.Davlyatova (2007, Rusiya), İ.Sokolova (2009, Koreya Xalq Demokratik Respublikası).

Qazaxıstan müsabiqəsinin (1999) münsiflər heyəti və Litva müsabiqəsinin (2007) münsiflər heyəti Pianoçuların Beynəlxalq Müsabiqələrinin laureatlarının yüksək səviyyədə hazırlanmasına görə N.Poladxanovaya ən yaxşı pedaqoq diplomu təqdim ediblər.

N.Poladxanova səmərəli pedaqoji işlə intensiv ifaçılıq fəaliyyətini müvəffəqiyyətlə əlaqələndirir. Gözəl fortepiano məktəbi keçmiş N.Poladxanova piano ifaçılıq texnikasının bütün növlərinə virtuozcasına yiyələnmiş dərin, incə musiqiçidir. Onun arsenalında 40-dan çox tammetrajlı konsert proqramı var. Pianoçunun repertuarına

İ.Bax, V.Motsart, L.Bethoven, F.Şubert, R.Şuman, İ.Brams, F.Şopen, F.List, C.Prokofyev, K.Debüssi, M.Ravel, C.Raxmaninov, P.Çaykovski, Q.Qarayev, F.Əmirov, N.Zakirov, A.Haşımov kimi dünya klassiklərinin fortepiano əsərləri daxildir. Bu günə qədər o, Özbəkistanda F.Listin "Poetik və dini harmoniyalar", "Xəyallar", "Milad yolkası", "Vyana axşamları" fortepiano əsərləri silsiləsini tam həcmdə ifa etmiş yeganə pianoçudur.

N.Poladxanova solo proqramlarından ibarət 5 kompakt-disk yazdırıb. Onun ifasında F.Şubertin və F.Listin əsərləri Özbəkistan radiosunun Qızıl fonduna daxil edilib.

Pianoçunun ifaçılıq repertuarında onun solo konsertləri və Özbəkistanın simfonik kollektivləri ilə birgə çıxışları ilə yanaşı, filarmoniyanın orkestri, konservatoriyanın opera studiyasının orkestri, kamera orkestri ilə birgə çıxışları da var (dirijorlar – Özbəkistanın Əməkdar Artisti, professor K.Usmanov, Özbəkistanın Əməkdar İncəsənət Xadimi, professor E.Əzimov, Özbəkistan gənclərinin böyük hamisi professor V.Neymer).

Professor N.Poladxanovanın çoxsaylı elmi-metodik işləri ixtisas fortepianonun tədrisi metodikasının dərindən, ciddi öyrənilməsini əks etdirir. Onun qələminin məhsulu olan çap edilmiş onlarca elmi əsər arasında həm beynəlxalq nəşrlər, həm də fundamental işlər var. Onun ali musiqi təhsili müəssisələri üçün yazdığı "İri formalı birhissəli fortepiano əsərlərinin üslub interpretasiyası problemi" adlı tədris-metodik vəsaiti "2007-ci ilin ən yaxşı dərsliyi" respublika müsabiqəsində ən yaxşı dərslik hesab edilib. N.Poladxanovanın bir sıra işləri alman, italyan, fransız, özbək fortepiano musiqisinin interpretasiyası problemlərinə həsr edilib. Onun "İxtisas fortepiano sinfində gənc musiqiçinin yaradıcı şəxsiyyətinin tərbiyəsi məsələsinə dair" əsəri ingilis dilinə tərcümə olunub.

Professor N.Poladxanovanın zəngin pedaqoji, elmi-metodik və ifaçılıq təcrübəsi ona pianoçuların respublika və beynəlxalq müsabiqələrində münsiflər heyətinin üzvü kimi iştirak etmək hüququ verir. O, ali məktəbin Dövlət İmtahan Komissiyasının daimi üzvüdür. 2008-ci ildə Özbəkistan Respublikasının Ali Attestasiya Komitəsi ona professor elmi adı verib.

N.Poladxanova incəsənətdə və yüksək ixtisaslı kadrlar hazırlığı sahəsində qazandığı nailiyyətlərə görə Özbəkistan Respublikası Mədəniyyət və İdman Nazirliyinin fəxri fərmanları, Özbəkistan Respublikası Mədəniyyət və İdman Nazirliyinin TASANNO sertifikatları, özünün də üzv olduğu Özbəkistan Teatr Xadimləri İttifaqının fərmanları ilə təltif olunub.

Hazırda N.Poladxanova Özbəkistan Dövlət Konservatoriyasının ixtisas fortepiano kafedrasının professorudur.



## Poladxanova
## Ramidə Şamil qızı

*Professor. Özbəkistan Dövlət Konservatoriyasının konsertmeyster ustalığı kafedrasının müdiri*

Poladxanova Ramidə Şamil qızı 1955-ci il dekabrın 27-də Daşkənddə anadan olub.

1978-ci ildə M.Əşrəfi adına Daşkənd Dövlət Konservatoriyasını Özbəkistan Əməkdar İncəsənət Xadimi, professor O.Y.Yusupovanın ixtisas fortepiano sinfi üzrə fərqlənmə diplomu ilə bitirib. Leninqrad Konservatoriyasının konsertmeyster sinfi və kamera ansamblı kafedrasında professor İ.R.Radinanın və başqalarının siniflərində təcrübə keçib.

R.Poladxanova konservatoriyanın birinci kursunda oxuyarkən, əvvəlcə xor dirijorluğu kafedrasında, sonra isə akademik vokal kafedrasında Özbəkistanın görkəmli vokal sənəti xadimlərinin - Özbəkistanın Xalq Artisti, professor N.X.Haşımovun, Özbəkistanın Əməkdar Mədəniyyət İşçisi, professor M.N.Rizayevanın siniflərində konsertmeyster kimi işləməyə başlayır.

O, vokalçıların respublika müsabiqələrində konsertmeyster kimi fəal iştirak edib, həmin müsabiqələrdə çıxışlarına və laureatların hazırlanmasına görə ən yaxşı müşayiətçi kimi Özbəkistan Respublikası Mədəniyyət və İdman Nazirliyinin diplomları və fərmanları ilə təltif edilib.

Konsertmeyster kimi əməli iş təcrübəsi onun ixtisas seçimində həlledici rol oynayıb. 1985-ci ildə R.Poladxanovanı Özbəkistan Dövlət Konservatoriyasına konsertmeysterlik ustalığı kafedrasına müəllim vəzifəsinə dəvət edirlər, o vaxtdan bu günə qədər orada çalışır.

Həmin kafedrada çalışdığı illərdə R.Poladxanova bakalavriatın, magistratura və aspiranturanın 80-dən çox diplomçusunu hazırlayıb. Onun şagirdlərinin çoxu respublika və beynəlxalq miqyaslı müsabiqələrdə ən yaxşı müşayiət üçün diplomlara layiq görülüb: Qazaxıstanda və Rusiyada (2004, 2009) "Romansın cazibəsi" müsabiqələrinin diplomçusu D.Axmetşina, Y.Brovkina (2004, Qazaxıstan), Y.Tişkunova (1999, 2002, Özbəkistan), N.Abdulrəhimova (1998, 2005, Özbəkistan), Q.Musabayeva (2007, Özbəkistan), E.Abdullayeva (2009, Fransa), L.Davlyatova (2008, Qazaxıstan), İ.Sokolova (2008, Koreya).

R.Poladxanovanı akademik M.Həmidova, Özbəkistanın əməkdar artistləri Q.Zakirova, R.Titeyev, N.Sinhəbibi, S.Ruzikulov, beynəlxalq müsabiqələr laureatları A.Yu-

dina, Y.Kolqanova, O.Medyanova və başqa aparıcı müğənnilərlə yaradıcı əməkdaşlıq əlaqələri bağlayır.

R.Poladxanova XVII-XIX əsrlərin bəstəkarlarının artıq vokal sənətinin klassikasına çevrilmiş əsərlərinin ifası ilə yanaşı, müasir bəstəkarların yaradıcılığının təbliğinə də böyük diqqət yetirir.

R.Poladxanovanın Özbəkistanın əməkdar artistləri Q.Zakirova və S.Ruzikulovla birlikdə yazdırdığı N.Narxocayev, K.Kencayev, M.Atacanovun əsərləri Özbəkistan Radiosunun Qızıl Fonduna daxil edilib. O, akademik M.Həmidova və Özbəkistanın Əməkdar Artisti R.Titeyev ilə birgə C.Verdi, E.Qriq, Ü.Hacıbəyov, C.Puççini, V.Motsart, Q.Donisetti, S.Raxmaninov, N.Rimski-Korsakov, P.Çaykovski, İ.Ştrausun vokal əsərlərindən ibarət kompakt-disklər yazdırıb.

R.Poladxanova elmi işə, konsertmeyster ustalığı sinfində tədris metodikasına böyük diqqət yetirir. O, konsertmeysterlik işinin spesifikasına aid onlarca nəşr edilmiş əsərin, elmi-metodik məqalənin müəllifidir. Onun bütün işlərində solistin və konsertmeyster-pianoçunun birgə yaradıcılıq fəaliyyətinin dərindən öyrənilməsi izlənir. Onun ali musiqi təhsili müəssisələri üçün "Konsertmeysterlik ustalığı sinfində opera səhnəsi üzərində iş" adlı fundamental tədqiqatı "2006-cı ilin ən yaxşı dərsliyi" respublika müsabiqəsində nüfuzlu münsiflər heyəti tərəfindən ən yaxşı dərslik hesab edilib. Bu əsər iki dəfə nəşr edilib və Özbəkistan Respublikası Ali və Orta İxtisas Təhsili Nazirliyinin sertifikatını alıb. R.Poladxanovanın çoxşaxəli metodik tədqiqatları barokko musiqisinin metodik işləmələrindən başlamış F.Şubert, C.Verdi, P.Çaykovski, İ.Brams, K.Debüssi, M.Əşrəfi, D.Yanov-Yanovski və başqalarının yaradıcılığını əhatə edir.

R.Poladxanova bir neçə dəfə "Sənət qönçələri" respublika müsabiqəsinin münsiflər heyətinin işində iştirak edib. O, işlədiyi ali məktəbin Dövlət İmtahan Komissiyasının daimi üzvüdür.

1997-2007-ci illərdə o, Özbəkistan Dövlət Konservatoriyasının ən böyük fakültələrindən birinin - bəstəkar, musiqişünas və pianoçu ixtisasları üzrə müəllim və tələbələrin böyük kollektivini birləşdirən FFMT (Fakültativ fortepiano, musiqi tənqidi) fakültəsinin dekanı olub. Poladxanova FFMT fakültəsinin dekanı vəzifəsində işinə görə Musiqi İşçilərinin Şəhər Həmkarlar İttifaqının fərmanı ilə təltif edilib.

2008-ci ilin aprelində Özbəkistan Respublikası Ali Attestasiya Komitəsi R.Poladxanovaya professor elmi adı verib.

Hazırda professor R.Poladxanova Özbəkistan Dövlət Konservatoriyasının konsertmeysterlik ustalığı kafedrasının müdiridir.



## Rəhimov
## Əliheydər Ağaələkbər oğlu

*Tibb elmləri doktoru, professor. İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin həkimlərin ali məktəbdənsonrakı peşə təhsili fakültəsinin kliniki transfuziologiya kafedrasının müdiri. İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin Qan Mərkəzinin müdiri*

Rəhimov Əliheydər Ağaələkbər oğlu 1950-ci il iyulun 25-də Azərbaycan Respublikasında anadan olub.

1975-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) bitirib. 1976-cı ildə cərrahiyyə üzrə internaturada oxuyub.

Ə.Rəhimov elmi və tibbi fəaliyyətinə 1977-ci ildə Bakıda, Azərbaycan Elmi-Tədqiqat Hematologiya və Qanköçürmə İnstitutunda kiçik elmi işçi vəzifəsində başlayıb.

1977-1980-ci illərdə Mərkəzi Elmi-Tədqiqat Hematologiya və Qanköçürmə İnstitutunun (Moskva) aspirantı olub. 1980-ci ildə tibb elmləri namizədi alimlik dərəcəsi almaq üçün "İnsanın plazmatik-həll edilə bilən histoloji birgəlik antigenləri (HLA)" mövzusunda dissertasiya müdafiə edib.

1986-1988-ci illərdə Rusiya Tibb Elmləri Akademiyasının Hematoloji Elmi Mərkəzinin doktorantı olub. 1988-ci ildə tibb elmləri doktoru alimlik dərəcəsi almaq üçün "Qanında irsi anomaliyalar olan şəxslərin immun statusunun kompleks qiymətləndirilməsi" mövzusunda dissertasiya müdafiə edib.

1980-1988-ci illərdə Ə.Rəhimov Azərbaycan Elmi-Tədqiqat Hematologiya və Qanköçürmə İnstitutunun böyük elmi işçisi, immunoloji tipləşdirmə qrupunun rəhbəri olub. 1988-1992-ci illərdə Ümumittifaq Bioloji Aktiv Maddələr Elmi Mərkəzinin toksikologiya və gigiyenik normalaşdırma laboratoriyasının şöbə müdiri vəzifəsində çalışıb. 1992-ci ildən Ə.Rəhimov Rusiya Tibb Elmləri Akademiyasının akademik B.V.Petrovski adına Rusiya Cərrahiyyə Elmi Mərkəzinin professoru, transfuziologiya şöbəsinin müdiridir.

1998-ci ildən İ.M.Seçenov adına Moskva Tibb Akademiyasının (hazırda İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universiteti) Klinikalararası qanköçürmə şöbəsinə başçılıq edir. 1999-cu ildən İ.M.Seçenov adına Moskva Tibb Akademiyasının həkimlərin ali məktəbdənsonrakı peşə təhsili fakültəsinin kliniki transfuziologiya kafedrasının müdiridir.

2006-2012-ci illərdə Ə.Rəhimov Rusiya Tibb Elmləri Akademiyasının akademik B.V.Petrovski adına Rusiya Cərrahiyyə Elmi Mərkəzinin transfuziologiya və laboratoriya texnologiyaları şöbəsinə rəhbərlik edib. 2012-ci ildən İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin Qan Mərkəzinin müdiridir.

Ə.Rəhimovun elmi maraqları transfuziologiya, hematologiya, immunologiya və laboratoriya işinin bir çox bölmələrini əhatə edir, onun idarə etdiyi kollektiv transfuzion təbabətin və qanın laboratoriya sertifikatlaşdırmasının müasir texnologiyalarını işləyib hazırlayır və tətbiq edir, diaqnostika, ekstrakorporal hemokorreksiya, autodonorluq və qan xidmətlərinin bir sıra sahələrində aparıcı mövqe tutur.

Ə.Rəhimovun tədqiqatlarının çoxu immunohematologiyanın aktual istiqamətinə - eritrositar və leykositar antigenlərin (HLA) immunogenetik markerlərinin əhali arasında və xəstələrin müxtəlif kateqoriyaları arasında bölgüsünün, onların immunoloji fəallığının, orqanların və toxumaların hemotransfuziyası və transplantasiyası zamanı əhəmiyyətinin öyrənilməsinə həsr edilib. Ə.Rəhimov ilk dəfə olaraq, qanın irsi anomaliyaları olan şəxslərdə immuniteti tədqiq edib. O, hemoqlobinopatiyalar və Q-6-FDQ fermentinin defisiti zamanı immun statusunun müxtəlif xüsusiyyətlərini və variantlarını aşkar edib, bu anomaliyalar zamanı HLA antigenlərinin bölgüsünün xüsusiyyətlərini öyrənib. Bu araşdırmalar qanın irsi anomaliyaları olan şəxslərdə populyasiya immunitetinin vəziyyəti barədə təsəvvürləri əhəmiyyətli dərəcədə genişləndirib.

Professor Ə.Rəhimovun daimi elmi maraq sahələrindən biri allogen hemotransfuziyaların immunoloji təhlükəsizliyinin təmin edilməsi problemidir. Ə.Rəhimov və onun əməkdaşları hemotransmissiv infeksiyalarla bağlı vəziyyətin riyazi modelləşdirilməsi metodunu təklif edib və işləyib hazırlayıblar. Bu metod hemotransfuziyaların infeksion təhlükəsizliyini təmin edən diaqnostik tədqiqatların və profilaktik tədbirlərin zəruri həcmini müəyyən etməyə imkan verir.

Eritrositar antigen sistemlər üzrə donor-resipiyent cütlüklərinin immunoloji seçiminin riyazi modeli immunohematoloji tədqiqatların alqoritmini obyektivləşdirməyi və optimallaşdırmağı mümkün edib.

Professor Ə.Rəhimovun başçılıq etdiyi kollektiv İmmunologiya İnstitutu ilə birlikdə genlərdə tək nukleotidlərin əvəzetmələrinin rast gəlməsi tezliyinin öyrənilməsi üzrə tədqiqatlar aparır, bu nukleotidlərin məhsulları immun cavabını təmin edir. Alınmış nəticələr populyasiyada çoxfaktorlu xəstəliklərin etiologiya və patogenezinə genetik komponentinin töhfəsinin təyin edilməsinə yönəlmiş genetik populyasiya tədqiqatlarında referens məlumat bazası kimi xidmət edən Rusiya məlumat bazasının yaradılması üçün lazımdır.

Ə.Rəhimovun daimi elmi maraq sahələrindən biri də cərrahiyyə əməliyyatları zamanı qanın qorunması və ekstrakorporal hemokorreksiya metodlarının tətbiqi problemləridir.

Onun bilavasitə rəhbərliyi altında Rusiya Tibb Elmləri Akademiyasının akademik B.V.Petrovski adına Rusiya Cərrahiyyə Elmi Mərkəzinin və İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin şöbələrinin təcrübəsində donorların və xəstələrin qanının laboratoriya şəraitində sertifikatlaşdırmasının, şöbənin müalicə profilinin xüsusiyyətləri nəzərə alınmaqla hemotransfuzion vəsaitlə kompleks təminatın ən yeni metodları tətbiq edilib. Son illərdə əməliyyatlar zamanı qana maksimum qənaət edilməsinə, donor qanı komponentlərindən istifadənin, hemotransfuzion fəsadlar riskinin azaldılmasına yönəldilmiş metodlar intensiv şəkildə və uğurla işlənib hazırlanır. Sitoferez və plazmaferez, qanın ekstrakorporal şüalanması kimi müasir hemokorreksiya metodlarının elmi cəhətdən əsaslandırılmasında və tətbiqində böyük uğurlar qazanılıb, qanqoruyucu texnologiyalar – əməliyyatqabağı autodonorluq, hemodelyusiya, reinfuziya intra və əməliyyatdansonrakı qanvurma metodları işlənib hazırlanır və tətbiq olunur.

Ə.Rəhimovun təşəbbüsü ilə İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetində təşkil edilmiş Qan Mərkəzi klinika bölməsinin hemotransfuzion vəsaitlə təchizatını əhəmiyyətli dərəcədə yaxşılaşdırmağa, hemotransfuziyaların təhlükəsizliyinin təmin olunmasını yeni səviyyəyə qaldırmağa imkan verib. Hazırda Qan Mərkəzi hazırlamada və ekstrakorporal hemokorreksiyanın, autodonorluğun və autohemotransfuziyaların, qidalanmanın parenteral-enteral müasir metodlarından istifadə edilməklə yeni müalicə metodlarının tətbiqində pionerdir. Bu, DVS-sindrom, hemolitik postransfuzion fəsadlar, transplantatların qəbul edilməməsi kimi təhlükəli fəsadlar nəticəsində ağırlaşmaları və ölüm faizini əhəmiyyətli dərəcədə azaltmağa imkan verib.

Ürəyində transplantasiya əməliyyatı aparılmış xəstələrdə (metabolik pozuntularının korreksiyası, transplantatın disfunksiyasının profilaktikası), böyrəyində transplantasiya əməliyyatı aparılmış xəstələrdə (kəskin reperfuzion sindromun profilaktikası), mürəkkəb ürək cərrahiyyə əməliyyatları zamanı (poliorqanik çatışmazlıq sindromunun profilaktikası və erkən terapiyası) plazmaferezin elmi cəhətdən əsaslandırılmasında və kliniki tətbiqində prioritet Ə.Rəhimova və onun əməkdaşlarına aiddir. Ə.Rəhimov tərəfindən yaradılmış elmi məktəb müasir transfuziologiyada – transfuzion immunologiyada perspektivli yeni istiqamət olan hemotransfuziyaların laboratoriya təhlükəsizliyinin təmin olunmasını müvəffəqiyyətlə inkişaf etdirir.

Professor Ə.Rəhimov 390-dan çox elmi işin, 16 monoqrafiyanın, 12 tədris və tədris-metodik vəsaitinin, o cümlədən "Cərrahiyyədə hemaferez" (1999), "Cərrahiyyədə transfuziologiya" (1998), "Cərrahiyyədə DVS-sindromu" (1999), "Cərrahiyyədə qanqoruyucu texnologiyalar" (1999), "Transfuzion immunologiya" (2000), "Transfuzion-infuzion terapiya üzrə rəhbər vəsait" (2003), "Reanematologiyada transfuziologiya" (2005), "Transfuzioloji hemokorreksiya" (2007), "Autodonorluq və autohemotransfuziya" (2010), "Transfuziologiya. Milli rəhbər vəsait" (2012) və s., həmçinin 2 ixtiranın müəllifidir.

Professor Ə.Rəhimov Moskva Hemaferez Cəmiyyətinin, Moskva İmmunologiya Cəmiyyətinin, "Problemı gematoloqii i perelivaniya krovi" və "Vestnik slujbı krovi Rossii" jurnallarının redaksiya heyətinin üzvüdür. Avropa, Asiya və Amerika ölkələrində keçirilən beynəlxalq konqreslərdə dəfələrlə Rusiya transfuziologiyasını və Rusiya Qan Xidmətini təmsil edib.

A.Rəhimov böyük elmi və təşkilati işlə bərabər, həm də fəal pedaqoji iş aparır. O, ölkənin transfuzion təbabətdə əsas tendensiyaları müəyyən edən aparıcı kafedralarından birinin - İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin həkimlərin ali məktəbdənsonrakı peşə təhsili fakültəsinin kliniki transfuziologiya kafedrasının müdiri olaraq, müdavimlərə mühazirələr oxuyur, imtahan komissiyalarının işində, tədris-metodiki tövsiyələr hazırlanmasında iştirak edir. Onun bilavasitə elmi rəhbərliyi altında 12 namizədlik və 5 doktorluq dissertasiyası müdafiə edilib.



## Rəhimov
## Əlizaman Sabir oğlu

*"Günay" İstehsal-Kommersiya Firması MMC-nin baş direktoru*

Rəhimov Əlizaman Sabir oğlu 1958-ci il oktyabrın 22-də Azərbaycan Respublikasının Saatlı rayonunun Saatlı kəndində anadan olub.

1981-ci ildə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunu (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti), 2008-ci ildə Moskva Kommunal Təsərrüfat İnstitutunu bitirib.

Bu gün Ə.Rəhimov – iqtisad elmləri namizədi, fəlsəfə doktoru, Dünya Kompleks Təhlükəsizlik Elmləri Akademiyasının müxbir üzvüdür.

Əmək fəaliyyətinə Azərbaycanın Saatlı rayonunun orta məktəblərindən birində başlayıb. 1984-cü ildə Rusiyaya gəlib və Oqneupornıy zavodunda (Moskva vilayətinin Domodedovo rayonu) işə düzəlib, orada mühəndislikdən sex müdirinə qədər əmək yolu keçib.

1992-ci ildə Ə.Rəhimov "Günay" İstehsal-Kommersiya Firması MMC-ni yaradıb.

Qısa vaxt ərzində Moskva vilayətinin ən müvəffəqiyyətli tikinti şirkətlərindən birinə çevrilmiş "Günay" İstehsal-Kommersiya Firması MMC Domodedovo şəhəri dairəsində ərazilərin kompleks tikintisi üzrə sosialyönümlü bir sıra investisiya kontraktlarını reallaşdırır. Müəssisə Moskva vilayətinin ən etibarlı tikinti şirkətlərinin siyahısına daxildir. "Günay"ın əsas strategiyası – köhnə, qəzalı yaşayış sahələrinin yerində müasir məhəllələr kompleksi tikməkdir.

Ə.Rəhimov uzun illər ərzində həm yaşayış komplekslərinin yaradılması və əhalinin köhnə evlərdən köçürülməsinə dair dövlət proqramının reallaşdırılması ilə məşğul olan inşaatçı kimi, həm də öz vəsaiti hesabına Domodedovo şəhərinin infrastrukturunu yaradan məsuliyyətli vətəndaş kimi böyük nüfuz qazanıb. O, məktəblər, uşaq bağçaları, müxtəlif idman zalları və asudə vaxt mərkəzləri tikir.

Ə.Rəhimov həm də aktiv xeyriyyəçilik fəaliyyəti ilə məşğul olur – Domodedovo mərkəzi şəhər xəstəxanasına, "Boyevoye bratstvo" ictimai təşkilatına, əlillər cəmiyyətinə, ayrı-ayrı veteranlara və əlillərə, həmçinin şəhərin maddi ehtiyac duyan çoxsaylı sakinlərinə yardım göstərir, lokal müharibələrdə və silahlı münaqişələrdə həlak

olmuş döyüşçülərə abidə ucaldılması, məbədlərin – məscidlərin və kilsələrin tikintisi və təmiri üçün vəsait ayırır.

Domodedovo şəhər dairəsi əhalisinin mənzil və sosial-məişət şəraitinin yaxşılaşdırılması ilə bağlı məsələlərin həllinə Ə.Rəhimovun əmək töhfəsi çoxsaylı mükafatlarla qeyd edilib. Ona "Rusiyanın Fəxri İnşaatçısı", "Moskva vilayətinin Əməkdar İnşaatçısı", "Rusiya Federasiyasının Əməkdar İnşaatçısı" kimi yüksək fəxri adlar verilib. O, Moskva vilayəti qubernatorunun "Təşəkkür edirəm", "Faydalı işə görə", "Əməyə və səyə görə" fəxri nişanlarına, Moskva vilayət Dumasının "Əmək rəşadətinə görə" nişanına və Fəxri fərmanına layiq görülüb, İvan Kalita ordeninin medalı ilə, 2011-ci ildə İvan Kalita ordeni və Azərbaycanın "Tərəqqi" medalı ilə təltif olunub.

Rusiya dövlətinin inkişafı və möhkəmləndirilməsi naminə böyük xidmətlərinə və şəxsi töhfəsinə görə o, həmçinin "Qızıl ulduz" ali beynəlxalq ordeni, I dərəcəli Böyük Pyotr ordeni, Dünya Kompleks Təhlükəsizlik Elmləri Akademiyasının I dərəcəli "Rusiyaya xidmətə görə" ordeni, "Boyevoye bratstvo" ictimai təşkilatının "Fəal vətəndaş mövqeyinə və vətənpərvərliyə görə" medalı ilə təltif olunub.

2015-ci ildə Moskvanın və bütün Rusiya Patriarxı Kirilin Fərmanı ilə Rus Pravoslav kilsəsinin III dərəcəli Müqəddəs knyaz Daniil Moskovski ordeninə layiq görülüb.

Ə.Rəhimov Ümumrusiya Azərbaycanlılar Konqresinin Moskva vilayət bölməsinin sədridir.



## Rəhmanov Vaqif Məmməd oğlu

*Tibb elmləri doktoru, professor.*
*Ukrayna Psixoterapevtik Reabilitasiya Mərkəzinin rəhbəri*

Rəhmanov Vaqif Məmməd oğlu 1951-ci ildə Azərbaycan Respublikasının Lerik rayonunda anadan olub.

Orta məktəbi bitirəndən sonra N.Nərimanov adına Azərbaycan Tibb İnstitutuna (indiki Azərbaycan Tibb Universiteti) daxil olub. Təhsil müddətində sanitar, ağır xəstələrə qulluq üzrə kiçik tibb işçisi kimi işləyib.

V.Rəhmanov ali məktəbi bitirəndən dərhal sonra ilk uğurlarını qazanıb. 1975-1979-cu illərdə o, mərkəzi əsəb sisteminin və dayaq-hərəkət aparatının patologiyasından əziyyət çəkən xəstələr üçün "Naftalan" sanatoriyasında çalışıb. Orada müəllimləri V.Q.Bazarov, A.T.Filatov, İ.A.Jukov və B.V.Karvasarskinin məsləhəti ilə təbabət təcrübəsində ilk dəfə mərkəzi əsəb sisteminin ağır patologiyalarından əziyyət çəkən, o cümlədən fiziki və sensor imkanları məhdudlaşmış xəstələrin yeni, dərmansız müalicə üsullarını işləyib hazırlamağa başlayıb və müəllimi İ.A.Jukovun nümunəsində belə xəstələrin müalicəyə qədər istifadə etdikləri, müalicədən sonra isə "Naftalan" sanatoriyasında qoyub getdikləri əşyaların – hərəkət vasitələri (qoltuq ağacları, əsalar), dərmanlar, eşitmə aparatları, eynək və s. muzeyini yaradıb. V.Rəhmanov 27 yaşında ikən Sovet İttifaqında ən məşhur gənc mütəxəssislərdən biri idi. SSRİ-nin bütün guşələrindən, həmçinin xarici ölkələrdən olan xəstələr kömək üçün ona müraciət edir və az qala ona sitayiş edirdilər.

Ancaq zaman keçdikcə bu sanatoriyadakı şərait V.Rəhmanov səviyyəli həkim üçün namünasib oldu. Buna görə İ.İ.Meçnikov adına Dnepropetrovsk Vilayət Klinik Xəstəxanasının baş həkimi V.A.Pavlov onu oraya dəvət edəndə V.Rəhmanov bu dəvətdən istifadə etdi.

1978-ci ildə Dnepropetrovsk vilayətinin rəhbərliyinin və vilayət səhiyyə şöbəsinin təşəbbüsü ilə V.Rəhmanov tibbi təcrübədə ilk dəfə fiziki və sensor imkanları məhdudlaşmış (uşaq beyin iflicindən, eşitmə sinirinin nevritindən əziyyət çəkən) xəstələrə, funksional nasazlıqları (nevroz, nevrasteniya və başqa psixosomatik na-

sazlıqlar) olan xəstələrə dərmansız müalicə-bərpa köməyi göstərilməsi üsullarının işlənib hazırlanması və tətbiqi üzrə kabinet təşkil etdi.

Bərpa tədbirlərində qazanılmış uğurlar nəzərə alınaraq, 1986-cı ildə bu kabinet əsasında vilayət miqyaslı, 1989-cu ildə isə respublika miqyaslı elmi-praktik psixoterapevtik surdonevroloji mərkəz təşkil edildi. 60 çarpayılıq stasionar bölməsi və poliklinikası olan həmin Mərkəzə rəhbərlik V.Rəhmanova həvalə edildi. 2002-ci ildə bu mərkəzin adı dəyişdirilərək Ukrayna Psixoterapevtik Bərpa Mərkəzi adlandırıldı və onun direktoru vəzifəsinə V.Rəhmanov təyin edildi.

V.Rəhmanov xəstələrin psixofiziki bərpasının xüsusi metodlarını yaradıb, imkanları məhdud olan xəstələrin medikomentoz vasitələrdən istifadə edilmədən tamdəyərli tibbi-sosial bərpasının mümkünlüyünü ilk dəfə olaraq elmi cəhətdən əsaslandırıb və təcrübədə tətbiq edib.

Bundan başqa, V.Rəhmanov mərkəzi əsəb sisteminin ağır patologiyasından əziyyət çəkən xəstələrin dərmansız bərpasının yeni üsullarını araşdırıb və işləyib hazırlayıb. Alim təcrübədə tətbiq olunmaq üçün yeni psixoterapevtik və sosioterapevtik metodlar təklif edib, məsələn, qeyri-verbal hipnoterapiya və psixoterapevtik suqqestiyalar üsulu, hipnoterapiya, psixoterapevtik və sosioterapevtik təlqinetmə üsulu, relaksasiya və süni (hipnotik) yuxu vəziyyətində sensor həssaslığın və fiziki fəallığın yaxşılaşdırılması üsulu, imkanları məhdud olan şəxslərə vizual analizatorların və psixofiziki metodların tətbiqi yolu ilə onların sensor həssaslığını aktivləşdirmə üsulu, sosioterapevtik və psixoterapevtik tədbirləri dəstəkləyən metodlar və s. Bütün bu metodlar mərkəzi motoneyronlara, mikromühitə və makromühitə təsiri nəzərə alınmaqla diferensiasiyalı və məqsədyönlü istifadəyə əsaslanır.

V.Rəhmanov dünya təcrübəsində ilk dəfə sübut edib ki, eşitmə sinirinin nevriti çarəsiz xəstəlik deyil və vaxtında müalicə-bərpa tədbirləri görülsə, xəstələrin əsas kontingentini sağaldaraq normal həyata qaytarmaq mümkündür. O, həmçinin, ilk dəfə olaraq, eşitmə funksiyasının ağır pozuntularından əziyyət çəkən xəstələrin xüsusi hipnopsixoterapiya (qeyri-verbal hipnoz) metodlarını işləyib hazırlayıb və təcrübədən keçirib.

O, həmçinin, xəstələrin tibbi və psixi-sosial bərpasının nəticələrinin ilkin proqnozlaşdırmasının riyazi düsturunu hazırlayıb və hesablamanın ümumi düsturunu çıxarıb. Bərpa tədbirlərinin proqnozlaşdırılması üçün onun hazırladığı 7 riyazi düsturun hər birində bu və ya digər amilin (xəstələrin yaşı, xəstəliyin başlanması vaxtı və səbəbi, əvvəl aparılmış müalicə, imkanları məhdud olan xəstələrdə sensor

həssaslığın itirilməsinin dərəcəsi, nevrotik və psixosomatik nasazlıqlardan (nevroz, nevrasteniya) əziyyət çəkən xəstələrin anamnezində psixotravmatik vəziyyətin mövcudluğu) nəzərə alınması sonrakı stasionar müalicə müddətini azaltmağa, bioloji terapiya metodlarının əsassız, həddən artıq tətbiqini istisna etməyə və bərpa müalicəsinin ümumi effektivliyini düzgün qiymətləndirməyə imkan verir.

V.Rəhmanov sübut edib ki, imkanları məhdud olan xəstələrdə sonradan ikincili nevrozlar və somatoform nasazlıqlar inkişaf edir, buna görə də tamdəyərli terapiya və bərpa üçün, həmçinin köməkçi vasitələrin təyinatı üçün əvvəlcə bu nasazlıqları aradan qaldırmaq, sonra isə surdotexniki vasitələrdən (eşitmə aparatları, əlil arabaları, əl ağacları və s.) istifadə olunmasını tövsiyə etmək lazımdır.

Onun çoxillik iş təcrübəsinin nəticələri orqanik və funksional patologiyaların kompensasiyası, onların ailə üzvlərinə təsiri mexanizmlərini anlamaq və bu əsasda, xəstələrin psixoloji, psixoterapevtik və sosioterapevtik korreksiyası, həmçinin ətraf mikromühitdə və makromühitdə olmağın pozulmuş psixososial funksiyasının müalicə metodlarının işlənib hazırlanması üçün əhəmiyyətlidir.

Yeni, dərmansız müalicə metodlarının işlənib hazırlanmasına və onların yüksək effektivliyinə görə 1985-ci ildə V.Rəhmanova Ukrayna Lenin komsomolu mükafatı laureatı adı verilib, 1989-cu ildə o, yeni, dərmansız psixososial müalicə metodlarının hazırlanmasına görə SSRİ XTNS-nin qızıl medalına layiq görülüb, 1991-ci ildə Ukraynanın Əməkdar səmərələşdiricisi adı alıb. V.Rəhmanov 1999-cu ildən Avropa Psixoterapevtlər Assosiasiyasının üzvüdür, 2000-ci ildə isə onun adı Ukraynanın Qızıl kitabına yazılıb.

Mərkəzi sinir sisteminin ağır orqanik patologiyasından əziyyət çəkən xəstələrə yardım göstərilməsi metodlarının işlənib hazırlanmasına, həmçinin bu sahədə elmi əsərlərinə görə 2001-ci ildə Beynəlxalq Kadr Akademiyasının Rəyasət Heyəti doktor V.Rəhmanova "Fəxri professor" adı verib. 2013-cü ildə professor V.Rəhmanova "Ukraynanın Əməkdar Həkimi" fəxri adı verilib.

V.Rəhmanov əsas işi ilə paralel olaraq, mütəxəssisləri öyrədir, tələbələrə dərs deyir. 1995-1996-cı illərdə o, Dnepropetrovsk Dövlət Universitetinin psixologiya kafedrasında professor olub. 1997-ci ildən – Dnepropetrovsk Bədən Tərbiyəsi və İdman İnstitutunun pedaqogika və psixologiya kafedrasının professorudur.

V.Rəhmanov müəlliflik şəhadətnamələri ilə təsdiq edilmiş 3 ixtiranın, 37 səmərələşdirmə təklifinin və 6 ixtira üçün prioritetlik arayışının müəllifidir. V.Rəhmanov xarici ölkələrdəki klinikalarda işləmək üçün dəfələrlə təkliflər alıb, lakin Ukraynada

özünün yaratdığı yeganə müalicə mərkəzini atıb gedə bilməyib. Bu Mərkəzdə işlənib hazırlanmış metodika nevrotik və nevroza bənzər nasazlıqları olan, normal eşidən xəstələr üçün də müvəffəqiyyətlə tətbiq edilir.

V.Rəhmanov "Surdologiyada psixoterapiya", "Sağlamlığın Bərpası Mərkəzi. Birinci psixoterapevtik surdoloji mərkəz", "Eşitmə qüsurları olan uşaqların təlim-tərbiyəsinin tibbi-sosial aspektləri", "Uşaqlar və eşitmə. Təlim-tərbiyənin tibbi-sosial aspektləri" monoqrafiyalarının müəllifidir.

V.Rəhmanov çoxdan qeyd edilmiş bir qanunauyğunluğu təsdiq edir ki, həkimlər yaxşı yazıçı ola bilirlər. 2015-ci ildə onun "Müdrik sözlər, psixoloji və bəzi başqa fikirlər, aforizmlər" adlı kitabının 3-cü - tamamlanmış nəşri çapdan çıxıb. Həmin kitabda, məsələn, belə  bir dərin fikir var: "Əgər təbiət insanın səhlənkarlığına görə onu xəstəliklə cəzalandırırsa, elə həmin təbiət ona sağalma üçün şans verir. Kim öz təbiətindəki gizli imkanları tapmağı və belə şansdan istifadə etməyi bacarsa, sözsüz, sağlam və normal həyata gedən yolda müvəffəqiyyətə nail olacaq".

Həmin ildə onun R.Rəhmanovla həmmüəllif kimi yazılmış "Ailə nevrozu – uşaqlarda və yaşlılarda psixosomatik və vegetativ nasazlıqlar" kitabı da çapdan çıxıb. Bu kitabda yaşlılarda və uşaqlarda nevrozların diaqnostikası və psixofiziologiyası məsələləri, uşağın xəstəliyindən sonra yaranan özünəməxsus psixoloji ab-hava ilə əlaqədar, ailədə münasibətlərin xüsusiyyətləri nəzərdən keçirilir. Maraqlıdır ki, həmin kitab həm bu sahədə praktiki fəaliyyətlə məşğul olan həkimlərə, tibbi profilli ali məktəblərin tələbələrinə, xəstə uşaqların valideynlərinə, həm də bu nəşrdə qaldırılmış mövzu ilə maraqlanan geniş oxucu auditoriyasına ünvanlanıb.

Əlamətdar haldır  ki, V.Rəhmanovun bu və başqa kitablarının satışından əldə edilən vəsait 2015-ci ilin yayında açılmış Uşaq və ailə psixiatriyası, psixoterapiya, psixologiya, tibbi və psixososial bərpa institutunun ərazisinin abadlaşdırılması işlərinin tamamlanmasına sərf edilir. Bu, Ukraynada unikal elmi-tədqiqat institutudur.

V.Rəhmanov Ukrayna televiziyasının bir çox proqramlarının qəhrəmanıdır, onun haqqında bir neçə sənədli film çəkilib. 2015-ci ildə çəkilmiş sonuncu sənədli film belə adlanır: "Zəmanəmizin qəhrəmanı – Vaqif Rəhmanov". Filmdə V.Rəhmanovdan, onun müalicə metodikalarından və onun pasiyentlərinin necə şəfa tapmasından bəhs edilir.



**Rəhmanova**
**Aza Həsən qızı**
*(1932-2015)*
*Tibb elmləri doktoru, professor.*
*Sankt-Peterburq Səhiyyə Komitəsinin*
*sabiq baş infeksionisti*

Rəhmanova Aza Həsən qızı 1932-ci il sentyabrın 17-də Bakıda anadan olub.

Onun atası və əmisi Azərbaycanda yüksək vəzifələr tuturdu. 1937-ci ildə atası repressiyaya məruz qalaraq həbs edilib və həbsxanada ölüb, əmisi isə "xalq düşməni" elan edilərək güllələnib. 1941-ci ildə Rəhmanovlar ailəsi Altay diyarındakı Sintaş mədəninə sürgün edilib. A.Rəhmanova orta məktəbi Semipalatinskdə bitirib.

1955-ci ildə 1-ci Leninqrad Tibb İnstitutunu fərqlənmə diplomu ilə bitirib, 1955-1957-ci illərdə həmin ali məktəbin yoluxucu xəstəliklər kafedrasının kliniki ordinatoru olub, eyni vaxtda N.F.Filatov adına uşaq xəstəxanasının və S.P.Botkin adına kliniki infeksion xəstəxananın bazalarında işləyib.

A.Rəhmanova kliniki ordinaturadan sonra Qazaxıstanda və Azərbaycanda difterit epidemiyasına, Sibir xorası, qarın yatalağı, brusellyoz, ağır formada dizenteriya xəstəliklərinə qarşı mübarizə aparmalı olub. Həkim-praktik kimi çox qiymətli təcrübə toplayandan sonra doğma instituta qayıdıb və uzun illər ərzində orada dərs deyib.

1973-cü ildə A.Rəhmanova namizədlik dissertasiyası müdafiə edib. Elə həmin ildə SSRİ-də ilk dəfə infeksion xəstəxanada intensiv terapiya şöbəsini, 1976-cı ildə isə xroniki hepatitdən əziyyət çəkən xəstələrin mərhələli müalicəsi sistemini təşkil edib. 40 yaşında ikən Leninqradın baş infeksionisti vəzifəsinə təyin edilib.

1984-cü ildə "Virus hepatiti zamanı qaraciyər koması" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

1987-ci ildə A.Rəhmanovanın təşəbbüsü ilə S.P.Botkin adına infeksion xəstəxananın nəzdində QİÇS kliniki mərkəzi, bir il sonra isə indiki Sankt-Peterburq Diplomdansonrakı Tibbi Təhsil Akademiyasının yoluxucu xəstəliklər kafedrasının nəzdində QİÇS-in laboratoriya diaqnostikası kursu açılıb. 1987-ci ildən Leninqradın və regionun QİÇS və virus hepatitləri problemləri ilə məşğul olan bütün müəssisələrini birləşdirən "QİÇS və QİÇS-indikator xəstəlikləri" elmi-praktik birliyinin rəhbəri olub.

1988-ci ildə A.Rəhmanova Həkimləri Təkmilləşdirmə İnstitutunda kafedraya rəhbərlik edib, qısa müddətə həmin kafedranın fəaliyyətinin bütün istiqamətlərini yenidən təşkil edib, onu Rusiyada İHV/QİÇS və başqa yoluxucu xəstəliklər üzrə kadrlar hazırlanması

üzrə aparıcı təşkilata çevirib. Elə həmin ildə RF Səhiyyə Nazirliyinin əmrinə əsasən, Leninqradın QİÇS problemləri ilə məşğul olan bütün müalicə, sanitar-epidemiologiya və elmi-tədqiqat müəssisələrini birləşdirən "QİÇS və QİÇS-indikator xəstəlikləri" elmi-praktik birliyi (EPB) yaradıldı və bu, QİÇS-in laboratoriya şəraitində diaqnostikası kursunu açmağa imkan verdi. 1989-cu ildə A.Rəhmanovanın xahişi və rektor, professor Simbirtsevin təşəbbüsü ilə kafedranın adı dəyişdirilərək QİÇS-in laboratoriya şəraitində diaqnostikası kursu olan infeksion xəstəliklər kafedrası adlandırıldı.

A.Rəhmanova öz sələfləri N.K.Rozenberqin və P.İ.Strelovun ənənələrini davam etdirərək, yeni elmi istiqamətə – ən geniş yayılmış ləng infeksiyaların və ciddi epidemioloji xəstəliklərin inkişaf amillərinin öyrənilməsi və yeni təşkilati strukturlar (çoxprofilli infeksion stasionarlar) şəraitində, reanimasiyalarda və poliklinikaların infeksion-parazit xəstəliklər və immunoprofilaktika şöbələrində etipatogenetik və intensiv terapiya üsullarının təkmilləşdirilməsi işlərinə rəhbərlik edirdi.

Son illərdə İHV/QİÇS epidemiyasına qarşı mübarizə A.Rəhmanova üçün ən mühüm problem idi. A.Rəhmanova qubernatorun QİÇS problemi üzrə məsləhətçisi idi. 1998-1999-cu illərdə o, Kanada-Rusiya layihəsinin supervayzeri idi, bu layihə Diplomdansonrakı Tibbi Təhsil Akademiyasını daha da məşhurlaşdırıb.

2000-2003-cü illərdə "Bristol-Myers Sguibb", "Pliva" və "Tibotes" firmaları ilə birgə kliniki tədqiqatlar aparıb. 2004-2007-ci illərdə "Sankt-Peterburqda və Leninqrad vilayətində perinatal HİV-infeksiyasının profilaktikası" layihəsində iştirak edib.

2006-cı ildə Diplomdansonrakı Tibbi Təhsil Akademiyasının bazasında, indi artıq USAID və Amerika Beynəlxalq Səhiyyə İttifaqının dəstəyi ilə, HİV-infeksiya problemləri üzrə hazırlıq və təhsil Mərkəzi açılmışdı.

A.Rəhmanova elmi araşdırmalarla yanaşı, həm də QİÇS-dən və virus hepatitlərindən əziyyət çəkən xəstələrə köməyin təşkili ilə də məşğul olur, onların müalicəsi üçün pul axtarır və əlbəttə, özü onları müalicə edirdi.

A.Rəhmanova "SPİD. Seks. Zdorovye" jurnalının təsisçisi və baş redaktoru, Şimal-Qərb Federal dairəsində Prezidentin səlahiyyətli nümayəndəsi yanında Narkotiklər əleyhinə İdarələrarası Komissiyanın üzvü, "Dünya həkimləri nüvə təhlükəsinə qarşı" Cəmiyyətinin üzvü, Beynəlxalq İnsan Haqları Komissiyanın İcraiyyə Komitəsinin üzvü idi. 10-dan çox beynəlxalq konfransda və konqresdə iştirak edib.

Professor A.Rəhmanova – 11 kitabın, tibb bacıları üçün məlumat kitabçasının, 50-yə yaxın metodik vəsaitin və çoxsaylı jurnal məqalələrinin müəllifi, 7 dərsliyin həmmüəllifidir. Onun rəhbərliyi altında 14 doktorluq və 50-dən çox namizədlik dissertasiyası hazırlanıb.

A.Rəhmanova 2015-ci ildə vəfat edib.



## Rüstəmov Eldar Ənvər oğlu

*Biologiya elmləri doktoru, professor. Türkmənistan Təbiəti Mühafizə Nazirliyinin Ramsar ekosisteminin mühafizəsi və davamlı istifadəsi üzrə ekspert*

Rüstəmov Eldar Ənvər oğlu 1952-ci il aprelin 16-da Aşqabadda anadan olub. Atası Rüstəmov Ənvər Göyüş oğlu (1917-2005) biologiya elmləri doktoru, professor, Türkmənistan Elmlər Akademiyasının akademiki olub və oğlu atasının işini layiqincə davam etdirir.

1974-cü ildə E.Rüstəmov Türkmənistan Dövlət Universitetini əla qiymətlərlə bitirib, 1974-1976-cı illərdə həmin universitetin zoologiya kafedrasında baş laborant işləyib. 1976-1979-cu illərdə M.V.Lomonosov adına MDU-nun coğrafiya fakültəsinin biocoğrafiya kafedrasının aspiranturasında təhsil alıb. 1980-ci ildə namizədlik dissertasiyasının müdafiəsindən sonra Türkmənistan Dövlət Universitetinin zoologiya kafedrasında assistent vəzifəsində, 1985-ci ildən isə baş müəllim və dosent işləyib.

1988-1991-ci illərdə M.V.Lomonosov adına MDU-nun biologiya fakültəsinin onurğalılar zoologiyası və ümumi ekologiya kafedrasında "ekologiya" ixtisası üzrə əyani doktoranturada təhsil alıb. 1992-ci ildə həmin universitetdə biologiya elmləri doktoru elmi dərəcəsini almaq üçün dissertasiya müdafiə edib. Hər iki dissertasiya şəxsən müəllif tərəfindən 15 il ərzində Qaraqum, Üstyurd və Qobi səhralarında aparılmış böyükhəcmli ekspedisiya işlərinin əsasında hazırlanıb. 1994-cü ildə E.Rüstəmova professor adı verilib. Onun həyatının mühüm dövrü ali məktəblərdə pedaqoji fəaliyyəti ilə bağlıdır. Məsələn, Türkmənistan Dövlət Universitetinin biologiya və coğrafiya fakültələrində Türkmənistanda ekologiya və təbiətin mühafizəsi, zoocoğrafiya, heyvanların ekologiyası, herpetologiya, ornitologiya, fauna üzrə kurslar təşkil edib və mühazirələr oxuyub.

1995-1997-ci illərdə E.Rüstəmov Türkmənistan EA-nın Zoologiya İnstitutunun aparıcı elmi işçisi kimi iki layihə - "Mərkəzi Asiya regionu ölkələrinin biomüxtəlifliyi və quşların mühafizəsi" və "Aral Sea Project – UNESCO" layihələri üzrə iş həyata keçirib. 1997-ci ildə institut bağlanandan sonra E.Rüstəmov beynəlxalq təbiəti mühafizə təşkilatları ilə əməkdaşlığa başlayıb: 1997-ci ildən Şimali Avrasiya ölkə-

lərinin iki beynəlxalq İşçi Qrupunun – qazkimilər (QİQ) və durnalar (DİQ) qruplarının üzvü olur və orada işləyir, 1997-2005-ci illərdə Niderland Kənd Təsərrüfatı Nazirliyinin köməyilə "PIN/KNIP Wetland International" Proqramı üzrə su-bataqlıq quşları resurslarının qiymətləndirilməsini aparıb, 2006-cı ildə "Wetland International" Moskva nümayəndəliyinin vasitəçiliyi ilə Mərkəzi Asiya ölkələrində, 2007-2010-cu illərdə isə Türkmənistanda UNDP/GEF-in "Xəzər layihəsi" çərçivəsində bu quşların siyahıya alınmasını keçirib.

E.Rüstəmov 2004-2010-cu illərdə IBA/CA Proqramı və Böyük Britaniyanın Quşların Mühafizəsi Kral Cəmiyyəti ilə Türkmənistan Təbiəti Mühafizə Nazirliyi arasında sazişlər çərçivəsində "Türkmənistanın mühüm ornitoloji əraziləri" layihəsinə rəhbərlik edib. 2012-2013-cü illərdə Türkmənistanda UNDP/GEF layihəsi üzrə "Sumbar" ilk Milli Təbii Parkın yaradılması üçün təkliflərin, 2014-cü ildən isə "Badxız" və "Köytendağ" təbii ərazilərinin UNESCO-nun Dünya Təbii İrsi şəbəkəsinə təqdim edilməsi üçün nominasiya dosyesinin hazırlanması ilə məşğul olub.

Bundan başqa, E.Rüstəmov Ümumdünya Elmi-Tədqiqat Təbiəti Mühafizə İnstitutunda (1996-1998, 2001-2008) heyvanlar və bitkilər aləminin kadastrı laboratoriyasında (əvəzçilik üzrə) Rusiya Təbiət Elmləri Akademiyasının (2009-2012) Biomüxtəlifliyin Mühafizəsi Elmi Mərkəzində aparıcı elmi işçi işləyib.

E.Rüstəmov 2009-cu ildən Türkmənistan Elmlər Akademiyasının Rəyasət Heyəti və Türkmənistan Səhra, Bitki və Heyvanlar Aləmi İnstitutunun yanında elmlər namizədi və elmlər doktoru elmi dərəcələrinin ("zoologiya" və "ekologiya" ixtisasları) verilməsi üzrə iki elmi şuranın üzvüdür. 2014-cü ildən onun redaktəsi ilə bir sıra elmi toplular buraxılıb. O, həmçinin Rusiya Elmlər Akademiyasının "Aridnıye ekosistemı" jurnalının redaksiya heyətinin üzvüdür.

E.Rüstəmov 4 namizədlik dissertasiyasının elmi rəhbəridir.

Alimin elmi-praktik maraqları zoocoğrafiya, ekologiya və quruda yaşayan onurğalılar faunasının, əsasən quşların mühafizəsi sahəsidir.

E.Rüstəmov tərəfindən Mərkəzi Asiyanın arid regionları üçün ekoloji strukturların oxşar və fərqliliyinin və orada yaşayan quşların kartoqrafik interpretasiyasının dəyərləndirilməsi üzrə konsepsiya hazırlanıb. Son illər alim əsas diqqətini Türkmənistanda arid və su-bataqlıq ekosistemlərinin və xüsusi mühafizə olunan təbiət ərazilərinin monitorinqinin və idarə edilməsinin optimal sistemlərinin yaradılması həllərinin axtarışına və praktik tətbiqinə ayırır.

E.Rüstəmov tərəfindən 200-dən çox elmi iş, o cümlədən 4 monoqrafiya nəşr edilib. Türkmənistanda ilk Ramsar ərazisinin təşkili üçün onun hazırladığı nominasiya

paketi təbiəti mühafizə praktikasına böyük töhfə hesab olunur. E.Rüstəmov Türkmənistanın ətraf mühit üzrə BMT Proqramları və Konvensiyalarından irəli gələn öhdəliklərinin yerinə yetirilməsinin təmin edilməsi üzrə Dövlət Komissiyası yanında Ramsar Konvensiyası üzrə İşçi Qrupunun üzvüdür.

E.Rüstəmov Türkmənistanı ekologiya və təbiətin mühafizəsi sahəsində alimlərin və praktiklərin beynəlxalq görüşlərində - seminarlarda, simpoziumlarda, konfranslarda və konqreslərdə dəfələrlə (30-dan çox ölkə) təmsil edib və bu gün də təmsil edir. O, bu tədbirlərdə elmi fəaliyyətinin nəticələrini məruzə edib və rəhbərlik etdiyi qrup və kollektivlərin işlərini təqdim edib.

E.Rüstəmov 2007-ci ildə Rusiya Təbiət Elmləri Akademiyasının müxbir üzvü, 2012-ci ildə akademiki seçilib. İctimai xadim kimi 1969-cu ildən Türkmənistan Təbiəti Mühafizə Cəmiyyətinin üzvüdür. 1982-ci ildən Menzbir Ornitoloji Cəmiyyətinin, 2005-ci ildən Azərbaycan Ornitoloji Cəmiyyətinin üzvüdür. 2001-ci ildən "Turkmenoxotrıbolovsoyuz"la əməkdaşlıq edir, 2014-cü ildən bu ictimai təşkilatın Mərkəzi Şurasının üzvüdür. 2006-cı və 2011-ci illərdə Dünya Azərbaycanlıları qurultaylarına nümayəndə seçilib və Bakı Humanitar forumlarının (2012, 2013) iştirakçısı olub.



## Rüstəmov
## Mahir Rüstəm oğlu
*"Holdinq OMEQA" MMC-nin baş direktoru*

Rüstəmov Mahir Rüstəm oğlu 1958-ci il sentyabrın 26-da Azərbaycan Respublikasının Cəlilabad rayonunun Ağdaş kəndində anadan olub.

Orduda xidmətini başa vurandan sonra Belorusiya Kənd Təsərrüfatı Akademiyasına daxil olub. 1984-cü ildə Akademiyanı bitirəndən sonra təyinatla "Soyuztomskmeliorasiya" İstehsalat Birliyinə işləməyə göndərilib.

1984-1987-ci illərdə Tomsk vilayətinin Pervomayski rayonunda baş iş icraçısı vəzifəsində işləyib, sonra Zıryanski rayonundakı 4 №-li səyyar mexanikləşdirilmiş dəstənin (SMD-4) baş mühəndisi vəzifəsinə keçirilib.

1988-ci ildə kollektiv M.Rüstəmovu səyyar mexanikləşdirilmiş dəstənin (SMD) rəisi, 1996-cı ildə isə SMD-4-ün və "PMK "Zıryanski" SC-nin bazasında yaradılmış "PMK "Zıryanski" QSC-nin baş direktoru vəzifəsinə seçib.

Zıryanski SMD-4 (səyyar mexanikləşdirilmiş dəstə) hələ müharibədən əvvəlki illərdə yaradılmış Çerdatskaya maşın-meliorasiya stansiyasının əsasında təşkil edilmişdi. SMD-nin mövcud olduğu 30 il ərzində bu təşkilata altı rəhbər başçılıq edib. 80-ci illərin sonlarında SSRİ Meliorasiya Nazirliyi ləğv ediləndə çoxları düşünürdü ki, bu müəssisə məhv olacaq. Ancaq M.Rüstəmovun rəhbərliyi altında SMD nəinki çətinliklərə davam gətirdi, hətta işin bir sıra yeni istiqamətlərini mənimsəyərək, inkişafın yeni mərhələsinə yüksəldi, həm vilayətdə, həm də regionda ən böyük və tanınmış təşkilatlardan birinə çevrildi.

O vaxtdan SMD abreviaturunu "proizvodstvennıy mnoqootraslevoy kompleks" kimi açıqlamağa başladılar. 1988-2007-ci illərdə "PMK "Zıryanski" QSC-nin əsas fəaliyyət növləri tikinti (Kemerovo və Tomsk vilayətlərində yolların çoxu M.Rüstəmovun rəhbərliyi altında çəkilib) və "OMEQA" mineral suyunun və onun əsasında içkilərin istehsalı ilə bağlı olub.

"PMK "Zıryanski" QSC-nin Zıryanski, Tequldetski, Pervomayski rayonlarında və Tomskda bir neçə bölməsi var. Müxtəlif vaxtlarda bu kompleksin tərkibində donuzçuluq ferması, süd-əmtəə ferması, vilayətin hüdudlarından uzaqda da məşhur olan "OMEQA"

mineral suyunun qablaşdırılması üzrə iki sex, "Severtrans" MMC (nəqliyyat xidmətləri), iki kafe, çörəkxana, kolbasa sexi, süd məhsullarının emalı üzrə mini-zavod, tikiş sexi, qaz ferması, "Belovodovskiy" kolxozu fəaliyyət göstərib. Bundan başqa, M.Rüstəmovun başçılığı ilə bu PMK bitkiçilik, qoyunçuluq, arıçılıq və ticarətlə də məşğul olub (Tomskdakı "Omeqa" ticarət evi). Üstəlik, "PMK "Zıryanski" QSC və şəxsən M.Rüstəmov "Mass-media" MMC formasında qəzet redaksiyasının həmtəsisçiləridir.

Lakin M.Rüstəmovun sahibkarlıq fəaliyyətinin əsası "Omeqa" mineral suyunun istehsalı olub və bu gün də belədir. Bu suyu haqlı olaraq Tomskun və vilayətin vizit kartı hesab etmək olar. "Omeqa" mineral suyu çıxarılan quyunun dərinliyi 3001 metrdir. Quyu 1956-cı ildən işləyir (o, neft axtaran geoloqlar tərəfindən qazılmışdı). Ancaq 90-cı illərin əvvəlinə qədər bu qiymətli su sadəcə torpağa axıdılardı. M.Rüstəmov mineral suyun istehsalına sıfırdan başladı. İndi o, ən müasir texnologiyalara əsaslanan böyük bir müəssisəyə rəhbərlik edir. "PMK "Zıryanski" QSC Tomsk elmini də dəstəkləyir, təşkilatın mütəxəssisləri Tomsk Politexnik Universitetinin, Tomsk Elmi-Tədqiqat Kurortologiya və Fizioterapiya İnstitutunun alimləri ilə birgə işləyirlər. M.Rüstəmovun başçılıq etdiyi istehsalat əsasında alimlər elmi işlər yazır, məruzələrlə çıxış edirlər, o cümlədən başqa ölkələrdə.

İndi "PMK "Zıryanski" QSC, "Torqovıy dom "Omeqa" MMC, "REM-qrupp" QSC (tikinti və metal konstruksiyaların istehsalı) və "Energetik" Mədəniyyət Sarayı (mədəniyyət müəssisəsi) M.Rüstəmovun baş direktor olduğu "Xoldinq OMEQA" MMC-yə daxil olub.

M.Rüstəmov xeyriyyə fəaliyyətinə və sosial proqramlara daim böyük diqqət yetirir. Holdinqin işçilərinin və onların uşaqlarının müayinəsi, müalicəsi və istirahəti üçün müəssisə ilə Sibir Dövlət Tibb Universiteti və Altaydakı "Belokurixa" kurortu arasında müqavilələr bağlanıb. Yeni uşaq doğulan ailələrin dəstəklənməsi üçün xüsusi sistem mövcuddur. Tomsk ali məktəblərində və texnikumlarda təhsil alan onlarca tələbə bu müəssisədən təqaüd alır. Bu tələbələr əsasən, holdinqin rayon filiallarının əməkdaşlarının övladlarıdır. M.Rüstəmov hər il keçirilən "İlin şagirdi" müsabiqəsinə sponsorluq edir. Müsabiqənin nəticələrinə əsasən mükafatçılar holdinqdən təqaüd alır, bu isə uşaqların müvəffəqiyyət göstəricisini əhəmiyyətli dərəcədə artırır. M.Rüstəmov təhsil müəssisələrində müsabiqələr və konfranslar keçirilməsində sponsor köməyi göstərir.

2006-cı ildə M.Rüstəmov Azərbaycanın Cəlilabad rayonunun Ağdaş kəndində, vaxtilə özünün oxuduğu məktəbin 100 illiyi şərəfinə həmin məktəbin binasını yenidən tikdirib və təhsil müəssisəsində kompyuter sinfi yaradıb.

M.Rüstəmov veteranları da unutmur. Müəssisənin veteranlarına holdinqdən əlavə pensiya ödənilir. M.Rüstəmov rayonların və ya şəhərin rəhbərliyi tərəfindən yaşlı insanlar üçün keçirilən bayramların maliyyələşdirilməsində daim iştirak edir. O, şəhərin bir neçə veteranını hamiliyə götürüb.

M.Rüstəmov uşaq koloniyalarına maddi yardım göstərir. Şirkət "Tomsk sakinləri – Çeçenistan Respublikasında döyüşən həmyerlilərə" adlı xeyriyyə aksiyalarında iştirak edir, Şimali Qafqaz regionunda axtarış-xilasetmə dəstəsini mineral su ilə təchiz edir.

Bundan başqa, o, Tomsk məbədlərinə – kilsələrə və məscidlərə kömək edir. Tomsk məscidinin girişində, üzərində xeyriyyəçilərin siyahısı olan lövhədə M.Rüstəmovun da adı var. Tomskun daha da abadlaşdırılmasına onun öz sakinlərini cəlb etmək məqsədilə hər il "Şəhərimizi birlikdə dəyişdirək" şüarı altında ümumşəhər müsabiqəsi keçirilməsi də M.Rüstəmovun ideyasıdır.

2004-cü ildə M.Rüstəmov şəxsi vəsaiti hesabına Tomskun Lenin rayonunun "Severnaya storona" adlı pulsuz qəzetinin buraxılmasını təşkil edib, "Selena" adlı regional qeyri-kommersiya xeyriyyə fondu yaradılması təşəbbüsünü irəli sürüb və həmin fondun sədri olub.

"Rusiya Federasiyasının yanacaq-energetika kompleksinin inkişafında xidmətlərinə görə" M.Rüstəmova Rusiya Federasiyasının Yanacaq və Energetika Nazirliyinin Fəxri Fərmanı təqdim olunub. Dəfələrlə Tomsk vilayət administrasiyasının, Tomsk şəhərinin, Tomsk vilayəti Dövlət Dumasının və Tomsk şəhər Dumasının fəxri fərmanları və təşəkkürnamələri ilə təltif edilib.

2006-cı ilin iyununda M.Rüstəmov "Slava natsii" ordeninə layiq görülüb. Bu orden "Yüzilliyin mesenatları" Beynəlxalq Xeyriyyəçilik Fondunun təltifləri çərçivəsində "Dünyanın xeyirxah insanları" Beynəlxalq Forumunun mükafatlarına aiddir. Fondun İcraiyyə Komitəsi bu ordenlə həm Rusiya iqtisadiyyatının inkişafına, həm də sosial-iqtisadi proqramların reallaşdırılmasına yönəldilmiş fəaliyyətə töhfə verən, xeyriyyəçilik fəaliyyəti və mesenatlıqla məşğul olan insanları təltif edir.

M.Rüstəmov bir neçə dəfə deputat seçilib. 1997-2001-ci illərdə – II çağırış Tomsk vilayəti Dövlət Dumasının, 2005-2010-cu illərdə – IV çağırış Tomsk şəhər Dumasının, 2010-2015-ci illərdə – V çağırış Tomsk şəhər Dumasının deputatı olub.



## Rzayev
## Cəlal Əhməd oğlu

*Murmansk Dövlət Pedaqoji Universitetinin fəlsəfə və sosiologiya kafedrasının professoru*

Rzayev Cəlal Əhməd oğlu 1927-ci il fevralın 23-də Bakıda anadan olub.

Onun atası 1937-ci ildə “xalq düşməni” kimi güllələnib, bir il sonra isə anası “xalq düşməninin arvadı” kimi həbs düşərgəsinə sürgün edilib (1953-cü ildə hər ikisinə tam bəraət verilib). Bununla əlaqədar, C.Rzayevin xalası onu, qardaşını və bacısını Moskvaya aparıb. 1952-ci ildə C.Rzayev Moskvada orta məktəbi bitirib, Moris Torez adına Birinci Moskva Dövlət Pedaqoji Xarici Dillər İnstitutunun ingilis dili fakültəsinə daxil olub. Ali məktəbi bitirəndən sonra 1959-cu ilədək Qırğızıstan məktəblərində ingilis dili müəllimi işləyib. 1959-1962-ci illərdə Frunze (indiki Bişkek) şəhərində Qırğızıstan Dövlət Universitetinin fəlsəfə kafedrası nəzdində aspiranturada oxuyub.

1962-1969-cu illərdə həmin universitetdə fəlsəfə müəllimi kimi – əvvəlcə assistent, sonra baş müəllim, 1965-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetində SSRİ-də milli münasibətlərin inkişafı mövzusuna həsr edilmiş namizədlik dissertasiyası müdafiə edəndən, ona elmlər namizədi alimlik dərəcəsi və dosent elmi adı veriləndən sonra isə dosent vəzifəsində çalışıb.

1969-cu ildə C.Rzayev müsabiqə üzrə RSFSR-ə, Murmansk Ali Dəniz Mühəndisliyi Məktəbinə keçib, 1973-cü ilə qədər orada həmin vəzifədə fəlsəfə dərsi deyib, sonra vəzifəsi saxlanılmaqla Murmansk Dövlət Pedaqoji İnstitutunun marksizm-leninizm kafedrasına (indiki fəlsəfə və sosiologiya kafedrası) köçürülüb, 1974-1981-ci illərdə həmin kafedranın müdiri olub. Artıq 42 ildir ki, C.Rzayev bu kafedrada (1998-ci ildən – professor vəzifəsində) işləyir.

80-ci illərin ortalarında C.Rzayev işlədiyi institutda aspirantura açılmasının təşəbbüskarı və təşkilatçısı kimi çıxış edib, iyirmi il ərzində aspirantların və alimlik dərəcəsinə iddiaçıların fəlsəfə üzrə namizədlik imtahanına hazırlanmasında fəal iştirak edib, müvafiq metodik vəsait hazırlayıb və nəsr etdirib. Göstərilən müddətdə fəlsəfə üzrə namizədlik minimumu vermiş onlarca aspirant və tədqiqatçı öz karyerasını müvəffəqiyyətlə davam etdirib və böyük elm aləminə inamla daxil olublar.

C.Rzayev fəlsəfə üzrə 50-dən çox nəşrin, o cümlədən 3 monoqrafiyanın müəllifidir. Onun elmi-tədqiqat yaradıcılığını iki mərhələyə bölmək olar. "Yenidənqurma" dövründən əvvəlki, birinci mərhələdə C.Rzayevin tədqiqatlarının əsas istiqaməti SSRİ-də milli münasibətlərin təkmilləşdirilməsi metodologiyasının işlənib hazırlanması və müvafiq ingilisdilli materialların öyrənilməsi əsasında bu məsələ üzrə xarici sovetoloji konsepsiyaların tənqidi təhlili idi. Onun "Sovet Şərqi respublikalarında milli münasibətlərin inkişafı" monoqrafiyası (1968, Frunze) və "Milli məsələdə antisovetizmin tənqidi beynəlmiləl tərbiyə amili kimi" əsəri bu tipli tədqiqatlara aiddir.

90-cı illərin əvvəlində C.Rzayev çoxmillətli sovet xalqının bütöv bir sosial birlik olması mövzusuna həsr edilmiş doktorluq dissertasiyası yazır. Dissertasiya Belorusiya Dövlət Universitetində (indiki Belarus Dövlət Universiteti, Minsk) müdafiəyə qəbul edildi, lakin müdafiəni "daha yaxşı vaxtlara qədər" təxirə salmağı məsləhət gördülər, çünki həmin dövrdə Sovet İttifaqının tezliklə dağılacağından xəbər verən siyasi tendensiya açıq-aydın özünü göstərirdi.

Bundan sonra C.Rzayevin yaradıcılığında ikinci mərhələ başlandı. Həmin mərhələnin əsas fərqləndirici xüsusiyyəti qeyri-ənənəvi elmi-fəlsəfi problemlərin işlənib hazırlanmasıdır. Bu tipli problemlərə, o cümlədən aşağıdakılar aiddir: elmin və kvazi-elmin nisbətinə yeni baxış, onların qırılmaz vəhdəti ideyasının və tərəqqi yolunda elmin güclü hərəkətverici qüvvəsi kimi kvazi-elmin pozitiv əhəmiyyətinin əsaslandırılması, məntiqin və intuisiyanın qırılmaz əlaqəsi və idrak prosesində onların qarşılıqlı təsirinin harmonikləşməsi metodları, intuitiv fəhm qabiliyyətinin müsbət rolu, mənəviyyat səviyyəsinin davamlı artımına və maddiliklə onun üzvi kompleksinin yaradılmasına yönəlmiş müasir mənəvi inqilabın danılmaz əhəmiyyəti, müasir şəraitdə aktual olan, çox cəhətdən Yunqun kollektiv qeyri-şüurilik nəzəriyyəsinə əsaslanan, bütöv, kosmik düşüncə metodologiyasının inkişafına və möhkəmlənməsinə imkan yaradan transpersonal (şəxsiyyətin fövqündə dayanan) psixologiyanın proqressiv əhəmiyyəti, dünyaya və insana elmin, dinin və fəlsəfənin qırılmaz vəhdəti mövqeyindən (XIX əsr rus filosofu V.Solovyovun müvafiq proqressiv konsepsiyasından istifadə edilməklə) bütöv baxış.

C.Rzayev belə istiqamətlərin məcmusunun inkişafı əsasında varlığın substansional bütövlüyü və dünyanın dərk edilməsinin substansional bütövlüyü (bu halda substansiya, bütün varlığın mahiyyəti dedikdə Ümumdünya Şüuru nəzərdə tutulur) konsepsiyasının işlənib hazırlamasına mühüm töhfə verib. Bu isə müasir həyatın diktə etdiyi kosmik təfəkkürün inkişafı məqsədinə tam uyğundur.

Bu mərhələdə C.Rzayevin elmi işləri arasında “Dünyanın yeni mənzərəsinin astanasında”, “Transpersonal psixologiya – təcavüzkarlıq və terrorizm sindromuna qarşı. Sülhpərvərliyə aparan yol”, “Həyatın xolosofiyası: psixoloji-fəlsəfi esse”, “Elm və kvazi-elm”, “Tibet kosmizmi” əsərləri xüsusi yer tutur.

C.Rzayev Beynəlxalq Rerix Cəmiyyətinin və Rusiya Fəlsəfə Cəmiyyətinin Murmansk filiallarının üzvüdür.

C.Rzayevin fəlsəfənin aktual məsələlərinin təhlilinə həsr edilmiş yaradıcılıq fəaliyyəti iki ensiklopedik nəşrdə əksini tapıb: “Murmansk vilayətinin pedaqoji ensiklopediyası. XX əsr. Tarix simalarda” (Murmansk, 2001) və “Rusiyanın uğurlu insanlarının bioqrafik ensiklopediyası. Who Is Who v Rossii” (təsisçi və məsul redaktor – Ralph Hubner, İsveçrə, 2009).

C.Rzayev öz pedaqoji fəaliyyəti ilə əlaqədar, xarici universitetlərdə – Hindistanda, Norveçdə və ABŞ-da sosial-fəlsəfi mövzularda ingilis dilində mühazirələr oxuyub.

C.Rzayev “Yüksək peşəkar pedaqoji məharətə görə” Murmansk Dövlət Pedaqoji Universitetinin rektorunun və Murmansk vilayətinin qubernatorunun fəxri fərmanları ilə təltif olunub, ona həmçinin, “Əmək veteranı” adı və “Rusiya Federasiyasının Fəxri ali peşə təhsili işçisi” titulu verilib.



## Sadıxov
## Qulam Sadıx oğlu

*Texnika elmləri doktoru, professor. N.E.Bauman adına Moskva Dövlət Texniki Universitetinin baş elmi işçisi. REA-nın A.A.Dorodnitsın adına Hesablama Mərkəzinin aparıcı elmi işçisi*

Sadıxov Qulam Sadıx oğlu 1940-cı il iyulun 16-da Bakıda anadan olub.

1962-ci ildə V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunu (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti) əla qiymətlərlə bitirib. 1962-1963-cü illərdə Azərbaycan Elmlər Akademiyasının (indiki Azərbaycan Milli Elmlər Akademiyası) Mexanika və Riyaziyyat İnstitutunda kiçik elmi işçi işləyib. 1963-1965-ci illərdə SSRİ EA-nın V.A.Steklov adına Riyaziyyat İnstitutunda staj keçib. 1965-1968-ci illərdə SSRİ EA-nın V.A.Steklov adına Riyaziyyat İnstitutunun əyani aspiranturasında oxuyub, 1968-ci ildə fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsini almaq üçün vaxtından əvvəl dissertasiya müdafiə edib. Müdafiədən sonra elektron texnikası ETİ yanında Moskva Energetika İnstitutunun ali texniki təhsil müəssisəsi-zavoduna işləməyə göndərilib.

1972-1991-ci illərdə radioelektron texnikasının sahə institutlarında şöbə və etibarlılıq laboratoriyalarına rəhbərlik edib. 1989-cu ildə texnika elmləri doktoru elmi dərəcəsini almaq üçün dissertasiya müdafiə edib. 1991-ci ildə ona professor elmi adı verilib. Q.Sadıxov 1995-ci ildən RF Keyfiyyət Problemləri Akademiyasının həqiqi üzvüdür.

1991-ci ildən N.E.Bauman adına MDTU-da raket-kosmos texnikası fakültəsində professor, 2008-ci ildən indiyədək isə baş elmi işçi vəzifəsində çalışır. REA-nın A.A.Dorodnitsın adına Hesablama Mərkəzinin aparıcı elmi işçisidir.

Q.Sadıxovun qiymətləndirmə və qalıq ehtiyatına nəzarət sahəsində elmi nəticələri fundamental elmə mühüm töhfə verib və texniki obyektlərin ehtiyatlarının istifadə müddətinin uzadılması məsələlərində geniş mühəndis tətbiqini tapıb. Onun tərəfindən müəyyən edilmiş "Fasiləsiz işləmənin orta gəliri", "Qamma faizli qalıq ehtiyatı" və digər ehtiyat göstəriciləri SSRİ və RF dövlət standartlarına daxil edilib. O, həmçinin qiymətləndirmənin və potensial təhlükəli texnogen obyektlərin təhlükəsizliyinə nəzarətin fundamental elmi əsaslarını tədqiq edib.

Q.Sadıxov 200-dən çox elmi nəşr və publikasiyanın müəllifidir, onların sırasında 7 monoqrafiya, 5 kitab, etibarlılıq üzrə 5 soraq kitabçası və 6 dövlət standartı var.

Üç məqaləsi NASA-da dərc edilib. O, elmi məktəbin rəhbəridir, yetirmələrindən 12-si elmlər namizədi və 2-si elmlər doktorudur.

Q.Sadıxov RF Rusiya Elmlər Akademiyası Hesablama Mərkəzinin doktor və elmlər namizədi elmi dərəcələrinin, o cümlədən "fövqəladə hallarda təhlükəsizlik" ixtisasının verilməsi üzrə iki dissertasiya şurasının üzvüdür. Rusiya Dövlət Standartları Komitəsinin "Metodı menecmenta kaçestva" jurnalı redaksiya heyətinin üzvü, habelə illik "Etibarlılıq və keyfiyyət" Beynəlxalq simpoziumunda "Material istehsalı vasitələri və obyektlərinin renovasiyası" seksiyasının rəhbəridir.



## Sadıxov
## Rauf Xosrov oğlu

*Texnika elmləri doktoru, professor.*
*Belarus Dövlət İnformatika və Radioelektronika Universitetinin elektron hesablama maşınları kafedrasının müdiri*

Sadıxov Rauf Xosrov oğlu 1944-cü il oktyabrın 21-də Bakıda anadan olub.

1962-ci ildə Bakı şəhər 3 nömrəli məktəbi gümüş medalla bitirib və Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunun (indiki Azərbaycan Texniki Universiteti) avtomatika və hesablama texnikası fakültəsinə qəbul olunub. 1967-ci ildə ali məktəbi "riyazi və hesablama-həlletmə cihazları və qurğuları" ixtisası üzrə bitirib və mühəndis-elektrik diplomu alaraq təyinatla Azərbaycan Dövlət Sənaye Müəssisələrinin Layihələndirilməsi İnstitutuna göndərilib, orada 1970-ci ilədək mühəndis-proqramçı, sonra böyük mühəndis-proqramçı işləyib.

1970-ci ildə Azərbaycan EA (indiki Azərbaycan Milli Elmlər Akademiyasının) Kibernetika İnstitutunun aspiranturasına qəbul olunub və 1971-ci ildə Belarus EA-nın aspiranturasına ezam edilib. Həmin ildə də Minskə köçüb. 1974-cü ildə Belarus EA-nın Texniki Kibernetika İnstitutu yanında aspiranturanı bitirib. 1975-ci ildə texnika elmləri namizədi elmi dərəcəsini almaq üçün Texniki Kibernetika İnstitutunda "Təsadüfi proseslərin və obyektlərin dinamikasının spektral invariantlar əsasında analizi" mövzusunda dissertasiya müdafiə edib.

R.Sadıxov 1972-1975-ci illərdə Belorusiya EA-nın Texniki Kibernetika İnstitutunda kiçik elmi işçi, 1976-1985-ci illərdə böyük elmi işçi, 1986-1991-ci illərdə aparıcı elmi işçi, 1992-1993-cü illərdə baş elmi işçi, 1994-cü ildən sonra isə identifikasiya sistemi laboratoriyasının müdiri işləyib. Eyni vaxtda 1995-ci ildən Belarus Dövlət İnformatika və Radioelektronika Universitetində EHM kafedrasının müdiri olub.

1991-ci ildə R.Sadıxov texnika elmləri doktoru elmi adını almaq üçün "Eksperimental tədqiqatların avtomatlaşdırılması sistemlərində siqnalların rəqəmsal emal metodlarının və hesablama strukturlarının tədqiqi" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 1992-ci ildə R.Sadıxova professor adı verilib.

1999-cu ildə R.Sadıxovun sədrliyi ilə universitetdə "Obrazların tanınması və təsvirlərin emalı" 5-ci Beynəlxalq Konfrans keçirilib. Konfransda dünyanın 15 ölkəsindən alimlər iştirak ediblər.

Alim tərəfindən 360 elmi iş, o cümlədən 99 məqalə və 3 monoqrafiya dərc edilib. O, 80 müəllif şəhadətnaməsinin, 1 patentin, 15 preprintin sahibidir, beynəlxalq və respublika konfranslarında, simpoziumlarda, müşavirələrdə 162 məruzə edib. O, 3 elmlər doktoru və 13 elmlər namizədi hazırlayıb.

R.Sadıxov təsvirlərin emalı və tanınması, obrazların identifikasiyası, informasiyanın qorunması, hesablama sistemlərinin paralel arxitekturunun modelləşdirilməsində kompyuter sistemlərinin yaradılması sahəsində tanınmış mütəxəssisdir.

2000-ci ildə R.Sadıxova Belarus Respublikasının Prezident təqaüdü təyin edilib. Alim, həmçinin Belarus MEA-nın (2004), Belarus AAK-ın (2004), Belarus Respublikası Təhsil Nazirliyinin (2004) fəxri fərmanları ilə təltif edilib. O, "Stoxastik məlumatlar və rəqəmsal təsvirlərin tanınması və analizi" işinə görə Belarus Dövlət mükafatı laureatıdır (2002).

R.Sadıxov 1996-cı ildən Belarus Respublikasında Obrazların Tanınması və Təsvirlərin Emalı Beynəlxalq Assosiasiyasının vitse-prezidentidir, 1997-ci ildən Beynəlxalq Elektrik Mühəndisləri İnstitutunun (IEE, İngiltərə, London) üzvüdür, 2001-ci ildən Belarus Respublikası Ali Attestasiya Komissiyasının Kompyuter Elmləri üzrə Ekspert Şurasının sədrinin müavinidir.

R.Sadıxov doktorluq dissertasiyaları müdafiə şuralarının (Belarus MEA İnformasiya Problemləri Birləşmiş İnstitutu, Belarus Dövlət İnformatika və Radioelektronika Universiteti), Belarus Respublikası Fundamental Tədqiqatlar Fondunun Ekspert Şurasının, "Dokladı BQUİR" jurnalının redaksiya şurasının üzvüdür.

R.Sadıxov Rusiya, İtaliya, Belçika, Hollandiya, Yaponiya, Böyük Britaniya və Polşanın elmi mərkəzləri ilə əlaqə saxlayır.



## Sadıqov
## Famil Kamil oğlu

*İqtisad elmləri namizədi.*
*"Qazprombank" ASC-nin idarə heyəti sədrinin müavini*

Sadıqov Famil Kamil oğlu 1968-ci il martın 3-də Azərbaycan Respublikasının Naxçıvan şəhərində anadan olub.

1993-cü ildə S.Orconikidze adına Dövlət İdarəçilik Akademiyasını "iqtisadiyyat və avtonəqliyyatın idarə edilməsi" ixtisası üzrə bitirib. Tələbə və aspirant olarkən Moskvada bir sıra kommersiya təşkilatlarında rəhbər vəzifələrdə işləyib. 1995-1996-cı illərdə RF maliyyə nazirinin birinci müavininin məsləhətçisi olub. 1996-cı ildən Rusiya Dövlət Vergi Xidməti rəhbərinin müşaviri, analitik proqnoz idarəsinin rəisi işləyib.

1997-1998-ci illərdə F.Sadıqov Rusiya Federal Yol Xidmətində "Dorinvest" avtomobil yollarının bərpası və saxlanması layihəsinin idarə edilməsi üzrə direksiya rəhbərinin müavini işləyib. 1998-ci ildə hökumətin qərarı ilə Rusiya Federal Yol Xidməti rəhbərinin müavini vəzifəsinə təyin edilib.

1999-2004-cü illərdə RF vergi və yığım üzrə nazir müavini olub. 2002-ci ildə ona RF vergi xidmətinin II dərəcəli həqiqi dövlət müşaviri rütbəsi verilib. 2005-2009-cu illərdə F.Sadıqov Federal Xəzinədarlıq rəhbərinin müavini vəzifəsində çalışıb.

2006-cı ildə F.Sadıqov "RF büdcə sisteminə vergi gəlirlərinin daxil olmasının dövlət inzibatçılığı (regional aspekt)" mövzusunda dissertasiya müdafiə edib. Elmi iş RF Maliyyə Nazirliyinin Ümumrusiya Dövlət Vergi Akademiyasının iqtisadiyyat və idarəetmə kafedrasında yerinə yetirilib.

F.Sadıqov Ümumrusiya Vergi Akademiyasını bitirib. 2009-cu ildə "Qazprombank" ASC-nin idarə heyəti sədrinin müavini təyin edilib.



## Salahov
## Tahir Teymur oğlu

*Rəssam.*
*Rusiya Rəssamlıq Akademiyasının vitse-prezidenti, professor*

Salahov Tahir Teymur oğlu 1928-ci il noyabrın 29-da Bakıda anadan olub.

1950-ci ildə Ə.Əzimzadə adına Azərbaycan rəssamlıq məktəbini bitirib və İ.Y.Repin adına Rəssamlıq, Heykəltəraşlıq və Memarlıq İnstitutuna qəbul olunmaq istəyib, lakin bioqrafiyasındakı "xalq düşməninin oğlu" qeydi buna mane olub - onun atası 1937-ci ildə repressiya edilib (cinayət tərkibi olmadığı üçün 1956-cı ildə reabilitasiya olunub). Buna baxmayaraq, o, V.İ.Surikov adına Moskva Dövlət Rəssamlıq İnstitutuna (P.D.Pokarjevskinin emalatxanası) qəbul oluna bilir və 1957-ci ildə oranı "rəssam-rəngkar" ixtisası üzrə bitirib.

1960–1961–ci illərdə Azərbaycan Rəssamlar İttifaqında məsul katib, M.Əliyev adına Azərbaycan Dövlət Teatr İnstitutunda baş müəllim işləyib, dosent, professor vəzifələrini icra edib, sonra institutun professoru olub (1963–1974).

Praktiki olaraq yarım əsrdir ki, T.Salahov Rəssamlıq Akademiyası ilə sıx bağlıdır. 1966-cı ildən müxbir üzv, 1975-ci ildən həqiqi üzv, 1979-cu ildən SSRİ Rəssamlıq Akademiyasının (1992-ci ildən Rusiya Rəssamlıq Akademiyası adlanır) rəyasət heyətinin üzvü, 1979-2001-ci illərdə rəssamlıq bölməsinin akademik katibi olub. 1997-ci ildə xarici məsələlər üzrə vitse-prezident seçilib.

T.Salahov akademiyanın müxtəlif yaradıcılıq istiqamətli rəssamları birləşdirən ən çoxsaylı rəssamlıq bölməsinə 20 ildən çox rəhbərlik edib. Onun təşkilatçılığı ilə böyük rəssamlar K.P.Bryullov, İ.Y.Repin, V.İ.Surikov, V.V.Vereşşaqin, A.M.Kuinci, V.D.Polenov, V.M.Vasnetsov, A.M.Vasnetsov, M.V.Nesterov, P.D.Korin, P.Konçalovski, P.Plastov, A.A.Deyneka, S.V.Gerasimov və başqalarının yubileyi keçirilib. Rusiyada və xaricdə çoxsaylı sərgilər, konfranslar, yaradıcılıq gecələri, rəssamların və sənətşünasların xatirə gecələri, məbədlərin tikilməsi və naxışlanması (o cümlədən Moskvada Xilaskar İsa Məbədi), abidələrin və memorial lövhələrin qoyulması - bütün bunlar onun diqqət yetirdiyi və səylə iştirak etdiyi fəaliyyət sferasına daxildir. Son illər akademiyanın beynəlxalq fəaliyyəti əsaslı surətdə aktivləşib, buna T.Salahovun Rusiyada və dünyanın bir çox ölkələrində böyük nüfuzu əhəmiyyətli dərəcədə təsir göstərib.

T.Salahovun səyləri nəticəsində Rusiyada F.Bekon, G.Yukker, D.Rozenkvist, R.Rauşenberq, Y.Kunellis, R.Tamayo və başqa tanınmış xarici rəssamların sərgisi keçirilib.

Rəssam pedaqoji fəaliyyətə də böyük qüvvə sərf edib. 1963-1974-cü illərdə M.Əliyev adına Azərbaycan Dövlət Teatr İnstitutunda dərs deyib. 1974-1992-ci illərdə V.İ.Surikov adına Moskva Dövlət Rəssamlıq Akademiyasının dəzgah rəssamlığı emalatxanasının rəhbəri olub, 1984-1992-ci illərdə rəssamlıq kafedrasına rəhbərlik edib. 2003-cü ildən V.İ.Surikov adına Moskva Dövlət Akademik Rəssamlıq İnstitutunda aspirantura rəhbəri kimi işini bərpa edib. 2003-cü ildən Azərbaycan Rəssamlıq Akademiyasının Dövlət Attestasiya Komissiyasına rəhbərlik edir.

T.Salahov 50-ci illərdən bəri rəsm əsərlərinin respublika, ümumittifaq və beynəlxalq miqyaslı nümayişlərinin daimi iştirakçısıdır. Dəfələrlə Bakıda və Moskvada, habelə dünyanın bir çox ölkələrində fərdi sərgisi keçirilib.

T.Salahov SSRİ RA-nın həqiqi üzvü (1975), Azərbaycan Xalq Rəssamı (1963), SSRİ Xalq Rəssamı (1973), RF Xalq Rəssamıdır (1996). 1973-cü ildən professordur. 1973-1992-ci illərdə SSRİ Rəssamlar İttifaqının birinci katibi, 1972-1974-cü illərdə Azərbaycan Rəssamlar İttifaqının idarə heyətinin sədri olub. 1975-ci ildə ADR Rəssamlar İttifaqının, 1983-cü ildə Avstriya Təsviri Sənət Xadimləri Cəmiyyətinin fəxri üzvü, 1985-ci ildə Montana ştatı (ABŞ) Mədəniyyət və Təhsil Federasiyasının üzvü seçilib. Tirenton, Santa-Fe, Billinqz (ABŞ) şəhərlərinin fəxri vətəndaşıdır.

Rəssamlıq sənətində mühüm nailiyyətlərinə görə iki dəfə Azərbaycan Dövlət mükafatına (1965, 1970) və SSRİ Dövlət mükafatına (1968) layiq görülüb. Sofiyada Realist Rəssamlıq Triennalesi Beynəlxalq Sərgisinin birinci mükafatının laureatıdır və s. 1989-cu ildə ona Lenin ordeni və "Oraq və çəkic" qızıl medalı ilə birlikdə Sosialist Əməyi Qəhrəmanı adı verilib. T.Salahov Qırmızı Əmək Bayrağı (1971), Oktyabr inqilabı, Xalqlar dostluğu (1981), Rusiyanın "Vətən qarşısında xidmətlərinə görə" II və III dərəcəli (2003, 1998), "Heydər Əliyev" (2008), "İstiqlal" (1998), I dərəcəli "Kiril və Mefodiy" (Bolqarıstan, 1979) və s. - ümumilikdə 16-dan çox orden və medallarla təltif edilib. Onların sırasında M.B.Qrekov (1977) adına qızıl medal, SSRİ Rəssamlıq Akademiyasının gümüş medalı (1962), Rusiya Rəssamlıq Akademiyasının qızıl medalı (1998) da var. Bundan başqa, T.Salahov 2009-cu ildə Azərbaycanla Fransa arasında mədəni əlaqələrin inkişafında xüsusi xidmətlərinə görə Fransa İncəsənət Akademiyasından "İncəsənət və Ədəbiyyat" ordeninin kavaleridir.

Dünya şöhrətli rəssam Avstriya Rəssamlar İttifaqının fəxri üzvü (1983), Fransa İncəsənət Akademiyasının fəxri üzvü (1987), UNESCO yanında Plastik İncəsənət

üzrə Beynəlxalq Assosiasiyanın (AIAP) vitse-prezidenti və fəxri prezidenti (1983) seçilib. 1993-cü ildən Azərbaycan Rəssamlıq Akademiyasının həqiqi üzvü və rəyasət heyətinin üzvü, 1998-ci ildən Qırğızıstan Respublikası Rəssamlıq Akademiyasının həqiqi üzvüdür. Rusiya Rəssamlarının Beynəlxalq Federasiyası və Yaradıcılıq İttifaqının vitse-prezidentidir (1992). Yaradıcılıq Akademiyasının (Rusiya), Beynəlxalq Ekoenerji Akademiyasının (Azərbaycan) akademiki, San-Fernando İncəsənət Kral Akademiyasının (İspaniya, 1998) müxbir üzvü, Almaniya Rəssamlar İttifaqının fəxri üzvüdür.

T.Salahovun əsərləri Azərbaycanın (R.Mustafayev adına Azərbaycan Dövlət İncəsənət Muzeyi, Bakı), Qazaxıstanın, Meksikanın (Dieqo Rivera Muzeyi, Mexiko) ən böyük muzeylərində nümayiş olunub, habelə dünyanın bir çox muzeylərində və şəxsi kolleksiyalarında saxlanılır. Rəssamın əsərlərinin yer aldığı Rusiya muzeyləri sırasında Dövlət Tretyakov Qalereyasını (Moskva), Şərq Xalqları İncəsənəti Dövlət Muzeyini (Moskva), Dövlət Rus Muzeyini (SPb), Rusiya Rəssamlıq Akademiyasının Elmi-Tədqiqat Muzeyini (SPb), "ROSİZO" Dövlət Muzey-Sərgi Mərkəzini (Moskva), Perm Dövlət Rəssamlıq Qalereyasını qeyd etmək olar.

T.Salahovun rəssamlıq məktəbində və institutda təhsil aldığı illərdə yaratdığı ilk əsərlər ("Dalğalar", "Estakada", Surikov İnstitutunda "Gecə növbəsindən qayıdanlar" adlı diplom işi) artıq tamaşaçıların və mütəxəssislərin diqqətini cəlb etmişdi. O, çox keçmədən "mülayim" dövrün ən görkəmli rəssamlarından və "sərt üslub" adlı istiqamətin əsasını qoyanlardan biri olub. Bu üslub bir növ Stalin dövrünün sərt qaydalarına etiraz idi.

Rəssamın yaradıcılığında Azərbaycan neftçiləri haqqında əsərlər silsiləsi mühüm yer tutur. T.Salahovun ən məşhur işləri sırasında "Səhər eşelonu" (1958), "Təmirçilər" (1960), "Xəzər üzərində" (1961), "Abşeron qadınları" (1967), "Xəzərdə səhər" (1986) və digərləri yer alıb.

T.Salahovun portret qalereyası da, o cümlədən "Aydan" (1967), anasının portreti, "Dananın portreti" (1983) böyük şöhrət qazanıb. O, dünya səviyyəli portretçi rəssamdır. Bəstəkarlar və musiqiçilər Dmitri Şostakoviç, Mstislav Rostropoviç, Qara Qarayev, Fikrət Əmirov, balerinalar İrina Struyeva və Olqa Rukavişnikova, aktyorlar Maksimilian Şell və İrina Miroşniçenko, yazıçı Herman Hesse, şair Mirzə Ələkbər Sabir, Rəsul Rza, rəssam Robert Rauşenberq və başqalarının portreti onun fırçasının məhsuludur. T.Salahov natürmortlarına və Abşeron mənzərələrinə, ABŞ, İtaliya, Meksika ("Meksika korridası") və digər ölkələrdə çəkilmiş əsərlərinə görə də şöhrət qazanıb.

T.Salahov həyatın ritmini həssaslıqla tutan, zamanı dinləməyi və eşitməyi bacaran rəssamdır. Müxtəlif planlı işlərin müəllifidir, dəqiq kompozisiya ustası, xətlərdən və rənglərdən virtuoz istifadə edən, lakonik və dərin fərdi icra manerası olan rəssamdır. Obrazların gücü və ümumiləşdirilməsi onun əsərlərinə freska rəssamlığı ilə səsləşən monumental xarakter verir.

T.Salahovun əsərləri çox maraqlı xüsusiyyətə malikdir: onlar nəinki aktuallığını itirmir, tez-tez zamanı qabaqlayır, bu əsərlərin yaradıldığı vaxtdan nə qədər çox uzaqlaşırsan, onların əhəmiyyətli bir o qədər artır. Onun yaradıcılıq diapazonu genişdir. Rəssam boyakarlıq, qrafika, ssenoqrafiya sahələrində işləyir. T.Salahovun insan şəxsiyyəti, ətraf aləm haqqında düşüncələri ilk növbədə müasirliyə ünvanlanıb. Rəssamın əsərlərinə dövrün ruhu hakimdir. Bu əsərlərdən insanı bu gün narahat edən mənəvi problemlər haqqında dürüst fikir yürütmək olar.



## Salmanov
## Aydın Qurban oğlu

*Tibb elmləri doktoru.*
*Ukrayna Dövlət Sanitar-Epidemioloji Xidmətinin baş mütəxəssisi*

Salmanov Aydın Qurban oğlu 1957-ci il aprelin 2-də Azərbaycan Respublikasının Şamxor (indiki Şəmkir) rayonunda anadan olub.

1981-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunu (indiki Azərbaycan Tibb Universiteti) bitirib. Azərbaycan Səhiyyə Nazirliyinin təyinatı ilə Şuşaya göndərilib. Lakin Dağlıq Qarabağ Muxtar Vilayətinin səhiyyə idarəsinin rəhbərliyi onun vilayətin "yerli sakini" olmamasını bəhanə edərək A.Salmanovu işə götürməkdən rəsmən imtina edib.

A.Salmanov 1982-2005-ci illərdə Kiyev sanitar-epidemioloji xidmət sistemində işləyib. 2006-2011-ci illərdə Ukrayna Səhiyyə Nazirliyində baş mütəxəssis olub. 2011-ci ildən indiyədək Ukrayna Dövlət Sanitar-Epidemioloji Xidmətinin baş mütəxəssisidir.

A.Salmanov 2008-ci ildə tibb elmləri namizədi elmi adını almaq üçün dissertasiya müdafiə edib. Dissertasiya əməliyyatdan sonra infeksiya ağırlaşmalarının diaqnostikası üçün cərrahi müdaxilə sahəsində irinli-iltihabi infeksiyaların müəyyənləşdirilməsinin standart kriterilərinin tədqiqi əsasında xəstəxanadaxili infeksiyalar üzərində nəzarət sisteminin təkmilləşdirilməsinə həsr olunub. 2013-cü ildə əsas işindən ayrılmadan tibb elmləri doktoru adını almaq üçün dissertasiya müdafiə edib. Dissertasiya əməliyyatdan sonra antibiotiklərin təsirinə rezistent mikroorqanizmlərin yaratdığı irinli-iltihabi infeksiyalara Ukraynada epidemioloji nəzarət sisteminin yaradılmasına həsr edilib. A.Salmanov tərəfindən işlənib hazırlanmış bu sistem cərrahiyyə stasionarlarında antibiotiklərin təsirinə rezistent mikroorqanizmlərin formalaşmasına nəzarət etməyə və əməliyyatdan sonra irinli-iltihabi infeksiyalar formasında ağırlaşmalara qarşı effektiv profilaktik tədbirlər görməyə imkan yaradır. Nəzarət sistemi müalicə-profilaktika müəssisələrinin işində uğurla tətbiq edilib.

A.Salmanov hospital epidemiologiya, mikroorqanizmlərin antibiotiklərə rezistentliyi, dezinfeksiyalar, strelizasiyalar, habelə pasiyentin və müalicə-profilaktika müəssisələri personalının infeksiya təhlükəsizliyi sahəsində mütəxəssisdir.

Cərrahi müdaxilə sahəsində irinli-iltihabi infeksiya hallarının işlənmiş standart kriteriləri həkim-cərrahlara infeksiya prosesinin 83 lokal formasını vaxtında aşkar etməyə və diaqnoz qoymağa imkan yaradır. Kriterilər cərrahi kəsiyin anatomik lokalizasiyasını və infeksiya mənbəyindən patoloji (bioloji) materialın laboratoriya tədqiqatlarının nəticələrini nəzərə alır. Tədqiq edilmiş kriterilər Ukrayna səhiyyə nazirinin əmri ilə ölkənin səhiyyə sisteminə tətbiq edilib.

A.Salmanov Ukraynada Xəstəxanadaxili İnfeksiyaların Profilaktikası Milli Konsepsiyasının müəllifidir. Bu infeksiyalar üzərində aktiv epidemioloji nəzarət sistemi yaradılıb. Ukraynanın bütün müalicə-profilaktika müəssisələrində tətbiq edilən bu sistem epidemiya vəziyyətinə nəzarət etməyə və əməliyyatlardan sonra irinli-iltihabi formada xəstəliklərin yaranmasının qarşısını alır.

A.Salmanov 187 elmi işin, o cümlədən 7 monoqrafiyanın, ali tibb məktəblərinin tələbələri üçün 2 dərsliyin və 1 dərs vəsaitinin müəllifidir. Onun tərəfindən, həmçinin Ukrayna Səhiyyə Nazirliyinin 11 normativ-hüquqi sənədi, o cümlədən xəstəxanadaxili infeksiyalara qarşı mübarizəyə yönələn normalar və qaydalar tərtib edilib. Bununla yanaşı, alim Ukrayna Ali Radasının qəbul etdiyi 2 qanun layihəsinin müəllifidir.

A.Salmanov fəal alim və dövlət qulluqçusudur. Əsas işi ilə yanaşı, o, "Ukrayna Səhiyyə Nazirliyinin elmi jurnalı"nın məsul katibidir, Dünya Səhiyyə Təşkilatının Avropa Bürosunda Ukraynanın Milli əlaqələndiricisidir, Ukrayna Səhiyyə Nazirliyinin müalicə-profilaktika müəssisələrinin lisenziyalaşdırılması və akkreditasiyası üzrə ekspert komissiyasının üzvü, dərman vasitələri üzrə Ukrayna Mərkəzi Formulyar Komitəsinin ekspertidir. A.Salmanov Ukrayna Səhiyyə Nazirliyinin beynəlxalq elmi-praktik konfranslarının təşkilatçısıdır. O, müxtəlif illərdə Norveç (Oslo), Çexiya (Brno) və Rusiyada (Moskva) məruzələr edib. MDB ölkələri ilə infeksiya xəstəliklərinə dair informasiya mübadiləsi üzrə Ukrayna Milli əlaqələndiricisidir.

Dövlət qulluğunda əldə etdiyi uğurlara görə Ukrayna Nazirlər Kabinetinin Fəxri fərmanı (2007), Ukrayna Səhiyyə Nazirliyinin fəxri fərmanları (2006, 2008, 2009, 2011) ilə təltif olunub və ona Ukrayna Dövlət Sanitar-Epidemioloji Xidmətinin təşəkkürnaməsi verilib.



## Salmanov
## Fərman Qurban oğlu

*(1931-2007)*
*Geologiya-mineralogiya elmləri doktoru.*
*"Yuqneftqaz" MMC-nin Direktorlar Şurasının sabiq sədri*

Salmanov Fərman Qurban oğlu 1931-ci il iyulun 28-də Azərbaycan Respublikasının Şamxor (indiki Şəmkir) rayonunun Morul kəndində anadan olub.

1947-ci ildə Şamxor kəndində orta məktəbi bitirib və Şirvan kompleks ekspedisiyasında kollektor işləməyə başlayıb. Həmin vaxtdan F.Salmanovun bütün həyatı neftçi sənəti ilə bağlanıb.

1954-cü ildə Azərbaycan Sənaye İnstitutunun (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) geoloji kəşfiyyat fakültəsini "dağ-mədən mühəndis-geoloqu" ixtisası üzrə bitirib. Onun diplom işi Orta Ob neftçıxarma rayonunun perspektivləri mövzusunda olub. Gənc geoloqun çıxardığı nəticələr, o dövrün nüfuzlu geoloqlarının fikrincə, "həddən artıq cəsarətli" idi – Sibirdə "böyük neftin" olmasına heç kim inanmırdı.

F.Salmanov institutu bitirəndən sonra Bakıya təyinat alır, lakin neft sənayesi naziri N.K.Baybakova məktub yazıb, Sibirə işə göndərilməsini xahiş edir. Gənc neftçinin arzusu yerinə yetirilir və F.Salmanov 1955-1957-ci illərdə Kemerovo vilayətində Plotnikovo neft kəşfiyyatı ekspedisiyasının rəisi və Qryaznen neft kəşfiyyatı ekspedisiyasında baş geoloq işləyir.

F.Salmanov Kuzbasda neft axtarışını perspektivsiz hesab edərək son dərəcə riskli addım atır. 1957-ci ilin avqustunda geoloji partiyasını özbaşına və gizlicə Surquta aparır. O, əmin idi ki, nefti məhz orada axtarmaq lazımdır. Odur ki, qazmanı dayandırmaq haqqında kəskin və hətta təhdidedici əmrlərə baxmayaraq, F.Salmanov kəşfiyyatı davam etdirdi. Onu işdən kənarlaşdırmaq və mühakimə etmək istədilər, lakin o, qazıntını dayandırmadı. Vəziyyəti kəskinləşdirməmək üçün rəhbərlik F.Salmanovun kəşfiyyat partiyasının Surquta göndərilməsi haqqında köhnə tarixlə əmr imzaladı.

1961-ci il martın 21-də ilk quyuda neft fontan vurdu. F.Salmanov bütün opponentlərinə eyni məzmunda məktub göndərdi: "Hörmətli yoldaş, Megionda dərinliyi 2180 metr olan 1 nömrəli quyuda neft fontan vurdu. Aydındır? Hörmətlə, Fərman Salmanov". Opponentlər cavab verdilər ki, bu, təbiətin anomaliyasıdır, iki həftədən

sonra quyu quruyacaq. Qərbi Sibirdə böyük neft ola bilməz. Bundan sonra Ust-Balık rayonunda ikinci quyu fontan vuranda F.Salmanov rəhbərliyə radioqramma göndərdi: "Quyu bütün qaydalara uyğun olaraq əməlli-başlı fontan vurur". N.S.Xruşşova isə bu məzmunda teleqram göndərdi: "Mən nefti tapdım. Bax belə! Salmanov".

Sonra kəşflər bir-birinin ardınca davam etdi: Mamontov, Megion, Pravdin və digər nəhəng neft yataqları. 1962-ci ildən F.Salmanov Ust-Balıkda baş geoloq, Pravdin neft kəşfiyyatı ekspedisiyasının rəisi olur.

F.Salmanov ümumilikdə Tümenin şimalında 130-dan çox neft və qaz yatağını kəşf edib və açılışların iştirakçısı olub. Onların sırasında yuxarıda qeyd edilən unikal, tanınmış və böyük yataqlar, habelə neft-qaz kompleksinin etibarlı bazası olan Surqut, Fyodrov, Urenqoy, Yamburq və bir çox digərləri olub. F.Salmanov Qərbi Sibirdə 30 ildən çox işləyib.

SSRİ Ali Soveti Rəyasət Heyətinin 1966-cı il 4 iyul tarixli Fərmanı ilə geoloji kəşfiyyat işlərinin inkişafı, faydalı qazıntı yataqlarının kəşfiyyatı və açılışı üzrə yeddiillik planın yerinə yetirilməsində əldə edilmiş mühüm uğurlara görə F.Salmanova Lenin ordeni və "Çəkic və oraq" qızıl medalı ilə birgə Sosialist Əməyi Qəhrəmanı adı verilib.

F.Salmanov 1970-ci ildə Tümen istehsalat-geologiya baş idarəsinin neft və qaz üzrə baş geoloqu, rəis müavini, 1978-ci ildə "Qlavtümengeologiya"nın rəisi təyin edilib.

F.Salmanov 1987-ci ildə Moskvaya köçüb. 1987-1991-ci illərdə SSRİ geologiya nazirinin birinci müavini olub. 1992-ci ildən "Rospan İnterneşnl" QSC-nin prezidenti, 2002-ci ildən "İtera" Neft-Qaz Şirkəti MMC-nin direktorlar şurasının sədri, "Yuqneftqaz" MMC-nin direktorlar şurasının sədri olub.

F.Salmanov bazar münasibətləri hüdudunda öz biliyi və intuisiyası nəticəsində əvvəllərdə olduğu kimi Qərbi Sibirin perspektivini görürdü. Onun rəhbərliyi altında "Rospan İnterneşnl" MMC-də Novo-Urenqoy və Şərqi-Urenqoy yataqlarında qaz, kondensat və neft verən qatlar ilk dəfə tədqiq edildi və əlavə kəşfiyyat aparıldı. "İtera" NQŞ MMC Kalmıkiya Respublikasında neft və qaz axtarışı və kəşfiyyatını həyata keçirdi.

F.Salmanov geologiya-mineralogiya elmləri doktorudur (1972). Rusiya Elmlər Akademiyasının müxbir üzvüdür (1991). "Geologiya nefti i qaza" elmi-texniki jurnalının baş redaktoru olub. İri neft və qaz yataqlarının formalaşması və bölüşdürülməsi problemlərinə həsr edilmiş fundamental elmi işlərin müəllifidir. 160-dan çox məqalə və 10 monoqrafiya nəşr etdirib.

F.Salmanov Lenin (1966), Qırmızı Əmək Bayrağı (1971, 1976), Oktyabr inqilabı (1983), Azərbaycanın "Şöhrət" (2001) ordenlərinin kavaleridir. Bir neçə medal, o cümlədən "Qərbi Sibirin yeraltı sərvətlərinin mənimsənilməsi və neft-qaz kompleksinin inkişafına görə" medalı ilə təltif edilib. "Yataqları kəşf edən" (1970 - Ust-Balık, 1986 - Fyodrov) diplomu verilib. Lenin mükafatı laureatı (1970), İ.M.Qubkin adına mükafatın laureatıdır. "Rusiya Federasiyasının Əməkdar Geoloqu", "Neft və Qaz Sənayesi Əməkdar İşçisi" fəxri adlarına layiq görülüb, Rusiya Elmlər Akademiyasının fəxri üzvüdür.

F.Salmanovun xatirəsinə Moskvada, Bakıda, Surqutda, Salexardda, Xantı-Mansıda abidə və büstlər qoyulub. Surqutda gimnaziya və küçə onun adını daşıyır, adına neftqazkondensat yatağı, teploxod və təyyarə var. 2008-ci ildə "Sibir elmi-analitik mərkəzi" şirkətlər qrupu tərəfindən keçirilən gənclərin elmi-praktik konfransı "Salmanov qiraəti" adını alıb. F.Salmanovun həyatı və şəxsiyyəti haqqında "Riskin strategiyası" bədii filmi çəkilib (1978). Onun haqqında digər sənədli və bədii filmlər, o cümlədən "Sibiriada" çəkilib.

F.Salmanov Surqutun ilk fəxri vətəndaşı (1968), Xantı-Mansı və Yamalo-Nenets muxtar dairələrinin, Texas ştatının (ABŞ), Tszinçjou şəhərinin (Çin) fəxri vətəndaşı olub.

Əfsanəvi geoloq F.Salmanov 2007-ci ildə vəfat edib.



## Səmədov
## Fərhad Astan oğlu
*"Birləşmiş neft-kimya şirkəti" ASC-nin prezidenti*

Səmədov Fərhad Astan oğlu 1959-cu il aprelin 23-də Gürcüstan Respublikasının Qardabani rayonunda anadan olub.

1982-ci ildə V.V.Kuybışev adına İnşaat-Mühəndis İnstitutunu əla qiymətlərlə bitirib, 1988-ci ildə V.A.Kuçerenko adına Mərkəzi Elmi-Tədqiqat və Layihə-Eksperimental İnşaat Konstruksiyaları və Qurğuları İnstitutu yanında aspiranturanı bitirib. Texnika elmləri namizədi, monoqrafiyaların və Rusiyanın ixtisaslaşmış nəşrlərində dərc edilən elmi işlərin müəllifidir.

F.Səmədov 1982-1985-ci illərdə Azərbaycan Sənaye Tikinti Nazirliyində, 1985-1994-cü illərdə Mərkəzi Elmi-Tədqiqat İnşaat Konstruksiyaları İnstitutunda (Moskva) işləyib. Moskvada "Eksimer" Elm-İstehsalat Müəssisəsində baş direktorun maliyyə məsələləri üzrə müavini, Moskva "Petrotek-Holdinq" ASC-nin birinci vitse-prezidenti olub.

2003-cü ildə "Kaustik" QSC-nin baş direktorunun iqtisadiyyat və maliyyə üzrə müavini, 2005-ci ilin mart ayınadək bu müəssisənin baş direktoru işləyib.

F.Səmədov 2005-ci ildə Sterlitamak şəhərində "Soda" ASC-nin baş direktoru olub. 2008-2009-cu illərdə "Başkirskaya ximiya" ASC-nin direktorlar şurasının sədri, baş direktorun müşaviri işləyib. 2010-2012-ci illərdə "Başneft" Səhmdar Neft Şirkəti ASC-nin direktorlar şurası sədrinin müşaviri olub. 2012-ci ilin fevralından "Başneft" Səhmdar Neft Şirkəti ASC-nin neft-kimya departamentinin direktorudur.

2015-ci ilin fevralından "Birləşmiş neft-kimya şirkəti" ASC-nin prezidenti, "Ufaorqsintez" ASC-nin baş direktorunun vəzifələrini icra edir.

F.Səmədov 2004-cü ildə "Professional" Beynəlxalq Proqramlar Komitəsinin "İdarəetmədə qüsursuz işgüzar reputasiya və çevikliyə görə" mükafatını, Rusiya-İsveçrə biznes klubunun "Qüsursuz işgüzar reputasiyaya görə" qızıl medalını, "Milli şöhrət" ordenini alıb.

2005-ci ildə "Luçşiye lyudi Rossii" ensiklopediyasının ictimai-konsultasiya şurasının təqdimatı ilə F.Səmədov "Böyük Rusiyanın çiçəklənməsi və inkişafı naminə cəmiyyətin qüvvələrinin konsolidasiyası işinə böyük töhfəsinə görə" diplomu ilə təltif edilib.



## Səmədov
## Əhməd Məcid oğlu

*Texnika elmləri doktoru.*
*"Kiyev Politexnik İnstitutu" Ukrayna Milli Texniki Universitetinin Enerjiyə Qənaət və Enerji Menecmenti İnstitutunun geoloji tikinti və dağ-mədən texnologiyaları kafedrasının professoru*

Səmədov Əhməd Məcid oğlu 1935-ci il mayın 18-də Azərbaycan Respublikası Qubadlı rayonunun Xanlıq kəndində anadan olub.

1959-cu ildə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunu (indiki Azərbaycan Texniki Universitetini) "sənaye və mülki inşaat" ixtisası üzrə bitirib və Qazax Respublikasının (indiki Qazaxıstan Respublikası) Semipalatinsk 2 nömrəli "Sovnarxozstroy" trestinə göndərilib, orada "Spetstroy", "Montajjilstroy" tikinti idarələrində tikinti ustası işləyib. 1961-ci ildə Semipalatinsk Sovnarxoz Layihə İnstitutunda mühəndis-layihəçi vəzifəsinə təyin edilib. 1962-ci ildən ailə vəziyyəti ilə əlaqədar olaraq Kiyevə köçüb. İki il ərzində "Oblmejkolxozstroy" trestinin istehsalat-texnika bölməsində böyük mühəndis işləyib.

Ə.Səmədov 1964-1974-cü illərdə Kiyev Şəhər İcraiyyə Komitəsinin divar materialları və konstruksiyaları trestinin Podolsk zavodunun panel sexinin rəisi vəzifəsində işləyib və Kiyevdə, habelə Kiyev, Jitomir və Çerniqov vilayətlərində tikintidə fəal iştirak edib. Keramik panel və bloklardan konstruksiyalar hazırlayıb, yeni materiallar və konstruksiyalar üçün yazdığı texniki şərtlər Ukrayna Dövlət Tikinti İdarəsi tərəfindən təsdiqlənib.

Ə.Səmədov istehsalatdan ayrılmadan 1968-1974-cü illərdə SSRİ Dövlət Tikinti Komitəsinin Elmi-Tədqiqat Tikinti Konstruksiyaları İnstitutunun qiyabi aspiranturasında oxuyub və "Çox sayda təkrarlanan dinamik yüklər zamanı keramik divar materiallarının dözümlülüyü" mövzusunda dissertasiya müdafiə edib və texnika elmləri namizədi elmi adını alıb.

1974-1976-cı illərdə SSRİ Dövlət Tikinti Komitəsinin Elmi-Tədqiqat Tikinti Konstruksiyaları İnstitutunun "Yeni materiallardan konstruksiyalar" laboratoriyasında baş mühəndis işləyib. 1976-1978-ci illərdə Kiyev Şəhər İcraiyyə Komitəsinin divar materialları və konstruksiyaları trestinin Korçevatsk zavodu idarəsinin texniki bölməsinin rəisi olub.

Ə.Səmədov 1978-ci ildə Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun (indiki Azərbaycan Memarlıq və İnşaat Universiteti) "Qrunt, özül və bünövrələrin mexa-

nikası" kafedrasının dosenti vəzifəsinə müsabiqə əsasında qəbul edilib. 1993-cü ildən elə həmin kafedrada professor vəzifəsini icra etməyə başlayıb.

Ə.Səmədov 1995-ci ildə ailə vəziyyəti ilə əlaqədar olaraq Kiyevə qayıdıb və "Kiyev Politexnik İnstitutu" Ukrayna Milli Texniki Universitetinin Enerjiyə Qənaət və Enerji Menecmenti İnstitutunda yeraltı tikinti kafedrasının dosenti olub.

1996-cı ildə texnika elmləri doktoru elmi adını almaq üçün Ukrayna EA-nın Milli Hidromexanika İnstitutunda "dənəvər cisimlərin, qruntların və dağ süxurlarının mexanikası" ixtisası üzrə "Termogüc və dinamik təsirlərdə qrunt massivlərinin və bünövrələrin gərgin-deformasiya vəziyyəti" mövzusunda dissertasiya müdafiə edib. 1998-ci ildə ona professor elmi adı verilib.

Ə.Səmədov 1997-ci ildə "Kiyev Politexnik İnstitutu" Ukrayna Milli Texniki Universitetinin Enerjiyə Qənaət və Enerji Menecmenti İnstitutunda yeraltı inşaat kafedrasının professoru vəzifəsinə keçirilib. O, 1999-cu ildən geotexnik tikinti və dağ texnologiyaları adlanan bu kafedrada indiyədək professor vəzifəsində çalışır.

1998-ci ildə Ukrayna Tikinti Akademiyasının həqiqi üzvü, Ukrayna Texnologiya Elmləri Akademiyasının müxbir üzvü, 2000-ci ildə Ukrayna Texnologiya Elmləri Akademiyasının həqiqi üzvü (akademiki) seçilib.

Ə.Səmədovun hələ panel sexinin rəisi işləyən vaxt hazırladığı keramik panel və blokların konstruksiyasından Kiyev, Brovarı, Borispol şəhərlərində, habelə Makarovski, Boquslavski, Mironovski, Fastovski, Kaqarlıkski və digər rayonlarında 5 və 9 mərtəbəli yaşayış evlərinin, məktəbəqədər uşaq müəssisələrinin tikintisində geniş istifadə olunub. Bu obyektlərin çoxu bilavasitə Ə.Səmədov tərəfindən layihələndirilib, panel və bloklar isə onun rəhbərliyi altında zavod şəraitində hazırlanıb və tikintidə tətbiq edilib. Bu panel və bloklardan Kiyev massivlərində (Çokolovka, Sırets, Vinoqradar, Lesnoy massiv, Bereznyaki, Rusanovka, Borşşaqovka, Obolon və s.) çoxlu isti və rahat evlər tikilib.

Ə.Səmədov Kiyevbaştikinti, Kiyevtikinti, Brovarıkəndtikinti, Borispolkəndtikinti və digər idarələrin tikinti təşkilatları ilə əməkdaşlıq edib. Yuxarıda sadalanan obyektlərin layihələrinin hazırlanması çox hallarda Ə.Səmədovun iştirakı ilə Kiyevlayihə, mülki tikinti üzrə Ukrayna Zona Elmi-Tədqiqat və Layihə İnstitutu, Kiyevselxozproyekt, Oblmejkolxozproyekt və digər layihə institutları tərəfindən hazırlanıb.

Kənd təsərrüfatı tikintiləri üçün sadələşdirilmiş üçqat panellərin hazırlanmış konstruksiyaları əsasında çoxlu mexanikləşdirilmiş mal, donuz, it damları və digər obyektlər tikilib.

Ə.Səmədov bina və tikililərin qəzalı vəziyyətlərinin ekspertizası sahəsində mütəxəssisdir, qəzaya meyilli 2550-dən çox obyektin ekspertizasını verib. O, 470 elmi işin, o cümlədən 11 monoqrafiyanın, 1 dərsliyin Ukrayna Maarif və Elm Nazirliyinin qrifi ilə 1 dərs vəsaitinin, 12 normativ sənədin (yeni tikinti konstruksiyaları və materiallarının istehsalı üzrə texniki şərtlər), tikinti elementlərinin hesablanması və konstruksiyası üzrə 12 metodik göstərişlərin, 14 ixtira və patentin müəllifidir. Dəfələrlə fəxri fərmanlar, sosial yarışların qalibi nişanları, beşilliyin zərbəçisi nişanları, səmərələşdiricilərin diplomları, "Əmək rəşadətinə" görə medalı ilə təltif edilib.

Onun tərəfindən müxtəlif qrunt şəraitlərində, o cümlədən davamsız strukturlu qruntlu özüllərdə yeraltı tikililərin mürəkkəb konstruksiyalarının müxtəlif hesablama metodları təklif edilib. Ə.Səmədovun işlərinin silsiləsi müxtəlif statik, dinamik və termogüc təsirində zəif qrunt əsaslı yeraltı tikililərin hesablanma və layihələndirilməsinin rasional metodlarının seçiminə həsr olunub. Müxtəlif hidrogeoloji şərait və təsirlərdə qrunt əsaslı tikililərin davranışının nəzəri və riyazi modelləşdirmə metodu, habelə eksperimental tədqiqat aparılıb. Mürəkkəb qrunt şəraitlərində yeraltı tikililərin hesablanması və layihələndirilməsi zamanı mürəkkəb nəzəri məsələlərin həllində Ə.Səmədov tərəfindən yeraltı tikililərin konstruksiyalarının hesablanmasında materialların mənimsənilməsini asanlaşdıran çoxlu tətbiqi məsələlər və ədədi nümunələr həll edilib.

Ə.Səmədovun əsərlərində qruntların çökmə, sıxılma, şişmə, habelə faza çevrilməsi, yəni qruntun bir növdən başqa növə keçməsi kimi fiziki-mexaniki xüsusiyyətlərinin dəyişmə imkanları göstərilib. Bu əsərlərdə istilik qurğuları mənbələrindən, sənaye sobaları, torflu materialların öz-özünə yanmasından, kömür sənayesi tullantılarından və s. ətraf mühitin temperaturunun dəyişməsinin təsiri altında geomexanikada baş verən proses və sistemlər daha təfsilatı ilə analiz edilib. Geomexaniki proseslər (filtrasiya və istilik) binaların və tikililərin inşasında özül kimi istifadə edilən massivdə dağ süxurlarının xüsusiyyətinə kəskin təsir edir. Bu proses və sistemlər Ə.Səmədov tərəfindən modelləşdirilib.

Ə.Səmədov namizədlik və doktorluq dissertasiyaları üzrə müxtəlif ixtisaslaşdırılmış şuraların üzvüdür, qruntlar, özüllər və bünövrələrin mexanikası, geotexnika, yeraltı təchizat, inşaat və yeraltı məkanın mənimsənilməsi üzrə respublika və beynəlxalq (Rusiya, Polşa, Bolqarıstan) konfranslarda fəal iştirak edir. O, 8 texnika elmləri namizədi hazırlayıb.

Ə.Səmədov Polşada "Geomechaniki" və "Geotechniki" beynəlxalq konfranslarında fəal iştirakına görə fəxri fərmanlar, "Tanınma diplomu", digər diplomlar və qiymətli hədiyyələrlə təltif edilib.



## Səfərov Firudin Səttar oğlu

*Ə.Nəvai adına Özbəkistan Dövlət Akademik Böyük Teatrın quruluşçu rejissoru*

Səfərov Firudin Səttar oğlu 1933-cü il avqustun 1-də Bakıda anadan olub.

1951-ci ildə musiqi məktəbini, 1957-ci ildə Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyasını (indiki Ü.Hacıbəyli adına Bakı Musiqi Akademiyası) bitirib. 1953-1964-cü illərdə Azərbaycan Dövlət Simfonik Orkestrində işləyib. 1957-ci ildə Ümumdünya Gənclər və Tələbələr Festivalının (Moskva) laureatı adına və gümüş medalına, 1958-ci ildə Ümumittifaq Estrada Artistləri Müsabiqəsinin (Moskva) laureatı adına layiq görülüb. 1964-1968-ci illərdə N.A.Rimski-Korsakov adına Leninqrad Dövlət Konservatoriyasında opera rejissorluğu fakültəsində təhsil alıb.

F.Səfərov Azərbaycanın ilk professional opera rejissorudur. 1969-1977-ci illərdə M.F.Axundov adına Azərbaycan Dövlət Opera və Balet Teatrında (indiki Azərbaycan Dövlət Akademik Opera və Balet Teatrı) baş rejissor olub və ictimaiyyətin qəbul etdiyi bir sıra operaları, o cümlədən Ü.Hacıbəyovun "Koroğlu", "Leyli və Məcnun", P.İ.Çaykovskinin "Qaratoxmaq qadın", A.Xolminovun "Nikbin faciə", N.Kodallın "Van-Qoq" operalarının baş rejissoru olub.

F.Səfərov 1977-ci ildə Daşkənddə Ə.Nəvai adına Dövlət Akademik Böyük Teatrında baş rejissor vəzifəsinə dəvət edilib. Bu teatrdakı yaradıcılıq fəaliyyəti dövründə 50-dən çox opera tamaşasını səhnələşdirib. Onların sırasına A.Petrovun "I Pyotr" (Özbəkistanın Dövlət Mükafatına layiq görülüb, tamaşa Kreml Sarayının səhnəsində qoyulub və mətbuatda yüksək qiymətləndirilib), S.Prokofyevin "Odlu mələk" (SSRİ-də ilk dəfə tam müəllif redaktəsində səhnəyə qoyulub), C.Verdinin "Otello", "Aida", "Bal-maskarad", "Trubadur", "Traviata", Ş.Qunonun "Faust", K.Sen-Sansın "Samson və Dalila", P.İ.Çaykovskinin "Qaratoxmaq qadın", "İolanta", C.Rossininin "Nikah vekseli", C.Puççininin "Bogema", J.Bizenin "Karmen", F.Yanov-Yanovskinin "Orkestr", F.Pulenkin "İnsan səsi", K.Veberin "Əbu-Həsən", S.Yudakovun "Maysaranın kələyi", M.Əşrəfi və S.Vasilenkonun "Buran", M.Bafoyevin "Ömər Xəyyam", X.Rəhimovun "Ana ürəyi", R.Abdullayevin "Sadokat", "Xivə ordeni", A.Mansurovun "Heyvanlar şahı" və s. daxildir.

Rejissorun digər şəhərlərdə və ölkələrdə də xeyli tamaşası oynanılıb. Bu sırada Odessada “Qaratoxmaq qadın”, Voronejdə “Otello”, Alma-Atada “Aida”, “Qaratoxmaq qadın” və “Faust”, Bakıda “Van-Qoq”, Səmərqənddə “Sadokat”, Bilkəntdə (Türkiyə) “Leyli və Məcnun” və s. qeyd etmək olar.

O, Özbəkistanda təxminən 50 böyük bayram konsertinə quruluş verib. Onların sırasında Azərbaycanda, Rusiyada, Ukraynada, Tacikistanda “Özbəkistanın ədəbiyyat və incəsənət günləri”ni qeyd etmək olar.

F.Səfərov Özbəkistan Dövlət Konservatoriyasında opera hazırlığı kafedrasının professoru olaraq pedaqoji fəaliyyətə böyük diqqət ayırır.

Onun yaradıcılığı layiqincə qiymətləndirilib. 1981-ci ildə “Özbəkistanın Əməkdar İncəsənət Xadimi”, 1986-cı ildə “Özbəkistanın Xalq Artisti”, 1992-ci ildə “Azərbaycanın Xalq Artisti” adına layiq görülüb. F.Səfərov 1982-ci ildə XXVI Berlin Teatr və Musiqi Festivalının iştirakçısı olub.

F.Səfərov Dünya Azərbaycanlılarının Əlaqələndirmə Şurasının üzvüdür, 2002-ci ildə Azərbaycan Respublikasının “Tərəqqi” medalı və Özbəkistan Respublikasının “Emek mexnati” ordeni ilə təltif edilib.



## Səfərov Həsən Hüseyn oğlu

*İqtisad elmləri doktoru, professor. Sankt-Peterburq Hökuməti Tarif Komitəsi sədrinin birinci müavini*

Səfərov Həsən Hüseyn oğlu 1964-cü il dekabrın 3-də Azərbaycan Respublikası Naxçıvan MR-in Şərur rayonunun Xok kəndində anadan olub.

1982-ci ildə orta məktəbi bitirdikdən sonra Azərbaycan Xalq Təsərrüfatı İnstitutuna (indiki Azərbaycan Dövlət İqtisad Universiteti) qəbul olunub. Birinci kursdan sonra 1983-1985-ci illərdə Sovet Ordusu sıralarında hərbi xidmətdə olub.

1988-ci ildə N.A.Voznesenski adına Leninqrad Maliyyə İqtisad İnstitutunun Bakı filialını (indiki Azərbaycan Dövlət İqtisad Universiteti), sonra Sankt-Peterburq Dövlət İqtisadiyyat və Maliyyə Universitetini bitirib. Əvvəlcə stajor-tədqiqatçı, bir ildən sonra aspirant olub.

Aspiranturanı namizədlik dissertasiyasının müdafiəsi ilə başa vurduqdan sonra H.Səfərova həmin universitetdə əmək və əmək ehtiyatlarının iqtisadiyyatı kafedrasının tədris-metodik laboratoriyasına rəhbərlik etmək təklif olunur. O, əvvəlcə assistent, sonra müəllim, baş müəllim və nəhayət, kafedranın dosenti işləyir.

1996-2002-ci illərdə H.Səfərov Sankt-Peterburq Dövlət İqtisadiyyat və Maliyyə Universitetinin əməyin iqtisadiyyatı və personalın idarə olunması fakültəsinin dekan müavini olur.

Sankt-Peterburq müəssisələrinin yeni təsərrüfat formasına keçməsi üzrə Rusiya-Yaponiya birgə komissiyasının üzvü olub, Rusiyanın xalq təsərrüfatı üçün rəhbər kadrlarının hazırlanmasına dair Prezident Proqramında iştirak edib.

H.Səfərov 2002-ci ildə Sankt-Peterburq Hökuməti Tarif Komitəsi (Sankt-Peterburq ərazisində təbii monopoliyalar subyektlərinin tariflərini tənzimləyən hökumət orqanı) sədrinin müavini oldu. Sankt-Peterburq ərazisində Rusiya Vahid Energetika sistemi RSC-nin elektrik enerjisi balansı çərçivəsində elektrik enerjisi istehsalı və təchizatı balanslarının formalaşdırılmasına, "Qazprom" balansı çərçivəsində qaz təchizatına, habelə istilik enerjisi və su təchizatı balanslarının formalaşdırılmasına məsuldur.

H.Səfərov 2005-ci ilin noyabr ayında "Rusiya Federasiyasında təbii monopoliyaların dövlət tənzimlənməsi mexanizminin formalaşması" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

H.Səfərov 100-dən çox elmi və tədris-metodiki işin müəllifidir. Sənaye inkişafı üzrə BMT-nin Şimal-Qərb Beynəlxalq Təmiz İstehsal Mərkəzinin eksperti, Rusiya Şimal-Qərb Energetiklər İttifaqının Ekspert Şurasının üzvüdür.

Moskva, Madrid, Milan, Roma, Vyana, Qratsda təlim və staj keçib.

Sankt-Peterburqda Azərbaycan Mədəniyyət Mərkəzinin yaradılmasında iştirak edib. Azərbaycan Mədəniyyət Mərkəzinin yarandığı vaxtdan 2000-ci ilədək idarə heyətinin sədri olub.

H.Səfərov 1999-cu ildən indiyədək "Sankt-Peterburq Tələbə Klubu" Regional İctimai Təşkilatının idarə heyətinin sədridir. Təşkilatın fəaliyyətinin əsasını Sankt-Peterburq ali məktəblərində tələbə klublarını tələbə gənclərin istirahət və yaradıcılıq mərkəzi kimi dirçəltmək, habelə ali məktəblərarası ŞHK çempionatı - Sankt-Peterburq ŞHK Liqası oyunlarını keçirməkdir.

2015-ci il avqustun 17-dən Sankt-Peterburq Tarif Komitəsi sədrinin birinci müavinidir.

H.Səfərov Sankt-Peterburqun 2-ci dərəcəli dövlət müşaviridir. Sankt-Peterburq qubernatorunun fərmanı, qiymət və tariflərin dövlət tənzimlənməsi sisteminin inkişafına verdiyi mühüm töhfəyə, habelə Rusiya Federal Tarif Xidmətinin üzərinə düşən vəzifələrin həll edilməsində böyük şəxsi töhfəsinə görə "Tarif Federal Xidmətinin 10 ili" fərqlənmə nişanı ilə təltif edilib (2014).



## Sultanov
## Namiq Həmid oğlu

*San-Jose Dövlət Universitetinin Musiqi və Rəqs Məktəbinin professoru*

Sultanov Namiq Həmid oğlu 1948-ci il iyunun 10-da Bakı şəhərində anadan olub.

Orta məktəbi fərqlənmə ilə bitirdikdən sonra P.İ.Çaykovski adına Moskva Konservatoriyasına daxil olub. 1971-ci ildən Ü.Hacıbəyli adına Azərbaycan Dövlət Konservatoriyasında professor F.Quliyevanın başçılıq etdiyi xüsusi fortepiano kafedrasında pedaqoji fəaliyyətə başlayıb.

Gənc olmasına baxmayaraq, N.Sultanov qısa zamanda ən yaxşı müəllim-pianoçulardan biri kimi nüfuz qazanıb. Konservatoriyadakı 20 illik (1971-1991) fəaliyyəti ərzində onun sinfində istedadlı tələbələrin sayı çox olub. 1984-cü ildə Zaqafqaziya müsabiqəsinə gənc müəllim-pianoçunun hazırladığı 3 tələbə bütün mərhələləri uğurla keçərək müxtəlif mükafatlar qazanıb: F.Adıgözəlzadə - birinci mükafat, Q.Mərdanova – ikinci mükafat və S.Agişeva – fəxri diplom.

Pedaqoji fəaliyyətdən əlavə, N.Sultanov aktiv ifaçılıq fəaliyyəti aparır. Bu dövrdə onun çoxsaylı konsert çıxışları arasında Q.Qarayevin “12 fuqa”sının ilk ifasını xüsusi qeyd etmək gərəkdir. N.Sultanov digər gənc Azərbaycan bəstəkarları O.Felzer, M.Quliyev, A.Dadaşov, F.Nağıyevin əsərlərinin ilk ifaçısı olub.

1975-1979-cu illərdə N.Sultanov Əlcəzair Konservatoriyasında və Musiqi İnstitutunda dərs deyib. Onun pedaqoji fəaliyyətinin bu dövrü də şagirdlərinin parlaq uğurları ilə yadda qalıb: o, Moskva Konservatoriyasına daxil olan üç əlcəzairli tələbəni yetişdirib.

Azərbaycan Dövlət Konservatoriyasına qayıtdıqdan sonra N.Sultanov tezliklə dosent vəzifəsinə seçilir və 1991-ci ildə musiqi sahəsində böyük xidmətlərinə görə “Azərbaycanın Əməkdar İncəsənət Xadimi” adına layiq görülür, 1985-ci ildə Moskvada 3-cü Beynəlxalq Musiqi Festivalında ölkəmizi təmsil edir. Tamaşaçılar Q.Qarayevin fortepiano üçün “12 fuqa”sını səsləndirən Azərbaycan pianoçusunun uğurunu alqışlarla qarşılayırdılar.

1990-cı ildə N.Sultanov Meksikada keçirilən Azərbaycan Mədəniyyəti Günləri çərçivəsində Meksika Beynəlxalq Musiqi Festivalının iştirakçısı olub, solo proq-

ramla çıxış edib, SSRİ və Azərbaycanın Xalq Artisti F.Qasımovanı müşayiət edib.

1991-ci ildə musiqiçi Ankarada Bilkent Universitetinin professor-müəllim heyətinə qatılıb, yaradıcı həyatının yeni bir dövrünə qədəm qoyub. Bir müddət sonra fortepiano kafedrasına rəhbərlik edir, musiqi və təsviri sənət fakültəsinin dekan müavini vəzifəsinə təyin olunur. Türkiyədə çalışdığı 10 il müddətində özünü işinə dərindən bağlı olan əsl musiqiçi-sənətkar kimi göstərib.

1999-cu ildə Türkiyə Mədəniyyət Nazirliyi N.Sultanovun fortepiano ifaçılığının inkişafındakı görkəmli nailiyyətlərini qiymətləndirib. N.Sultanov milli və beynəlxalq müsabiqələrin münsiflər heyətinə, habelə Avropa və ABŞ-da ustad dərsləri keçməyə dəvət olunub. Yaradıcılıq karyerasının bu dövründə N.Sultanov Türkiyə Radiosunda bir neçə fond yazısı həyata keçirib və CD-disk yazdırıb.

Bilkent Universitetində işlədiyi illər onun pedaqoji istedadının genişlənməsinə dəlalət edir. Onun tələbələri bir çox beynəlxalq müsabiqələrin qalibləri olub. Belə ki, 1993-cü ildə Yapınçak Gürerk Ankarada Britaniya səfirliyi tərəfindən təşkil edilən pianoçuların müsabiqəsində birinci mükafatı qazanıb. Müsabiqədən sonra o, İngiltərədəki ən nüfuzlu musiqi məktəblərinin birində pulsuz təhsil almaq hüququ əldə edib. Bir il sonra həmin tələbə qız İngiltərədən qayıdıb və N.Sultanov onun Nyu-Yorkdakı "Manhattan School of Music"də təhsilini davam etdirməsi üçün proqram hazırlayıb. Yapınçak Gürerk öz videokasetini Nyu-Yorka göndərib və yüksək göstəricilərlə qəbul edilib.

Başqa bir tələbəsi Aysedeniz Gokçin 11 yaşında Kiyevdə, pianoçuların V.Qorovits adına beynəlxalq müsabiqəsində türk piano məktəbini təmsil edib və diploma layiq görülüb. Bu qələbə ilə əlaqədar N.Sultanov Türkiyə mədəniyyət nazirinin fəxri mükafatı, Kiyevdə isə fəxri pedaqoq diplomu ilə təltif olunub.

İstanbul, İzmir, Adana və ABŞ-dan olan bir çox pianoçular dərs almaq və ya N.Sultanovun onlarla xüsusi məşğul olması üçün onun yanına gəliblər.

2001-ci ilin oktyabrında N.Sultanov münsiflər heyətinin üzvü kimi Ensheddə (Niderland) pianoçuların beynəlxalq müsabiqəsinə dəvət olunub.

N.Sultanovun fəal yaradıcılıq bioqrafiyasının 2002-ci ildən başlayan üçüncü dövrünü obrazlı şəkildə "Amerika dövrü" adlandırmaq olar. Əvvəlcə, o, "Almaden School of Music"də dərs deyib, sonra Kaliforniya ştatındakı San-Jose Dövlət Universitetinin "Shool of Music and Dance"də ("Musiqi və Rəqs Məktəbi") professoru olub.

2003-cü ildən N.Sultanov hər il San-Jose pianoçuların beynəlxalq müsabiqəsinin münsiflər heyətinin üzvü dəvət edilir, burada münsiflər heyətinin bütün üzvləri ustad

dərsləri keçirlər. Bu ustad dərsləri sırasında N.Sultanov və V.Viardo (Van Klibern adına beynəlxalq müsabiqənin qalibi) ayrı-ayrılıqda solo konsertlər verib. Ustad dərslərindən sonra tələbələr arasında keçirilən yazılı sorğunun nəticələri əsasında azərbaycanlı musiqiçi "The most popular of five master teacher" siyahısına, yəni ən maraqlı və populyarlar sırasına daxil olub.

N.Sultanovun yeni Amerika yaradıcılıq dövrü daha zəngin və məhsuldardır. Bu barədə çoxsaylı afişaları, N.Sultanovun konsert-ifaçılıq fəaliyyəti haqqında Amerika mətbuatındakı müsbət materialları, eləcə də onun pianoçu tələbələrinin uğurlarını və musiqiçilər arasında nüfuzunun artmasını, ümumiyyətlə musiqi yaradıcılığının beynəlxalq səviyyədə tanınmasını nəzərə alaraq mühakimə yürütmək olar.

Hazırda Amerikada onun solo konsertləri böyük müvəffəqiyyətlə keçir. Musiqiçinin repertuarına Qərbi Avropa, rus və Azərbaycan bəstəkarlarının əsərləri daxildir. O, 4 solo və türk fleyta ifaçısı Şəfiqə Kutluərlə birlikdə İsveçrədə bir disk yazdırıb.

N.Sultanov Kaliforniya Musiqi Müəllimləri Assosiasiyasının, eləcə də Amerika Musiqi Müəllimləri Assosiasiyasının üzvüdür.



## Süleymanov
## Akif Firudin oğlu

*hüquq elmləri doktoru, professor. Almatı İqtisadiyyat və Hüquq Akademiyasının elmi iş üzrə prorektoru. Abay adına Qazaxıstan Milli Pedaqoji Universitetinin professoru*

Süleymanov Akif Firudin oğlu 1976-cı il dekabrın 14-də Qazaxıstan Respublikasının Cambul vilayətinin Merke rayonunun Merke kəndində anadan olub.

1994-cü ildə Qazaxıstan Respublikasının Cambul rayonunun Merke kəndində Turbitsın adına 17 saylı məktəbi fərqlənmə ilə, 1998-ci ildə Əl-Fərabi adına Qazaxıstan Dövlət Milli Universitetinin hüquq fakültəsini fərqlənmə diplomu ilə, 2000-ci ildə həmin universitetin magistraturasını "dövlət hüququ və idarəetmə" ixtisası üzrə, 2006-cı ildə İqtisadiyyat və Hüquq Akademiyasını "maliyyə" ixtisası üzrə bitirib.

2006-cı ildə Qazaxıstan Dövlət Hüquq Akademiyasının dissertasiya şurasında A.Süleymanov hüquq elmləri namizədi alimlik dərəcəsi almaq üçün "Qazaxıstan Respublikası Prezidenti və Konstitusiya Şurasının qarşılıqlı fəaliyyətinin konstitusion-hüquqi əsasları" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 2008-ci ildə Təhsil və Elm Nazirliyinin Təhsil və elm sahələrinə nəzarət Komitəsi A.Süleymanova hüquqşünaslıq dosenti elmi adı verib.

2010-cu ildə Qazaxıstan Respublikası Daxili İşlər Nazirliyinin Akademiyası yanında Dissertasiya Şurasında A.Süleymanov hüquq elmləri doktoru alimlik dərəcəsi almaq üçün "Qazaxıstan Respublikasının icra hakimiyyəti orqanlarının fəaliyyətinə ictimai nəzarət sisteminin formalaşmasının nəzəri və tətbiqi problemləri" mövzusunda dissertasiya müdafiə edib.

2000-ci ildən A.Süleymanov Almatı İqtisadiyyat və Hüquq Akademiyasının hüquq fənləri kafedrasında müəllim, baş müəllim, dosent, kafedra müdiri, professordur. 2003-cü ildən əvəzçilik əsasında Abay adına Qazaxıstan Milli Pedaqoji Universitetinin hüquq və dövlət nəzəriyyəsi kafedrasının dosentidir. 2010-cu ildən Almatı İqtisadiyyat və Hüquq Akademiyasının elmi iş üzrə prorektorudur.

A.Süleymanov "Uçyonıye zapiski Akademii ekonomiki i prava" jurnalının (Qazaxıstan Respublikası Təhsil və Elm Nazirliyinin Təhsil sahəsində nəzarət Komitəsi tərəfindən hüquq və iqtisad elmləri üzrə dissertasiyaların nəticələrinin dərc olunması

üçün tövsiyə olunub) məsul katibidir. “Pravovaya reforma Kazaxstana” elmi jurnalının və “Pravo i Zakon” beynəlxalq elmi-praktik jurnalının redaksiya heyətinin üzvüdür.

A.Süleymanovun tədqiqat maraqları çox genişdir: Konstitusiya hüququ, inzibati hüquq, dövlət xidməti və idarəçilik, insan hüquqları, dövlət və ictimai nəzarət.

A.Süleymanov 120-dən çox elmi əsərin, o cümlədən 2 monoqrafiyanın (“Qazaxıstan Respublikası Prezidenti və Konstitusiya Şurasının qarşılıqlı fəaliyyətinin konstitusion-hüquqi əsasları”, 2007, “Qazaxıstan Respublikasında ictimai nəzarət”, 2012), eləcə də 4 dərsliyin (“Prezident və Qazaxıstan Respublikasının Konstitusiya Şurası”, 2008, “Əhalinin həyat səviyyəsi: müasir vəziyyəti və yaxşılaşdırılması yolları”, 2012 (həmmüəllif), “Hüquq fənləri tədrisində innovativ və interaktiv metodlardan istifadə”, 2013 (həmmüəllif), “Prezident və Qazaxıstan Respublikasının Konstitusiya Şurası: qarşılıqlı fəaliyyətin konstitusiya-hüquqi əsasları”, 2012) müəllifidir.

A.Süleymanovun əsərləri “Knowledge Web” (Tomson Reuters, ABŞ və “Scopus” (Elsevier, Niderland) beynəlxalq informasiya resurslarına daxil olan yüksək impakt faktorlu beynəlxalq reytinq jurnallarında, yaxın və uzaq xarici ölkələrdə (ABŞ, Almaniya, Polşa, Çexiya, Türkiyə, Azərbaycan, Rusiya, Ukrayna, Özbəkistan, Qırğızıstan və s.) nəşr edilib, 50-dən çox ixtisasartırma sertifikatı var. Onun rəhbərliyi ilə 50-dən çox hüquq elmləri magistri və hüquq magistri hazırlanıb.

A.Süleymanov fəal alimdir. O, “Qazaxıstan və dünya birliyi: qlobal modernləşmə şəraitində hüquq və iqtisadiyyatın aktual problemləri”, “Qazaxıstanın modernləşməsi şəraitində hüquq və iqtisadiyyatın aktual problemləri”, “Dünya birliyində müasir Qazaxıstanın rolu” beynəlxalq elmi-nəzəri və elmi-praktiki konfransların, İqtisadiyyat və Hüquq Akademiyası və Avrasiya Poliqrafoloqlar Assosiasiyasının keçirdiyi “Poliqrafdan istifadənin aktual problemləri və inkişaf perspektivləri”, “Qazaxıstan Respublikasında genotiposkopik ekspertiza və tədqiqatların istifadəsinin aktual problemləri və perspektivi”, “Qazaxıstan Respublikasında odorologiyanın müasir vəziyyəti və inkişaf perspektivləri” “dəyirmi masa”larının təşkilatçılarından biridir. O, bu tədbirlərin materiallarının redaktoru və tərtibçisi olub. 2012-ci ildə o, Rusiya Təbiətşünaslıq Akademiyasının, Rusiya Siyasi Elmlər Assosiasiyasının müxbir üzvü seçilib.

2010-cu ildə A.Süleymanov İqtisadiyyat və Hüquq Akademiyasının rektoru tərəfindən “İlin məruzəçisi” fəxri adı, 2011-ci ildə Abay adına Qazaxıstan Milli Pedaqoji Universitetinin fəxri fərmanı, 2013-cü ildə Qazaxıstan Respublikası Təhsil

və Elm Nazirliyinin "Qazaxıstan Respublikası elminin inkişafında xidmətlərinə görə" döş nişanı ilə təltif edilib. 2013-cü ildə elmi və pedaqoji fəaliyyətindəki uğurlara görə A.Süleymanov Vernadski adına "Təbiət və humanitar elmlər sahəsində nailiyyətlərinə görə" (Rusiya, PEA) medalı ilə təltif edilib. 2014-cü ildə Avropa elmi və sənaye konsorsiumu tərəfindən nüfuzlu "LABORE ET SCİENTİA" (latın dilində "Əmək və bilik"lə ifadəsindən) ordeni alıb.

Onun adı "Qazaxıstan alimləri" Ensiklopediyası (2014), "Elmdə həyat. Qazaxıstan Respublikasının alimləri" toplusu (2013), "Rusiya alimləri" Ümumrusiya Ensiklopediyasına (2013), Qazaxıstanın məşhur şəxsləri, görkəmli şəxsiyyətləri Milli Portalına (Biografia.kz) daxil edilib.



## Tağıyev
## Ələsgər Soltan oğlu

*Hüquq elmləri doktoru.*
*Beynəlxalq Hüquqşünaslar İttifaqı sədrinin birinci müavini*

Tağıyev Ələsgər Soltan oğlu 1958-ci il iyulun 1-də Bakıda həkim ailəsində anadan olub.

1975-ci ildə Bakıda 134 saylı rus orta məktəbini, 1980-ci ildə "hüquqşünaslıq" ixtisası üzrə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin hüquq fakültəsini bitirib.

M.V.Lomonosov adına Moskva Dövlət Universitetini bitirdikdən sonra Ə.Tağıyev təyinatla Azərbaycan Respublikasının ədliyyə orqanlarında işə göndərilib. 1980-1987-ci illərdə Azərbaycan Respublikası Ədliyyə Nazirliyi aparatında Məhkəmə Orqanları İdarəsində baş məsləhətçi, şöbə müdirinin müavini, şöbə müdiri işləyib.

1987-ci ildə Sov.İKP MK-nın qərarı ilə Azərbaycan Respublikasının ədliyyə və məhkəmə orqanlarında rəhbər kadrların hazırlanması ilə bağlı Ə.Tağıyev SSRİ Ədliyyə Nazirliyinin mərkəzi aparatına işləməyə göndərilib.

1987-1991-ci illərdə SSRİ Ədliyyə Nazirliyinin mərkəzi aparatında hüquqi təbliğat şöbəsi rəisinin müavini, sonra SSRİ Ədliyyə Nazirliyinin İctimai Təşkilatların işləri üzrə İdarəsi rəisinin müavini vəzifəsində çalışıb.

1992-ci ildən bu günə qədər Ə.Tağıyev Beynəlxalq Hüquqşünaslar İttifaqında (SSRİ Hüquqşünaslar İttifaqının hüquqi varisi) çalışır. Əvvəlcə sədrin müşaviri olub, sonra - 1998-ci ildən Beynəlxalq Hüquqşünaslar İttifaqı sədrinin müavini seçilib. 2009-cu ildən Ə.Tağıyev Beynəlxalq Hüquqşünaslar İttifaqı sədrinin birinci müavinidir. Bu ittifaq postsovet məkanında və uzaq xaricin bir çox ölkələrində hüquqşünasların ictimai təşkilatlarını birləşdirir.

Beynəlxalq Hüquqşünaslar İttifaqında çalışdığı dövrdə Ə.Tağıyev fəal hüquqi təcrübəni müəllimlik və elmi tədqiqat fəaliyyəti ilə birləşdirib. Bundan başqa, dövlət orqanları və məhkəmələrdə əqli mülkiyyət, əmtəə nişanı, əmlak və qeyri-əmlak məsələləri ilə bağlı mübahisələrdə xarici şirkətlərin – Almaniyanın "Bayer AG", kommersiya banklarının ("Vneşekonombank", "Evrofinans-MosnarBank"), neft və qaz şirkətlərinin ("LUKoyl", "İtera", "Rospan International") və s. maraqlarını təmsil edib.

1991-ci ildə Ə.Tağıyev “dövlət və hüquq nəzəriyyəsi” ixtisası üzrə hüquqi dövlətin formalaşması şəraitində hüquqi təlimin sosial funksiyalarına həsr olunan namizədlik dissertasiyası müdafiə edib (SSRİ Elmlər Akademiyasının Dövlət və Hüquq İnstitutu).

2001-ci ilin noyabrında o, Rusiya Federasiyası Prezidenti yanında Dövlət Qulluğu Akademiyasında doktoranturanı bitirdikdən sonra “İqtisadi münasibətlər sahəsində qanunilik: nəzəri-hüquqi təhlil” mövzusunda doktorluq dissertasiyası müdafiə edib.

Ə.Tağıyev dövlət və hüquq nəzəriyyəsi, mülki hüquq, mülki-prosessual, arbitraj-prosessual və hüququn digər sahələrində elmi-tədqiqat fəaliyyəti ilə məşğul olub. Onun ən mühüm elmi əsərindən biri Rusiya Federasiyasının iqtisadiyyat sahəsində qanunilik probleminə həsr olunub. Bu əsərdə hazırkı mərhələdə Rusiya Federasiyasında iqtisadiyyat sahəsində qanuniliyin və hüquqpozmaların vəziyyəti müfəssəl təhlil edilib, ölkədə qüvvədə olan qanunvericiliyin təkmilləşdirilməsinin, iqtisadi münasibətlərin hüquqi tənzimlənməsinin, qanuniliyin və hüquq qaydasının təmin edilməsinin əsas istiqamətləri müəyyən edilib.

Ə.Tağıyevin “Sahibkarların məhkəmə müdafiəsi” kitabında mülki-hüquqi münasibət iştirakçılarının qanuni maraqlarının məhkəmədə effektiv müdafiəsinin təmininə, Rusiya Federasiyası arbitraj-prosessual qanunvericiliyin və arbitraj məhkəmələri sisteminin təkmilləşdirilməsi məsələlərinə xüsusi diqqət yetirilib. Müəllifin əsərlərində irəli sürdüyü bir çox ideya və təkliflər sonrakı mülki, arbitraj-prosessual qanunvericilik, arbitraj məhkəmə icraatı qanunvericiliyində öz əksini tapıb. Ümumilikdə Ə.Tağıyev 30-dan çox elmi əsər və 2 monoqrafiyanın müəllifidir.

O, Dünya Hüquqşünaslar Assosiasiyasının I dərəcəli ədliyyə ordeni, “Moskvanın 850 illiyinə xatirə” medalı, Rusiya Federasiyası Federal Vəkillər Palatasının “Vətəndaşların hüquq və azadlıqlarının qorunmasında xidmətlərinə görə” medalı və digər mükafatlarla təltif edilib. 2011-ci ildə Azərbaycan Prezidentinin Fərmanı ilə Ə.Tağıyevə “Azərbaycan Respublikasının Əməkdar Hüquqşünası” fəxri adı verilib.

Uzun illər boyu və bu gün də Ə.Tağıyev Rusiya Prezidenti yanında Dövlət Qulluğu Akademiyasının dissertasiya şurasının üzvüdür. Ə.Tağıyev yarandığı vaxtdan bu günədək Ümumrusiya Azərbaycan Konqresinin vitse-prezidentidir.



## Tağıyev
## Ramis Mərdan oğlu

*Texnika elmlər doktoru, professor.*
*"Qazprom" ASC baş direktorunun müavini – yanğın əleyhinə təhlükəsizlik və yeni texnika idarəsinin rəisi*

Tağıyev Ramis Mərdan oğlu 1951-ci il sentyabrın 1-də Bakıda anadan olub.

1979-cu ildə SSRİ DİN-in Ali Yanğın Texniki Mühəndis Məktəbini bitirib. 1980-ci ildən R.Tağıyevin əmək fəaliyyəti neft-qaz obyektlərində sənaye və yanğın təhlükəsizliyinin təmin edilməsi ilə bağlı olub. O, qarovul rəisliyindən "Xəzərneftqazsənaye" İstehsalat Birliyinin obyektlərinin mühafizəsi üzrə dəniz dəstəsinin rəisinədək bütün vəzifələrdə çalışıb.

R.Tağıyev bir çox qəza və yanğınların ləğv edilməsində, o cümlədən Xəzər dənizindəki "28 aprel" yatağının 2 saylı dərin dəniz platformasında 6 quyunun mürəkkəb qrup fontanının ləğv edilməsində iştirak edib. Fontanın ləğv edilməsində göstərdiyi şücaət və qəhrəmanlığa görə, habelə yanğın mühafizəsinin döyüş nizamnaməsindən kənara çıxan novator qərarlarına görə SSRİ neft sənayesi naziri L.İ.Filimonovun vəsatəti ilə R.Tağıyevə vaxtından əvvəl polkovnik rütbəsi verilib.

1993-1995-ci illərdə R.Tağıyev "Vyetsovpetro" Birgə Müəssisəsinin dəniz yanğın xidmətini yaradıb və ona rəhbərlik edib. 1995-ci ildən R.Tağıyev "Qazprom" ASC-nin strukturunda, "Qazflot" ASC-də sənaye və yanğın təhlükəsizliyi şöbəsinin rəisi işləyib. Bu vəzifədə olarkən R.Tağıyev "Qazprom" ASC-nin qəza-xilasetmə donanmasının dirçəlişinə, Arktik dənizlərin şelfində neft və qaz hasilatı üzrə dəniz obyektləri personalının təhlükəsizlik və xilasetmə sistemlərinin hazırlanmasına xeyli əmək sərf edib.

Bu dövrdə R.Tağıyev tanınmış alimlərin (texnika elmləri doktoru, professor B.A.Nikitinin və texnika elmləri doktoru, professor D.A.Mirzəyevin) rəhbərliyi ilə texnika elmləri namizədi alimlik dərəcəsi almaq üçün "Arktik dənizlərin şelfində neft və qaz yataqlarının təhlükəsiz işlənilməsinin elmi-metodiki əsasları" mövzusunda dissertasiya müdafiə edib.

R.Tağıyev "Maraton" (ABŞ), "Braun and Rut" (Böyük Britaniya), "DEU" (Cənubi Koreya), "LUKoyl", "Saxalin Enerci" şirkətləri tərəfindən karbohidrogen yataqlarının işlənməsi layihələrində sənaye və yanğın təhlükəsizliyinin təmin edilməsinin ekspertizasının aparılması üçün dəvət olunub.

R.Tağıyev təhlükəsizlik və personalın xilası sistemlərini, habelə iri dəniz neft-qaz yataqlarının, o cümlədən "Saxalin-2", "Prirazlomnoye" və "Ştokmanovskoye" yataqlarının layihələrinin istismarının təhlükəsizliyini tənzimləyən federal səviyyəli normativ sənədləri işləyib hazırlayıb.

2003-cü ildən R.Tağıyevin bioqrafiyasında yeni mərhələ başlayıb: o, "Qazprom" ASC-nin sahə təşkilatı - "Qazprom qazbezopasnost" MMC-nin baş direktorunun yanğın təhlükəsizliyi və yeni texnika üzrə müavini vəzifəsinə təyin olunur. Kamçatkadan tutmuş Qara dənizədək Rusiya Federasiyasının qaz sahələrinin bütün obyektlərinin yanğın təhlükəsizliyinin təmin edilməsi onun səlahiyyətində olub. R.Tağıyev 100-dən çox cəmiyyət və təşkilatın yanğın təhlükəsizliyi xidmətinin işini əlaqələndirib, yanğın təhlükəsizliyi və yeni texnika sahəsində vahid texniki siyasəti təmin edib.

"Qazprom qazbezopasnost" MMC-də R.Tağıyevin rəhbərliyi ilə "Qazprom" ASC-nin obyektlərində tətbiq olunan, söndürmənin effektivliliyi meyarına və yetərincə kiçik inersiyalılığa əsaslanan yanğınsöndürücü maddələrin və yanğınsöndürmə texnologiyasının optimallaşdırılması üçün böyük işlər görülüb.

Rusiya praktikasında ilk dəfə (R.Tağıyevin şəxsi iştirakı ilə) "Qazprom" ASC obyektlərində qazötürücü aqreqatların mühafizəsi üçün ən yeni yüksək effektivli yanğınsöndürmə qurğularının yaradılması və tətbiqi (onların söndürmə effektivliliyi köhnə sistemlərin xarakteristikasından on dəfə üstün idi) "Qazprom" ASC-nin elm və texnika sahəsində mükafatına, eləcə də "Rusiyanın təhlükəsizliyinin möhkəmləndirilməsinə görə" milli sahəvi mükafatına layiq görülüb.

R.Tağıyevin təhlükəsizlik sahəsindəki fəaliyyəti çoxşaxəlidir. Atom sualtı gəmilərinin yanğın mühafizəsi kompleks sisteminin hazırlanmasına görə "Qazprom qazbezopasnost" MMC RF Müdafiə Nazirliyinin minnətdarlıq məktubuna layiq görülüb. R.Tağıyev Ukrayna və Belarus qaz nəqli obyektlərinin yanğın təhlükəsizliyi sisteminin hazırlanmasına da köməklik göstərib.

Peşəkar işi ilə yanaşı, R.Tağıyev elmi və pedaqoji fəaliyyətlə də aktiv məşğul olur. Onun buza davamlı platformaların çoxlaylı texnoloji modullarında yanğınların söndürülməsinin yeni üsuluna dair təklifinə Rusiya Federasiyasının ixtira patenti verilib.

2006-cı ildə R.Tağıyev texnika elmləri doktoru alimlik dərəcəsi almaq üçün "Dəniz neft-qaz yataqları obyektlərinin təhlükəsizliyinin təminatı metodologiyasının hazırlanması" mövzusunda dissertasiya müdafiə edib. O, İ.M.Qubkin adına Rusiya Dövlət Neft və Qaz Universitetinin dəniz yataqlarının istismarı kafedrasının professoru, Rusiya Federasiyası Texnoloji Elmlər Akademiyası, Yanğın Təhlükəsizliyi

Milli Elmlər Akademiyası və Dünya Kompleks Təhlükəsizlik Akademiyasının həqiqi üzvüdur.

R.Tağıyev "Arktika şelfində yataqların qurulması üçün dəniz obyektlərinin təhlükəsizlik sistemlərinin optimallaşdırılması tədqiqatları və prinsipləri" kitabının, qaz sənayesində yanğın təhlükəsizliyi və dəniz yataqları obyektlərinin qurulmasına həsr olunan monoqrafiyalar və çoxsaylı məqalələrin müəllifidir.

R.Tağıyev "Qazprom" ASC-nin hərbiləşdirilmiş qəza-xilasetmə xidmətinin rəhbərinin müavinidir. O, təhlükəsizlik sahəsində "Zubr" Rusiya milli sahə mükafatının münsiflər heyətinin, "Qazprom" ASC-nin elm və texnika üzrə mükafatları ilə təltif etmə komissiyasının, "Yanğın təhlükəsizliyi – XXI əsr" beynəlxalq sərgisinin təşkilat komitəsinin üzvüdür.

R.Tağıyev, I, II və III dərəcəli "Qüsursuz xidmətə görə", "Yanğında şücaətə görə", "Xilas naminə əməkdaşlıq" medalları, "Xidmətlərə görə", "DİN-də əla xidmətə görə", "SSRİ-nin yanğın mühafizəsinin ən yaxşı işçisi", "Rusiyanın yanğın mühafizəsinin ən yaxşı işçisi" döş nişanları ilə təltif olunub. Bundan başqa, R.Tağıyev "Qazprom" ASC-nin Zapolyarye qaz yatağının mənimsənilməsinə böyük şəxsi töhfəsinə görə fəxri fərmanla mükafatlandırılıb. Dəfələrlə Ümumrusiya Sərgi Mərkəzinin diplomları və qızıl medalı ilə təltif olunub, RF Sənaye və Energetika Nazirliyinin təşəkkürnaməsi və Dünya Kompleks Təhlükəsizlik Akademiyasının bir sıra mükafatlarını alıb.

Yüksək ixtisası, yanğın təhlükəsizliyi sistemində böyük iş təcrübəsi R.Tağıyevə yüksək göstəricilər əldə etməyə, yanğınların sayının və dəyən ziyanın azaldılmasına nail olmağa imkan yaradıb. Bunun sayəsində "Qazprom" ASC-nin fövqəladə vəziyyətlərin qabaqlanması və ləğvi üzrə fəaliyyəti Rusiya yanacaq-enerji kompleksində ən yaxşı sayılıb.

R.Tağıyevin adı Rusiya Federasiyasının "Rusiyanın qaz sənayesində kim kimdir" və Rusiya Yanğın-Texniki Ensiklopediyası kimi nüfuzlu nəşrlərində yer alıb.



## Tağıyev
## Sadiq Rza oğlu

*Hüquq elmləri namizədi.*
*Ukraynanın Əməkdar Hüquqşünası.*
*Çerniqov vilayəti Apellyasiya Məhkəməsinin sədri*

---

Tağıyev Sadiq Rza oğlu 1959-cu il sentyabrın 5-də Azərbaycan Respublikasının Tovuz rayonunun Aşağı Ayıblı kəndində aqronom-alim ailəsində anadan olub.

1976-cı ildə Azərbaycanın Xanlar rayonunun (indiki Samux) İnstitut qəsəbə orta məktəbini bitirib. 1982-ci ildə Donetsk Tibb İnstitutunu fərqlənmə diplomu ilə bitirib və 1985-ci ilə qədər Voroşilovqrad (indiki Luqansk) şəhərində həkim işləyib. 1985-1992-ci illərdə Daxili İşlər Nazirliyi orqanlarında baş ekspert-kriminalist, müstəntiq kimi xidmət edib. 1992-ci ildə Ukrayna Hüquq Akademiyasını (hazırda Ukrayna Milli Hüquq Akademiyası) qiyabi bitirib.

1992-ci ildə Luqansk vilayətinin Rubejansk şəhər məhkəməsinin, 1999-cu ildən isə Luqansk Vilayət Məhkəməsinin hakimi seçilib. 2001-2010-cu illərdə Luqansk Vilayət Apellyasiya Məhkəməsi sədrinin müavini, mülki işlər üzrə məhkəmə palatasının sədri olub. 2010-cu ildə Ukrayna Prezidentinin fərmanı ilə Çerniqov Vilayətinin Apellyasiya Məhkəməsinin sədri təyin edilib və bu gün də həmin vəzifədədir.

S.Tağıyev elmi işlə də məşğul olur. 2009-cu ildə Ukrayna Milli Elmlər Akademiyasının Dövlət və Hüquq İnstitutunda hüquq elmləri namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. Hazırda doktorluq dissertasiyası üzərində işləyir. O, 25 elmi əsərin, 2 monoqrafiyanın müəllifi, 2 dərs vəsaiti və 1 toplunun həmmüəllifidir.

Müxtəlif illərdə Avropa İnsan Haqları Məhkəməsində (2005), Ohayo ştatının Ali Məhkəməsində (ABŞ, 2005), Zutfendəki hakimlərin və prokurorların hazırlığı mərkəzində (Niderland, 2000), Polşa və Macarıstan məhkəmələrində təcrübə keçib.

Praktiki və elmi fəaliyyətində uğurlarına görə çoxsaylı dövlət və idarə mükafatları alan S.Tağıyev 2004-cü ildə Ukrayna Prezidentinin Fərmanı ilə "Ukraynanın Əməkdar Hüquqşünası" adı, Ukrayna Ali Radasının Fəxri fərmanı (2005), "Regionun inkişafına görə", "Luqansk diyarı qarşısında xidmətlərinə görə" medalları, Ali Məhkəmə, Daxili İşlər Nazirliyi, Ali Ədliyyə Şurasının mükafatları ilə təltif olunub.

2006-2009-cu illərdə, o, Ukrayna Hakimlər Şurasının üzvü olub, I ixtisas dərəcəli hakimdir. 1990-cı ildə Rubejansk şəhər Xalq Deputatları Şurasının deputatı seçilib.



## Şahverdiyev Əzizağa Xanbaba oğlu

*Texnika elmləri doktoru, professor. Neft və Qaz Hasilatı Proseslərinin Sistemli Tədqiqi İnstitutunun baş direktoru*

Şahverdiyev Əzizağa Xanbaba oğlu 1951-ci il yanvarın 10-da Azərbaycan Respublikasının Əli Bayramlı rayonunun (indiki Şirvan rayonu) Ağaməmmədli kəndində anadan olub.

1973-cü ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetini (indiki Bakı Dövlət Universiteti) "maye və qazın mexanikası" ixtisası üzrə bitirib. Elmi fəaliyyətə Azərbaycan Elmlər Akademiyasının Dərin Neft və Qaz Yataqları Problemləri İnstitutunda kiçik elmi işçi kimi başlayıb. SSRİ Elmlər Akademiyasının Yerin Fizikası İnstitutunda və akademik A.P.Krılov adına Ümumittifaq Neft-Qaz Elmi-Tədqiqat İnstitutunda təcrübə keçmək üçün Moskvaya göndərilib. Aspiranturada təhsilini başa vurduqdan sonra namizədlik dissertasiyası müdafiə edib, daha sonra Azərbaycan Elmlər Akademiyasının Dərin Neft və Qaz Yataqları Problemləri İnstitutunda işləyib.

1984-cü ildə Ə.Şahverdiyev Moskvaya köçüb və A.P.Krılov adına Ümumittifaq Neft-Qaz Elmi-Tədqiqat İnstitutunda işə düzəlib. Burada o, kiçik elmi işçidən Neft yataqlarının işlənməsi prosesini idarəetmənin avtomatlaşdırılması elmi Mərkəzinin direktoru vəzifəsinədək yüksəlib. 1998-ci ildə institutu tərk etmək məcburiyyətində qalıb.

1999-cu ildə Ə.Şahverdiyev direktorun birinci müavini vəzifəsində instituta qayıdıb, bir il sonra isə baş direktor təyin edilib. Rəhbər vəzifədə o, qısa müddətdə dərin böhran keçirən institutun keçmiş şöhrətini qaytara bilib.

Hazırda Ə.Şahverdiyev Neft-Qaz Hasilatı Proseslərinin Sistemli Tədqiqi İnstitutunun baş direktoru, Rusiya Təbiət Elmləri Akademiyası Rəyasət Heyətinin üzvü, Rusiya Təbiət Elmləri Akademiyasının yeraltı sərvətlər bölməsinin sədridir.

O, 250-dən çox elmi əsərin, Rusiya və xarici patentlərlə müdafiə olunan 100 ixtiranın müəllifidir. Neft və qaz yataqlarının işlənmə prosesinin sistemli opitimallaşdırma konsepsiyasının, o cümlədən layların məhsuldarlığının inkişafı və neft hasilatının intensivləşdirilməsi və işlənmə obyektlərinin modelləşdirməsinin yaradıcısıdır.

Ə.Şahverdiyev tərəfindən yaradılan "Geoloji-texniki tədbirlərin texnoloji effektivliliyinin müəyyən edilməsinin vahid metodikası" və "ŞAHMET", "ŞAHMETEK"

proqram kompleksləri neft və qaz sənayesində geniş tətbiq olunub. Bununla bərabər, Ə.Şahverdiyev qeyri-müəyyənlik və informasiya çatışmazlığı şəraitində karbohidrogen yataqlarının işlənməsi layihəsinin optimal variant seçimini təmin edən yeni metodika hazırlayıb.

Ə.Şahverdiyev tərəfindən qeyri-səlis çoxluq nəzəriyyəsinin istifadəsi ilə tətbiqi proqram təminatının alqoritmi, ehtimal-statistika və evristik minimaks meyarlar – “OPTİMA” təklif edilib.

Ə.Şahverdiyev tərəfindən neft-qaz yataqlarının işlənməsi prosesinin kiçik parametrli stoxastik modelləşdirmənin, o cümlədən karbohidrogen yataqlarının işlənməsində bütövlükdə sinergistik effekt təzahürü ilə lay sisteminin fəaliyyətinin qanunauyğunluğunun əsasları yaradılıb. Elastik, elastik-plastik və plastik-məsaməli mühitlərdə flüidlərin filtrasiya nəzəriyyəsi hazırlanıb. Bu nəzəriyyə neft-qaz yataqlarının işlənməsi prosesində təzyiq dəyişikliklərinin məsaməlilik və keçiricilik dönməzliyini nəzərə alır.

Rusiya Təbiət Elmləri Akademiyası yeraltı sərvətlər bölməsi çərçivəsində Ə.Şahverdiyevin təşəbbüsü və özünün fəal iştirakı ilə Rusiyada səmt neft qazının səmərəli istifadəsi konsepsiyası yaradılır. Konsepsiyanın məqsədi səmt neft qazının atmosferdə yandırılmasını və seyrəldilməsini xeyli azaltmaqdır. Ə.Şahverdiyev Rusiya Federasiyası Təbii Resurslar və Ekologiya Nazirliyi ilə dövlət müqaviləsi çərçivəsində “İnnovasiya texnologiyalarını istifadə etməklə neft yataqları laylarının məhsuldarlığının artırılması və səmt qazından istifadənin artırılması sayəsində neft yataqlarının səmərəli mənimsənilməsinə dair tövsiyələrin hazırlanması” layihəsinin rəhbəridir.

Ə.Şahverdiyev SPE Beynəlxalq Neftçilər Assosiasiyasının (ABŞ, Riçardson), “Neftyanoye xozyaystvo”, “Bureniye i neft”, “Oborudovaniye i texnologii dlya nefteqazovoqo kompleksa”, “Azərbaycan Milli Elmlər Akademiyasının Xəbərləri” (“Yer elmləri” seriyası), Rusiya Elmlər Akademiyasının “Vestnik”, ARDNŞ-in Neft-Qaz Problemləri Elmi-Tədqiqat İnstitutunun “Elmi əsərləri” kimi tanınmış jurnalların redaksiya heyəti və redaksiya şuralarının üzvüdür.

Rusiya Federasiyası Prezidentinin Fərmanı ilə 1999-cu ildə Ə.Şahverdiyev “Rusiya Federasiyasının Əməkdar İxtiraçısı” dövlət mükafatına layiq görülüb. Onun xidmətləri qeyri-hökumət təşkilatlarında da əks olunub. O, Rusiya Təbiət Elmləri Akademiyasının “Elm və sənət cəngavəri” fəxri adı, “Ağ Qartal” ordeni, “Nobel mükafatı laureatı P.S.Kapitsa” gümüş medalı, “V.İ.Vernadski” gümüş medalı ilə təltif olunub. 2003-cü ildə fəxri fransız mükafatı – strateji idarəetmə sahəsində əldə etdiyi nailiyyətlərə görə Sənaye Təşviqi Assosiasiyasının “Qızıl medal”ını alıb.



## Şahverdiyev
## Tofiq Rzaqulu oğlu
*Rusiya kinorejissoru, jurnalist, fotoqraf*

Şahverdiyev Tofiq Rzaqulu oğlu 1938-ci il sentyabrın 12-də Bakı şəhərində anadan olub.

1960-cı ildə Taqanroq Radiotexnika İnstitutunu (hazırda Cənub Federal Universitetinin Mühəndis-Texnologiya Akademiyası), 1971-ci ildə İ.K.Karpenko-Karıy adına Kiyev Dövlət Teatr Sənəti İnstitutunun (indiki Kiyev Milli Teatr, Kino və Televiziya Universiteti) Vladimir Denisenkonun kinorejissorluq emalatxanasını bitirib. Riqa və Minsk zavodlarında mühəndis işləyib.

T.Şahverdiyev 1964-cü ildən Riqa kinostudiyasının səs rejissorudur. 1969-cu ildən Mərkəzi televiziyanın rejissoru işləyib. 1971-1991-ci illərdə "Ekran", Qorki adına kinostudiya, "Lenfilm", "Mosfilm" və "Videofilm" yaradıcılıq birlikləri və kinostudiyalarının rejissoru və ssenaristi olub. 1992-ci ildən "Studiya TŞ" kompaniyasının rəhbəridir. 2006-cı ildən Moskvada Beynəlxalq Universitetdə dərs deyir.

T.Şahverdiyev "Yeni evdə iki nəfər" (1978) və "Sevgi hissi" (1982) bədii filmlərini, 30-a yaxın sənədli film çəkib. Özünün bir çox kinolentlərində ssenari müəllifi və operator qismində işləyib. Bundan başqa, rejissor kimi "Yeralaş" uşaq kinojurnalının bir neçə seriyasını çəkib.

1970-1990-cı illərdə rejissor tərəfindən "Gimnastika dərsi" (1973), "Rusiya uşaqları" (1974), "Sənin mahnın nə barədədir?" (1977), "Stalin bizimlədir" (1989), "Sevgidən ölmək" (1991), "Bu adı yadda saxlayın" (1997), "Sevgi etirafı" (1998), "Qələbə marşı" (2000, "Nika" mükafatı) sənədli filmləri çəkilib.

T.Şahverdiyevin son illərdəki sənədli filmləri arasında "İnsan öldürmək" (2002), "Sevgi haqda" (2003), "Üfürülən şarlar" (2006), "Mənim dostum Yuri Xaşevatski" (2008), "Dağıstan dağlarında vəhhabi axtarışı" (2010), "Bizim uşaqlar necə insanlardır?" (2012), "İtalyan dili dərsləri" (2013) xüsusilə seçilir.

Onun ilk Kiyev hospisinin banisi, məşhur həkim Yelizaveta Qlinka barədə çəkdiyi "Mənim dostum həkim Liza" (2010) ekran əsəri 2011-ci ildə "Ən yaxşı sənədli film" nominasiyasında "Nika" mükafatına layiq görülüb.

T.Şahverdiyev Rusiya Kinematoqrafçılar İttifaqının üzvüdür, fotoqrafiya ilə peşəkar səviyyədə məşğul olur, fərdi fotosərgilərdə iştirak edir. 1988-ci ildən Rusiya Kinorejissorlar Gildiyasının, 1990-cı ildən Rusiya Rəssamlar İttifaqının qrafiklər və fotoqraflar bölməsinin üzvüdür.

T.Şahverdiyevin yaradıcılığı bir çox mükafatlarla qeyd olunub. 2005-ci ildə ona "Rusiya Federasiyasının əməkdar incəsənət xadimi" adı verilib. O, Portorojda Beynəlxalq Kinofestivalın (BKF) Qran-prisinin (1973), Tallində idman filmləri BKF-nin qızıl medalının (1974), San-Fransiskoda BKF-nin "Qızıl qapılar" Qran-prisinin (1990), Xanjonkov adına kinofestivalın xüsusi prizinin (1998), XI Ümumrusiya sənədli filmlər kinofestivalının tamaşaçı simpatiyaları prizinin (2000), Rusiya Kinematoqrafçılar İttifaqının Kinoşünaslar və Kino Tənqidçiləri Gildiyasının ali prizinin (2001) və başqa mükafatların sahibidir.

T.Şahverdiyev iki dəfə "Nika" mükafatına (2001, 2011), həmçinin "Avropaya pəncərə" kinofestivalının mükafatına (2010), Varşavada keçirilən turistik filmlər festivalında ən yaxşı filmə görə (2015, "Lahıc" filmi) mükafata, UNESCO-nun "Kino sənətində humanizmə görə" mükafatına və digər mükafatlara layiq görülüb.



## Şərifov
## Firdovsi Axun oğlu

*Fizika-riyaziyyat elmləri doktoru.*
*Kiyev Milli Aviasiya Universitetinin professoru*

Şərifov Firdovsi Axun oğlu 1954-cü il fevralın 24-də Azərbaycan Respublikasının Quba rayonunun Qarxun kəndində anadan olub.

1975-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetini (indiki Bakı Dövlət Universiteti) bitirib. 1978-ci ilə qədər Azərbaycan Elmlər Akademiyasının Kibernetika İnstitutunda mühəndis işləyib. 1979-1981-ci illərdə Ukrayna Elmlər Akademiyasının Kibernetika İnstitutunda təcrübəçi-tədqiqatçı olub, riyaziyyatın müxtəlif bölmələri üzrə hazırlıq keçmək üçün akademik institutların aparıcı ekspertlərinin mühazirələrində iştirak edib. 1982-1985-ci illərdə Ukrayna Elmlər Akademiyasının Kibernetika İnstitutunun aspiranturasında təhsil alıb.

"Yerləşmə sinfinə aid bəzi məsələlərin həlli metodları" mövzusunda namizədlik dissertasiyasını müdafiə etdikdən sonra F.Şərifov Ukrayna Elmlər Akademiyasının Kibernetika İnstitutunun iqtisadi kibernetika şöbəsində işləməyə başlayıb. Bu dövrdə o, bir neçə əsər nəşr edib, onların hər birində təqdim edilən riyazi prinsiplərin ümumiliyini, xarici təsirə və elmi dəbə meylin olmamasını görmək olar. Bu tədqiqatların əsas nəticələri F.Şərifov tərəfindən təklif olunan diskret proqramlaşdırma məsələlərinin həlli üçün effektiv alqoritmlərdir. Oxşar məsələlər xalq təsərrüfatının müxtəlif sahələrində, eləcə də cəmiyyət həyatının bir çox sahələrində meydana çıxır. Tədqiqatların praktik təbiəti F.Şərifovu bu sinifdən olan məsələlərin, o cümlədən Dnepropetrovskdakı metallurgiya zavodlarının layihələndirmə üzrə elmi-tədqiqat institutu (ETİ) ilə birlikdə konveyer xətlərinin optimal tərkibinin müəyyənləşdirilməsi, SSRİ Dövlət Aqrar Komitəsinin Moskvadakı Kənd Təsərrüfatı ETİ ilə birlikdə kənd təsərrüfatı obyektlərinin optimal yerləşdirilməsinin seçimi, Kiyevdəki Rabitə ETİ ilə birlikdə Ukraynanın ilkin magistral telefon şəbəkəsinin optimal layihələndirilməsi və energetika sahəsində bir sıra digər praktik məsələlərin həlli üçün informasiya texnologiyalarının yaradılması fikrinə gətirib çıxarır. Həmin dövrdə F.Şərifov Moskva Mərkəzi İqtisadiyyat və Riyaziyyat İnstitutunun Ukrayna Elmlər Akademiyasının Kibernetika İnstitutu ilə birlikdə təşkil etdiyi ümumittifaq və respublika elmi konfranslarında çıxışlar edib.

Sonralar F.Şərifov yeni sinif sintez şəbəkələri məsələlərinin tədqiqi ilə məşğul olub. Bu şəbəkələr optik internet (IP networks), molekulyar biologiya, eləcə də kristalların sabitlik strukturunun öyrənilməsində çoxsaylı əlavələrə malikdir. Tədqiqatların nəticələri müxtəlif beynəlxalq elmi jurnallarda dərc edilib, həmçinin F.Şərifov tərəfindən fizika-riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün “Mürəkkəb strukturlu şəbəkə sintezinin həlli üçün metod və alqoritmlər” mövzusunda 2006-cı ildə müdafiə etdiyi dissertasiyaya daxil edilib. Əldə edilən nəticələr F.Şərifovun dəvətli məruzəçi qismində qatıldığı bir sıra beynəlxalq konfranslarda təqdim olunub. “AMS” (American Mathematical Society) jurnalının dəvəti ilə alim bu jurnal üçün məqalələrə rəy yazıb.

F.Şərifov 70-dən çox elmi məqalənin müəllifi və 1 monoqrafiyanın həmmüəllifidir.



## Şərifov
## Ruslan Vahid oğlu

*İqtisad elmləri namizədi.*
*"Liqa Servis" MMC-nin direktoru.*
*Volqoqrad Vilayət Dumasının deputatı*

Şərifov Ruslan Vahid oğlu 1970-ci il avqustun 27-də Rusiya Federasiyasının Yaroslavl vilayətinin Konstantinovski qəsəbəsində anadan olub.

1987-ci ildə Volqoqrad şəhərinin Sovet rayonundakı 103 saylı orta məktəbi qızıl medalla, 1992-ci ildə Volqoqrad Texniki Universitetinin maşınqayırma fakültəsini qırmızı diplomla bitirib. 2003-cü ildə Volqoqrad Dövlət Qulluğu Akademiyasında ikinci ali təhsilini başa vurub.

2004-2007-ci illərdə R.Şərifov "Lukoyl-Volqoqradneftepererabotka" MMC-də baş direktorun müavini olub. 2004-cü ildə vahid seçki dairəsi üzrə "Yedinaya Rossiya" partiyasından (müvəqqəti əsasda) Volqoqrad Vilayət Dumasının deputatı seçilib.

2007-2009-cu illərdə vilayət Dumasının deputatı, tikinti, mənzil-kommunal siyasət və yol kompleksi üzrə komitə sədrinin müavini olub. Büdcə komitəsinin üzvüdür. "Yedinaya Rossiya" partiyasının üzvüdür.

2008-ci ildə "Rusiya transmilli korporasiyalarında sosial tərəfdaşlıq institutunun inkişafı" mövzusunda namizədlik dissertasiyasını müdafiə edərək iqtisad elmləri namizədi alimlik dərəcəsi alıb. 2009-2011-ci illərdə R.Şərifov "Dövlət hakimiyyəti orqanlarında korrupsiya müqavimət Mərkəzi" Volqoqrad vilayət regionlararası ictimai təşkilatı sədrinin hüquq-mühafizə orqanları ilə qarşılıqlı əlaqə üzrə müavini olub.

2011-2012-ci illərdə "Status" MMC-nin direktoru vəzifəsini tutub. Bu qurumun həyata keçirdiyi ən böyük layihələrdən biri "Volqa yelkənləri" yaşayış kompleksinin tikintisi olub. Bundan əlavə, R.Şərifov gənclərin peşə yönümü və işlə təmin edilməsi üzrə "Uğur qazan" regional layihənin əlaqələndiricisi olub.

2012-ci ildə R.Şərifov Volqoqrad merinin mənzil və kommunal-təsərrüfat sahəsini kurasiya edən birinci müavini təyin edilib. 2012-ci ildən "Liqa Servis" MMC-nin direktorudur.

2014-cü ildə R.Şərifov (müvəqqəti əsasda) IV çağırış Volqoqrad Vilayət Dumasının deputatı, 2014-cü ilin sentyabrından bu günədək (müvəqqəti əsasda) V çağırış Volqoqrad Vilayət Dumasının deputatıdır. Sənaye, yanacaq-energetika kompleksi, nəqliyyat və yol təsərrüfatı komitəsinin, habelə büdcə və vergi komitəsinin üzvüdür.

2005-ci ildə R.Şərifov Volqoqrad vilayət qubernatorunun "Volqoqrad vilayətinin inkişafına verdiyi töhfələrə görə" fəxri diplomuna layiq görülüb.



## Şərifov
## Teyyub Eldar oğlu

*"Avropa-Asiya" Moskva Vəkillər Kollegiyası Rəyasət Heyətinin sədri*

Şərifov Teyyub Eldar oğlu 1976-cı il sentyabrın 30-da Gürcüstanın Dmanisi rayonunda anadan olub.

1994-cü ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin Ulyanovsk filialının (indiki Ulyanovsk Dövlət Universiteti) hüquq fakültəsinə daxil olub və ali təhsilini 1999-cu ildə vəkil ixtisası üzrə başa vurub.

2000-ci ildə müəllimlərinin (tanınmış hüquqşünaslar, hüquq elmləri doktoru, professor V.P.Volojanin və hüquq elmləri doktoru, professor A.İ.Çuçayev) təkidi ilə T.Şərifov Ulyanovsk Dövlət Universiteti nəzdindəki Hüquq və Dövlət Qulluğu İnstitutunun aspiranturasında təhsilini davam etdirib. Bu dövrdən başlayaraq hüquqşünas alimlərin elmi və metodiki rəhbərliyi ilə, o, Rusiya Federasiyası Cinayət Prosessual Məcəlləsinin cinayət prosesində mülki iddia hissəsinə dair layihənin hazırlanması ilə bağlı geniş elmi-tədqiqat işləri aparmağa başlayıb.

T.Şərifov həmçinin Ulyanovsk Dövlət Universiteti nəzdindəki Hüquq və Dövlət Qulluğu İnstitutunun hüquq fakültəsinin cinayət prosesi və kriminalistika kafedrasında müəllim kimi işə qəbul edilib. 2000-2004-cü illərdə o, Ulyanovsk Vilayət Vəkillər Kollegiyasında fəxri vəkil olub.

2004-cü ildə T.Şərifov hüquq elmləri doktoru, professor İ.L.Trunovun dəvəti ilə elmi iş və vəkil fəaliyyətini davam etdirmək üçün Moskvaya dəvət olunub. 2004-cü ildən vəkil statusu alıb.

2004-2007-ci illərdə T.Şərifov hüquq elmləri doktoru, professor İ.L.Trunovun rəhbərlik etdiyi Moskva Mərkəzi Vəkillər Kollegiyasının vəkili olub. İ.L.Trunov, eləcə də hüquq elmləri doktoru, professor L.K.Ayvarla birlikdə T.Şərifov Moskva və Volqodonskda evlərin partladılması (1999), Dubrovkadakı mədəniyyət evində "Nord-Ost" müzikli tamaşaçılarının girov götürülməsi (2002), "Rijskaya" metro stansiyası yaxınlığında, "Avtozavodskaya" ilə "Paveletskaya" stansiyaları arasındakı keçiddə törədilən terror aktlarında (2004), Donetsk yaxınlığındakı aviaqəzada (2006), habelə "Transvaal park" əyləncə kompleksində günbəzin dağılması ilə ya-

ranan texnogen qəza nəticəsində (2004) zərərçəkmişlərin hüquqlarının müdafiəsi ilə məşğul olub.

2005-ci ildə T.Şərifov Rusiya Federal Təhlükəsizlik Xidmətinin Moskva İnstitutunun adyunkturasına, xüsusi cinayət-hüquqi fənlər kafedrasına daxil olub. Onun elmi araşdırma mərhələlərinin nəticələri "Hərbi qulluqçular tərəfindən törədilmiş cinayətlər üzrə məhkəmə prosesində iddianın hüquqi tənzimlənməsi" mövzusunda namizədlik dissertasiyasında ümumiləşdirilib. Rusiya Federal Təhlükəsizlik Xidmətinin dissertasiya şurasının 2006-cı il 23 may tarixli qərarı ilə T.Şərifova hüquq elmləri namizədi alimlik dərəcəsi verilib.

T.Şərifov Beynəlxalq Vəkillər İttifaqının (Birliyinin) üzvüdür və daim Fransa, Almaniya və Çində keçirilən elmi-praktik konfransların işində iştirak edir.

O, "Cinayət prosesində iddia" monoqrafiyasının müəllifidir. 2007-ci ildən bu günə qədər "Avropa-Asiya" Moskva Vəkillər Kollegiyası Rəyasət Heyətinin sədridir.

2009-cu ildə Ədliyyə Nazirliyinin sərəncamı ilə T.Şərifov korrupsiya ilə bağlı ekspertiza keçirmək səlahiyyəti olan ekspert kimi tanınıb.



## Şirinov
## Adil Şamil oğlu

*"Ford Sollers" MM-in birinci vitse-prezidenti və icraçı direktoru*

Şirinov Adil Şamil oğlu 1964-cü il iyunun 29-da Bakıda anadan olub.

Nijeqorod Xarici Dillər İnstitutunu, Beynəlxalq Menecment İnstitutunu, Sankt-Peterburq (IMISP) MBİ-ni bitirib.

1993-1998-ci illərdə "OTIS Elevators" kompaniyasında Şimal-Qərb regionunun kommersiya direktoru, "OTİS Rossiya" kompaniyasının satınalmalar üzrə direktoru işləyib. 1999-2002-ci illərdə "Ford Motor Company" şirkətində, əvvəlcə istehsalat və qeyri-istehsalat satınalmaları üzrə direktor, sonradan satınalmalar üzrə regional direktor vəzifələrində çalışıb (Povoljye). 2003-2004-cü illərdə "RusPromAvto" ASC-də satınalmalar üzrə direktor olub.

2004-cü ilin sentyabr ayında A.Şirinov "Sollers" kompaniyasına kommersiya direktoru kimi işə qəbul edilib, 2006-cı ilin sentyabrında "Sollers–Elabuqa" MMC-nin baş direktoru təyin olunub. 2010-cu ilin fevralında "Turin-Avto DM" MMC-nin və "Sollers–Naberejnıye Çelnı" ASC-nin baş direktoru işləyib. 2010-cu ilin noyabrından "Sollers–Isuzu" QSC-nin baş direktoru vəzifəsini tutub, "Sollers" ASC-nin kommersiya direktoru olub.

A.Şirinov "Sollers" portfelinin bütün brendləri üçün lokallaşdırılma məsələləri ilə məşğul olub, həmçinin "Sollers–Elabuqa" meydançasında "Isuzu" yük avtomobillərinin istehsalına rəhbərlik edib.

A.Şirinov 2011-ci il oktyabrın 3-dən "Ford Sollers" MM-in birinci vitse-prezidenti və icraçı direktorudur. Bu vəzifədə o, "Ford Sollers" MM-in əməliyyat strategiyasının həyata keçirilməsinə cavabdehdir. "Ford Sollers" "Ford" şirkətinin avtomobilləri, avtomobil hissələri və aksessuarları da daxil olmaqla bütün məhsullarının Rusiya bazarında istehsalı, idxalı və satışına cavabdeh olan "Ford Motor Company" və "Sollers" ASC-nin, tərəflərin bərabər iştirakı ilə müştərək müəssisəsidir. "Ford Sollers" MM Vsevoljsk (Leninqrad vilayəti), Naberejnıye Çelnı və Elabuqada ("Alabuqa" xüsusi iqtisadi zonanın ərazisində) 3 istehsalat meydançasına sahibdir.



## Vəliyev
## Eldar İsmayıl oğlu

*Fizika-riyaziyyat elmləri doktoru, professor.*
*Dövlət Elmi-Tədqiqat və Layihə Əsas Kimya İnstitutunun direktoru*

Vəliyev Eldar İsmayıl oğlu 1951-ci il yanvarın 24-də Bakı şəhərində anadan olub.

1968-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) fizika fakültəsinə qəbul olunub. 1972-1973-cü illərdə diplom işini yazmaq üçün Ukrayna Elmlər Akademiyasının Radiofizika və Elektronika İnstitutuna göndərilib. Elmi işinin uğurla yerinə yetirilməsi Ukrayna Elmlər Akademiyasının akademiki V.P.Şestopalova onu Radiofizika və Elektronika İnstitutuna aspirant kimi dəvət etməsinə əsas yaradıb. 1977-ci ildə fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almaq üçün "Uzununa yarıqlı dairəvi silindrlərdən təşkil olunmuş qəfəsdə elektromaqnit dalğalarının difraksiyası" mövzusunda dissertasiya işini uğurla müdafiə edib. Bu işdə E.Vəliyev tərəfindən hesablı-analitik həll üsulu inkişaf etdirilib və qəfəslər nəzəriyyəsində yeni rezonans təzahürlər öyrənilib.

1978-1986-cı illərdə o, tətbiqi elektrodinamikanın bəzi sərhəd məsələlərinin həllinə gətirib çıxaran ikili inteqral və summator tənliklərin həllinin ciddi üsullarını inkişaf etdirib. E.Vəliyev tərəfindən yastı və dairəvi ekranlarda və çoxbucaqlı silindrlərdə elektromaqnit dalğaların difraksiyasının dərin fundamental tədqiqatı aparılıb, açıq rezonatorlarda və kanallarda müxtəlifliyin rezonans xüsusiyyətləri öyrənilib, reflektor antenaların xassələri tədqiq olunub. Bütün bu işlər onun 1988-ci ildə Xarkov Milli Universitetində uğurla müdafiə etdiyi "Çoxbucaqlılarda, lentvarı və dairəvi silindrik ekranlarda elektromaqnit dalğaların difraksiyası" mövzusunda doktorluq dissertasiyasının əsasını təşkil edib.

1992-1995-ci illərdə E.Vəliyev dəvət olunmuş professor kimi Çukurova Universitetinin (Adana, Türkiyə) mühəndislik fakültəsində işləyib. Bu dövr ərzində o, elektrodinamikanın əsasları, riyazi fizika üzrə bir neçə kurs tədris edib və bir elmlər namizədi hazırlayıb.

E.Vəliyev 1991-2002-ci illərdə dəfələrlə Türkiyə, Yaponiya, Yunanıstan, ABŞ və başqa ölkələrin universitetlərinə dəvət edilib.

1997-ci ildə o, Amerika Bioqrafiya İnstitutu tərəfindən ilin adamı, 1999-cu ildə isə Beynəlxalq Radiomühəndislər İnstitutuna IEEE (ABŞ) böyük üzv seçilib.

2000-ci ildə E.Vəliyev Ukrayna, Rusiya və Belarus alımlərini birləşdirən Tətbiqi Radioelektronika Akademiyasının (Xarkov) akademiki seçilib.

Onun nəzəri radiofizika sahəsindəki elmi işləri dünyada tanınıb. Topladığı geniş elmi material dünyanın aparıcı elmi nəşrlərində 160-dan çox elmi işdə təmsil olunub. E.Vəliyevin rəhbərliyi altında 7 elmlər namizədi hazırlanıb.

E.Vəliyev 20 ildən artıqdır ki, "Elektromaqnit nəzəriyyəsində riyazi metodlar (ENRM)" beynəlxalq elmi konfransın təşkilatçılarından biri və təşkilat komitəsinin sədridir. Bu nüfuzlu beynəlxalq tədbirin yaranması və inkişafı tarixi E.Vəliyevin adı ilə bağlıdır və başlanğıcını onun tərəfindən təşkil olunan Radiotexnika və Elektronika İnstitutunun cavan alimlərinin elmi məktəbindən götürür.

E.Vəliyevin adı Müasir Ukrayna Ensiklopediyasında qeyd olunub. O, tətbiqi elektrodinamika üzrə monoqrafiyalar seriyası nəşrinin (Science House Co., Ltd., Tokio, Yaponiya) beynəlxalq redaksiya şurasının, həmçinin "Elektromaqnitnıye volnı i elektronnıye sistemı" (Moskva) jurnalının redaksiya kollegiyasının üzvüdür.

2005-ci ildən Azərbaycan Milli Elmlər Akademiyasının Fizika İnstitutunda (Bakı) "Tətbiqi elektrodinamikanın müasir metodları" laboratoriyasına ictimai əsaslarla rəhbərik edir.

Elmi kadrların hazırlanmasına, Ukrayna və Azərbaycan alimləri arasında elmi əlaqələrin genişləndirilməsinə verdiyi böyük töhfəyə görə o, 2006-cı ildə Ukrayna və Azərbaycan Milli Elmlər Akademiyalarının fəxri fərmanları, həmçinin millətlər arasında qarşılıqlı hörmətin qorunmasında fəal vətəndaş mövqeyinə və yüksək elmi nailiyyətlərinə görə Xarkov Vilayəti Dövlət Administrasiyası, Xarkov meriyası və Azərbaycan Respublikasının Ukraynadakı səfirliyinin fəxri fərmanları ilə təltif olunub.

E.Vəliyev hazırda Dövlət Elmi-Tədqiqat və Layihə Əsas Kimya İnstitutunun direktorudur. Bu institut onun rəhbərliyi altında Qazaxıstan, Polşa, Rusiya, Argentina və bu kimi digər dövlətlər üçün söndürülmüş soda istehsalı üzrə zavodların tikintisi üçün nəhəng layihə işlərini uğurla yerinə yetirir. E.Vəliyev, həmçinin 2007-ci ildən ictimai əsaslarla Xarkov Dövlət Administrasiyası başçısının sosial-iqtisadi məsələlər üzrə müşaviridir.

2011-ci ildə E.Vəliyevə "Azərbaycanın Əməkdar elm xadimi" fəxri adı verilib.



## Vəliyev
## Niyaz Qədim oğlu

*Texnika elmləri doktoru, professor.*
*Ural Dövlət Dağ-Mədən Universitetinin elmi iş üzrə prorektoru*

Vəliyev Niyaz Qədim oğlu 1961-ci il fevralın 17-də Ermənistan Respublikasının Qızıldaş kəndində fəhlə ailəsində anadan olub.

V.V.Vaxruşev adına Sverdlovsk Dağ-Mədən İnstitutunu "Səpinti yataqlarının işlənməsinin texnologiyası və kompleks mexanikləndirilməsi" ixtisası üzrə fərqlənmə ilə bitirib. 1987-ci ildən Ural Dövlət Dağ-Mədən Universitetində çalışır. Əmək fəaliyyətinə mühəndis kimi elmi-tədqiqat sektorunda başlayıb. 1987-1994-cü illərdə torf və səpinti yataqlarının işlənməsi kafedrasında assistent işləyib.

Niyaz Vəliyev hələ tələbə ikən elmi-tədqiqatlarla məşğul olub, təhsil illərində Ümumi və Peşə Təhsili Nazirliyinin ən yaxşı tələbə işi üçün medalı ilə təltif edilib, Lenin komsomolu təqaüdçüsü olub. 1994-cü ildə "Kömür kəsiklərinin tozlu səthinin bərkidilmə texnologiyasının inkişafı" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib.

Onun tədqiqatının nəticələri qızılın hidromexaniki hasilatının elmi əsaslarının işlənib hazırlanmasına nəzərəçarpacaq töhfə verib. Bunun sayəsində xırda qızıl dənələrinin azad edilməsi üçün gilli yataqların dezinteqrasiya qanunauyğunluğu, mərkəzdənqaçma hidravlik  qəlbirləmə qanunauyğunluğu, hidravlik laylın yamacında qızıl hissəciklərinin yerləşməsi qanunauyğunluğu müəyyən edilib.

N.Vəliyevin atmosfer çöküntülərinin rütubəti ilə tam doyması şəraitində topa qələviləşdirmə qalağının maili səthinin davamlılığının təmin olunmasına və qalağın açıq səthinin və özülünün qudron emulsiyası ilə izolə edilməsi üsulu ilə topa qələviləşdirmənin ekoloji təhlükəsizliyinin təmin olunmasına yönələn tədqiqatları hələ də aktual olaraq qalır.

1994-1995-ci illərdə prorektorun hüquqi və iqtisadi məsələlər üzrə müavini, 1996-cı ildən isə torf və mədən yataqlarının işlənməsi kafedrasının problemli laboratoriyasının baş elmi işçisi işləyib. 1997-ci ildən torf və səpinti yataqlarının işlənməsi kafedrasının dosentidir. 1997-2002-ci illərdə yataqların açıq üsulla işlənməsi kafedrasının dosentidir. 2003-cü ildən yataqların açıq üsulla işlənməsi kafedrasının

professoru, Yüksək İxtisaslı Kadrların Hazırlanması idarəsinin rəisidir. 2005-ci ildə prorektorun elmi iş üzrə müavini, 2008-ci ildə isə universitetin elmi iş üzrə prorektoru təyin edilib.

Niyaz Vəliyevin elmi işlərinin nəticələri "Xırda qızılın ayrılması üçün tərkibində qızıl olan süxurların hidro-mexaniki hazırlanmasının elmi-metodiki və texnoloji əsasları" (2002) mövzusunda doktorluq dissertasiyasında ümumiləşdirilib.

N.Vəliyevin elmi tədqiqatları Uralın və başqa regionların: "Uralalmaz", "Zoloto Severnoqo Urala", AS "Neyva", "Yakutalmaz", "Berezovskoye rudoupravleniye", "Severo-vostok zoloto" dağ-mədən müəssisələrində istifadə edilib.

2003-cü ildən "Mədənlərin yeraltı işlənməsi", "Dağ-mədən işinin əsasları" və "Qızıl hasilatının geoloji texnologiyası" mövzusunda mühazirələr oxuyur. Əsas elmi işləri qiymətli metalların silkələmə, hidromonitor, yeraltı və geotexnoloji üsullarla hasilatı problemlərinin həllinə həsr olunub.

Professor N.Vəliyev ekologiya, insan və təbiətin təhlükəsizliyi Beynəlxalq Elmlər Akademiyasının "dağ-mədən metallurgiyası" seksiyası üzrə həqiqi üzvü, Ali Attestasiya Komissiyası tərəfindən müəyyən edilmiş aparıcı resenziyalaşdırılmış elmi jurnalların siyahısına daxil olan "İzvestiya vuzov. Qornıy jurnal" jurnalının redaksiya şurasının üzvüdür.

N.Vəliyevin elmi fəaliyyətinin nəticələri 80-dən artıq elmi işdə öz əksini tapıb. O, Rusiya ali təhsil müəssisələrinin dağ-mədən işi sahəsində təhsil üzrə tədris-metodiki birliyinin qrifi ilə buraxılmış 4 dərs vəsaitinin müəllifi və həmmüəllifidir.

N.Vəliyevin elmi və pedaqoji fəaliyyəti Rusiya Federasiyası Elm və Təhsil Nazirliyinin fərmanı və diplomu, həmçinin Sverdlovsk vilayəti hökumətinin fərmanı, III dərəcəli "Şaxtaçı şöhrəti", "Rusiya Federasiyası ali peşə təhsilinin fəxri işçisi" döş nişanları ilə qeyd olunub.

N.Vəliyev Ümumrusiya Azərbaycan Konqresinin üzvüdür.



## Vəliyeva Cəmilə Seyfəddin qızı

*Hüquq elmləri doktoru, professor. P.A.Stolıpin adına Povoljye İdarəçilik İnstitutunun konstitusiya və beynəlxalq hüquq kafedrasının müdiri*

Vəliyevə Cəmilə Seyfəddin qızı 1970-ci il iyunun 5-də Gürcüstan Respublikasının Qardabani rayonunda anadan olub.

1988-ci ildə Saratov Kənd Təsərrüfatı Texnikumunun "hüquqşünaslıq" bölməsinə qəbul olunub və 1990-cı ildə oranı fərqlənmə diplomu ilə bitirib. Sonra D.İ.Kurski adına Saratov Hüquq İnstitutuna daxil olub və 1994-cü ildə təhsilini başa vurub. Elə həmin il Saratov Dövlət Hüquq Akademiyasının aspiranturasına qəbul edilib.

1994-2000-ci illərdə Saratov Kənd Təsərrüfatı Texnikumunda hüquq fənləri kafedrasında müəllim işləyib. Hüquq elmləri doktoru, professor V.T.Kabışevin rəhbərliyi altında "Rusiyada əlverişli ətraf mühitdə insan və vətəndaş hüquqlarının həyata keçirilməsinin konstitusion və hüquqi məsələləri" mövzusunda namizədlik dissertasiyasını hazırlayıb və 2001-ci ildə müdafiə edib.

2000-ci ildən indiyədək P.A.Stolıpin adına Povoljye İdarəetmə İnstitutunda çalışır. 2004-cü ildə C.Vəliyevaya konstitusiya hüququ kafedrasında dosent elmi dərəcəsi verilib.

C.Vəliyevanın 130-dan artıq dərc edilmiş işi, o cümlədən 5 monoqrafiyası (onlardan 3-nün həmmüəllifidir) var. Dərsliklərin və dərs vəsaitlərinin (cəmi 13) yazılmasında aktiv iştirak edir. Bu dərsliklərdən 2-si Rusiyanın konstitusiya hüququ barədədir (həmmüəllif, 2005, 2006 Metodika-Dərslik Birliyinin qrifinə malikdir).

O, "Rusiya Federasiyasında dövlət mülki xidmətin hüquqi tənzimlənməsi" (Saratov, 2006) dərs vəsaitinin həmmüəllifidir. 2006-cı ildə "Rusiyada ekoloji təhlükəsizlik" dərs vəsaiti, 2012-ci ildə Moskvada – "Konstitusiyanın ekoloji müddəaları: toplu" dərs vəsaiti çap olunub.

C.Vəliyeva, həmçinin çoxsaylı şərhlərin (onlardan 8-i dərc edilib), o cümlədən "Rusiya Federasiyasında yerli özünüidarəetmənin təşkilinin ümumi prinsipləri haqqında" Federal Qanuna, "Rusiya Federasiyasında dövlət və mülki xidmət haqqında" Federal Qanuna və s. qanunlara verilən şərhlərin həmmüəllifidir.

Onun "Daxili dəniz suları, ərazi dənizi və Rusiya Federasiyasına bitişik zona haqqında" 1998-ci il 31 iyul tarixli №155-FZ Federal Qanuna şərhi (maddələrlə) və "Rusiya Federasiyasının azsaylı yerli xalqlarının hüquq qarantı haqqında" 1999-cu il 30 aprel tarixli №82-FZ Federal Qanuna şərhi (maddələrlə) (T.V.Zametina ilə həmmüəllif) "KonsultantPlyus" hüquq-sorğu sisteminin kataloquna salınıb.

C.Vəliyeva elmi-tədqiqat işlərinin "İctimai hökumət orqanları və vətəndaş cəmiyyəti institutlarının qarşılıqlı əlaqəsi" və "Hökumət orqanları tərəfindən insan hüququnun müdafiəsi" kafedral mövzularına rəhbərlik edir. Konstitusion, bələdiyyə hüququ üzrə fundamental və tətbiqi elmi tədqiqatların aparılmasında aktiv iştirak edir. C.Vəliyevanın işləri mühüm elmi yenilikləri ilə fərqlənir və hüquq elminin inkişafına diqqətəlayiq töhfə verir. O, ekoloji konstitusiya hüququ və vəzifələrinin, Rusiya Federasiyasında ekoloji təhlükəsizliyin hüquqi əsaslarının təmin olunması və qorunması məsələləri üzrə konseptual tədqiqatlar aparıb.

2011-ci ildə C.Vəliyeva "Rusiya Federasiyasında ekoloji təhlükəsizliyin konstitusion və hüquqi əsasları" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. 2011-ci ilin oktyabr ayında Ali Attestasiya Komissiyasının qərarı ilə ona hüquq elmləri doktoru elmi rütbəsi verilib.

C.Vəliyevanın işlərinin əsas xülasəsi elmlər doktoru və elmlər namizədi alimlik dərəcəsı almaq üçün dissertasiyaların əsas elmi nəticələrinin dərc olunduğu Rusiyanın resenziyalı elmi jurnalların siyahısına daxil olan nəşrlərdə dərc edilib, həmçinin konstitusion hüquq məsələləri üzrə çoxsaylı Ümumrusiya və beynəlxalq konfranslarda məruzə şəklində səslənib.

C.Vəliyevanın tədqiqatlarının praktiki əhəmiyyəti özünü onun elmi işlərinin materiallarından dövlət quruculuğu, dövlət və bələdiyyə xidməti, insan haqlarının qorunması üzrə dövlət və bələdiyyə orqanlarının fəaliyyətində istifadə olunması ilə təsdiqləyir. C.Vəliyevanın dövlət hakimiyyəti və idarəsi orqanlarına ekspert qismində cəlb olunması onun elmi tədqiqatlarına olan praktik tələbata sübutdur. Müstəqil ekspert C.Vəliyeva Saratov vilayəti qubernatoru aparatının attestasiya komissiyasının, Saratov Vilayət Dumasının işinin təşkili və reqlamenti komitəsi yanında ekspert şurasının, Saratov vilayətinin insan haqları üzrə müvəkkili yanında ekspert şurasının üzvüdür.

1998-ci ildən hər il keçirilən Beynəlxalq "Konstitusiya oxuları" (Konstitusiya forumu) elmi-praktiki konfransının təşkilat komitəsinin üzvü olub. 2009-cu ildən "Müasir Rusiyanın konstitusion inkişafı" ali məktəblərarası "dəyirmi masa"sının,

2010-cu ildən E.A.Didorenko adına Luqansk Dövlət Daxili İşlər Universiteti ilə birgə keçirilən "Rusiya və Ukrayna konstitusiyaları müdavim və tələbələrin gözü ilə" ən yaxşı tələbə işi beynəlxalq müsabiqəsinin təşkilatçısıdır.

C.Vəliyevanın elmi fəaliyyəti müəllim sənəti ilə uğurla çulğaşır. Əldə edilən elmi nəticələr və praktiki təkliflər, metodiki işlər tələbələrlə praktiki məşğələlərin keçirilməsində və mühazirələr zamanı, həmçinin yerli idarəetmə orqanlarının deputatları, bələdiyyə işçiləri, eləcə də Federasiya subyektlərinin dövlət qulluqçuları üçün ixtisasartırma kurslarında və qısamüddətli hazırlıq seminarlarında istifadə olunur.

Aspirant və dissertantlarla iş C.Vəliyevanın elmi fəaliyyətinin əhəmiyyətli istiqamətidir. Onun rəhbərliyi altında "Konstitusiya hüququ", "Konstitusiya məhkəməsi prosesi", "Bələdiyyə hüququ" ixtisasları üzrə 6 namizədlik dissertasiyası uğurla hazırlanıb və müdafiə edilib.



## Yaqubov
## Emin Zəfər oğlu

*Texnika elmləri namizədi, professor.*
*Uxta Dövlət Texniki Universitetinin*
*təhsil işi üzrə prorektoru*

Yaqubov Emin Zəfər oğlu 1970-ci il avqustun 13-də Bakıda, texnika elmləri doktoru, professor Z.Yaqubovun ailəsində anadan olub. 1983-cü ildə ailəsi ilə birgə Komi ASSR-in (indiki Komi Respublikası) Uxta şəhərinə köçüb. 1988-ci ildə Uxtanın 1 nömrəli məktəbini əla qiymətlərlə bitirib. Təhsil illərində şahmatla aktiv şəkildə məşğul olub, dəfələrlə respublika çempionatlarında qalib gəlib, 1984-1985-ci illərdə şahmat üzrə keçmiş dünya çempionu V.V.Smıslovun şahmat məktəbinin dinləyicisi, sonradan şahmat üzrə FİDE ustası olub.

E.Yaqubov məktəbi bitirdikdən sonra D.F.Ustinov adına Leninqrad Mexanika İnstitutunun (indiki D.F.Ustinov adına Baltik Dövlət Texniki Universiteti) maşınqayırma fakültəsinə "raketqayırma" ixtisası üzrə qəbul olunub. 1994-cü ildə BDTİ-ni uğurla bitirib və həmin universitetin aspiranturasına qəbul olunub. 1998-ci ildə "maşınqayırma texnologiyası" ixtisası üzrə texnika elmləri namizədi alimlik dərəcəsi almaq üçün qapalı dissertasiya şurasında dissertasiyasını müdafiə edib. 1999-cu ildə ona Komi Respublikası başçısının "Gənc alim-99" mükafatı verilib.

Aspiranturanı bitirdikdən sonra E.Yaqubov Uxta Dövlət Texniki Universitetinin magistral qaz və neft borularının layihələndirilməsi və istismarı kafedrasında əvvəlcə baş müəllim, sonradan isə kafedranın dosenti vəzifəsində çalışıb.

2008-ci ildə Moskva Dövlət Texniki Universitetinin qiyabi şöbəsini "marketinq" ixtisası üzrə fərqlənmə diplomu ilə bitirib. 2000-ci ildə Primorsk diyarının Naxodka (Dalniy Vostok) şəhərinə köçüb.

2000-2002-ci illərdə Texnologiya və Biznes İnstitutunun elmi iş üzrə prorektoru vəzifəsini tutub. İşlədiyi dövr ərzində Rusiya və MDB-nin 20 şəhərindən 200-dən çox insanın iştirak etdiyi "Üçüncü minillik ərəfəsində elm-texnika-texnologiya" mövzusunda iki Beynəlxalq elmi-praktiki konfrans keçirilib.

2002-2004-cü illərdə "Naxodka dəniz balıq limanı" ASC-nin marketinq üzrə direktoru işləyib. 2005-2007-ci illərdə ardıcıl olaraq "Fast-Forest İnterneşnl" QSC-nin baş direktorunun marketinq üzrə müavini, "Evrosib Sankt-Peterburq – nəqliyyat

sistemləri" QSC nümayəndəliyinin direktor müavini, Uzaq Şərq Dövlət Texniki Universitetinin Naxodka filialı direktorunun elmi-tədqiqat işləri üzrə müavini vəzifələrində çalışıb.

2007-ci ilin sentyabrından E.Yaqubov Sakit Okean Dövlət İqtisad Universitetinin Naxodka şəhərindəki filialının direktoru işləyib. 2009-cu ildə bu filial "Rusiyanın 100 ən yaxşı məhsulu" – "Primorsk diyarının ən yaxşı məhsulu-2009" müsabiqəsinin regional mərhələsinin eyni vaxtda üç nominasiyasının - "Ali təhsil xidmətləri", "Təhsil sistemində xidmətlər" və "İctimai iaşə xidmətləri" nominasiyalarının laureatı olub. Müsabiqənin federal mərhələsinin nəticəsinə görə isə filial iki nominasiyanın - "Ali təhsil xidmətləri", "Təhsil sistemində xidmətlər" nominasiyalarının diplomantı olub. Bundan başqa, filial 2009-cu ilin nəticələrinə əsasən, əla iş reputasiyasına malik və dövlət sifarişlərinin yerləşdirilməsinin iştirakçısı kimi Federal vicdanlı təchizatçılar reyestrinə daxil edilib. Hazırda filial aktiv beynəlxalq fəaliyyət göstərir, tələbə və müəllimlərin mübadiləsi proqramı üzrə Koreya Respublikası və Çinin ali məktəbləri ilə əməkdaşlıq edir, həmçinin müştərək elmi-tədqiqat işləri aparır.

2012-ci ildə E.Yaqubov "Korroziyaya davamlı kompozit borular əsasında neft-qaz boruları sisteminin konstruktiv etibarlılığının təminatı prinsiplərinin işlənməsi" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. 2014-cü ildə Uxta Dövlət Texniki Universitetinin elmi iş üzrə prorektoru təyin olunub.

E.Yaqubov 38 elmi əsərin və 18 monoqrafiyanın (bəziləri həmmüəlliflikla) müəllifi, həmçinin ixtiralarına görə 5 patentin sahibidir. Çoxsaylı konfranslarda iştirak edib.

Hazırda Uxta Dövlət Texniki Universitetinin elmi iş üzrə prorektorudur.



## Yaqubov
## Zəfər Xanhüseyn oğlu

*Texnika elmləri doktoru, professor.*
*Uxta Dövlət Texniki Universitetinin texnoloji proseslərin elektrikləşdirilməsi və avtomatlaşdırılması kafedrasının müdiri*

Yaqubov Zəfər Xanhüseyn oğlu 1945-ci il mayın 12-də Azərbaycan Respublikasının Salyan rayonunda anadan olub.

1962-ci ildə Puşkin rayonunun (indiki Biləsuvar rayonu) Nizami adına orta məktəbini bitirdikdən sonra Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutuna (indiki Azərbaycan Texniki Universiteti) qəbul olunub. 1962-ci ilin martında Azərbaycanda riyaziyyat olimpiadasında III yeri tutub. İnstitutu fərqlənmə diplomu ilə bitirdikdən sonra ümumi və nəzəri radiotexnika kafedrasında müəllim kimi saxlanılıb.

1975-1978-ci illərdə Z.Yaqubov Azərbaycan Politexnik İnstitutunun radiotexnika və elektrorabitə fakültəsinin dekan müavini işləyib. Üç dəfə tələbə inşaat dəstəsinin komandiri olub. Bu institutun aspiranturasını bitirib. 1962-1983-cü illərdə institutun çoxtirajlı "Politexnik" qəzetinin redaksiya heyətinin üzvü və "Bakı" qəzetinin ştatdankənar müxbiri olub.

1983-cü ildə Z.Yaqubov ailəsi ilə birgə Komi ASSR-in Uxta şəhərinə köçüb və 1999-cu ildə Uxta Dövlət Texniki Universitetinə çevrilən Uxta Sənaye İnstitutunda işləməyə başlayıb.

1987-ci ildə texnika elmləri namizədi alimlik dərəcəsi almaq üçün "Ərazi - cəmlənmiş obyektlərin nəzarət və idarəetmə sistemləri komponentlərinin parametr və dislokasiyalarının optimal seçimi (neftin şaxta hasilatı timsalında)" mövzusunda dissertasiyasını müdafiə edib. 1991-ci ildə Z.Yaqubova dosent elmi adı verilib. 1994-cü ildə həmin ixtisas üzrə "Cəmlənmiş elementli obyektlərin nəzarət və idarə edilməsinin optimallaşdırılması metodları (neftin şaxta hasilatı timsalında)" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. 1998-ci ildə RF Ümumi və Peşə Təhsili Nazirliyinin qərarı ilə Z.Yaqubova professor elmi adı verilib.

Z.Yaqubov baş müəllim, dosent, professor, informasiya texnologiyaları fakültəsində dekan elmi-pedaqoji vəzifələrində çalışıb. 1996-cı ildən indiyədək UDTU-nun texnoloji proseslərin elektrikləşdirilməsi və avtomatlaşdırılması kafedrasının müdiri işləyir. 1997-2000-ci illərdə İdarəetmə və Beynəlxalq Biznes İnstitutunun direktoru olub.

1970-80-ci illərdə Z.Yaqubov neft şaxtalarının avtomatlaşdırılması üzrə elmi-tədqiqat işlərinə rəhbərlik edib və bu işlərin bilavasitə iştirakçısı olub. Onun rəhbərliyi altında neftin şaxta üsulu ilə hasilatı üçün nəzarət və idarəetmə sistemləri komponentlərinin parametr və dislokasiyalarının optimal seçimi metodu hazırlanıb. O, ilk dəfə olaraq neft şaxtaları üçün nəzarət-idarəetmə sistemlərinin keyfiyyət göstəricilərindən və ölçmə cihazlarının miqdarından asılı olaraq istehsalat xərcləri və itkilərin məbləğinə dair qanunauyğunluq irəli sürüb.

Həmçinin ilk dəfə şaxtada rabitə kanalının texniki xarakteristikalarının meyar seçimini və yalançı qəza siqnalizasiyası ehtimalını minimuma endirməyi həyata keçirməyə imkan verən metodika işlənib hazırlanıb. Uçqunlar və rabitə kanalının digər zədələri səbəbindən yaranan qəza vəziyyətini aradan qaldırmaq üçün lazım olan vaxtı qiymətləndirməyə imkan verən nəticə alınıb.

1990-cı illərdə Z.Yaqubovun rəhbərliyi altında “Severqazprom” MMC üçün su təchizatı və istilik sistemi şəbəkələrinin nasos aqreqatlarını qrup halında idarəetmə stansiyaları hazırlanıb və istifadə olunub. Su məsrəfinin və təzyiqinin orijinal tənzimləmə alqoritmi tətbiq edilib. Bənzər obyektlərdə tezlik-tənzimlənən elektrik ötürücünün (TTEÖ) tətbiqindən əldə olunan texniki-iqtisadi effektin qiymətləndirməsinin dəqiqləşdirilmiş metodikası hazırlanıb. Göstərilən metodikanın bazasında sənaye və kommunal istilik su təchizatı obyektlərində TTEÖ-nün effektivliyinin ekspress-qiymətləndirilməsini əldə etməyə imkan verən kompyuter proqramı yaradılıb. TTEÖ-dən istifadə edilməsi elektrik enerjisinə 43 faiz səviyyəsində qənaət etməyə imkan yaradıb. Əldə edilən texniki nəticələr TTEÖ-nün “Severqazprom” MMC-nin digər obyektlərində tətbiqinin kompleks proqramının inkişafı üçün əsas olub.

Z.Yaqubov tərəfindən 1990-cı illərin ikinci yarısında “Severqazprom” MMC QBİİ-nin istixanalarının elektrik avadanlıqlarının əsaslı təmirinin və istilik nasos stansiyalarında əsaslı təmirin aparılması üçün layihə-smeta sənədləşməsi hazırlanıb. “USA” (Usinsk) neft hazırlanması qurğusunda (NHQ) neft nasoslarının elektrik mühərriklərinin sıradan çıxmasının səbəbləri tədqiq edilib. Göstərilən nasosların elektrik ötürücüləri ilə idarəetmə stansiyaları hazırlanıb ki, bu da elektrik maşınlarının uzunmüddətli istismarına zəmanət verir. İdarəetmə və güc qurğularının elektromaqnit uyğunluğunun təmin olunması üzrə kompleks tədbirlər təklif edilib. ETİ-nin nəticələrinin istifadə olunması “USA” NHQ neft nasoslarının etibarlılığını yüksəltməyə və elektrik maşınlarının istismar müddətini normativə çatdırmağa imkan verib.

Z.Yaqubov tərəfindən “Severqazprom” MMC-nin enerji təsərrüfatı İAS-ın strukturunun və texniki vasitələrinin təkmilləşdirilməsi üzrə texniki təkliflər hazırlanıb.

"Severqazprom" MMC-nin SCADA sistemində enerji təsərrüfatı İAS-ın inteqrasiya etməyə imkan verən əlavə idarəetmə səviyyəsi əsaslandırılıb. Məlumat ötürən radio kanalların istifadəsi üzrə tövsiyələr verilib. Sonradan digər koordinasiya şurası birliklərdə tətbiq edilməsi məqsədi ilə EEANQS strukturunun unifikasiyası həyata keçirilib. Sistemin tətbiqindən əldə olunan texniki-iqtisadi effektin qiymətləndirilməsi aparılıb.

Həmçinin konfuzorda təzyiq və təzyiqin düşməsi ötürücüləri siqnallarının spektral analiz alqoritmi əsasında pompaj detektorlarının istifadəyə daxil olunması üzrə tövsiyələr hazırlanıb. Bu qaz vuran aqreqatın (QVA) istismarı prosesində artıq köhnəlmiş pompaj testlərinin nəticələrinin istifadəsindən imtina etməyə imkan verir. "Severqazprom" MMC-nin QVA AİS-in antipompaj idarəetməsində istismar olunan modernizəsi üzrə texniki təkliflər hazırlanıb.

Z.Yaqubovun sadalanan bütün fəaliyyət istiqamətlərində yenilikləri RF-nin ixtiralar üzrə 10 müəllif şəhadətnaməsi və patentləri ilə təsdiqlənib. Toplanmış bütün təcrübə 160 məqalədə və 2 monoqrafiyada ümumiləşdirilib və təqdim edilib. O, 12 dərs vəsaitinin müəllifidir.

Kafedrada alimin rəhbərliyi altında çoxmərhələli təhsil sisteminin qurulması üzrə məqsədyönlü işlər aparılır: bakalavrlar - diplomlu mütəxəssislər – aspirantlar. Z.Yaqubov iki magistr proqramına rəhbərlik edir, hesabında 10 namizədlik dissertasiyası, 10-dək çap edilən monoqrafiya və dərs vəsaiti, 200-dən çox məqalə, neft-qaz sahəsində tələbə, bakalavr və magistrlərin öyrədilməsi üçün 100 metodiki göstəriş olan federal əhəmiyyətli "Mürəkkəb texnoloji sistemlərdə avtomatlaşdırma, idarəetmə və identifikasiya" elmi-pedaqoji məktəbinin banisi və rəhbəridir.

Kafedrada aparılan elmi-tədqiqat və təcrübə-konstruktor işləri sahəsində əsas istiqamətlər, həmçinin Uzaq Şimal şəraitində neft və qaz sənayesində texnoloji proseslərin nəzarət metodları və vasitələrinin hazırlanması ilə bağlıdır.

1996-cı ildə Z.Yaqubov RF Sənaye Ekologiyası Akademiyasının akademiki, 1997-ci ildə isə Rusiya Təbiət Elmləri Akademiyasının həqiqi üzvü seçilib.

Z.Yaqubov doktorluq dissertasiyalarının müdafiəsi üzrə iki dissertasiya şurasının üzvüdür. 2005-ci ildə "İlin mühəndisi" müsabiqəsinin qalibi olub və ona "Rusiyanın peşəkar mühəndisi" sertifikatı təqdim edilib.

Z.Yaqubov sənaye təhlükəsizliyi üzrə ekspertdir. Dağ Mədən İnstitutunda (Vorkuta) və Dağ Mədən-Neft Kollecində (Uxta) diplom layihələrinin müdafiəsi üzrə DAK-ın sədridir. 2000-ci ildə ona "Rusiya Federasiyası ali peşə təhsilinin fəxri işçisi", 2008-ci ildə isə "Rusiya Federasiyasının əməkdar ali məktəb işçisi" adları verilib.



## Yusubov
## Mehman Süleyman oğlu

*Kimya elmləri doktoru, professor.*
*Sibir Dövlət Tibb Universitetinin kimya kafedrasının müdiri*

Yusubov Mehman Süleyman oğlu 1961-ci il oktyabrın 26-da Gürcüstan Respublikasının Marneuli rayonunun Algeti kəndində anadan olub.

1980-ci ildə Tomsk Politexnik İnstitutunun kimya-texnologiya fakültəsinə qəbul olunub və 1985-ci ildə oranı fərqlənmə diplomu ilə bitirərək "bioloji aktiv birləşmələrin kimyəvi texnologiyası" ixtisasına yiyələnib.

1991-ci ildə M.Yusubov "Aromatik 1,2-diketonlar və bis-1,2-diketonlarla sintezdə dimetilsulfoksid əsasında yeni oksidləşdirici reagentlər" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib və TPU-nun üzvi kimya və üzvi sintez texnologiyaları kafedrasında baş elmi işçi vəzifəsində çalışmağa davam edib.

M.Yusubov 1995-ci ildə doktoranturaya qəbul olunub və oranı bitirdikdən sonra 1998-ci ildə REA SB-nin Novosibirsk Üzvi Kimya İnstitutunun dissertasiya şurasında "Əlaqəli aril qarışıqlı etilen və asetilenlərin funksionallaşdırmasının yeni reaksiya və reagentləri" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. Elə həmin il müsabiqə yolu ilə Sibir DTU-nun kimya kafedrasının müdiri seçilib və indiyədək bu vəzifədə çalışır. 2001-ci ildə RF Təhsil Nazirliyi M.Yusubova professor elmi adı verib. O, tibbi-biologiya fakültəsinin 2-ci və 3-cü kurs tələbələrinə üzvi kimyadan mühazirə kursları oxuyur və praktiki məşğələlər keçir.

M.Yusubov Ulsan Universitetində (Koreya), professor Chi Ki-Whanın laboratoriyasında (1994, 1996, 2007), Kardiff Universitetində (Böyük Britaniya), professor T.Wirthin laboratoriyasında (2004), Almaniya Akademik Mübadilə Xidmətinin (DAAD) proqramı üzrə Hannover Universitetində, professor A.Kirschningin laboratoriyasında (2006, 2009, 2011) qrantlarla dəstəklənən xarici elmi təcrübə keçib. Dəvət edilən professor qismində qrant dəstəyi ilə Minnesotanın "Duluth" Universitetində (ABŞ) V.Zhdankinin laboratoriyasında işləyib (2006, 2009, 2011). M.Yusubov ümumilikdə 12 kollektiv qrantın rəhbəri və icraçısı olub.

Professor M.Yusubovun sitat indeksi (h-index) 12-dir. Bu, Sibir DTU-da ən yüksək indekslərdən biridir. O, Rusiya və xarici resenziyalı elm jurnallarında nəşr olun-

muş 103 məqalənin müəllifidir. Son bir neçə ildə onun 46 məqaləsi dərc edilib ki, onlardan 29-u yüksək impakt-faktorlu xarici jurnallarda yer alıb. Professor M.Yusubovun redaksiyası və həmmüəllifliyi ilə son illər 4-ü TMB qrifli 8 tədris-metodiki vəsait nəşr edilib.

M.Yusubov 14 patentin, o cümlədən 3 "İmmun stimullaşdırıcı aktivliyə malik vasitə" patentinin (2007, 2008), 3 "Allergiya əleyhinə təsirə malik vasitə" patentinin (2009, 2010), 1 "Sitostatik preparatların gematotoksikliyini aşağı salan vasitə" patentinin (2010) sahibidir. O, bədxassəli yeni törəmələrin sitostatik terapiyasının effektivliyini artıran "Polistan" yeni inyeksiya dərman vasitəsinin və "Bioferron" baytarlıq preparatının müəllifidir.

Professor M.Yusubovun tədqiqat işləri "yaşıl" kimya prinsiplərinə uyğun olan yod birləşmələri əsasında kimya texnologiyalarının fundamental əsaslarının hazırlanmasına, bitki mənşəli dərman və baytarlıq preparatlarının yaradılmasına əhəmiyyətli töhfə verir.

M.Yusubov Sibir DTU-nun elmi şurasının, həmçinin Sibir DTU-nun əczaçılıq fakültəsinin və Mərkəzi Elmi-Tədqiqat Laboratoriyasının elmi şuralarının üzvüdür. O, 7 elmlər namizədi hazırlayıb, son illər onun rəhbərliyi altında 2 namizədlik dissertasiyası müdafiə edilib.

M.Yusubov Tomsk vilayəti qubernatorunun Fəxri fərmanı (2001), RF Səhiyyə Nazirliyinin fərmanı (2005), Tomsk merinin fərmanları (2009, 2010) ilə təltif olunub.



## Zalov
## Ceyhun Eminbala oğlu
*"United oils" şirkətinin prezidenti*

Zalov Ceyhun Eminbala oğlu 1962-ci il iyunun 26-da Azərbaycan Respublikasının Dəvəçi (indiki Şabran) rayonunda anadan olub.

1979-cu ildə Dəvəçidəki T.Abbasov adına orta məktəbi bitirib. 1980-ci ildə SSRİ Silahlı Qüvvələri sıralarında müddətli hərbi xidmətə çağırılıb. Sibir hərbi dairəsində (Omsk) xidmət edib.

1981-ci ilin sentyabrında müddətli hərbi xidmətdən tərxis olunub. Mandat komissiyasından keçərək, Bakı Ali Ümumqoşun Komanda Məktəbinə (BAÜKM) daxil olub. Orada "ümumqoşun taqımının komandiri" ixtisası alıb.

1985-ci ildə C.Zalov hərbi məktəbdə təhsilini başa vurub və ona SSRİ Silahlı Qüvvələrinin leytenantı rütbəsi verilib.

1985-ci ilin sentyabrında C.Zalov hərbi xidmətini davam etdirmək üçün Türküstan hərbi dairəsinə göndərilib. Bir il Türküstan hərbi dairəsi komandanının ehtiyatında xidmət edib. 1986-1988-ci illərdə Əfqanıstan Demokratik Respublikasında (ƏDR) taqım komandiri, kəşfiyyat taqımının komandiri, həmçinin kəşfiyyat batalyonunun rəisi və alayın qərargah rəisinin köməkçisi vəzifəsində xidmət edib. Döyüş əməliyyatlarında iştirak edib.

Əfqanıstanda ikiillik xidmət müddətini başa vurandan sonra, 1988-ci ilin dekabrında C.Zalov hərbi xidmətini davam etdirmək üçün Pribaltika Hərbi Dairəsinə göndərilib. 1988-1989-cu illərdə Latviya SSR Hərbi komissarlığında xidmət keçib. 1989-cu ilin noyabrında xidmət müddəti başa çatıb. SSRİ Silahlı Qüvvələri Baş Qərargah rəisinin əmrinə əsasən "ştatların ixtisarı" ilə əlaqədar, ordudan tərxis olunub.

1990-1994-cü illərdə C.Zalov müxtəlif biznes-strukturlarda: menecer vəzifəsini icra edən, menecer, kommersiya direktoru və digər vəzifələrdə işləyib. 1996-cı ildən C.Zalov "Salang" Latviya-Əfqanıstan veteranlar cəmiyyətinin üzvüdür.

1989-cu ildən C.Zalov "Azəri" Latviya-Azərbaycan Mədəniyyət Cəmiyyətinin idarə heyəti sədrinin birinci müavini olaraq cəmiyyətin həyatında fəal iştirak edir.

1994-cü ildə C.Zalov Baltikyanı ölkələrdə avtokimya vasitələri, yağlar və sürtgü materialları istehsalı və ticarəti üzrə ən iri müəssisə olan "United oils" şirkətini yaradıb və onun idarə heyətinin sədridir.

2006-cı ildə "United oils" şirkəti Avropa fondlarının pul vəsaitləri hesabına uğurla maliyyələşdirilirdi. 2006-cı ildə C.Zalov Tukumsda (Latviya) tamamilə yeni istehsal bazasını istismara verir. Bu gün "United oils" istehsal obyekti maddi-texniki təchizatının səviyyəsinə görə Baltikyanı bölgədə yeganə obyektdir.

2015-ci ildə C.Zalov Baltika Beynəlxalq Akademiyasını bitirib.

C.Zalov "Qırmızı Ulduz" ordeni, "İgidliyə görə", "Döyüş xidmətlərinə görə", "SSRİ Silahlı Qüvvələrinin 70 illiyi", "Saur inqilabının 10 illiyi", "Beynəlmiləlçi döyüşçüyə – minnətdar əfqan xalqından", "Hərbi rəşadət", SSRİ Ali Soveti Rəyasət Heyətindən "Beynəlmiləlçi döyüşçüyə", III dərəcəli "Qüsursuz xidmətə görə" medalları, "Türküstan hərbi dairəsində fədakar hərbi əməyə görə" nişanı ilə təltif olunub.

C.Zalov Dünya Azərbaycanlılarının I Qurultayının iştirakçısı olub.



## Zeynalov
## Hüseyn Qardaş oğlu

*Fəlsəfə elmləri doktoru, professor.*
*M.Y.Yevsevyev adına Mordoviya Dövlət Pedaqoji İnstitutunun fəlsəfə kafedrasının professoru*

Zeynalov Hüseyn Qardaş oğlu 1962-ci il avqustun 7-də Bakıda anadan olub.

1979-cu ildə Bakıdakı Həsən Cəbrayılov adına 99 №-li orta məktəbi bitirib. 1980-1982-ci illərdə Sovet Ordusu sıralarında xidmət edib. 1983-cü ildə N.P.Oqaryov adına Mordoviya Dövlət Universitetinin hazırlıq bölməsinə daxil olub. 1984-1989-cu illərdə N.P.Oqaryov adına Mordoviya Dövlət Universitetinin tarix fakültəsində oxuyub. 1989-cu ildə "tarix" ixtisası üzrə ali təhsilini başa vurub, gənc mütəxəssis kimi təyinatla universitetdə saxlanılıb.

1989-cu ilin sentyabrında H.Zeynalov M.Y.Yevsevyev adına Mordoviya Dövlət Pedaqoji İnstitutuna (MDPİ) fəlsəfə müəllimi kimi dəvət edilib. 1989-1991-ci illərdə M.Y.Yevsevyev adına MDPİ-nin fəlsəfə və siyasi iqtisad kafedrasında assistent, stajor-müəllim, müəllim vəzifələrində işləyib. 1991-ci ildə Moskvaya, V.İ.Lenin adına Moskva Dövlət Pedaqoji Universitetinin aspiranturasına göndərilib. 1994-cü ildə "sosial fəlsəfə" ixtisası üzrə fəlsəfə elmləri namizədi alimlik dərəcəsi almaq üçün "İctimai inkişafın müasir nəzəriyyələrinin ekoloji konteksti" mövzusunda dissertasiya müdafiə edib.

1995-1997-ci illərdə H.Zeynalov M.Y.Yevsevyev adına MDPİ-nin fəlsəfə və iqtisadi nəzəriyyə kafedrasında baş müəllim işləyib. 1997-ci ilin sentyabrından həmin ali məktəbdə fəlsəfə və iqtisadi nəzəriyyə kafedrasının dosenti vəzifəsini tutub. 1998-ci ilin fevralından 2000-ci ilin dekabrına qədər Moskva Dövlət Pedaqoji Universitetinin fəlsəfə kafedrasının doktorantı olub.

2000-ci ilin oktyabrında H.Zeynalov "sosial fəlsəfə" ixtisası üzrə fəlsəfə elmləri doktoru alimlik dərəcəsi almaq üçün "Davamlı inkişaf strategiyasının sosial-fəlsəfi aspektləri" mövzusunda dissertasiya müdafiə edib. 2000-ci ilin dekabrında M.Y.Yevsevyev adına MDPİ-nin fəlsəfə, sosiologiya və iqtisadiyyat kafedrasının dosenti vəzifəsinə qəbul edilib. 2005-ci ildə H.Zeynalova professor elmi adı verilib.

H.Zeynalov sosial fəlsəfə sahəsində mütəxəssisdir. Onun elmi maraq dairəsi cəmiyyətin davamlı inkişafı, regionşünaslıq, sosial ekologiya, ekoloji təhsil, təhsilin fəlsəfəsi problemlərini əhatə edir.

O, fəlsəfəyə aid ənənəvi beynəlxalq və Rusiya konfranslarının təşkilat komitələrinin üzvü, bir neçə elmi jurnalın ("Uçebnıy eksperiment v obrazovanii", "Nauka Krasnoyarya" və s.) redaksiya heyətinin üzvüdür.

H.Zeynalov 170-dən çox elmi işin, o cümlədən 6 monoqrafiyanın, ali məktəblər üçün 3 dərsliyin müəllifi və həmmüəllifidir. Onun rəhbərliyi altında 3 aspirant namizədlik dissertasiyası müdafiə edib. O, Rusiya Humanitar Elmi Fondunun iki qrantının və Rusiya Federasiyası Təhsil və Elm Nazirliyinin iki qrantının elmi rəhbəri olub.

Elmi və pedaqoji fəaliyyətində qazandığı uğurlara görə H.Zeynalov hökumət təltiflərinə (Mordoviya Respublikası Hökumətinin Fəxri Fərmanı) və sahə üzrə təltiflərə layiq görülüb. Elmi-pedaqoji fəaliyyətdə xidmətlərinə və ixtisaslı kadrların hazırlığına verdiyi böyük töhfəyə görə ona "Mordoviya Respublikasının Əməkdar Elm Xadimi" fəxri adı verilib.



## Zinçenko
## Rəna Əbülfəz qızı

*Tibb elmləri doktoru, professor.*
*N.İ.Piroqov adına Rusiya Milli Tibb Universitetinin hüceyrə və molekulyar genetika kafedrasının professoru*

Zinçenko (qızlıq soyadı Məmmədova) Rəna Əbülfəz qızı 1963-cü il martın 23-də Bakıda anadan olub.

1979-1986-cı illərdə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun (indiki Azərbaycan Tibb Universiteti) pediatriya fakültəsində təhsil alıb. 1986-cı ildə həmin institutu "pediatriya" ixtisası üzrə fərqlənmə diplomu ilə bitirib. 1986-1989-cu illərdə Elmi-Tədqiqat Mamalıq və Ginekologiya İnstitutu (Bakı) yanında Tibbi-Genetik Məsləhətxanada həkim-pediatr vəzifəsində işləyib. 1989-1992-ci illərdə Tibbi-Genetik Elmi Mərkəzin (TGEM) genetik epidemiologiya laboratoriyasında "genetika" ixtisası üzrə aspiranturada oxuyub. 1993-cü ilin mayında "genetika" ixtisası üzrə "Genetik dreyfin ərazi bölgüsünə təsiri və Kirov vilayətinin populyasiyalarında irsi xəstəliklərin spektri" mövzusunda namizədlik dissertasiyası müdafiə edib.

1993-2006-cı illərdə R.Zinçenko TGEM-in Klinik Genetika İnstitutunda əvvəlcə elmi işçi, sonra elmi katib, böyük elmi işçi, aparıcı elmi işçi vəzifələrində işləyib, 2006-cı ilin fevral ayından TGEM-in genetik epidemiologiya laboratoriyasının müdiridir.

2001-ci ilin dekabrında R.Zinçenko "genetika – tibb elmləri" ixtisası üzrə "Rusiya populyasiyalarında irsi xəstəliklərin epidemiologiyası" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 2009-cu ildə "genetika" ixtisası üzrə professor elmi adı alıb. R.Zinçenko 2008-ci ildən bu günə qədər TGEM yanında Dissertasiya Şurasının elmi katibidir.

R.Zinçenko kliniki və fundamental tibbi genetika sahəsində mütəxəssisdir. Onun məşğul olduğu konkret fundamental məsələ – irsi xəstəliklərin genetik epidemiologiyasıdır. Bu tədqiqatlarda əsas məqam - müxtəlif populyasiyaların və etnik qrupların genomlarının şərti neytral genlər və irsi xəstəliklərin genləri üzrə genetik diferensiasiyasının öyrənilməsidir. Hazırda "İnsan genomunun müxtəlifliyi" proqramının dünyada müvəffəqiyyətlə reallaşdırılması davam edir. R.Zinçenko tərəfindən aparılmış tədqiqatlar əsasında tez-tez rast gəlinən, həm konkret regionların bütün əhalisi üçün səciyyəvi, həm də ayrı-ayrı etnik qruplar üçün spesifik irsi xəstəliklər seçilib.

Əvvəllər təsvir edilməmiş autosom-resessiv irsi hipotrixoz xəstəliyi sonuncular arasında yenilikdir. Bu xəstəliyin geni müəyyən edilərək xəritələşdirilib, onun mutasiyası təsvir olunub, özü isə yeni xəstəlik kimi qeydə alınmışdır.

R.Zinçenkonun rəhbərliyi altında 10 namizədlik və 2 doktorluq dissertasiyası hazırlanıb. O, TGEM və N.İ.Piroqov adına Rusiya Milli Tibbi Tədqiqatlar Universiteti (RMTTU) bazasında aspiranturada və doktoranturada "genetika" ixtisası üzrə, həmçinin "genetika", "dermatologiya", "oftalmologiya" və "nevrologiya" ixtisaslarının qovuşması istiqamətində müvəffəqiyyətlə elmi kadrlar hazırlayır.

R.Zinçenko "Science", "The Lancet", "European Journal of Human Genetics", "Balkan Journal of Medical Genetics", "Russian Journal of Genetics", "Qenetika" və digər elmi nəşrlərdə dərc olunmuş 420-dən çox işin müəllifidir: ISI-nin məlumatına görə, R.Zinçenkonun elmi işlərinin RİNS-də sitat gətirilməsi indeksi və Scopusda Xirş indeksi, müvafiq olaraq 12-yə və 6-ya bərabərdir.

R.Zinçenko tələbələr üçün 4 tədris-metodik vəsaitin və 5 monoqrafiyanın müəllifi və həmmüəllifidir: "Genomics And Health In The Developing World" (ABŞ, 2012), "Milli rəhbər vəsait. İrsi xəstəliklər" (Moskva, 2012), "İnsan populyasiyalarında irsi xəstəliklər" (Moskva, 2002), "Çuvaşiya populyasiyasının genetik strukturu və irsi xəstəlikləri" (Çeboksarı, 2006), "Rostov vilayətinin əhalisində anadangəlmə və irsi patologiyanın kliniki-genetik aspektləri" (Rostov-Don, 2010).

2000-ci ildə R.Zinçenko "Rusiyanın bəzi populyasiyalarında irsi xəstəliklərin epidemiologiyası" mövzusunda silsilə işlərinə görə Rusiya Tibb Elmləri Akademiyasının S.N.Davidenkov adına mükafatının laureatı olub. 2008-ci ildə ona Rusiya təbabətinə kömək Regional İctimai Fondunun profilaktik təbabət sahəsində diplomu və qrantı, 2009-cu ildə – "Tibb elminin və Səhiyyənin inkişafı üzrə səmərəli işinə görə" Rusiya Tibb Elmləri Akademiyasının Fəxri Fərmanı verilib.

2008-ci ildə R.Zinçenko "Gen coğrafiyası və irsi xəstəliklərin epidemiologiyası" elmi-tədqiqat mövzusu üzrə aparıcı elmi məktəblər sahəsində RF Prezidentinin qrantının rəhbərlərindən biri, Rusiya Fundamental Araşdırmalar Fondunda və tələbə diplom işlərində qrantların daimi rəhbəri, TGEM nəzdində ETM-in (elm-təhsil mərkəzi) "Rusiya populyasiyalarında genom müxtəlifliyi" mövzusunun rəhbəri olub. R.Zinçenko digər ölkələrdə də tanınıb. Rusiya və beynəlxalq miqyaslı konfranslarda müntəzəm olaraq elmi məruzələrlə çıxış edir. 1999-cu ilin iyun ayında ona "həkim-genetik" ixtisası üzrə ali ixtisas kateqoriyası verilib.



## Zülfüqarov İsmayıl Söhbət oğlu

*Biologiya elmləri namizədi.*
*Pusan Milli Universitetinin və M.K.Ammosov adına Şimal-Şərq Federal Universitetinin professor-tədqiqatçısı*

Zülfüqarov İsmayıl Söhbət oğlu 1959-cu il yanvarın 16-da Azərbaycan Respublikasının İsmayıllı rayonunun Talıstan kəndində anadan olub.

1981-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetini (indiki Bakı Dövlət Universiteti) bitirib. 1981-1983-cü illərdə Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunda məhsuldarlıq proseslərinin molekulyar-genetik əsasları şöbəsində böyük laborant vəzifəsində işləyib. 1983-1987-ci illərdə Botanika İnstitutunun qiyabi aspiranturasında oxuyub. Namizədlik dissertasiyası müdafiə edəndən sonra 2002-ci ilin sonuna qədər Azərbaycan Elmlər Akademiyasının Botanika İnstitutunda məhsuldarlıq proseslərinin molekulyar-genetik əsasları şöbəsində əmək fəaliyyətini davam etdirib, aparıcı elmi işçi vəzifəsinə yüksəlib.

2003-cü ildə Cənubi Koreyada işə dəvət alan İ.Zülfüqarov bu ölkəyə köçüb və Pusan Milli Universitetinin molekulyar biologiya şöbəsində professor-tədqiqatçı kimi işləməyə başlayıb.

2012-ci ilin oktyabr ayından İ.Zülfüqarov eyni zamanda M.K.Ammosov adına Şimal-Şərq Federal Universitetinin (Yakutsk, Rusiya) professor-tədqiqatçısı və Azərbaycan Elmlər Akademiyası Botanika İnstitutunun doktorantıdır.

İ.Zülfüqarov fotosintez və bitkilərin molekulyar biologiyası sahəsində mütəxəssisdir. Onun elmi araşdırmalarının əsas istiqaməti – xlorofil flüoresensiyasının qeyri-fotokimyəvi üsullarla söndürülməsinin molekulyar mexanizmi, bitkilərin inkişafının tənzimlənməsi və abiotik stress amillərinə yüksək dərəcədə tolerant bitkilərin yaradılmasıdır.

İ.Zülfüqarov elektronların dövri daşınmasının rolunu elektronların tam daşınması və enerjidən asılılıq komponenti olmayan çəltik bitkilərindən istifadə edilməklə fotomüdafiə prosesinə onun töhfəsinin təyin edilməsi yolu ilə qiymətləndirib.

İ.Zülfüqarov 120-dən çox elmi işin, o cümlədən yüksək impakt-faktorlu "Proceeding National Academy of Sciences" (ABŞ), "Plant Physiology", "The Plant Journal", "PLoS ONE", "Physiologia Plantarum", "Photochemical and Photobiological Sci-

ences", "Journal Plant Biology" kimi beynəlxalq elmi jurnallarda dərc edilmiş 30 elmi məqalənin müəllifi və həmmüəllifidir.

İ.Zülfüqarov 2012-ci ildən M.K.Ammosov adına Şimal-Şərq Federal Universiteti (ŞŞFU) ilə əməkdaşlıq çərçivəsində ŞŞFU-nun biologiya-coğrafiya fakültəsinin "Molekulyar-genetik texnologiyalar" və "Hüceyrə texnologiyaları" tədris-elmi laboratoriyalarının elmi fəaliyyətinə rəhbərlik edir. O, ŞŞFU-nun tələbələri, aspirantları, gənc alimləri və əməkdaşları üçün ingilis dilində "Hüceyrənin molekulyar biologiyası" adlı elmi məktəb-seminar işləyib hazırlayıb və həyata keçirib.

İ.Zülfüqarov – aktiv alimdir. O, bir neçə elmi cəmiyyətin üzvüdür, 1998-2002-ci illərdə Avropa Bitki Fiziologiyası Cəmiyyətində (sonradan Bitki Biologiyası Cəmiyyəti adlandırılıb) bitki fizioloqları cəmiyyətinin nümayəndəsi olub. 20-dən çox beynəlxalq konfrans, konqres və simpoziumda elmi məruzələrlə iştirak edib. M.K.Ammosov adına ŞŞFU-nun bazasında və Soyuq Qütbünün ərazisində – Oymyakonda təşkil edilmiş və keçirilmiş "Şimalın bioloji resurslarının ekoloji-resurs və molekulyar-genetik monitorinqi" mövzusunda II Beynəlxalq yay məktəb-ekspedisiyasının (2012, Saxa (Yakutiya) Respublikası) Təşkilat Komitəsinin üzvü, 2011-ci və 2012-ci illərdə Bakı Beynəlxalq Humanitar Forumunun iştirakçısı, I Bakı Beynəlxalq Humanitar Forumunun "Biotexnologiyanın etik problemləri" seksiyasının moderatoru olub.

İ.Zülfüqarov "2009-2013-cü illər üçün innovasiyalı Rusiyanın elmi və elmi-pedaqoji kadrları" Məqsədli Federal Proqramının "Şimalın yabanı bitkilərinin stresə uyğunlaşma genlərinin aşkar edilməsi və onların əsasında bioloji aktiv maddələrin alınması" mövzusu üzrə qrantını qazanıb.

# MÜNDƏRİCAT

